# AZƏRBAYCAN TOPONİMLƏRİNİN



## ENSİKLOPEDİK LÜĞƏTİ

BİRİNCİ CİLD



AZƏRBAYCAN MİLLİ ELMLƏR AKADEMİYASI
NƏSİMİ ADINA DİLÇİLİK İNSTİTUTU

# AZƏRBAYCAN TOPONİMLƏRİNİN





# ENSİKLOPEDİK LÜĞƏTİ

İKİ CİLDDƏ
BİRİNCİ CİLD



ŞƏRQ-QƏRB
BAKI 2007

Redaktor: **Rübabə Əliyeva**

Tərtibçilər: **Rübabə Əliyeva**
**Qara Məşədiyev**
**Etibar İnanc**
**Tünzalə Baxşıyeva**
**Şəms Qocayeva**

Rəyçilər: **İsmayıl Məmmədov**
**Fikrət Xalıqov**

**ISBN 978-9952-34-155-3**

**914.754/003-dc22**
Azərbaycan toponimləri – Lüğətlər

**Azərbaycan toponimlərinin ensiklopedik lüğəti.** İki cilddə. I cild.
Bakı, "Şərq-Qərb", 2007, 304 səh.

İkicildlik Azərbaycan toponimlərinin ensiklopedik lüğətində 12 minə yaxın coğrafi adın izahı verilmişdir. Lüğətin tərtibində Azərbaycanın görkəmli dilçi, tarixçi və toponimist alimlərinin tədqiqatları nəzərə alınmışdır.



# ÖN SÖZ

Hər bir xalqın tarixi, dili, etnogenezi, təfəkkürü, məşğuliyyəti haqqında dəyərli məlumat verən toponimlər onomastik vahidlər sırasında öz zənginliyi ilə seçilir. Lüğətdə toplanmış toponimlər Azərbaycan Respublikasının bu günü və yaxın keçmişi (1980-ci illər) ilə bağlı olan coğrafi adlardır. Müstəqillik dövründə dəyişdirilmiş adlar da lüğətdə öz əksini tapmışdır.

Lüğətin tərtibində toponimiyadakı son məlumatlar nəzərə alınmışdır. Lakin bəzi məqamlarda tərtibçilər və redaktor öz mövqelərindən çıxış etməyi lazım bilmişlər. Belə ki, əsasən toponimik tədqiqatlara yardım məqsədilə nəzərdə tutulmuş bu lüğətdə gələcək tədqiqatçıları düzgün istiqamətləndirmək üçün kəndlərin adları onların daxil olduqları inzibati ərazi vahidlərinin adları ilə birlikdə çəkilir. Müstəqillik dövründə dəyişdirilmiş adların bəziləri tərtibçiləri qane etmədiyindən, köhnə adların etimologiyası da açıqlanmış və beləliklə də qədim dil vahidlərinin dildən çıxarılmasına qarşı tədqiqatçılar öz fikirlərini söyləmiş olmuşlar.

Lüğətin tərtibində müəlliflərin öz tədqiqatları ilə yanaşı, Azərbaycanın bir çox görkəmli dilçi alimlərinin, türkoloqların, tarixçilərin, coğrafiyaşünasların, toponimistlərin, etnoqrafların əsərləri nəzərdən keçirilmiş, mövzu ilə bağlı müxtəlif lüğətlərə, toplulara, inzibati ərazi bölgülərinə müraciətlər olmuş, müqayisələr aparılmışdır.

## ŞƏRTİ İXTİSARLAR

*alm* – almanca
*antr* – antroponim
*avar* – avarca
*Azərb* – Azərbaycan
*azərb* – azərbaycanlı
*c* – cənub
*d y* – dəmir yol
*düz* – düzəltmə
*erm* – ermənicə
*etn* – etnonim
*ər* – ərəbcə
*fars* – farsca
*fr* – fransızca
*ha* – hektar
*hidr* – hidronim
*hün* – hündürlüyü
*i ə v* – inzibati ərazi vahidi
*km* – kilometr
*q* – qərb
*qəd* – qədim
*lat* – latınca
*ləzg* – ləzgicə
*m* – metr
*mənsub şək -si* – mənsubiyyət şəkilçisi
*min* – mineral
*monq* – monqolca
*mür* – mürəkkəb
*Nax MR* – Naxçıvan Muxtar Respublikası
*oyk* – oykonim
*or* – oronim
*r-n* – rayon
*rus* – rusca
*ş* – şərq
*ş a* – şəxs adı
*şək* – şəkilçi
*şm* – şimal
*şfq* – şəhər tipli qəsəbə
*tal* – talışca
*tat* – tatca
*təqr* – təqribən
*top* – toponim
*türk* – türkcə

## AZƏRBAYCAN ƏLİFBASI

| | | | | | | | |
|---|---|---|---|---|---|---|---|
| **Ab**<br>*a* | **Bb**<br>*be* | **Cc**<br>*ce* | **Çç**<br>*çe* | **Dd**<br>*de* | **Ee**<br>*e* | **Əə**<br>*ə* | **Ff**<br>*fe* |
| **Gg**<br>*ge* | **Ğğ**<br>*ğe* | **Hh**<br>*he* | **Xx**<br>*xe* | **Iı**<br>*ı* | **İi**<br>*i* | **Jj**<br>*je* | **Kk**<br>*ke, ka* |
| **Qq**<br>*qe* | **Ll**<br>*el* | **Mm**<br>*em* | **Nn**<br>*en* | **Oo**<br>*o* | **Öö**<br>*ö* | **Pp**<br>*pe* | **Rr**<br>*er* |
| **Ss**<br>*se* | **Şş**<br>*şe* | **Tt**<br>*te* | **Uu**<br>*u* | **Üü**<br>*u* | **Vv**<br>*ve* | **Yy**<br>*ye* | **Zz**<br>*ze* |





# Aa

**Abad** *oyk., sadə* Ağdaş r-nunun Qaradeyın i e.v.-də kənd 1809-cu ildə Avat, 1917-ci ildə Avad şəklində qeydə alınmışdır Yerli sakinlərin dilində *Avat* kimi tələffüz olunur və "quru kol-kos" mənasında izah edilir Mənbələrin verdiyi məlumata görə, *avat* qırğız tayfalarından birinin adıdır. Tümen vilayətində Abat, Gürcüstanda Abat-xevı, Qazaxıstanda Avat, Qafqazda Avat dağ və kənd adları Abad (Ağdaş) oykoniminin *avat* etnonimi ilə bağlı olduğunu söyləməyə əsas verir Türklərin Qərb yürüşlərində iştirak edən avatların XI-XIII əsrlərdə Səlcuq oğuzlarının tərkibində Azərb -a gəlmələri ehtimal olunur

**Abadgöl** *hidr , mür* Ağdaş r-nunda arx Hidronim *Abad* (kənd adı) və *göl* sözlərindən düzəlib, "Abad kəndinə məxsus göl" deməkdir

**Abadkənd** *oyk., mür* Salyan r-nunun Xələc i ə v -də kənd. 1954-cü ilədək Cındırlı (əsli Candarlı) olmuşdur Cənub-Şərqi Şirvan düzündədir Oykonim *abad* və *kənd* topokomponentlərindən düzəlib, "müntəzəm və çoxlu tikintisi, yaşayış üçün hər cür şəraiti olan, məskun edilmiş, səliqəli, inkişaf etmiş, becərilmiş, düzəldilmiş yer, yaşayış məntəqəsi" deməkdir *Abad* topokomponenti çox vaxt şəxs adlarına qoşularaq rus dilindəki *-qrad*, *-ovka*, yunan dilindəki *-pol*, alman dilindəki *-burq* topoformantlarına uyğun gəlir və memorial toponimlərin yaranmasında iştirak edir. Bu topokomponentə hind, Pakistan, fars, türk (həmçinin digər türkdilli xalqlar) toponimiyasında rast gəlmək mümkündür Candarlı toponiminə gəlincə, bu toponimə Çandır/Çandar/Candar variantlarında Türkmənistan, Özbəkistan, Gürcüstan toponimiyasında təsadüf olunur Azərb -ın Qazax-Ağstafa bölgəsində Candar göl hidronimi və Çəndirli familiyası da qeydə alınmışdır XIX əsrdə Azərb -nın keçmiş Cavad qəzasında yaşayan xələclərin bir tirəsinin adı *candır* olmuşdur İndiki Abadkənd kəndinin Xələc i ə v.-nin tərkibində olması bu toponimin etnotoponim olmasını söyləməyə əsas verir Çandar etnonimi Səlcuq oğuzları ilə əlaqələndirilir

**Abalı/Abalu** (1933) *oyk., sadə*. Zaqatala r-nunun Danaçı i ə v -də kənd Mənbələrin verdiyi məlumata görə, kəndin əsl adı Abaəlioba olmuşdur Yerli əhalinin ehtimalına görə, oykonim *Abaəli* (Dağıstanın Çaroda kəndindən gəlmiş şəxsin adı) və *oba* (kəndin ərazisində kiçik icma) komponentlərindən ibarətdir Türk dillərində, o cümlədən Azərb dilinin dialekt və şivələrində *aba* "ata, baba, əmi, ana, xala, böyük bacı" mənalarında işlənir Oykonimi Dədəli, Babalı və s etnotoponimlərinin omonimi kimi qəbul etmək lazımdır Bu oykonim sonrakı illərdə Abasalı (1979), Abaslı (1986) variantlarında qeydə alınmışdır 2004-cü ildə kəndin adı Abaəli variantında rəsmiləşdirilmişdir

**Abazallı** (1968) / **Abasallı** (1917, 1933, 1961) / **Abasalılı** (1979, 1986) *oyk. düz* 1 Neftçala r-nunun Tatarməhlə i ə v -də kənd Salyan düzündədir Son illərdə Abasəlikənd variantında rəsmiləşdirilmişdir; 2 Cəlilabad r-nunun Təklə i ə v -də kənd Burovar silsiləsinin ətəyindədir 2001-ci ildən Abasallı kimi rəsmiləşdirilmişdir Biləsuvar r-nundakı Novomixaylovka (indiki Zəhmətabad) kəndinin adı da 1840-cı ilədək Abazallı olmuşdur. Bu oykonimlər xəzər və peçeneqlərin tərkibində Azərb -na gəlmiş *abaza* (avaz/abas/abaz) tayfasının adı ilə bağlıdır Türkmənistanda Avaza, Xakas MV-də Abaza, Gürcüstanda Abaşa, Abazlar toponimlərinin, Azərb -da isə Avazlar, Avaz, abbazlı (Qazax r-nunun İkinci Şıxlı kəndində tayfa) toponim və etnonimlərinin qeydə alınması bu fikri təsdiq edir

**Abbasabad** *oyk , mür* Yardımlı r-nunun Hamarkənd i ə v -də kənd. Viləş çayının sahilində, dağətəyi ərazidədir Yaşayış məntəqəsi XIX əsrin ortalarında pornayım tayfasına mənsub ailələr tərəfindən salınmışdır Bəzi mənbələrdə Abasabad (1917, 1933, 1961) variantında qeydə alınmışdır Oykonim *Abbas* (şəxs adı) və *abad* topokomponentlərindən düzəlib 1809-1810-cu illərdə Araz çayı sahilində, Naxçıvan şəhərinin 6 km

c.-ş.-ində fransız hərbi mühəndislərinin layihəsi əsasında Abbasabad qalası tikilmişdi. Qala İran dövlət xadimi, Fətəli şah Qacarın oğlu və vəliəhdi Abbas Mirzənin adı ilə bağlı idi. Rusiya-İran müharibəsində (1826-1828) qalada vuruşmalar olmuşdu. Araz su qovşağı tikiləndən sonra Abbasabad qalasının xarabalığı su altında qalmışdır. Mənbələrdə 1828-30-cu illərdə baş vermiş hadisələrlə əlaqədar İrəvan xanlığının Vedibasar, Şərur və Sürməli mahallarında Abbasabad adlı kəndlərin azərb. əhalisi haqqında məlumat verilir.

**Abbasbəyli/Abasbəyli** *oyk., sadə.* 1. Qazax r-nunun Alpout i.ə.v.-də kənd. Gəncə-Qazax düzənliyindədir. Keçmiş adı Daharbəylidir. Yaşayış məntəqəsi XIX əsrdə Dəmirçilər kəndinin abbasbəyli adlı nəslinə mənsub ailələr tərəfindən salınmışdır. 2. Masallı r-nunun Yeyənkənd i.ə.v.-də kənd. Lənkəran ovalığındadır. 1933-cü ildə Dəvəçi və Sabirabad r-nları ərazisində də Abasbəyli kəndləri qeydə alınmışdır. Bu oykonimlər abasbəyli etnonimi ilə bağlıdır.

**Abbasxanlı/Abasxanlı** *oyk., sadə.* Ağsu r-nunun Kəndoba i.ə.v.-də kənd. Şirvan düzündədir. Keçmiş adı Gorus Abbasxanlı olmuşdur. Oykonim Şamaxı qəzasında maldarlıqla məşğul olan bir nəslin adını əks etdirir. Bu kənd Şirvan xanlığı dövründə Çaparlı və Ağarx kəndləri ilə birlikdə Gorus adlanan mahala daxil idi. Mahalın adı vaxtilə burada məskunlaşmış gorus qızılbaş tayfasının adından götürülmüşdür. XVIII əsrdə Gorus mahalı Şamaxı xanı Mustafa xanın kürəkəni Ağakişi bəyə mənsub olmuşdur. 1933-cü ildə Cəlilabad r.-nu ərazisində eyniadlı kənd qeydə alınmışdır. Bu oykonimlər *abbasxanlı* nəslinin adı ilə bağlıdır.

**Abbaskənd** *oyk., mür.* Şəki r-nunun Aşağı Göynük i.ə.v.-də kənd. Alazan-Əyriçay çökəkliyindədir. Oykonim *Abbas* (şəxs adı) və *kənd* topokomponentlərindən düzəlib, "Abbas adlı şəxsə məxsus yaşayış məntəqəsi" deməkdir.

**Abbasqulular/Abasqulular** (1933) *oyk., sadə.* Tovuz r-nunun Çeşməli (keçmiş Çirkinli) i.ə.v.-də kənd. Əsrik çayının sahilindədir. Gədəbəy r-nunda da eyniadlı kənd qeydə alınmışdır. Etnotoponimdir.

**Abbaslar köbəri** *or., mür.* Yevlax r-nunun Ərəbbəsrə kəndi ərazisində yoxuş. Oronim *abbaslar* (etnonim) və *köbər* (qabarmış səth boyu gedən yol, yoxuş) sözlərindən düzəlib (*-i* mənsub. şəkilçisidir).

**Abbaslı/Abaslı** *oyk., sadə.* Şəmkir r-nunun Seyfəli i.ə.v.-də kənd. Şəmkir çayının sahilində, dağ ətəyindədir. Oykonim *abbaslı/abaslı* etnonimi ilə bağlıdır. Yerli əhalinin verdiyi məlumata görə, kəndin əsası XIX əsrdə İrəvan quberniyasından gəlmiş eyniadlı nəslə məxsus ailələr tərəfindən qoyulmuşdur. 1917-ci ildə Yardımlı r-nunun Şiləvəngə i.ə.v.-də Abaslı kənd adı qeydə alınmışdır.

**Abdal** *oyk., sadə.* 1. Ağdam r-nunun Gülablı i.ə.v.-də kənd. Dağ yamacındadır; 2. Tovuz r-nunun Yanıxlı i.ə.v.-də kənd. Çınqıldağ silsiləsinin ətəyindədir. Oykonim *abdal* tayfasının adı ilə bağlıdır. Qafqaz Albaniyasında hələ eradan əvvəl yaşaması ehtimal olunan abdalıların (heftal/heptal/eftal) adına qazax, qaraqalpaq, türkmən və türk toponimiyasında da rast gəlmək mümkündür.

**Abdal** *hidr., sadə.* Tovuz r-nu ərazisində çay. Zəyəm çayının qoludur. Mənbəyini Öküz dağı və Maral dağının yamaclarından götürür. Çay qədim Abdal qalasının yaxınlığından axdığı üçün həmin qalanın adı ilə adlandırılmışdır.

**Abdal** *or., sadə.* Ordubad r-nu ərazisində dağ. Etnotoponimdir.

**Abdalanlı** *oyk., düz.* Qubadlı r-nunun Qayalı i.ə.v.-də kənd. Dağətəyi ərazidədir. Keçmiş adı Ocaqqışlaqdır. Yaşayış məntəqəsi keçmiş qışlaq yerində salınmışdır. Tədqiqatçılara görə, kəndin adı *abdalanlı* adlı elatın adı ilə bağlıdır. Oykonim *abdal* etnonimindən, *-an* (far. cəm şək.-si) və *-lı* (azərb. mənsubluq, aidlik bildirən şək.) şəkilçilərindən düzəlib, "abdallara məxsus, abdallar yaşayan kənd" deməkdir.

**Abdallar** *oyk., sadə.* Laçın r-nun Qarıkaha i.ə.v.-də (keçmiş Abdallar) kənd. Həkəri çayının sahilində, Qarabağ silsiləsinin ətəyindədir. 1923-cü ilədək Laçın şəhərinin adı da Abdallar olmuşdur. Etnotoponimdir.

**Abdallı** *oyk., düz.* Oğuz r-nunun Xaçmaz i.ə.v.-də kənd. Qala çayının sahilində, dağ-





ətəyi ərazidədir. Mənbələrin məlumatına görə, XIX əsrdə Şəkinin Qoruqlar kəndindən köçüb gələnlər Oğuzda üç kiçik məntəqəni yaratmışdılar. Bunlar Şibili, Yemişanlı və Abdallı məntəqələri idi. *Abdallı* "abdal tayfasına məxsus yaşayış məntəqəsi" deməkdir. XIX əsrdə Gürcüstan ərazisində də eyniadlı iki kənd qeydə alınmışdır.

**Abdinli** (1961, 1968) / **Abdınlı** (1933, 1979) / **Abidinli** (1917) *oyk., sadə.* 1. Ağdam r-nunun Göytəpə i.ə.v.-də kənd. Düzənlikdədir. Kəndin ərazisi keçmişdə Tağıbəyli kəndinin abdınlı nəslinə məxsus qışlaq yeri olmuşdur; 2. Yardımlı r-nunun Şəfəqli i.ə.v.-də kənd. Viləş çayının sahilində, dağətəyi ərazidədir. Oykonim *abidinli* (digər adı qullardır) nəslinin adı ilə bağlıdır.

**Abdullauşağı** *oyk., sadə.* Kəlbəcər r-nunun eyniadlı i.ə.v.-də kənd. Mozçayın sol sahilində, dağ ətəyindədir. Keçmiş adı Şahsevənlidir. Yerli əhalinin məlumatına görə, XIX əsrin sonlarında Ağcabədi r-nunun Şahsevən kəndindən köçmüş Abdulla adlı şəxs ərazidə iki binə salmışdır. XX əsrin əvvəllərində də Cavanşir qəzasında Böyük və Kiçik Abdullauşağı adlı iki binə adı qeydə alınmışdır. R-nun Çobangərəkməz kəndi yaxınlığında bir yurd yeri indi də Abdulla yurdu adlanır. Etnotoponimdir.

**Abdullu** *oyk., sadə.* Cəlilabad r-nunun Astanlı i.ə.v.-də kənd. Burovar silsiləsinin ətəyindədir. Keçmiş adı Molla Abdulla olmuşdur. Yaşayış məntəqəsinin XIX əsrin ortalarında keçmiş Hasıllı kəndinə məxsus pay torpağı sahəsində salınmışdır. Oykonim Qızılbaş tayfalarından şamlıların bir qolu olan *abdullu* tirəsinin adı ilə bağlıdır. 1933-cü ildə həmin r-nun ərazisində Abdullu oykonimi ilə yanaşı iki Abdullalı kənd adı da qeydə alınmışdır.

**Abdulyan** *oyk., sadə.* Sabirabad r-nunun eyniadlı i.ə.v.-də kənd. Kür çayının sol sahilində, Şirvan düzündədir. Yaşayış məntəqəsini Kür çayındakı balıq vətəgələrində işləyən Cənubi Azərb.-dan köçmüş ailələr salmışlar. Son illərdə kəndin adı Abdullaabad adlandırılmış və Hacıqabul r-nun ərazisinə daxil edilmişdir. *Abdulyan* abdullar etnoniminin variantıdır. XIX əsrdə İrəvan xanlığında Abdullar, Abdulkənd, Abdulağalı oykonimləri qeydə alınmışdır. Orenburq vilayətindəki Abdulino şəhərinin adı da, çox güman ki, bu etnonimlə bağlıdır.

**Abışabad** *oyk., mür.* Cəlilabad r-nunun Şilvəngə i.ə.v.-də kənd. Burovar silsiləsinin ətəyindədir. Oykonim *Abış* (şəxs adı) və *abad* topokomponentlərindən ibarətdir. Bu şəxs adı ilə bağlı Masallı r-nunun Şıxlar kəndi ərazisində Abış toposi oronimi və Ağcabədi r-nunun Qaradolaq i.ə.v.-də Abışbəyli (1933) oykonimi məlumdur. Elmi ədəbiyyatların verdiyi məlumata görə, bu yaşayış məntəqəsi keçmişdə həmin ərazidə yaşayan aslar tayfasının üçüncü qolundan olan Abış bəyə mənsub ailələr tərəfindən XIX əsrdə salınmışdır.

**Abix** *or., sadə.* Bakı şəh.-dən 12 km şm.-da, Abşeron yarımadasında palçıq vulkanı. Uzun müddətdir püskürmür. Abşeron yarımadasında və Xəzərdə olan palçıq vulkanlarını öyrənmiş, Azərb.-nın geoloji quruluşuna və 1859-cu il Şamaxı zəlzələsinə aid əsərlər yazmış alman geoloqu, Peterburq EA-nın akademiki German Vilhelm Abixin (1806-1886) şərəfinə adlandırılmışdır. Memorial toponimdir.

**Abjit** *hidr., sadə.* Balakən r-nu ərazisində çay. Qanıx çayının qoludur. Bəzi tədqiqatçıların fikrincə, çayın adı İran mənşəli *ab* (su, çay) və *jıt* (qətran) sözlərindən ibarət olub "qətranlı çay" mənasındadır. Qədim türk yazılı abidələrində xristianların xeyirdua mərasimi "abijik/abişik" adlanır. Ehtimal ki, *abjit* sözü r-nun ərazisində tarixi məlum olmayan qədim məbəd və ibadətgahla bağlıdır.

**Abjit** *oyk., sadə.* Balakən r-nunun Qaysa i.ə.v.-də kənd. Qoyuntəpə dağının ətəyindədir. Yaşayış məntəqəsi İkinci dünya müharibəsindən sonra yaradılmışdır. Kəndin adı eyniadlı çayın adından alınmışdır.

**Abrıx** *oyk., sadə.* Qəbələ r-nunun Tikanlı i.ə.v.-də kənd. Alazan-Əyriçay çökəkliyindədir. Keçən əsrə aid materiallara əsasən, Abrıx Tikanlı kəndindən yaranmış yaşayış məntəqəsidir. IX əsr ərəb coğrafiyaşünaslarının yazdığına görə Beyləqanda (bu şəhərin xarabalıqları Mil düzündə indiyədək

Örənqala adı ilə qalmaqdadır) Abrık/Abrek adlı qala mövcud olmuşdur. Toponimikada belə bir fərziyyə var ki, həmin Abrık qalası bir vaxt müəyyən hadisə ilə əlaqədar olaraq (bəlkə də monqolların XIII əsr basqınları) dağıdıldıqdan sonra əhalisinin müəyyən hissəsi bu zonaya gəlmiş və bu adı da özləri ilə gətirmişlər. Mənbələr Bizansda da Abrık adlı şəhərin mövcudluğundan xəbər verir. Azərb. dilinin dialekt və şivələrində *avırıx/avruğ* "çay qırağında olan qamışlıq, çubuq" deməkdir. Türk dilində avrık "hörülmüş, sarınmış, bağlanmış" mənalarını ifadə edir. Deməli, *Abrıx/Abrik/Abriq qalası* "qamışdan hörülmüş qala" kimi izah oluna bilər.

**Abşeron** *or., sadə.* Azərb.-da, Xəzər dənizinin q. sahilində ən böyük yarımada. Böyük Qafqazın c.-ş. qurtaracağındadır. Bakı şəhəri və ətraf kəndləri Abşeron yarımadasına daxildir. Sözün etimologiyası ilə bağlı müxtəlif fikirlər mövcuddur. Bəziləri "Abşeron"un farsca *ab* (su) və *şoran* (duzlu) sözlərindən əmələ gəldiyini güman edirlər. Bir çox alimlərin fikrincə, "Abşeron" oğuz boylarından biri olan *avşar/əfşar* tayfa adı ilə bağlıdır. Mənbələrin məlumatına görə, Bakı yaxınlığında, İrandan Dərbəndə gedən karvan yolu üzərində Əfşaran adlı yaşayış məntəqəsi olmuşdur. Orta əsrlərdə Xəzər dənizinin q. sahilində, Pirallahı adasının qarşısında Əfşaran şəhərinin mövcudluğu haqqında məlumat verilir. Türk-səlcuq tayfa birliyinə daxil olmuş və Azərb. xalqının etnogenezində iştirak etmiş əfşarlar Səfəvilər dövlətinin siyasi həyatında mühüm rol oynamış, Nadir şah Əfşarın dövründə bir müddət İranda hakimiyyəti ələ ala bilmişdilər. Belə olan surətdə əfşarların adı Azərb. toponimiyasında öz əksini tapmaya bilməz. Odur ki, *Abşeron* toponiminin "əfşarlar yaşayan yer" kimi izah olunması məntiqə daha çox uyğundur.

**Abşeron** *oyk., sadə.* 1. Azəb.-nın ş.-ində inzibati r-n. Fatmayı, Masazır, Məhəmmədli, Hökməli kəndləri, Güzdək, Qobu, Saray, Digah, Ceyranbatan qəsəbələri r-nun ərazisinə daxildir; 2. Bakı şəhəri, Əzizbəyov r-nunda qəsəbə. Xəzərin sahilində, eyniadlı yarımadada salınmışdır (1960-cı illərdə) Türkiyə, İran, Ermənistan, Gürcüstan, Türkmənistan ərazilərində də avşar/əfşar etnonimi ilə bağlı çoxlu coğrafi adlara rast gəlmək mümkündür. Krasnodar vilayətindəki Apşeronsk şəhər və r-nunun adı isə Abşeron y.a.-nın adı ilə bağlıdır.

**Abşeron arxipelaqı** *or., mür.* Xəzər dənizində Abşeron yarımadasından ş.-də bir qrup adadır. Arxipelaqın tərkibinə Pirallahı, Çilov, Qu daşı, Böyük Tava, Kiçik Tava və b. adalar daxildir.

**Abşeron boğazı** *hidr., mür.* Pirallahı adası ilə Abşeron yarımadası arasında su sahəsi. Bu boğazda şose və elektrik d.y.-ları keçən bənd salınmışdır.

**Abşeron kanalı** *hidr., mür.* Abşeron yarımadasında q.-dən ş.-ə doğru uzanır. Kanala su Ceyranbatan su anbarından verilir.

**Acıbulaq** *hidr., mür.* Abşeron yarımadasında göl. Hidronim *acı* və *bulaq* sözlərindən düzəlib, göl suyunun dadına görə bu adı almışdır. Belə hidronimlərdən biri də Kürdəmir r-nu ərazisindəki Acı arxdır. Şamaxı və Qazax r-nları ərazisində və Şəki r-nunun Təpəcənnət kəndində də Acıbulaq adlı su obyektləri qeydə alınmışdır.

**Acıçay** *hidr., mür.* 1. Şamaxı r-nunda çay (Çigil çayı hövzəsi). Tudar kəndinin yaxınlığından axır. Tudar da adlanır; 2. Qax r-nunda çay. Kürmük (Qurmux) çayından ayrılaraq Qanıx (Alazan) çayına tökülən qoldur. Hidronim *acı* və *çay* sözlərindən düzəlib, obyekt suyunun acı və ya şor olduğunu bildirir. Türkmənistan ərazisində Açisay adlı çay və yaşayış məntəqəsi qeydə alınmışdır.

**Acıçeşmə** *or., mür.* Ordubad r-nu ərazisində dağ. Oronim *acı* (dad bildirən söz) və *çeşmə(n)* (far. bulaq) sözlərindən düzəlib, "acıbulaq" və ya "acıbulaqlar" deməkdir. Dağın adı ərazidəki duzlu bulaqlardan alınmışdır.

**Acıdağ** *or., mür.* Goranboy r-nu ərazisində dağ. Hün. 807 m. Oronim *acı* və *dağ* sözlərindən düzəlib. Mütəxəssislərin fikrincə, oronimin birinci komponenti dad bildirən sifətlə ifadə olunaraq coğrafi obyektin süxurlarının acı maddələrlə zəngin olduğunu bildirir. Başqa mülahizəyə görə, dağın adındakı *acı* sözü oradakı otların acı olmasını





əks etdirir. İlin üç fəslində bu otlar acı olduğu üçün heyvanlar onu yemir. Yalnız qışda bu otlar quruduqda yem üçün yararlı olduğundan maldarlar qış qoyun yataqlarını, binələri belə yerlərdə salırlar. Lakin onu da əlavə etmək lazımdır ki, *açı taş* ifadəsi qədim türk dillərində "zəy, zəyli" mənalarında işlənmişdir. Ərazidəki Zəylik, Zəylikçay coğrafi adları bu fikri təsdiqləyir. Mənbələrdə bu ərazidə Acıqala oronimi də qeydə alınmışdır.

**Acıdərə/Ajıdərə/Acdərə** *hidr., mür.* 1. İsmayıllı və Kürdəmir r-nlarından axan çay. Gırdıman çayının sol qoludur; 2. Şamaxı r-nunda çay (Gırdıman çayı hövzəsi). Pirsaat çayının sol qoludur. Sündü kəndi yaxınlığından başlayıb, Acıdərə kəndi yaxınlığında qurtarır. Yay quraq keçəndə suyu azalır və şorlaşır. Buna görə də Acıdərə adlanır. Bu çaylar adlarını ərazidəki eyniadlı çay dərələrindən almışlar.

**Acıdərə** *or., mür.* 1. Şamaxı r-nu ərazisində dağ. Hün. 931 m; 2. Şamaxı r-nunda eyniadlı çayın dərəsi. Şamaxı şəhəri kənarından başlayıb, Acıdərə kəndi yaxınlığında qurtarır; 3. Qazax r-nunun şm.-q.-ində yarğan. Yaylacıq dağlarından c. istiqamətdə ayrılan Dəmirdağ, İlanlıcadağ və Sacdağ yüksəklikləri ilə birləşir. Həmin yüksəkliklərin arasındakı dərə keçmişdə Böyük Acı adlanırdı. Oronim buradakı şor sulu bulaqlarla əlaqədardır; 4. Qax r-nu ərazisində dərə; 5. Tovuz r.-nu ərazisində dərə və s. Mütəxəssislərin statistik hesablamasına görə, respublika ərazisində 50-dən artıq Acıdərə oronimi qeydə alınmışdır. Oronim *acı* və *dərə* sözlərindən düzəlib, obyekt örtüyünü dad cəhətdən təyin edir. Məs., Qazax r-nundakı Acıdərə həmin dərədən axan Acısu çayının, Qax r-nundakı Acıdərə isə oradan axan Acıçayın suyunun dadının acı olmasına görə belə adlandırılmışdır. Cənubi Azərb.-da da Acıdərə oronimi qeydə alınmışdır.

**Acıdərə** *oyk., sadə.* Şamaxı r-nunun Göylər i.ə.v.-də kənd. Acıdərə çayının sahilində, Ləngəbiz silsiləsinin ətəyindədir. Kəndin ərazisi keçmişdə Şamaxı qəzasında yaşamış çıraqlı tayfasının qışlaq yeri olmuşdur. 1896-cı ildə çıraqlıların bir hissəsi Acıdərədə xidmət evi olan poçt (çaparxana) ətrafında məskunlaşmışlar. Yaşayış məntəqəsi yerləşdiyi ərazinin adı ilə adlanmışdır.

**Acıdərəsu** *hidr., mür.* Şamaxı r-nu ərazisində çay. Hidronim "Acıdərədən axan su, çay" deməkdir.

**Acıqançay** *hidr., mür.* Kürün sol qolu. Böyük Qafqazdan axır. Hidronim *acıqan* və *çay* sözlərindən düzəlib, "acıqlı, qəzəbli çay" deməkdir.

**Acılıqbinə** *oyk., mür.* Balakən r-nunun Qullar i.ə.v.-də kənd. Mazım çayının sahilindədir. Mütəxəssislərin fikrincə, *Acılıqbinə/Hacılıqbinə* "Hacıya məxsus binə" deməkdir. Əvvəllər bu ərazidə Qullar kəndi camaatının binələri yerləşirdi. XIX əsrin ortalarında Qullar kəndindən çıxmış ailələr Acılıq adlanan pay torpağında məskunlaşdılar. Bəzi tədqiqatçılar oykonimin birinci komponentini həmin ərazidə acı dad verən yovşan bitkisinin bolluğu ilə əlaqələndirirlər. Əslində *acılıq* sözü Azərb. dilinin bir sıra dialekt və şivələrində "sıx tikanlı bitkisi olan yer" mənasında işlənir. Odur ki, oykonim "sıx tikanlı bitkisi olan binə (kənd)" kimi izah olunmalıdır.

**Acınohur** *hidr., mür.* Şəki və Qax r-nları ərazisində şor göl. Acınohur çölünün mərkəzi hissəsindədir. Dəhnə çayı daşqın zamanı Acınohura tökülür. Axarı olmayan göldür. Hidronim *acı* (şor) və *nohur* (monq. "göl") sözlərindən düzəlib, "şor göl" deməkdir. Yerli əhali arasında Acıgöl də adlanır. Qərbi Sibirdəki Aşikul, Aşequl, Açikul hidronimləri bu hidronimin paralelləridir.

**Acınohur çölü** *or., mür.* Acınohur ön dağlığının Bozdağ və Gəmiqaya silsilələri arasında Qax və Şəki r-ları ərazisindədir. Turut çölünə qovuşur. Qış otlağı kimi istifadə olunur. Adını ərazidəki Acınohur gölündən almışdır.

**Acınohurdərəsi** *or., mür.* Qax r-nunun Zərnə kəndi ərazisində dərə. Dərəyə bu ad Acınohur gölünün yaxınlığında olduğu üçün verilmişdir.

**Acınohur ön dağlığı** *or., mür.* Böyük Qafqazın c.-unda, Alazan-Həftəran vadisi ilə Kür-Araz ovalığı arasındadır. Hün. 1100 m. Silsilə və tirələrdən (Daşüz, Gəmiqaya,

Bozdağ-Qaraca, Qaraməryəm və s ), onları ayıran çökəklik və dərələrdən (Sarıca, Acınohur, Turut, Ərəş, Qarayazı, Külüllü və s ) ibarətdir Adını Acınohur gölündən almışdır

**Acısu** *hidr*, *mür* 1 Qazax r-nunda çay Kürün sağ qoludur; 2 Şamaxı r-nu ərazisində çay Hidronim *acı* və *su* sözlərindən düzəlib Hidronim çay suyunun dadının acı və ya şor olduğunu bildirir V-XIII əsrlərə aid gürcü mənbələrində Acısu hidronimi qeydə alınmışdır Dağıstan toponimiyasında Açisu hidronimi və oykonimi, Cənubi Azərb -da Acısu hidronimi vardır

**Açarlı** *oyk*., *sadə* Ağdam r-nunun Novruzlu i ə v -də kənd Dağətəyi ərazidədir Toponimiyada *atsa/aça* coğrafi termin kimi "iti uclu qaya, yüksəklik, dağətəyi yer" mənalarını ifadə edir

**Adnalı** *oyk*., *düz* 1 Cəlilabad r-nunun Şiləvəngə i ə v -də kənd İnceçayın sahilindən bir qədər aralı, Burovar silsiləsinin şm -ş ətəyindədir, 2. Şamaxı r-nunun Çarhan i ə v -də kənd. 1933-cü ildə bu kənd Kələxana i ə v -nin tərkibində qeydə alınmışdır. Kələxana fars "ilxı saxlanılan yer" deməkdir Adna qədim türk dillərində *adana/adına/aduna* formasında olub "axtalanmış dəvə, at ilxısı, at saxlanılan yer" mənalarında işlənmişdir Şamaxı r-nu yaxınlığında, Ağsu r-nuna aid İlxıçı kəndinin olması bir daha əsas verir ki, Adnalı oykonimi "ilxısı olan, at saxlanılan yer" kimi izah olunsun Türkiyədəki Adana adlı şəhərin adı da, çox güman ki, qədim türklərin bu məşğuliyyəti ilə bağlıdır

**Adur** *oyk*, *sadə* Quba r-nunun Rük i ə v -də kənd Qaraçayın sahilində, Yan silsiləsinin yamacındadır Türk dillərində *adir/adır/adur* "təpəlik", "dağlıq yer", "düzən olmayan yer", "suvarıla bilməyən yüksəklik", "bir neçə təpədən ibarət meşəsiz yer", "dağ ətəyi" mənalarında işlənir Dağlıq yerdə, alçaq təpəli ərazidə yerləşən kəndin coğrafi relyefi adın verilməsində əsas olmuşdur Fərqanə vadisini əhatə edən təpəli dağətəyi sahələr *adır* adlanır Altay toponimiyasında Adur, Türkiyə toponimiyasında Ədirnə oykonimləri bu sözlə əlaqədardır

**Adurçay** *hidr*, *mür* Quba r-nu ərazisində kiçik çay Qaraçayın sol qoludur Çay öz adını yaxınlığındakı eyniadlı kəndin adından almışdır Hidronim *adur* (sərt relyefli yer) və *çay* (axar su obyekti) sözlərindən düzəlib, "sərt relyefli yerdən axan çay" deməkdir Pireney dağlarından başlayaraq Fransanın c -q.-indən axan və Biskay körfəzinə tökülən bir çayın adı da Adurdur

**Afan** *oyk*, *sadə* Saatlı r-nunda kənd Mil düzündədir R-nun Novruzlu kəndindən çıxmış yeddi ailə tərəfindən Afan adlanan yerdə salınmış bu kənd əvvəllər Təzə Novruzlu, Yeddievlər, Gəlmələr də adlanırdı Azərb dilinin dialektlərində *afan* "zəif, gücsüz" mənasında işlənir Toponim "gücsüz yer" mənasını ifadə edir

**Afurca** *oyk*., *sadə* Quba r-nunun Gülezi i.ə v -də kənd Cimı çayının sahilində, Baş Qafqaz silsiləsinin yamacındadır Adını ərazidəki eyniadlı şəlalədən almışdır Bu şəlalə Azərb -da dağ çaylarına məxsus daimi fəaliyyətdə olan şəlalələrdən biridir və Velvelə çayının Təngə dağından axan hissəsidir Kənd də həmin şəlalənin yaxınlığında yerləşir Afurca sözünü tədqiqatçılar belə izah edirlər İran mənşəli abforuce (yerli tələffüz forması ofirecə) sözünün qismən təhrif olunmuş formasıdır Toponim *a* (ab) "su", *fur/for* "aşağı" və *ca* (castən) "sıçramaq" sözlərindən düzəlib, "su aşağı sıçrayan (tökülən) yer, şəlalə" deməkdir

**Ağababa/Ağbaba** *or*, *sadə* Kəlbəcər r-nunun ş hissəsində, Qarabağ silsiləsində dağ Hün 2367 m Türkcə *akbaba* "qartal" deməkdir Oronim "qartal dağı, qartallı dağ" mənasını ifadə edir Dağda Ağbaba piri var Qərbi Azərb -nın Amasiya r-nunda böyük bir ərazi də Ağbaba adlanır

**Ağabağı** *oyk*., *mür* Zərdab r-nunun Şıxbağı i ə v -də kənd Kür çayının sahilində, Şirvan düzündədir Oykonim *Ağa* (şəxs adı) və *bağ* sözlərindən düzəlib (-ı mənsub şək.-si), "Ağaya məxsus bağ" deməkdir Mənbələrin verdiyi məlumata görə, 1855-ci ildə Kür sahilində 740 desyatinlik tut bağı (çəkillik) ayrı-ayrı şəxslər arasında bölüşdürülmüşdü Ağa adlı bir nəfərə verilmiş hissə əhali arasında Ağabağı adlandırılmışdır Son-





ralar Zərdabın kəndlərindən buraya köçmüş ailələr həmin ərazidə məskunlaşmış, yeni yaşayış məntəqəsi həmin adı saxlamışdır

**Ağabəyələnc/Ağabəyəlenc** (1979) / **Ağabəyəlinc** (1933) *oyk*, *mür* Ağdərə r-nunun Möhrətağ i ə.v -də kənd Oykonim *ağabəy* (ağabəyli etn -nin qısaldılmış forması), -*ə* (bitişdirici sait) və *linc/lənc* (tat dilində "ətək, yer, yüksəklik") sözlərindən düzəlib, "ağabəylilərə məxsus yüksəklik" deməkdir Kəndin adı XIX əsrdə Ağabəyyal kimi qeydə alınmışdır Toponimin ikinci komponentinin lənc sözü ilə əvəz olunması XIX əsrin əvvəllərində İrandan gəlmə erməni ailələrinin həmin ərazidə məskunlaşması ilə əlaqədardır 1992-ci ildən kənd Ağabəyyal adı ilə rəsmiləşdirilmişdir

**Ağabəylər** *hidr*, *sadə* İmişli və Biləsuvar r-nları ərazisində çay Etnohidronimdir Ağabəylilər nəsli 1903-cü ilədək Cavad və Göyçay qəzalarında yaşamış ərəbəbdülkərimli tayfasının qollarından biridir. Bu nəsil Hacıbəy oğlu Ağabəyin adını daşıyır

**Ağabəyli** *oyk*., *sadə* 1 Ağcabədi r-nunun Hacıbədəlli i ə v -də kənd Qarqar çayının sahilindədir; 2 Ağsu r-nunun Çaparlı i ə v -də kənd Ağsu çayının sahilində, Şirvan düzündədir Tam adı Hacı Ağabəylidir Oykonim *ağabəyli* nəslinin adını əks etdirir Bu etnonimlə bağlı Şamaxı r-nunda Ağabəyli (1933), Ağdam və Ağsu r-nlarında Ağalarbəyli (1917-1961), Ağsu r-nunun Bozavand kəndində Ağabəy qobusu, Qax r-nunun Zərnə kəndində Ağabəylilər obası və s qeydə alınmışdır Ağabəylilər kəbirlilərin ağabəyalı qoluna məxsus bir nəslin adıdır

**Ağabulağı** *or*, *sadə* Tovuz r-nu ərazisində dərə Oronim dərədəki eyniadlı bulağın adından yaranmışdır "Ağaya (mülkədara) məxsus bulaq olan dərə" deməkdir

**Ağacanlı** *oyk*, *düz* Sabirabad r-nunun Qaragüney i ə v -də kənd Kür çayının sahilində, Şirvan düzündədir Etnotoponimdir Oykonim XIX əsrin ortalarında Şirvandan köçmüş muğanlı tayfasının xıləmirzələr tirəsinə aid *ağacanlı* nəslinin adını daşıyır

**Ağacbulaqdərəsi** *hidr*, *mür* Yardımlı r-nu ərazisində dərə və həmin dərədən axan çay Hidronim *Ağacbulaq* (bulağın adı) və *dərəsi* komponentlərindən düzəlib Adından məlum olduğu kimi, çay meşədə yeraltı suların üzə çıxaraq axması nəticəsində yaranmışdır Çay Ağacbulaq adlı bulağın yerləşdiyi dərə ilə axdığı üçün belə adlandırılmışdır

**Ağacəri** *or*, *sadə* Tovuz r-nu ərazisində dağ Hün 1769 m Etnooronimdir Eyniadlı dağ Cənubi Azərb ərazisində də qeydə alınmışdır

**Ağacqala** *oyk*., *mür* Tovuz r-nunun Sarıtala i ə v -də kənd Dağlıq ərazidədir Oykonim *ağac* (taxta) və *qala* (qurğu, tikinti) sözlərindən düzəlib, "taxtadan tikilmiş, qurulmuş qala" deməkdir Başqa məlumata görə, əsl adı Ağcaqaladır Kənd adını sıldırım qayada olan Ağcaqalanın (XIX əsrdən adıçəkilən Kırən qalasının xarabalığıdır) adından almışdır Toponim *ağca* (qalanın divarları kirəc və gil məhlulla hörüldüyündən ağımtıl görünür) və *qala* sözlərinin birləşməsindən əmələ gəlib, "ağımtıl divarlı qala" mənasındadır Qeyd etmək lazımdır ki, Azərb dilində kərən "meşə məmulatı, şalban, tir" deməkdir Bu baxımdan Ağacqala toponimi doğru variant hesab olunmalıdır

**Ağaçay** *hidr*, *mür* Qubadlı r-nu ərazisində çay Bazarçayın qoludur Yerli məlumata görə, çay vaxtilə oradakı yaylaq yurdundan istifadə edən Ağa adlı pirani bir seyidin adını daşıyır Hidronim *ağa* (böyük, enli, güclü) və *çay* (hidrokomp ) sözlərindən düzəlib, "böyük çay, güclü çay" deməkdir

**Ağakişibəyli** *oyk*. *sadə* Masallı r-nunun Şərəfə i ə v -də kənd. Lənkəran ovalığındadır Etnotoponimdir Kənd XIX əsrdə təklə tayfasından olan Ağakişi bəyə mənsub ailələrin məskunlaşması nəticəsində yaranmışdır

**Ağakişilər** *oyk*, *sadə* Zəngilan r-nunun İsgəndərbəyli i ə v -də kənd Dağlıq ərazidədir Etnotoponimdir Kəndi vaxtilə Ermənistanın Qafan r-nunun Kırs kəndindən qovulmuş ağakişilər nəsli salmışdır Kəndin ərazisi keçmişdə həmin nəslin qışlaq yeri olmuşdur 1933-cü ildə Bərdə r-nu ərazisində də eyniadlı kənd qeydə alınmışdır

**Ağalaruşağı** *oyk., sadə* Laçın r-nunun Qorçu i ə v -də kənd. Dağlıq ərazidədir Etnotoponimdir

**Ağalçay** *hidr mür* Tovuz r-nu ərazisində çay Türk dillərində *ağal* komponenti çay adlarında "sahilindən çıxan, daşan, həddini aşan" mənalarını ifadə edir Hidronim "daşan, sahilindən çıxan çay" mənasındadır

**Ağalı** *oyk., düz* Ağdaş r-nunun Aşağı Zeynəddin i ə v -də kənd Düzənlikdədir Yerli əhalinin dediyinə görə, oykonim *ağa* və *-lı* komponentlərindən ibarət olub, "ağası, sahibi olan, mülkədara məxsus" deməkdir 1917-ci ildə Xanlar r-nunda Ağalıbəyli, Kəlbəcər r-nunda Ağalıyeri, 1961-ci ildə Zəngilan r-nunda Birinci Ağalı, İkinci Ağalı, Üçüncü Ağalı adlı üç kənd qeydə alınmışdır Etnotoponimdir

**Ağalıkənd** *oyk., mür* Biləsuvar r-nunun eyniadlı i ə v -də kənd Muğan düzündədir Oykonim *ağalı* (etn ) və *kənd* sözlərindən düzəlib, etnotoponimdir 1917-ci ildə Ağamkənd adı ilə qeydə alınmış bu yaşayış məntəqəsi 1941-ci ilədək Sarpabad adlanmışdır 1870-ci ilə aid bir sənəddə yaşayış məntəqəsinin keçmiş dilağarda tayfasının canşalı (cahanşahlı) tirəsinin ağalı nəsli tərəfindən salındığı haqqında məlumat verilir

**Ağamalı** *oyk., sadə* Gədəbəy r-nunun Nərimankənd i ə v -də kənd. Mıssuyu çayının (Zəyəm çayının sağ qolu) sahilində, Qızılca dağının ətəyindədir Kəndi 1929-cu ildə Tovuz r-nunun Çanaqçı kəndindən gəlmiş namazlar, səfirzalar nəsillərinə mənsub ailələr salmışlar Yaşayış məntəqəsi sovet dövlət xadimi Səmədağa Ağamalıoğlunun (1867-1930) şərəfinə adlandırılıb

**Ağamalılar** *oyk., sadə* İmişli r-nunun Muradxanlı i ə v -də kənd Mil düzündədir Etnotoponimdir 1933-cü ildə Ağamallar kimi qeydə alınmışdır Yaşayış məntəqəsi XIX əsrin ortalarına qədər maldarlıqla məşğul olmuş təklə tayfasının *ağamalılar* tirəsinə mənsub ailələr tərəfindən salınmışdır

**Ağamalıoğlu** *oyk., sadə* Goranboy r-nunun eyniadlı i ə v -də kənd Gəncə-Qazax düzənliyindədir Antropotoponimdir Sovet dövlət xadimi, publisist Səmədağa Həsən oğlu Ağamalıoğlunun şərəfinə adlandırılmışdır 1925-ci ilədək kəndin adı Abdullabəykürdü olmuşdur İnqilabdan əvvəl Düzqışlaq adlanan bu ərazidə Bağçakürd kəndindən olan abdullabəykürdü nəsli məskunlaşmışdı Memorial toponimdir

**Ağaməmmədli** *oyk., sadə* 1 İmişli r-nunun Cəfərli i ə v -də kənd Mil düzündədir Mənbələrdə Ağammədli variantında da təsadüf olunur Keçmişdə Alıpənahlı adlanan bu kənd qışlaq yeri olmuşdur; 2 Cəlilabad r-nunun Xanəgah i ə v -də kənd. Burovar silsiləsinin yamacında, İncəçayın sahilindədir Etnotoponimdir 1979-cu ildə Azərb -da üç (İmişli, Cəlilabad, Tovuz), 1961-ci ildə isə dörd (Əli Bayramlı, İmişli, Astraxanbazar, Tovuz) Ağaməmmədli adlı kənd qeydə alınmışdır

**Ağanus** *hidr., mür* Laçın r-nu ərazisində mineral bulaq Hidronim *ağan/aqan* (iti axan) və *us* (su) sözlərindən düzəlib, "iti axan su" deməkdir

**Ağanus** *oyk., sadə* Laçın r-nunun Fətəlinəyə i ə v.-də kənd Adını ərazidəki eyniadlı mineral bulaqdan almışdır. Bəzi tədqiqatçılara görə, toponim *ağ* və *naus* (ərəbcə "məbəd" deməkdir. Sasanilər dövründə zərdüştiliyə sitayiş edənlərin qəbirüstü tikilisi də "naus" adlanırdı) sözlərindən düzəlib, "ağ rəngli məbəd" mənasını ifadə edir

**Ağarəhimoba** *oyk., sadə* Xaçmaz r-nunun Qımılqışlaq i ə v -də kənd Məzarçayın sahilindədir Etnotoponimdir 1917-ci ildə Ağarəhim şəklində qeydə alınmışdır XIX əsrin ortalarında Quba r-nunun Cek kəndindən köçmüş ailələrin həmin kəndə aid qışlaq yerində məskunlaşması nəticəsində yaranmışdır 1933-cü ildə Sabirabad r-nunda da Ağarəhimli yaşayış məntəqəsinin olduğu göstərilir

**Ağarx** *oyk., sadə* Ağsu r-nunda kənd Şirvan düzündədir Yaşayış məntəqəsi eyniadlı arxın yaxınlığında salındığı üçün belə adlandırılmışdır Hidronim isə *ağ* (şəffaf) və *arx* (süni suvarma kanalı) sözlərindən düzəlib

**Ağasovqat** *or., mür* İsmayıllı r-nu ərazisində dağ. Pırsaat çayının yuxarı axarındadır Oronim *ağa* (burada ilahi, tanrı) və *sovqat* (hədiyyə, bəxşiş) sözlərindən düzəlib, "allahın bəxşişi, hədiyyəsi" deməkdir Oronimi Ağasovqat şəxs adı ilə də əlaqələndirirlər





**Ağaşirinoba** *oyk., mür* Xaçmaz r-nunun Qusarçay i.ə v -də kənd Qusar çayının sahilində, Samur-Dəvəçi ovalığındadır. XIX əsrin ortalarında Qrız kəndinə məxsus qışlaq yerində salınmışdır Oykonim *Ağaşirin* (şəxs adı) və *oba* (el, birlik, nəsil) sözlərindən düzəlib, "Ağaşirinə məxsus el, nəsil" deməkdir

**Ağaverdioba** *oyk., mür.* Xaçmaz r-nunun Qusarçay i.ə v -də kənd Samur-Dəvəçi ovalığındadır Kənd XIX əsrin II yarısında Qrız kəndinin sakini Ağaverdi adlı şəxsin oba yerində salınmışdır Oykonim "Ağaverdiyə məxsus oba, el" deməkdir.

**Ağayrı** *oyk., mür* Biləsuvar r-nunun Mircəlal (keçmiş Kırovka) i ə v -də kənd Muğan düzündədir Kənd XX əsrin əvvəllərində Ağalıkənd əhalisinin bir hissəsinin Ağayrı adlanan sahəyə köçərək burada məskunlaşması nəticəsində yaranmışdır Toponimiyada belə bir fikir mövcuddur ki, bu söz qədim türk dillərindəki *ak* (axın, çay) və *ayrı* sözlərindən ibarət olub, "axının əyildiyi, burulduğu yer" mənasını verir Bu da Ağayrı kəndinin məhz Bolqarçayın əyildiyi, burulduğu yerdə yerləşməsi ilə izah olunur Türk dillərində *ağayrı* sözü "ağıldan (tövlədən) kənar"; "kiçik çay", "ot, çiçək" adı kimi də izah olunur

**Ağazaman** *or., sadə* Şamaxı r-nunun ş.-ində, Quşçu kəndi yaxınlığında dağ Ləngəbiz silsiləsindədir Dağda eyniadlı pir vardır Dağın adı da pirin adından götürülmüşdür Hün 831 m Oronim Ağazaman şəxs adındandır

**Ağbaldır** *or., mür* Tovuz r-nu ərazisində dağ Oronim *ağ* (kiçik, balaca) və *baldır* (qədim türkcə "dağ çıxıntısı") sözlərindən düzəlib, "kiçik çıxıntı" deməkdir Həmin r-nun ərazisində Qarabaldır adlı dağ da vardır

**Ağbalıq** *hidr., sadə* Salyan r-nu ərazisində çay Aquşa çayının qoludur *Ağbalıq* çay balığı növüdür Çayda yaşayan balıq növünün adı çayın adına köçürülmüşdür

**Ağbaş** *oyk., sadə* Dəvəçi r-nunun Ağbaş i ə v -də kənd. Samur-Abşeron kanalının kənarında, Samur-Dəvəçi ovalığındadır Yaşayış məntəqəsi XX əsrin ortalarında Çırax, Hacıiskəndərli və Təkyə kənd sakinlərinə məxsus Ağbaş adlanan qışlaq yerində bəzi ailələrin məskunlaşması nəticəsində yaranmışdır Oğuzların *ağbaş* tayfasının adındandır Etnotoponimdir XIX əsrin əvvəllərində keçmiş İrəvan xanlığında Aqbaş adlı kənd qeydə alınmışdır 1900-cü ildə İran ərazisində Ağbaşlı keçidi adlı yerin olması haqqında məlumat verilir

**Ağbaşlar** *oyk., sadə* Tovuz r-nunun Qəribli i ə v -də kənd Zəyəm çayının sahilindədir Etnotoponimdir

**Ağbaşyurd** *or., mür* Zəngilan r-nu ərazisində dağ Oronim *ağbaş* (tayfa adı) və *yurd* sözündən düzəlib, "ağbaş tayfasının məskəni" deməkdir Etnotoponimdir

**Ağbatxayır** *hidr., mür.* Laçın r-nu ərazisində mineral bulaq Ağbatxeyir (Minkənd çayının qolu) çayının dərəsindədir Suyu az kükürdlüdür; xalq arasında mədə ağrısının müalicəsində istifadə edilir Yerli əhalinin məlumatına görə, təhrifə uğramış bu hidronimin əsli Aqihəti xeyırdir Bulağın belə adlandırılması suyunun müalicəvi faydası ilə izah olunur Hidronim *ağ* (rəng), *bat/bad/bed* (kənd, məskən, hündür yer) və *xayır/kayır* (su şırnağı, fəvvarə) sözlərindən düzəlib, "Ağkənd bulağı" deməkdir Tarixi mənbələrdə verilən məlumata görə, orta əsrlərdə Dağlıq Qarabağda Aqbat/Aqbed adlı yaşayış məntəqəsi olmuşdur XIX əsrin 20-ci illərində həmin kəndə ermənilər doluşmuş və onun adını çevirərək Spitakşen, yəni Ağkənd qoymuşlar

**Ağbənd** *or., mür* Zəngilan r-nu ərazisində dağ Ağbənd qəsəbəsinin c -ş -indədir Süxurları ağ rəngdə olan dağ Araz çayının dərəsinə doğru bəndi xatırladan formada uzandığı üçün belə adlandırılmışdır

**Ağbənd** *oyk., sadə* Zəngilan r-nunun Bartaz i ə v.-də qəsəbə Araz çayının sahilində, Ağbənd dağının ətəyindədir Yaşayış məntəqəsi adını ətəyində salındığı dağın adından almışdır 1958-ci ildə meydana gəlmiş bu qəsəbəni Bartaz, Vejnəli, Dolləklı, Əmirxanlı, Baharlı, Çöpədərə və Sürtük kəndlərindən gəlmiş ailələr salmışdır Qazaxıstanın

Səlinoqrad vilayətində Akbent qəsəbəsi qeydə alınmışdır

**Ağbil** *oyk* *mür* Quba r-nunun Vladimirovka i ə v.-də kənd Qusar maili düzənliyindədir XVI əsrə aid Ağbil türbələri bu kəndin ərazisindədir Yerli əhali bu türbələri Dörd Ağbil adlandırır Hazırda üçü qalmaqda olan həmin türbələr şeyxlər üçün tikilmişdir XIX əsrdə Zeyid kəndindən köçüb gələnlər tərəfindən məskunlaşmış Ağbil kəndi bir müddət Ağbil Zeyid adlandırılmışdır Oykonim *ağ* (kiçik) və *bil* (qəd bulqar dilində "türbə, məzar daşı") komponentlərindən düzəlib, "kiçik türbə, məzar daşı" deməkdir Xorasan ərazisində qeydə alınmış Akməzar toponimi ilə sinonimdir

**Ağbiz** *or*, *mür* Zəngılan r-nu ərazisində dağ Oronim *ağ* (burada dağ süxurlarının rəngini bildirir) və *biz/bis/pis* (dik, yüksəklik, şiş, çıxıntı, yuva, oyuq) komponentlərindən düzəlib, "ağ dağ" mənasını bildirir

**Ağbiz** *oyk*, *sadə* Zəngılan r-nunun İsgəndərbəyli i ə.v.-də kənd. Ağbiz dağının yamacındadır Kənd əvvəllər Sofulu tayfasına məxsus olan eyniadlı qışlaq yerində salınmışdır Ərazı öz adını Ağbız dağının adından almışdır. VII əsrə aid mənbələrdə Albaniya ərazisində Aqbid adlı yaşayış məskəni yad olunur 1933-cü ildə Zəngılan r-nu ərazisində iki Ağbis kənd adı qeydə alınmışdır

**Ağbulaq** *hidr*, *mür* 1 Ağdam r-nunda min. bulaq; 2 Oğuz r-nunda min bulaq, 3 Şərur r-nunda min bulaq, 4 Abşeron r-nunda min bulaq, 5 Ağsu r-nunda min bulaq; 6 İsmayıllı r-nunda min bulaq, 7 Quba r-nunda min bulaq, 8 Qusar r-nunda min bulaq, 9 Qobustan r-nunda Ceyrankeçməz çayı dərəsində soyuq sulu kükürdlü bulaq Mərəzə qəsəbəsi yaxınlığındadır Hidronim *ağ* (içməyə yararlı su) və *bulaq* (hidrokomp ) sözlərindən düzəlib, "içməyə yararlı suyu olan bulaq" mənasındadır, 10 Quba r-nu ərazisində çay, 11 Oğuz r-nu ərazisində çay. Çayların adı eyniadlı bulaqdan götürülmüşdür.

**Ağbulaq** *or*, *sadə* 1 Baş Qafqaz silsiləsinin suayrıcında dağ Azərb -ın Qax r-nu ilə Dağıstanın sərhədindədir Hün 3072 m Ağbulaq (Xuray, hun 2800 m ) aşırımı buradadır Adını eyniadlı bulaqdan almışdır; 2 Baş Qafqaz silsiləsinin c yamacında, Qəbələ r-nu ərazisində dağ. Vəndam çayının sol sahilindədir Hün. 2468 m Adını eyniadlı bulaqdan almışdır, 3 Xocavənd r-nu ərazisində dağ Adını eyniadlı bulaqdan almışdır; 4 Şamaxı r-nu ərazısındə dağ. Adını eyniadlı bulaqdan almışdır

**Ağbulaq** *oyk*, *sadə*. 1 Cəlilabad r-nunun Ağdaş i ə v -də kənd Burovar silsiləsinin yamacındadır; 2 Əsgəran r-nunun eyniadlı i ə v -də kənd Dağlıq ərazidədir Hidrooykonimdir; 3 Xocalı r-nunun eyniadlı i ə v -də kənd Dağətəyi ərazidədir Keçmiş adı Talıbxanbəyli olmuşdur Yaşayış məntəqəsi XIX əsrdə Talıbxan bəy adlı birisinə məxsus maldar ailələrin Ağbulaq adlı yerdə məskunlaşması nəticəsində yaranmışdır; 4 Xocavənd r-nunun Edilli i ə v -də kənd Qarabağ silsiləsinin ətəyindədir XIX əsrdə Cənubi Azərb -nın Qaradağ əyalətindən köçüb gəlmiş ailələrin burada məskunlaşmasından yaranmışdır Sovet hakimiyyəti illərində 1992-ci ilədək Mısmına adlandırılmışdır, 5 İsmayıllı r-nunun Qoşakənd i.ə.v -də kənd Baş Qafqaz silsiləsinin ətəyindədir Kəndin ərazisi keçmişdə ərəbşahverdi tayfasının qışlaq yeri olmuşdur Yaşayış məntəqəsi XIX əsrin sonlarında həmin tayfaya mənsub ailələr tərəfindən məskunlaşmışdır, 6. Laçın r-nunun Qarıkaha i ə v -də kənd Qarabağ silsiləsinin ətəyindədir; 7 Laçın r-nunun Mustafabəyli i ə v -də kənd Hocazsu çayının sağ qolunun sahilindədir. Kəndin ərazisi keçmişdə Zəngəzur qəzasında yaşamış ağkörpü adlı tayfanın qışlaq yerlərindən olmuşdur; 8 Tovuz r-nunun Kirən i ə.v -də kənd Əsrik və Zəyəm çaylarının suayrıcında, orta dağlıq qurşaqdadır Yaşayış məntəqələri ərazideki bulaqların adı ilə adlandırılmışdır Əfqanıstanda Aqbulaq adlı 2 kənd, Qazaxıstanda Akbulak, Ermənistanda Ağbulax, Türkiyədə Ağbulaq, Orenburq vilayətində Akbulak, Qırğızıstanda Ak-Bulak və s adlı obyektlərin mövcudluğu bu toponimin ümumtürk onomastikasında geniş yayıldığını göstərir İran toponimiyasındakı Ağkəhriz (Mərkəzi İran), Ağçeşmə (Xorasan) oykonimləri də Ağbulaq oykoniminin sinonimləridir





**Ağburun** *or*, *mür* 1 Xocavənd r-nu ərazisində, Ağcaqoşun çayının sol sahilində dağ. Hün. 196 m , 2 Qaradağ r-nu ərazisində, Lökbatan qəsəbəsindən q -də dağ Hün 130 m Oronim *ağ* (rəng, kiçik) və *burun* (qurunun, dağın və ya qayanın sivri bucaq şəklində uzanmış hissəsi) komponentlərindən düzəlib, obyektin sivri bucaq şəklində uzanmış hissəsinin ağ süxurlardan ibarət olmasını və ya ölçüsünün kiçikliyini bildirir. Gürcüstanın Marneuli r-nu ərazisində də Aqburun dağı qeydə alınmışdır.

**Ağcabədi** *oyk*, *mür*. 1 Azərb -da inzibati r-n 1930-cu ildə təşkil edilmiş, 1963-cü ildə ləğv edilib Ağdam r-nuna verilmiş, 1965-ci ildə yenidən müstəqil r-n olmuşdur Kür-Araz ovalığının Mil və Qarabağ düzlərindədir Qarqar çayı və Yuxarı Qarabağ kanalı r-nun ərazisindən keçir Mərkəzi Ağcabədi şəhəridir; 2 Azərb -da şəhər. Eyniadlı r-nun mərkəzi. Qarqar çayının hər ıkı sahilində, Mil və Qarabağ düzlərindədir. Yaşayış məntəqəsinin adı mənbələrdə ilk dəfə 1593-cü ildən çəkilir Ağcabədi bir müddət mənbələrdə Ağcabədi Xəlfərəddin adı ilə qeyd olunmuşdur. Şəhərin mərkəzindəki çökəkliyin bir hissəsi keçmişdə Xəlfərəddin adlanırdı XIX əsrın əvvəllərində ərazıdəki xəlfərəddinlilər 88 ailədən ibarət bir icma olmuşdur Toponim bəzi mənbələrdə *ağca* (burada "ağımtıl", "bozumtul", "boz") və *badi* (ərəbcə badiyə sözünün təhrif forması olub, "düzənlik", "düzən" deməkdir) sözlərindən ibarət olub, "bozumtul yer", "ağca düz" kimi açıqlanır 1933-cü ildə Cəlilabad r-nu ərazisində Ağcabəd adlı kənd qeydə alınmışdır. Əslində *ağca* (bozumtul, əkilməmiş) və *badi* (türk dillərində bət/bet/bəd "dağ yamacı" mənasını ifadə edir) sözlərindən düzəlib, "əkilməmiş dağ yamacı" deməkdir Ərazinin coğrafi mövqeyi bunu bir daha sübut edir.

**Ağcabulaq** *hidr*, *mür* Şamaxı r-nu ərazisində mineral bulaq Hidronim *ağca* (içməyə yararlı) və *bulaq* (yeraltı suyun süxur çatlarından yer səthinə çıxması nəticəsində yaranan su obyekti) sözlərindən düzəlib, "içməyə yararlı su" deməkdir

**Ağcakənd** *oyk*, *mür* 1 Xocavənd r-nunun Köhnə Tağlar i ə v -də kənd Qarabağ silsiləsinin ətəyindədir, 2 Kəlbəcər r-nunun eyniadlı i ə.v -də kənd Qarasu çayının sol sahilində Qonqur silsiləsinin ətəyindədir Digər adı Kamyanlıdır Kamyanlı burada məskunlaşmış nəslin adıdır XIX əsrın əvvəllərində Laçın r-nunun Ağcakənd kəndindən çıxmış bir qrup ailənin burada məskunlaşması nəticəsində kəndin adı da dəyişdirilmişdir; 3 Laçın r-nunun Qoşasu i.ə v -də kənd Hocazsu çayının sahilində, Qarabağ yaylasındadır Kənd pırembel tayfasının məskunlaşması nəticəsində yaranmışdır Oykonim *ağca* (ağımtıl) və *kənd* (yaşayış məntəqəsi termini) sözlərindən düzəlib, "ağımtıl, bozumtul, quru sahəsi olan kənd" deməkdir 1960-cı ilə qədər Ermənistan ərazisində Ağcakənd, 1933-cü ildə Qarabağ ərazisində Aşağı Ağcakənd kəndləri qeydə alınmışdır Goranboy r-nu ərazisində olan bu kənd 1938-ci ildə Şaumyanselsk (Şaumyankənd) adlandırılmışdı 1992-ci ildən kəndin keçmiş adı yenidən bərpa edilmişdir.

**Ağcakənd** *hidr*, *sadə* Kəlbəcər r-nu ərazisində çay Tutqunçayın qoludur. Quzey və Güney çaylarının birləşməsindən əmələ gəlmişdir Eyniadlı kəndin ərazısindən axdığı üçün belə adlanır. Bəzi mənbələrdə Qarasu çayı kimi də qeyd olunur

**Ağcaqoşun** *or*, *mür* Ağcabədi r-nu ərazisində dağ Oronim *ağca* (çox da yüksək olmayan, alçaq) və *qoşun* (bır cərgəyə düzülmüş; silsilə) sözlərindən düzəlib, "alçaq dağ sırası" deməkdir

**Ağcaqoşun** *hidr* *sadə* Ağcabədi və Xocavənd r-nları ərazisində çay Xonaşen çayının sol qoludur Müvəqqəti axarlıdır Suvarmada istifadə edilir Adını ərazideki eyniadlı dağdan almışdır

**Ağcaqovaq** *oyk*, *sadə* Ağdaş r-nunun Eymur i ə v -də kənd Kür çayının sahilində düzənlikdədir Oykonim "ağcaqovaq ağacı bitən yer" deməkdir Kəndin ərazisində həqiqətən də çoxlu ağcaqovaq ağacı var

**Ağcalarsu** *hidr* *mür* Daşkəsən r-nu ərazisində çay Hidronım *ağcalar* (etn ) və *su* (çay) sözlərindən düzəlib, "ağcalar nəslinə mənsub çay" deməkdir Etnotoponimdir

**Ağcayazı** *or*, *mür* 1 Laçın r-nu ərazisində düz Yerli əhali tərəfindən Ağcaəzi kimi

tələffüz olunur Toponim türk mənşəli *ağca* (ağımtıl, bozumtul) və *yazı* (çöl, düz, düzənlik) sözlərindən düzəlib, "ağımtıl, bozumtul düz" deməkdir; 2 Laçın r-nu ərazisində dağ. Dağ öz adını eyniadlı düzənliyin adından almışdır

**Ağcayazı** *oyk sadə* Laçın r-nunun Vəqazin i ə v -də kənd Oykonim *ağca* (ağımtıl, quru, şumlanmamış bozumtul torpaq) və *yazı* (çöl, düz, düzənlik, səhra) sözlərindən düzəlib, "ağımtıl, bozumtul düzən, çöl" deməkdir Ağdaş r-nu ərazisində Aşağı və Yuxarı Ağcayazı adlı iki kənd var

**Ağcüyür** *oyk , mür* İmişli r-nunun Beciravan i ə v.-də kənd 1933-cü ildə kəndin adı əslində olduğu kimi, Ağcığır şəklində qeydə alınmışdır Oykonim *ağ* (quru torpaq) və *cığır* (yol) sözlərindən düzəlib, "quru torpaq yolu olan kənd" deməkdir

**Ağçala** *hidr , mür* Muğan düzünün c -ş -ində bataqlıq göl 1896-cı ildə Araz çayı daşıb Muğan düzünü basarkən Ağçala, Mahmudçala və Cavadçala gölləri yaranmışdı Hazırda Mahmudçala gölü bataqlığa çevrilmiş və öz növbəsində iki hissədən – Mahmudçala və Ağçala göllərindən ibarət olmuşdur Beləliklə, ərazidə iki Ağçala gölü meydana gəlmişdir Əvvəllər göl Araz çayı daşan zaman dolurdu İndi isə gölə su Muğanın suvarma kanallarından və Bolqarçayın artıq sularından toplanır Hidronim *ağ* və *çala* (çökək yer, çuxur yer; dərə, quyu, əkilməmiş yer; yağış və çay sularının doldurulduğu çökək) sözlərindən düzəlmişdir Tədqiqatçıların bir qismi bu hidronimin suyun keyfiyyəti ilə bağlı olduğunu söyləyir Bəzi tədqiqatçılar isə çalanın yay fəslində suyunun qurumasından duzların üzə çıxması və ağ rəngdə olması ilə əlaqələndirirlər Mənbələrdə təkcə Salyan və Biləsuvar r-nları ərazisində 4 Ağçala adlı gölün olduğu göstərilir

**Ağçay** *hidr , mür* 1 Quba və Xaçmaz r-nlarında çay Yan silsilənin Yarımyaylaq dağından (1780 m yüksəklikdən) başlanır Xəzər dənizinə tökülür Əsas qolu Qarıçaydır Suvarmada istifadə edilir, 2 Quba r-nu ərazisində çay Qudyal çayının sağ qoludur, 3 Qax r-nu ərazisində çay Qurmux çayının sağ qoludur Qurmux çayına nisbətən suyunun duru olduğu üçün belə adlandırılması ehtimal olunur; 4 Kəlbəcər r-nu ərazisində çay Lev çayının (Tərtər hövzəsi) qoludur. Laçın, Qubadlı, Oğuz, Tovuz r-nları ərazisində də eyniadlı çaylar qeydə alınmışdır Hidronim *ağ* (kiçik, içməyə yararlı, axan; cənub) və *çay* (axar su) sözlərindən düzəlib Dağıstan, Çeçenistan, Rostov vilayəti (Don çayının sağ qolu) ərazisində Aksay adlı çaylar da qeydə alınmışdır Maraqlı burasıdır ki, Ağçay adlı çayların böyük əksəriyyəti ayrıldıqları çayların sağ qolunu təşkil edir

**Ağçay** *oyk., sadə* 1 Xaçmaz r-nunun Niyazoba i.ə v -də kənd Ağçayın kənarındadır XIX əsrdə gəlmə rusların məskunlaşdığı bu kənd Vasilyevka (1992-ci ilədək) adlandırılmışdı, 2. Qax r-nunun İlisu i ə v -də kənd Ağçayın sahilində, Baş Qafqaz silsiləsinin c ətəklərindədir Yaşayış məntəqəsi 1953-cü ildə yeni yaradılmış üzümçülük sovxozunun fəhlələri üçün salınmışdır Kəndlər öz adlarını ərazidəki eyniadlı çaydan almışlar. Ural və Rostov vilayətlərində də eyniadlı (Aksay) yaşayış məntəqələri qeydə alınmışdır

**Ağdaban** *or , mür* Şərur, Kəlbəcər və Ağdərə r-nları ərazisində dağ Oronim *ağ* (ağımtıl-bozumtul rəng, kiçik, alçaq, çox da hündür olmayan) və *daban* (aşırım, təpə, dağ yüksəkliyi, dağ və ya qaya ayağının aşağı hissəsi; dağın dibinə yaxın yer) sözlərindən düzəlib, "kiçik aşırım" deməkdir

**Ağdaban** *hidr , sadə* Kəlbəcər r-nunda çay Tərtər çayının sol qoludur Adını eyniadlı dağdan almışdır Obyektin başlanğıcını, mənbəyini, yerləşdiyi ərazini göstərir

**Ağdaban** *oyk , sadə* Kəlbəcər r-nunun eyniadlı i ə v -də kənd Ağdaban çayının sağ sahilində, Murovdağ silsiləsinin c ətəyində, Ağdaban dağının yamacındadır Adını eyniadlı dağdan almışdır XIX əsrin sonunadək kəndin ərazisi Dəmirçidam kəndinin binəsi olmuşdur 1905-ci ildə həmin kəndin dəlikli, məmmədli, məhərrəmli, feyzalılar adlı nəsillərindən bir qrup ailələr bu binəyə köçərək burada məskunlaşmışlar

**Ağdağ** *or , mür* 1 Qazax r-nunun Köçəsgər kəndindən c -da dağ Hün 770 m , 2 Ordubad r-nu ərazisində dağ, 3 Tovuz r-nunda, Tovuz şəhərindən c.-q -də dağ Hün 937 m , 4 Şəmkir şəhərinin q.-ində dağ Hün. 359 m., 5 Şəki yaylasından c.-da, Axar-baxar silsiləsinin q. hissəsində zirvə. Hün 282 m Oronim *ağ* (kiçik, alçaq) və *dağ* (yer səthinin müsbət relyef forması) sözlərindən düzəlib, "kiçik, alçaq dağ" deməkdir Dağların ağ rəngə çalan süxurlardan ibarət olduğu üçün bu adı alması fikri də istisna deyil Hələ XIII əsrə aid coğrafi adlar lüğətlərində Ağdağ oronimine rast gəlmək mümkündür Ağdağ digər türkdilli xalqların oronimiyasında da geniş yayılmışdır Aktuu (Dağlıq Altay), Aktau (Tatarıstan, Qazaxıstan), Ağdağ (İran, Türkiyə) və s

**Ağdam** *or , mür* 1 Ağdam r-nu ərazisində dağ, 2. Abşeron r-nu ərazisində, Qobustanda palçıq vulkanı; 3 Tovuz r-nunun Ermənistanla sərhədində dağ Hün 966 m Oronim *ağ* (rəng, kiçik, alçaq) və *dam/tam* (yer qatı, divar, qala, yüksəlmiş tikilinin üst örtüyü, başı, zirvəsi) sözlərindən düzəlib, "kiçik qala, kiçik yüksəklik, kiçik zirvə" deməkdir Adlandırmada dağ süxurlarının rənginin ağımtıl olmasının nəzərə alınması da istisna deyil.

**Ağdam** *oyk , sadə.* 1. Azərb.-da inzibati r-n 1930-cu ildə təşkil edilmişdir. Kür-Araz ovalığının q hissəsində və Kiçik Qafqazın ş ətəklərində yerləşir Xaçın və Tərtər çayları r-nun ərazisindən axır Burada tikinti daşları istehsal edilir Mərkəzi Ağdam şəhəridir; 2. Azərb -da şəhər (1828-ci ildən) Eyniadlı r-nun mərkəzidir Qarqar çayının sol sahilində, Qarabağ düzünün c -q -indədir Şəhərin əsası XVIII əsrin ikinci yarısında qoyulmuşdur Burada Pənah xanın ağ daşdan tikdirdiyi "İmarət" mühafizə edilib Şəhərin adının bu bina ilə əlaqədar olması ehtimal edilir Lakin əslində, şəhərin adı yaşayış məntəqəsi kimi ilk dəfə 1357-ci ilə aid mənbələrdə çəkilir Ağdam yaxınlığındakı Şahbulaq adlanan yerdə əhəngdaşından ibarət qədim daş karxanası vardır Qalanın divarları həmin daşdan hörülmüşdür Bütün bunlara baxmayaraq, şəhərin adı r-nun ərazisindəki eyniadlı dağdan götürülmüşdür; 3 Tovuz r-nunun Vahidli i ə.v -də kənd. Kiçik Qafqazın ətəyindədir Kəndin adı r-nun ərazisindəki eyniadlı dağdan götürülmüşdür 1917-ci ildə bu kəndin adı Ağdam Ocaqlı şəklində qeydə alınmışdır; 4 Xocavənd r-nunun Tuğ i ə v -də kənd Qarabağ silsiləsinin ətəyindədir XIX əsrdə buraya gələn ermənilər kəndin adını Akaku toponimi ilə əvəz etmişdilər 1992-ci ildə kəndin əvvəlki adı özünə qaytarılmışdır

**Ağdam** *hidr , sadə* Abşeron yarımadasında göl Gölün adı yarımadanın ərazisindəki eyniadlı dağdan götürülmüşdür

**Ağdamkənd** *oyk , mür* Ağdam r-nunun eyniadlı i ə v -də kənd Qarabağ düzündədir Ağdamkənd su anbarı kəndin yaxınlığındadır Oykonim *Ağdam* (r-nun ərazisindəki dağın adı) *kənd* (yaşayış məntəqəsi) sözlərindən düzəlib, kəndin ərazisindəki dağın adını əks etdirir

**Ağdam Qalal/Ağdam Kələl** *oyk , mür* Zaqatala r-nunun Gözparaq i ə v -də kənd Dağlıq ərazidədir Oykonim *Ağdam* (oyk.) və *Qalal* (oyk.) sözlərindən ibarətdir Kəndin adının Ağdam Qalal variantını səhv hesab edən bəzi tədqiqatçıların fikrincə, vaxtilə kəndin ərazisində, Dağıstana gedən yolun kənarındakı dağ keçidində daşdan bir bina (dam) tikilmiş və ağ kirəclə suvanıb ağardılmışdır Xarici görünüşünə görə Ağdam adlanan bu binadan karvansara, düşərgə məqsədilə istifadə olunurdu XIX əsrdə Dağıstanın Baş Kələl kəndindən bir qrup ailə köçərək burada məskunlaşmış, yeni yaşayış məntəqəsini Baş Kələldən fərqləndirmək üçün Ağdam Kələl, yəni "Ağdamın yanında salınmış Kələl kəndi" adlandırmışlar Lakin əslində, kəndin əhalisi XIX əsrdə buraya köçmüş Ağdam r-nundakı baraxlılardan və Dağıstanın Baş Kələl kəndindən gələn saxurlardan ibarətdir *Kələl/Qalaal*-saxur dilində "qalalı" deməkdir Beləliklə, kəndin adı iki gəlmə icmanın əvvəlki məskəninin adından düzəlmişdir

**Ağdaş** *or , mür* 1 Füzuli r-nu ərazisində dağ R-nun şm -q -ində yerləşir Hün 222 m., 2 Gədəbəy r-nu ərazisində dağ; 3 Kəlbəcər r-nu ərazisində dağ, 4 Qazax r-nu ərazisində dağ Oronim *ağ* (kiçik, alçaq, ağ rəng çaları) və *daş* (qaya, dağ) sözlərindən düzəlib,

"kiçik qaya və ya ağ rəngli süxurlardan əmələ gəlmiş dağ" deməkdir. Oronimin etnotoponim olması da istisna deyil Ağdaş toponiminə XIII əsrə aid coğrafi adlar lüğətində rast gəlmək mümkündür

**Ağdaş** *oyk., sadə* 1 Azərb -da inzibati r-n 1930-cu ildə təşkil edilmişdir Şirvan düzünün şm -q -ində, Acınohur ön dağlığının c -undadır Türyan çayı r-nun ərazisindən axır Mərkəzi Ağdaş şəhəridir; 2 Azərb -da şəhər (1900-cü ildən) Eyniadlı r-nun mərkəzidir Türyan çayının sağ sahilindən bir qədər aralı, Şirvan düzünün şm -q -indədir Yaşayış məntəqəsi kimi adı XV əsrin ortalarından çəkilir; 3 Cəlilabad r-nunun eyniadlı i ə v -də kənd. Göytəpə çayının sol sahilində, Lənkəran ovalığındadır Keçmişdə Üçüncü Dərviş adlanırdı Bu da onunla bağlıdır ki, kənd XIX əsrin ortalarında ərazidə maldarlıqla məşğul olan dərvişbəyli tayfasının üçüncü qoluna mənsub ailələr tərəfindən məskunlaşmışdır Oykonim kəndin ərazisindəki Ağdaş adlı qayanın adından götürülmüşdür; 4 Kəlbəcər r-nunun Çaykənd i ə v -də kənd. Dağlıq ərazidədir Kənd Ağdaş dağının döşündə salınmışdır Etnotoponimdir Əfşarların araşlı oymağının bir qolunun ağdaş adlanması və Ağdaş r-nunun XX əsrin əvvəllərinə qədər Ərəş qəzası kimi qeydə alınması bunu bir daha sübut edir Ağdaş toponimi türk xalqlarının onomastikasında geniş yayılmışdır Aktaş (Özbəkistanda dağ), Akdaş (Türkmənistan), Aktas (Qazaxıstan), Ağdaş (Başqırdıstan, Ermənistan), Aqtaş (Əfqanıstan), Akdaş (İran, Türkiyə) və s

**Ağdaşsu** *hidr , mür* Gədəbəy r-nu ərazisində çay Şəmkir çayının sol qoludur Başlanğıcını Ağdaş adlı dağdan alır Hidronim *Ağdaş* (r-nun ərazisindəki dağın adı) və *su* (çay) sözlərindən düzəlib, "Ağdaş dağından axan çay" deməkdir

**Ağdərə** *or mür* 1 Ağsu r-nunun Bico kəndi ərazisində dərə; 2 Şamaxı r-nu ərazisində dərə, 3 Tərtər r-nu ərazisində dağ; 4 Zəngilan r-nunun İsgəndərbəyli, Sadallı və Şərifli kəndləri ərazisində dərə Oronim *ağ* (kiçik, qısa, dayaz, çox da dərin olmayan) və *dərə* (çay yatağı, çayın axdığı yer; iki dağ və ya təpə arasında, eləcə də düzənlikdə uzun, dərin çuxur) sözlərindən düzəlib, "kiçik çay yatağı, çox da dərin olmayan çuxur" deməkdir

**Ağdərə** *oyk., sadə* 1 Xızı r-nunda kənd Çigil çayının sahilindədir Kəndin əhalisi vaxtilə Abşeronun Novxanı kəndindən köçüb gələn ailələrdən ibarətdir , 2 Ordubad r-nunun Parağaçay qəsəbə i ə v -də qəsəbə Zəngəzur silsiləsinin c -q. yamacındadır Qəsəbə 1950-ci ildə Ağdərə adlı ərazidə filizsaflaşdırma kombinatının yaradılması ilə əlaqədar salınmışdır Ətraf yamaclar ağ rəngə çalan süxurlardan ibarətdir Adını ərazidəki eyniadlı dərədən almışdır; 3 Şamaxı r-nunun Xılmilli i ə v -də kənd. Qozluçayın sahilində, dağətəyi ərazidədir Adını ərazidəki eyniadlı dərədən admışdır; 4 Tərtər r-nunda ştq Tərtər-İstisu avtomobil yolunun kənarındadır Keçmişdə eyniadlı r-nun mərkəzi olmuşdur XIX əsrdə burada məskunlaşdırılmış ermənilər r -nun və qəsəbənin adını 1923-cü ildən Crabert, 1930-cu ildən isə Mardarkert kimi rəsmiləşdirmişdilər 1992-ci ildən r-nun ərazisi Tərtər r-nuna birləşdirilmiş, qəsəbə isə keçmiş adı ilə adlandırılmışdır, 5 Tovuz r-nunun Qaraxanbəyli i ə v -də kənd Şahdağ silsiləsinin şm yamacındadır Adını ərazidəki eyniadlı dərədən almışdır 1933-cü ildə Laçın, 1917-ci ildə Daşkəsən r-ları ərazisində Ağdərə kəndləri qeydə alınmışdır. Əfqanıstan, Ermənistan, İran ərazisində də Ağdərə toponiminə rast gəlmək mümkündür.

**Ağdərə** *hidr , sadə* Gırdımançay hövzəsində çay Adını ərazidəki eyniadlı dərədən almışdır

**Ağdəyirman** *or , mür* Ağcabədi r-nunun Boyat kəndində təpə Oronim *ağ* (kiçik və ya rəng çaları) və *dəyirman* (qurğu) sözlərindən düzəlib. "üzərində kiçik dəyirman (yel dəyirmanı və ya su dəyirmanı) quraşdırılmış təpə" deməkdir.

**Ağdəyirmançay** *hidr , mür.* Ağcabədi r-nu ərazisində çay Kiçik Həkəri (Əkərə) çayının yuxarı axarının adıdır Hidronim *Ağdəyirman* (or ) və *çay* (axar su obyekti) sözlərindən düzəlib, "Ağdəyirman təpəsindən axan çay" deməkdir

**Ağduyux** *or , mür* Zəngilan r-nu ərazisində dağ Oronim *ağ* (kiçik, alçaq) və *duyux/durux* (təpə, dağ zirvəsi) sözlərindən düzəlib, "kiçik təpə" mənasındadır





**Ağəhməd** *oyk , sadə* Şərur r-nunun Dəmirçi i ə v -də kənd Araz çayının sahilində, düzənlikdədir Kəndin adının Ağaəhməd adından təhrif olunması güman edilir Oykonim Ağaəhməd şəxs adı ilə bağlıdır.

**Ağgədik** *or , mür* 1 Böyük Qafqazda (Yan silsilədə), Quba r-nunun Buduq kəndinin q -ində dağ Hün 2861 m ; 2 Masallı r-nunun Miyanku kəndi ərazisində dağ, 3 Şəki-Zaqatala zonasında dağ Oronim *ağ* (rəng) və *gədik* (türk dillərində, o cümlədən Azərb.dilində "hündür dağlar arasında yol", "dağ keçidi", "aşırım", "dağ belində batıq") sözlərindən düzəlib, "qarlı aşırım" və ya "ağımtıl rəngli dağ keçidi" deməkdir

**Ağgədik** *oyk., sadə* Xocalı r-nunun Xanabad i ə v.-də kənd Dağətəyi ərazidədir. Keçmiş adı Ağdər, 1992-ci ilədək Kətük ("gədik" sözünün təhrif forması) olmuşdur Oykonim ərazidəki eyniadlı dağ keçidinin adından yaranmışdır

**Ağgöl** *hidr , mür* 1. Ağcabədi r-nu ərazisində, Mil düzündə şor göl. Suyunu Ağcabədi və Beyləqan r -nlarındakı kollektorlardan alır Yasaqlıqdır; 2 Ağcabədi r-nu ərazisində, Mil düzündə axarı olmayan şirin sulu göl Qarqar çayı bu gölə tökülür, 3 Ağdaş r-nu ərazisində göl, 4 Kəlbəcər r-nu ərazisində göl, 5 Laçın r-nu ərazisində göl Hidronim *ağ* (təmiz, şəffaf, içməyə yararlı) və *göl* (su obyekti) sözlərindən düzəlib, "şəffaf sulu göl" və ya "içməyə yararlı suyu olan göl" deməkdir. Şor sulu göllərdə isə sahillərinin ağ şoran sahə olması nəzərə alınır Qarabağ və Mil düzlərində bu adla bir neçə başqa göllər də vardır. Cənubi Azərb -da, Ermənistanda (Ağgöl), Qərbi Sibirdə (Akkul), Qazaxıstanda (Akkol), Tatarıstanda (Akul/Akqol/Beloozerka) və başqa türkdilli regionlarda da külli miqdarda Ağgöl hidronimləri qeydə alınmışdır

**Ağgöl düzü** *or , mür* Ağcabədi r-nu ərazisində düz Mil düzünün şm -ş -ində, Qarqar çayının aşağı axarı boyundadır Adını ərazidəki eyniadlı göldən almışdır

**Ağgöz** *hidr mür* Qax r-nu ərazisində çay Hidronim *ağ* (yaxşı, içməyə yararlı) və *göz* (bulaq, bulağın çıxdığı yer, mənbə) sözlərindən düzəlib, "mənbəyi bulaq olan çay" deməkdir

**Ağıl dərəsi** *or , mür* Füzuli r-nunun Kərimbəyli kəndi ərazisində dərə Oronim *ağıl* (qoyun-quzu yatağı) və *dərə* (çuxur) sözlərindən düzəlib, "qoyun-quzu yatağı olan dərə" deməkdir

**Ağırca** *hidr , düz* Abşeronda çay (Xəzər hövzəsi) Sitalçay da adlanır Hidronim *ağır* (ləng, yavaş) sözündən və *-ca* şək -şindən ibarət olub, axının vəziyyətini, sürətinin ləngliyini bildirir

**Ağızdağ/Aızdağ** *or mür* Hacıqabul (Əli Bayramlı) r-nu ərazisində dağ Hün 272 m Oronim *ağız* (girəcək, qapı, sərhəd keçidi) və *dağ* (müsbət relyef forması) sözlərindən düzəlib, "keçid dağ və ya dağ keçidi" deməkdir

**Ağız güneyi** *or , mür* 1 Gədəbəy r-nunun Zamanlı kəndi ərazisində yüksəklik; 2 Qubadlı r-nu ərazisində yüksəklik Oronim *ağız* (keçid, qapı), *güney* (yüksəkliyin cənuba, günəşə baxan hissəsi) sözlərindən və *-i* mənsub şək -şindən düzəlib Birinci obyekt güneydə ağızdan keçildiyi üçün, ikinci obyekt isə dərədən düzənliyə çıxıldığı üçün belə adlandırılmışdır

**Ağıztala** *or , mür* Gədəbəy r-nu ərazisində düzənlik Oronim *ağız* və *tala* (düzənlikdə açıq yer, çöl) sözlərindən düzəlib, talanın girəcəyi olduğu üçün belə adlandırılmışdır

**Ağkeşçay** *hidr , mür* İsmayıllı r-nu ərazisində çay Girdiman çayının qollarından biridir Hidronim *ağ* (kiçik), *keş* (çay yatağı) və *çay* (axar su, su obyekti) sözlərindən düzəlib, "yatağı çox da dərin olmayan çay" deməkdir

**Ağkənd** *oyk , mür* 1 Zəngilan r-nunun Canbar i ə v -də kənd Dağətəyi ərazidədir Kənd XIX əsrdə saralı tayfasının aldavudlu, qəzənfərli, ismayıllı, hacıaxundlu nəsillərinə məxsus binə yerində salınmışdır Oykonim *ağ* (burada varlı, dövlətli, yaşayış səviyyəsi yüksək olan) və *kənd* (əhalisi əksəriyyətlə kənd təsərrüfatında çalışan yaşayış məntəqəsi) sözlərindən düzəlib, "varlı kənd" deməkdir; 2 Tərtər r-nunun Dəmirçilər

i.ə.v.-də kənd. İncəçayın sahilindədir. Keçən əsrin 20-ci illərində bir qədər yerini dəyişdiyindən Təzəkənd də adlanır. 3. Xocavənd r-nunun Ağkənd i.ə.v.-də kənd. 1828-ci ildə İranın Xoy əyalətindən gəlmə ermənilər burada məskunlaşdıqdan sonra kəndin adı erməni dilinə kalka edilərək Spitakşen (Ağkənd) adlandırılmış, 1992-ci ildən kəndin əvvəlki adı özünə qaytarılmışdır. 1917-ci ildə Gəncə və Şuşa qəzalarında da Ağkənd kəndləri qeydə alınmışdır. Keçən əsrdə Ermənistan ərazisində Ağkənd adlı 6 kənd olmuşdur.

**Ağkəsən** *or., mür.* Qax r-nu ərazisində dağ. Keçmişdə bu dağda ağ daş karxanası olmuşdur. Oronim "ağ daş kəsilən, ağ daş çıxarılan dağ" mənasındadır.

**Ağkəsən** *hidr., sadə.* Şəki-Zaqatala r-nları ərazisindən axan çay. Adını ərazidəki eyniadlı dağdan almışdır.

**Ağkilsə** *oyk., mür.* Balakən r-nunun Şambul i.ə.v.-də kənd. Oykonim *ağ* (rəng) və *kilsə* (ibadət üçün tikilmiş bina) sözlərindən düzəlib, "ağ rəngli kilsə" deməkdir. Kəndin ərazisində ağ kilsə olduğundan belə adlanmışdır. Gədəbəy r-nunun Novoivanovka kəndinin adı 1844-cü ilə qədər Ağkilsə olmuşdur. Keçən əsrdə Ermənistan ərazisində bir neçə Ağkilsə kəndi qeydə alınmışdır.

**Ağkilsə** *or., sadə.* Gədəbəy r-nu ərazisində dağ. Adını yerləşdiyi kəndin adından almışdır.

**Ağkörpü** *hidr., sadə.* Astara r-nunun Pəlikəş kəndindən ş.-də, Təngərud çayının hövzəsində mədən bulağı. Suyu soyuq və kükürdlüdür. İstifadə edilmir. Etnotoponimdir.

**Ağköynək** *oyk., sadə.* Qazax r-nunun eyniadlı i.ə.v.-də kənd. Düzənlikdədir. Etnotoponimdir.

**Ağqaya** *or., mür.* 1. Babək r-nu ərazisində dağ; 2. Daşkəsən r-nu ərazisində dağ; 3. Göyçay r-nunun ş.-ində, Qarayazı kəndindən şm.-da dağ. Hün. 450 m.; 4. Quba r-nu ərazisində dağ; 5. Naxçıvan r-nunun Payız kəndindən şm.-da dağ. Hün. 1754 m.; 6. Oğuz r-nu ərazisində dağ; 7. Şəki r-nunun Baş Layski kəndi ərazisində dağ; 8. Şəmkir çayının hövzəsində Şahdağ silsiləsinin ş. yamacında dağ. Hün. 2980 m.; 9. Tovuz r-nu ərazisində qaya. Oronim *ağ* (rəng, kiçik, alçaq, çox da hündür olmayan) və *qaya* (sıra dağlardan ayrılmış qol, dağların müəyyən hissəsində daş süxurlardan ibarət olan, çətin keçilən yer) sözlərindən düzəlib. Gədəbəy, Kəlbəcər, Laçın, Şuşa, Cəbrayıl r-nlarında Ağqaya, Dağlıq Altayda Akkaya, Ermənistanda Ağqaya, Ağqayadağ, Krımda Ak Kaya, İranda Axqaya və s. dağlar da qeydə alınmışdır.



**Ağqaya** *hidr., sadə.* Axınca hövzəsində çay. Gədəbəy, Tovuz və Şəmkir r-nlarının ərazisindən axır. Adını Şahdağ silsiləsinin şm. yamacındakı Ağqaya dağının adından almışdır. Çay öz mənbəyini də bu dağın yaxınlığından alır.

**Ağqaya** *oyk., sadə.* Kəlbəcər r-nunun Almalıq i.ə.v.-də kənd. 1933-cü ildə Ağqaya binəsi kimi qeydə alınmışdır. Kənd XIX əsrdə Zəngəzur qəzasının Şelvə dərəsindəki kəndlərdən öz yaylaq yerlərinə gələrək məskunlaşmış rəhimli və kərimli nəsilləri tərəfindən salınmışdır. Sonralar yaxınlıqdakı Pələnkəli kəndi dağıdıldıqdan sonra onun əhalisinin çox hissəsi də Ağqaya kəndinə köçmüşdür. Adını r-nun ərazisindəki Ağqaya adlı yüksəklikdən almışdır. Hazırda bu yüksəklik Şişqaya adlanır.

**Ağqayabaşı** *or., mür.* Kəlbəcər r-nu ərazisində dağ. Oronim *Ağqaya* (dağ adı), *baş* (dağın zirvəsi) sözlərindən və -ı mənsub. şək.-sindən düzəlib, "zirvəsində ağ qaya olan dağ" və ya "Ağqaya dağının zirvəsi" deməkdir.

**Ağqılınc** *or., mür.* Şamaxı r-nu ərazisində dağ. Oronim *ağ* (kiçik) və *qılınc* (klinc/kılınc/qiliç/qilinc – türk dillərində, o cümlədən Azərb. dilində "dağ yalı", "dağ üstü") sözlərindən düzəlib, "kiçik dağ yalı" deməkdir. Abşeron r-nu ərazisində Qaraqılınc dağı da qeydə alınmışdır.

**Ağqıraqlı/Ağqıraq** *oyk., mür.* Yevlax r-nunun Varvara i.ə.v.-də kənd. Qarabağ düzündədir. Yerli əhalinin verdiyi məlumata görə, kəndi XIX əsrdə Qazax mahalından köçüb gəlmiş ağqıraqlı nəsli salmışdır. Bu nəslin nümayəndələri indi də Qazax r-nunun Yuxarı Salahlı kəndində yaşayırlar. Etnotoponimdir.





**Ağqışlaq** *oyk., mür.* Lənk r-nunun Şingədulan i.ə.v.-də kənd. Burovar silsiləsinin c. yamacında, Şərətük çayı sahilindədir. Oykonim *ağ* (kiçik; cənub) və *qışlaq* (qış yatağı, qış mənzili) sözlərindən düzəlib, "kiçik qış yatağı" və ya "cənubdakı qış yatağı" deməkdir.

**Ağqobu** *or., mür.* İmişli r-nu ərazisində dərə. Oronim *ağ* (kiçik, dayaz) və *qobu* (quru dərə) sözlərindən düzəlib, "kiçik quru dərə" deməkdir.

**Ağlar** *hidr., sadə.* Bakı şəhərinin Suraxanı r-nu ərazisində göl. Türk dillərində *ağlar* – "bir qabdan başqasına tökülən" deməkdir. Ağlar gölü "axarı olan göl" mənasını ifadə edir. İkinci adı Qaraçuxurdur.

**Ağlıq** *oyk., düz.* Oykonim *ağ* (rəng) sözündən və *-lıq* şəkilçisindən düzəlib, "torpağı ağımtıl, ağ rəngə çalan yer" deməkdir. Azərb.-da arpa və buğda əkilən sahələrə də "ağlıq" deyilir. 1933-cü ildə Oğuz r-nunun Padar i.ə.v.-də Ağlıq adlı kənd qeydə alınmışdır. Son illərin məlumatına görə, kənd xarabalığa çevrilmişdir.

**Ağmollaçal** *or., mür.* Qazax r-nunun şm.-q.-ində, Əli Bayramlı kəndindən c.-da dağ. Hün. 553 m. Türk dillərində *Akmola* – "ağ məzar" mənasını ifadə edir. Oronim "Ağ məzar daşı olan yüksəklik" deməkdir. Yerli əhalinin dediyinə görə, guya Allaha asi olan bir molla dağın başına çıxaraq orada öldüyü üçün dağ belə adlanmışdır. Qazaxıstan və Türkmənistan ərazisində Akmola adlı yaşayış məntəqəsi var.

**Ağnaqtəpə** *or., mür.* Şahbuz r-nu ərazisində dağ və təpə. Yerli əhalinin dediyinə görə, təpədə olan torpaq sürüşməsi bu adın yaranmasına səbəb olmuşdur. Azərbaycan dilinin dialektlərində "ağnaq" sözü "ovulub tökülən", "gilli, çirkli gölməçə" mənalarında da işlənir. Oronim "ovulub tökülən, dağılan təpə" mənasındadır. XIX əsrə aid mənbələrdə İrəvan xanlığının Dərəkənd Parçenis mahalında Quru Ağnac adlı kənd haqqında məlumat verilir.

**Ağnohur** *hidr., mür.* Sumqayıt şəhər i.ə.v.-nin Qızılqazma kəndi yaxınlığında şirin sulu, axarsız göl. Gölə su süni yolla Ataçayın sağ qolundan suvarma kanalı vasitəsilə axıdılır. Hidronim *ağ* (içməyə yararlı) və *nohur* (monq. "göl" deməkdir) sözlərindən düzəlib, "içməyə yararlı, şirin sulu göl" mənasındadır. Dəvəçi r-nunda, Gilgilçay hövzəsində, Ataçay hövzəsində, Abşeron yarımadasında da eyniadlı göllər vardır.



**Ağoğlan** *or., mür.* Laçın r-nu ərazisində dağ. Türk dillərində *oğlanak* – "kiçik oğlan, kiçik şahzadə" deməkdir. Müqəddəs dağ sayılır.

**Ağoğlan** *hidr., sadə.* Həkəri (Əkərə) çayının sağ qolu olub Laçın r-nundan axır. Yuxarı axarında Minkənd və ya Əhmədli, aşağı axarında isə Zabux adlanır. Adını ərazidəki eyniadlı dağdan almışdır.

**Ağoğlan** *oyk., sadə.* Laçın r-nunun Malıbəy i.ə.v.-də kənd. Ağoğlan çayının sahilində, Qarabağ yaylasındadır. Keçmiş adı Kosalar olmuşdur. Sonralar yaşayış məntəqəsi ərazidəki Ağoğlan pirinin adı ilə adlandırılmışdır. Yerli əhalinin rəvayətinə görə, Ağoğlan qədimdə buraya basqın etmiş yadellilərə qarşı döyüşdə öldürülmüş və alban kilsəsi ərazisində dəfn edilmiş igidin adıdır və "pak, təmiz, müqəddəs oğlan" mənasını daşıyır. Xocavənd r-nunun ərazisinə daxil olan keçmiş Hadrut r-nunun 1923-cü ilədək adı Ağoğlan olmuşdur.

**Ağoyuq** *or., mür.* 1. Zəngilan r-nunun c.-ş.-ində dağ. Hün. 548 m. Oronim ağ (kiçik) və oyuq (çökək, kaha, mağara, zağa) sözlərindən düzəlib, "kiçik kaha, mağara olan dağ" deməkdir; 2. Zəngilan r-nu ərazisində düz. Oxçu və Həkəri çayları arasındadır. Yerli əhali arasında Yazı adlanır. Düzənlikdə torpağa sancılmış təqr. 1,5 m hündürlükdə yanaşı iki daş var. Bu daşlar *oyuq* və ya *Koroğlu daşları* adlanır. Daşların üzərində qədim yazılar var. Əhali həmin daşları pir hesab edir. Keçmişdə əkin sahələri arasında sərhədi bildirmək üçün düzəldilmiş hər hansı süni torpaq qalağı, yerə basdırılmış dik daş və ya ağac da *oyuq* adlanırdı. Düz öz adını ərazidəki eyniadlı dağdan da ala bilər.

**Ağoyzi/Ağözü** *oyk., sadə.* 1933-cü ildə Biləsuvar r-nunun indiki Nəsimi (keçmiş Novotroitski) i.ə.v.-də qeydə alınmışdır. Oykonim *ağ* və *özü* (vadi, dərə) sözlərindən

düzəlib, "kiçik vadi, ağdərə" deməkdir Kəndin adını ərazidəki eyniadlı vadidən götürməsi ehtimal olunur

**Ağrı** *oyk., sadə* Ordubad r-nunun Vənənd i ə v -də kənd Vənənd çayının sahilində, Arazboyu düzənlikdədir Türk dillərində *ağrı/ağru* – "hündür, yüksək" deməkdir Adını Türkiyənin ş -ində, Van gölündən şm -da, Ermənistan yaylasının orta hissəsində yerləşən Ağrıdağ silsiləsindən almışdır

**Ağsal** *or., mür* 1 Şərur r-nunun şm -ş -ində dağ Hün 1924 m; 2 Culfa r-nunun Ərəfsə kəndi yaxınlığında qayalıq dərə Oronim *ağ* (rəng) və *sal* ( hamar daş, qaya) sözlərindən düzəlib, "ağ rəngli hamar daş" deməkdir.

**Ağsal** *hidr., sadə* Culfa r-nunun Ərəfsə kəndi yaxınlığında, Ağsal dərəsində mineral bulaq Adını eyniadlı dərədən almışdır Suyu soyuq, qoxusuz və azacıq turşdur

**Ağstafa** *hidr., mür* Ermənistanda və Azərb -nın Qazax r-nu ərazisində çay Kürün sağ qoludur Pəmbək silsiləsindən (Ermənistan) 3000 m hündürlükdən başlanır Üstündə eyniadlı su anbarı və su qovşağı var Ermənistanda Aqstev adlanır XII əsr erməni mənbələrində Axstev kimi təqdim edilir Ağstafa variantında ilk dəfə XIV əsrdə Həmdullah Qəzvininin əsərlərində işlənmişdir Xalq arasında hidronim "oğuz təpəsi", "oğuz tayfası" kimi yozumlanır Hidronim *ağsu* (şirin su, içməyə yararlı su) və *tafa* (qaval, zınqırov; səs-küylü) sözlərindən düzəlib, "səs-küylü çay" deməkdir

**Ağstafa** *oyk., sadə* 1 Azərb -da inzibati r-n. Müxtəlif illərdə gah müstəqil r-n, gah da Qazax r-nunun tərkibində ayrıca şəhər kimi fəaliyyət göstərmişdir Mərkəzi Ağstafa şəhəridir Gəncə-Qazax düzənliyindədir, 2 Azərb -da şəhər, eyniadlı r-nun mərkəzi Adını ərazidən axan eyniadlı çaydan almışdır XIX əsrin sonlarına qədər burada İtibulaq ("sürətlə axan bulaq" mənasında) adlanan karvansara olmuşdur

**Ağsu** *hid., mür* 1 Əsasən Ağsu və Kürdəmir r-nları ərazisindən axan çay Niyaldağ silsiləsində Sarıbulaq dağından 2110 m hündürlükdən başlanır, kanalla Kür çayına tökülür Əsas qolu Sulut çayıdır Şirvan düzündə Ağsudan suvarmada geniş istifadə edilir Suyunun bir hissəsi Cavanşır su anbarına axıdılır Yuxarı axarında Sulut adlanır XIII əsrə aid mənbələrdə Çaqanmuren (monq "ağ su") kimi adı çəkilir; 2 Qax r-nu ərazisində çay Qurmux (Kürmük) çayını əmələ gətirən qollardan biridir; 3 Laçın r-nunda çay Həkəri (Əkərə) çayının sağ qoludur Qarabağ silsiləsindən başlanır, 4 Xanlar r-nunda çay Kürək (Kür hövzəsi) çayının sağ qoludur Kəpəz dağının yamacından 2180 m hündürlükdən başlanır Göygölə tökülür və ondan axır 1139-cu ildə zəlzələ zamanı Kəpəz dağının bir hissəsi uçaraq çayın qarşısını kəsmiş, nəticədə Göygöl, Maralgöl, Zəligöl və bir neçə kiçik gölün əmələ gəlməsinə səbəb olmuşdur Çayın Göygölə qədər olan hissəsi Yuxarı Ağsu, göldən başlanan hissəsi isə Aşağı Ağsu adlanır Ağsudan Gəncəyə su kəməri çəkilmişdir Hidronim *ağ* (içməyə yararlı, şirin, axar, çağlayan, coşan) və *su* (çay, axar su) sözlərindən düzəlib Türkdilli xalqların toponimiyasında geniş yayılmışdır Ağsu (Ermənistan), Aqsu (Əfqanıstan), Aksu-Sarıçay çayının (Qazaxıstan və Çin) aşağı axınında adı, Aksuu (Qırğızıstan), Aksuat (Qazaxıstan), Ağsu (Dağıstan) və s

**Ağsu** *oyk., sadə* 1 Azərb -da inzibati r-n 1943-cü ildə təşkil edilmişdir 1963-cü ildə ləğv edilib Kürdəmir r-nuna verilmiş, 1965-ci ildə yenidən müstəqil r-n olmuşdur Mərkəzi Ağsu şəhəridir. Adını ərazidəki eyniadlı çaydan almışdır; 2 Azərb.-da şəhər Ağsu r-nunun mərkəzi – Ağsu çayının hər iki sahilində, Şirvan düzünün şm -ş qurtaracağında, Hinqar silsiləsinin ətəyindədir. Yaşayış məntəqəsi kimi XV əsrdən məlumdur Şəhərin 4-5 km -ində "Xaraba şəhər" adlanan orta əsr şəhəri Ağsu və ya Yeni Şamaxının qalıqları var Adını ərazidəki eyniadlı çaydan almışdır

**Ağsu aşırımı** *or., mür* Azərb -da Ağsu və Şamaxı r-nları arasında, Ləngəbiz silsiləsində aşırım Aşırımdan şose yolu keçir Oronim *Ağsu* (çay adı), *aşırım* (dağ silsiləsində ən alçaq yer) sözlərindən və *-ı* mənsub şək -sindən ibarətdir Adını ərazidəki eyniadlı şəhərdən almışdır





**Ağsuçay dərəsi** *or., mür* Qax r-nunun Ağçay kəndi ərazisində dərə Oronim *Ağsu* (r-nun ərazisindəki çayın adı), *çay* (axar su), *dərə* (mənfi relyef forması) sözlərindən və *-(s)i* mənsub şək -sindən düzəlib, "Ağsu çayının axdığı dərə" mənasındadır

**Ağsu təpəsi** *or., mür* Laçın r-nunun Budaqdərə kəndi ərazisində yüksəklik Təpə adını r-nun ərazisindəki eyniadlı çaydan almışdır

**Ağtala** *oyk., mür* Xaçmaz r-nunun Nərəcan i ə v -də kənd Samur-Dəvəçi ovalığındadır 1840-cı ildə adı dəyişdirilərək Rodnikovka (bulaqlı yer) adlandırılmasına baxmayaraq, 1933-cü ildə Ağtala şəklində qeydə alınmışdır. Oykonim *ağ* (kiçik) və *tala* (ətrafa nisbətən fərqlənən sahə) sözlərindən düzəlib, "kiçik sahə" deməkdir Gürcüstan və Ermənistan ərazisində Axtala kənd adları olmuşdur

**Ağtala** *or., mür* Qax r-nunun Qoşaqovaq kəndi ərazisində düz Oronim *ağ* (kiçik) və *tala* sözlərindən düzəlib, "kiçik tala" deməkdir

**Ağtəpə** *or., mür* 1 Qazax r-nunda, Kürün sağ sahilində, Həsənsu çayının mənsəbi yaxınlığında dağ Hün 307 m; 2 Qobustanda Ceyrankeçməz çayının sağ sahilində dağ Hün 253 m, 3 Gəncə şəhərindən c -ş -də, Gəncə çayının sağ sahilində dağ Hün 582 m, 4 Gəncə şəhər i ə v -də Qocaşen silsiləsinin c -q -ində ucqar zirvə Hün 375 m, 5 Lerik r-nunun Ordahal kəndi ərazisində dağ. Abşeron, Qusar, Zəngilan, Gədəbəy, Göyçay, Naxçıvan, Kəlbəcər, Cəbrayıl, Şəmkir, Xanlar r-nları ərazisində də eyniadlı yüksəkliklər qeydə alınmışdır Oronim *ağ* (kiçik, rəng) və *təpə* (müsbət relyef forması) sözlərindən düzəlib, "kiçik təpə" və ya "ağımtıl rəngli təpə" deməkdir

**Ağtəpə** *oyk., sadə* Cəbrayıl r-nunun Minbaşılı i ə v -də kənd Düzənlikdədir Yaşayış məntəqəsi XX əsrin 30-cu illərində Daş Veysəlli kəndindən ayrılmış bir qrup ailə tərəfindən Ağtəpə adlanan yerin yaxınlığında salınmışdır Adını ərazidəki eyniadlı dağdan almışdır İran (Ağtəpə), Sibir (Aktöbe), Əfqanıstan (Aqtəpə, Aqtubə), Özbəkistan (Oktepa), Türkmənistan (Aqdepe), Tatarıstan (Aktübe) toponimiyasında da eyniadlı oykonimlər qeydə alınmışdır

**Ağvan** *hidr., sadə* Şuşa r-nu ərazisində çay. Qarqar çayının qoludur Mənbəyini Çınqıldağın yamacından alır Yerli əhalinin dilində Alvançay variantında işlənir Keçmişdə Şuşa r-nunun Malıbəyli kəndi ərazisində Ağvan adlı yaşayış məntəqəsi də olmuşdur. Etnotoponimdir Ağvanlar Azərbaycanın qədim türk mənşəli tayfalarından biri olmuşdur

**Ağyal** *or., mür* 1 Gədəbəy r-nu ərazisində dağ, 2 Qazax r-nu ərazisində dağ, 3 Tovuz r-nu ərazisində dağ; 4 Zəngilan r-nu ərazisində dağ Oronim *ağ* (rəng) və *yal* (dağın ən hündür zirvələrini birləşdirən xətt, dikdir; dağın başı) sözlərindən düzəlib, "başı ağ rəngdə olan dağ" deməkdir

**Ağyamac** *or., mür* Zəngilan r-nunun Aşağı Yemezli kəndi ərazisində yüksəklik. Oronim *ağ* (rəng çalan) və *yamac* (dağın və ya təpənin ətəyindən zirvəsinə qədər olan hissə) sözlərindən düzəlib, "ağımtıl, açıq rəngli yamac" deməkdir

**Ağyar** *or., mür* 1 Babək r-nu ərazisində dağ, 2 Laçın r-nunun Qarıqışlaq kəndi ərazisində dağ Oronim *ağ* (süxurun rəngini bildirir, çünki oradan ağ gəc çıxarılır) və *yar* (yerli xalq coğrafi termini olub düzənlikdə yer səthinin sınmasından yaranan relyef formasıdır) sözlərindən düzəlib, "ağ torpaqlı, ağ süxurları olan dağ" deməkdir

**Ağyataq** *or., mür* Kiçik Qafqazda, Kəlbəcər r-nunun Kılsəli kəndi ərazisində dağ Hün 2389 m Oronim *ağ* (rəng) və *yataq* (burada faydalı material çıxarılan yer) sözlərindən düzəlib Ağyataqda civə yatağı var Ağyataq civə yatağı Moz çayı ilə Kilsəli kəndi arasındadır Dağın adı da buradan götürülmüşdür

**Ağyataq** *oyk., sadə* Kəlbəcər r-nunun Abdullauşağı i ə v -də kənd Adını eyniadlı civə yatağı olan dağdan almışdır

**Ağyazı** *or., mür* 1 Qubadlı r-nunun Xələc kəndi ərazisində çöl, 2 Qanıx çayının sol sahilində geniş çöl Oronim *ağ* (kiçik, şorq; ağ rəngə çalan, arpa-buğda əkini üçün ayrılmış sahə) və *yazı* (düzən, çöl) sözlərindən düzəlib, "ərazicə çox geniş olmayan çöl" deməkdir

**Ağyazı** *oyk., sadə* Qax r-nunun Qıpçaq i.ə.v.-də kənd. Ağyazı düzündə, Alazan-Əyriçay çökəkliyindədir. Keçən əsrdə bu kənd Kirovkənd də adlanmışdır. Bu da onunla bağlı idi ki, Qax r-nunun İlisu i.ə.v.-nin Kirovkənd adlı kəndindən Ağyazıya köçən ailələr özləri ilə əvvəlki yaşayış məntəqəsinin adını da gətirmişdilər. Ağyazı adı həmin ərazidəki eyniadlı çölün adından götürülmüşdür.

**Ağyazıbuduq** *oyk., mür.* Xaçmaz r-nunun Yergüc i.ə.v.-də kənd. Samur-Dəvəçi ovalığındadır. 1917-1933-cü illərdə Ağyazı şəklində qeydə alınmışdır. Oykonim *Ağyazı* və *buduq* (etn.) sözlərindən düzəlmişdir. Dağıstandan gəlmiş buduqluların kəndin ərazisində məskunlaşması ilə əlaqədar yaranmışdır. "Buduqlular yaşayan Ağyazı kəndi" deməkdir. Etnotoponimdir.

**Ağyoxuş** *or., mür.* 1. Xocavənd r-nunun Muğanlı kəndi ərazisində düz; 2. Kəlbəcər r-nu ərazisində düz; 3. Qubadlı r-nunun Sarıyataq kəndi ərazisində düz; 4. Laçın r-nunun Zabux kəndi ərazisində düz; 5. Zəngilan r-nunun Sarılı Xeştab kəndi ərazisində düz. Oronim *ağ* (torpağın ağımtıl rəngi; çox da dik olmayan, alçaq, asanlıqla keçilən) və *yoxuş* (yolun dağa, təpəyə çıxan hissəsi) sözlərindən düzəlib, "asanlıqla keçilən dağ yolu" deməkdir.

**Ağyoxuş** *oyk., sadə* Xanlar r-nunun Lahıc i.ə.v.-də kənd. Adını ərazidəki eyniadlı keçiddən almışdır. 1917-ci ildə kəndin adı Ağaxuş şəklində qeydə alınmışdır.

**Ağyurd** *or., mür.* Lənkəran r-nu ərazisində dağ. Oronim *ağ* (kiçik, rəng; abad) və *yurd* (yaşayış yeri, yaylaq, köçəri maldarların hər il yayı keçirdikləri yer) sözlərindən düzəlib, "kiçik yurd, abad yaylaq yeri, ağ rəngli alaçıqları olan yaylaq" deməkdir. Tarixən burada maldarların yaylaq yurdu olmuşdur. Vaxtilə burada eyniadlı kənd də qeydə alınmışdır.

**Ağzıbir** *or., mür.* 1. Bakıda palçıq vulkanı. Ağzıbirçala da adlanır; 2. Qaradağ r-nu ərazisində, Xəzər dənizi sahilində palçıq vulkanı, Cənub-Şərqi Şirvan düzündədir. Hün. 120 m. *Ağız* çoxmənalı coğrafi termin olub "sərhəd keçidi, başlanğıc yer", "çayın, axar suyun digər su obyektinə, dənizə, gölə töküldüyü yer", "dərənin düzənliyə çıxan hissəsi", "bir yerin giriləcək və ya keçiləcək tərəfi", "girəcək qapı" mənalarında işlənir. Oronim "bir çıxacaqlı, bir yerdən püskürən" mənasındadır.

**Ağzıbir** *oyk., sadə* Ağdaş r-nunun Pirəzə i.ə.v.-də kənd. Kürün sol sahilindən bir qədər aralı, Şirvan düzündədir. Kəndin ərazisində Ağzıbir meşəsi də var. "Axar suyun digər su obyektinə töküldüyü yer" mənasını ifadə edir. 1945-ci ilə qədər Ermənistanda Ağzıbir adlı kənd olmuşdur.

**Ağzıbirçala** *hidr., mür.* Dəvəçi r-nunda, Xəzər dənizi sahilində şirin sulu göl-bataqlıq. Vaxtilə liman olmuşdur. Dəvəçi limanı adı ilə də tanınır. Gölə Şabran, Dəvəçi və Taxtakörpü çayları tökülür, göldən isə Xəzərə Qaradəhnə çayı axır. Hidronim *ağzıbir* (çayın, axar suyun su obyektinə, dənizə, gölə töküldüyü yer) və *çala* (su yığılan yer, çuxur) sözlərindən düzəlib, "bir axarlı göl" deməkdir. Göl keçid rolu oynayır.

**Ağzıqır** *or., mür.* Abşeron r-nunda palçıq vulkanı. Oronim *ağız* və *qır* (qeyri-məhsuldar yer) sözlərindən düzəlib (burada *-ı* mənsub şək.-sidir), "bitkisiz, qeyri-məhsuldar yerə giriş, keçid" deməkdir.

**Ahoh/Axox** *hidr., sadə* İsmayıllı r-nunda çay. Əyriçayın (Göyçayın qolu) sağ qoludur. Qovdağ silsiləsindən, 2000 m hündürlükdən başlanır. Dəvəbatan çayı da adlanır. Qədim türk dillərində *ax/ak* – "yüksəklik, zirvə", *ox/ok* – "su, çay, axar su" deməkdir. *Ahoh/Axox* – "dağ çayı" mənasını ifadə edir.

**Ahudağ** *or., mür.* Şamaxı r-nu ərazisində dağ. Qozluçaydan sağ tərəfdə, Qurbançı kəndi yaxınlığında yerləşir. Hün. 963 m. Ərazidə Ahudağ dərəsi adlanan obyekt də vardır. Tədqiqatçılar bu oronimi "ceyrandağ" kimi izah edirlər. Türk dillərində *axu/aqu* – "təpə, yüksəklik" deməkdir. Bundan başqa, qədim türk abidələrinin dilində akı sözünün "comərd, səxavətli" mənası ilə yanaşı "qoz ləpəsi" mənasında işlənməsinə təsadüf edilir. Qozluçayın yaxınlığında yerləşən obyekt öz adını həmin çaydan da ala bilərdi. Ermənistan toponimiyasında da Axudağ oronimi qeydə alınmışdır.





**Ahvay/Axvay** *or., sadə.* Qax r-nu ilə Dağıstan sərhədində dağ. Baş Qafqaz silsiləsinin zirvələrindən biridir. Hün. 3480 m. Etnotoponimdir. Özlərini "aşvado" adlandıran və adıçəkilən ərazidə yaşayan axvaxların adları ilə bağlıdır. Dağıstan ərazisində Axvax adlı r-n var.

**Axarbaxar** *or., mür.* 1. Abşeron r-nunda aşırım; 2. Kəlbəcər r-nunun q. hissəsində, Ermənistanla sərhəddə dağ. Hün. 3047 m; 3. Sumqayıt ərazisində dağ. Baş Qafqaz silsiləsindən c.-ş.-ə doğru ayrılan qolun üzərində yerləşir. Hün. 1388 m.; 4. Şəki yaylası ilə Mingəçevir su anbarı arasında dağ silsiləsi. Burada qədim qala uçuqları da vardır; 5. Yevlax r-nunda aşırım. Oronim Azərb. dilindəki *axar* (su axarı, çay) və *baxar* (dağın çayabaxar tərəfi) sözlərindən düzəlib, "çayətrafı, çayabaxar tərəf" mənasındadır. Azərb. dilində və dialektlərində *axar-baxar* – "dağların döşü, mənzərəli yer" mənasını ifadə edir. 1917-ci ildə Qubadlı qəzasında Axarlı, Gəncə qəzasında Axarca, 1933-cü ildə Goranboy r-nunda Axarça adlı yaşayış məntəqələri qeydə alınmışdır.

**Axarsu** *hidr., mür.* Laçın r-nu ərazisində çay. "Axan su, çay" mənasında olan hidronim suyun hərəkəti ilə bağlı yaranmışdır.

**Axınca** *hidr., düz.* Azərb. və Ermənistanda çay (Kür hövzəsi). Başkənd aşırımı yaxınlığından (1950 m. hündürlükdən) başlanır. Tovuz çayının sağ qoludur. Üstündə 1969-cu ildə Tovuz r-nunun Ermənistanla sərhədində Axıncaçay su anbarı yaradılıb. XIX əsrin axırlarında çayın yaxınlığında Axınca adlı qışlaq da olmuşdur. Hidronim *axın* (sel, iti hərəkət) sözündən və *-ca* şəkilçisindən ibarət olub, suyun hərəkəti, sürəti ilə bağlı yaranmışdır. Şəmkir çayının qollarından biri də Axınca adlanır. "Axın" termini ilə bağlı Çində Korakırakın, Karakumısakın, Suakınsay, Tümen vilayətində Aqınakattı və Aqınaktı çayları qeydə alınmışdır.

**Axıncalı** *oyk., düz.* İmişli r-nunda kənd. Mil düzündədir. Axıcanlı variantında qeydə alınan bu kənd, yerli əhalinin məlumatına görə, vaxtilə Axıcan adlı şəxs tərəfindən salındığı üçün belə adlandırılmışdır. Əslində kəndin adı Axıncalı, yəni "Axıncadan gələnlər" olmalıdır.

**Axısxa** *oyk., sadə* Sabirabad r-nunun eyniadlı i.ə.v.-də kənd. Kür çayının sol sahilində, Şirvan düzündədir. 1944-cü ildə Gürcüstanın Axısxa r-nundan Qazaxıstana və Orta Asiyaya sürgün edilmiş, 60-cı illərdə isə Azərbaycana köçmüş türk ailələri tərəfindən salınmış yaşayış məntəqəsi onların köhnə məskənlərinin adı ilə adlandırılmışdır. Mənbələrdə *axısxa/axsıxa* Axalsix qalasının adı, *Axal* isə təkə-türkmənlərin yaşadığı yer kimi izah olunur.

**Axmaz** *hidr., sadə* 1. Ağdaş r-nunda göl; 2. Mingəçevir şəhərindən c.-da, Kürün sol sahilində göl; 3. Sabirabad r-nunda göl; 4. Yevlax r-nunda göl. *Axmaz* Azərb. dilində toponimik termin kimi çayın əsas yataqdan tamamilə və ya qismən ayrılmış hissəsinə deyilir. Axmazlar ilk dövrdə göl şəklində olur və çay daşqınları ilə qidalanır; su çatmayanda tədricən bataqlığa çevrilir və quruyur.

**Axmazkənd** *oyk., mür.* Əli Bayramlı r-nunda kənd. 1954-cü ilə qədər Osmanlı adlanmışdır. Oykonim *axmaz* (göl, bataqlıq) və *kənd* sözlərindən düzəlib, kəndin yaxınlığındakı gölün adından yaranmışdır.

**Axpərqan/Axperqan** *oyk., mür.* Ağdərə r-nunun Çıldıran i.ə.v.-də kənd. Bəzi tədqiqatçılar bu oykonimin *axpur* (erm. bulaq) və *-kan* (şək.) elementlərindən ibarət olduğunu söyləyərək onu erməni mənşəli hesab edirlər. Lakin nəzərə almaq lazımdır ki, Qaraaxpur, Gərməaxpur və s. toponimlərinin birinci komponenti türk mənşəli sözlərdir. Digər tərəfdən, Azərb. dilinin Ordubad şivəsində *axbur* sözü "bulaq" mənasında işlənməkdədir. Qədim türk dillərində də *burqan/purqan* "çağlayan, qaynayan, coşan" mənalarını ifadə edir. Odur ki, *Axburqan/Axpurqan* sözünün fonetik dəyişməsi olan Axpərqan oykonimi türk mənşəli söz olub "Ağbulaq" deməkdir.

**Axtaçı** *oyk., sadə* 1. Ağsu r-nunun Ağsu şəh. i.ə.v.-də kənd. Ləngəbiz silsiləsinin ətəyindədir. XIX əsrdə bu kənd Çöl Axtaçı adlanmışdır; 2. Kürdəmir r-nunun Axtaçı i.ə.v.-də kənd. Şirvan düzündədir. Kəndin keçmiş adı Axtaçı Yekəqurşaqlı olmuşdur. 1933-cü ildə həmin i.ə.v.-də Axtaçı-binə adlı başqa bir kənd də qeydə alınmışdır; 3. Sabir-

abad r-nunun Qasımbeyli i ə v.-də kənd Sarısu gölündən bir qədər aralı, Kür çayının sol sahilindədir XIX əsrin 60-cı illərində Ağsu r-nundakı Axtaçı kəndindən köçüb gələn ailələr tərəfindən salınmışdır; 4 Sabirabad r-nunda kənd. Muğan düzündədir Sovet hakimiyyəti illərində Axtaçı Şaumyan kimi rəsmiləşdirilən bu ad 1992-ci ildən dəyişdirilmişdir Axtaçılar padar tayfasının bir qolu olub XIX əsrdə Kür çayının sol sahilində yaşayırdılar Etnooykonimdir *Axtaçı* "atabaxan, mehtər" deməkdir

**Axtaçı Muğan** *oyk*, *mür* Sabirabad r-nunun Güdəcühür i ə v -də kənd Kür çayının sağ sahilində, Muğan düzündədir Oykonim "Muğan düzündəki Axtaçı kəndi" deməkdir

**Axtaçı Şirvan** *oyk*., *mür* Hacıqabul r-nunda kənd Şirvan düzündədir Kürün Şirvan hissəsində yerləşdiyi üçün belə adlanmışdır 1917-ci ildə Göyçay qəzasında Axtaçı Salyan adlı yaşayış məntəqəsi də qeydə alınmışdır XIX əsrə aid mənbələrdə Axtaçı Sultanbəyli, Axtaçı Kəkəli kəndlərinin olduğu da göstərilir

**Axtaxana** *oyk*., *mür* Cəlilabad r-nunun Ağdaş i ə v -də kənd Göytəpə çayının sahilində, Burovar silsiləsinin ətəyindədir Oykonim *axta* və *xana* sözlərindən düzəlib, "heyvanların axtalandığı yer; at saxlanan yer" deməkdir Yerli əhalinin verdiyi məlumata görə, yaşayış məntəqəsi vaxtilə Göytəpə çayı boyunca keçən köç yolunda yerləşən axtaxanada salındığı üçün belə adlandırılmışdır Ermənistan və Özbəkistan toponimiyasında da Axtaxana oykonimləri qeydə alınmışdır

**Axtarma** *or*., *sadə* Abşeron r-nunda palçıq vulkanı *Axtarma* türk dillərində "atma, dağıtma, ətrafa səpələmə" deməkdir Vulkan püskürərkən yerin altındakı çirkli sular, palçıq və qaz üzə çıxaraq ətrafa yayılır

**Axtarmadalı** *or*., *mür* Abşeron r-nunda palçıq vulkanı Oronim "vulkanın arxa tərəfi" deməkdir

**Axtarma Qaradağ** *or*., *mür* Qaradağ r-nu ərazisində palçıq vulkanı Kraterində 35-ə yaxın qrifon var Qrifonlarından qaz, palçıq və su çıxır Oronim palçıq vulkanının yerləşdiyi ərazinin adını əks etdirir

**Axtarma Paşalı** *or*., *mür* Azərb.-da ən böyük palçıq vulkanlarından biridir Şamaxı r-nu ərazisində, Paşalı stansiyası yaxınlığındadır Nisbi hün 3000 m -ə çatır

**Axtarma Puta** *or*., *mür* Qaradağ r-nunun Puta qəsəbəsi yaxınlığında palçıq vulkanı 1923-cü, 1933-cü və 1950-ci illərdə püskürmüşdür Oronim vulkanın yerləşdiyi ərazini əks etdirir

**Axullu** *oyk*., *sadə* Xocavənd r-nunun Edilli i ə v -də kənd Qarabağ silsiləsinin ətəyindədir Bəzi tədqiqatçılar bu sözü haxıllı etnoniminin təhrif forması hesab edirlər Etnotoponimdir Akullar (Axsullar) Dağıstanın c.-unda (Aqul və Qurax r-nlarında) yaşayan xalqın adıdır Etnoqrafik cəhətdən ləzgilərə yaxındırlar Ərazidə Ləzgisuyu adlı obyektin olması bunu bir daha sübut edir *Axu* (*axul*) Qafqaz xalqlarının (abxaz) dilində "təpə, yüksəklik" deməkdir

**Axun** *hidr*., *sadə* Abşeronda mineral bulaq. Sumqayıt şəhər i ə v -də, Altıağac kəndindən bir qədər şm -q -də yerləşir Soyuq sulu bulaqdır Toponimikada bu hidronimi V əsrdə Muğanda hunlar tərəfindən salınmış Ak-qunn (Ağhun) şəhərinin adı və ya axund (molla) dini rütbə adı ilə əlaqələndirmək meyilləri vardır Lakin nəzərə almaq lazımdır ki, türk dillərində *aqın/axın/axun/akun* paralelləri "sel", "axıntı", "can atmaq", "iti axan çay, su" mənalarında işlənməkdədir Su obyekti ilə bağlı olan bu coğrafi ad yalnız "iti axan su, bulaq" kimi izah oluna bilər Qafqazda (Soçi) Böyük Axun adlı dağ, Penza vilayətində, Sura çayının sahilində Axuni adlı kurort şəhəri vardır

**Axunahiran** *oyk*, *sadə* Lənk r-nunun Veri i ə v -də kənd Peştəsər silsiləsinin yamacındadır Əsl adının Ahunageran olduğu və talış dilində "dəmirçilər" mənasını bildirdiyi güman edilir Adını ərazidəki eyniadlı çaydan almışdır Hidronim isə *axun* (sel, çay), *hır* (tal duman, çiskin) sözlərindən və *-an* (məkan) şək -sindən düzəlib, "dumanlı, bulanıq çay" deməkdir







**Axundlu** *oyk*., *sadə* Ağsu r-nunda kənd Şirvan düzündədir Etnotoponimdir Yaşayış məntəqəsinin yaxınlığında Axundlu qobusu, Axundlu dağı, Axundlu qəbiristanı adlı coğrafi obyektlər də var

**Axunkaxl** *hidr*., *mür* Abşeron yarımadasında göl. Hidronim *axun* (kiçik çay, çay qolu) və far *-gahi* (-laq şəkilçisinin qarşılığı olub, məkan anlayışı bildirir) komponentlərindən düzəlib, "çayların töküldüyü yer" deməkdir

**Axura** *oyk*., *sadə* Şərur r-nunun eyniadlı i ə v.-də kənd Axura çayının (Arpaçayın qolu) sağ sahilində, Dərələyəz silsiləsinin q ətəyindədir Adını ərazidəki eyniadlı çaydan almışdır Keçmiş adı Yeni Axura olmuşdur Axura adlı yaşayış məntəqəsinin adı ilk dəfə VII əsrə aid mənbədə çəkilir 1840-cı il iyunun 20-də güclü zəlzələ nəticəsində Ağrı dağının ətəyində yerləşən Axura kəndi dağılmış, kəndin əhalisi indiki əraziyə köçərək Yeni Axura kəndinin əsasını qoymuşdur Sonralar oykonimin birinci komponenti düşmüş, kənd Axura adlandırılmışdır

**Axura çayı** *hidr*., *mür* Şərur r-nunda çay Şərqi Arpa çayının sol qoludur Mənbəyini Keçəltəpə dağından, 2460 m. yüksəklikdən alır Qabaqlıçay da adlanır Üzərində Axura körpüsü vardır. Abidələrin dilində *axur/akur/akuru* sözləri "əhatə olunmuş, bəndə salınmış; sakit, səssiz, yavaş, sərbəst" mənalarını ifadə edir Çayın ikinci adı da həmin mənaya uyğun gəlir Ermənistan ərazisində Araz çayının sağ qolu olan Zəngiçay da Axuryan adlanır

**Axurçay** *hidr*., *mür* Qusar r-nu ərazisində çay Hidronim *axur* (sakit, səssiz) və *çay* sözlərindən düzəlib, "sakit axan çay" deməkdir

**Akaku** *oyk*., *mür* Xocavənd r-nunun Tuğ i ə v -də kənd Tədqiqatçıların əksəriyyəti bu oykonimi "mənası aydın olmayan" adlar sırasına daxil edir 1933-cü ildə həmin kənd Ataqut i ə v -nin tərkibində verilmişdir Türk dillərində "aka" sözü "baba, böyük qardaş, ata" mənalarını ifadə edir Eyni zamanda həm "ku", həm də "ut" komponentlərinin hər ikisi "davamçı, vəliəhd, şahzadə, arxasınca gedən" mənalarında işlənmişdir Əgər bu sinonimliyə Ağaoğlan oykonimini də əlavə etsək, görərik ki, eyni ərazidə yerləşən Ataqut (və ya Ataut), Akaku məntəqə adları "atanın oğlu, atanın davamçısı, kiçik şahzadə" mənalarına uyğun gəlir Kənd 1992-ci ildən Ağoğlan adlandırılmışdır

**Akop Kamari** b a x Lüləsaz

**Akuşa** b a x Aquşa

**Akuşapeştə** *oyk*., *mür* Lerik r-nunun Siyov i ə v -də kənd. Lemər çayının (Lənkəran çayının sağ qolu) sahilində, Peştəsər silsiləsinin ətəyindədir Kənddə Akuşa adlanan pir var Oykonim *akuşa* (delta) və *peşta/ piştə* (talış. "quru, hündür yer, suyun içində təpəcik") sözlərindən düzəlib, "çayın qollara ayrıldığı yer; delta" deməkdir

**Aqaçay** *hidr*., *mür* Qubadlı r-nu ərazisində çay Hidronim *aqa* (türk dillərində "iki ayaq arasındakı genişlik, iki son arasındakı boşluq, iki sahil arası") və *çay* (su obyekti bildirən termin) komponentlərindən düzəlib, "çox da enli olmayan çay" deməkdir Aqadır (Qazaxıstanda r-n və qəs ), Aqan (Rusiyanın Tümen vil -də çay), Aqapa (Rusiyanın Krasnoyarsk ölkəsində çay) coğrafi adları da *aqa* topokomponenti ilə bağlıdır 1917-ci ildə Nuxa qəzasında Aqalıx, Şamaxı qəzasında Aqan (1961-ci ildə Əhən) oykonimləri də qeydə alınmışdır

**Aqarlincə** *or*., *mür* Quba r-nu ərazisində dağ. Oronim türk dillərindəki *aqar* (hündür, yüksəklik, nərdivan, pilləkən) və tat dilindəki *lingə/lincə* (ətək, yer; nərdivan, pilləkən) sözlərindən düzəlib Hər iki komponent yüksəklik anlamı ilə bağlıdır Astara r-nunun Pəlikəş kəndi ərazisindəki Ağalingə dağının adı da Aqarlincə oroniminin bir variantıdır

**Aqartəpə** *or*., *mür* Laçın r-nu ərazisində dağ Oronim *aqar* və *təpə* (yüksəklik anlayışı bildirən coğrafi termin) sözlərindən düzəlib, "hündür təpə, yüksək təpə, dağ" deməkdir "Aqar" komponentli coğrafi adlara Türkmənistan (Aqar), Gürcüstan (Aqara), Ermənistan (Aqarak, Gülaqarak), Türkiyə (Eqerek), Hindistan (Aqartala) və b ölkələrin ərazisində də rast gəlmək mümkündür

**Aqusəm/Aqussam** (1917) / **Aqusən** (1933) *oyk*., *mür* Cəlilabad r-nunun Cəngan i ə v -də

kənd. Burovar silsiləsinin ətəyindədir Oykonimi iki cür izah etmək olar 1 Türk dillərində *ağı/aqu* (acı, zəhər) və *sam* (isti külək) sözlərindən düzəlib, "acı, isti küləkli yer" deməkdir; 2 Türk dillərində *aquş/ağuj* (ağız südü, yeni bala vermiş heyvanın ilk südü) və *san/san* (sağım) sözlərindən düzəlib, "yeni bala vermiş heyvanların saxlandığı, sağıldığı yer" deməkdir Toponimiyada Aqusəm kənd adını Aqusəm çayının adı ilə də bağlayırlar Bu baxımdan həmin hidronim Ağüzən (ağ çay) adının təhrif olunmuş forması kimi qəbul olunur

**Aquşa/Ağuşa/Akuşa Bala Kür** *hidr., düz.* Salyan şəhəri yaxınlığında Kür çayından ayrılan qol Keçmişdə Qızılağac körfəzinin bir hissəsi olmuş Xurşidçalaya tökülürdü Sonralar Kürün səviyyəsi aşağı düşdüyündən bu çaya su axmamışdır Bala Kür kimi "kiçik Kür" mənasını ifadə edir Dağıstan ərazisində Akuşa adlı kənd və r-n qeydə alınmışdır Deyilənə görə, keçmişdə burada Dağıstanın Aquşa mahalından gəlib Kür çayının kənarında məskən salanların eyniadlı yaşayış məntəqəsi olmuşdur Çayın qolu da həmin kəndin adı ilə adlanmışdır Bəzi tədqiqatçılara görə, hidronim farsca *ağuş* (qucaq) sözündən düzəlib, "çay qolları ilə bürünmüş ərazi, delta" deməkdir

**Alabaşlı** *oyk., sadə* Xanlar r-nunun Qarayeri i.ə.v.-də kənd Qoşqar çayının sağ sahilindən bir qədər aralı, Gəncə-Qazax düzənliyindədir Etnooykonimdir 1943-cü ilədək Şəmkir r-nunun Qasım İsmayılov kəndinin adı da Alabaşlı olmuşdur

**Alaciki** *or., mür.* Qazax r-nunda dağ Gürcüstanla sərhəddədir Ağstafa şəhərinin şm.-ş.-ində yerləşir Hün 696 m XV əsr Azərb şairi Bədr Şirvaninin əsərlərində Alancik coğrafi adına təsadüf olunur Türk dillərində *cıq/cıq* "dar dərə", "xəndək, səngər", "çıxıntı" mənalarını ifadə edir "Alaciki" oroniminin coğrafi mövqeyi onun Alanciki olduğunu düşünməyə əsas verir. Oronim *alan* (etn.), *cik* (dərə) və *-i* (mənsub şək.-si) komponentlərindən düzəlib, "alan dərəsi" deməkdir Dağ öz adını oradakı dərənin adından almışdır



**Alaçadırlı** *oyk., sadə* Bərdə r-nunun Kələntərli i.ə.v.-də kənd Tərtər çayının sağ sahilində, Qarabağ düzündədir Keçmiş adı Məzməzəkdir Ərazi XIX əsrdə Zəngəzur qəzasının Məzməzək kəndinin qışlağı olmuşdur Sonralar bu kənddən alaçadırlı nəslinə mənsub ailələr köçərək qışlaq yerində məskunlaşdığı üçün kənd də həmin nəslin adını daşımışdır Etnooykonimdir

**Aladaş** *or., mür.* 1 Baş Qafqaz silsiləsinin c.-ş. qolu Abşeron və Şamaxı r-nlarındadır Dübrar (Kolanı) zirvəsi yaxınlığından başlayıb c.-ş. istiqamətində Tudar çayının dərəsinədək 30 km məsafədə uzanır Bəzi zirvələrinin hündürlüyü 1600 m-dən çoxdur Dağın adı oradakı Aladaş qayasının adındandır; 2 Zəngilan r-nu ərazisində dağ. 3 Zəngilan r-nu ərazisində dərə Adını ərazidəki eyniadlı dağdan almışdır Oronim *ala* (rəng) və *daş* (qaya, dağ) sözlərindən düzəlib, "ala rəngli dağ silsiləsi" deməkdir Krım, Orta Asiya və Sibirdə bir sıra dağ silsilələri Alatau adlanır

**Aladin** *oyk., mür.* Zəngilan r-nunun Giletağ i.ə.v.-də kənd Dağlıq ərazidədir 1826-28-ci illər, Rusiya-İran müharibəsindən sonra Cənubi Azərb.-nın Aladin kəndindən gəlmiş azərb. ailələr tərəfindən salınmışdır Şərur r-nunda Aralıdağ yaxınlığındakı kənd xarabalığı da Aladın adlanır Tədqiqatçılar bu oykonimin *alan* və *dən* sözlərindən ibarət olub, "hamar, düz yer" və "vilayət, dairə" mənasını ifadə etdiyini söyləyirlər Lakin əslində bütün türkdilli xalqların toponimiyasında geniş yer tutan *ala* topokomponenti "müxtəlif rəngli, qonur rəng; böyük, geniş" mənalarını bildirir 1917-ci ildə Lənkəran qəzasında Alabin kəndi qeydə alınmışdır *Bin* sözü Azərb dilinin şərq qrupu dialekt və şivələrində "məskən, oturaq həyat üçün yer, bünövrə" mənalarında işlənir Qədim türk dillərində *dın/din* komponenti "düşərgə, məskən, dincəlmək üçün yer" mənalarını ifadə etmişdir Beləliklə, həm Aladin, həm də Alabin oykonimi "böyük məskən, geniş yaşayış məntəqəsi" kimi başa düşülməlidir. Moskva vilayətində də Alabino adlı qəsəbə və d.y. stansiyası qeydə alınmışdır





**Alagəz** *or., mür.* Qax r-nunun Sarıbaş kəndinin şm.-ında dağ. Oronim *ala* (böyük) və *gəz* (gədiyin ən alçaq hissəsi) sözlərindən düzəlib, "böyük gəz, böyük dağ yolunun alçaq hissəsi" deməkdir.

**Alagöl** *hidr., mür.* 1. Şəki-Zaqatala zonasında göl; 2 Yevlax r-nu ərazisində göl Hidronim *ala* (qonur, müxtəlif rəngli) və *göl* (su obyekti) sözlərindən düzəlib, "qonur rəngli göl" deməkdir Bu hidronim türkdilli xalqların toponimiyasında geniş yayılmışdır Alakul (Qərbi Sibir), Alakol (Qazaxıstan), Alagöl (İran) və s

**Alagöllər** *hidr., mür.* Kəlbəcər r-nunda göllər (30-a qədər) qrupu Dəniz səviyyəsindən 2700-2800 m hündürlükdədir. Ən böyükləri Böyük Alagöl, Kiçik Alagöl, Çilligöl və Dıkpilləkən göllərdir Vulkan püskürmələri nəticəsində çayların qabağının kəsilməsindən əmələ gəlmişdir Şirin suludur Hidronim suyun zahiri görünüşü (rəngi) ilə bağlı yaranmışdır

**Alagöllər** *or., sadə* 1 Azərb. və Ermənistan sərhədində, Şahdağ silsiləsinin (Kiçik Qafqaz) şm. yamacında dağ Gədəbəy r-nunun c.-undadır. Hün 2972 m., 2 Laçın r-nunun şm.-q.-ində, Qarabağ yaylasında dağ Qaragöl gölündən şm.-da yerləşir Hün 3175 m Adını ərazideki eyniadlı göllərin adından almışdır

**Alagöz** *or., mür.* Ordubad r-nunun şm. hissəsində dağ. Hün 2366 m Oronim *ala* (böyük) və *göz* (hissə, tamın bir parçası) sözlərindən düzəlib, "böyük hissə" deməkdir Erməni mənbələrində adı çəkilən Araqats dağının (4090 m.) adı türkmənşəli Alagöz adının erməni dilindəki tələffüz və yazılış forması hesab olunur XIX əsrə aid mənbələrdə Şərur, Dərələyəz qəzalarında və Eçmiədzin mahalında Alagöz adlı çay, şəhər xarabalığı haqqında məlumat verilir Alagöz dağı qədim zamanlardan azərb.-ların yaylaq yerləri olmuşdur.

**Alagözməzrə** *oyk., mür.* Babək r-nunun eyniadlı i.ə.v.-də kənd. Naxçıvan çayının sol sahilində, Zəngəzur silsiləsinin c.-q. ətəyindədir Digər adı Məzrədir Elmi ədəbiyyatda bu oykonim Alagozmərzə şəklində də izah olunur Oykonim *Alagöz* (ərazideki eyniadlı dağın adı ilə bağlıdır) və *məzrə* (ər. "əkin yeri", "tarla") sözlərindən düzəlib, "Alagöz dağının ətəyində əkin yeri" deməkdir 2003-cü ildən kəndin adı Məzrə kimi rəsmiləşdirilmişdir



**Alagüney** *or., mür.* Zəngilan r-nunun Ağbız kəndi ərazisində dağ Oronim *ala* (böyük, qonur) və *güney* (türk dillərində "dağın, təpənin və digər yüksəkliyin cənuba, günəşə baxan hissəsi, günəş şüası çox düşən tərəf") sözlərindən düzəlib, "günəş şüası düşən böyük dağ" deməkdir

**Alaxançallı** *oyk., mür.* Daşkəsən r-nunun Qaraqullar i.ə.v.-də kənd Gəncə çayının sahilində, Qoşqar dağının ətəyindədir Yaşayış məntəqəsi XIX əsrin ortalarında yaranmışdır Tədqiqatçıların bir hissəsi toponimi ayrımların alaxançallı nəslinin adı ilə, digər hissəsi isə "xəncər gəzdirən Alı" yozumu ilə bağlayırlar. Bu oykonim 1917-ci ildə Alıxançalı şəklində qeydə alınmışdır Oykonimin düzgün variantı da elə budur Kəndin adı *Alıxan* (antr., alıxanlı nəslinin banisi), *çal* (bozqır, geniş düzən, meşəsiz sahə) və *-ı* (mənsub şək.-si) komponentlərindən düzəlib, "Alıxana və ya alıxanlı nəslinə aid düzənlik yer" deməkdir

**Alakol** *oyk., mür.* Tovuz r-nunun eyniadlı i.ə.v.-də kənd Zəyəm çayının sol sahilindən bir qədər aralı, Mamırtı (Kiçik Qafqaz) dağının ətəyindədir Yerli əhalinin məlumatına görə, toponim "seyrək bitkili yer, addabudda kollu sahə" mənasındadır Oykonim *ala* (böyük, geniş) və *kol* (vadi, dərə, hamar düz, aran yeri) sözlərindən düzəlib, "geniş düzən, böyük aran yeri" deməkdir Bəzi mənbələrdə Alagöl şəklində qeydə alınmış bu i.ə.v.-də, 1917, 1933, 1961-ci illərə aid məlumat kitablarına görə, Alagöl adı ilə bağlı üç kənd olmuşdur Alagöl, Alagöl Mülkülü, Alagöl Qırıqlı Sonralar r-nun ərazisində gedən əsaslı planlaşdırma nəticəsində həmin kəndlər Alakol, Mülkülü və Düz Qırıqlı şəklində sabitləşmişdir

**Alaqaya** *or., mür.* Qarabağ silsiləsinin şm. hissəsində dağ Kəlbəcər və Laçın r-nlarının Əsgəran r-nu ilə sərhədindədir Hün 2583 m Oronim *ala* və *qaya* sözlərindən düzəlib *Ala* bir sıra mürəkkəb toponim-

lərın birinci komponenti kimi "alalıq", "rəngbərənglik", "ala-bulalıq", "ağ rəng, qırmızı və qara rənglərlə qarışıqlıq" mənalarını əks etdirir *Qaya* sözü toponimik termin olub, "sıra dağlardan ayrılmış qol", "dağların müəyyən hissəsində daş süxurlardan olan çətin keçilən yer" deməkdir Uzaqdan ala-bəzək görünən zirvəyə, qayaya, dağa, təpəyə *ala* deyirlər

**Alaqurşaq** *oyk mür* Qubadlı r-nunun Zilanlı i ə v -də kənd Həkəri çayının sahilindədir Yaşayış məntəqəsi şotlanlı tayfası tərəfindən Alaqurşaq yeri adlı sahədə salınmışdır Oykonim *ala* (rəng) və *qurşaq* (kəmər, zolaq) sözlərindən düzəlib, "ala rəngli zolaqda olan kənd" deməkdir

**Alar** *or*, *sadə* Yardımlı r-nunun Alar kəndi ərazisində dağ Etnooronimdir

**Alar** *oyk*, *sadə* Yardımlı r-nu ərazisində kənd. Alar çayının (Viləş çayının qolu) sahilindədir Etnooykonimdir Müxtəlif məlumat kitablarında Alar/Allar/Alılar şəklində qeydə alınmışdır Alarlar monqol yürüşlərində (XIII əsr) iştirak etmiş türk-monqol mənşəli oyrat tayfasının bir qolu olub, həmin əsrdə Talış zonasına köçürülmüşlər XIX əsrin ortalarında alarlar canşalı (cahanşahlı) tayfa birliyinə daxil idilər

**Alar** *hidr*, *sadə* Yardımlı r-nu ərazisində çay Viləş çayının qoludur Etnohidronimdir

**Alar bulağı** *hidr*, *mür* Lerik r-nunun Alar kəndi ərazisində bulaq Etnohidronimdir

**Alaşa** *hidr sadə* 1 Astara r-nunda Alaşa kəndindən 3 km q -də, İstisu çayının yatağında yerləşən 16 bulağın adıdır Bulaqlar yüksək debitli olub, acı-şordur Yerli əhali tərəfindən müalicə üçün istifadə olunur; 2 Lerik r-nu ərazisində çay Lənkəran çayının sol qoludur Suvarma üçün istifadə olunur *Alaşa* sözü türk dillərində qədim dil elementi kimi bir neçə məna ifadə edir "at", "koçəri həyata alışmış heyvan"; "coşan, harın, inadkar"; "aşağı, alçaq", "bel, arxa", "pis, murdar, iyrənc" və s Bulaq adı kimi "pis, xoşagəlməyən su", çay adı kimi "coşqun" mənalarını ifadə edə bilər

**Alaşa** *oyk*, *sadə* Astara r-nunun Sənçərədi i ə v -də kənd Lənkəran ovalığındadır. Toponimin yerli tələffüz formasına (eleşə) əsaslanan tədqiqatçılar onu "böyük həyat" kimi izah edirlər Adını ərazidəki eyniadlı bulaqdan almışdır

**Alaşaqolu** *hidr*, *mür* Bərdə r-nu ərazisində çay Hidronim *Alaşa* (çay adı), *qol* (çaydan ayrılan bir hissə) və *-u* (mənsub şək -si) komponentlərindən düzəlib, "Alaşa çayından ayrılan qol" deməkdir

**Alaşar** *or*, *sadə* Cəlilabad r-nu ərazisində dağ Alaşar-Burovar sıra dağları da adlanır Talış dağlarının ucqar şm -ş -ində silsilədir Bu dağ silsiləsi alçaq olub, ən hündür zirvələri 1000 m -dən artıq yüksəlir. Türk dillərində *alasar* "alçaq yer", *burovar* "yüksəklik, dağ" mənalarını ifadə edir Oronim "alçaq dağlar" deməkdir

**Alaşar** *oyk*, *sadə* Cəlilabad r-nunun Komanlı i ə v -də kənd Alaşar-Burovar silsiləsinin mərkəzi hissəsində, Şinəpədərə çayının sahilindədir XX əsrin əvvəllərində qışlaq yeri kimi qeydə alınmışdır Adını ərazidəki eyniadlı dağdan almışdır

**Alatava** *or*, *mür* Bakıda yüksəklik Oronim *ala* (böyük) və *tava* (yastı səthli iri daş) sözlərindən düzəlib, "yastı səthli iri daşlardan ibarət olan yer" deməkdir Tədqiqatçılar Alatavanın yaşının beş min il olduğunu, onun məkanca Manna dövlətinə daxil olduğunu, bu oronimin "dağ, dağlıq ölkə" mənasını ifadə etdiyini söyləyirlər Ad ərazinin coğrafi mənzərəsinə uyğundur Ərazidə eyniadlı yaşayış sahəsi də vardır

**Alazan** *or düz* Azərb -nın şm -q hissəsində Baş Qafqaz silsiləsinin c ətəyi boyunda vadi Şəki, Qax, Zaqatala və Balakən r-ları ərazisində yerləşir Q -ə doğru uzanaraq Gürcüstan ərazisindən keçir və burada Kaxetiya düzənliyi adlanır Mal-qara üçün təbii qış otlaqları kimi geniş istifadə edilən vadi c -dan Qombor silsiləsi, İori yaylası və Acınohur ön dağları ilə əhatə olunur Baş Qafqaz silsiləsindən başlayan Alazan (Qanıx), Balakən, Katex, Kürmük, Əlican, Türyan, Göyçay və b çaylar bu vadidən axır Alazan-Həftəran, Alazan-Əyriçay vadisi də adlanır Oronim *alaz/alas* (türk dillərində "aşağı", "dağətəyi düzənlik"; "enli çayların və göllərin hövzəsini əhatə edən çəmənlik") və *an* (yer, məkan) sözlərindən düzəlib,





"dağətəyi düzənlik, çay sahili, çəmənlik, otlaq" deməkdir 1933-cü ildə Lənkəran r-nunun Biləsər i ə v -də Alazonu yaşayış məntəqəsi qeydə alınmışdır Yakutiyada Alazeya çayı Alazeya yaylasının c -undan başlayaraq Şərqi Sibir dənizinə tökülür.

**Alazan** *hidr*, *sadə*. Baş Qafqaz silsiləsinin c -undan başlayıb Gürcüstan və Azərb ərazisindən axan və Mingəçevir su anbarına tökülən çay Azərb. ərazisində bu çaya sol tərəfdən Mazım, Balakən, Katex, Tala, Muxax, Kürmük və Əyriçay çayları tökülür Gürcüstan ərazisindəki hissəsi Alazani, Azərb ərazisindəki hissəsi isə çox vaxt Qanıx adlanır. Adını axdığı eyniadlı vadidən almışdır

**Albalan** *oyk*, *mür* Cəlilabad r-nunun Xəlilli i ə v -də kənd Burovar silsiləsinin ətəyindədir Oykonim *al* (burada "qırmızı") və *balan* (türk dillərində "başınağacı") sözlərindən düzəlib, "qırmızı başınağacı" deməkdir 1917-ci ildə bu oykonim Alıbağan şəklində qeydə alınmışdır Bu məqamda həmin oykonim *Alı* (antr ) və *bağan/bakan* (türk dillərində "asılı", "aid"; "məxsus", "tabeliyində olan") sözlərindən düzəlib, "Alı (və ya Əli) adlı şəxsə məxsus kənd" deməkdir. Toponimi "Alının bələni (aşırımı)", "boz aşırım" kimi yozanlar da var

**Alcanlı // Alıcanlı** *or*, *sadə* Şamaxı r-nu ərazisində dağ Etnotoponimdir 1933-cü ildə Kürdəmir r-nunda Alcanlı adlı kənd qeydə alınmışdır.

**Alçabulaq** *hidr*, *mür* 1 Yardımlı r-nunun Zovin kəndində bulaq, 2 Yardımlı r-nunun Vorgədüz kəndində bulaq Hidronim *alça* (qədim türk dillərində aluç/aluça – "soyuq, buz" deməkdir) və *bulaq* (su obyektini bildirən termin) sözlərindən düzəlib, "soyuq bulaq" mənasındadır

**Alçabulaq** *oyk sadə* Yardımlı r-nunun Sırıq i ə v -də kənd Viləş çayının sahilində, dağətəyi ərazidədir Keçmiş adı Sağolcandır Toponim təhrif olunaraq Soxulcan kimi yazılmışdır Sağolcan XIX əsrdə Lənkəran qəzasında yaşamış təklə tayfasının tirələrindən birinin adıdır XX əsrin 80-ci illərində kəndin adı guya pis səsləndiyi üçün dəyişdirilərək yaxınlığındakı bulağın adı ilə adlandırılmışdır

**Alçalı** *oyk*, *düz* 1 Kəlbəcər r-nunun Oktyabrkənd, Kilsəli və Qılıçlı i ə v -lərində üç kənd. Dağətəyi ərazidədir, 2 Salyan r-nunun Sarvan i ə v.-də kənd Bala Kürün sahilində, düzənlikdədir Oykonim *alça* (meyvə ağacı) və *-lı* (varlıq, bolluq ifadə edən şək ) komponentlərindən düzəlib, "alça ağacları çox olan və ya alça bağı olan kənd" deməkdir Bu meyvə ağacı ilə bağlı Alçalı dağ (Laçın, Xanlar), Alçalıdərə (Qubadlı Daşkəsən, Kəlbəcər, Cəbrayıl), Alçalıgöz (Ağsu r-nunun Bico kəndi), Alçalı yaylaq (Abşeron), Alçalı çuxur (Laçın), Alçalıq (Yardımlı r-nunun Vəlixanlı kəndi, Lerik r-nunun Veri kəndi) oroqrafik obyektlər, XIX əsrin əvvəllərində İrəvan xanlığında Alçalı adlı iki kənd qeydə alınmışdır

**Aldədə** *or*, *mür* Tovuz r-nu ərazisində pir Oronim *al* (böyük) və *dədə* (ata) sözlərindən düzəlib, "böyük ata" deməkdir Oronim burada dəfn olunan şəxsin müqəddəsliyini ifadə edir

**Aleksandrovka** *oyk*, *düz* 1 Sabirabad r-nunun eyniadlı i ə v -də kənd Kür çayının sağ sahilindən bir qədər aralı, Muğan düzündədir 2004-cü ildən adı dəyişdirilərək Şəhriyar olmuşdur; 2 Xaçmaz r-nunun Aleksеyevka i ə v -də kənd 1992-ci ildən adı dəyişdirilərək Gödəkli olmuşdur Oykonim *Aleksandr* (antr ) və *-ovka* (rus aidlik, məxsusluq bildirən şək ) komponentlərindən düzəlib XIX əsrdə Rusiyanın Saratov, Voronej, Samara, Tombov və s quberniyalarından Azərb.-a köçürülmüş rus təhkimli kəndliləri, hərbiçiləri, təriqətçilərinin (sektantlarının) məskunlaşdıqları kəndlərdəndir

**Alekseyevka** *oyk*, *düz* 1 Quba r-nunun eyniadlı i ə v -də kənd XIX əsrdə rusların burada məskunlaşmasına qədər kəndin adı Dollekkənd olmuşdur; 2 Xaçmaz r-nunun eyniadlı i ə v -də kənd Qusar çayının sağ sahilindən bir qədər aralı, Samur-Dəvəçi ovalığındadır 1933-cü ildə Azərb -da Alekseyevka adlı digər iki kənd Qazax və Lənkəran r-nlarında qeydə alınmışdır XIX əsrdə rusların Azərb -da yerləşdirilməsi ilə bağlı yaranmışdır

**Aleutəpə** *or mür* Qarabağ ərazisində dağ Oronim *aleu* (alovlu) və *təpə* (müsbət

relyef formasını ifadə edən termin) sözlərindən düzəlib, "alovlu təpə" deməkdir Yaloylu təpə, Yanardağ kimi oronimlərin sinonimidir Kamçatka vilayətində Aleut adlı dağ, ada və yaşayış məntəqəsi vardır

**Alxan çölü** *or mür* Füzuli r-nu ərazisində çöl Oronim *alxan* (Köndələnçayla bağlıdır), *çöl* (düz ) və *-ü* (mənsub şək -si) komponentlərindən düzəlib, "Köndələnçayın axdığı çöl" deməkdir

**Alxanlı** *oyk, düz* Füzuli r-nunun eyniadlı i ə v -də kənd Köndələnçayın sol sahilində, Mil düzündədir Tədqiqatçıların əksəriyyəti bu oykonimi alıxanlı etnonimi ilə əlaqələndirir və belə bir məlumata istinad edirlər ki, kəndi XVIII əsrdə Qarabağ xanı Pənahəli xanın Naxçıvandan Qarabağa köçürdüyü kəngərlilərin alıxanlı tirəsi salmışdır Lakin nəzərə almaq lazımdır ki, *alxan* sözü Azərb dilinin qərb qrupu dialektlərində "köndələn qazılmış xəndək yeri" deməkdir Kəndin Köndələn çayının sahilində yerləşdiyini nəzərə alsaq, bu oykonimi "Köndələnçayın axdığı kənd" kimi izah etmək olar Çeçenistanda VI-XIII əsrlərdə alanların yaşayış məskəni olan Alxanqala yer adı və Alxançurt dağ adı da "köndələn" mənasında izah olunur

**Alxaslı** *oyk, sadə* Laçın r-nun eyniadlı i ə v -də kənd Hocazsu çayının sağ sahilində, Hocaz dağının şm -ş. yamacındadır Yerli əhalinin verdiyi məlumata görə, yaşayış məntəqəsini XVIII əsrdə Qazax sultanlığından köçmüş ailələr salmışlar Kəndin bünövrəsini onlardan Alxas adlı bir şəxs qoymuşdur Kənddəki binnətalılar, əhmədxanlı, hüseynlər və şalıxlı nəsilləri özlərini Alxasın törəmələri sayırlar Etnooykonimdir 1933-cü ildə Kəlbəcər r-nunda Alxaslı, Göyçay r-nunda isə Birinci və İkinci Alxasava (Alxasoba) adlı yaşayış məntəqələri qeydə alınmışdır

**Alxasova** *oyk, mür* Göyçay r-nunun İncə i ə.v -də kənd Bozdağın ətəyindədir 1993-cü ilədək Birinci və İkinci Alxasova kəndlərindən ibarət idi Oykonim "Alxasa məxsus oba" mənasındadır

**Alıbəyli** *oyk., sadə* Ağdam r-nunun Üçoğlan i ə.v -də kənd Düzənlikdədir Keçmiş adı Tərəkəmə Alıbəylidir Kəndi tərəkəmə elatının alıbəyli tirəsi saldığı üçün belə adlandırılmışdır Sonralar toponimin birinci komponenti düşmüşdür Etnooykonimdir 1933-cü ildə Cəlilabad r-nunun Qaralı i ə v -də də eyniadlı kənd qeydə alınmışdır

**Alıc** *oyk, sadə* Quba r-nunun Amsar i ə v -də kənd Qaraçayın sahilindədir Qədim türk dillərində *alıs/alış/alıç* sözü çoxmənalı olub, "çayın ağzı, mənsəbi, axar suyun hövzəyə töküləri yeri", "soyuq", "uzaq, uzaqda olan", "düz olmayan, kələ-kötür", "dəyişdirilmiş", "iynəyarpaqlı ağac", "vəhşi heyvan, quş" və s mənaları ifadə edir Oykonim "uzaqda olan, ucqar kənd" deməkdir 1933-cü ildə Quba r-nunun Digah kəndinin adı da Alıc Digah şəklində qeydə alınmışdır

**Alıcan** *oyk, düz.* Laçın r-nunun Köhnəkənd i ə v -də kənd Dağlıq ərazidədir. Yerli əhalinin verdiyi məlumata görə, kəndi Xocavənd r-nunun Susalıq kəndindən gəlmiş Alıcan adlı şəxs salmışdır Kənddə onun nəsli indi də alıcanlılar və ya əmiralılar adlanır Oykonim *alıc* (ucqar) və *-an* (yer, məkan anlayışı ifadə edən şək.) komponentlərindən düzəlib, "ucqar yer" deməkdir Etnotoponim olması da mümkündür

**Alıcqışlaq** *oyk mür* Xaçmaz r-nunun Aşağı Zeyd i ə v -də kənd Düzənlikdədir Yaşayış məntəqəsini XIX əsrin ortalarında Qubanın Alıc kəndindən köçüb gələn ailələr salmışlar "Alıc kəndinin qışlağı, alıclıların qışlağı" mənasını bildirir

**Alıkeyxalı/Alıkeyxalı/Alıkovxalı** *oyk, düz* Cəbrayıl r-nunun Soltanlı i ə.v -də kənd Dağətəyi ərazidədir Yaşayış məntəqəsi keçmişdə Bəydili adlanan ərazidə salınmışdır Yerli əhalinin məlumatına görə, XVI əsrdə yaşamış Cəbrayıl adlı kişinin altı oğlundan birinin adı Alı olmuşdur Ataları öldükdən sonra onların saldıqları kəndlər də öz adları ilə adlanmışdır Bu kəndlərdən biri də indiki Alıkeyxalı (Alıkovxalı)dır. Oykonim *Alı kovxa* (antr ) və *-lı* (mənsubluq, aidlik ifadə edən şək ) komponentlərindən düzəlib, "Alı yüzbaşıya məxsus kənd" deməkdir Zaqatala r-nu ərazisində Alkoxalı (Alıkovxalı) çay adının qeydə alınması bu ərazidə də vaxtilə eyniadlı yaşayış məntəqəsinin olmasından xəbər verir





**Alıkənd** *oyk., mür* Kəlbəcər r-nunun Oktyabrkənd i ə.v -də kənd Şahdağ silsiləsinin ətəyindədir Keçmiş adı Alılıdır Yerli əhalinin məlumatına görə, kəndi XIX əsrdə kəlbəcərli Alı Kərbəlayi Avaz oğlu özünə məxsus binə yerində salmış və yaşayış məntəqəsi də onun adı ilə adlandırılmışdır (Alılı kənd/Allıkənd/Alı kənd) Oykonim *Alı* (antr ) və *kənd* (yaşayış məntəqəsi termini) sözlərindən düzəlib, "Alıya məxsus kənd" deməkdir. 1933-cü ildə Göyçay r-nunun Ramal və Şəkər i ə v -lərində daha iki Alıkənd kəndi qeydə alınmışdır.

**Alılar** *oyk, sadə* Cəlilabad r-nunun eyniadlı i ə.v -də kənd İnceçayın hər iki sahilində, düzənlikdədir Etnooykonimdir 2001-ci ildən rəsmi olaraq Alar adlandırılmışdır

**Alıncalı** *oyk, düz* Xanlar r-nunun Kolayır i ə v -də kənd Oykonim *Alınca* (qala adı, V-XIII əsr gürcü mənbələrində "Əlincə", "Kitabi-Dədə Qorqud" dastanlarında "Alınca qalası" kimi qeyd olunur) və *-lı* (mənsubluq, aidlik bildirən şək.) komponentlərindən düzəlib, "Alıncadan olanlar və ya Alıncadan gələnlər" deməkdir Naxçıvanda Əlincə/Alınca adlı məşhur qala, dağ və çay vardır

**Alırzalar** *oyk, sadə* Kəlbəcər r-nunun Başlıbel i ə v -də kənd Qaraxan çayının sahilində, Dəlidağın ətəyindədir Deyilənə görə, kəndin əsasını Laçın r-nunun keçmiş Muncuqlu kəndinin sakini Hacı Alırza adlı şəxs qoymuşdur Etnooykonimdir 1988-ci ilədək Ermənistanın Ararat rayonunda eyniadlı kənd olmuşdur

**Alırzalı** *oyk. sadə* Goranboy r-nunda kənd Düzənlikdədir Yerli əhalinin verdiyi məlumata görə, yaşayış məntəqəsi XVIII əsrdə Qarabağ xanı İbrahimxəlil xanın darğası, Ağdam r-nunun Sarıcalı kənd sakini Alırzanın Gullücə kəndindən gətirdiyi ailələrin məskunlaşması nəticəsində yarandığı üçün həmin darğanın adı ilə adlandırılmışdır

**Alışar** *oyk, düz* Şərur r-nunun Yengicə i ə v -də kənd Elmi ədəbiyyatda bu oykonimin izahı belə verilir *alış* (qədim türk dillərində "çay ağzı, çayın mənsəbi, axar suyun hövzəyə töküləri yeri") və *ar* ("qarşı, əks tərəf" mənasını ifadə edir) komponentlərindən düzəlib, "çay ağzının əks tərəfi" deməkdir Kəndin Xələcdaşı dağının ətəyində, Arazın sahilində, çay suyunun güclü axaraq töküldüyü yerin əks tərəfində yerləşməsi bu fikri təsdiq edir

**Alqışlaq** *oyk., mür* Xaçmaz r-nunun Aşağı Zeyd i ə v -də kənd 1979-cu ildə Alıqışlaq şəklində qeydə alınmışdır Oykonimi iki cür izah etmək olar 1 *al* (burada "böyük") və *qışlaq* (qış mənzili, yaşayış məntəqəsi termini) sözlərindən düzəlib, "böyük qışlaq, böyük kənd" deməkdir, 2. *Alı* (antr ) və *qışlaq* (kənd) sözlərindən düzəlib, "Alı adlı şəxsə məxsus qışlaq yeri" deməkdir

**Allahqulubağ/Allahqulubağı** *oyk. mür* Zərdab r-nunun Gəlmə i ə v -də kənd. Kür çayının sahilindədir Oykonim *Allahqulu* (antr ), *bağ* (meyvə ağacları əkilmiş sahə) və *-ı* (mənsub şək.-si) komponentlərindən düzəlib Mənbələrin verdiyi məlumata görə, 1855-ci ildə Zərdab icmasına aid olan Kür qırağındakı 740 desyatinlik tut bağları sonralar ayrı-ayrı bəylər və ruhanilər arasında bölüşdürülmüşdü Həmin bağlardan biri Allahqulu adlı bəyə mənsub olmuşdur Zərdabdan və başqa yerlərdən gəlmiş ailələr həmin ərazidə məskunlaşdıqdan sonra bağ yeri kəndə çevrilmiş və həmin bəyin adını daşımışdır Kəndin adı "Allahqulu adlı şəxsə məxsus bağ yeri" deməkdir 1917-ci ildə Birinci və İkinci Allahqulubağı adı ilə iki kənd kimi qeydə alınmışdır

**Allahqulu bulağı** *hidr, mür* Yardımlı r-nunun Vergədüz kəndində bulaq Hidronim *Allahqulu* (antr ), *bulaq* (su obyekti termini) və *-ı* (mənsub şək -si) komponentlərindən düzəlib, "Allahqulu adlı şəxsə məxsus bulaq" deməkdir

**Allahqulular** *oyk sadə* Şuşa r-nunun Şırlan i ə v -də kənd Xəlfəli çayının sahilində, düzənlikdədir Keçmiş adı Allahquluuşağı olmuşdur XIX əsrin əvvəllərində bu kəndi Qarabağ xanı Mahmudqulu xana mənsub xəlfəli elatının allahquluuşağı nəsli salmışdır Etnooykonimdir

**Allahmədədli** *oyk, sadə* İmişli r-nunun Məmmədli i ə v -də kənd Mil düzündədir Şahsevənlərin Muğanlı tayfasının allahmədədli tirəsi keçmişdə yayı Kəlbəcər dağlarında, qışı isə indiki kəndin yerində keçir-

mişdir XIX əsrin sonlarında onlar öz qışlaq yerində məskunlaşmış və indiki yaşayış məntəqəsini yaratmışlar Etnooykonimdir

**Allahverdi gölü** *hidr., mür* Abşeron yarımadasında göl Hidronim *Allahverdi* (antr.), *göl* (su obyekti termini) və *-ü* (mənsub şək.-si) komponentlərindən düzəlib, "Allahverdiyə məxsus göl" deməkdir Keçmişdə torpaq xüsusi şəxslərin olduğu kimi, bəzi təsərrüfat əhəmiyyəti olan göllər də ayrı-ayrı adamlara məxsus idi Bu səbəbdən də Azərb.-da şəxs adı daşıyan bir sıra göllər vardır Lerik r-nunun Kodərə kəndində Allahverdi yeri, Ermənistanda Allahverdi şəhəri qeydə alınmışdır

**Allahverənli** *oyk., sadə* Cəlilabad r-nunun Xəlilli i ə v.-də kənd Həmşirə çayının sahilində, Burovar silsiləsinin yamacındadır Kəndin əsasını XIX əsrin birinci yarısında allahverənli nəslinə mənsub ailələr qoymuşlar Etnooykonimdir

**Allahyarlı** *oyk., sadə* 1 Beyləqan r-nunun Eyvazlılar i ə v.-də qəsəbə Mil düzündədir 1986-cı ildə Biləsuvar r-nunun Səmədabad kəndindən köçmüş allahyarlı nəslinə mənsub ailələrin məskunlaşması nəticəsində salınmışdır Allahyarlılar vaxtilə Birinci Şahsevən kəndinin yaxınlığında Allahyarlı obası deyilən yerdə yaşamış, sonralar Səmədabad kəndinə köçmüşdülər; 2 Masallı r-nunun Yeyənkənd i ə v.-də kənd Dağətəyi düzənlikdədir Yaşayış məntəqəsi öz adını eyvazlılar elinə mənsub allahyarlı nəslinin adından almışdır; 3 Siyəzən r-nunun Ərziküş i ə v.-də kənd Dağətəyi ərazidədir Oykonim allahyarlı nəslinin adı ilə bağlıdır Etnotoponimdir

**Allanmış göl** *hidr., mür* Ataçay hövzəsində göl Hidronim *allanmış* (qızarmış, qırmızı rəngə çalan) və *göl* (su obyekti termini) sözlərindən düzəlib, "qızarmış göl" deməkdir

**Allı/Allıçay** *hidr., sadə* Xocavənd r-nunda çay Quruçayın sağ qoludur. Böyük Kirs dağından, 2280 m. hündürlükdən başlanır Aşağı axınında İgah adlanır Çay öz adını vaxtilə burada mövcud olmuş Allı yaşayış məntəqəsinin adından almışdır 1917-ci ildə Lənkəran qəzasında Allı adlı kənd qeydə alınmışdır

**Almaarx** *hidr., mür* Yevlax r-nu ərazisində arx Tədqiqatçıların böyük əksəriyyətinin fikrincə, "alma" sözü ilə bağlı toponimlər alma ağacı ilə zəngin obyektləri bildirir Lakin "alma" komponentli toponimlərin bağlı olduğu obyektlərin müxtəlifliyi və arealının genişliyi bu fikirlə razılaşmağa əsas vermir Belə ki, Alma Ata (Tatarıstan), Alma Atı (Qazaxıstan), Alma Kerman, Alma Tamak, Alma Tarxan (Krım), Alma/Zeda Alma (Acarıstan), Almazar (Özbəkistan), Alma çayı (Krım dağlarından axır), Alma Arasan (Qazaxıstan), Almalı (Azərb., Cənubi Azərb., Ermənistan) və s. coğrafi adların hamısı alma ağacı ilə bağlı ola bilməz. Türk dillərində *alma* sözünün "meyvə növü" mənasından başqa "dəyişmə", "alınma, götürülmə", "üstün, daha yaxşı" "turş", "almat/almatı" şəklində isə "təbəə, rəiyyət, tabeçilik" mənalarında işləndiyini və Alma Atı (Qazaxıstan) şəhərinin və Almatinka çayının rus mənbələrində "Vernıy", "reka okolo Vernoqo" adlanmasını nəzərə alsaq bu fikri təsdiq etmiş olarıq Bu baxımdan Yevlax r-nundakı Almaarx hidronimi *alma* (alınma) və *arx* (su obyekti termini) sözlərindən düzəlib, "hansısa su hövzəsindən alınma, ayrılma arx" deməkdir

**Almabulaq** *hidr., mür* Yardımlı r-nunun Horavar kəndində bulaq Hidronim *alma* (turş) və *bulaq* (su obyekti termini) sözlərindən düzəlib, "turş bulaq, turş su" deməkdir

**Almalı** *oyk., düz.* 1 Qax r-nunun eyniadlı i ə v.-də kənd Almalı çayının sahilində, Alazan-Həftəran vadisindədir Yaşayış məntəqəsi eyniadlı sahədə salındığı üçün belə adlandırılmışdır Kəndin ərazisində Almalı nüyü (Almalı dərəsi) adlanan başqa bir obyekt də qeydə alınmışdır Yerli əhalinin verdiyi məlumata görə, kənd Samux r-nundan gəlmiş ailələr tərəfindən salınmışdır; 2 Daşkəsən r-nunun Zinzahal i ə v.-də kənd Murovdağ silsiləsinin yamacında, Gəncə çayının sahilindədir Yaşayış məntəqəsi əvvəllər Almalı adlanan yamacda qonşu Zinzahal kəndindən köçmüş ailələr tərəfindən salınmışdır Oykonim *alma* (meyvə ağacı) və *-lı* (varlıq, bolluq bildirən şək.) komponentlərindən düzəlib, "alma bağı olan kənd" deməkdir Qax r-nunda Armudlu adlı kəndin olması bunu bir daha sübut edir; 3 Xocalı r-nunun eyniadlı i ə v.-də kənd Dağətəyi ərazidədir Azərb.-nın şm.-ı Rusiya tərəfindən işğal olunduqdan sonra burada gəlmə ermənilər məskunlaşmış, kəndin adını da tədricən erməni dilinə tərcümə edərək Xndzıristan (erməni dilində "almalı" deməkdir) qoymuşdular Sovet hakimiyyəti illərində bu adla da rəsmiləşdirilən kənd 1992-ci ildən yenidən Almalı adlandırılmışdır

**Almalı dağ** *or., mür* 1 Şahbuz r-nunda dağ. Aşağı Rəməşin kəndindən ş.-də yerləşir Hün 2150 m., 2 Şəki r-nu ərazisində dağ Oronim *almalı* (cır alma ağaclarından ibarət bitki örtüyü olduğu üçün) və *dağ* (müsbət relyef forması) sözlərindən düzəlib Şəki r-nundakı Almalı yaylağı oronimi də ərazidəki dağın adındandır

**Almalıq** *oyk., düz.* Kəlbəcər r-nunun eyniadlı i ə v.-də kənd Tutquçayın sahilində, Laçın dağının (Kiçik Qafqaz) ətəyindədir Kəndin ərazisi XIX əsrin ortalarında sarallı tayfasına mənsub səkkiz evdən ibarət elatın qışlaq yeri olmuşdur Qışlaq cır alma ağacları olan ərazidə yerləşdiyi üçün belə adlandırılmışdır 1934-40-cı illərdə yaxınlıqdakı Otaqlar, Gözlübulaq, Ortakənd və Çayqışlaq kəndlərindən köçmələrin bu ərazidə məskunlaşması ilə Almalıq kəndi yaranmışdır *Almalıq* "alma ağacları ilə zəngin olan yer; alma bağı" deməkdir Quba r-nunun Davudoba və Hacıqayıb kəndlərində Almalıq adlı iki sahə, Yardımlı r-nunun Vəlixanlı kəndində Almalıq adlı yer qeydə alınmışdır Almalıq adına Muq dağından tapılmış VIII əsrin əvvəllərinə aid sənədlərdə rast gəlmək olar Orta əsrlərdə Türkmənistan ərazisində bir neçə Almalık toponimi qeydə alınmışdır Özbəkistanın Daşkənd vilayətində Almalıq adlı şəhər, Dağıstanda Almalıq kəndi, Almalıqçay adlı çay var

**Almalıtala** *oyk., mür* Tovuz r-nunun Qəbbli i ə v.-də kənd Zəyəm çayının sahilindədir Oykonim *almalı* (alma ağacları olan) və *tala* (ətraf ərazidən fərqli sahə) sözlərindən düzəlib, "alma ağacları olan tala" deməkdir Keçmişdə Çanaxçı da adlanırdı Yaşayış məntəqəsi cır alma ağaclarının bol olduğu talada çanaxçı nəslinin məskunlaşması nəticəsində yaranmışdır Almalıdərə (Oğuz, Zəngilan, Göyçay, Laçın), Almalı düzü (Kəlbəcər), Almalı çökək (Gədəbəy), Almalı çuxur (Laçın) yer adları da "alma ağacları ilə zəngin yer" mənasını ifadə edir

**Almaz** *hidr., sadə* Oğuz və Qəbələ r-nları ərazisində dağ Əlican və Türyan çaylarının suayrıcında yerləşir Hün 395 m Olmaz variantında da qeydə alınmışdır Türk dillərində *almaz/almas* sözü "möhkəm daş", "polad", "parlaq" mənalarını ifadə edir Toponimiyada bu qiymətli daşın çıxarıldığı yataq da göstərilir. Voroşilovqrad, Rostov vilayətlərində və Yakutiyada qeydə alınmış Almaznaya, Almaznıy şəhər və qəsəbələri belələrindəndir Oğuz r-nundakı Almaz oronimi isə "möhkəm", "parlaq" mənasındadır

**Almu** *oyk., sadə* Lerik r-nunun Vizəzəmin i ə v.-də kənd Burovar silsiləsinin ətəyindədir Türk dillərində *alım/alımı* "yaxın, əldə edilmiş" deməkdir Oykonim kəndin mərkəzə yaxın olmasını bildirir

**Alolar** *oyk., sadə* Kəlbəcər r-nunun Keşdək i ə v.-də kənd Alolar çayının (Tərtər çayının qolu) sahilindədir Yaşayış məntəqəsi XIX əsrin ortalarında Keşdək kəndinə məxsus binə olmuşdur Sonralar həmin kənddən alolar nəslinə mənsub ailələrin burada daimi məskunlaşması nəticəsində yaşayış məntəqəsi yaranmışdır Etnotoponimdir

**Alolar gölü** *hidr., mür* Kəlbəcər r-nunda göl Bəzi mənbələrdə Alovlar gölü şəklində qeydə alınmışdır Göl ya təbii şəraitdən qurumuş, ya da qurudulmuşdur Hidronim *Alolar* (yerləşdiyi yaşayış məntəqəsinin adıdır), *göl* (su obyekti termini) və *-ü* (mənsub şək.-si) komponentlərindən düzəlib, "Alolar kəndinin gölü" deməkdir

**Alpan** *or., sadə* Quba r-nu ərazisində dağ Toponim qədim alban tayfa adını özündə əks etdirir Albanlar Azərb.-nın türk mənşəli qədim yerli sakinləri olmuşlar

**Alpan** *oyk., sadə* Quba r-nunun eyniadlı i ə v.-də kənd Quruçayın sağ sahilində, Qusar maili düzənliyindədir Kəndin ərazisində e.ə. 1 minilliyə aid Alpan şəhərgahı var Etnotoponimdir

**Alpı** *oyk., düz.* Ucar r-nunun Quləbənd (Güləbənd) i.ə.v.-də kənd. Şirvan düzündədir. Yerli əhalinin verdiyi məlumata görə, kənd keçmişdə Alplı adlanmışdır. Bəzi mənbələr bu toponimi Alplı etnotoponiminin fonetik dəyişikliyə uğramış forması kimi qəbul edir. Türk dillərində *alp* "böyük, iri, yüksək", "qəhrəman", "atıcı", "pəhləvan", monqol dilində *alba/alpa* "vergi, gəlir növü", "məcburi xidmət" deməkdir. Beləliklə, Alpı kəndinin adı "böyük kənd" və ya "vergi verən kənd" mənasını ifadə edir.

**Alpout** *or., sadə.* 1. Bərdə r-nunun eyniadlı i.ə.v.-də kənd. Yuxarı Qarabağ kanalından bir qədər aralı, Qarabağ düzündədir; 2. Goranboy r-nunun Fəxralı i.ə.v.-də kənd. Gəncə-Qazax düzənliyindədir. 1953-cü ildə keçmiş Samux r-nunun Alpout kəndinin buraya köçürülməsi ilə yaranmış yaşayış məntəqəsi keçmiş kəndin adını saxlamışdır; 3. Göyçay r-nunun eyniadlı i.ə.v.-də kənd. Şilyan çayının sol sahilində, Şirvan düzündədir; 4. Qazax r-nunun eyniadlı i.ə.v.-də kənd. Coqas çayının sol sahilində, dağ ətəyindədir; 5. Laçın r-nunun Qoşasu i.ə.v.-də kənd. Hocazsu çayının sol sahilində, Qabaqtəpə dağının ətəyindədir; 6. Ucar r-nunun eyniadlı i.ə.v.-də kənd. Şirvan düzündədir. 1914, 1917-ci illərə aid mənbələrdə Azərb.-nın Quba, Ağdam, Şamaxı (2), Samux r-nlarında da Alpout adlı kəndlər qeydə alınmışdır. Etnotoponimdir. Məlumdur ki, VIII əsrdən mənbələrdə adları çəkilən alpoutlar Səfəvilərə hərbi xidmət etdiklərinə görə Cənubi Qafqazın müxtəlif yerlərində torpaqlar almışdılar. Bu da Alpout adının yayılma arealına öz təsirini göstərmişdir.

**Alpout** *hidr., sadə.* Qazax r-nu ərazisində çay. Çay öz adını eyniadlı yaşayış məntəqəsinin adından almışdır.

**Alpout dərəsi** *or., mür.* Şamaxı r-nu ərazisində dərə. Oronim *Alpout* (kənd adı), *dərə* (mənfi relyef forması) və *-(s)i* (mənsubiyyət şək.-si) komponentlərindən düzəlib, "Alpout kəndinin dərəsi" deməkdir. 1917-ci ildə Şamaxı ərazisində Erməni Alpout və Türk Alpout adlı iki kənd qeydə alınmışdır.

**Alpoutdərə** *hidr., sadə.* Şamaxı r-nu ərazisində çay. Alpout dərəsindən axdığı üçün adını həmin dərədən almışdır.

**Altıağac** *oyk., mür.* Abşeron r-nunun eyniadlı i.ə.v.-də kənd. Ataçayın sahilində, Baş Qafqaz silsiləsinin ş. ətəyindədir. XIX-XX əsrlərdə Şurabad da adlanırdı. Oykonim *altı* (say) və *ağac* (qədim uzunluq ölçü vahidi, təqribən 6-7 km.-ə qədər məsafəni bildirir) sözlərindən düzəlmişdir. Həqiqətən də Altıağac kəndi ilə keçmişdə poçt məntəqəsi və ona məxsus karvansarası olan Şamaxı arasındakı məsafə 6 ağaclıqdır. Yaşayış məntəqəsi mərkəzlə arasındakı məsafəyə görə bu adı almışdır. Altıağac oykoniminə ilk dəfə 1823-cü ilə aid mənbədə təsadüf olunur. İranın Qafqaz vilayətində də Altıağac adlı yaşayış məntəqəsi qeydə alınmışdır.

**Altıağac** *hidr., sadə.* 1. Abşeron r-nunda mineral bulaq. Altıağac kəndindən 0,5 km c.-ş.-də yerləşir. Suları soyuq və kükürdlüdür. Adını eyniadlı yaşayış məntəqəsindən almışdır; 2. Abşeron r-nunda çay. Mutyanka çayından ayrılan sağ qoldur. Adını ərazidəki eyniadlı yaşayış məntəqəsindən almışdır.

**Altınca** *oyk., düz.* Qubadlı r-nunun Kavdadıq i.ə.v.-də kənd. Həkəri çayının sahilində, dağətəyi ərazidədir. Keçmiş adı Altınca Qiyaslı, yaxud Narlı Qiyaslı olmuşdur. Yerli əhalinin verdiyi məlumata görə, XIX əsrdə Naxçıvanın Nehrəm kəndindən qiyaslı nəslinə mənsub ailələr Narlı (Narlıdərə) adlanan bu əraziyə köçərək kəndin bünövrəsini qoymuşlar. Bu oykonim 1917 və 1933-cü illərdə Altınçı, 1961-ci ildə Altıncı şəklində qeydə alınmışdır. Türk dillərində *altın/ altun* "qızıl", "mis" mənasında işlənir, *-çı* isə peşə, sənət bildirən şək.-dir. Beləliklə, əsli Altınçı olan bu oykonim "zərgər" və ya "misgər" deməkdir.

**Altıntaxta/Altuntaxta** *or., mür.* Qarabağ silsiləsində aşırım. Kırs dağından c.-da, Laçın r-nu ilə Xocavənd r-nu arasındadır. Hün. 2242 m. Oronim altun (qızıl) və taxta (dağlıq yerdə hamar sahə, ətraf sahələrdən fərqli olaraq hündür ərazidə düzənlik) sözlərindən düzəlib. Tədqiqatçıların bir qismi bu oronimi "qızıl çıxarılan dağda hamar sahə", digər qismi isə dağın vulkan mənşəli olmasından çıxış edərək "dağda qırmızı süxurlardan ibarət hamar sahə" kimi izah edirlər. Lakin nəzərə almaq lazımdır ki, toponimiyada qırmızı rəngi ifadə etmək üçün "altun" deyil, "qızıl" sözündən istifadə olunur. Ona görə də bu oronimi ya qiymətli metal olan qızılla (və ya mislə), ya da onun qızıl kimi parıldaması ilə əlaqələndirmək lazımdır.







**Alunitdağ** *oyk., mür.* Daşkəsən r-nunun Daşkəsən şəh. i.ə.v.-də qəsəbə. Qaflanqala silsiləsinin c. ətəyindədir. Bir müddət "85-ci sahə" adlanmışdır. 1958-ci ildən Alunitdağ mədəni yaxınlığında salındığı üçün belə adlandırılmışdır. Toponim elmi ədəbiyyatda alunit (mineral adı) və dağ sözlərinin birləşməsi kimi izah olunur. Bəzi türkdilli xalqların toponimiyasında *alin/alun* və *it*-dağın c. tərəfi, c. ətəyi deməkdir. Qəsəbənin coğrafi mövqeyi onun "dağın cənub ətəyi" mənasında olduğunu bir daha sübut edir.

**Alvadı** *or., mür.* Masallı r-nu ərazisində dağ. Oronim *al* (burada "yüksək") və *vadı /vartı/virdu/artı* (təpə; aşırım) sözlərindən düzəlib, "yüksək təpə, dağ aşırımı" deməkdir. Dağın yaxınlığındakı kənd də onun adını daşıyır (b.a.x. Köhnə Alvadı, Təzə Alvadı). Yerli əhali toponimi "qırmızı vadi" (çoxlu qırmızı lalə bitdiyi üçün) kimi izah edir.

**Amankənd** *oyk., mür.* Biləsuvar r-nunun eyniadlı i.ə.v.-də kənd. Muğan düzündədir. Toponimikada bu yaşayış məntəqəsinin adını Qarabağın otuzikilər tayfasının amanlı tirəsinin adı ilə bağlayırlar. Oykonim "amanlı tirəsinə məxsus kənd" deməkdir. Etnotoponimdir.

**Amanlı** *oyk., sadə.* Qax r-nunun Qıpçaq i.ə.v.-də kənd. Alazan-Əyriçay çökəkliyindədir. Etnotoponimdir.

**Amaras** *hidr., mür.* Xocavənd r-nu ərazisində çay. Qədim Alban şəhəri Amarasın xarabalığı çayın sahilindədir. Hidronim *amar* (qəd. türk. "çay") və *as* (böyük çay qolu) sözlərindən düzəlib, "böyük çay qolu" deməkdir.

**Ambar** *hidr., sadə.* Şəmkir r-nu ərazisində çay dərəsi. *Ambar* türk dillərində "su yığılan yer", "su saxlanan yer", "müxtəlif ərzaq məhsulları və s. saxlanan yer" deməkdir. Türkiyədə Ambarlı, Gürcüstanda Ambartəpə, Kareliyada Ambarnıy adlı yaşayış məntəqələri var.

**Ambardağ/Anbardağ** *or., mür.* Şəmkir r-nu ərazisində dağ. Cəyir çayının sağ sahilindədir. Hün. 1125 m. Oronim *Ambar* (ərazidəki eyniadlı çay dərəsinin adı) və *dağ* (müsbət relyef forması termini) sözlərindən düzəlib, "Ambar dərəsi yaxınlığında dağ" deməkdir. Bəzi mənbələrdə Anabardağ şəklində qeydə alınmışdır. Yakutiyada Anabar adlı çay və r-n vardır.

**Ambu** *oyk., mür.* Lənk. r-nunun Biləbənd i.ə.v.-də kənd. Peştəsər silsiləsinin yamacındadır. Tədqiqatçıların fikrincə, *ambu/ambo* talış mənşəli söz olub, "yabanı xurma", "armud", "ambar" deməkdir. Yerli əhalinin verdiyi məlumata görə, bu toponim Ambuhoni adından təhrif olunmuşdur. Talış dilindəki ambu (armud) və honi (bulaq) sözlərindən düzəlib "armudlu bulaq" mənasındadır. Lakin türkdilli xalqların toponimiyasında *am* "keçid"; "ağız", "yarğan", "dərə", *bu*(*r*) isə "yüksəklik" mənalarını ifadə edir. Kəndin coğrafi mövqeyini nəzərə alsaq, demək olar ki, *ambu* sözü "dağ keçidi" mənasına uyğundur. 1961-ci ildə Anbu şəklində qeydə alınmışdır.

**Amburan** *or., mür.* Bakıda, Xəzər dənizində burun. Qədim Bilgəh kəndinin yaxınlığında olduğu üçün Köhnə Bilgəh burnu da adlanır. Oronim *am* (ağız) və *buran/burun* (çıxıntı) sözlərindən düzəlib, "çay ağzında, çay mənsəbində olan çıxıntı" deməkdir. 1917-ci ildə Lənkəran qəzasında Amburan adlı kənd qeydə alınmışdır.

**Amburdərə** or., mür. Lənk. r-nu ərazisində dərə. Oronim *ambur* (yarğan, dərə, keçid) və *dərə* (mənfi relyef forması; çuxur) sözlərindən düzəlib, "yarğan, çay dərəsi" deməkdir.

**Amburdərəçay** *hidr., mür.* Lənk. r-nunda çay. Hidronim *Amburdərə* (or.) və *çay* (su obyekti termini) sözlərindən düzəlib, "Ambur dərəsindən axan çay" deməkdir.

**Ambuzəmi/Ambuzyami** *or., mür.* Astara r-nunun Tərədi kəndi ərazisində dağ. Oronim *ambu* (dağ keçidi) və *zəmi* (yer, sahə) sözlərindən düzəlib, "keçidi olan dağ" deməkdir. Həmin r-nun ərazisində Ambon və Ambubənd coğrafi obyektləri də qeydə alınmışdır.

**Ametist** *hidr., sadə* Şahbuz r-nu ərazisində min bulaq Ametist şəffaf göy və ya bənövşəyi rəngli qiymətli mineral daşdır Bulağın adı həmin ərazidə ametist mineralının çıxarılması ilə bağlıdır

**Amirki/Amiraki** *or. mür* İsmayıllı r-nu ərazisində dağ Oronimi qismən təhrifə uğramış (Əmir oku) hesab edən bəzi tədqiqatçılar *Əmir* və *ku* (tatca "dağ") sözlərindən ibarət olan toponim kimi "Əmirin dağı" mənasına üstünlük verirlər Oronim *amir* (amur türk dillərində və monqol dilində "sakit dinc") və *ki* (ku/kuh İran dillərində "dağ") sözlərindən düzəlib, "sakit dağ, dinc dağ" deməkdir

**Amsar/Əmsar** *oyk., sadə.* Quba r-nunun eyniadlı i o v -də kənd Ağçayın sahilində, dağətəyi düzənlikdədir Tədqiqatçıların fikrincə, oykonim ərəb mənşəli *əmsar* (mesr sözünün cəmi) "böyük şəhər, ölkə", "böyük yaşayış məntəqəsi" sözü ilə bağlıdır Görünür, Ərəb xilafəti dövründə yaşayış məntəqəsi başqalarına nisbətən böyük və əhalisi çox olduğuna görə onu Amsar (Əmsar) adlandırmışlar

**Amsar** *hidr., sadə* Quba r-nunda Amsar kəndindən q -də min bulaq Azdəbitlidir Suyu soyuq, rəngsiz və şəffafdır Suyu bir qədər qızdırmaqla yerli əhali tərəfindən müalicə üçün istifadə edilir Adını yaxınlığında yerləşdiyi eyniadlı yaşayış məntəqəsindən almışdır

**Amsarqışlaq** *oyk., mür* Quba r-nunun Alekseyevka i o v -də kənd Qusar maili düzənliyindədir Amsar kəndindən köçüb gələnlər tərəfindən salınmışdır Oykonim *Amsar* (oyk ) və *qışlaq* (qış mənzili) sözlərindən düzəlib, "Amsar kəndinə aid qışlaq yeri" deməkdir 1933-cü ildə Amsarqazma kimi qeydə alınmışdır

**Amuduq** *or sadə* Qubadlı r-nu ərazisində dağ Dağın üstündə qədim yaşayış məskəninin yeri və təbii istehkamı xatırladan Amuduq məbədi var Türkiyədə Van gölünün yaxınlığındakı Amid qalasının adı ilə eyni mənşəli olması ehtimal olunur Xalq etimologiyasına görə, oronim Armudluq sözünün təhrif olunmuş formasıdır

**Anaarx** *hidr., mür* Tovuz, Ağsu, Neftçala, Ağdaş, Tərtər r-nlarında arxlar Hidronim *ana* (böyük, əsas, baş) və *arx* (su obyekti termini) sözlərindən düzəlib Obyekti ölçü cəhətdən təyin edir

**Anabad** *oyk., mür* Ordubad r-nunun Ordubad şəh i o.v -də kənd Zəngəzur silsiləsinin c ətəyindədir Bu sözlə bağlı Anabad yeri (Qubadlı), Anabad dərəsi (Laçın) və s mikrotoponimlər mövcuddur Van gölündən c -da, Anabad məbədinin yaxınlığında Anabad adlı kənd var Tədqiqatçılar toponimi orta fars dilindəki *anapat* (adam yaşamayan, abad olmayan yer) sözü ilə bağlayırlar Oykonim *ana* (əsas, böyük, baş) və *bad/batlbet* (dağ yamacı, eniş, dağ ətəyi) sözlərindən düzəlib, "böyük dağ ətəyi" deməkdir. 1918-ci ilədək Ermənistanın Qafan r-nunda Anabad adlı yaşayış məntəqəsi olmuşdur.

**Anabad Qayadın** *or., mür* Babək r-nu ərazisində dağ Əznəbürd kəndindən şm -da yerləşir Hün 2077 m Bəzi ədəbiyyatlarda Anabad Gədik kimi də işlədilir Oronim *Anabad* (oyk ), *qaya* (dağ) və *dın* (maldarların dincəldiyi yer, yaylaq) sözlərindən düzəlib, "Anabad kəndinin dağda yaylaq yeri və ya Anabad kəndinin yaylağı olan dağ" deməkdir

**Ana Zağa** *or., mür* Qobustanda mağara Oronim *ana* (baş, böyük, əsas) və *zağa* (oyuq, quyu, mağara) sözlərindən düzəlib, "böyük mağara" deməkdir

**Anart** *or., mür* Bakıda palçıq vulkanı Oronim türk dillərindəki *an* (çökək, quyu, yeraltı boşluq) və *art* (yüksəklik) sözlərindən düzəlib, "yüksəklikdə quyu, dağda yeraltı boşluq, vulkan" deməkdir

**Anbabu** *oyk., düz.* Astara r-nunun Asxanakəran i o v -də kənd Boşərü çayının sahilində, Peştəsər silsiləsinin ətəyindədir Anbobu, Anbubu, Anbobo variantlarına da təsadüf olunur 1917 və 1961-ci illərdə Ambu şəklində qeydə alınmışdır Talış dilində *ambu* "anbar" deməkdir

**Anbardağ** b a x Ambardağ

**Ancaqov** *oyk mür* Lerik r-nunun Bürsülüm i o v -də kənd Peştəsər silsiləsinin yamacındadır Bəzi tədqiqatçılara görə, Ancaku sözündən təhrifdir Güman edilir ki, qıpçaqların *ancə* tayfasının adından və talış dilindəki *ku* (yer, ərazi) sözündən ibarət olub,





"əncələrin məskən yeri" mənasındadır Əslində oykonim talış dilindəki *anca* (doğramaq, kəsmək) və *qovlgav* (öküz, qaramal) sözlərindən ibarət olub, "mal kəsilən yer, sallaqxana" deməkdir.

**Andreyev bankəsi** *hidr., mür* Bakıda, Xəzər dənizində dayazlıq. Rus dənizçilərindən birinin adı ilə bağlıdır.

**Andreyevka** *oyk., sadə* Cəlilabad r-nunun eyniadlı i.ə.v -də kənd. İncəçaydan bir qədər aralı, Lənkəran ovalığındadır XVIII əsrdə Rusiyadan köçüb gəlmiş kəndli icmalarından birinin adı ilə bağlıdır 1992-ci ildə kəndin əvvəlki adı özünə qaytarılaraq Qarazəncir adlandırılmışdır.

**Andurma** *oyk., sadə* Lerik r-nunun Çayrud i ə v.-də kənd Dağətəyi ərazidədir Türk dillərində andurma "qoruq, ov heyvanları ilə zəngin olan yer" deməkdir XX əsrin əvvəllərində kəndin əhalisi İrana köçmüş, sonralar kənd yenidən bərpa olunmuşdur Yerli əhalinin verdiyi məlumata görə, *andurma* talışca "dəmirağac" mənasındadır Yaşayış məntəqəsi dəmirağac bitən ərazidə salındığı üçün belə adlandırılmışdır Amur vilayətində Amdərma adlı qəsəbə vardır.

**Angəlan/Angəlan/Əngəlan** *or., düz* Abşeron r-nu ərazisində dağ. Türk dillərində *ankallangal* sözü "təəccüblü, heyranedici, qəribə", monq dilində isə *anq* "yarıq, çat, xəndək" mənalarını ifadə edir Oronim *angal* və *-an* (şək ) komponentlərindən düzəlib, "çatlamış yer və ya qəribə, heyranedici yer" deməkdir. 1917-ci ildə Quba qəzasında Angəlan, 1961-ci ildə isə Sumqayıtda Əngəlan adlı yaşayış məntəqələri qeydə alınmışdır

**Anqələvibənd/Anqılovibənd** *or., mür* Lənkəran r-nu ərazisində. Boşərü və Lomər çayları arasında dağ Hün 1160 m Oronim *anqıllanqülü* (talış "düyün", "qovşaq", "mərkəz", "bənd", "topa, yığın" mənalarını ifadə edir) və *bənd* (dağ) sözlərindən düzəlib, "mərkəzdə, ortada olan dağ" deməkdir Dağ iki çay arasında yerləşdiyi üçün belə adlandırılmışdır

**Anqələvikəş/Anqılovikəş** *hidr., mür* Lənkəran r-nunun Tatova kəndində çay Hidronim *Anqılovi* (ərazidəki dağın adı) və *kəş* (çay qolu) sözlərindən düzəlib, "Anqılovı yaxınlığından axan çay" deməkdir

**Anzor** *hidr. sadə* Naxçıvan ərazisində, Əlincə çayı dərəsində min bulaq Azdəbitlidir "Anzol" sözünün təhrif formasıdır

**Anzov** *oyk., sadə.* Yardımlı r-nunun Hamarkənd i o.v.-də kənd Peştəsər silsiləsinin yamacındadır Yerli əhali bu adı Anzo kimi tələffüz edir Kəndin keçmiş adı Ziviris olmuşdur XIX əsrin ortalarında aparılan araşdırmalara görə, kənddə cəmi beş ailə olmuşdur Mütəxəssislərin fikrincə, *anzol anzol* talış dilində "iki yarğan arasında kiçik torpaq sahəsi" deməkdir Lakin Qafqazda Andzav şəklində qeydə alınmış dağın adı "dar, çətinkeçilən; mağara" kimi izah olunur Tacikistanda, Hissar silsiləsindəki Anzob aşırımının adı da həmin məna ilə bağlıdır

**Anzovlu** *oyk., düz* Lerik r-nunun Çayrud i o v -də kənd Peştəsər silsiləsinin yamacındadır Kəndi Yardımlı r-nunun Anzov kəndindən çıxmış ailələr salmışlar 1917-ci ildə Anzoli, 1933 və 1961-ci illərdə Anzolu şəklində qeydə alınmışdır Oykonim "Anzovdan gəlmişlər" deməkdir. İran ərazisində Ənzəli adlı şəhər mövcuddur

**Apobənd** *or mür.* Lənkəran r-nunun Biləsər kəndi ərazisində dağ. Boşərü çayının sol sahilində yerləşir Hün 696 m Oronim *apo* (toponimiyada "papaq, yuvarlaq zirvə, dağ başı" kimi izah olunur) və *bənd* (dağ) sözlərindən düzəlib, "yuvarlaq zirvəli dağ" deməkdir 1917 və 1933-cü illərdə Lənkəran r-nunun Sefidor i o v -də Apo adlı kənd qeydə alınmışdır Sonralar həmin kəndin adı Aşağı və Yuxarı Apu kimi verilmişdir Filippində ən yüksək vulkan (2954 m) Apo, Xabarovsk vilayətində bir vulkan (çay və topo) Apokan adlanır

**Arabaçı** *oyk., sadə* 1 Gədəbəy r-nunun eyniadlı i o.v -də kənd Axınca çayının sağ sahilində, Murğuz silsiləsinin ətəyindədir Yerli əhali tərəfindən Şınıx Arabaçısı da adlanır XIX əsrin ortalarında indiki Çobankənd i o v -dəki Arabaçı kəndindən köçüb gəlmiş ailələr (azanlı, buyramlı, kəlbayılar, cülüylü tirələri) tərəfindən salınmışdır, 2 Gədəbəy r-nunun Çobankənd i o v -də kənd Dağətəyi ərazidədir Toponim oğuz tayfalarından salırların bir qolu olan arabaçılar tayfasının adını əks etdirir Etnotoponimdir

**Arabaçılar** *oyk., sadə.* Bərdə r-nunun Mustafaağalı i.ə.v.-də kənd. Qarabağ düzündədir. Arabaçılar Qarabağda yaşamış böyəhmədli tayfasının tirələrindən birinin adıdır. Etnotoponimdir.

**Aracı** *or., sadə.* Şahbuz r-nu ərazisində, Zəngəzur silsiləsində dağ zirvəsi. Şahbuz r-nu ilə Ermənistanın sərhədindədir. Hün. 3067 m. Oronim "arada olan, sərhəd" deməkdir. Azərb. dilində "türkeçarəçi, türkəçarə ilə müalicə edən" mənasında da aracı sözü işlənir. Təbii dağ çiçəklərinin müalicəvi xüsusiyyətini nəzərə alsaq, ikinci variant da qəbul oluna bilər.

**Araçadzor** *oyk., mür.* Kəlbəcər r-nunun eyniadlı i.ə.v.-də kənd. Xaçın çayının sol sahilində, Qarabağ silsiləsinin ətəyindədir. Dovşanlı kurqanları (e.ə. XI-IX əsrlərə aid 9 kurqan) kəndin yaxınlığındadır. Bəzi mənbələrdə Dovşanlı, Ayıdərəsi adları ilə də yad olunur. Tədqiqatçılar Araçadzor oykonimini erm. *arç* və *dzor* sözlərindən ibarət "ayı dərəsi" mənasını ifadə edən toponim kimi izah etmişlər. Əslində *araça/araçı* türk dillərində "qoruyucu, keşikçi", *zor/zur* "təpə, zirvə" deməkdir. 1992-ci ildən kəndin adı Dovşanlı kimi rəsmiləşdirilmişdir.

**Arakəç** *or., mür.* Xəzər dənizində ada. Türk dillərində *arak* "su, cövhər, tər", *aç/açak* "qucaq, ətraf, əhatə" deməkdir. *Arakaç/Arakaç* "su ilə əhatə olunmuş, ada" mənasını ifadə edir. Braziliyanın ş.-ində, Atlantik okeanının port şəhərlərindən biri Arakaju adlanır.

**Arakəl/Arakel/Arakul** *oyk., mür.* Xocavənd r-nunun eyniadlı i.ə.v.-də kənd. Çaylaq çayının (Araz çayının qolu) sol sahilində, Qarabağ silsiləsinin c.-ş. ətəyindədir. Kəndin əvvəlki adı Qara Quzey olmuşdur. Arakel oykonimi türk dillərindəki *arak* və *el* sözlərindən ibarət olub, "su, çay kənarında yerləşən kənd, oba" mənasına uyğundur. Çelyabinsk vilayətinin Silaçski kəndi 1968-ci ilədək Arakulski adlanırdı. 1917-ci ildə Cəbrayıl qəzasında Birinci və İkinci Arakul adlı iki yaşayış məntəqəsi qeydə alınmışdır. 1988-ci ildən kəndin adı Şah İsmayıl Xətainin şərəfinə Xətai adlandırılmışdır.

**Araqçay** *hidr., mür.* Kəlbəcər r-nu ərazisində çay. Tərtər çayının sağ qoludur. Hidronim *Araq* (monq. və türk dillərində "şimal", "dağın kölgə düşən yamacı", "açıq, geniş sahə", "quru çay yatağı" mənalarını ifadə edir) və *çay* (su obyekti termini) sözlərindən düzəlib, "şimaldan axan çay" və ya "geniş sahəni tutan çay" deməkdir. Zəngilan r-nundakı Araqlıdərə, keçmiş Yelizavetpol qəzasında qeydə alınmış Araqlı mülkü, Ermənistanda Araqats, Gürcüstanda Araqvi coğrafi adları da bu məna ilə bağlıdır.



**Aralıq** *or., düz.* Salyan r-nu ərazisində palçıq vulkanı. Türk dillərində və monq. dilində *aral* "ada, çay hövzəsi" mənasında işlənir. 1933-cü ildə Ağdaş r-nu ərazisində Aral kənd adı qeydə alınmışdır. Özbəkistan və Qazaxıstan ərazisində bir göl Aral, Uralda iki göl Aralsor adlanır. Azərbaycan dilinin qərb qrupu dialekt və şivələrində *aralıx* sözü "hər tərəfi su ilə əhatə olunan quru yer, adacıq" mənasını ifadə edir. *Aralıq* oronimi də "quru yer, adacıq" mənasına uyğundur.

**Aralıqbulaq** *hidr., mür.* Laçın r-nu ərazisində bulaq və çay. Hidronim Aralıq və bulaq sözlərindən ibarət olub, coğrafi obyektin yerləşmə mövqeyini bildirir. Çayın adı eyniadlı bulaqdan götürülmüşdür.

**Aralıqtəpə** *or., mür.* Gədəbəy r-nu ərazisində dağ. Oronim *aralıq* və *təpə* sözlərindən ibarət olub, "ada təpə" mənasını ifadə edir.

**Aran** *oyk., sadə.* 1. Lənk r-nunun Kirovud i.ə.v.-də kənd. Dağətəyi ərazidədir; 2. Tovuz r-nunun Yanıqlı i.ə.v.-də kənd. Çınqıldağ silsiləsinin ətəyindədir. Yerli əhali arasında Aran Yanıqlı kimi tanınır. Vaxtilə Yanıqlı kəndinin Aran adlı ərazisində əkin sahələri olmuş, İkinci dünya müharibəsindən sonra isə həmin kənddən ayrılmış əhali burada yeni yaşayış məntəqəsi salmışdır. Oykonim "Aranda yerləşən Yanıqlı kəndi" mənasındadır. Toponimi qıpçaqların uran tayfasının adı ilə bağlayırlar. Türk dillərində *aran* sözü "düzənlik, isti yer; qışlaq yeri, tövlə" mənalarında işlənir. Azərb. ərazisində bu sözlə bağlı bütün coğrafi obyekt adlarında həmin məna özünü doğruldur.

**Aran** *or., sadə.* 1. Azərbaycanın düzənlik hissəsinə (Kür-Araz, Samur-Dəvəçi, Lənkəran ovalıqları, Gəncə – Qazax və Araz-





boyu düzənlikləri və s.) əhali tərəfindən verilən ad. Yayı isti, qışı mülayim keçir. Əsas pambıqçılıq r-ları və qışlaqlar burada yerləşir; 2. Tovuz r-nu ərazisində dağ. Adını ərazidəki eyniadlı yaşayış məntəqəsindən almışdır; 3. Qəbələ r-nu ərazisində dağ silsiləsi. Erkən orta əsrlərdə Şimali Azərb.-nın adı olmuşdur. Mənbələrdə Tosaren (Düz Aran), Aran, Arran, əl-Ran, Rani kimi adı çəkilir. Qədim Azərb. dilində *aran* "isti, düzən yer, qışlaq yeri" mənasındadır. Oronimlərin eyniadlı etnonimlə bağlılığı da istisna deyil. Çünki Krım ərazisində Aranada, İrkutsk vilayətində Aranqala, Sibirdə Arankul, Azərbaycan ərazisində Aran təpəsi, Aran dərəsi (Lənk r-nu), Oran dərə (Masallı r-nu Yeləcaq kəndi), Arantəpə (Kəlbəcər r-nu Mozkənd kəndi), Urandağ (Xocavənd r-nu) və s. qeydə alınmışdır və tədqiqatçılar bu coğrafi adları aran/oran/uran etnonimi ilə əlaqələndirirlər.

**Arançı təpələri** *or., mür.* Ağstafa r-nunun Ağstafa şəhəri yaxınlığında qədim yaşayış yerləri sayılan iki təpə. *Arançı* və *təpələri* sözlərindən düzəlib. Azərb. dilinin Qazax dialektində "biçin işləri qurtaranadək yayda aranda qalan adam" *arançı* adlanır. *Arançı* sözünün etnonim olması da istisna deyil. Qeyd etmək lazımdır ki, türkdilli xalqların toponimiyasında *arançı* toponimik termin kimi "daşlıq, qayalıq, dağ" mənalarında işlənmişdir. Krımın Suvorovo kəndinin əvvəlki adı da Arançı olmuşdur.

**Aran görünən** *or., mür.* 1. Daşkəsən r-nu ərazisində dağ, 2. Daşkəsən r-nu ərazisində təpə. Həmin dağdan və təpədən baxdıqda aranı - Kür-Araz ovalığını görmək mümkün olduğundan bu cür adlanmışdır.

**Aranlı** *oyk., sadə.* Biləsuvar r-nunun Mircəlal i.ə.v.-də kənd. Düzənlikdədir. Yaşayış məntəqəsini XIX əsrin sonlarında Rusiyadan köçürülmüş ailələr salmışlar. 1991-ci ilədək Tatyanovski, Tatyanovka adlandırılmışdır. Oykonim "düzənlikdə yaşayanlar, arandan gələnlər" mənasındadır.

**Aranzəmin** *oyk., mür.* Xocalı r-nunun Naxçıvanlıq i.ə.v.-də kənd. Qarabağ silsiləsinin ətəyindədir. Yerli əhalinin məlumatına görə, Mirzəbuyı (Mirzənin yurdu), Mirzəboyun adları bu kəndin keçmiş adları olmuşdur. Tədqiqatçıların fikrincə, alban hökmdarı Varazın (VI əsr) burada iqamətgahı olduğuna görə kənd Varazabun adlanmışdır. Bəzi mənbələrdə bu kəndin adı Vartaşen kimi də qeyd olunmuşdur. Oykonim *aran* və *zamin* (fars "yer, məkan") sözlərindən düzəlib, "isti və mülayim iqlimə malik düzənlik yer" mənasındadır. Mənbələrin məlumatına görə, XIX əsrdə Cənubi Azərb.-nın Qaradağ əyalətindən köçüb gəlmiş bəzi ailələr Şuşa qəzasındakı Aranzəmin adlı sahədə məskunlaşmışlar.



**Araskut** *hidr., mür.* Abşeron yarımadasında göl. Hidronim *aras* və *kut* sözlərindən düzəlib, "axar suyun töküldüyü, çayın mənsəbi" deməkdir.

**Aratlı Curuqlu** *oyk., mür.* Ağsu r-nunun Ərəbuşağı i.ə.v.-də kənd. Şirvan düzündədir. Keçmiş adı İkinci Aratkənd olmuşdur. 1992-ci ildən kənd indiki adı ilə rəsmiləşdirilmişdir. Oykonimin uryat tayfa adından və həmin tayfanın curuğlu tirəsinin adından düzəldiyi güman edilir. Etnotoponimdir.

**Arayatlı** *oyk., düz.* Füzuli r-nunun eyniadlı i.ə.v.-də kənd. Araz çayının sol sahilindən bir qədər aralı düzənlikdədir. XIX əsrə aid sənədlərdə Mustafa Sərkarlı adı ilə verilir. 1933-cü ildə Arayatılı şəklində qeydə alınmışdır. Belə güman edilir ki, toponim XIII əsrdə monqolların tərkibində Azərb.-na gəlmiş türkdilli uryat tayfasının adını özündə əks etdirir. Etnonim isə türk dillərindəki *ara* (orta) və *yat/yatuq* (hərəkət etməyən, oturaq türk) sözlərindən olub, "mərkəzdə yerləşən oturaq türklər" deməkdir. Burada *-lı* şəkilçisi aidlik, mənsubluq ifadə edir.

**Araz** *hidr., sadə.* Türkiyə, Azərb. və Ermənistan ərazisindən axan çay. Kürün ən böyük qoludur. Türkiyədə Bingöl silsiləsinin yamaclarından, 3000 m hündürlükdən başlanır. Bəhramtəpə su qovşağı yaxınlığından mənsəbədək Araz Azərb. ərazisində axır. Sabirabad şəhəri yaxınlığında, Suqovuşan adlı yerdə Kürlə birləşir. Azərb.-nın İranla dövlət sərhədini təşkil edir.

Tarixi mənbələrdə *Araz* sözü Russ, Arras, Rude-Aras, Eraks, Araks, Aras, Araz şəklində işlənmişdir. Yunanlar bu hidronimi

"qazıram", qədim parslar "qaçmaq" mənası ilə əlaqələndirmişlər Tədqiqatçıların əksəriyyəti "aras" sözünün İran mənşəli dillərin birində "su" mənasında olduğunu söyləyirlər və bunu Midiya torpağında Araks adlı ikinci bir çayın olması ilə əlaqələndirirlər Hidronimin ən qədim forması Araks olmuşdur Son tədqiqatlara görə, çayın adı qədim türk dillərindəki *oraz/uraz/araz* (sakıt, dinc, xeyirxah, xeyir verən) sözündədir *Ar* türk və monqol dillərində "şimal", "dağın şimal yamacı", "qərb", "arxa tərəf" və s mənalarda işlənir "Aks, oks" komponenti isə türkdilli xalqların toponimiyasında "aksu, oksu" forması ilə yanaşı işlənərək həm müstəqil, həm də ikinci komponent mövqeyində "axan su, çay" mənalarını ifadə edir Beləliklə, sonralar Araz formasına düşmüş Araksu hidronimi "qərbdən axan çay" mənasında izah oluna bilər Bu çayın adı bəzi mənbələrdə Qarasu kimi də verilir ki, bu da həmin mənaya uyğundur Herodot Amudərya və Sırdərya çaylarını da Araks adlandırırdı.

**Araz** *oyk., sadə* Babək r-nunun Təzəkənd i ə v -də qəsəbə 1972-ci ildə Araz su qurğuları tikintisinin fəhlə qəsəbəsi kimi yaranmışdır Adını ərazisindəki eyniadlı çaydan almışdır

**Arazbarı/Arazbar/Arasbar** *oyk., mür* Ağcabədi r-nunun eyniadlı i.ə.v.-də kənd Qarqar çayının sağ sahilində, Mil düzündədir. İlk dəfə XIII əsrə aid mənbələrdə (Fəzlullah Rəşidəddin "Məktublar") Arasbar şəklində qeydə alınmışdır XVI əsrdə türk səyyahı Evliya Çələbinin yazdığına görə, Araz çayının nisbətən yuxarıdan töküldüyü ərazi yerli əhali arasında Arazbar adlanırmış XVIII əsrdə Arazbar Qarabağ xanlığının banisi Pənahəli xanın atası İbrahim ağanın otlaq yeri olmuşdur XIX əsrə aid mənbələrin birində Araz çayının Ordubad və Məhri arasında Arasbar adlı dar dərədən axdığı göstərilir Həmin əsrə aid başqa bir mənbədə isə Arazbarlı kəndi qeydə alınmışdır 1917-ci ildə Cəbrayıl və Şuşa qəzalarında Arasparlı, 1917 və 1933-cü illərdə Göyçay qəzasında Arazbəyli yaşayış məntəqəsi olmuşdur 1933-cü ildə Ağcabədi r-nundakı Arazbar kəndinin adı Araspar şəklində qeydə alınmışdır Türkiyənin Qars əyalətinin Kağızman dairəsində də Arasbarlı adlı yaşayış məntəqəsi mövcuddur Toponimin belə geniş arealda yayılması onu göstərir ki, Arazbar əvvəllər yer adı olmuş, orada yaşayan insanlar müxtəlif ərazilərə köçdükdən sonra saldıqları yeni yaşayış məntəqələrinə də keçmiş yurdlarının adını vermişlər Çox güman ki, Arasparlı etnonim və ya etnotoponim, Arasbar və ya Araspar isə toponimdir Toponim elmi ədəbiyyatda *Araz* (çay adı) və *bar* (farsca "sahil", "kənar") sözlərindən ibarət olub, "Araz çayının kənarı, yanı, sahili" mənasında izah olunur Lakin qeyd edək ki, türk dillərində *par/bar* sözünün bir çox mənaları ilə yanaşı "açıq, geniş düzən", "hərəkət edən, axan" mənalarında işlənməsi hallarına da təsadüf edilir Bu baxımdan Araspar və ya Arazbar oykoniminin mənası "Araz çayının axdığı geniş düzən" kimi izah oluna bilər.

**Araz Dilağarda** *oyk., mür* Füzuli r-nunun Əhmədbəyli i ə v -də kənd Araz çayı sahilində, düzənlikdədir Oykonim *Araz* (hidr ) və *Dilağarda* (etnotoponim, qaraqoyunlu qəbiləsinə mənsub nəsil adı) sözlərindən düzəlib, "Araz sahilində yerləşən Dilağarda kəndi" deməkdir Ərazidəki iki Dilağarda kəndini bir-birindən ayırmaq üçün oykonimin əvvəlinə Araz və Qobu komponentləri artırılmışdır

**Araz Zərgər** *oyk., mür* Füzuli r-nunun Əhmədbəyli i ə v -də kənd Araz çayının sahilində, Mil düzündədir Oykonim *Araz* (hidr ) və *Zərgər* (etnotoponim) sözlərindən düzəlib, "Araz sahilində Zərgər kəndi" deməkdir Kəndi r-nun ərazisindəki Zərgər adlı digər kənddən fərqləndirmək üçün Araz sahilində olan bu kənd belə adlandırılmışdır Kəndin əhalisi 1820-ci ildə Cənubi Azərb -dan köçürülmüş ailələrdən ibarətdir

**Arbat** *or., sadə* Abşeron r-nu ərazisində palçıq vulkanı. Türkdilli xalqların toponimiyasında *arba(t)* toponimik termin kimi "azsulu, dayaz yer", "saya", "qum, gil və çınqıldan ibarət torpaq sahəsi" mənalarında işlənir 1948-50-ci illərdə Ermənistanın Masis r-nundan deportasiya edilmiş bir kəndin adı Arbat olmuşdur Rusiya ərazisində Arbatsk adlı bir neçə coğrafi obyekt qeydə alınmışdır ki, bunları tədqiqatçılar ərəb dilin-





dəki *rabat* (karvansara, məscid, qonaq evi və s ) sözü ilə əlaqələndirirlər

**Arbatan** *oyk., düz* 1 Salyan r-nunun eyniadlı i ə v -də kənd Kür çayının sağ sahilindən bir qədər aralı, Salyan düzündədir, 2 Şərur r-nunun Dərvişlər i ə v -də kənd Arazboyu düzənlikdədir Oykonim "sayalıq, çınqıllıq" deməkdir

**Arçandağ** *or., mür* 1 Azərb -da Acınohur ön dağlığının c -unda dağ silsiləsi Bozdağ sil -nin Əlican və Türyan çayları arasındakı hissəsidir Hün 700 m Türyançay qoruğunun çox hissəsi bu ərazidədir; 2 Şəki r-nu ərazisində dağ Oronim *arçan* (ardıc ağacının nadir növlərindən birinin adıdır) və *dağ* sözlərindən düzəlib Ərazidə həmin ağacın bitdiyi meşələr var Şəki r-nunda Arçantəpə adlı yüksəkliyin olduğu da məlumdur

**Arçiman** *oyk., mür* Şamaxı r-nunun Dəmirçilər i ə v -də kənd. Pirsaat çayının sahilində, Baş Qafqaz silsiləsinin ətəyindədir. Bəzi tədqiqatçılara görə, toponim *arçan* (ardıc bitkisi) və *man* (ətraf) sözlərinin birləşməsindən yaranaraq yerli tələffüz nəticəsində indiki formasını almışdır Kənd ətrafı arçan ağacları ilə zəngin olan dağın ətəyində salındığı üçün belə adlandırılmışdır Toponimik sözlüklərdə Ərçiman variantında olan bu oykonim 1917-ci ildə Arçiman şəklində qeydə alınmışdır Oykonim *arçi* və *man* sözlərindən düzəlib Arçilər Qərbi Dağıstanda yaşayan və avarlara yaxın olan etnik qrupdur Türk dillərində *arçi* sözü "dağlı" sözünün sinonimidir, *man* komponenti isə "adam", "yer, məkan", "əhatə olunmuş" mənalarını ifadə edir Arçiman oykonimi "dağlılar", yaxud "dağlıların məskunlaşdığı yer" kimi başa düşülməlidir Türkmənistanda Köpetdağın ətəyində Arçiman adlanan kurort şəhərinin olduğu da məlumdur

**Arçivan** *oyk., mür* Astara r-nunun Arçivan i ə v -də kənd Arçivan çayının sahilində, Lənkəran ovalığındadır. Ədəbiyyatlarda Ərçivan şəklində təqdim edilir Tədqiqatçıların bir qrupu bu toponimi talış dilindəki *arç* (dəyirman) və *van* (məskən, ev, yaşayış yeri) komponentlərindən ibarət "dəyirman yeri" mənalı, digər qrupu isə türk dillərində *arça* (ardıc ağacı) və *van* (məkan, yer) komponentlərindən düzəlmiş "ardıc ağacı bitən yer" mənasında söz kimi qəbul edirlər Əslində oykonim *arçi* və *van* sözlərindən düzəlib, "dağlıların yaşadığı yer" deməkdir

**Arçivan** *hidr., sadə.* Astara r-nu ərazisində çay Adını eyniadlı yaşayış məntəqəsindən almışdır

**Ardağlı** *or., düz* Şərur r-nu ərazisində dağ Dərələyəz silsiləsinin q -indədir Hün 2229 m Yerli əhalinin verdiyi məlumata görə, dağın adı Ərdağ olmalıdır. Keçmişdə burada yaylaq olmuş, yaylaq sahibləri və dağ da sonralar Ərdağlı adlanmışdır. Toponimik ədəbiyyatlarda Türkiyədəki Ardağ şəhərinin adı ilə əlaqələndirilərək etnooronim hesab edilir Lakin əslində oronim "gözətçi, keşikçi dağı" kimi izah olunmalıdır

**Ardaşava** *or., mür* Laçın r-nu ərazisində dağ 1917-ci ildə həmin ərazidə Ardaşava adlı yaşayış məntəqəsi qeydə alınmışdır Yerli əhalinin dilində Ərdəşəvi kimi tələffüz edilən bu oronim çox vaxt kürd dilində *ardaş* (ardıc ağacı), (*-a* bitişdirici sait) və *va* (yer) komponentlərindən ibarət söz kimi "ardıclı dağ" mənasında izah olunur Güman ki, *Ardaş* ("keşikçi daş") dağın adı, *Ardaşava* ("Ardaş dağı olan oba") isə kəndin adı olmuşdur

**Ardaşava** *oyk., sadə* Laçın r-nunun Təzəkənd i ə v -də kənd Dağətəyi ərazidədir Adını ərazidəki eyniadlı dağdan almışdır Bəzi mənbələrdə Ərdəşəvi kimi verilmişdir

**Ardaşavasu** *hidr., mür* Laçın və Daşkəsən r-nları ərazisində çay Şəlvə çayının qoludur Adını ərazidəki eyniadlı yaşayış məntəqəsindən almışdır

**Ardıc** *or., sadə* 1 Gədəbəy r-nu ərazisində dağ, 2 Kəlbəcər r-nu ərazisində dağ, 3 Qubadlı r-nu ərazisində dağ, 4 Şərur r-nu ərazisində dağ Hün 2032 m Oronim bu dağların ətəyində bitən *ardıc* ağacının adı ilə bağlı yaranmışdır

**Ardıclı/Ardışlı** *oyk., düz* Laçın r-nunun Vaqazin i.ə v -də kənd Piçonis çayının sahilində, Qarabağ silsiləsinin ətəyindədir Oykonim "ardıc ağacı çox olan yer", "ardıc bitən yer" deməkdir

**Argüneş** *or., mür* Xocavənd r-nunun Xırmancıq kəndi ərazisində dağ Hün 1468 m

Oronim Ar və günəş sözlərindən düzəlmişdir Toponimik ədəbiyyatlarda Ərgünəş şəklində təqdim olunan bu oronim belə izah olunur "yaxınlığındakı dağlardan hündür olmasına və günəş şüası ilk dəfə həmin dağın zirvəsinə düşməsinə görə dağ belə adlanmışdır" *Ar* sözü "keşikçi, gözətçi", "quru çay dərəsi" mənaları ilə yanaşı buryat, yakut və monq. dillərində "qərb, arxa tərəf, şimal, dağın kölgə düşən hissəsi, quzey" mənalarını da ifadə edir Qeyd etmək lazımdır ki, Quba r-nu ərazisindəki hal-hazırda Dolanlar adlanan dağın da əvvəlki adı Argünəş olmuşdur Bu oronimin coğrafi mövqeyi ikinci izahla üst-üstə düşür *Dolanlar* adına gəlincə, *dolan* qədim fars və tacik dillərində "dağ keçidi", monq dilində (*dalın*) "arxa tərəf, yüksəklik, yol" deməkdir Bu baxımdan Argünəş və Dolanlar oronimləri sinonim hesab oluna bilər Qırğızıstanda Dolon, Tacikistanda Dolona, Dolonabulak yer adları bu oronimin türk dilləri üçün yad olmadığını sübut edir

**Arğalıdağı** *or., mür* Tovuz r-nu ərazisində dağ *Arğalı* Azərb. dilinin dialektlərində "vəhşi qoç" deməkdir Bu baxımdan oronim "qoç dağı" kimi izah olunmalıdır.

**Arxaclar düzü** *or., mür* 1 Qax r-nunun Tasmalı kəndi ərazisində düz, 2 Qax r-nunun Almalı kəndi ərazisində, dağ ətəyində düz, Azərb. dilində *arxac* qoyun, mal-qara yatağına deyilir *Arxaclar düzü* "qoyun, mal yatağı, düzü" deməkdir Azərb -da arxac komponentli Qaynararxac, Çayarxac, Qaraarxac, Ermənistanda Xanarxac, Arxactəpə, Gürcüstanda Arxacqaya coğrafi obyektləri qeydə alınmışdır

**Arxangelovka** *oyk., sadə* Biləsuvar r-nunun eyniadlı i ə v -də kənd. Mahmudçala gölündən bir qədər aralı, Muğan düzündədir Kəndin adı XIX əsrdə Arxangelsk vilayətindən köçüb gəlmiş əhali tərəfindən verilmişdi 1991-ci ildən Bağbanlar adı ilə rəsmiləşdirilmişdir

**Arxaşan** *or., mür* Tərtər r-nu ərazisində dağ Ərazidəki çaylardan birinin yuxarı axarında qarşısı daşla kəsilmiş, onun dərəsinin sağ yamacı boyu arx çəkilmişdir Arx yamacdan endirildikdən sonra dərin olmayan çökəklikdən keçərək qaşı aşır Ona görə də dağ Arxaşan adlandırılmışdır

**Arıarx** *hidr., mür* Astara r-nu ərazisində çay Hidronim *arı* (təmiz, şəffaf) və *arx* (kanal, su obyekti) sözlərindən ibarət olub, "təmiz su" deməkdir

**Arı dərəsi** *or., mür* Tovuz r-nu ərazisində dərə Hidronim "Arısu çayının dərəsi" mənasındadır

**Arılıq** *oyk., sadə* Balakən r-nunda kənd Dağətəyi ərazidədir Burada vaxtilə Gərəkli kəndinin əhalisinin yay vaxtı arıxanaları olmuşdur Yaşayış məntəqəsini Mahamalar kəndindən çıxmış ailələr Arılıq adlanan həmin yerdə saldıqlarına görə kənd belə adlanmışdır

**Arıqdam/Arıxdam** *oyk., mür*. Gədəbəy r-nunun Qumlu i ə v -də kənd. Gədəbəy çayının (Şəmkir çayının qolu) sol sahilindən bir qədər aralı, Şəkərbəy dağının ətəyindədir Kənd XVIII əsrin axırlarında yaranmışdır Hazırda həmin r-nun Hacılar kəndinin bir hissəsi də Arıqpəyə adlanır Xalq etimologiyasına görə, toponim Arıq Alı adlı şəxsin adı ilə bağlıdır Qədim türk dillərində *arıki erik* "kanal, arx, su hövzəsi", *dam* "mal saxlanan yer, yaşayış yeri" mənalarını ifadə edir Oykonim "su, çay sahilində yaşayış yeri" kimi izah olunur Gürcüstan ərazisində Arıxdam, Qazaxıstanda Arıkbalık yer adları da mövcuddur

**Arıqdamsu** *hidr., mür* Gədəbəy r-nu ərazisində çay Şəmkir çayının qoludur Başlanğıcını Çolpan dağından aldığına görə, yerli əhali arasında Çolpan çayı adı ilə tanınır Son zamanlar Çiçəkli adlandırılmışdır Bu da ərazidəki Arıqıran kəndinin Çiçəkli (1991-ci ildən) adlandırılması ilə bağlıdır Adını eyniadlı yaşayış məntəqəsindən almışdır Bəzi mənbələrdə hidronim Arıqsu şəklində də qeydə alınmışdır

**Arıqıran/Arqıran/Arıqran** *oyk., mür* Gədəbəy r-nunun eyniadlı i ə v -də kənd Çətindərə çayının (Zəyəm çayının qolu) sağ sahilində, Haçaqaya dağının (Şahdağ silsiləsi) ətəyindədir Güman edirlər ki, oykonim həmin ərazidə yaşayan və əsasən həşəratlarla qidalanan *arıqıran* adlı kiçik quşun adı ilə bağlıdır 1991-ci ildən Çiçəkli adlandırılmışdır







**Arıqıran** *hidr., sadə* Gədəbəy r-nunda çay Uzunluğu təqribən 10 km olan bu çay Zəyəm çayının sol qoludur Başlanğıcını Şahdağda Təndirli yurd deyilən yerdən alır Xalq etimologiyasına görə, çay daşarkən sahilindəki arıxananı yuyub apardığı üçün belə adlandırılmışdır.

**Arınc** *oyk., sadə* Şahbuz r-nunun Qarababa i ə.v.-də kənd Dağətəyi ərazidədir Qədim türk dillərində *arınc* "çətin, tərs, sərt, darıxdırıcı" mənalarını ifadə etmişdir Güman ki, oykonim mövcud ərazinin sərt iqlimi ilə əlaqədar olaraq yaranmışdır 2003-cü ildən kəndin adı naməlum səbəbdən Ayrınc kimi rəsmiləşdirilmişdir. XVIII əsrin əvvəllərində İrəvan xanlığının Qırxbulaq mahalında Arınca adlı kənd qeydə alınmış, 1948-50-ci illərdə Ermənistanın Yeğenadzor r-nun Arınc kəndindən azərb -lar deportasiya edilmişlər

**Arısu** *or., mür* Ordubad r-nu ərazisində dağ Oronim *arı* və *su* sözlərindən düzəlib, "təmiz, saf su" mənasını ifadə edir Dağın adı, güman ki, buradakı saf bulaqların varlığı ilə bağlı yaranmışdır

**Arısu** *hidr., mür* Gədəbəy r-nu ərazisində çay Şəmkir çayının qoludur Hidronim "təmiz su" mənasındadır.

**Arısu** *oyk., sadə* Gədəbəy r-nunun Çaldaş i.ə.v -də kənd. Adını ərazidəki eyniadlı çaydan almışdır Yaşayış məntəqəsi XIX əsrdə Arısu çayının sağ sahilində məskunlaşmış Qazax r-nundan gəlmiş ağsaçlı, Gədəbəy r-nunun Çalburun kəndindən gəlmiş didarlı, keçmiş Govdu kəndindən gəlmiş atxanlı nəsilləri tərəfindən salınmışdır

**Arış** *oyk., sadə* Füzuli r-nunun Qoçəhmədli i ə v -də kənd. Qarabağ silsiləsinin ətəyindədir Türk dillərində *arış/arıs* sözü "tayfanın bir qolu"; "arabanın yan qoşqusu", "hərıs, acgöz", "çovdar" mənalarını ifadə etmişdir 1933-cü ildə Gədəbəy r-nunda Arışlı kəndi, 1917-ci ildə Quba qəzasında Arısküş kəndi qeydə alınmışdır Başqırdıstanın Pobonin yaşayış məntəqəsinin adı əvvəllər Arış olmuşdur Qazaxıstanda Sırdərya çayının sağ qolu, həmin çayın sol sahilində şəhər və Qızıl Orda vilayətində şor göllərdən biri Arıs adlanır Deyilənlərdən belə nəticəyə gəlmək olar ki, Arış - tayfadan bir qol, Arışlı – çovdarlı, Arışküş – çovdar zəmisi; Arıs – çay qolu deməkdir

**Armaki** *oyk., sadə* Quba r-nunun Amsar i ə v -də kənd Düzənlikdədir 1917-ci ildə Armaki şəklində qeydə alınan bu oykonim sonralar Ermeki (1961), Ərməki (1986) kimi təqdim olunmuşdur Belə ehtimal olunur ki, kəndin adı türk dillərindəki *irmak* (çay) sözündən və *-i* şək -sindən ibarət olub, "çaylı" mənasını ifadə edir *Armakı* qədim türk dillərində "at bağlanan yer", "at tükündən toxunmuş kəndir" mənalarını da bildirmişdir

**Armakiqışlaq/Ərməkiqışlaq** *oyk., mür* Quba r-nunun Hacıhüseynli i ə v -də kənd Qusar maili düzənliyindədir Oykonim *Armakı* (kəndin adı) və *qışlaq* komponentlərindən ibarət olub, "Armaki kəndinin qışlağı" deməkdir Kollektivləşmədən sonra daimi yaşayış məntəqəsinə çevrilmiş bu kənd əvvəllər həqiqətən də Armakı kəndinin qışlaq yeri olmuşdur

**Armatyan** *or., mür* 1 Qazax r-nu ərazisində dağ, 2 Qax r-nu ərazisində dağ Hün 997 m Zirvəsində V-VI əsrlərə aid edilən dairəvi formalı, yerli əhali arasında Pərıqala adlandırılan atəşpərəst məbədinin qalıqları var Dağın adının zərdüştiliyin torpaq ilahəsi olan Armanin ilə əlaqədar olması ehtimal olunur Əsli Armatandır Oronim *arma* və *tan* sözlərindən düzəlib Qədim türk tayfalarından biri *arma* adlanırdı Bunu Krım vilayətində Batalnoye yaşayış məntəqəsinin keçmişdə Arma Eli adlanması da sübut edir *Tan* sözünün bir mənası da qədim türk dillərində "şiş, təpə, qabarıq yer səthi" deməkdir Beləliklə, oronim "armaların təpəsi" mənasındadır

**Armudlu** *hidr., sadə* Daşkəsən r-nu ərazisində min bulaq Ərazinin adıçəkilən ağac növü ilə zəngin olduğunu göstərir *Armud* sözü ilə bağlı olan digər hidronim Bərdə r-nu ərazisindəki Armudarxdır

**Armudlu** *oyk düz* 1 Kəlbəcər r-nunun Keşdək i ə v -də kənd Tərtər çayının sol sahilindədir; 2 Qax r-nunun Qaşqaçay i ə v -də kənd Qaşqaçayın sol sahilində, Ahvay dağının ətəyindədir Bu kəndin ərazisi keçmişdə qaraqoyunlu tayfasına mənsub yaylaq yeri

olmuşdur Sonralar həmin tayfa üzvlərinin bir hissəsi orada məskunlaşmışdır 3 Qubadlı r-nunun Başarat i.ə.v -də kənd Dağlıq ərazidədir Əliyanlı tayfasına mənsub ailələr tərəfindən salınmışdır 1948-ci ilədək rəsmi adı Armudluq olmuşdur Kənd Armudluq (armuda bənzər) dağının adı ilə adlandırılmışdır Sonralar Armudluq sözü səhvən Armudlu kimi qeydə alınmışdır Oykonim ərazidə armud ağacının zəngin olduğunu göstərir Ermənistandakı Tuafnin və Tandzit yaşayış məntəqələrinin adı 1946-cı ilədək, Gürcüstandakı Pantiani kəndinin adı isə 1949-cu ilədək Armudlu olmuşdur

**Armudlu** *or*, *düz* 1 Qax, Kəlbəcər, Xanlar, Şəmkir r-nları ərazisində dağ; 2 Qazax, Ağdərə, Laçın, Cəbrayıl, Şuşa r-nları ərazisində dərə; 3 Oğuz, Qubadlı, Laçın, Cəbrayıl r-nları ərazisində düz, 4 Qazax r-nu ərazisində yal və çal, 5 Tovuz r-nu ərazisində tala, 6 Füzuli r-nu ərazisində bağ, 7 Armud yeri – Yardımlı r-nunun Horovar kəndində yer; 8 Armudlu puca – Yardımlı r-nunun Vergədüz kəndində sahə Oronim ərazinin armud ağacı ilə zənginliyini bildirir

**Armudpadar** *oyk*, *mür* Xaçmaz r-nunun Yergüc i ə.v -də kənd Qudyal çayının sahilindədir 1933-də r-nun ərazisində eyniadlı üç kənd qeydə alınmışdır Etnooykonimdir Padarlarla bağlı olan və Padar adlanan başqa bir məntəqədən fərqləndirmək məqsədilə, eyni zamanda ərazidə armud ağacının zəngin olması ilə əlaqədar belə adlandırılmışdır

**Aronovka** *oyk*, *sadə* Xaçmaz r-nunun Müşkür i ə v -də kənd 1933-cü ildə həmin i ə v -in Əhmədoba adlandığı və burada rusların əhalinin 15%-ni təşkil etdikləri haqqında məlumat verilir Oykonim rus mənşəli olub rusların ərazidə məskunlaşması ilə əlaqədar yaranmışdır 1992-ci ildən kəndin adı dəyişdirilərək Əzizli olmuşdur

**Arpabulaq** *hidr*, *mür* Şamaxı r-nu ərazisində min bulaq Hidronim *arpa* və *bulaq* sözlərindən düzəlib Türkdilli xalqların toponimiyasında öz zənginliyi ilə seçilən *arpa* komponenti dənli bitkilərdən birinin adını bildirməklə bərabər *arma/arba/arpa* variantlarında işlənən qədim türkdilli tayfa adını da ifadə edir Relyef baxımından arpa bitkisinin əkilməsi mümkün olan ərazilər dənli bitki ilə bağlı olsa da, yüksəkliklər, su hövzələri etnonimlə ifadə olunur Toponimiyada "arpa" sözü ilə bağlı minlərlə obyekt adı mövcuddur Arpa dağı (Ağsu, Şəmkir), Arpa dərəsi (Oğuz, Ağdam, Qubadlı, Daşkəsən, Qazax, Zəngilan, Kəlbəcər, Goranboy, Ordubad, Xanlar), Arpa düzü (Kəlbəcər r -nunun Çovdar kəndi), Arpa yalı (Kəlbəcər, Şuşa), Arpaçı günbəzi (Cəbrayıl), Arpa çökəyi (Tovuz, Xanlar), Arpa çuxuru (Qubadlı), Ermənistanda Arpa, Arpa kəndi (1946-cı ildən Areni), Arpa çayı (1957-ci ildən Axuryan), Arpa gölü (1950-ci ildən Arpiliç), Arpavad (1945-ci ildən Xusakert), Arpavar/Arpava (1967-ci ildən Naşavan), Qarsda Arpaqala, Arpaşen; Gürcüstanda Arpatala, Arpa kəndi, Krımda Arpalar; Qazaxıstanda Arpa suyu və s 1933-cü ildə Cəlilabad r-nunun Qoşabulaq i ə v -də Arpalıq kəndi qeydə alınmışdır Arpa sözünün etnonim variantında *ar* hissəsinin "yüksəklik, dağlıq" mənası danılmazdır

**Arpaçay** *hidr*, *mür* Ermənistan və Azərb -nın Şərur r-nu ərazisindən axan çay Arpa, Şərqi Arpaçay da adlanır Araz çayının sol qoludur Vardenis silsiləsindən 3100 m hündürlükdən başlanır Yazılı mənbələrdə adına ilk dəfə XII əsrdən təsadüf edilir XVI əsrə aid mənbələrdə də Arpaçay hidronimi haqqında məlumat verilir Hidronim *arpa* (etn ) və *çay* (axar su hövzəsi) sözlərindən düzəlib, etnotoponimdir

**Arpadərə** *hidr*, *mür* Ordubad r-nu ərazisində çay Gilan çayının sağ qoludur Hidronim *Arpa* (çay adı) və *dərə* (çay dərəsi) komponentlərindən düzəlib, "Arpa çayının dərəsi" mənasındadır Cənubi Azərb ərazisində eyniadlı kənd vardır

**Arpadüzü** *oyk*, *sadə* Xocavənd r-nunun eyniadlı i ə v -də kənd Qarabağ silsiləsinin ətəyindədir. XIX əsrdə burada gəlmə ermənilər məskunlaşmışdı Sovet hakimiyyəti illərində kəndin adı Kolxozaşen (Kolxoz kəndi) adlandırılmış, 1992-ci ildə isə dəyişdirilərək Arpadüzü kimi rəsmiləşdirilmişdir Kənd öz adını ərazidəki "arpa əkilən düz, çöl" mənalı eyniadlı sahədən almışdır

**Arpagədik** *oyk*, *sadə* Xocavənd r-nunun Çaylaqqala i ə v -də kənd İlk dəfə adı Arpa





şəklində XII əsrə aid mənbədə çəkilmişdir Oykonim *arpa* (etn ) və *gədik* (dağın yastı yeri, dağarası yol) sözlərindən düzəlib. Kənd öz adını yaxınlığındakı yüksəkliyin adından almışdır Mənbələrdə Qarabağ ərazisində Arpadöşü oroqrafik obyekti də qeydə alınmışdır

**Arsal** *hidr*, *mür*. Qəbələ r-nu ərazisində çay Hidronim *ar* (yüksəklik, dağ, quzey) və *sal* (qədim və müasir türk dillərində "çay, axar su obyekti") sözlərindən düzəlib, "dağ çayı" və ya "şimaldan axan su" deməkdir Çayın adını axdığı dərənin landşaft xüsusiyyəti ilə əlaqələndirənlər *ar* (qonur) və *sal* (bütöv hamar daş, qaya) komponentli bu hidronimi "qonur rəngli sal daş, qaya" mənasında izah edirlər

**Arşalı** *oyk*, *düz* Kürdəmir r-nunun Pirili i ə v -də kənd Şirvan düzündədir Ərşəli variantında da işlənir Tədqiqatçılara görə, kəndin adı keçmişdə Quba və Şirvanda yaşamış tayfalardan biri olan ərşəli tayfasının adındandır Ərdəbil şəhərinin şm -q -ində, Qarasu çayı hövzəsində Ərşə adlı tarixi mahal qeydə alınmışdır Belə güman edilir ki, kəndi həmin mahaldan köçüb gələnlər salmışlar Türk, monqol, tunqus-mancur dillərində *arsan/arşan*, o cümlədən *arsal/arşal* "mineral su, müalicəvi su", "dağ çayı" deməkdir Oykonim "müalicəvi suyu olan yer" mənasını ifadə edir 1917-ci ildə Quba qəzasında Arşalı kəndi qeydə alınmışdır Buryat toponimiyasında Arşan, Tatarıstanda Arça adlı dağlıq kurort şəhəri vardır

**Arta** *oyk*, *sadə*. Lerik r-nunun Osyədərə i ə v.-də kənd Dağlıq ərazidədir Türk dillərində *arta* sözünün "sıra dağ, dağ tirəsi, alçaq dağlıq", "dağıdılmış, pozulmuş", "bolluq", "balta küpü" mənalarında işlənməsi məlumdur Oykonimin coğrafi mövqeyi əsas verir ki, onu "dağ aşırımında yerləşən kənd" kimi izah edək 1917-ci ildə Şamaxı qəzasında Artaçı kəndi də qeydə alınmışdır

**Artəpə** *or*, *mür* Gədəbəy r-nunun Soyuqbulaq kəndi ərazisində təpə Ərtəpə variantında daha çox işlənir "Yüksək təpə, hündür təpə" deməkdir

**Artəpə** *hidr*, *sadə*. Daşkəsən və Şəmkir r-nları ərazisində çay Şəmkir çayının qoludur Adını eyniadlı yüksəklikdən almışdır

**Artupa** *oyk*., *mür* Astara r-nunun Sənçərədi i ə.v -də kənd Xəzər dənizindən bir qədər aralı, Lənkəran ovalığındadır Oykonim *art* və *upa* (oba) sözlərindən düzəlib, "dağ aşırımında salınan oba, kənd" deməkdir

**Artyom** Abşeron arxipelaqında ən böyük ada, Xəzər dənizindədir Pirallahı adasının 1925-ci ildən 1991-ci ilədək adıdır Peşəkar inqilabçı Artyomun (F A Sergeyevin) şərəfinə adlandırılmışdır. Rus xəritələrində adanı "Svyatoy" da adlandırmışlar Artyomada qəsəbəsi bu adadadır 1991-ci ildən həm ada, həm də qəsəbə Pirallahı adlandırılmışdır

**Aru** *hidr*, *sadə* Goranboy r-nu ərazisində çay Mənası "təmiz, saf" deməkdir

**Arus** *oyk*, *sadə* Yardımlı r-nunun eyniadlı i ə v -də kənd Burovar silsiləsinin ətəyindədir Oykonim Ərus variantında da işlənir Mənbələrin verdiyi məlumata görə, həmin kənd Mirımli, Tapırlı, Məlekli və Aruslu adlanan dörd məhəllədən ibarətdir XIX əsrin ikinci yarısına aid mənbələrdə də Lənkəran qəzasında mənşəcə qıpçaqlardan olan *orus/ərus* tayfasının yaşadığı göstərilir *Arus* sözü qədim türklərdə "uzun, hündür adam" deməkdir

**Artunaqomer** *oyk*, *mür* Kəlbəcər r-nunun eyniadlı i ə v -də kənd Keçmiş adı Qızılqaya olmuşdur Keçən əsrdə ermənilərin dəyişdirdikləri adlardandır. Tərtər çayından bir qədər aralı, dağ ətəyindədir Erm *Artunaqomer* "Artun peyəsi" deməkdir 1992-ci ildən kəndin adı yenidən Qızılqaya kimi rəsmiləşdirilmişdir

**Arvan** *or* *sadə* Culfa r-nu ərazisində dağ Hün 1280 m Toponimik ədəbiyyatların bir çoxunda *arvan* sözü "erkək dəvə cinsi", "ikihürgüclü dəvə" kimi izah olunur Lakin aparılan tədqiqatlar göstərir ki, arvan *ar* və *van* hissələrindən ibarət olub, bir çox xalqların toponimiyasında *ar* "quru çay dərəsi"; "qoruyucu, keşikçi", *van* isə "düşərgə, yaşayış yeri", "şiş uclu zirvə", "dayanacaq" və s kimi mənalandırılır Bu baxımdan oronimi "keşikçi zirvə" kimi izah etmək olar Qazaxıstanın Oş vilayətində Aravan adlanan r-n məlumdur

**Arvan** *hidr* *sadə* Culfa r-nu ərazisində çay Adını eyniadlı dağdan almışdır

**Arvana** *oyk*, *düz* Yardımlı r-nunun Peştəsər i ə v -də kənd Talış dağlarının ətəklərindədir XIV əsrə aid Fəzlullah ibn Ruzbihan Xuncinin "Tarıxi Aləm-arayi əmini" əsərində Arvanadağı oronimu qeydə alınmışdır Azərbaycan dilinin dialektlərində *arvana* "boz dişi dəvə" deməkdir. Lakin kəndin adı yaxınlığındakı dağlardan birinin adı ilə də adlandırıla bilər Mənbələrin verdiyi məlumata görə, Peştəsər dağ silsiləsinin Alvan adlanan c -q yamacında Arvana adlı yaşayış məntəqəsinin xarabalığı var XIX əsrdə salınmış indiki kənd də həmin xarabalığın adı ilə adlanmışdır Bəzi tədqiqatçılara görə, Arvana etnotoponim hesab edilir

**Arvançay** *hidr*. *mür* Qəbələ r-nu ərazisində çay Hidronim "quru çay dərəsi" mənasındadır

**Arzanax** *or*, *mür* Qax və Şəki r-nları ərazisində dağ Qədim türk dillərində *arzalarzu* "sönməmiş əhəng", *nax/nak* "xalis, təmiz" deməkdir Dağın adı onu təşkil edən süxurların adından götürülüb Bu sözlə bağlı Ağstafa şəhəri yaxınlığında Arzamas adlı təpə və Rusiyanın Qorki vilayətində Arzamas adlı şəhər qeydə alınmışdır

**Arzu** *oyk*, *sadə* Xaçmaz r-nunun Yergüc i ə v -də qəs Samur-Dəvəçi ovalığındadır 50-ci illərin əvvəllərində 12 №-li sovxozun yanında salınmış, 1965-ci ildə rəsmi olaraq belə adlandırılmışdır Keçən əsrin əvvəllərində Ermənistandan köçürülmüş azərb -lar məskunlaşdırılmışdır Kəndin adı əhalinin xoş gələcəyə ümidi ilə bağlıdır

**Asxanakəran** *oyk* *mür* Astara r-nunun eyniadlı i ə v -də kənd Bəşərü çayının sol sahilində, Peştəsər silsiləsinin ətəyindədir Türk dillərində *as* sözünün "qartal", "qədim alanların adı", "qamış" mənalarında işlənməsi məlumdur Lakin Azərb dilinin dialektlərində *as* "əs, əks-səda, səs-küy" mənalarını da ifadə edir Kəndin yerləşdiyi coğrafi şərait onun adının "qartal" və ya "əks-səda" sözləri ilə bağlı olduğunu söyləməyə imkan verir *Xana* və *karan* sözlərinin hər ikisi yaşayış məntəqəsi bildirən toponimik terminlərdir Bəzi tədqiqatçılar toponimi talış dilinin materialları əsasında "dəmirçi evləri" kimi də izah edirlər

**Aslanarx** *hidr*, *mür* Bərdə r-nu ərazisində arx Hidronim *Aslan* və *arx* sözlərindən ibarətdir 1933-cü ildə həmin r-nun Xoruzlu i ə v -də Aslanlar adlı kənd də qeydə alınmışdır Arx həmin kəndin adı ilə bağlıdır.

**Aslan daşı** *or*, *mür* Xəzər dənizində ada Abşeron arxipelaqında ən kiçik adalardan biridir Çilov adası yaxınlığındadır Yerli əhalinin verdiyi məlumata görə, Aslan adlı bir dənizçinin gəmisi buradakı daşlara toxunub fəlakətə uğradığı üçün ada bu adı almışdır Buradakı mayak da Aslan mayakı adlanır *Aslan* (şir) çığıllərin totemi olmaqla yanaşı türk xalqlarında güc-qüdrət rəmzi olmuşdur Mənbələrdə ada Aslan qayası şəklində də qeydə alınmışdır "Qüdrətli qaya" deməkdir

**Aslanoba** *oyk*, *mür* Xaçmaz r-nunun Susayqışlaq i ə v -də kənd Xəzər dənizi sahilindədir Oykonim Aslan (şəxs adı) və oba sözlərindən düzəlib, "Aslana aid oba, kənd" deməkdir *Aslan* sözü antroponim və etnonim kimi türkdilli xalqların toponimiyasında geniş yayılmışdır Aslanboyun, Aslanbud, Aslanbəyli (Qazax r-nunda Əli Bayramlı kəndinin keçmiş adı), Aslanlar, Aslanlı (Ermənistan), Aslan, Aslanşah, Qamışaslan, Aslandüz (İran) və s

**Asmaçay** *hidr*, *mür* Xaçmaz və Quba r-nları ərazisində çay Hidronim *asma* və *çay* sözlərindən düzəlib Qədim türk abidələrinin dilində asla/asma sözü "qidalanan, artan, çoxalan" mənalarında işlənmişdir *Asmaçay* "artan, suyu çoxalan, hər hansı bir su hövzəsi hesabına qidalanan çay" deməkdir 1917-ci ildə Lənkəran qəzasında Asladar kəndi qeydə alınmışdır ki, bu oykonimin də mənası "artan, çoxalan, böyüyən" kimi izah olunmalıdır Toponimikada bu hidronimi türk dillərindəki asma (çıxıq, sallaq yer) və çay komponentlərindən ibarət "dağdan, çıxıqdan axan çay" mənalı söz kimi də izah edirlər

**Asparəsti** *oyk*., *mür* Quba r-nunun Zərqova i ə v -də kənd Vəlvələçayın sahilindədir Əslində Asparəstə olmalıdır Yerli əhalinin verdiyi məlumata görə, oykonim tat dilindəki *as* (at) və *parusta* (uçmuş, düşmüş) sözlərindən düzəlib, "atın uçduğu, düşdüyü yer" mənasındadır Tədqiqatçılara görə





isə, *aspa* (türk dillərində "sürgün", "dağ aşırımı, dağ yolu", "ağcaqovaq") və *rasta* (İran dillərində "yaşayış yeri, kənd") komponentlərindən ibarət olan bu coğrafi ad "dağ aşırımında kənd, dağ yolunda kənd" deməkdir

**Astaf** *oyk*, *mür* Daşkəsən r-nunun Qabaqtəpə i ə v -də kənd. Qaflanqala silsiləsinin ətəyindədir Oykonim *ast* (aşağı, çökək) və *af* (a/ab/ob) sözlərindən düzəlib, "dərə çay" və ya "çay dərəsi" deməkdir

**Astanlı** *oyk*, *düz* 1 Cəlilabad r-nunun eyniadlı i ə.v -də kənd Həmşirə çayı sahilində, Burovar silsiləsinin ətəyindədir XIX əsrin axırlarında kəndin əsasını Musabəyli kəndindən çıxmış astanlı nəsli qoymuşdur Kənd həmin nəslin adı ilə adlanmışdır 1933-cü ildə r-nda Astanabad adlı başqa bir kənd də qeydə alınmışdır; 2 Neftçala r-nunun Aşağı Qaramanlı i ə v -də kənd Kür çayının sahilində, düzənlikdədir Mənbələrin verdiyi məlumata görə, kənd keçmişdə Xançobanlı, Əli Sultanlı da adlanmışdır Əli Sultan xançobanı tayfasına mənsub astanlı tirəsinin başçısının adıdır Tədqiqatçılar bu oykonimləri dialekt variantında rəsmiləşdirilmiş (astanlı) aslanlı etnonimi ilə əlaqələndirirlər *Astan* sözünü toponimistlər çox vaxt şəxs adı hesab edirlər Əslində bu oykonimlərdəki *astan* komponenti Azərb xalq dilində "çay yatağında sualtı hündür yer, sualtı donqar" mənasında işlənir Çay kənarında yerləşən hər iki obyektin coğrafi mövqeyi sözün mənasına uyğundur *As* sözünün də bir çox türk dillərində "çay, böyük çay, böyük çay qolu" mənalarında işlənməsi məlumdur

**Astara** *hidr*, *mür* 1 Astara r-nu ərazisində min bulaq İstisu çay dərəsində. Astara şəhəri yaxınlığındadır Suyu yüksək dərəcədə minerallaşmış, acı-duzludur, 2 Azərb -nın İranla dövlət sərhədində çay Şindanqalası dağının (Talış silsiləsi) yamaclarından (1817 m yüksəklikdə) başlanır. Xəzər dənizinə tökülür Astara şəhəri çayın mənsəbindədir Adını ərazideki eyniadlı bulaqdan almışdır Hidronim *ast* (aşağı, çökək dərə) və *ara/ura* (yer; su, çay, bulaq) sözlərindən düzəlib, "dərədə bulaq, çökək yerdən çıxan su" mənasındadır

**Astara** *oyk*, *sadə* 1 Azərb -da inzibati r-n. İranla sərhəddə yerləşir Ş -dən Xəzər dənizinə qovuşur Q hissəsi dağlıqdır Reştəsər silsiləsinin və Talış dağlarının bir hissəsi r-nun ərazisində yerləşir Astara və Təngəru çayları r-nun ərazisindən axır Mərkəzi Astara şəhəridir Adını ərazideki eyniadlı çaydan almışdır; 2 Azərb -da şəhər Astara r-nunun mərkəzi Azərb -nın İranla sərhədində (bir hissəsi İran Azərb -nındadır), Astara çayının mənsəbində, Xəzər dənizinin sahilində, Lənkəran ovalığındadır Adını eyniadlı çaydan almışdır XIII əsrə aid mənbələrdə Astara yaşayış məntəqəsi adı kimi xatırlanır. Astara çayının Cənubi Azərb sahilində yerləşən şəhər və port da Astara adlanır Bu şəhərin qədim adı Qum olmuşdur Fars dilində qum sözü də "alçaq yer, aşağı yer" kimi izah edilir

**Astraxanbazar** *oyk*, *mür* Cəlilabad r-nunun və şəhərinin 1967-ci ilədək adı Oykonim *Haştarxan* adının rusca səsləşməsindən və *bazar* (burada "düz, meydan") sözündən ibarət olub, XIX əsrdə Həştərxan vilayətindən köçürülmüş ailələrin məskunlaşması ilə bağlı yaranmışdır

**Astraxanka** *oyk*, *düz* Şamaxı r-nunun eyniadlı i ə.v -də kənd Keçmiş adı Qızmeydanı olmuşdur Qozluçayın sağ sahilindən bir qədər aralı, Qızmeydanı platosundadır Çar hökumətinin Rusiyanın mərkəzi quberniyalarından müxtəlif dini təriqət nümayəndələrini (molokan, baptist, duxobor və b ) milli ucqarlara, o cümlədən Azərb -na köçürmə siyasəti ilə əlaqədar 1849-cu ildə Həştərxan vilayətindən köçüb gələnlər burada məskən salmışlar Oykonim *Haştarxan* adının rusca səslənməsindən və rusların əlavə etdiyi *-ka* şəkilçisindən ibarət olub, "Həştərxandan gələnlər" mənasındadır

**Astraxanka** *hidr*, *düz* 1 Şamaxı r-nu ərazisində çay Həmşirə (fars. "bacı") çayı da adlanır. 2 Şamaxı r-nunda Astraxanka kəndi yaxınlığında mineral bulaq Üç soyuq kükürdlü bulaqdan ibarətdir Hidronim ərazideki eyniadlı yaşayış məntəqəsinin adından yaranmışdır Toponimiyada *astraqan* bir-birinə çox yaxın olan kiçik körfəzlərə deyilir Bu baxımdan çayın hər iki adı bir-birini tamamlayır

**Astraxanovka** *oyk., düz.* Oğuz r-nunun Böyük Söyüdlü i.ə.v.-də kənd. Düzənlikdədir. Yaşayış məntəqəsi XIX əsrdə Həştərxan vilayətindən köçüb gəlmiş ailələrin məskunlaşması nəticəsində yaranmışdır. Oykonim *Həştərxan* (yer adı) və rusca *-ovka* şəkilçisindən ibarət olub, "həştərxanlılar" mənasındadır.

**Aşağılü** *or., sadə.* Şamaxı r-nu ərazisində dağ. Tudar və Çigil çaylarının aşağı axınları arasında yerləşir. Hün. 798 m. Əsli Aşağılı olmalıdır. Mənası "aşağıda yerləşən, aşağıda yaşayanlar" deməkdir. Ərazinin iki çayın aşağı axınında yerləşməsi də bu izahın doğruluğunu sübut edir. Bəzi tədqiqatçılar oronimi "aşağılü bitən dağ" kimi mənalandırırlar.

**Aşağı Ağcakənd** *oyk., mür.* Goranboy r-nunun eyniadlı qəsəbə i.ə.v.-də ştq. Qaraçayın (Goran çayının yuxarı axarı) sahilində, dağlıq ərazidədir. 1938-ci ildən 1992-ci ilədək Şaumyan adlandırılmışdır. Qarabağ yaylasında yerləşən Ağcakənd yaşayış məntəqəsinin adının qarşılığıdır.

**Aşağı Ağcayazı** *oyk., mür.* Ağdaş r-nunun Dəhnəxəlil i.ə.v.-də kənd. Şirvan düzündədir. XIX əsrin ortalarında Ağcayazı (indiki Yuxarı Ağcayazı) kəndindən çıxmış ərəbəbdülkərim tayfasına mənsub olan ailələrin məskunlaşması nəticəsində yaranmışdır. Birinci komponent ərazidəki eyniadlı iki yaşayış məntəqəsini fərqləndirmək məqsədilə işlənir. Oykonim "aşağıda yerləşən Ağcayazı kəndinin aşağı hissəsi" deməkdir.

**Aşağı Ağasıbəyli** *oyk., mür.* Samux r-nunun Əli Bayramlı i.ə.v.-də kənd. Düzənlikdədir. Yuxarı Ağasıbəyli oykoniminin qarşılığıdır. Ağasıbəyli XIX əsrin ortalarında maldar elatlardan birinin adını əks etdirir.

**Aşağı Amburdərə** *oyk., mür.* Lerik r-nunun Qosmalyan i.ə.v.-də kənd. Gəncəvü çayının sahilində, Peştəsər silsiləsinin ətəyindədir. 1933-cü ildə kənd sadəcə Amburdərə şəklində qeydə alınmışdır. Oykonim "aşağıda yerləşən Amburdərə kəndi" deməkdir.

**Aşağı Apu** *oyk., mür.* Lənkəran r-nunun Biləsər i.ə.v.-də kənd. Peştəsər silsiləsinin yamacındadır. Oykonim "aşağıda yerləşən Apu kəndi" deməkdir. Türk dilləri və onların dialektlərində *abı/abu/apu* paralelləri "xəlvət guşə, təcrid olunmuş yer, gizli yer, dincəlmək üçün sakit yer", "papaq; dağ başı" mənalarını ifadə edir. Bu da həmin kəndin yerləşdiyi ərazinin coğrafi mövqeyi ilə bağlıdır.

**Aşağı Aralıq** *oyk., mür.* Şərur r-nunun Qarxun i.ə.v.-də kənd. Düzənlikdədir. Yaşayış məntəqəsi keçmiş Aralıq Başkənd (indiki Yuxarı Aralıq) kəndindən çıxmış ailələr tərəfindən salınmış və Aşağı Aralıq Başkənd adlandırılmışdır. Sonralar toponimin tərkibindəki Başkənd komponenti ixtisara uğramış və indiki formada rəsmiləşdirilmişdir. Oykonim "aşağıda yerləşən Aralıq kəndi" deməkdir.

**Aşağı Astanlı** *oyk., mür.* Yardımlı r-nunun Astanlı i.ə.v.-də kənd. Bolqar çayından bir qədər aralı, Burovar silsiləsinin ətəyindədir. Keçmiş adı Astanlı olmuşdur. Oykonimin birinci komponenti kəndin coğrafi mövqeyini bildirməklə yanaşı, onu eyniadlı digər yaşayış məntəqəsindən fərqləndirməyə xidmət edir. "Astanlı kəndinin aşağı hissəsi" deməkdir.

**Aşağı Atuc** *oyk., mür.* Quba r-nunun Güləzı i.ə.v.-də kənd. Baş Qafqaz silsiləsinin yamacındadır. XIX əsrin sonlarında Atuc kəndindən çıxmış bir qrup ailənin həmin kəndə məxsus qışlaq yerində məskunlaşması nəticəsində yaranmışdır. Yaşayış məntəqəsi əvvəlki kənddən bir qədər aşağıda yerləşdiyi üçün belə adlandırılmışdır.

**Aşağı Ayıblı** *oyk., mür.* Tovuz r-nunun eyniadlı i.ə.v.-də kənd. Zəyəm çayının sol sahilində, Gəncə-Qazax düzənliyindədir. XIX əsrin əvvəllərində keçmiş Gövhər Ayıblı kəndindən çıxmış ailələrin burada məskunlaşması nəticəsində yaranmışdır. Tədqiqatçıların məlumatına görə, bu kənd şərti olaraq üç hissəyə ayrılır: Aşağı Ayıblı, Yuxarı Ayıblı (və ya Qaş Ayıblı), Qazanlar. Araşdırmalar göstərir ki, bu kəndin ilkin adı Çıraqlılardır. Zəyəmçay üzərində məskun olan çıraqlıların hakimi Eyyubxan olmuşdur. XVII-XVIII əsrlərdə kənd Eyyublu kimi də qeydə alınmışdır. *Ayıblı* Eyyublu adının təhrif olunmuş şəklidir. Oykonim "Eyyublu kəndinin aşağı hissəsi" kimi başa düşülməlidir. R-nun ərazisində Ayıblı qobusu adlı yarğan da vardır.





**Aşağı Ayrım** *oyk., mür.* Kəlbəcər r-nunun Oktyabrkənd i.ə.v.-də kənd. Dağətəyi ərazidədir. Kənd Ayrım çayının aşağı hissəsində yerləşdiyi üçün belə adlandırılmışdır.

**Aşağı Aza** *oyk., mür.* Ordubad r-nunun Aza i.ə.v.-də kənd. Düzənlikdədir. Oykonim "aşağıda yerləşən Aza kəndi" mənasındadır. 2003-cü ildən kəndin adı Azakənd kimi rəsmiləşdirilmişdir.

**Aşağı Bilnə** *oyk., mür.* Lerik r-nunun Nodə i.ə.v.-də kənd. Dağətəyi ərazidədir. XIX əsrdə Bilnə (indiki Yuxarı Bilnə) kəndindən çıxmış ailələr tərəfindən salınmışdır. "Bilnə kəndinin aşağı hissəsi" deməkdir. Kənd öz adını ərazidəki Bilnəçayın adından almışdır. Türk dillərində *bilən* "dağ keçidi", Azərb. dilinin dialektlərində *bilin* "tunel, dağın altından açılan yol" mənalarında işlənməkdədir. Onu da qeyd etmək lazımdır ki, 1917-ci ildə Lənkəran qəzasında iki Bilnə və bir Bilinə kəndi qeydə alınmışdır.

**Aşağı Bradi** *oyk., mür.* Lerik r-nunun Dəstər i.ə.v.-də kənd. Peştəsər silsiləsinin ətəyindədir. XIX əsrdə Bradi (indiki Yuxarı Bradi) kəndindən çıxmış bir qrup ailənin məskunlaşması nəticəsində yaranmışdır. Toponimin ikinci komponenti Talış dilində *bur* (hündür, yüksək) və *di* (kənd) sözlərindən ibarət olub (*-a* bitişdirici sait), "yüksəklikdə yerləşən kənd" deməkdir. Birinci komponent isə kəndin coğrafi mövqeyini göstərir. Oykonim "Bradi kəndinin aşağı hissəsi" deməkdir.

**Aşağı Bucaq** *oyk., mür.* Yevlax r-nunun eyniadlı i.ə.v.-də kənd. Əlican çayının sahilindədir. Yerli əhalinin verdiyi məlumata görə, kənd Əlican çayının Bozdağ silsiləsi ilə bucaq əmələ gətirdiyi ərazidə yerləşdiyi üçün belə adlanır. Birinci komponent isə eyniadlı iki yaşayış məntəqəsini fərqləndirməyə xidmət edir. Bucaq, eyni zamanda monqolların (tatarların) noğay qəbiləsinə mənsub nəslin adıdır. Bölgədə bu nəslin adı ilə bağlı başqa obyekt adları da vardır: Bucaq (Mingəçevir), Qarabucaq (Kürdəmir).

**Aşağı Buzqov** *oyk., mür.* Babək r-nunun Buzqov i.ə.v.-də kənd. Buzqov çayının sahilində, Dərələyəz silsiləsinin c. yamacındadır. Yaşayış məntəqəsi Buzqov çayının aşağı hissəsində yerləşdiyinə görə belə adlandırılmışdır. Oykonim Yuxarı Buzqov adının qarşılığıdır. Ərazi adını eyniadlı çaydan almışdır.

**Aşağı Cibikli** *oyk., mür.* Qubadlı r-nunun Çardaqlı i.ə.v.-də kənd. Kosakərəm (Bərgüşad çayının qolu) çayının sahilindədir. Keçmiş adı Kosakərəm olmuşdur. XIX əsrə aid mənbələrdən birinin məlumatına görə, qədim türk tayfalarından olan cibiklilərin oturaq həyata keçməsi ilə əlaqədar əvvəlcə Yuxarı Cibikli kəndinin əsası qoyulmuşdur. Kollektivləşmə illərində isə oradan çıxmış bir sıra ailələr tərəfindən Aşağı Cibikli kəndi salınmışdır. Oykonimlər yaşayış məntəqələrinin coğrafi mövqeyi ilə əlaqədar yaranmışdır. Mənbələrdə hələ XV əsrdən cibikli/cibiklu tayfasının bu ərazidə yaşaması haqqında məlumat verilir. Qazax r-nunun Caylı kəndində də cibişli nəsli qeydə alınmışdır.

**Aşağı Cürəli** *oyk., mür.* Biləsuvar r-nunun eyniadlı i.ə.v.-də kənd. Muğan düzündədir. Yerli əhalinin məlumatına görə, Sovet hakimiyyəti illərində Yuxarı Cürəli adlanan məntəqədən bir qrup ailə ayrılaraq Aşağı Cürəli kəndini əmələ gətirmişdir. Oykonim yaşayış məntəqəsinin coğrafi mövqeyi ilə əlaqədar yaranmışdır.

**Aşağı Çardaqlar** *oyk., mür.* Zaqatala r-nunun Danaçı i.ə.v.-də kənd. Düzənlikdədir. Tədqiqatçıların yazdığına və yerli əhalinin dediyinə görə, həmin kənd Dağıstanın Çurdax kəndindən köçüb gəlmiş ailələr tərəfindən salınmışdır. Bunlar mənşəcə avarlardır. Sonralar *çurdax* sözü *çardax* şəklinə düşmüşdür. Oykonim yaşayış məntəqəsinin coğrafi mövqeyi ilə əlaqədar yaranmışdır.

**Aşağı Çaykənd** *oyk., mür.* Şəmkir r-nunun Barsum i.ə.v.-də kənd. Dağ ətəyində yerləşir. XIX əsrdə bu ərazidə Gürcüstandan və Ermənistandan gəlmə ermənilər məskunlaşdıqdan sonra kəndin adı Barum kimi rəsmiləşdirilmişdir. Hal-hazırda, əsasən Ermənistanın Qaraqoyunlu mahalının Çaykənd kəndindən və Göyçə mahalından didər-

gin salınmış azərb ailələr burada məskunlaşmışlar

**Aşağı Çaylı** *oyk*, *mür* Ağdərə r-nunun Yuxarı Çaylı i ə.v -də kənd Tərtər çayının sol sahilində yerləşən və əvvəllər Çaylı adlanan kəndin aşağı hissəsidir 1933-cü ildə Aşağı Çaylı kimi qeydə alınan bu kənd sonralar Nerkin (erm "aşağı") Çaylı adlandırılmışdı 1992-ci ildən kəndin əvvəlki adı bərpa olunmuşdur

**Aşağı Çəmənli** *oyk*, *mür*. Beyləqan r-nunun Yuxarı Çəmənli i ə v -də kənd Mil düzündədir Yerli əhalinin məlumatına görə, kəndi Ağdam r-nundakı Çəmənli kəndindən ayrılmış ailələr salmışlar Bəzən Araz Çəmənlisi də adlanır Oykonim yaşayış məntəqəsinin coğrafi mövqeyi ilə əlaqədar yaranmışdır

**Aşağı Danzıq** *oyk*, *mür* 1933-cü ildə Naxçıvan r-nunun Yeci i ə v -də qeydə alınmışdır Oykonim "Danzıq yaşayış məntəqəsinin aşağı hissəsi" deməkdir Danzıq/Danzıx/Danzik variantlarında yazıya alınan bu oykonimin *dan* (qədim türk dillərində "çöl, açıq yer") və *zik/zıq* (soyuq) komponentlərindən ibarət olub, "soyuq çöl" mənasını ifadə etdiyini söyləmək olar

**Aşağı Daşağıl** *oyk*, *mür* Şəki r-nunun Aydınbulaq i.ə.v -də kənd Dəhnə çayının sahilində, çökəklikdədir Mənbələrin verdiyi məlumatdan və tədqiqatçıların yazılarından məlum olur ki, bu kənd Şəki r-nundakı Bucaq kəndinin yaxınlığında yerləşdiyinə görə keçmişdə Bucaq Daşağıl, bir müddət Qışlaq Daşağıl da adlandırılmışdır XIX əsrdə Daşağıl kəndindən çıxmış bir qrup ailə kəndin yaxınlığında yeni yaşayış məntəqəsi – Aşağı Daşağıl yaratmışlar Əvvəlki kənd isə indi olduğu kimi, Baş Daşağıl adlandırılmışdır Oykonimin ikinci komponenti *daş* və *ağıl* (qoyun saxlanan yer; tövlə) sözlərindən ibarətdir Həqiqətən də, kəndin ərazisində iki təbii mağara və bir qayaaltı daş mağara vardır

**Aşağı Daşarx** *oyk*, *mür* Şərur r-nunun Siyaqut i ə v -də kənd Arpaçayın sahilindədir Oykonim "Daşarx yaşayış məntəqəsinin aşağı hissəsi" deməkdir Kəndi keçmiş Daşarx (indiki Yuxarı Daşarx) kəndindən çıxmış ailələr kollektivləşmə illərində (XX əsrin 30-cu illəri) salmışlar

**Aşağı Daşkəsən** *oyk*, *mür* Daşkəsən r-nunun Daşkəsən qəs i ə v.-də kənd Qoşqar çayının sahilindədir "Daşkəsən yaşayış məntəqəsinin aşağı hissəsi" deməkdir Daşkəsən filiz mədənlərinin istismarı ilə əlaqədar olaraq Böyük Vətən müharibəsindən sonra yaranmış yaşayış məntəqələrindəndir

**Aşağı Əbdürəhmanlı** *oyk*, *mür*. Füzuli r-nunun Əbdürəhmanlı i ə v.-də kənd. Çərəkən çayının sahilindədir Kəndi əbdürəhmanlı nəslinə mənsub ailələr salmışlar "Əbdürəhmanlı yaşayış məntəqəsinin aşağı hissəsi" deməkdir Oykonim yaşayış məntəqəsinin coğrafi mövqeyi ilə əlaqədar yaranmışdır

**Aşağı Əndəmiç** *oyk*, *mür*. Ordubad r-nunun Nüsnüs i ə v.-də kənd Ordubad çayının sahilindədir Yaşayış məntəqəsini XIX əsrin əvvəllərində keçmiş Əndəmiç kəndindən çıxmış ailələr salmış və aşağıda, çökəkdə yerləşdiyinə görə belə adlanmışdır Xalq danışıq dilində *əndə* "eniş-yoxuş"; "çala-çuxur", *miş* "su yığılan yer" mənalarını ifadə edir Beləliklə, oykonim "su yığılan çala, çuxur yer" mənasındadır 2003-cü ildən kəndin adı Aşağı Əndəmic kimi rəsmiləşdirilmişdir

**Aşağı Əskipara** *oyk*., *mür* Qazax r-nunun Əskipara i ə v -də kənd. Coğas çayının sol sahilində, Qazançı dağının ətəyindədir Oykonim kəndin coğrafi mövqeyi ilə bağlı yaranmışdır "Əskipara yaşayış məntəqəsinin aşağı hissəsi" deməkdir Əskipara isə Köhnəkənd oykoniminin sinonimidir.

**Aşağı Əylis** *oyk*, *mür* Ordubad r-nunun Əylis i ə v -də kənd Əylis çayının sahilində, dağ ətəyindədir. "Əylis yaşayış məntəqəsinin aşağı hissəsi" deməkdir Kənd XIX əsrdə Əylis (indiki Yuxarı Əylis) kəndindən çıxmış bir qrup ailənin Dəşt (farsca "çöl, səhra") adlı yerdə məskunlaşması nəticəsində yaranmışdır Toponimin ikinci komponenti *Əylis* (əylənmək, köç salmaq, məskunlaşmaq mənalı feldən) "əylənc, düşərgə, yaşayış yeri" mənasına uyğundur

**Aşağı Fərəcan** *oyk*, *mür*. Laçın r-nunun eyniadlı i ə v -də kənd Həkəri çayının sol sahilindən bir qədər aralı, Qarabağ silsiləsinin c -q ətəyindədir. Keçmiş adı Haraldır 1954-cü ildə qonşu Fərəcan kəndindən kö-





çüb gəlmiş ailələr məskunlaşdığı üçün kəndin adı dəyişdirilərək Aşağı Fərəcan adlandırılmışdır Oykonim "Aşağıda yerləşən Fərəcan kəndi" deməkdir

**Aşağı Filfili** *oyk*, *mür* Oğuz r-nunun Filfili i ə v -də kənd XIX əsrdə indiki Filfili kəndi əsasında yaranmışdır Bucaq kəndi yaxınlığında yerləşdiyinə görə keçmişdə Bucaq Filfili də adlandırılmışdır Oykonim yaşayış məntəqəsinin coğrafi mövqeyi ilə əlaqədar yaranmışdır *Filfili* isə "istiot" deməkdir

**Aşağı Gədik** *or*, *mür* Lerik r-nunun Kəlvəz kəndində dağ "Ətrafa nisbətən alçaq dağ yolu" deməkdir

**Aşağı Göyəli** *oyk*., *mür* Zəngilan r-nunun Şayıflı i ə v -də kənd Dağətəyi ərazidədir Oykonim yaşayış məntəqəsinin coğrafi mövqeyi ilə bağlı yaranmışdır Kəndi Yuxarı Göyəli kəndindən köçüb gələn ailələr salmışlar Toponim XIX əsrdə Zəngəzur qəzasında yaşamış maldar göyəli tayfasının adını əks etdirir Etnotoponimdir

**Aşağı Göynük** *oyk*, *mür* Şəki r-nunun eyniadlı i.ə v -də kənd Çaparx çayının hər iki sahilində, Alazan-Həftəran vadisindədir Yaşayış məntəqəsi XIX əsrin əvvəllərində Göynük (indiki Baş Göynük) kəndindən çıxmış ailələrin burada məskunlaşması nəticəsində yaranmışdır "Aşağıda olan Göynük kəndi" deməkdir

**Aşağı Güzdək** *oyk*., *mür* Abşeron r-nunun Ceyranbatan i ə v -də qəsəbə Əvvəllər Güzdək dəmir yol stansiyası yanında qəsəbə adlandırılmışdır 1965-ci ildən qəsəbənin adı indiki kimi rəsmiləşdirilmişdir Oykonim yaşayış məntəqəsinin coğrafi möqeyi ilə bağlı yaranmışdır Oykonimin ikinci komponenti *güzlək* (payız otlağı) sözünün tələffüz formasıdır

**Aşağı Güzlək** *oyk*, *mür* Füzuli r-nunun Pirəhmədli i ə v -də kənd Düzənlikdədir Yaşayış məntəqəsi XIX əsrdə Güzdək (indiki Yuxarı Güzlək) kəndindən çıxmış ailələrin məskunlaşması nəticəsində yaranmışdır "Güzlək yaşayış məntəqəsinin aşağı hissəsi" deməkdir *Güzlək* qədim Azərb dilində "payız otlağı", "payız yurdu" mənalarını ifadə edir

**Aşağı Hacıqasımlı** *oyk*, *mür* Saatlı r-nunun Hacıqasımlı i ə.v -də kənd. Araz çayının sahilində, Mil düzündədir Oykonimin birinci komponenti kəndin yerləşdiyi coğrafi mövqeyi bildirir, ikinci komponent isə şahsevənlərin hacıqasımlı qolunun adı ilə bağlıdır

**Aşağı Xaç** *oyk*., *mür* Kəlbəcər r-nunun Çaykənd i ə v -də kənd Tərtər çayının sahilində, dağətəyi ərazidədir Oykonimin birinci komponenti yaşayış məntəqəsinin coğrafi mövqeyi ilə bağlıdır İkinci komponent isə abidələrin dilində "xristianlığın rəmzi işarəsi", "kilsə bayrağı"; "kilsə" mənalarında işlənmişdir Ərazidəki Sınıqkilsə yer adı bu sözün məhz "kilsə" mənasını qəbul etməyə əsas verir

**Aşağı Xocamusaxlı** *oyk*, *mür* Qubadlı r-nunun Fərəcan i ə v -də kənd Bərgüşad silsiləsinin ətəyindədir Keçmiş adı Qalacıq Xocamusaxlıdır Yaşayış məntəqəsini XIX əsrin axırlarında Xocamusaxlı (indiki Yuxarı Xocamusaxlı) kəndindən çıxmış ailələr salmışlar Əsl adı xacəbuishaqlı olan xocamusaxlı tayfası qədimdən Zəngəzur qəzasında yaşamışdır Onların keçmişdə Qalacıq, Dəstəgird və Mazutlu adlanan qışlaqları sonralar tədricən müstəqil yaşayış məntəqələrinə çevrilmişdir Oykonim yaşayış məntəqəsinin coğrafi mövqeyi ilə bağlı yaranmışdır

**Aşağı Xuc** *oyk*., *mür* Quba r-nunun Xucbala i ə.v -də kənd Yaşayış məntəqəsi XIX əsrdə Orta Xuc kəndinə məxsus qışlaq yerində bina edilmişdir Toponimi, əsasən mənşəcə qıpçaqlardan olan kuç tayfasının adı ilə əlaqələndirirlər Oykonimin birinci komponenti yaşayış məntəqəsini eyniadlı digər iki kənddən fərqləndirməyə xidmət edir

**Aşağı İmamqulukənd** *oyk*, *mür* Qusar r-nunun eyniadlı i ə v -də kənd Qusar maili düzənliyindədir XX əsrin əvvəllərində İmamqulukənd yaşayış məntəqəsinə aid pay torpaqlarından bir qədər aşağıda eyniadlı yeni yaşayış məntəqəsi salınmış və Aşağı İmamqulukənd adlandırılmışdır

**Aşağı Kəldək/Gəldək** *oyk*, *mür* Şəki r-nunun Baş Küngüt i ə v -də kənd. Əyriçayın sahilində, Alazan – Əyriçay çökəkliyindədir Tədqiqatçılar oykonimi *kəl* (gücdən düşmüş,

dincə qoyulmuş) və -*dak* (-*lak*) komponentlərindən ibarət "dincə qoyulmuş əkin sahəsi" mənalı söz kimi izah edirlər. *Kəldək* komponenti kəndin ərazisindəki Kol dağının adından yaranıb "Kol dağı yerləşən, Kol dağının ətrafı, yanı" mənasını ifadə edir. Yaşayış məntəqəsini keçmiş Kəldək (indiki Baş Kəldək) kəndindən çıxmış ailələr nisbətən aşağıda saldıqları üçün belə adlandırılmışlar.

**Aşağı Kəsəmən** *oyk., mür.* Ağstafa r-nunda kənd. Gəncə-Qazax düzənliyindədir. Yaşayış məntəqəsi Sovet hakimiyyəti illərində Qıraq Kəsəmən kəndindən çıxmış ailələr tərəfindən salınmışdır. Dağ Kəsəmən kəndinin qarşılığı kimi nəzərdə tutulmuşdur.

**Aşağı Küngüt** *oyk., mür.* Şəki r-nunun eyniadlı i.ə.v.-də kənd. Küngüt çayının sahilində, Alazan-Həftəran vadisindədir. Kəndi XIX əsrin əvvəllərində Baş Küngüt kəndindən çıxmış ailələr salmışlar. Oykonimin birinci komponenti kəndin coğrafi mövqeyini, ikinci komponenti isə türkdilli kinkit tayfasının adını əks etdirir.

**Aşağı Kürdmahmudlu** *oyk., mür.* Füzuli r-nunun Kürdmahmudlu i.ə.v.-də kənd. Düzənlikdədir. Oykonimin birinci komponenti yaşayış məntəqəsinin coğrafi mövqeyi, ikinci komponenti isə maldar kürdmahmudlu tayfasının adı ilə bağlıdır.

**Aşağı Kürkəndi** *oyk., mür.* Salyan r-nunun Arbatan i.ə.v.-də kənd. Kür çayının sahilindədir. Yaşayış məntəqəsi XX əsrin əvvəllərində Salyan balıq vətəgələrində işləmək üçün Cənubi Azərb.-dan gələnlər tərəfindən salınmış və Kürkəndi adlandırılmışdı. Sonralar tikinti idarəsinin fəhlə və qulluqçuları üçün salınmış qəsəbə də kəndlə birləşmişdir. Yeni salınmış yaşayış məntəqəsi həmin kənddən bir qədər aşağıda yerləşdiyi üçün Aşağı Kürkəndi adlandırılmışdır. Kürkəndi "Kür sahilində kənd" mənasındadır.

**Aşağı Qaraçanlı** *oyk., mür.* Kəlbəcər r-nunun Orta Qaraçanlı i.ə.v.-də kənd. Uluxan çayının (Tərtər çayının qolu) sahilində, dağətəyi ərazidədir. Yerli əhalinin məlumatına görə, yaşayış məntəqəsini XIX əsrdə Zəngəzur qəzasının Qaraçanlı kəndindən (indiki Laçın r-nu ərazisindədir) gəlmiş iki qardaş – Uluxan və Əhmədxan salmışlar. Ona görə də kəndə el arasında Uluxan Qaraçanlı və ya Fərzalıuşağı deyirlər. Əhmədxanın oğlanlarından Fərzalı kəndin aşağı hissəsində məskunlaşdığı üçün bura Aşağı Qaraçanlı, digər oğlu Məmmədxan kəndin orta hissəsində məskunlaşdığı üçün bura Orta Qaraçanlı, Uluxanın əmisi oğlu Bayram (Balo) isə kəndin yuxarı hissəsində məskunlaşdığı üçün həmin yer Baş Qaraçanlı adlandırılmışdır (bu kənd Balouşağı da adlanır).

**Aşağı Qaragüvəndli** bax Qaragüvəndi.

**Aşağı Qaramanlı** *oyk., mür.* Neftçala r-nunun eyniadlı i.ə.v.-də kənd. Kür çayının sağ sahilində, Salyan düzündədir. Oykonimin birinci komponenti kəndin coğrafi mövqeyi ilə, ikinci komponenti isə türkdilli qaramanlı tayfasının adı ilə bağlıdır.

**Aşağı Qaraməryəm** *oyk., mür.* Göyçay r-nunun İncə i.ə.v.-də kənd. Şirvan kanalı boyundadır. "Qaraməryəm (əsli Qaraməryan) adlı yaşayış məntəqəsinin aşağı hissəsi" deməkdir. Mənbələrdə Aşağı Qaraməryən variantında da qeyd olunur. İkinci komponent *qara* (böyük) və *maryan* (dağın gündöyən hissəsi, çöl bitkiləri ilə əhatə olunmuş sahə) komponentlərindən ibarət olub, "böyük otlaq sahəsi, dağın gündöyən ətəyi" mənalarını bildirir. Ərazinin coğrafi mövqeyi də bu izaha uyğundur.

**Aşağı Qaranlıq** *oyk., mür.* Xocavənd r-nunun 1923-cü ilədək adı. Oykonimin birinci komponenti yaşayış məntəqəsinin coğrafi mövqeyi ilə bağlıdır. Məntəqə adını ərazidəki Qaranlıq dağından almışdır. Ərazidə eyniadlı çay da vardır. Ermənistan ərazisindəki Martuni r-nunun adı da 1946-cı ilədək Aşağı Qaranlıq olmuşdur.

**Aşağı Qarxun** *oyk., mür.* Yevlax r-nunun Yuxarı Qarxun i.ə.v.-də kənd. Şirvan düzündədir. Kəndi XIX əsrdə İrəvan quberniyasındakı Qarxun kəndindən köçüb gəlmiş ailələr salmışlar. Yaşayış məntəqəsi Qarxun Körpükənd və ya Qıraqlı Qarxun da adlanır. Bu da onun Körpükəndin yaxınlığında və Kür çayı sahilində olması ilə əlaqədardır. XIX əsrin sonlarında kənd böyüyərək Aşağı və Yuxarı Qarxun kəndlərinə bölünmüşdür. Ermənistanın Eçmiədzin r-nundakı Araks kəndinin adı da 1946-cı ilədək Aşağı Qarxun adlanmışdır.





**Aşağı Qələnxur** *oyk., mür.* Qusar r-nunun Gilah i.ə.v.-də kənd. Samur çayının sahilindədir. Tədqiqatçılar bu toponimi ləzgi dilindəki *kalunxur* (düzənlikdə yerləşən kənd) və ya *kalınxur* (sahil kəndi) sözlərinin təhrifə uğramış forması hesab edirlər. *Qələnxur* ərazidəki orta əsrlərə aid Qalaxur/Qələxür/Qalakənd yaşayış məntəqəsinin adındandır.

**Aşağı Qəsil** *oyk., mür.* Ağdaş r-nunun Qülbəndə i.ə.v.-də kənd. Şirvan düzündədir. "Aşağıda yerləşən Qəsil kəndi" deməkdir. *Qəsil* Azərb. dilinin dialektlərində və bəzi türk dillərində işlənən *qas/qəs/qəşəl* sözləri ilə bir yuvadan olub, "otlaq, yamac" mənasını ifadə edir.

**Aşağı Qılıçbağ** *oyk., mür.* Xocalı r-nunun Xanabad i.ə.v.-də kənd. Dağətəyi ərazidədir. XIX əsrin 20-ci illərində İrandan köçüb gəlmiş erməni ailələri məskunlaşdıqdan sonra kəndi Nerkin (erm. "aşağı") Qılınçbağ adlandırmışdılar. 1992-ci ildə kəndin əvvəlki adı bərpa edilmişdir. Toponimin *Qılınc* şəxs adından və *bağ* sözündən ibarət olub, "Qılınca məxsus bağ" mənasını bildirməsi ehtimal olunur. Oykonimin birinci komponenti kəndin coğrafi mövqeyi ilə bağlıdır.

**Aşağı Qışlaq** *oyk., mür.* Şahbuz r-nunun Kolanı i.ə.v.-də kənd. Dağətəyi ərazidədir. Tədqiqatçıların fikrincə, oykonimin ikinci komponenti olan *qışlaq* sözünü "qışlama" mənasında qəbul etmək olmaz. Çünki ərazidəki Aşağı Qışlaq və Yuxarı Qışlaq kəndləri qışlaq üçün əlverişli deyil. Bu ad kəngərlilərin qızıl qışlaq tayfasının tirələrindən (orta qışlaq, güllü qışlaq, yazlı qışlaq, yazı qışlaq və ya düz qışlaq) birinin adı ilə bağlıdır. Aşağı Qışlaq oykonimi etnotoponim kimi "adı çəkilən tayfanın, tirənin məskunlaşdığı ərazinin aşağı hissəsi" anlamındadır.

**Aşağı Qolqəti** oyk., mür. Ağdaş r-nunun Yuxarı Qolqəti i.ə.v.-də kənd. Yuxarı Şirvan kanalının sahilində, Şirvan düzündədir. *Qolqəti* sözü *qol* və *kəndi* hissələrindən ibarət olub "çay qolunun və ya çayın sahili" mənasını ifadə edir. Kənd doğrudan da vaxtilə Türyançayın qollarından birinin sahilində yerləşmişdir. Hal-hazırda yatağı qalmış həmin çay quruduqdan sonra əhali oranı tərk edərək indiki əraziyə köçmüşdür. Qolqəti kəndin keçmiş adının (Qol kəndi) yerli tələffüz formasıdır. 1933-cü ildə Aşağı Kolqatı variantında qeydə alınmışdır. Oykonimin birinci komponenti yaşayış məntəqəsini eyniadlı digər məntəqədən fərqləndirməyə xidmət edir.

**Aşağı Qoşun** *or., mür.* Şəki r-nunun Aşağı Kəldək kəndində dağ. Oronim "Aşağı Kəldək kəndindəki Qoşun dağı" deməkdir. *Qoşun* sözü isə "dağ silsiləsi, cərgəsi, sırası" mənasını ifadə edir.

**Aşağı Qumlu** *oyk., mür.* Gədəbəy r-nunun Qumlu i.ə.v.-də kənd. Dağətəyi ərazidədir. Oykonim "aşağıda yerləşən Qumlu kəndi" deməkdir.

**Aşağı Quşçu** *oyk., mür.* Tovuz r-nunun eyniadlı i.ə.v.-də kənd. Əsrik çayının sahilində, dağ ətəyindədir. Oykonim "aşağıda yerləşən Quşçu kəndi" deməkdir. Etnotoponimdir.

**Aşağı Quşçular** *oyk., mür.* Şuşa r-nunun Malıbəyli i.ə.v.-də kənd. Dağətəyi ərazidədir. "Aşağıda yerləşən Quşçular kəndi" deməkdir. Etnotoponimdir.

**Aşağı Layski** *oyk., mür.* Şəki r-nunun Aşağı Göynük i.ə.v.-də kənd. Şin çayının sahilində, Alazan-Həftəran vadisindədir. Oykonim ərazidəki Layskiqaya dağının adını daşıyır və "aşağıda yerləşən Layski kəndi" deməkdir. Qarşılığı Baş Layski oykonimidir.

**Aşağı Ləgər** *oyk., mür.* 1. Xaçmaz r-nunun Xudat şəhər i.ə.v.-də qəsəbə. Samur-Dəvəçi ovalığındadır. Çkalov adına sovxozun 5-ci şöbəsi yanında yaranmış bu kənd 1965-ci ildən Aşağı Ləgər qəsəbəsi adlandırılmışdır; 2. Qusar r-nunun eyniadlı i.ə.v.-də kənd. Qusar maili düzənliyindədir. Oykonim "aşağıda yerləşən Ləgər kəndi" deməkdir.

**Aşağı Ləkətağ** *hidr., mür.* Culfa r-nunun Ərəfsə kəndi yaxınlığında min bulaq. Bəzi ədəbiyyatlarda Aşağı Ləkətan variantında da işlənir. Ləkətağ çayı dərəsində yerləşdiyi üçün belə adlandırılmışdır. İki bulaqdan ibarətdir və içmək üçün istifadə edilir.

**Aşağı Ləki** *oyk., mür.* Ağdaş r-nunun eyniadlı i.ə.v.-də kənd. Türyan çayının sağ sahilindən bir qədər aralı, Şirvan düzündədir. Oykonim "aşağıda yerləşən Ləki kəndi" deməkdir. Etnotoponimdir.

**Aşağı Lənkəran** *hidr., mür.* Lənkəran r-nunda min bulaq. Müalicə məqsədilə isti-

fadə edilir Bulaq Lənkəran çayının aşağı hissəsində yerləşdiyi üçün belə adlandırılmışdır

**Aşağı Lüləkəran** b a x Aşağı Tüləkəran

**Aşağı Malax** *oyk mür* Qax r-nunun Qaşqaçay i.ə v -də kənd Qaşqaçayın sahilindədir Keçmişdə bu zonada Malax adlı iki kənd mövcud idi Onlar yaxınlıqlarındakı kəndlərin adları ilə Ləkit Malax və Qaçar Malax adlanırdı XI əsrə aid mənbədə Şəki zonasında Maluq qalasının adı çəkilir Toponimikada Malax kəndinin adının Maluq qalasının adından götürülməsi ehtimalı var. Tədqiqatçıların məlumatına görə, bu kənd Dağıstanın Zeyxur kəndindən çıxmış saxurlar tərəfindən salınmışdır Təxminən XVI əsrin ortalarında saxurlar bu zonaya köçüb gəlmiş və Malax kəndinin əsasını qoymuşlar Ərazideki Malaxlar adlı dağın olması bu toponimin etnotoponim olmasından xəbər verir Qafqaz dillərində *malax/malux* "az, bir az, bir hissə" mənasını bildirir Oykonim "aşağıda yerləşən Malax kəndi" deməkdir

**Aşağı Maralyan** *oyk., mür* Cəbrayıl r-nunun Karxulu i ə v -də kənd Araz çayının sol sahilində, düzənlikdədir Bəzi tədqiqatçılara görə, yaşayış məntəqəsi Cənubi Azərb -nın Maraluy kəndindən çıxmış ailələrin XIX əsrin əvvəllərində şm -a köçərək burada məskunlaşması nəticəsində yaranmışdır və "maraluylular" mənasındadır Birinci komponent isə kəndin yerləşdiyi coğrafi mövqeyi bildirir

**Aşağı Mollu** *oyk., mür* Qubadlı r-nunun Yuxarı Mollu i ə v -də kənd Həkəri çayının sağ sahilindədir. Yerli əhalinin verdiyi məlumata görə, kəndi XVI-XVIII əsrlərdə Cənubi Azərb -dakı Mollu kəndindən gəlmiş ailələr salmışlar *Mol* sözü türk dillərində bir çox mənalarla yanaşı "torpaq bənd; qumdaşı" mənasını da ifadə edir Kəndin çay sahilində yerləşməsi *mollu* sözünün məhz bu mənası ilə bağlılığından xəbər verir Oykonimin birinci komponenti yaşayış məntəqəsini eyniadlı digər məntəqədən fərqləndirməyə xidmət edir

**Aşağı Mülkülü** *oyk, mür* Tovuz r-nunun Düz Cırdaxan i ə v -də kənd Gəncə-Qazax düzənliyindədir Keçmiş adı Alakol Mülkülüdür Əvvəllər kənd Kürün sağ sahilində yerləşirdi Hazırda orada kəndin qəbiristanı var Sonralar kəndin əhalisi indiki yerə köçmüş və kənd belə adlanmışdır Oykonim "aşağıda yerləşən Mülkülü kəndi" deməkdir

**Aşağı Nehrəm** *oyk, mür* Babək r-nunun Nehrəm i.ə v -də kənd Düzənlikdədir Nehrəm kəndinin yaxınlığındakı eyniadlı d y st.-nın yanında salınmışdır. Oykonim "aşağıda yerləşən Nehrəm kəndi" deməkdir

**Aşağı Nemətabad** *oyk, mür* Ağdaş r-nunun eyniadlı i ə v -də kənd Yuxarı Şirvan kanalından bir qədər aralı, Şirvan düzündədir Yaşayış məntəqəsini keçmiş Nemətabad (indiki Yuxarı Nemətabad) kəndindən köçmüş ailələr salmışlar Aşağı sözü kəndin coğrafi mövqeyini göstərir

**Aşağı Noxudlu** *oyk., mür* Salyan r-nunun Arbatan i ə v.-də kənd Muğan düzündədir Kənd keçmişdə şahsevənlərin sarıxanbəyli tayfasına mənsub Noxudlu yeri adlanan qışlaq yerində ətraf kəndlərin əhalisinin məskunlaşması nəticəsində yaranmışdır Oykonim "Noxudlu yaşayış məntəqəsinin aşağı hissəsi" deməkdir.

**Aşağı Nüvədi** *oyk., mür* Lənkəran r-nunun eyniadlı i ə v -də şiq Xəzər dənizi sahilində, Lənkəran ovalığındadır Oykonim "aşağıda yerləşən Nüvədi kəndi" deməkdir Oykoniminin ikinci komponenti tat və talış dillərində "təzəkənd", "yenikənd" mənasını bildirir

**Aşağı Oratağ** *oyk., mür* Tərtər r-nunun eyniadlı i ə v -də kənd Dağətəyi ərazidədir XIX əsrdə ermənilər burada məskunlaşdıqdan sonra kəndin adı tədricən erməniləşmiş və Sovet hakimiyyəti illərində Nerkin (erm "aşağı") Oratağ kimi rəsmiləşmişdi 1992-ci ildən kənd indiki adını daşıyır Toponimin ikinci komponenti qədim İran dillərinin materialları əsasında "qala yeri" mənasında izah olunur

**Aşağı Öysüzlü/Aşağı Öksüzlü** *oyk, mür* Tovuz r-nunun eyniadlı i ə v -də kənd Çal dağının (Kiçik Qafqaz) ətəyindədir Ayrı-ayrı mənbələrdə Aşağı Öküzlü, Aşağa Öksüzlü variantlarında da qeydə alınmışdır Yaşayış məntəqəsini XIX əsrdə Öysüzlü (indiki Yuxarı Öysüzlü) kəndindən çıxmış ailələr salmışlar Oykonimin birinci komponenti yaşayış məntəqəsinin coğrafi mövqeyini





təyin edir, ikinci komponenti isə Azərb elatlarından birinin adıdır

**Aşağı Remeşin** *oyk., mür* Şahbuz r-nunun Kükü i ə v -də kənd Kükü çayının sol sahilində, Zəngəzur silsiləsinin ətəyindədir Təhrifə uğramış toponimin əsli Aşağı Rəməşindir. Yaşayış məntəqəsini keçmiş Rəməşin (indiki Yuxarı Rəməşin) kəndindən çıxmış ailələr salmışlar. 1969-cu ildə yaxınlığındakı Zimel kəndi də bu kəndə birləşmişdir Tarixi sənədlərin və tədqiqatçıların məlumatına görə, Rəməşin adına ilk dəfə XVII-XIX əsrlərə aid sənədlərdə rast gəlinir 1654-cü ilə aid sənədlərdə Naxçıvan ərazisinin Şahbuz dərəsində yerləşən Xurəmeşin kəndinin bir hissəsinin satılması haqqında məlumat verilir Sənəddən aydın olur ki, hələ bu tarixdən 300 il əvvəl kəndin adı "hure-nişin" hissələrindən ibarət olub "hurilər, gözəl qadınlar yaşayan yer" mənasını ifadə edir 1727-ci ildə Hurçeşin, XIX əsrdə Huremeşin (Qurəmeşin) kimi qeydə alınmışdır Azərbaycan xalq danışıq dilində toponimik termin kimi *rəməl irəmə* "kiçik təpə, düzənliyə çıxan alçaq təpə, kələ-kötür yer", *şin/şın* – "məskən, çoxlu adam olan yer", "qələbəlıq, bolluq" mənalarında işlənməkdədir Bu baxımdan *Rəmeşin* sözünü "düzənliyə çıxan alçaq təpə üzərində yerləşən yer, kələ-kötür yer, kənd" kimi də izah etmək olar 2003-cü ildən kəndin adı Qızıl Qışlaq kimi rəsmiləşdirilmişdir

**Aşağı Rəfədinli** *oyk, mür* Füzuli r-nunun Pirəhmədli i ə v -də kənd. Düzənlikdədir Yaşayış məntəqəsini XIX əsrdə keçmiş Rəfədinli kəndindən çıxmış ailələr salmışlar Oykonimin birinci komponenti yaşayış məntəqəsinin coğrafi mövqeyini təyin edir, ikinci komponenti isə Rəfieddinli antropotoponiminin təhrif olunmuş formasıdır

**Aşağı Salamabad** *oyk mür* Yevlax r-nunun Xaldan i ə v -də kənd Əlican çayının sahilindədir Yerli əhali arasında Salamaur (Salamovur və ya Salamov) adı ilə tanınır Yaxınlığındakı Əsnaf kəndi sonralar Yuxarı Salamabad adlandırıldıqdan sonra, bu kənd də coğrafi mövqeyinə görə Aşağı Salamabad adlandırılmışdır

**Aşağı Salahlı** *oyk, mür* Qazax r-nunun eyniadlı i ə v -də kənd Kür çayından bir qədər aralı, Gəncə-Qazax düzənliyindədir Oykonim "aşağıda yerləşən Salahlı kəndi" deməkdir Oykonimin ikinci komponenti qazaxların salahlı tayfasının adı ilə bağlıdır

**Aşağı Seyfəli** *oyk, mür* Şəmkir r-nunun Seyfəli i ə v -də kənd Şamxor çayının sahilində, Kiçik Qafqazın ətəyindədir Bəzi ədəbiyyatlarda Şamaxı r-nu ərazisində də Aşağı Seyfəli yaşayış məntəqəsinin olduğu göstərilir 1917-ci ildə Seyfalı variantında qeydə alınmışdır Etnotoponimdir Seyfalı dərəsi (Daşkəsən), Seyfalas/Seyfalısu (Qəbələ) oronim və hidronimi də seyfalı etnonimi ilə bağlıdır XIX əsrə aid sənədlərdə Gəncə qəzasında maldarlıqla məşul olan *seyfali* (*seyfalli*) elatı haqqında məlumat verilir Onlar əsasən Şəmkir çayından çəkilmiş Kotançı arxın kənarında yaşayırdılar Oykonim "aşağıda yerləşən Seyfəli kəndi" mənasındadır

**Aşağı Seyidəhmədli** *oyk mür* Füzuli r-nunun eyniadlı i ə v -də kənd Quruçay və Köndələnçay arasındadır Oykonimin birinci komponenti yaşayış məntəqəsinin yerləşdiyi coğrafi mövqeyi, ikinci komponenti isə *seyidəhmədli* nəslinin adını əks etdirir

**Aşağı Siyaku** *or mür* Abşeronda dağ Sumqayıt şəhər i ə v -də, Çigil və Kəndə çayları arasında yerləşir Hün 643 m *Siyaku/Siyakı* tat dilində "qara dağ" mənasını ifadə edir Birinci komponent dağın coğrafi mövqeyini göstərir

**Aşağı Surra** *oyk., mür* Neftçala r-nunun eyniadlı i ə v -də kənd Kür çayının sahilində, Salyan düzündədir Birinci komponent kəndin Kür çayının aşağı axarında yerləşdiyini göstərir Qədim abidələrin dilində *sur-sur* "şap-şap, su şırıltısı", *sura/sora* "bataqlıq, sulu yer" mənalarında işlənmişdir Oykonimin ikinci komponenti "su şırıltısı eşidilən yer"; "sulu yer"; "çay sahili" kimi başa düşülməlidir Surra toponimini qızılbaşların surra tayfasının adı ilə də əlaqələndirirlər

**Aşağı Şabalıd** *oyk, mür* Şəki r-nunun İncə i.ə.v -də kənd Murdarçayın sahilindədir Oykonimin birinci komponenti kəndin yerləşdiyi coğrafi mövqeyi bildirir, ikinci komponent isə ərazidə yetişdirilən şabalıd bitkisinin adındandır

**Aşağı Şilyan** *oyk mür* Kürdəmir r-nunun eyniadlı i ə v -də kənd Şirvan düzündədir Oykonimin birinci komponenti kəndi ərazi-

doki eyniadlı yaşayış məntəqələrindən fərqləndirməyə xidmət edir, ikinci komponent isə türkdilli şilyan tayfasının adını əks etdirir.

**Aşağı Şurtan** *oyk.*, *mür.* Kəlbəcər r-nunun Şurtan i.ə.v.-də kənd. Tərtər çayının sahilində, Dəlidağın ətəyindədir. Yaşayış məntəqəsi ərazidəki Şurtançayın aşağı axarında yerləşdiyi üçün belə adlandırılmışdır.

**Aşağı Tahircal** *oyk.*, *mür.* Qusar r-nunun Yuxarı Tahircal i.ə.v.-də kənd. Tahircal çayının sahilində, Qusar maili düzənliyindədir. Yaşayış məntəqəsi Tahircal çayının nisbətən aşağı axarında yerləşdiyi üçün belə adlandırılmışdır.

**Aşağı Tala** *oyk.*, *mür.* Zaqatala r-nunun eyniadlı i.ə.v.-də kənd. Tala çayının sol sahilində, Baş Qafqaz silsiləsinin ətəyindədir. XIX əsrdə bu ərazidə yalnız bir Tala kəndi olmuşdur. Onun Aşağı və Yuxarı Tala kəndlərinə ayrılması kollektivləşmə illərinə aiddir. "Tala kəndinin aşağı hissəsi" deməkdir. Oykonimin ikinci komponenti Azərb. toponimiyasında "meşə içərisində ağacsız, otlu sahə" mənasında işlənir.

**Aşağı Tüləkəran** *oyk.*, *mür.* Quba r-nunun Tüləkəran i.ə.v.-də, Ağçayın sahilində, dağətəyi ərazidədir. Lüləkəran variantında da qeydə alınmışdır. XIX əsrin ortalarında Tüləkəran (indiki Yuxarı Tüləkəran) kəndindən çıxmış ailələrin həmin kəndə məxsus pay torpağında məskunlaşması nəticəsində yaranmışdır. Oykonim "aşağıda yerləşən Tüləkəran kəndi" deməkdir. Tüləkəran komponenti *tülə* (tat. "yunu çıxmış dəri") və *karan* (kənd, yaşayış məntəqəsi termini) sözlərindən ibarət olub, "gön aşılamaqla məşğul olanlara aid kənd" mənasını ifadə edir.

**Aşağı Uzunoba** *oyk.*, *mür.* Babək r-nunun Şıxmahmud i.ə.v.-də kənd. Naxçıvan çayının sahilindədir. Oykonim "aşağıda yerləşən Uzunoba kəndi" deməkdir.

**Aşağı Veysəlli** *oyk.*, *mür.* Füzuli r-nunun eyniadlı i.ə.v.-də kənd. Qarasu çayının sol sahilində, düzənlikdədir. Oykonimin birinci komponenti yaşayış məntəqəsinin coğrafi mövqeyini təyin edir, ikinci komponenti isə veysəlli nəslinin adı ilə bağlıdır.

**Aşağı Yağlavənd** *oyk.*, *mür.* Füzuli r-nunun Kərimbəyli i.ə.v.-də kənd. Araz çayının sol sahilində, düzənlikdədir. Oykonimin birinci komponenti yaşayış məntəqəsinin coğrafi mövqeyini təyin edir, ikinci komponenti isə *yağıla* (qədim abidələrin dilində "döyüş, vuruş, cəng") və *vand* (bir çox xalqların toponimiyasında "yer, məkan") sözlərindən ibarət olub, "döyüş yeri", "savaş meydanı" mənasını ifadə edir. Bu baxımdan oykonim Cəngən toponiminin sinonimidir. XIX əsrə aid sənədlərdə Cəbrayıl qəzasında maldarlıqla məşğul olan yağlavənd adlı bir elat haqqında məlumat verilir. Oykonimin etnotoponim olması da istisna deyil.

**Aşağı Yeməzli** *oyk.*, *mür.* Zəngilan r-nunun Qarababa i.ə.v.-də kənd. Dağətəyi ərazidədir. Kəndin ərazisi əvvəllər Orta Yeməzli kəndinin qışlaq yeri olmuşdur. Əhali qışlaq yerinə köçərək məskunlaşdıqdan sonra yeni yaşayış məntəqəsini Qışdaqlı, daha sonra Aşağı Yeməzli adlandırmışdır. Oykonimin birinci komponenti yaşayış məntəqəsinin coğrafi mövqeyi ilə bağlıdır, ikinci komponent isə atyeməzli etnoniminin qısaldılmış formasıdır.

**Aşağı Yemişcan** *oyk.*, *mür.* Xocalı r-nunun Qızıloba i.ə.v.-də kənd. Dağətəyi ərazidədir. XIX əsrdə gəlmə ermənilər Sıznaq adlanan bu yerdə məskunlaşmış, kəndin adını da Nerkin Sıznek (Aşağı Sıznek) kimi rəsmiləşdirmişdilər. 1992-ci ildə kəndə Aşağı Yemişcan adı verilmişdir. Toponimin ikinci komponenti "yemişan" sözünün tələffüz formasıdır.

**Aşağı Yəyci** *oyk.*, *mür.* Şərur r-nunun Yəyci i.ə.v.-də kənd. Arpaçayın sol sahilində, Dərələyəz silsiləsinin ətəyindədir. Yaşayış məntəqəsini 1928-ci ildə keçmiş Yəyci (indiki Yuxarı Yəyci) kəndindən çıxmış bir qrup ailə salmışdır. Oykonimin birinci komponenti yaşayış məntəqəsinin coğrafi mövqeyi ilə bağlıdır, ikinci komponenti isə türk mənşəli yaycı tayfasının adını əks etdirir.

**Aşağı Zeyd** *oyk.*, *mür.* Xaçmaz r-nunun eyniadlı i.ə.v.-də kənd. Qaraçayın sağ sahilində, Samur-Dəvəçi ovalığındadır. Yaşayış məntəqəsi XIX əsrin ortalarında Quba r-nunun Zeyid kəndindən bir qrup ailənin həmin kəndə məxsus qışlaqda məskunlaşması nəticəsində yaranmışdır. Oykonimin birinci komponenti yaşayış məntəqəsinin coğrafi mövqeyini bildirir. Kəndin əsasını





Qasım adlı bir şəxs qoyduğundan Qasım qışlağı da adlanır.

**Aşağı Zeyneddin** *oyk.*, *mür.* Ağdaş r-nunun eyniadlı i.ə.v.-də kənd. Şirvan düzündədir. XIX əsrin axırlarında həmin r-ndakı Zeyneddin (indiki Yuxarı Zeyneddin) kəndindən çıxmış ailələrin burada məskunlaşması nəticəsində yaranmışdır.

**Aşağı Zurnabad** *oyk.*, *mür.* Xanlar r-nunun Zurnabad i.ə.v.-də qəsəbə. Gəncə çayının sol sahilində, Murovdağ silsiləsinin ətəyindədir. Burada 1929-cu ildə Azərb.-da ilk SES-lərdən olan Zurnabad Su Elektrik Stansiyası tikilmişdir. Su elektrik stansiyası tikilərkən onun yanında qəsəbə salınmışdır. Qəsəbə Zurnabaddan aşağıda yerləşdiyi üçün 1966-cı ildən belə adlandırılmışdır.

**Aşağıbulaq** *hidr.*, *mür.* Quba r-nu ərazisində bulaq. Hidronim coğrafi obyektin yerləşmə mövqeyini bildirir. Ərazidə Yuxarıbulaq da vardır.

**Aşağıoba** *oyk.*, *mür.* Xaçmaz r-nunun Susayqışlaq i.ə.v.-də kənd. Xəzər dənizinin sahilində, Samur-Dəvəçi ovalığındadır. Kənd obalar əsasında yaranmışdır. Obalar ilk yaşayış məskəni kimi kəndlərə çevrilir. Məs., Şəki r-nundakı Topçennət kəndi, Qax r-nundakı Almalı kəndi Yuxarıoba və Aşağıoba məhəllələrindən ibarətdir. Deməli, Aşağıoba kəndi də əvvəllər ayrı-ayrılıqda mövcud olmuş obalardan ərazinin nisbətən aşağı, alçaq hissəsində yerləşəni əsasında yaranmışdır. Yaşayış məntəqəsi XIX əsrin ortalarında Susay kəndinə məxsus qışlaqda yaranmış iki obadan (Susayqışlaq və Aşağıoba) biridir.

**Aşan** *oyk.*, *sadə* Xocavənd r-nunun eyniadlı i.ə.v.-də kənd. Xonaşen çayının sol sahilindən bir qədər aralıdır. Kənd adını ərazidəki Aşandağdan almışdır.

**Aşandağ** *or.*, *mür.* Xocavənd r-nu ərazisində dağ. Oronim *aşan* (aşırım, dağ keçidi) və *dağ* sözlərindən ibarət olub, "dağ aşırımı, keçidi olan dağ" deməkdir.

**Aşıqalılar** *oyk.*, *sadə* Beyləqan r-nunun Əhmədli i.ə.v.-də kənd. 1933-cü ildə Qaradonlu (İmişli) r-nunun Xoləc i.ə.v.-də bu etnotoponim Aşqallar variantında qeydə alınmışdır. *Aşqal* "arıq, döllüyə yaramayan" deməkdir. *Aşaqalılar* isə XIX əsrdə Mil düzündə yaşamış xələc tayfasının bir qolunun adıdır.

**Aşıqbayramlı** *oyk.*, *sadə* İsmayıllı r-nunun Kürdmaşı i.ə.v.-də kənd. Dəvəbatan çayı sahilindədir. Yaxınlığında eyniadlı su anbarı var. XIX əsrin ortalarında Şamaxı qəzasında yaşamış, mənşəcə indiki Quba r-nundakı Hapıt kəndindən çıxmış ailələrin məskunlaşması nəticəsində yaranmışdır. "Aşıq Bayramın nəslinə aid kənd" mənasındadır.

**Aşıqbayramlı** *hidr.*, *sadə* İsmayıllı r-nunun İvanovka kəndi yaxınlığında süni göl. Dəvəbatan çayının suyunu bənd vasitəsilə saxlamaq üçün yaradılmış bu göl 1951-ci ildə istifadəyə verilmişdir. Göyçay r-nunun pambıq tarlalarını suvarmaq üçün istifadə olunur. Adını yaxınlığındakı eyniadlı kənddən almışdır. Bəzi ədəbiyyatlarda bu su qovşağının adı Aşağı Bayramlı variantında qeydə alınmışdır.

**Aşıqlı/Aşıxlı** *oyk.*, *sadə* 1. Beyləqan r-nunun eyniadlı i.ə.v.-də kənd; 2. Xanlar r-nunun eyniadlı i.ə.v.-də kənd. 1931-ci ilədək Qaryağdı, 1958-ci ilədək Voroşilovka adlanmışdır. Gəncə çayının sağ sahilindən bir qədər aralı, Sarıyal dağının ətəyindədir. Etnotoponimdir. 1917-ci ildə Aşaxlı variantında qeydə alınmışdır. Gürcüstanın Dmanisi r-nunda Aşıq kəndi, Moskva vilayətində Aşukino qəsəbəsi və d.y. stansiyası, Şəki-Zaqatala zonasında Aşıqlar məhəlləsi var.

**Aşkar** *oyk.*, *sadə* Şamaxı r-nunun Quşçu i.ə.v.-də qəsəbə. Oykonim türk dillərində "döyüş atı", fars dilində isə "açıq, aydın, müstəqil" mənalarını ifadə edir. Burada *aşkar* sözü "müstəqil" mənasında işlənmişdir.

**Aşralar/Aşıralılar** *oyk.*, *sadə* 1. Tovuz r-nunun Qəribli i.ə.v.-də kənd. Dağlıq ərazidədir; 2. Tovuz r-nunun Alakol i.ə.v.-də kənd. Düzənlikdədir. Hər iki kəndin əhalisi vaxtilə Xınna dərəsində məskən saldıqları üçün Xınnalı da adlanırdı. Onların qışlaq yeri arasında Alakol ərazisində, yaylaq yurdu isə Qəribli sahəsində olmuşdur. Sonralar həmin yaylaq və qışlaq yerləri əsasında aşıralıların adını daşıyan iki müstəqil kənd yaranmışdır. Yerli əhali bu kəndləri Aran Aşıralıları və Dağ Aşıralıları da adlandırır. Aşrallar/Aşırallar variantlarında da qeydə alınan bu oykonim

ərəb mənşəli "aşura" sözü ilə əlaqələndirilir. Mütəxəssislərin bir qismi bu fikirdədir ki, oykonim *aşur* (məhərrəm ayının onuncu günü), alı (Əli) sözlərindən və *-lar* şək.-dən ibarət olub, "məhərrəm ayının onuncu günü matəm saxlayan müsəlmanlar" deməkdir. Əslində oykonim aşıralılar nəslinin adındandır.

**Aşurlar obası** *oyk., mür.* Qax r-nunun Tasmallı kəndi ərazisindədir. Etnotoponimdir.

**Aşurlu** *oyk., sadə* Masallı r-nunun Bədəlan i.ə.v.-də kənd. Lənkəran ovalığındadır. Etnotoponimdir.

**Atabəy** *oyk., sadə* Şəmkir r-nunun Çardaqlı i.ə.v.-də kənd. Şəkərbəy silsiləsinin ətəyindədir. Yaxınlığında Qalaboynu qalası var. Kənd 1924-cü ildə Atabəy yeri adlanan ərazidə salınmışdır. Burada keçmişdə Atabəy adlı kənd olmuşdur. Xalq etimologiyasına görə, Atabəy, Şəkərbəy və Gədəbəy adlı üç qardaş olmuşdur. Onların hər birinin adı bir-birinə yaxın olan üç yaşayış məntəqəsindən birinə verilmişdir. Oykonim Azərb.-da XII-XIII əsrlərdə fəaliyyət göstərən Eldəgizlər və ya Atabəylər sülaləsinin nümayəndələrindən birinin adı ilə bağlıdır. Mənbələrin məlumatına görə, Məhəmməd Cahan Pəhləvanın oğlu Atabəy Əbubəkr (1191-1210) 1203-cü ildə Şəmkir yaxınlığındakı döyüşdə müttəfiqlərə (gürcü çariçası Tamara, Şirvanşah I Axsitan və düşmənlər tərəfə keçmiş qardaşı Əmirmiran) məğlub olaraq qaçmağa məcbur oldu. Gəncə Əmirmiranın əlinə keçdi. *Atabəy* qədim Azərb. dilində "qəyyum" deməkdir. Bu adla adlanan digər obyekt Atabəy türbəsidir. Möminə xatın türbəsi kimi daha çox tanınan bu sərdabə 1186-cı ildə Atabəy Məhəmməd Cahan Pəhləvanın xanımı üçün Naxçıvanda tikilmişdir. Kürdəmir r-nunun Sığırlı kəndində Atabəyli məhəlləsi, Qazaxıstanda Atabəy kəndi, Tatarıstanın Kukmara r-nunda Atabay adlı yaşayış məntəqəsi qeydə alınmışdır. Cənubi Azərb.-da Atabəyli, Bağatabəy adlı kəndlər vardır.

**Ataçay** *hidr., mür.* Abşeron və Dəvəçi r-nları ərazisində çay. Dübrar dağından 1870 m. hündürlükdən başlanıb Xəzər dənizinə tökülür. Bir çox qol və xırda çayları özündə birləşdirir. Toponimikada *ata* və *çay* sözlərindən ibarət olan bu hidronim "əsas çay, baş çay", "iti axan çay" kimi izah olunur. Qazaxıstanda Atasu adlı qəsəbə və çay vardır.

**Ataxal** *oyk., mür.* Gədəbəy r-nunun Böyük Qaramurad i.ə.v.-də kənd. Zəyəm çayının sağ sahilində, Şahdağ silsiləsinin ətəyindədir. Yerli əhalinin verdiyi məlumata görə, kəndi XVIII əsrdə Qaraboyun Ataxal adlı bir nəfər bina etmişdir. Kənddə Ataxal bulağı da var. Hazırda kənddə yaşayan nəsillərdən biri qaraboyunlu adlanır. 1930-cu illərdən başlayaraq kənddən xeyli ailə Zəyəm çayının sol sahilinə köçmüş, bir qədər aralıda Təzə Ataxal adlı yeni kənd salmışdır. Türk dillərində *ata* sözünün "baba", "yaşlı kişi, erkək" və s. mənaları ilə yanaşı "təyin etmək, göndərmək" mənasında işlənməsinə də təsadüf olunur. *Xal/xayl* sözü isə "atlı dəstəsi, süvari dəstəsi" deməkdir. Ataxal oykonimləri "atlı dəstəsi göndərilən yer" mənasını bildirir. 1917-ci ildə bu oykonim Atalxal variantında qeydə alınmışdır. Bu variantda oykonim "məşhur atlı dəstəsi" mənasını ifadə edir.

**Atakişili** *oyk., sadə.* Kürdəmir r-nunun Atakişili i.ə.v.-də kənd. Şirvan düzündədir. XIX əsrin ortalarında maldarlıqla məşğul olan atakişili nəslinə mənsub ailələrin burada məskunlaşması nəticəsində yaranmışdır. Etnotoponimdir. Bu etnonimlə bağlı 1933-cü ildə Ağcabədi r-nunda Atakişibəyli, 1917-ci ildə Quba qəzasında Atakişiqazma adlı yaşayış məntəqələri qeydə alınmışdır.

**Ataqut** *hidr., mür.* 1. Kürdəmir r-nu ərazisində çay; 2. Xocavənd r-nunda çay. Quruçayın sağ qoludur. Bəzən Ataut variantında da işlənir. Türk dillərində *atak* "bənd, sədd, düyün" mənalarını ifadə edir, *ut* komponenti isə "kəsmək, qarşı gəlmək" fellərinin (utruş/utrun) kökləndir. Hidronim "qarşısı kəsilmiş", "qarşısına bənd çəkilmiş çay" kimi başa düşülməlidir.

**Ataqut** *oyk., sadə* Xocavənd r-nunun Tuğ i.ə.v.-də kənd. Qarabağ silsiləsinin ətəyindədir. Adını ərazidəki eyniadlı çaydan almışdır.

**Atbatan** *hidr., mür.* 1. Tovuz r-nunda bataqlıq; 2. Abşeron yarımadasında göl. Obyektə ad burada atın batması və ya sudan keçə bilməməsi ilə əlaqədar verilmişdir. 1933-cü ildə Salyan r-nu ərazisində Atbatan kəndi qeydə alınmışdır.







**Atbulaq** *oyk., sadə* 1. Hacıqabul r-nunun eyniadlı i.ə.v.-də kənd. Pirsaat çayının sahilində, düzənlikdədir. Adını ərazidəki eyniadlı çaydan almışdır. Bəzi ədəbiyyatlarda Atabulaq variantında da işlənir. Əsl adı Atbulağıdır. Yaşayış məntəqəsinin ərazisi keçmişdə maldarlıqla məşğul olan elatların qışlaq yeri olmuşdur. Sonralar burada Mərəzədən köçmüş ailələr məskunlaşmışlar. Kənd öz adını vaxtilə heyvanları suvarmaq üçün burada qazılmış su quyusunun adından almışdır; 2. Əli Bayramlı r-nunun eyniadlı i.ə.v.-də kənd və d.y. stansiyası. Adını ərazidəki eyniadlı bulaqdan almışdır. Mənbələrin verdiyi məlumata görə, XIX əsrdə mərzili adlı tayfa Atbulaq adlanan yerdə məskunlaşmışdır.

**Atbulaq** *hidr., mür.* 1. Salyan r-nu ərazisində bulaq; 2. Əli Bayramlı r-nu ərazisində bulaq; 3. Lerik r-nunun Kəlvə kəndi ərazisində bulaq. Hidronim *at* və *bulaq* sözlərindən ibarət olub, "atın sulandığı, su içdiyi bulaq" deməkdir.

**Atərk** *oyk., sadə.* Ağdərə r-nunda kənd. Tərtər çayının sol sahilində, Atərk çökəkliyindədir. Hələ XII əsrə aid mənbələrdə bu oykonim yad edilirdi. Toponimikada *atərk* Türkmənistandakı Atrek, Şimali Qafqazdakı Terek coğrafi adları da daxil olmaqla qədim türk dillərindəki "atrak" (çayın mənsəbə töküldüyü yer, çayın mənsəbi) sözünün metatezaya uğramış variantı hesab olunur. Kənd həqiqətən də Tərtər çayının mənsəbinə yaxındır. 1992-ci ildən kəndin adı Həsənriz kimi rəsmiləşdirilmişdir.

**Atəşgah** *or., mür.* 1. Abşeron yarımadasının c.-q. hissəsində, Şabandağ silsiləsində zirvə. Hün. 276 m.; 2. Qaradağ r-nunun Şubanı qəsəbəsində dağ; 3. Quba r-nunun Xınalıq kəndində Qızılqaya yastanının c.-unda dağ. Bu ərazilərdə yer altında yerləşən yanar şistlərdən ayrılan qazlar üzə çıxır və açıq təbiətdə yanır. Bu səbəbdən də onlar Atəşgah adlanır. *Ataşgah* fars. "od evi", "yanar yer" deməkdir. Vaxtilə atəşgahlar müqəddəs yer kimi məşhur olduğundan ora ziyarətə gəlirlərmiş. İran və Cənubi Azərb. ərazisində Atəşgah adlanan çoxlu obyektlər qeydə alınmışdır.

**Atəşi/Ataşi şoru** *hidr., mür.* Abşeron yarımadasında göl. *Ataşi* "oda inanan", *şor* "göl" deməkdir. *Ataşi şoru* "oda inananlara aid göl" mənasını bildirir. Krımın Beloqlinka kəndinin keçmiş adı Ataş Kıyat olmuşdur. Mordva Respublikasında da Atyaşevo adlanan kənd və r-n vardır.

**Atəşqaya** *or., mür.* Abşeron yarımadasında qaya. Oronim ərazidəki yanar qazlarla bağlı yaranmışdır.

**Atlıxan** *oyk., sadə* Qusar r-nunun Quzuqışlaq i.ə.v.-də kənd. Qusar çayının sahilində, Yan silsiləsinin ətəyindədir. Oykonim Atlıxan şəxs adı ilə bağlı yaranmışdır. Yerli əhalinin verdiyi məlumata görə, Atlıxan əslən Kuzun kəndindən olan bir tayfa başçısının adıdır.

**Atmanlı** *oyk., sadə* Kürdəmir r-nunun Əlvənd i.ə.v.-də kənd. Etnooykonimdir. *Atman* "nişançı, mahir atıcı" deməkdir.

**Attaqay/Ataqay aşırımı** *or., mür.* Baş Qafqaz silsiləsində, Qax r-nu ilə Dağıstanın sərhədində dağ aşırımı. Hün. 2600 m.-ə qədərdir. Türk dillərinə aid abidələrdə *atta* "keçid", "böyük addım atmaq", "sərhədi keçmək", *qay/kay* "daş, qaya" deməkdir. Başqa halda *atağ* "son, nəhayət, uc, zirvə" mənalarını ifadə edən söz, *-ay* isə isim düzəldən şəkilçidir. Hər iki halda oronim "dağ aşırımı", "dağ zirvəsi" kimi izah olunur. İrkutsk vilayətində Ataqay, Yakutiyada isə Bataqay oroqrafik obyektləri qeydə alınmışdır.

**Atuc** *oyk., sadə* Quba r-nunun Güləzi i.ə.v.-də kənd. Baş Qafqaz silsiləsinin yamacındadır. Toponimik tədqiqatlarda bu oykonim belə izah olunur: *Atuc* mənbələrdə və bəzi müasir türk dillərində rast gəlinən "iki arx arası əkin sahəsi", "suvarma üçün ayrılan lək və ya şum sahəsi" mənalı "atız" sözünün "c" dialekt variantını əks etdirir. Yaşayış məntəqəsi XIX əsrdə Qonaqkənddən gəlmiş ailələrin burada məskunlaşması nəticəsində yaranmışdır.

**Atuçan** *or., mür.* Tovuz r-nu ərazisində qaya. Atın qayadan düşməsi hadisəsi ilə əlaqədar yaranmış addır.

**Atyaldağ** *or., mür.* Qobustanda dağ. Ceyrankeçməz çayından solda yerləşir. Hün. 611 m. Xarici görünüşü at yalına oxşadığı üçün belə adlandırılmışdır. Kəlbəcər r-nu ərazisindəki *Atdağ* oronimi də dağın adı-

çəkilən heyvanə bənzəməsi ilə bağlı yaranmışdır At dərəsi (Qubadlı, Zəngilan), At təpəsi (Daşkəsən r-nunun Qaraqullar kəndi), At yaylağı (Qəbələ), At güneyi və s oronimlər isə həmin ərazilərdə vaxtilə at sürülərinin otarılması ılə əlaqədar olaraq meydana gəlmişdir

**Atyemezli** *oyk*, *sadə* Ağdam r-nunun Qiyaslı i ə v -də kənd Dağətəyi ərazidədır Çox vaxt Ətyemezli şəklində təqdim olunan bu coğrafi ad etnotoponim olub atyemezlər tayfasının adı ilə bağlıdır və "at əti yeməyənlər" deməkdir Atyemezli kəbirli tayfa qrupuna daxil olan qərvəndli elinin bir qoludur İranın Xorasan vilayətində də Atyemez adlanan kənd qeydə alınmışdır Güman edilir ki, atyemezlilər vaxtilə Cənubi Azərb -nın Atyemez mahalından gəlmişlər

**Avaxıl** *hidr*, *mür* 1 Şamaxı r-nunda çay Pirsaat çayının sol qolu olub, Ağsu çayı hövzəsinə daxildir Mənbəyini Qırxbulaq dağından alır Avaxılçay kimi də işlənir; 2 Şamaxı r-nunda, Pirsaat çayının sol qolu sahilində, Avaxıl kəndi yaxınlığında mın. bul Kükürdlü soyuq bulaqdır Qəd türk *avağu* "üfunətli, pis iyli su" deməkdir

**Avaxıl** *oyk*, *sadə* Şamaxı r-nunun Qalaybuğurt i ə v -də kənd Avaxılçayın sahilindədir Yaşayış məntəqəsinin adı ərazisindəki mineral bulağın adından götürülüb

**Avaran** *oyk*, *düz* Qusar r-nunun Avaran i.ə v -də kənd Qusar çayının sol sahilində, Qusar maili düzənliyindədir Oykonim *avar* etnonimindən və *-an* (məkan və cəmlık bildirir) şək -dən düzəlib, "avarların yeri" mənasındadır Mənbələrdə VI əsrin ortalarından etibarən Şimali Qafqazdan Albaniya ərazisinə gəlmiş türkdilli avar tayfasının adı ilə bağlı Avarqan dərəsi oronimi Qubadlı r-nu ərazisində qeydə alınmışdır

**Avarandağ** *or*, *mür* Qusar və Xaçmaz r-nları ərazisində dağ Dağ adını yerləşdiyi kəndin adından almışdır

**Avaranqışlaq** *oyk*, *mür* Qusar r-nunun Avaran i ə v -də kənd Qusar çayının sahilində, düzənlikdədir Avaran kəndinə məxsus keçmiş qışlaq yerində məskunlaşma nəticəsində bu yaşayış məntəqəsi meydana gəlmişdir Oykonim *Avaran* (kənd adı) və *qışlaq* sözlərindən düzəlib, "Avaran kəndinin qışlağı" deməkdir

**Avararx** *hidr*, *mür* Qusar r-nu ərazisində arx Hidronim *avar* (etn ) və *arx* (su obyekti) sözlərindən düzəlib Etnotoponimdir

**Avaş** *oyk*, *sadə* Yardımlı r-nunun Kürəkçi i ə.v -də kənd Vileş çayının sahilindədir XIX əsrin ortalarında Pirəmbel kəndindən çıxmış ailələrin Avaş adlanan yerdə məskunlaşması nəticəsində bu kənd yaranmışdır Türk dillərində və monqol dilində *abl/av* (aş) sözü "qoruq", "uzaq", "yaşayış məskənindən kənar"; "boş yer", "sakitlik" kimi izah olunur XIX əsrin əvvəllərində İrəvan xanlığının Göyçə mahalında Abaş kəndi qeydə alınmışdır Avaş eyni zamanda Həbəşistanda dağ dərəsinin və çayın adıdır

**Avaz** *or*, *sadə* 1 Tovuz r-nu ərazisində dağ. Hün 520 m, təpə; 2. Laçın r-nunun Hacılar kəndində təpə, 3 Astara r-nunun Təngəbin kəndinin q -ində aşırım, Haməşam kəndində dərə və təpə Oronim qədim xəzər tayfalarından birinin adı olan *avaz/abaz* etnonimi ilə bağlıdır

**Avazlar** *oyk*., *sadə* Laçın r-nunun Hoçaz i ə v -də kənd Qarabulaq yaylasındadır Xəzər və peçeneqlərin tərkibindəki *avaz/abaz/abas* tayfasının bir qolunun adı ilə bağlıdır Gürcüstanın Bolnisi r-nunda yaşayan avazlar nəsli burada da Avazlar məhəlləsini təşkil etmişdir

**Avazlı** *oyk*, *sadə* Goranboy r-nunda kənd Gəncə-Qazax düzənliyindədir Etnotoponimdir 1933-cü ildə Cəlilabad r-nu ərazisində də Avazlı kəndi qeydə alınmışdır

**Avdur** *oyk* *sadə*. Xocavənd r-nunda kənd Dağətəyi meşəlikdədir. Yaşayış məntəqəsi bəzi mənbələrdə Avdur Takır kimi qeydə alınmışdır Yerli əhalinin verdiyi məlumata görə, kənd keçmiş Buğuz qalasının yerində salınmışdır Ərazidə köhnə qəbiristanlıqların olması burada çox qədimdən insanların məskunlaşmasından xəbər verir Kənd sonralar yerini dəyişərək bir qədər aşağıda salınmışdır Toponimi fars dilindəki *ab* və *duru* ("təmiz su") və ya qədim türk dillərindəki *adur* (təpəlik yer, sıldırım) sözləri ilə əlaqələndirirlər Avdur





Takır toponiminə gəlincə, ikinci komponent *takır* türk dillərində "gurultu", "uğultu" mənalarını ifadə edir Moldoviianın ərazisində Lunqa çayının sağ, Yalpuq çayının sol qolu Avdarma/Avdırma adlanır Çayın kənarında qaqouzlar yaşayan eyniadlı yaşayış məntəqəsi də yerləşir Qaqouz toponimikasında bu hidronim qıpçaq dilinin elementi kimi "bulanıq, çevrilmiş, qarışmış" mənalarında izah olunur Xocavənd r-nu ərazisindəki Qaranlıq çayının adı da bu mənanı əks etdirir.

**Aveydağ** *or*, *mür* Qazax r-nu ərazisində dağ Daş Salahlı kəndindən q.-də, dəniz səviyyəsindən 600-900 m hündürlükdədir Dağda qədim insan məskənlərindən sayılan Aveydağ mağaraları yerləşir Oronim *avey* və *dağ* (yüksəklık ifadə edən topoformant) sözlərindən düzəlib Türk dillərində *avey* "sığınaq, örtülü səngər, sığınacaq, daldalanacaq yer" mənalarını ifadə edir Bəzi tədqiqatçılar Avey oronimini Ayev sözünün fonetik variantı kimi qəbul edərək "Ay evi (məbədi)" mənasına üstünlük verirlər Bu tədqiqatçılar Strabonun albanların İbenya sərhədinə yaxın yerdə Ay məbədinin yerləşməsi haqqındakı məlumatına və Aveydağda qazıntı işləri aparılarkən üzərində Ay rəsmi olan saxsı parçalarının tapılmasına istinad edirlər

**Avləzin** *or*, *mür* Lerik r-nunun Şinəband kəndi ərazisində dağ Tədqiqatçıların fikrincə, talış dilində *avlə* (ovələ) "ətək, aşağı hissə", *zin* "daş" deməkdir Oronim "dağ ətəyi" mənasındadır.

**Avrora** *oyk*., *sadə* Lənkəran r-nunun eyniadlı i ə v -də qəs. Dağətəyi düzənlikdədir Xanbulançay su anbarı bu qəsəbədədir 1934-cü ildə Baltik donanmasının "Avrora" kreyserinin şərəfinə "Avrora" çayçılıq sovxozu əsasında yaradılmışdır Krımın Razdolnoye r-nunda da eyniadlı yaşayış məntəqəsi var

**Avsı** *or*., *sadə* Qazax r-nunun q -ində, Yuxarı Əskipara kəndinin c -unda dağ Hün 996 m Türk dillərinin materialları əsasında *avçı* "ovçu" kimi izah oluna bilər Lakin oronimin peçeneqlərin tərkibindəki *avas/abas* etnonimi ilə bağlılığı ehtimalı da var

**Avşar** *oyk*, *sadə* 1 Ağcabədi r-nunun eyniadlı i ə v -də kənd Kür-Araz ovalığındadır Keçmiş adı Üzeyirkənd olmuşdur 1991-ci ildən indiki adı ilə rəsmiləşdirilmişdir, 2 Xocavənd r-nunda kənd Oykonim oğuz tayfalarından olan *avşarların* adı ilə bağlıdır, etnotoponimdir

**Avun** *hidr*, *sadə* Yardımlı r-nunun Osnakeran kəndində çay Toponim yerli əhalinin dilində Ovun kimi tələffüz edilir. Tədqiqatçıların bir qisminə görə, hidronim talış dilindəki *ov* (su) sözündən və həm məkan, həm də cəmlik bildirən *-on* şəkilçisindən ibarət olub, "sulu yer" deməkdir Tədqiqatçıların digər qismi isə bu toponimi "ov, ovlaq" kimi izah edir Əslində türk dillərində *avun* "sakitləşdirən, təsəlli verən, ovudan"; "ram olan, sakitləşən" deməkdir Deməli, *Avun* hidronimini "sakit çay" kimi qəbul etmək daha məqsədəuyğundur Toponimikada Amur çayının adı da eyni məna ilə açıqlanır

**Avun** *oyk*., *sadə* Yardımlı r-nunun Çayüzü i ə v -də kənd Vileş çayı sahilində, dağətəyi ərazidədir Yaşayış məntəqəsi adını ərazidəki eyniadlı çaydan almışdır

**Avur** *oyk*. *sadə* Yardımlı r-nunun Çayüzü i ə v -də kənd Vileş çayının sahilindədir Yerli əhalinin məlumatına görə, *av* (ov sözünün qədim variantı) və *ur* (qədim türk dillərində "bol", "çox") komponentlərindən ibarət olan bu toponim "ovlaq, ov heyvanları çox olan yer" mənasını ifadə edir Qədim türk yazılı abidələrinin dilində *avırmak/evirmək* "bir şeyin ətrafında hərlənmək, dolanmaq" mənasında işlənmişdir Kəndin adlandırılmasında onun coğrafi mövqeyi nəzərə alınmışdır Kəndin kənarındakı çay onun ətrafına dolanır

**Avuş** *hidr*, *sadə* 1 Şərur r-nunda Keçəltəpə dağının ətəyində gur sulu bulaq Yerli əhalinin məlumatına görə, bulağın adı ovuc (avuc) sözündən olub, formaca ovuca oxşadığı üçün belə adlanmışdır; 2 Şərur r-nu ərazisində çay Mənbəyini Keçəltəpə dağının ətəyindəki bulaqdan alır Avuşçay variantında da işlənir Türk dillərində *avuş/avuj* "aşı maddəsi, zəy" deməkdir Bu da bulağın suyunun tərkibində həmin maddənin olmasına işarədir

**Avuş** *or., sadə* Şorur r-nunda dağ. Dərələyəz silsiləsinə aiddir. Adını Avuş bulağından almışdır.

**Avuş** *oyk., sadə* Şərur r-nunun Axura i.ə.v.-də kənd. Avuş dağının ətəyində yerləşir. Toponimin Havuş variantına da təsadüf olunur. Bəzi tədqiqatçıların şərhinə görə, *avuş* "ağuş" sözünün təhrif formasıdır. Farsca *ağuş* "qucaq" deməkdir. Guya kənd Avuş dağının ətəyində olduğu üçün belə adlanır. Əslində isə kənd öz adını eyniadlı bulaqdan götürmüşdür. 2003-cü ildən kəndin adı Havuş kimi rəsmiləşdirilmişdir.

**Avyarud** *oyk., mür.* Astara r-nunun Pelikəş i.ə.v.-də kənd. Dağətəyi ərazidədir. Oykonimin talış dilindəki *avya* (çəmən, biçənək, açıq yer) və *rud* (çay) sözlərindən düzəldiyi ehtimal olunur. Qədim türk yazılı abidələrinin dilində *avya* "abır-həya", "heyva" mənalarını ifadə edir.

**Ayadı Tağa** *or., mür.* Qubadlı r-nu ərazisində dağ. Oykonim *ayadı* (türk dillərində ayağın altı; dib, özül, dağın ətəyi) və *tağa* (nal) sözlərindən düzəlib, "ayağı nallı dağ" deməkdir. 1933-cü ildə Qarabağ ərazisində Ayad adlı yaşayış məntəqəsi qeydə alınmışdır.

**Ayaq Qərvənd** *oyk., mür.* Ağdam r-nunun Qərvənd i.ə.v.-də kənd. Xaçın çayının sahilindədir. Toponimiyada *ayaq* "kənar, uzaq", "aşağı"; "qurtaracaq" mənalarını ifadə edir. Yaşayış məntəqəsi Baş Qərvənd kəndindən aşağıda yerləşdiyinə görə belə adlandırılmışdır. Qərvənd etnotoponimdir.

**Ayaqqobu** *or., mür.* Tovuz r-nunda çökəklik. Oronim *ayaq* (aşağı) və *qobu* (dərə) sözlərindən düzəlib, "aşağı dərə" deməkdir.

**Ayaqyalın dağ** *or., mür.* Cəbrayıl r-nu ərazisində dağ. Oronim *ayaq* (dağın aşağı hissəsi, qurtaracağı), *yalın* (çılpaq, bitkisiz, qayalıq) və *dağ* (müsbət relyef forması) sözlərindən düzəlib, "aşağı hissəsi bitkisiz, çılpaq olan dağ" deməkdir.

**Ayazaxtarma** *or., mür.* Şamaxı r-nu ərazisində, Qobustanda, Gicəki dağında palçıq vulkanı. Hün. 45-50 m. Gicəkiaxtarma da adlanır. Sahəsinə və həcminə görə Azərb.-da ən iri palçıq vulkanıdır. Oronim *ayaz* (türk dillərində "aydın", "açıq" mənaları ilə yanaşı "boşalmaq", "yoxsullaşmaq", "zəifləmək" mənalarını da ifadə edir) və *axtarma* (türk dillərində "dağıntı", "ətrafa səpələnmək", "vulkan") sözlərindən düzəlib, "boşalmış vulkan" deməkdir.

**Ayçənqal** *or., mür.* Zəngəzur silsiləsində, Ordubad r-nu ilə Ermənistan sərhədində aşırım. Hün. 3699 m. Əslində oronim *Ayıçınqıl* adının təhrifi olub, dağın süxurlarını təyin edir.

**Aydınbulaq** *hidr., mür.* 1. Şəki r-nu ərazisində bulaq, 2. Qusar r-nu ərazisində bulaq. Hidronim *aydın* (etn.) və *bulaq* (su obyekti) sözlərindən düzəlib. Etnotoponimdir.

**Aydınbulaq** *oyk., sadə* Şəki r-nunun eyniadlı i.ə.v.-də kənd. Alazan-Həftəran vadisindədir. Adını ərazidəki eyniadlı bulaqdan almışdır. Kəndin şm.-ında təqribən IX-XIII əsrlərə aid edilən qüllə də (Ağacqala, Meydanqala, Qız qalası da adlanır) Aydınbulaq qülləsi adlanır. Kənd 1804-cü ildə Xoy xanı Cəfərqulu xanla Cənubi Azərb.-dan gəlmiş ailələrin bir qrupunun Aydınbulaq adlanan yerdə məskunlaşması nəticəsində yaranmışdır.

**Aydıngün** *oyk., sadə* Salyan r-nunun Qaraçala qəs. i.ə.v.-də qəsəbə. Kür çayının sahilində, Şirvan düzündədir. Sovet hakimiyyəti illərində (1965) verilmiş adlardandır. Oykonim "xoş gün, firavan həyat" mənasındadır.

**Aydınkənd** *oyk., mür.* Quba r-nunun Güləzi i.ə.v.-də kənd. Oykonim *aydın* (etn.) və *kənd* (yaşayış məntəqəsi termini) sözlərindən düzəlib. Etnotoponimdir.

**Aydınqışlaq** *oyk., mür.* Qəbələ r-nunun Zarağan i.ə.v.-də kənd. Dəmiraparan çayının sağ sahilində, Alazan-Həftəran vadisindədir. Oykonim *aydın* (etn.) və *qışlaq* (yaşayış məntəqəsi termini) sözlərindən düzəlib. Etnotoponimdir.

**Aydınlar** *oyk., sadə* 1933-cü ildə Dəvəçi r-nunun Ərzıküş i.ə.v.-də qeydə alınmış kənd. Etnooykonimdir. Kəndin ərazisindən axan Aydınlar çayının adı da kəndin adından alınmışdır. *Aydınlar* qızılbaşların təkəli tayfasının bir qolunun adıdır.

**Ayğır bulağı** *hidr., mür.* Şəki-Zaqatala zonasında bulaq. Hidronim *ayğır* (erkək at) və *bulaq* (su obyekti) sözlərindən düzəlib.







Zoohidronimdir. 1978-ci ilədək Ermənistanda Ayğırgöl kəndi olmuşdur.

**Ayğırlı dağ** *or., mür.* Tovuz r-nu ərazisində dağ. Oronim *ayğır* (erkək at), *-lı* (şək.) və *dağ* (müsbət relyef forması) sözlərindən düzəlib.

**Ayıbasanlı** *oyk., mür.* Füzuli r-nunun eyniadlı i.ə.v.-də kənd. Bəzi mənbələrdə Ayıbasan kimi də verilir. Oykonim *ayı* (heyvan adı), *basan* (yenən, qalib gələn, məğlub edən) və *-lı* (şək.) komponentlərindən düzəlib. 1980-ci ilə qədər Ermənistanda Ayıbasan adlı kənd olmuşdur. Sonralar bu kəndi ermənilər Marqahovit adlandırmışlar. Yəqin ki, Ayıbasanlı kəndində məskunlaşmış əhali Ermənistandan köçüb gəlmişdir. *Ayıbasan* "ayını məğlub edən" və ya "ayının çox olduğu yer" deməkdir. *Ayıbasanlı* isə "Ayıbasan kəndindən gələnlər" mənasına uyğundur. Hal-hazırda Ayıbasanlı kəndi Yuxarı və Aşağı Ayıbasanlı adı ilə iki kəndə ayrılmışdır.

**Ayıbazar** *oyk., mür.* Laçın r-nunun Təzəkənd i.ə.v.-də kənd. Ayıbazar çayının (Şəlvə çayının qolu) kənarında, Qarabağ silsiləsinin ətəyindədir. Əsli Aybazardır. Yaşayış məntəqəsi meşəlikdən zolaq şəklində ayrılmış sahədədir. Tədqiqatçılara görə, oykonim *ayı* (heyvan adı) və *bazar* (satış yeri, bolluq olan yer) sözlərindən düzəlib, "ayı bol olan yer; ayının satışa çıxarıldığı yer" deməkdir. Əslində isə, kəndin adı keçmişdə bu ərazidə ayda bir dəfə təşkil olunan bazarla əlaqədar yaranmışdır.

**Ayıçınqılı/Ayıçınqıllı** *or., mür.* Kəlbəcər r-nu ərazisində Qarabağ yaylasında dağ. Tərtər çayı və Bazarçayın mənbəyi yaxınlığında sönmüş vulkan konusudur. Hün. 3344 m. Ədəbiyyatlarda Ayıçınqıllığı, Ayıçınqıllı formalarına da təsadüf olunur. Oronim *ayı* (heyvan adı), *çınqıl* (daş qırıntısı) və *-lı* (şək.) komponentlərindən düzəlib. Vulkan mənşəli olduğuna görə dağda şaxta aşınması nəticəsində çoxlu çınqıl əmələ gəlmişdir. Türk dillərində *ayı* sözünün "çoxlu", "zoydaşı" mənalarına da rast gəlirik. Bu baxımdan oronimi "çoxlu çınqıl olan dağ" kimi izah etmək olar.

**Ayıdağ** *or., mür.* Qazax r-nu ərazisində dağ. Oroqrafik obyektlərin bir qismi orada tez-tez rast gələnən ayının adını daşıyır. Ayıdağ oronimi də belələrindəndir. Oronim *ayı* (heyvan adı) və *dağ* komponentlərindən düzəlib, "ayı olan dağ" deməkdir. Ayı qayası (Cəbrayıl), Ayı dərəsi (Ağsu, Qax, Qubadlı, Şahbuz), Ayı mağarası dağı (Qubadlı), Ayı vurulan qaya (Kəlbəcər), Ayı öldürülən çöl (Zaqatala), Ayı meşəsi (Şəki), Ayı təpəsi, Ayı vurulan dağ, Ayı qaçan dağ, Ayı nüyü (Tovuz), Ayı dağ (Krım), Ayıdərə (Türkmənistan) və s. həmin ərazidə ayının olmasından xəbər verir.

**Ayıtala** *oyk., sadə* 1. Gədəbəy r-nunun Dəyəqarabulaq i.ə.v.-də kənd. Şəmkir çayının sol sahilində, Şahdağ silsiləsinin ətəyindədir. Bəzi mənbələrdə Aytala şəklində qeydə alınmışdır. Kənd 1935-ci ildə r-nun Musayal kəndinin ərazisi əlverişsiz olduğu üçün xeyli ailənin Ayıtalası adlı yerə köçməsi nəticəsində yaranmışdır. 1970-ci ildən kəndin adı əhali arasında və yerli rəsmi sənədlərdə Talakənd şəklində işlənir. 2. Zaqatala r-nunun Maqov i.ə.v.-də kənd. Bəzi mənbələrdə Oytala şəklində qeydə alınmışdır. Oykonim *ayı* (heyvan adı) və *tala* (ətrafa nisbətən fərqli sahə) sözlərindən düzəlib. Hər iki oykonim adını ərazidəki ayı olan talanın adından almışdır.

**Ayindağ** *or., mür.* Qubadlı r-nu ərazisində dağ. Oronim *ayin* (fars. "adət, dəb, mərasim", "din qanunları", "bəzək, zinət") və *dağ* (müsbət relyef forması) sözlərindən düzəlib. Oronimin mənasını iki cür izah etmək olar: 1. "Müəyyən mərasimin keçirildiyi dağ", 2. "Yerləşdiyi əraziyə bəzək, yaraşıq verən dağ".

**Aygünlü** *oyk., sadə* Dəvəçi r-nunun Gəndob i.ə.v.-də kənd. Baş Qafqaz silsiləsinin ətəyindədir. Etnotoponimdir. XIX əsrdə Aygünlü Kəngərli adı ilə qeydə alınmışdır. Həmin əsrin ortalarında Aygünlü, Burbur (Bərbər), Kəngərli, Molla Kamallı, Əbey Məhəmməd Hacıbəbir və Ağamirzə obası adlı kiçik məntəqələr birləşərək Aygünlü Kəngərli, Burbur Molla Kamallı və Burbur adlı üç böyük kənd icması əmələ gətirmişdir. Sonralar oykonimin tərkibindəki "kəngərli" komponenti düşmüşdür.

**Ayrantökən** *or., sadə* 1. Qobustanda dağ. Ələt d.y. stansiyasından şm.-da yerləşir. Hün.

293 m, 2 Əli Bayramlı r-nunda, Atbulaq d y stansiyası yaxınlığında palçıq vulkanı Sonuncu dəfə 1969-cu ildə püskürmüşdür Oronim *ayran* (süd məhsulu) və *tokən* (axıdan) sözlərindən düzəlib, palçıq vulkanının bir formasının adıdır Vulkan püskürərkən kənara sıçrayan maddə ayran rəngində olduğundan belə adlanır

**Ayrıqobuaxmaz** *hidr mür* Ağdaş r-nunda, Kürün sol sahilində axmaz göl Hidronim *ayrı* (kənar; künc, bölünmüş, başqasına məxsus), *qobu* (dərə, çökək) və *axmaz* (axarı olmayan göl) sözlərindən düzəlib, "hər hansı bir ərazinin kənarındakı dərədə olan axarsız göl" deməkdir *Ayrı* sözünü çox vaxt elmi ədəbiyyatda "əyri" sözü ilə əvəz etməyə cəhd göstərilir Lakin nəzərə almaq lazımdır ki, Ayrı dərə, Ayrısu (Gədəbəy), Ayrıqışlaq (Əli Bayramlı), Ayrıca (Bərdə), Ayrıca, Ayrıbulaq (Ermənistan) toponimlərindəki "ayrı" komponenti "yad, özgə, kənar; başqa" mənalarını ifadə edir.

**Ayrım** *hidr, sadə* Kəlbəcər r-nu ərazisində çay Tərtər çayının qoludur Etnohidronimdir XIX əsrə qədər çayın sahilində Ayrım binəsi olmuşdur. Çay öz adını həmin binənin adından almışdır. Sonralar binənin yerində Aşağı Ayrım kəndi salınmışdır Ayrım və ya ayrum Kiçik Qafqazda yaşamış azərb -ların qədim etnoqrafik adıdır

**Ayrımca** *or, düz* Gədəbəy r-nu ərazisində dağ Oronim *ayrım* (etn ) və *-ca* (şək ) komponentlərindən düzəlib, "ayrımlara məxsus dağ" deməkdir Etnotoponimdir

**Aza** *oyk, sadə* Ordubad r-nunun Aza i ə v -də qəsəbə Azərb -nın ən qədim şəhərlərindən olan Azanın adındandır. Bu şəhər Culfa şəhərinin 20 km -liyində, Gilançayın sahilində idi Müxtəlif mənbələrdə Aza, Azar, Azat, Azad adı ilə təqdim edilən bu obyekt kiçik şəhər kimi təsvir olunur Həmin şəhərin yerində indi Aşağı və Yuxarı Aza adlı iki kənd var Qədim türk dillərində *aza* "kiçik, kiçildilmiş" mənalarında işlənmişdir Beləliklə, *Aza* oykonimi "kiçik yaşayış məntəqəsi" deməkdir Qəsəbənin yerləşdiyi ərazinin keçmiş adı Uluçaydır.

**Azad/Azat** *oyk, sadə* 1 Goranboy r-nunun Ağamalıoğlu i ə.v -də kənd. Gəncə-Qazax düzənliyindədir 1949-cu ildə Xanlar r-nunun Azad kəndindən gəlmiş ailələr tərəfindən salındığına görə belə adlandırılmışdır; 2. Xanlar r-nunun eyniadlı i ə v -də kənd. Kürək çayının sol sahilindən bir qədər aralı Murovdağ silsiləsinin ətəyindədir Keçmiş adı Suluqdur 1990-cı ilədək yaşayış məntəqəsinin əhalisi XIX əsrdə Cənubi Azər -nın Xoy mahalından köçüb gəlmə ermənilərdən ibarət olmuşdur İndiki əhalisi Ermənistandan zorla çıxarılmış azərb -lardır Tarixi mənbələrin verdiyi məlumata görə, III-V əsrlərdə Azərb.-da feodal istehsal üsuluna keçildi Feodallar iki qrupa ayrılırdı dünyəvi və ruhani feodallar Dünyəvi feodallar iri və xırda feodallar təbəqəsindən ibarət idi. Xırda feodallar "azatlar" adlanırdı Hökmdarların və iri feodalların dayağı olan azatlar onların vassalları hesab edilirdilər I Xosrov Anuşirəvanın zamanında azatların sayı artırdı Azatlar kahinlər kimi böyük imtiyaza malik idilər Bununla bağlı *azat/azad* sözü "xırda", "kiçik" mənası ilə yanaşı "müstəqil, sərbəst" mənalarını kəsb etməyə başladı *Azad* sözünün şəxs adı kimi istifadə edilməsi daha sonrakı dövrlərə aiddir Azərb toponimiyasında rast gəlinən Azad toponimləri və topokomponentlərinin böyük əksəriyyəti "xırda", "müstəqil" mənaları ilə izah olunur. Ermənistan ərazisində Azad (keçmiş Ağkilsə kəndinin 1935-ci ildən etibarən adı), Azatamut, Krımda Azat yaşayış məntəqələri qeydə alınmışdır

**Azad** *hidr, sadə* Xanlar r-nu ərazisində çay. Kürək çayının sol qoludur. Başlanğıcını Kiçik Qafqazın şm -ş yamacından götürür Adını ərazisindən axdığı kəndin adından almışdır.

**Azadkənd** *oyk, mür.* 1 Saatlı r-nunun eyniadlı i.ə v -də kənd Muğan düzündədir Keçmiş adı 5 Dekabr (Konstitusiya gününə işarədir) olmuş, 1937-ci ildə Sabirabad r-nunun Heşimxanlı kəndindən gəlmiş ailələr tərəfindən salınmışdır; 2 Sabirabad r-nunun eyniadlı i ə v -də kənd Kür çayının sağ sahilində, Muğan düzündədir. Kür çayının daşması nəticəsində torpaqlar şorlaşdığından Heşimxanlı kəndinin əhalisi indiki kəndin ərazisinə köçmüş, kənd 1938-ci ildən belə adlandırılmışdır Oykonim *azad* (kiçik, xırda, müstəqil) və *kənd* (yaşayış məntəqəsi termini) sözlərindən düzəlib, "kiçik kənd, müstəqil kənd" deməkdir 1933-cü ildə Lənk və Kürdəmir r-nlarında da Azadkənd yaşayış məntəqələri qeydə alınmışdır





**Azad Qaraqoyunlu** *oyk., mür.* Tərtər r-nunun eyniadlı i ə.v.-də kənd Qarabağ düzündə Tərtər çayının sahilindədir Oykonim *Azad* (Azad bəy Cavanşirin adı) və *qaraqoyunlu* (etn ) sözlərindən düzəlib, "qaraqoyunlu tayfasının Azad bəyə mənsub tirəsi" mənasını ifadə edir və etnotoponim hesab olunur. Kənd yerli əhali arasında Azadağabəy Cavanşirli və ya Azadağa Qaraqoyunlusu da adlanır Keçmişdə yerli əhali qaraqoyunlu Azadağa bəy Cavanşirin rəiyyəti olduğundan kənd belə adlandırılmışdır 1933-cü ildə Bərdə r-nunda Azatqoyunlu adlı başqa bir kənd də qeydə alınmışdır.

**Azaplı/Azaflı** *oyk., sadə* Tovuz r-nunun eyniadlı i ə v -də kənd Əsrik çayının sol sahilində, dağ ətəyindədir. Kənd sakinləri arasında oykonim Azaflı kimi tələffüz olunur Yerli əhalinin məlumatına görə, yaşayış məntəqəsinin yaxınlığında, Köhnəqala adlı yerdə zindan (əzabxana) olmuş və kənd öz adını buradan götürmüşdür

**Azaru** *oyk., sadə* Astara r-nunun Asxanakəran i.ə v -də kənd Peştəsər silsiləsinin ətəyindədir Adını ərazidəki eyniadlı çaydan almışdır

**Azaruçay/Azarud** *hidr, mür* Astara r-nu ərazisində çay Hidronim *aza* (kiçik), *ru* (talış "çay") və *çay* (axar su obyekti) sözlərindən düzəlib, "kiçik çay" deməkdir Hidronimi talış dilindəki *azu/asu* (sürətli) və *rud* (dağ çayı) sözlərindən düzəlmiş "iti axan dağ çayı" mənalı söz kimi də izah edirlər

**Azərbaycan** *oyk, sadə.* 1 Ön Asiyada yerləşən qədim tarixə malik ölkə Ş -dən Xəzər dənizi ilə əhatə olunub, şm -dan Dağıstan, şm -q -dən Gürcüstan, c -q.-dən Ermənistan, c -dan Türkiyə və İranla həmsərhəddir Paytaxtı Bakı şəhəridir. 2 Lənk r-nunun Nodə i ə v -də kənd Ölkənin adındandır Tarixi mənbələrdə ta qədimdən Atropaten, Adərbadaqan, Atorpatakan, Azərbaycan, Azərbaycan adları ilə tanınan bu ölkə azərb -ların ulu əcdadlarının məskəni olmuşdur Qədimdə bu ölkədə atəşpərəstliyin geniş yayılması ilə əlaqədar olaraq tədqiqatçıların bir çoxu *Azərbaycan* adını İran dilləri əsasında "odla qorunan", "atəşpərəstlərin ölkəsi", "od ölkəsi" kimi mənalandırmışlar Toponimi türk dilləri əsasında izah etməyə çalışan digər tədqiqatçılar onu "varlıların, böyüklərin məkanı", "böyüklər, bəylər ölkəsi", "Atropatın (Midiya canişini) ölkəsi" kimi izah etmişlər Türk mənşəli toponimlərin coğrafi terminlərinə əsaslanan son tədqiqatlar isə bu toponimin "yüksəklik, təpəlik, dağətəyi yamacda olan məkan, yer" mənasına üstünlük verir Azərbaycanın tarixən iqtisadi cəhətdən qüdrətli bir ölkə kimi yadellilən özünə cəlb etməsini nəzərə alaraq onun adını "az ərlərin bolluq məkanı" kimi də şərh etmək olar

**Azərməscidi/Azərməscid** *or, mür* Ordubad r-nu ilə Ermənistanın sərhədində aşırım Zəngəzur silsiləsinin suayrıcısıdır Hün 3460 m Vənənd və Ordubad çayları Azərməscidi aşırımının yaxınlığından başlanır Oronim *azər* (etn ), *məscid* (ər müsəlmanların ibadətgahı) və *-i* (mənsub şək -si) komponentlərindən düzəlib, "azərlərin sitayiş etdiyi dağ" deməkdir

**Azıx/Azox** *oyk, sadə* Xocavənd r-nunun eyniadlı i ə v -də kənd Quruçayın sol sahilindən bir qədər aralı, dağ ətəyindədir Adını ərazidəki Azıx mağarasının adından almışdır XIX əsrin I yarısında Cənubi Azərb -nın Qaradağ mahalından gəlmiş erməni ailələri burada məskunlaşmış və yaşayış məntəqəsini Azox adlandırmışlar Azıx mağarası və ya Azıx kahası Quruçayın sol sahilində, 900 m hündürlükdədir Azərb -da ən iri karst mağarası hesab olunur Tədqiqatçıların fikrincə, *azıx* qədim türk dillərindəki "ayı" sözündəndir və mağara "ayı mağarası"dır Mənbələrdəki *Azuq* variantına əsaslanan tədqiqatçılar isə bu toponimi "azuqə yeri", "tədarük yeri", "anbar" kimi izah edirlər Lakin mağaradakı 6 salon və 2 giriş qapısının olması, ocaq yerinin varlığı burada insanların yaşadıqlarından xəbər verir Deməli, *Azıx* "azılar, böyük insanlar birliyi" deməkdir

**Aznakar** *or, mür* Qazax r-nu ərazisində dağ. Oronim *azna* (qədim türk dillərində "dar keçid") və *kar/qar* (qədim türk dillərində "dağ") sözlərindən düzəlib, "dar keçidli dağ" deməkdir

# Bb

**Babacıq** *or., düz.* Culfa r-nunun Gal kəndi ərazisində dağ. Kənddə Babacıq yaylağı adlanan sahə də vardır. Oronimlər kənddəki beş pirin (Dağdağan piri, Əlihəsən piri, Gal piri, Göydaş piri, Qala piri) varlığı ilə bağlı yaranmışdır, "pirlərlə zəngin yer" mənasındadır.

**Babaçay** *hidr., mür.* 1. Gədəbəy və Şəmkir r-nlarında çay. Zəyəm çayının sağ qoludur. Kiçik Qafqazın şm.-ş. yamacından (1790 m yüksəklikdən) başlanır. Bəzi ədəbiyyatlarda Babacan da adlanır. Bu adı çayın mənbəyinin Babacan yeri adlanan sahəyə yaxın ərazidən axması ilə izah edirlər. XIX əsrin sonu, XX əsrin əvvəllərinə aid sənədlərdə çayın yuxarı axını boyu ərazidə Babacan qışlağı, Babacan dərəsi adlı oroqrafik obyektlər də qeydə alınmışdır; 2. Quba r-nunda çay. Cimi çayı ilə birlikdə Vəlvələ çayını əmələ gətirir. *Baba* (Babadağdan başladığı üçün) və *çay* sözlərindən düzəlib, "Babadağdan axan çay" deməkdir.

**Babadağ** *or., mür.* 1. Baş Qafqaz silsiləsinin c.-ş.-ində dağ. Quba və İsmayıllı r-nlarının sərhədindədir. Hün. 3632 m. Qaraçay, Vəlvələ və Girdiman çayları buradan başlanır. İlin çox vaxtı qarla örtülü olur. Dağ ziyarətgah yeridir və Həzrətbaba piri də adlanır; 2. Baş Qafqaz silsiləsinin c.-ş.-ində, eyniadlı dağın yamacında aşırım. Hün. 3380 m. Quba və İsmayıllı r-nları arasında əsas keçidlərdən biridir. Qaraçay və Girdımançayın hövzələrini birləşdirən yol bu aşırımdan keçir. *Baba* və *dağ* sözlərindən düzəlib. "Yüksək, uca, başı qarla örtülü dağ" deməkdir. Özbəkistanın Surxanderya vilayətində, Surxanderya və Kafirniqan çayları arasında Babataq, Krımın Canköy r-nunda Babatau dağlarının olduğu məlumdur.

**Babadin** *oyk., sadə.* Laçın r-nunun Təzəkənd i.ə.v.-də kənd. Dağətəyi ərazidədir. *Baba* və *din* (xalq terminologiyasında "hündür yer, təpə"; "düşərgə, dincəlmək üçün yer") sözlərindən düzəlib. "Hündür təpə" mənasını ifadə edir. Oykonim ərazidəki dağların birinin adından törəmişdir.

**Babagil** *oyk., sadə.* Lerik r-nunun Noda i.ə.v.-də kənd. Dağətəyi ərazidədir. Kəndin adı 1508-ci ilə aid edilən Babagil türbəsinin adındandır. Qədim adı Asnaqaran/Əsnəkəran (talış "dəmirçilər") olmuşdur. Babagil türbəsi Səfəvilərin gilanlı müridlərindən birinə mənsub olmuş, sonralar zaviyəyə çevrilmişdir. Türbə sahibinin nəvəsi Babagilli Əmir Şahsevər Keskəri Səfəvilərin tanınmış sərkərdələrindən olmuş, 1578-ci ildə talış hakimi Bayandır xanın fərmanı ilə Xorasanda baş verən iğtişaşı yatırarkən döyüş zamanı öldürülmüşdür.

**Babaxanlı** *oyk., sadə.* Cəlilabad r-nunun Bozayran i.ə.v.-də kənd. Düzənlikdədir. Mənbələrə görə, yaşayış məntəqəsi 1905-ci ildə Məşədieli kəndindən köçüb gəlmiş *babaxan* nəslinə mənsub ailələr tərəfindən salınmışdır. Etnotoponimdir. 1917 və 1933-cü illərdə Salyan r-nunun Kür Qarabucaq i.ə.v.-də də eyniadlı kənd qeydə alınmışdır.

**Babakar** *or., mür.* Qazax r-nunda dağ. Xram çayından sağda, Gürcüstanla sərhəddə yerləşir. Hün. 708 m. Yerli tələffüz forması Babakyardır. Oronim *baba* və *kar* sözlərindən düzəlib, "yüksək dağ", "müqəddəs dağ" deməkdir.

**Babakücə** *oyk., mür.* 1. Masallı r-nunun Sığdaş i.ə.v.-də kənd. Lənkəran ovalığındadır; 2. Lerik r-nunun Veri i.ə.v.-də kənd. Peştəsər silsiləsinin ətəyindədir. Yerli əhali kəndi Bobokümə adlandırır. *Bobo* (kənddəki Cahangir pirini belə adlandırırlar) və *kümə* (talış "məhəllə, küçə") sözlərindən ibarət olan bu toponim "pir məhəlləsi, pir kəndi" kimi izah olunur. Oykonim *baba* (dağ) və *kücə* (*kuca* türk dillərində "əhatə olunmuş", "dövrələnmiş, tutulmuş") sözlərindən düzəlib, "dağla əhatə olunmuş yer, dağlıq ərazi" deməkdir.

**Babaqum** *or., mür.* 1. Şamaxı r-nunda dağ; 2. Əli Bayramlı r-nunda Ləngəbız silsiləsinin c.-ş. hissəsində ucqar zirvə. Hün. 576 m. Türkdilli xalqların böyük əksəriyyətində, o cümlədən azərb.-larda yüksək dağ zirvələri *baba* adlandırılır, *qum/qom/kom* sözü isə Azərb. dilində "yığıntı, toplantı, təpəcik" mənalarında işlənir. Azərb. dilinin dialektlərində "boz rəngli mərcan" mənasında "babaqulu" sözü də işlənməkdədir. Birinci halda or. "yüksək təpə", ikinci halda isə "boz rəngli mərcandan olan təpə" deməkdir.

**Babala** *hidr., sadə.* Lənkəran r-nunda çay. Girdanı çayının sol qoludur. Abidələrin dilində *ba* sözü təqlidi söz kimi "gurultu", "qoyunun mələməsi" və s. mənalarda işlənir. Bu baxımdan *babala* toponimiyadakı *valvala* sözünün sinonimi olub "gurultulu" deməkdir. Bəzən Boblaçay da adlandırılır. *Bobla* bu çaylardan tutulan balıq növünün adıdır.

**Babalı** *oyk., sadə.* 1. Xaçmaz r-nunun Niyazoba i.ə.v.-də kənd. Samur-Dəvəçi ovalığındadır. 1917-ci ildə Bəbəli variantında qeydə alınmış bu kənd o zaman Quba qəzasının Dədəli bölgəsinə daxil idi. Keçmişdə Qoz Babalı (qozluq ərazidə yerləşdiyi üçün) və ya Ərəb Babalı da adlanırdı. Hazırda həmin r-nun Qaraqaşlı kəndi yaxınlığında Ərəb Babalı adlı xarabalıq var; 2. Cəlilabad r-nunun Xaçmaz i.ə.v.-də kənd. Dağətəyi ərazidədir. İ.ə.v.-nin adı kənd sakinlərinin mənşəyi haqqında məlumat verir. Məlum olur ki, kəndin əsasını Xaçmaz r-nundan köçmüş *babalılar* qoymuşlar. Tədqiqatçılar oykonimi VII əsrdə Azərb.-na köçürülmüş ərəb tayfalarından birinin adı ilə və ya pirəmbel tayfasının *babalı* tirəsinin adı ilə bağlayırlar. 1917-ci ildə Zaqatala qəzasının Qaraqan (Almalı) bölgəsində Babalo (Babalı) yaşayış məntəqəsi qeydə alınmışdır. Etnotoponimdir.

**Babaratma** *oyk., mür.* Şəki r-nunun Qaradağlı i.ə.v.-də kənd. Murdarçayın (Əyriçayın qolu) sahilində, Alazan-Həftəran vadisindədir. Kəndin yaxınlığında Babaratma piri var. Bu pirə bəzən Pirbaba da deyirlər. Rəvayətə görə, pir ərəb işğalları dövründə (VII əsr) yerli əhali ilə vuruşmada öldürülmüş ərəb sərkərdəsi Babarutənin qəbridir. Oykonimin ikinci komponenti *iratma* variantında yerli dialektdə "kəlağayı toxunan yer, emalatxana" mənasında işlənir. Məlumdur ki, Şəki ta qədimdən özünün qiymətli ipəyi və kəlağayısı ilə məşhurdur.

**Babasər** *oyk., mür.* Masallı r-nunun Boradigah i.ə.v.-də kənd. Lənkəran ovalığındadır. *Baba* və *sər/sar/sər* (Azərb. toponimiyasında "yer, məkan, yaşayış məntəqəsi" mənalarında işlənir) sözlərindən düzəlib, "böyük kənd; köhnə kənd" deməkdir.

**Babasər** *hidr., sadə.* Masallı r-nunun Babasər kəndi yaxınlığında iki su anbarı. Fərqləndirilmək üçün Birinci və İkinci Babasər adlanır. Boşağadərə çayı üstündədir. Müvafiq olaraq 1956 və 1964-cü illərdə istifadəyə verilmişdir. Adını yaxınlığdakı kəndin adından almışdır.

**Babasəfər** *or., sadə.* Şamaxı r-nunun şm. hissəsində dağ. Pirsaat çayının sahilindədir. Hün. 2161 m. Dağ buradakı Yeddiqardaş adlı qədim qəbiristanda yerləşən *Babasəfər* pirinin adı ilə adlandırılmışdır.

**Babaşlar** *oyk., sadə.* Kəlbəcər r-nunun Seyidlər i.ə.v.-də kənd. Ağçayın sahilində, Murovdağ silsiləsinin ətəyindədir. Əsl adının Babakişilər olduğu güman edilir. *Babaşlar* ayrımlara məxsus bir nəslin adıdır. Etnotoponimdir. 1917-ci ildə Lənkəran qəzasının Lerik bölgəsində Babaşlı (1921-ci ildə dağıdılmışdır), 1933-cü ildə Xaçmaz r-nunun Əhmədoba i.ə.v.-də Babaşlı kəndləri qeydə alınmışdır.

**Babayal** *or., mür.* 1. Goranboy r-nu ərazisində dağ; 2. Mingəçevir su anbarından c.-da, Bozdağ silsiləsində zirvə. Hün. 463 m. Bəzi ədəbiyyatlarda Babayeldağ da adlanır. Oronim *baba* və *yal* sözlərindən düzəlib, "dağ beli, dağın üstü, zirvə hissəsi" deməkdir.

**Babaylı** *oyk., sadə.* Zəngilan r-nunun Məmmədbəyli i.ə.v.-də kənd. 1917-ci ildə *Baba Yaqublu* şəklində qeydə alınmışdır. Görünür, sonralar oykonimin ikinci komponenti ixtisara uğramışdır. Etnotoponimdir. Toponimikada belə bir məlumat da var ki, yaşayış məntəqəsini XIX əsrin əvvəllərində Cənubi Azərb.-nın *Babaylı* kəndindən köçüb gələnlər saldığına görə belə adlanmışdır.

**Babazənən** *or., mür.* Salyan şəh.-dən şm.-ş.-də dağ, palçıq vulkanı. Hün. 41 m. Cənub-Şərqi Şirvan düzündədir. Bəzi ədəbiyyatlarda Babasənən variantında da işlənir. Mütəxəssislərin bir qismi oronimin ikinci komponentini fars dilindəki "qadın" sözünün qarşılığı, digər qismi isə Sənan şəxs adı ilə əlaqələndirirlər. Əslində *Babasinən* variantında qəbul olunmalı olan bu oronim "baba" və "sinən" (türk dillərində "enən",

"düşən", "yatan", "kiçilən") sözlərindən ibarətdir Dağın palçıq vulkanı ilə əlaqədar olması, vulkanın püskürüb sönməsi bu variantın doğruluğunu söyləməyə imkan verir.

**Babazənən** *hidr*, *sadə* Salyan r-nunda mıн bulaqlar Eyniadlı dağda yerləşdiyi üçün adını da oradan almışdır Suyu isti və kükürdlüdür. Yerli əhali tərəfindən müalicə üçün istifadə edilir Tədqiqatçılara görə, burada əsasən qadın xəstəlikləri müalicə olunduğu üçün bulaqlar Babazənən (qadın piri) adı ilə tanınır

**Babək** *oyk*, *sadə* 1 Azərbaycanın Naxçıvan MR ərazisində inzibati r-n. İran İslam Respublikası, Şərur, Şahbuz və Culfa r-nları ilə həmsərhəddir 1978-ci ilədək Naxçıvan r-nu adlanırdı Mərkəzi Babək qəsəbəsidir; 2 Babək r-nunda ştq Arazboyu düzənlikdədir 1978-ci ilədək Təzəkənd adlanırdı Qəsəbə və r-n VII əsrdə ərəb istilasına qarşı xürrəmi hərəkatının qəhrəmanı Babəkin şərəfinə adlandırılmışdır

**Babəki** *oyk*, *sadə* Şərur r-nunun Dərvişlər i.ə v -də kənd. Araz çayı yaxınlığında, Şərur düzündədir. XX əsrin ortalarında qonşu Çərçiboğan kəndindən çıxmış bir qrup gənc ailənin burada məskunlaşması nəticəsində yaranmışdır. Toponim özündə xalq qəhrəmanı Babəkin adını əks etdirir "Babəkə məxsus, Babəkin tərəfdarları" deməkdir

**Babərşor** *hidr*, *mür* Abşeron yarımadasının ş hissəsində göl Hidronim *babər* (*ba* - dib və *bər* - dayaz yer) və *şor* (göl) sözlərindən düzəlib, "dibi dayaz olan göl" deməkdir

**Babı** *oyk*, *sadə* 1 Füzuli r-nunun Arayatlı i ə v -də kənd Araz çayının sol sahilindən bir qədər aralı, düzənlikdədir. Kənddə XIII əsrə aid *Babı türbəsi* (Şıxbaba) var Türbə 1271-72-ci illərdə Şeyx Əbu Yaqub ibn Səd tərəfindən tikilmişdir; 2 Cəbrayıl r-nunun Horovlu i ə v -də kənd Bəzi mənbələrdə Babi variantında da adı çəkilir Oykonim "babi məzhəbinə mənsub olan" deməkdir

**Baburl** *or*, *sadə*. Xəzərdə ada Etnotoponimdir 1947-ci ilədək Ermənistanın Ani r-nunda Baburlu adlı kənd olmuşdur Oronimin Böyük Moğollar sülaləsinin banisi Zahirəddin Məhəmməd Baburun (XV-XVI əsrlər) xatirəsinə yaranmış olduğu ehtimal edilir

**Bad** *oyk*, *sadə* Quba r-nunun Rustov i.ə.v -də kənd Dağ ətəyindədir Tam adı Bad Qalagah olan bu kəndin ərazisi Rustov kəndinin keçmiş məhəllələrindən birinin adıdır. Ərazidə Qala Suvarın və Qala Ələmun adlı qala xarabalıqları var. Bu qalalar bad adlanan kərpicdən hörüldüyü üçün kənd Bad Qalagah adını almışdır Sonralar toponimin ikinci komponenti düşmüşdür Azərbaycan ərazisində çox əlverişli, qışda və yayda tikilinin daxilində mülayim temperaturun saxlanmasında əsas rol oynayan belə kərpiclərdən evlərin tikilməsində indi də istifadə olunur Azərb dilinin dialekt və şivələrində, qədim abidələrin dilində *bad* "tərkibinə keçi qılı qatılmış sarı torpaqdan hazırlanmış palçıq, bu palçıqdan qurulan təndir və ya kəsilən kərpic, saxsı qab", "su arxının kənarı", "ağac qabığı" mənalarında işlənir

**Badaçay** *hidr*, *mür* Şəmkir r-nu ərazisində çay Zəyəm çayının qoludur Hidronim *bada* və *çay* sözlərindən düzəlib, "su arxı, çay qolu" deməkdir

**Badakənd** *oyk*., *mür*. Şəmkir r-nunun eyniadlı i ə v -də kənd. Badaçayın (Zəyəmin qolu) sahilində, Kiçik Qafqazın ətəyindədir Oykonim *bada* və *kənd* sözlərindən düzəlib, "su arxının kənarında, çay kənarında olan kənd" deməkdir Bəzi ədəbiyyatlarda səhv olaraq Badəkənd variantında verilmişdir 1920-ci ilədək Zəngəzur mahalında Badabar adlı yaşayış məntəqəsi olmuşdur Qaraqalpaq Respublikasında Amuderya çayının sahilində Sultanuizdaq silsiləsinin ətəyində Badaytuqay adlı qoruğun olduğu da məlumdur

**Badamağac** *oyk*., *sadə* Cəlilabad r-nunun Ağdaş və Ləkın i ə v -lərində iki kənd Lənkəran ovalığındadır Oykonim "badam ağacları olan kənd" mənasındadır

**Badamdağ** *or*, *mür* Daşkəsən r-nu ərazisində dağ Oronimin birinci komponenti Azərb -da qədim tikililərin, qalaların inşaatında işlənən xüsusi daş növünün (badamdaş) adı ilə bağlıdır Dağın tərkibi həmin materialdan olduğu üçün belə adlandırılmışdır

**Badamdar** *or*, *sadə* Bakı yaxınlığında dağ *Badamdaş* adlanan xüsusi daş növünün karxanası rolunu oynadığı üçün belə adlandırılmışdır





**Badamdar** *oyk*, *sadə* Bakı şəhəri, Səbayıl r-nunda qəsəbə Bəzi tədqiqatçılara görə, oykonim fars dilində *badam* (yarğan, çapılmış yer) və *dar* (keçid, qapı, ətək, dib) komponentlərindən ibarət olub, "yarğandakı keçid, yarğanın dibi" mənasındadır Oykonimin Badamlar sözünün fonetik dəyişməsi kimi "badam ağacları ilə zəngin yer" mənasını ifadə etdiyini söyləyən tədqiqatçılar da var Əslində qəsəbənin adı yaxınlıqdakı dağın adından yaranmışdır

**Badamlı** *oyk*., *düz* Şahbuz r-nunun Badamlı i ə v -də kənd Dərələyəz silsiləsinin c yamacındadır Oykonim "ərazisində badam ağacı olan kənd" deməkdir Yaşayış məntəqəsi həqiqətən də keçmişdə yabanı badam ağacları ilə zəngin olan Badamlı adlı ərazidə salınmışdır

**Badamlı** *hidr*, *sadə* Şahbuz r-nunun Badamlı kəndindən bir qədər aralı, 1262-1274 m hündürlükdə mineral bulaqlar Çoxdibetli 5, azdibetli 20 bulaqdan ibarətdir Bulaqlar XIX əsrin sonlarında yer qatının çatlaması nəticəsində üzə çıxmışdır Suyu həzmi asanlaşdırır, iştahı artırır Qiymətli süfrə suyu kimi sənaye miqyasında istehsal edilir Adını ərazideki kəndin adından almışdır

**Badamlısu** *oyk*., *sadə* Şahbuz r-nunun Badamlı i.ə v -də qəsəbə Dərələyəz silsiləsinin c yamacındadır Yaşayış məntəqəsi 1964-cü ildə Badamlı mineral suları zavodu əsasında salınmışdır

**Badara** *oyk*., *düz* Xocalı r-nunun Daşbulaq i ə.v -də kənd Qarabağ silsiləsinin ətəyindədir Azərb.-da dağlıq yerlərə xas olan kiçik əkin sahəsinə *badar* deyilir Oykonim "kiçik əkin sahəsi olan yer" deməkdir

**Bağanis Ayrım** *oyk*, *mür* Qazax r-nunun Əskipara i.ə v -də kənd. Coğaz çayının sahilindədir Keçmiş adı Seyid Ayrım olmuşdur Yaşayış məntəqəsini *ayrımların* seyidli qoluna mənsub ailələr keçmişdə mövcud olmuş Bağanis kəndi yaxınlığında saldığı üçün belə adlandırılmışdır Kəndi 1990-cı ilin martında erməni işğalçıları zorbı edərək büsbütün yandırmış, əhali ətraf kəndlərdə məskunlaşmışdı Etnotoponimdir Türk dillərinin əksəriyyətində *bağana* "köhnə, keçmiş", "sadəlövh" mənalarını ifadə edir Qazaxıstandakı Bakanas (İli çayının qolu), Bakanas (Qara İrtışın qolu), Narın-Bakanas, Orta-Bakanas, Şet-Bakanas və s çaylarının adı toponimiyada monq dilindəki *boqon* və *us* sözlərinin birləşməsi kimi "qısa çay" mənasını verir Lakin kəndin daxil olduğu i ə v -in adı da (*Əskipara* – "köhnə kənd") onun "ayrımlar yaşayan köhnə kənd" kimi izah olunmasına imkan verir

**Bağban** *oyk*, *sadə*. 1 Kürdəmir r-nunun Böyük Kəngərli i ə v -də kənd Keçmiş adı Barlıdır XIX əsrin ortalarında elatlar tərəfindən salınmışdır; 2 Ucar r-nunun Boyat i ə v -də kənd Göyçayın sahilində, Şirvan düzündədir Bəzi ədəbiyyatlarda Bağman variantında qeydə alınmışdır *Bağban* "bağ salan", "bağçılıqla məşğul olan" deməkdir

**Bağbanlar** *oyk*, *sadə*. 1 Ağdam r-nunun eyniadlı i ə.v -də kənd Qarqar çayının sağ sahilindən bir qədər aralı, Qarabağ düzündədir; 2 Gəncə şəhəri, Bağbanlar i.ə v -də ştq Gəncə şəhərinin keçmiş məhəllələrindən birinin adıdır; 3 Biləsuvar r-nunun eyniadlı i ə v -də kənd Keçmiş adı Arxangelovka olmuşdur XX əsrin əvvəllərində Rusiyanın Arxangelsk vilayətindən köçüb gələnlər burada məskunlaşmış, köhnə yaşayış yerlərinin adını yeni məskənlərinə vermişdilər 1991-ci ildən kəndin adı Bağbanlar kimi rəsmiləşdirilmişdir Etnotoponimdir 1933-cü ildə Bərdə r-nunun Mehdixanlı i ə v -də də eyniadlı kənd qeydə alınmışdır Bəzi ədəbiyyatlarda və yerli əhalinin dilində Bağmanlar variantı da işlənir

**Bağbanlı** *oyk* *sadə* Quba r-nunun Zərdabi i ə v -də qəsəbə Qusar maili düzənliyindədir Yaşayış məntəqəsi 12 №-li meyvəçilik sovxozunun 2-ci şöbəsində salındığı üçün belə adlandırılmışdır

**Bağçakürd/Baxçakürd** *oyk*., *sadə* Goranboy r-nunun Ağamalıoğlu i ə v -də kənd Gəncə-Qazax düzənliyindədir Yaşayış məntəqəsini r-nun ərazisindəki Balakürd, Səfikürd kəndlərindən fərqləndirmək üçün belə adlandırmışlar 1961-ci ilədək Quba r-nunun Talabı i ə v -də Bağçaqaraxan adlı kənd olmuşdur Krımın Leninskoye, Boqatoye yaşayış məntəqələrinin keçmiş adı Baxçı

Eli olmuşdur 1933-cü ildə Astara r-nunun Unuz i ə v -də Baxçalar adlı kəndin olduğu da məlumdur Oykonimin birinci komponenti etnonim mənşəlidir

**Bağçalı** *oyk*, *düz* Quba r-nunun Rustov i ə v -də kənd Keçmiş adı Bağçalı Qışlaq olmuşdur Kəndin ərazisi Rustov kəndinin keçmiş məhəllələrindən biridir Yerli əhalinin verdiyi məlumata görə, yaşayış məntəqəsinin əsl adı Bağça Əlidir XIX əsrin əvvəllərində İsmayıllı r-nunun Lahıc kəndindən gəlmiş Əli adlı şəxsin ailəsinin orada məskunlaşması əsasında yaranmışdır Lakin aparılan araşdırmalar Bağçalı toponiminin etnotoponim olduğunu söyləyir 1933-cü ildə r-nun Talabı i ə v -də Bağçaqaraxan, 1917-ci ildə Nuxa qəzasının Qaxmux bölgəsində Bağçalı kəndləri qeydə alınmışdır Mənbələrdə bu oykonimin Baxşalı variantı da nəzərə çarpır.

**Bağəli** *oyk*, *sadə* İsmayıllı r-nunun Lahıc qəsəbə i ə v -də kənd Yaşayış məntəqəsi XIX əsrdə Lahıcdan çıxmış ailələrin Bağəli adlı yerdə məskunlaşması nəticəsində yaranmışdır Tat dilində *bağala/bəğələ* böyürtkən, moruq deməkdir Oykonim "böyürtkənli, moruqlu yer" mənasını ifadə edir

**Bağırbəyli** *oyk*, *sadə* Ucar r-nunun Qulabənd i.ə v -də kənd Etnotoponimdir 1917-ci ildə Qubadlı qəzasının Cicimli i ə v -də eyniadlı kənd qeydə alınmışdır XIX əsrə aid məlumata görə, Göyçay qəzasında *bağırbəyli* adlı cəmi 5 ailədən ibarət elat yaşayırdı. Onlar XIX əsrin ortalarında Qulabənd qobusu və Qaraqulu yataq adlı yerdə məskunlaşaraq indiki kəndin əsasını qoymuşdular

**Bağırxan silsiləsi** *or*, *mür* Yuxarı Qarabağda dağ silsiləsi Qarabağ silsiləsinin şm -ş yamaclarındadır Hün 1600 m Meşələrlə örtülüdür Bəzi ədəbiyyatlarda Bağırqan variantında qeydə alınır Yəqin ki, bu ad meşələrdən gələn heyvan nəriltisi ilə əlaqədar yaranmışdır Oronimin Bağırxan antroponimindən yarandığı ehtimalı da istisna olunmur

**Bağırlı** *oyk*, *sadə* 1 Şamaxı r-nunun eyniadlı i ə v -də kənd Ləngəbiz silsiləsinin c ətəyində, Bulanıqsu çayının sahilindədir



Tam adı Lələ Bağırlıdır Kəndin adı keçmişdə qışı Ərəş qəzasında, yayı isə Kəlbəcər yaylaqlarında maldarlıqla məşğul olmuş bir elatın adındandır, 2 Kəlbəcər r-nunun Ağdaban i ə v -də kənd Toponim XIX əsrdə Şamaxı qəzasında yaşamış 47 ailədən ibarət *bağırlı* maldar elatının adı ilə bağlıdır Etnotoponimdir Krım vilayətində Baqerovo adlı şiq , 1933 ildə Sabirabad r-nunun Haşımxanlı i ə v -də Bağırtuğay kəndi qeydə alınmışdır Aşqabad vilayətində Baqır adlı dağ vardır Türk dillərində *bağır/baqır* sözü "dağ yamacı", "dağ döşü", "obyektin qabaq hissəsi" mənalarında da işlənir

**Bağırlıdağ** *oyk*, *mür* Şamaxı r-nunun Bağırlı i ə v -də kənd Mənbələrin məlumatına görə, yaşayış məntəqəsi XIX əsrdə Şamaxı qəzasının dağlıq ərazisində yaşamış *bağırlı* elatının məskunlaşması nəticəsində yaranmışdır Etnotoponimdir "Bağırlı kəndinin dağlıq hissəsi və ya dağlıq ərazidə yerləşən Bağırlı kəndi" deməkdir

**Bağırsaq** *or*, *sadə* Şərur r-nunda dağ Dərələyəz silsiləsinin zirvələrindən biridir Hün 1992 m Ətəyindən başlayaraq zirvəsinə qədər dolanbac şəkildə olmasına, yəni bağırsağa oxşadığına görə bu adı almışdır

**Bağırsaq** *hidr*, *sadə* Kəlbəcər r-nunda, Bağırsaq çayının dərəsində, 2400 m hündürlükdə, İstisu kurortunun yaxasında çıxan mineral bulaqlar Çoxdibetlidir Temperaturu aşağıdır Vannası oynaq, sinir və s xəstəliklərin müalicəsinə müsbət təsir göstərir Adını eyniadlı dərədən almışdır

**Bağırsaq** *oyk*, *sadə* Kəlbəcər r-nunun Yanşaq i ə v -də kənd Kəndin ərazisi əvvəllər yaxınlıqdakı Qamışlı kəndinin binəsi olmuşdur Tədricən həmin kənddəki ağayarlı və qazıxanlı nəsillərinə mənsub ailələr burada məskunlaşdıqdan sonra daimi yaşayış məntəqəsinə çevrilmişdir Adını ərazidəki eyniadlı çay dərəsindən və mineral bulaqlardan almışdır 1917-ci ildə Baqarsıx variantında qeydə alınmışdır

**Bağırsaqçayı** *hidr*, *mür* Kəlbəcər r-nu ərazisində çay Tərtər çayının qoludur Bağırsaqdərəsi adlı dərədən axdığı üçün belə adlandırılmışdır





**Bağırsaqdərə** *or*, *mür* 1 Babək r-nunun Gərməçataq kəndi ərazisində dərə, 2 Culfa r-nunun Yaycı kəndi ərazisində dərə Oronimlər *bağırsaq* və *dərə* sözlərindən düzəlib Dərənin relyef formasının əyri-üyrülüyünə, həmçinin ərazidəki Bağırsaq dağına görə bu adı almışlar

**Bağırsaqdərəsi** *hidr*, *mür* 1 Sədərək r-nunda şm -dan c -a doğru uzanan quru çay dərəsi Yağışlı dövrdə axan su Araza tökülür; 2 Şərur r-nunda çay Arazın sol qoludur 1860 m hündürlükdən başlanır Forma oxşarlığına, eyni zamanda ərazidəki eyniadlı dərənin varlığına görə bu adı almışdır

**Bağlıca** *hidr*, *düz* Gədəbəy r-nunda çay Bacan çayının sol qoludur Hidronim "əsas çaya bağlı kiçik qol" deməkdir

**Bağlıpəyə** *oyk*, *mür* Kəlbəcər r-nunun Ağdaban i ə v -də kənd Tərtər çayının sahilində, Murovdağ silsiləsinin ətəyindədir Kəndin ərazisində qayalıqdakı mağara yaxınlığında keçmişdə kolanılara məxsus mal-qara saxlanılan pəyə yerləşirdi Mağaranın üç tərəfi bağlı olduğu üçün ərazi belə adlanırdı Kəndin adı əvvəllər Məşədiməmmədli olmuşdur Keçmişdə Kolanı tayfasının məşədiməmmədli nəslinə mənsub ailələr burada məskunlaşmışdılar Oykonim *bağlı* və *pəyə* (tövlə) sözlərindən düzəlib, "qapalı, bağlı tövlə; heyvanların bağlandığı yer" deməkdir

**Bağmansu** *hidr*, *mür* Əsli Bağbansudur Daşkəsən r-nu ərazisində çay Etnotoponimdir Hidronim *bağman/bağban* (etn ) və *su* (çay) sözlərindən düzəlib, "bağbanlara məxsus çay" deməkdir

**Bağtala** *oyk*, *mür* Qax r-nunun Qaxıngiloy i ə v -də kənd Bağtala keçmişdə Qaxbaş kəndinə məxsus bağların adı olmuşdur XIX əsrin ortalarında həmin kənddən ayrılmış ailələrin burada məskunlaşması nəticəsində yaranan yaşayış məntəqəsinə elə həmin bağların adı verilmişdir Oykonim "bağ içərisində kənd" deməkdir

**Bağyə** *or*, *sadə* Quba r-nu ərazisində dağ Azərb. dilinin dialektlərində *bağa/bağıa* "şiş, düyün", türk dillərində *bağdan* "dağ döşü", "dağ yamacı" mənalarında işlənir



Oronim "yerin qabarmış, şişmiş səthi", "dağ" mənasını ifadə edir.

**Bahar** *or*, *sadə* Qaradağ r-nu ərazisində palçıq vulkanı Ələt burnundadır. Bəzən Ələt burnu da adlanır Bu palçıq vulkanı son dəfə 20 mart 1967-ci ildə püskürmüşdür Baharın (Novruzun) girdiyi gün püskürdüyünə görə rəmzi olaraq belə adlandırılmışdır

**Bahar** *oyk*, *sadə*. Beyləqan r-nunun Qəhrəmanlı i ə v -də kənd Mil düzündədir 1965-ci ildən pambıqçılıq sovxozu yanında salınmış bu kənd rəmzi olaraq belə adlandırılmışdır

**Baharabad** *oyk*, *mür* Beyləqan r-nunun Örənqala i ə v -də qəsəbə 1965-ci ildə üzümçülük sovxozunun malikanəsi yanında salınmış yaşayış məntəqəsi rəmzi olaraq belə adlandırılmışdır Türkmənistanda Baxarden, Baxardok, Özbəkistanda Baxoristan, Ermənistanda Bahar toponimləri də bu qəbildən olan coğrafi adlardır.

**Baharlı** *oyk*, *sadə* 1 Ağdam r-nunun Xındırıstan və Üçoğlan i ə v -lərində kəndlər Hər iki kənd düzənlikdədir; 2 Zəngilan r-nunun Çöpədərə və Ördəkli i ə v -lərində kəndlər Bəsit çayının sahilində, dağlıq ərazidədir Yaşayış məntəqələrinin adları oğuzların *baharlı* tayfasının adı ilə bağlıdır Etnotoponimdir

**Baxçakürd** b a x Bağçakürd

**Baxışlı** *oyk*, *sadə* Xızı r-nunun Altıağac i ə v -də kənd Ataçayın sahilində, dağ ətəyindədir Müxtəlif illərdə Baxşalı (1933), Baxşılı (1961) variantlarında da qeydə alınmışdır Etnotoponimdir Kəndin əvvəlki adı Baxışlı qazmaları olmuşdur XIX əsrin əvvəllərində Ataçay sahilindəki Zarat kəndinə məxsus qışlaqda həmin kənddən çıxmış ailələrin məskunlaşması nəticəsində yaranmışdır Deyilənlərə görə, kəndin əsasını *baxışlı* nəsli qoymuşdur

**Bakı** *oyk* *sadə* Azərb Respublikasının paytaxtı Xəzər dənizinin sahilindədir Abşeron yarımadasının c hissəsində yerləşən bu şəhər çox qədim tarixə malikdir Qədim mənbələrdə Baku, Bakuh, Bakuyyə, Badkubə variantlarında rast gəlinir

a) Bəzi araşdırıcılar toponimin *bagavan/baguan/bagan* "allahların yeri, müqəddəs

yer" (Bakı ətrafında təbii odun-qazın olması və atəşpərəstlik inancları ilə əlaqədar) sözlərdən törədiyini qeyd edirlər

b) XVIII əsrdə fars *bad* (külək) və *kube* (döymək) birləşməsindən olan Badkubə (külək döyən) variantı xalq etimologiyası əsasında yaranmışdır və elmi cəhətdən əsassızdır

c) *Bag* tayfa adından törəmiş *bagan* variantı ilə bağlamaq meyilləri də mövcuddur

ç) Qədim qürk mənşəli *bakı/baku* sözünün "təpə", "yüksəklik", "yamac" sözündən yaranması fikri daha həqiqətə uyğundur Bu coğrafi ada müxtəlif variantlarda geniş arealda təsadüf olunur Laxubaku, Musilbaku, Urqbaku (Dağıstan), Qumbakı (Bakı yaxınlığında), Bakuriani (Gürcüstan), Maku/Maki (Cənubi Azərb ) və s

**Bakı buxtası/Bakı körfəzi** *hidr*, *mür* Xəzər dənizinin q. sahilində, Abşeron yarımadasının c-undadır Ş-də Sultan Burnu, c-q-də Şıx Burnu, c-ş-də və c-da Qum, Daş Zirə (Vulf), Böyük Zirə (Nargin) adaları ilə əhatə olunmuşdur Körfəz Bakı şəhərinin ətrafında yarımdairə şəklində yerləşir və dünyada ən gözəl körfəzlərdən sayılır *Körfəz* limanda gəmilərin təhlükəsiz yan ala bildiyi yerdir

**Bakıxanov** *oyk*, *sadə* Bakı şəhəri Sabunçu r-nunda ştq Sovet hakimiyyəti illərində burada salınmış qəsəbə Razin (Stepan Razinin adı ilə) adlandırılmışdı XVII əsrdə Rusiyada üsyan edən kəndli hərəkatının başçısı Stepan Razin quldurluq məqsədilə 1667-ci ildə Xəzər dənizi vasitəsilə Abşerona gəlmiş, burada yerləşən dağdakı mağarada düşərgə salmışdı. Sonralar Razin dağı adlandırılan bu dağdakı düşərgədən ətraf kəndlərə basqınlar etmiş, soyğunçuluq və qarətlə məşğul olmuşdur 1992-ci ildən yaşayış məntəqəsinin adı Bakıxanov (Azərb alimi şair və maarifpərvər Abbasqulu ağa Bakıxanov Qüdsinin şərəfinə) adlandırılmışdır

**Baklani** *or*, *sadə* Xəzərdə ada Qarabatdaq adası da adlanır Adadakı qarabatdaq (rusca baklan) quşlarının zənginliyi ilə əlaqədar yaranmışdır

**Baqqal** *or*, *sadə* Şəki r-nu ərazisində dağ. 1917, 1933, 1961-ci illərdə r-nun ərazisində Baqqal adlı kənd qeydə alınmışdır Dağın adı kəndin adından törəmişdir Yaşayış məntəqəsinin əsl adı Baqqallıdır Yerli əhalinin verdiyi məlumata görə, kəndin ilk sakinləri həmin r-nun Cunut kəndindən çıxmış *baqqal* ailələrindən ibarət olmuşdur *Baqqal* peşə adıdır, ərzaq malları satan adamlara deyilir Rusiyanın Çelyabinsk vilayətində Bakal, Başqırdıstanda Bakallı, Krımda Bakal, Bakal Kayat, Bakal-Tatar, Bakkal-Su və s coğrafi adlarının olması onu göstərir ki, bu, etnotoponimdir

**Baqqallı** *oyk*, *sadə* Tovuz r-nunun Kıran i.ə v-də kənd Keçmiş adı Göllüdür Kənd hazırda Aşağı və Yuxarı Baqqallı adlanan iki hissədən ibarətdir Etnotoponimdir

**Bala** *hidr*, *sadə* Cəlilabad r-nunda çay Göytəpə çayının sağ qoludur Uz 10 km Suvarma üçün istifadə edilir "Kiçik çay" mənasındadır

**Bala Badara** *hidr*, *mür* Əsgəran r-nunda çay Badara çayının sol qoludur. Bala Bədərə variantında da qeydə alınmışdır Hidronim *bala* (kiçik, balaca) və *Badara* komponentlərindən düzəlib, "kiçik Badara çayı" deməkdir

**Bala Bəhmənli** *oyk*, *mür* Füzuli r-nunun Əhmədbəyli i.ə.v-də kənd Araz çayının sol sahilində, Mil düzündədir Kənd Bəhmənli adlanan yaşayış məntəqəsinin nisbətən kiçik hissəsini təşkil edir Oykonim "kiçik Bəhmənli" deməkdir Etnotoponimdir

**Bala Cəfərli** *oyk*, *mür* Qazax r-nunun Cəfərli i.ə v-də kənd Ağstafa çayının sahilində, Gəncə-Qazax düzənliyindədir Oykonim "kiçik Cəfərli kəndi" deməkdir Etnotoponimdir

**Bala Göyüşlü** *oyk*, *mür* Bərdə r-nunun Kolayır (keçmiş Boyəhmədli) i.ə.v-də kənd. 1933-cü ildə Bala Göyüş və Bala Göüc variantlarında da qeydə alınmışdır Oykonim "kiçik Göyüşlü kəndi" deməkdir

**Bala Haşımxanlı** *oyk*, *mür* Sabirabad r-nunun Moranlı i ə v-də kənd Muğan düzündədir Etnotoponimdir "Kiçik Haşımxanlı kəndi" deməkdir Yaşayış məntəqəsi XIX əsrin ortalarında Haşımxanlı (indiki Böyük Haşımxanlı) kəndindən çıxmış ailələrin məskunlaşması nəticəsində yaranmışdır





**Bala Hemyə** *oyk*, *mür* Dəvəçi r-nunun Həmyə i ə v-də kənd Ataçayın sahilində, Samur-Dəvəçi ovalığındadır Oykonim "Kiçik Həmyə kəndi" deməkdir *Həmyə/həməyə* tat və talış dillərində "düz yer", "hamar yer" mənasını ifadə edir Keçən əsrdə kəndin adı Balaca Hemyə (1933, 1979) variantında da qeydə alınmışdır

**Bala Kəhrizli** *oyk*, *mür* Ağcabədi r-nunun Kəhrizli i ə v-də kənd Mil düzündədir Yaşayış məntəqəsini XIX əsrdə Kəhrizli (indiki Böyük Kəhrizli) kəndindən çıxmış ailələr salmışlar Oykonim bala (kiçik) və Kəhrizli (kənd adı) komponentlərindən düzəlib, "kiçik Kəhrizli kəndi" deməkdir *Kəhriz* isə yeraltı su yolu, su kəmərinə deyilir

**Bala Kəngərli** *oyk*, *mür* 1 Tərtər r-nunun Dəmirçilər i ə v-də kənd Qarabağ düzündədir XIX əsrdə Kəngərli kəndindən ayrılmış ailələr tərəfindən salınmış, nisbətən kiçik olduğuna görə belə adlandırılmışdır; 2 Kürdəmir r-nunun Cəyli i ə v-də kənd Keçmiş adı Çılpaq Kəngərli (Çılpaq adlanan yerdə salındığı üçün) olmuşdur Etnotoponimdir. "Kəngərli yaşayış məntəqəsinin nisbətən kiçik hissəsi" deməkdir

**Bala Körfəz** *hidr*, *mür* Kiçik Qızılağac körfəzi də adlanır. Xəzər dənizinin c-q sahilindədir. Sarı (Sara) yarımadası vasitəsilə Qızılağac körfəzindən və dənizdən ayrılır Qızılağac körfəzinin bir hissəsidir

**Bala Kür** *hidr*, *mür* Aquşa çayının ikinci adıdır Salyan şəhəri yaxınlığında Kürün sağ tərəfindən ayrılan qoldur "Kiçik Kür" deməkdir Keçmişdə Qızılağac körfəzinin bir hissəsi olmuş Xurşidçalaya tökülürdü Sonralar Kürün səviyyəsi aşağı düşdüyündən Bala Kürə su axmamışdır

**Bala Kürək** *hidr*, *mür* Buzluqçayın ikinci adıdır Kürək çayından ayrıldığı üçün belə adlandırılmışdır. "Kiçik Kürək" və ya "Kürək çayının qolu" deməkdir

**Bala Qacar** *oyk*, *mür* Bərdə r-nunun Şirvanlı i ə v-də kənd Qarabağ düzündədir Etnotoponimdir. "Qacar yaşayış məntəqəsinin nisbətən kiçik hissəsi" deməkdir

**Bala Qoşqar** *or*, *mür* Daşkəsən r-nunun c-q hissəsində, Şahdağ silsiləsində dağ Hün 2607 m "Kiçik Qoşqar" deməkdir *Qoşqar* sözü Azərb-da dağ və çay adlarında özünü göstərir Çin Uyğurustanındakı Qaşqar (dağ adı) toponimi ilə eyni mənşəlidir Oronim "qoşa daş, qoşa dağ" mənasındadır

**Bala Qusar** *oyk*, *mür* Qusar r-nunun eyniadlı i ə v-də kənd Qusar çayının sol sahilində, Qusar maili düzənliyindədir Oykonim "Qusar yaşayış məntəqəsinin nisbətən kiçik hissəsi" deməkdir Kənd XIX əsrdə Qusardan köçmüş ailələrin məskunlaşması nəticəsində yaranmışdır

**Bala Qusarqışlaq** *oyk*, *mür* Xaçmaz r-nunun Qusarçay i.ə v-də kənd Oykonim "Kiçik Qusar kəndinin qışlağı" deməkdir Yaşayış məntəqəsi Bala Qusardan həmin kəndə məxsus qışlağa köçmüş ailələrin məskunlaşması nəticəsində yaranmışdır

**Bala Soltanlı** *oyk*, *mür* Qubadlı r-nunun eyniadlı i ə v-də kənd Həkəri çayının sol sahilində, Qarabağ silsiləsinin ətəyindədir Etnotoponimdir Oykonim "Soltanlı yaşayış məntəqəsinin kiçik hissəsi" deməkdir Yaşayış məntəqəsini XIX əsrin ortalarında indiki Cəbrayıl r-nundakı Soltanlı kəndindən köçmüş ailələr salmışlar

**Bala Söyüdlü** *oyk*, *mür* Oğuz r-nunun Böyük Söyüdlü i ə v-də kənd Oykonim "Söyüdlü yaşayış məntəqəsinin kiçik hissəsi" deməkdir

**Bala Surra** *oyk*, *mür* Neftçala r-nunun Cəngən i ə v-də kənd Kürün sahilində, Şirvan düzündədir Oykonim "kiçik Sura kəndi" deməkdir Yaşayış məntəqəsini XIX əsrin 80-ci illərində Kürün sağ sahilindəki Ərəb Bəbirxanlı kəndindən köçüb gəlmiş ailələr salmışlar

**Bala Şahağac** *oyk*, *mür* Astara r-nunun Kakalos i ə v-də kənd Lənkəran ovalığında, Xəzər dənizi sahilindədir Oykonim "Kiçik Şahağac kəndi" deməkdir *Şahağac* ərazidəki ağac növlərindən birinin adıdır

**Bala Şamlıq** *oyk*, *mür* Tovuz r-nunun Qəribli i ə v-də kənd İki dağ silsiləsinin arasında, dərədə yerləşir Kəndin içərisindən Zəyəm çayı keçir Oykonim "Kiçik Şamlıq kəndi" deməkdir *Şamlıq* komponentini tədqiqatçılar "şam ağacları çox olan yer", "şamlı

tayfasının adı", "gunəşə, işığa tapınanlar" və s kimi açıqlamağa çalışmışlar Lakin Azərb -da coğrafi termin *şam yer* (şamlıq) ifadəsi işlənməkdədir ki, bu da "otlu, xam yer" mənasını bildirir

**Bala Şürük** *oyk*, *mür* Lənkəran r-nunun Gormətük ı ə v -də kənd Bəşəru çayının sahilindədir Oykonim "kiçik Şürük kəndi" deməkdir Türk dillərində *şurük* "cavan şam ağacı", "gavalı ağacı", "kiçik, balaca, cır" mənalarını ifadə edir

**Bala Təklə** *oyk* *mür* Masallı r-nunun Çaxırlı i ə v -də kənd Lənkəran ovalığındadır Keçmiş adı Abdulla Təkləli olmuşdur Abdulla həmin kənddə məskunlaşmış təklə tayfasına mənsub ailələrin başçısının adıdır "Təklə yaşayış məntəqəsinin kiçik hissəsi" deməkdir Etnotoponimdir

**Balaçay/Bala** çayı *hidr* *mür* Cəlilabad r-nu ərazisində çay Göytəpə çayının sağ qoludur Suvarma üçün istifadə edilir "Kiçik çay" və ya "çay qolu" deməkdir

**Balahəsənli** *oyk*, *mür* Qubadlı r-nunun Teymurmüskenli i ə v -də kənd Bərgüşad çayının sahilində, Qarabağ yaylasının ətəyindədir Yerli əhalinin verdiyi məlumata görə, kəndi 1918-ci ildə Ermənistan ərazisindəki Ağvanlı kəndindən didərgin salınmış ailələr bina etmişlər Kənd *balahəsənli* nəslinin adını daşıyır Etnotoponimdir.

**Balaxanı** *oyk*, *mür* Bakı şəhərinin Sabunçu r-nunda ştq Abşeron yarımadasının qədim neft r-nlarındandır Böyükşor gölündən bir qədər aralı yerləşir Bəzi mənbələrdə Balaxana variantında da qeydə alınmışdır XIII əsrə aid mənbələrdə adı çəkilən bu toponimi tədqiqatçıların bir qismi fars dilindəki bala (yüksəklik, üst, yuxarı) və xani (qaynaq, mədən, quyu) komponentlərindən ibarət "təpədə yerləşən mədən" mənalı söz kimi izah edir Lakin ərazinin coğrafi mövqeyi bu mülahizəni doğrultmur Fars bala (uca, yüksək, yuxarıda olan), xanı/xanc (ev, otaq) sözlərindən düzəlib *Balaxana* bir sıra şərq ölkələrində, o cümlədən Azərb.-da yaşayış binalarının üstündə tikilən əlavə eyvanlı otaqdır Bəzən karvansaraların giriş darvazası üzərində də tikilən bu tipli otaqlar qonaq və yay istirahət otağı olduğu üçün daxildən və xaricdən bəzədilirdi. Balaxanalar Naxçıvan, Ordubad, Abşeron, Lənkəran, Cənubi Azərb., Kürdəmir, Sabirabad evləri üçün əsas idi

**Balakeçiçay** *hidr*, *mür* Gədəbəy r-nu ərazisində çay Çay öz başlanğıcını ərazideki Bala Keçidərəsi adlı dərədən götürdüyü üçün həmin dərənin adı ilə adlandırılmışdır Burada Böyük Keçidərəsi adlı dərənin olması ərazidə dağkeçisinin varlığından xəbər verir

**Balakən** *hidr*, *sadə* Balakən r-nu ərazisində çay Qanıx çayının sol qoludur Baş Qafqaz silsiləsinin c yamacından, 2500 m hündürlükdən başlanır Hidronim türk dillərindəki *bel* (təpə, yüksəklik) və *kan/kən* (çay) sözlərindən düzəlib, "yüksəklikdən, təpədən axan çay" deməkdir

**Balakən** *oyk*, *mür* 1 Azərb -nın şm -q -ində inzibati r-n Baş Qafqaz sıra dağlarının s yamacında, Gürcüstanla sərhəddə yerləşir Mərkəzi Balakən şəhəridir; 2 Balakən r-nunda şəhər Eyniadlı r-nun mərkəzi Balakən çayının sağ sahilində, Baş Qafqaz silsiləsinin c ətəyindədir Adını ərazideki eyniadlı çaydan almışdır XIII-XVIII əsrlər gürcü mənbələrində Belakani variantında adı çəkilir

**Balakənd** *oyk*, *mür* Sabirabad r-nunun Qalağayın i ə.v -də kənd. Muğan düzündədir Oykonim *bala* və *kənd* komponentlərindən düzəlib, "kiçik yaşayış məntəqəsi" deməkdir

**Balaoylaq** *or*, *mür* Xocalı r-nu ərazisində, Qarabağ silsiləsində dağ. Oronim *bala* və *oylaq* komponentlərindən düzəlib, "kiçik meydan; kiçik sahə" deməkdir

**Balakürd** *oyk*, *mür* Goranboy r-nunun Qızılhacılı i ə v -də kənd Qarabağ düzündədir Etnotoponimdir "Kiçik Kürd kəndi" deməkdir

**Balbau** *oyk*, *sadə* Astara r-nunun Asxanakəran i ə v -də kənd. Bəşəru çayının sahilində, Peştəsər silsiləsinin ətəyindədir Yerli əhalinin dilində Balbou, Balbo kimi tələffüz edilir və talış dilində "kiçik qardaş" mənasında olması ehtimal edilir 1917-ci ildə Balabur variantında qeydə alınmışdır. Dialektlərimizdə *balbır* suya batmamaq üçün tora bağlanan taxtalara deyilir Güman





etmək olar ki, kəndin adı balıqçılıqla bağlı yaranmışdır

**Balçılı** *oyk*, *düz*. 1 Xanlar r-nunun Salahlı i.ə v.-də kənd Qoşqar çayının (Kürün qolu) sahilində, Qaflanqala silsiləsinin ətəyindədir Köhnə ədəbiyyatlarda Balçalı kimi də işlənmişdir Əsas məşğuliyyəti balçılıq olan sakinlərin peşə adından yaranmışdır; 2 Yevlax r-nunun Varvara i ə v -də kənd. Kür çayının sahilindədir Kənd XIX əsrdə Gəncə (Yelizavetpol) qəzasında maldarlıqla məşğul olmuş *balçılı* nəslinin adı ilə adlandırılmışdır

**Baldırğanlı** *oyk*, *sadə* Laçın r-nunun Mığdərə i ə v -də kənd. Həkəri çayının sahilində, Qarabağ silsiləsinin ətəyindədir Kəndi XX əsrin əvvəllərində haqverdiuşağı nəsli *Baldırğanlı* adlanan sahədə salmışdır Oykonim "baldırğan bitkisinin zəngin olduğu yer" deməkdir 1918-ci ilədək Ermənistanda eyniadlı kənd olmuşdur

**Balıqçı** *oyk*, *sadə* Hacıqabul r-nunda qəsəbə. Hacıqabul gölünün sahilində, Şirvan düzündədir Oykonim sakinlərin əsas məşğuliyyətini özündə əks etdirir Xakas vilayətində Balıksa, Özbəkistanda Balıqçi, Qazaxıstanda Balıkşi qəsəbələri qeydə alınmışdır

**Balıqçılar** *oyk*, *düz* Lənkəran r-nunun eyniadlı i ə v -də qəsəbə Sarı yarımadasındadır 1971-ci ildə balıq zavodu fəhlələri üçün salınmışdır Əsas məşğuliyyəti balıqçılıq olan sakinlərin adından yaranmışdır

**Balıq daşı** *or*, *mür* Xəzərdə ada Oronim *balıq*, *daş* və *ı* (mənsub şək.-si) komponentlərindən düzəlib, "balıqla zəngin olan qayalıq" kimi başa düşülür

**Balılar/Ballar** *oyk*, *sadə* Ağdam r-nunun Üçoğlan i ə v -də kənd. Qarabağ düzündədir Keçmişdə qışı Mil düzünün Çatalan, yayı isə Kəlbəcər r-nunun Alagöllər yaylağında keçirən *balılar* (kəbirlilərin qərvəndli qolunun tirəsi) elatına mənsub ailələr tərəfindən salınmış bu kənd həmin elatın adını daşıyır Etnotoponimdir

**Balik** *oyk*, *sadə*. İsmayıllı r-nunun Quşencə i ə.v -də kənd Baş Qafqaz silsiləsinin ətəyindədir Qədim türk dillərində *balık/balıq* "şəhər", "divarla əhatə olunmuş şəhər" mənasını bildirir

**Ballton** *oyk* *düz* Lənkəran r-nunun Gəgiran i ə v -də kənd Burovar silsiləsinin ətəyindədir. Tədqiqatçıların fikrincə, talış dilindəki *bal* (gilas) və *ton* (tərəf, səmt) sözlərindən ibarət olan bu toponim "gilas ağacları olan yer, gilaslı" mənasındadır 1917-ci ildə Bəleton variantında qeydə alınmışdır Talış dilində *balet* "kiçik qapı, doqqaz" deməkdir, *-on* isə *-an* (yer, məkan) şəkilçisinin yerli dilə məxsus variantıdır Kəndin coğrafi mövqeyi ilə bağlı adlandırılmışdır

**Balkaldağ** *or*, *mür*. Balakən r-nu ərazisində dağ. Oronim *balkal* və *dağ* komponentlərindən düzəlib Balkal komponentinin qədim türk tayfalarından olan *balkarların /bulqarların* adı ilə əlaqədar olduğunu ehtimal etmək olar

**Balkarçay** *hidr*, *mür* Biləsuvar r-nu ərazisində çay Azərb -nın İranla sərhədində axaraq Muğanda Mahmudçalaya tökülür Mənbələrdə Bolqaru/Bulqaru/Balharı/Bolqarçay/Bulqarçay/Balharçay variantlarında qeydə alınmışdır. Qədim türk tayfalarından olan *balkarların/bulqarların* adı ilə bağlı olması ehtimal olunur

**Balqaya** *or*, *mür* Abşeronda dağ Oronim *bal* (üstü yastı) və *qaya* komponentlərindən düzəlib, "üstü yastı qaya" deməkdir

**Ballıca** *hidr*, *düz* Xocalı r-nunda çay Qarqar çayının sol qoludur Suvarma üçün istifadə olunur Başlanğıcını Ballıca adlı yaylaqdan aldığına görə belə adlandırılmışdır Yaylaq isə öz adını burada bitən *ballıca* (öfkeotu) bitkisinin adından almışdır

**Ballıca** *oyk*, *sadə* Xocalı r-nunun eyniadlı i ə v -də kənd Ballıca çayının sol sahilində, Qarabağ silsiləsinin ətəyindədir. Adını ərazideki eyniadlı çaydan almışdır Yaşayış məntəqəsi XIX əsrədək Gəncə qəzasındakı Əhmədbəyli kəndinin əhalisinin yaylağı olmuşdur Sonralar başqa yerlərdən köçürülmüş ermənilər burada məskunlaşmışdılar

**Ballıcalı** *oyk*, *düz* Neftçala r-nunun Boyat i ə v -də kənd. Salyan düzündədir Yaşayış məntəqəsi XIX əsrdə Şorsulu kəndindən çıxmış ailələrin Ballıcalı adlı ərazidə məskunlaşması nəticəsində yaranmışdır Ərazinin adı isə burada ballıca otunun bitməsi ilə bağlıdır

**Ballıqaya** *or*. *mür*. Abşeronda dağ Oronim *ballı* və *qaya* komponentlərindən düzəlib Xızı kəndindən şm.-da yerləşir Hün 986 m Qayadakı kiçik təbii oyuqlarda vəhşi bal arılarının pətək salması ilə əlaqədar dağın belə adlandırılması ehtimal olunur

**Ballıqaya** *oyk*. *sadə* 1. Ağdam r-nunun Şıxavənd i.ə.v.-də kənd Xaçın çayının sahilində, dağətəyi ərazidədir. Bir müddət Kirk Kiçan adlandırılmışdır 1992-ci ildən bu adla rəsmiləşdirilmişdir; 2 Qubadlı r-nunun Hal i.ə.v.-də kənd Dağətəyi ərazidədir Keçmiş adı Mahmuduşağı imiş Vaxtilə sofulu tayfasının qışlaq yeri olmuşdur; 3 Goranboy r-nunun Yuxarı Ağcakənd i.ə.v.-də kənd Quruçayın sahilində, dağ yamacındadır Keçmiş adı Birgöz Ballıqaya olmuşdur 1990-cı ildə ermənilərin hücumları zamanı dağıdılmışdır, 4 Goranboy r-nunun Qızılhacılı i.ə.v.-də kənd Düzənlikdə yerləşir. 1922-ci ildə Birgöz Ballıqayadan köçüb gəlmiş ailələr tərəfindən salınmışdır Oykonimlər Xankəndi r-nu ərazisində, Xaçınçayın sol sahilində yerləşən qədim *Ballıqaya kurqanlarının* adından yaranmışdır

**Baltalı** *oyk*. *düz* Şəki r-nunun Kiş i.ə.v.-də kənd Kiş çayının sağ sahilində, Alazan-Həftəran vadisindədir Yaşayış məntəqəsini XIX əsrdə Gürcüstanın indiki Laqodexi r-nundakı Balta kəndindən köçüb gəlmiş ailələr salmışlar *Baltalı* qədim türk tayfalarından birinin adıdır Qədim zamanlarda türk ellərinə yadellilərin hücumu zamanı hər bir kənd müxtəlif silahlarla silahlanırdı Sonralar kəndlər döyüş zamanı yerinə yetirdikləri funksiyalarına görə adlandırılırdı Məs balta > baltalı/baltaçı, sapan > sapançı/sabançı/sabançe/sabunçu; yay > yaylı/yayçı; qılınc > kılıclı/qılınclı, top > topçu və s Başqırdıstanda Baltaçayevski, Starobaltaçevo, Tatarıstanda Baltask, Odessa vilayətində Balta və s qeydə alınmışdır

**Baltalı düzü** *or*. *mür*. Qax r-nu ərazisində düz Cəlair kəndi yaxınlığındadır Etnooronimdir

**Balvan** *oyk*. *sadə* Sabirabad r-nunun Surra (keçmiş Daballar/Qaralı) i.ə.v.-də kənd Kür çayının sahilindədir Kəndin tam adı əvvəllər Balvan Dabağlar olmuşdur Sonralar toponimin ikinci komponenti (əslində Dabbağlar) düşmüş, 1936-cı ildən isə guya pis səsləndiyi üçün Balvan komponentini Balvar, daha sonralar Balvan şəklində yazmışlar Kənddəki nəsillərdən biri də balvan adlanır Türk dillərində *balban/balvan* – qırğının bir növünün adıdır Bəzi tədqiqatçılar yaşayış məntəqəsinin adını erkən orta əsrlərdə Azərb.-da mövcud olmuş Balavankərəc şəhərinin adı ilə əlaqələndirirlər

**Balyand** *oyk*. *sadə* Cəbrayıl r-nunun eyniadlı (keçmiş Qarakəlli) i.ə.v.-də kənd. Yerli əhalinin dilində *balən* sözünün təhrif olunmuş formasıdır Qozluçayın sağ sahilində, dağ ətəyində yerləşən kəndin adı "hündür yer, təpə" mənasını ifadə edir Xalq etimologiyasına görə, əvvəllər burada balı yandıraraq alınan şəkərdən çay hazırlanarmış Buradan da Balyand adı yaranmışdır Başqa bir məlumata görə, kənd vaxtilə Cənubi Azərb.-nın Balyand kəndindən çıxmış ailələr tərəfindən salınmışdır Cənubi Azərb.-da Baland adlı kənd mövcuddur

**Banazur** *oyk*. *mür* Xocalı r-nunun eyniadlı i.ə.v.-də kənd Qarabağ silsiləsinin c.-ş ətəyindədir Oykonim *bana* (alçaq tirə) və *zur* (üst, təpə) sözlərindən düzəlib, "tirənin üstü" deməkdir Kəndin adı 1992-ci ildən Binədərəsi kimi rəsmiləşdirilmişdir

**Banbaşı** *oyk*. *mür* Masallı r-nunun eyniadlı i.ə.v.-də kənd Vileş çayının sol sahilində, Lənkəran ovalığındadır 1972-ci ildə Böyük Xocavar kəndi Banbaşı ilə birləşdirilmişdir Oykonim *ban* (çardaq), *baş* və *ı* (mənsub şək.-si) komponentlərindən düzəlib, "çardaq üstü" mənasındadır Türk dillərində *baş* sözü "dağ, təpə zirvəsi", "çayların mənbəyi" mənasını daşıyır Kənd yüksəklikdə yerləşdiyi üçün bu adı almışdır Bambaşı variantında da qeydə alınmışdır

**Banke** *oyk*. *sadə* Neftçala r-nunun eyniadlı i.ə.v.-də ştq Kür çayının sol sahilində, Cənub-Şərqi Şirvan düzündədir Balıq sənayesinin inkişafı ilə əlaqədar 1842-ci ildə salınmışdır *Bank/banka* "sahil", "dayaz yer", "kiçik boğaz" mənası bildirən Hind-Avropa mənşəli sözdür Geniş Avrasiya arealında rast gəlinir Banke həmin sözün yerli tələffüzə uyğunlaşdırılmış variantıdır 1933-cü ildə *Banq-madan* variantında qeydə alınmışdır





**Baraxum** *oyk*. *sadə*. Xaçmaz r-nunun Uzunoba i.ə.v.-də kənd Qusar çayı sahilində, düzənlikdədir 1933-cü ildə r-nun ərazisində Baraxlı kəndi də qeydə alınmışdır 1917-ci ildə Kiçik və Böyük Baraxun, Köhnə və Yeni Baraxun adlı dörd kəndin Quba qəzasının Dədəli və Müşkür bölgələrində yerləşməsi haqqında da məlumat var Oykonim *baraxlı/barağlı* etnonimindən yaranmışdır

**Baranbat** *or*. *mür* Goranboy r-nu ərazisində dağ İncəçayın sol sahilində yerləşir Hün 1635 m Yerli əhalinin verdiyi məlumata görə, vaxtilə burada Baranbat adlı yaşayış məntəqəsi olmuşdur Həmin kəndin adını daşıyan qəbiristan indi də mövcuddur Oronim *baran* (baranilər-qaraqoyunlu tayfa ittifaqının adı) və *bat/bet* (türk dillərində "yüksəklik", "dağ yamacı", "dağın güney hissəsi") sözlərindən düzəlib Etnotoponimdir Macarıstanda Baranya, Belorusda Baranoviçi, Baranq, Hindistanda Baranaqar, Türkiyədə Baran və s. qeydə alınmışdır

**Barxudarlı** *oyk*. *düz* Qazax r-nunun Cəfərli i.ə.v.-də kənd Dağətəyi ərazidədir *Barxudar* şəxs adından və *-lı* şək.-dən əmələ gəlmiş toponim hesab olunur Barxudar (Bərxudar) Bəy Ənis XVI əsrin ikinci yarısı, XVII əsrin əvvəllərində yaşamış Azərb.-nın məşhur top tökmə ustası olmuşdur Səfəvilər dövlətində ona "topçubaşı" ləqəbi və vəzifəsi verilmişdir XVII əsrin əvvəllərində Səfəvi-Osmanlı müharibələri dövründə Təbriz, İrəvan, Gəncə və b şəhərlərin mühafizəsində istifadə edilən iri qaladağıdan toplar Bərxudarın başçılığı ilə hazırlanmışdı Oykonim həmin hadisələrin nəticəsi kimi də meydana çıxa bilər Bəzi tədqiqatçıların fikrincə, kəndi *barxudarlı* nəslinə mənsub ailələr saldığına görə belə adlanmışdır

**Barlı** *oyk* *düz* Quba r-nunun Zərdabi i.ə.v.-də qəsəbə Qudyal çayının sahilində, Qusar düzənliyindədir Quba r-nunda meyvəçiliyin inkişafı ilə əlaqədar 1955-ci ildə Qonaqkənd kəndindən köçüb gələn ailələr tərəfindən salınmışdır Oykonim *bar* (meyvə, bəhrə) və *-lı* (şək.) komponentlərindən düzəlib, "meyvəsi olan, meyvəli" deməkdir

**Barlıbağ** *oyk*. *mür* Şəmkir r-nunun Təzəkənd i.ə.v.-də qəsəbə Gəncə-Qazax düzənliyindədir 1965-ci ildən Nizami, 1994-cü ildən isə Barlıbağ (məhsuldar bağ) adlandırılmışdır

**Barmaqbinə** *oyk*. *mür* Kəlbəcər r-nunun Kəlbəcər qəsəbə i.ə.v.-də kənd Dikyurd dağının ətəyindədir Keçmişdə binə yeri olan bu əraziyə XIX əsrdə qonşu Dalqılınlı kəndindən bir qrup ailə köçüb məskunlaşmışdı Oykonim *barmaq* və *binə* komponentlərindən düzəlib Türkdilli arealda *barmaq/barmak/barmax/bormax* "zirvə", "şiş uclu zirvə" mənası daşıyır, *binə* komponenti isə toponimiyada "müvəqqəti yaşayış məskəni", "köç" mənalarında işlənməkdədir Oykonim "zirvədə yaşayış məskəni" mənasını ifadə edir

**Barsum** *oyk*. *düz*. Şəmkir r-nunun Barsum i.ə.v.-də kənd Şamxor çayının sol sahilindən bir qədər aralı, Kiçik Qafqazın şm. ətəyindədir 1933-cü ildə Barsım variantında qeydə alınmışdır Oykonimin etnonimdən düzəldiyini ehtimal etmək olar *Barsillər/barsellar, basillar/barseltlər* adlanan türkdilli tayfanın IV-V əsrlərdə Xəzər dənizinin şm.-q sahillərində yaşaması, etnik və dil cəhətdən bulqar, savir və avarlara yaxın olması, V-VIII əsrlərdə onların bir qisminin Azərb.-na, Kür çayı sahillərinə köçməsi, digər qisminin Dağıstanda və Azərb.-nın şm.-ında əkinçilik və maldarlıqla məşğul olması haqqında elmi ədəbiyyatda kifayət qədər məlumat var *Barsel* "pələng, bəbir eli" deməkdir

**Bartaz** *or* *mür* Zəngilan r-nunun c.-q.-ində Mehri (Mehri Güney) silsiləsində, Ermənistanla sərhəddə dağ Hün 2270 m Toponimiyada *bart/bard* "dağ", *as/az/ats* "su"; "iti uc, iti zirvə" deməkdir Oronim "iti zirvəli dağ" mənasındadır

**Bartaz** *oyk*. *sadə* 1 Zəngilan r-nunun eyniadlı i.ə.v.-də kənd Bartaz çayının sol sahilində, Mehri silsiləsinin ətəyindədir Adını ərazidəki eyniadlı dağdan almışdır Yaşayış məntəqəsi vaxtilə Ordubad və Samux r-nlarından gəlmiş ailələrin Pəri Bartaz adlanan yerdə məskunlaşması nəticəsində yaranmışdır, 2 Zəngilan r-nunun eyniadlı

i.ə.v.-də qəsəbə. Düzənlikdədir. 1952-ci ildə qonşu kəndlərdən gəlmiş ailələr Bartaz d.y. stansiyası ətrafında salmışlar.

**Barum** *oyk., sadə*. Şəmkir r-nunun Barsum i.ə.v.-də kənd. 1917-ci ildə Göyçay qəzasında Barumlar, 1933-cü ildə Kürdəmir r-nunda Barımpərdili yaşayış məntəqələri qeydə alınmışdır. Tuvada Barun-Xemçik, Krımda Barın toponimlərinin olması oykonimin etnotoponim kimi qəbul edilməsinə imkan verir. Mənbələrin məlumatına görə, həm *barımlar* həm də *pərdililər* qaraqoyunluların tərkibində olmuşlar. Türk dillərində *barım* "gəzən, köçəri" deməkdir.

**Barzavu** *or., mür.* Lerik r-nunda dağ. Peştəsər silsiləsindədir. Toponimiyada *barz/bardz* "hündür yer", "yüksəklik, dağ beli", *vu* talış dilində "təpə", "meydan" mənalarını ifadə edir. Oronim "hündür təpə" mənasındadır.

**Barzavu** *oyk., sadə*. Lerik r-nunun Bilabənd i.ə.v.-də kənd. Gəncəvü çayının sol sahilində, Barzavu dağının yamacındadır. Adını ərazidəki eyniadlı dağdan almışdır. 1917-ci ildə Borzava variantında qeydə alınmışdır.

**Barzeku** *or., mür.* Astara r-nunda dağ. Talış dağ silsiləsində, Bəşərü və Siyəkü çaylarının suayrıcında yerləşir. Hün. 559 m. Oronim *barz* (yüksək) və *ku* (dağ) sözlərindən düzəlib, "yüksək dağ" deməkdir.

**Basqal** *oyk., mür.* İsmayıllı r-nunun eyniadlı i.ə.v.-də kənd. Niyaldağ silsiləsinin ətəyindədir. Tədqiqatçılar bu oykonimi "dağ yalı" kimi izah etmişlər və türk dillərindəki *baskı* (mənbə) və *yal* sözlərindən ibarət olduğunu söyləmişlər. Azərb. dilinin dialektlərində *basalax, basmax, basna* kimi sözlər "nəsil, tayfa", "çeşid, növ" mənalarında işlənir. *Qal/kal/xal* komponenti isə *kalın* sözünün kökü kimi dilimizdə qədimdən "sıx", "yığın", "cəmlənmiş", "kütlə" mənalarını ifadə edir. Həqiqətən də basqallılar yaşadıqları ərazidə kompakt halda öz kiçik cəmiyyətlərini yaratmışlar. Krımın Krasnoselskoye yaşayış məntəqəsinin də keçmiş adı Baselak olmuşdur.

**Basqalçay** *hidr., mür.* İsmayıllı r-nunda çay. Girdiman çayının sol qoludur. Basqal və çay sözlərindən düzəlib. Adını ərazidəki eyniadlı (Basqal) yaşayış məntəqəsindən almışdır.

**Basqum** *or., mür.* Quba r-nu ərazisində dağ. Oronim *bas* (qalaq, yığın), *qum* və *-a* (şək.) komponentlərindən düzəlib, "qum qalağı, qum dağı" deməkdir. Burada *qum* sözünün toponimiyada "təpəcik" mənasını ifadə etdiyini də nəzərdən qaçırmaq olmaz.

**Basma** *oyk., sadə*. Sabirabad r-nunun Qasımbəyli i.ə.v.-də kənd. 1933-cü ildə Basmaçı variantında qeydə alınmışdır. Azərb. dilinin Şamaxı dialektində *basmaçı* "kömür yandıran, kömürçü" mənasını ifadə edir. Dialektlərimizdə bu sözün "yolayrıcı", "arpa əkilən yer, sahə" (basmalıx) mənasında işlənməsinə də təsadüf olunur.

**Baş Daşağıl** *oyk., mür.* Oğuz r-nunun eyniadlı i.ə.v.-də kənd. Daşağıl çayının sahilində, Baş Qafqaz silsiləsinin ətəyindədir. Oykonim "Daşağıl yaşayış məntəqəsinin yuxarı hissəsi" deməkdir. Qədimdən Daşağıl adlandırılan ərazidə iki mağara və qayaaltı ağıl (mal-qara və ya qoyun yatağı) var. XIX əsrin ortalarında Aşağı Daşağıl kəndi yarandıqdan sonra nisbətən yuxarıda yerləşən eyniadlı kənd Baş Daşağıl adını almışdır.

**Baş Dizə** *oyk., mür.* Ordubad r-nunun Aza i.ə.v.-də kənd. Zəngəzur silsiləsinin ətəyindədir. Oykonim "Böyük Dizə" deməkdir. *Dizə* komponenti türkdilli xalqların toponimiyasında "kənd", İran dillərində "hasar", "qala divarı", "qala" mənalarını ifadə edir. *Baş* sözü kəndin adına onu eyniadlı yaşayış məntəqələrindən fərqləndirmək üçün əlavə olunmuşdur.

**Baş Ələt** *oyk., mür.* Bakı şəhəri Qaradağ r-nunda d.y. stansiyası, qəsəbə. Düzənlikdədir. Toponimin ikinci komponenti türk-monqol mənşəli oyrat tayfasının ələt qolunun adı ilə bağlıdır. Bu etnonim digər xalqların toponimiyasında da özünü göstərir: Ələtli (Ermənistan, Dağıstan), Ələt (Monqolustan), Alat (Volqaboyunda), Ələt (Özbəkistan) və s. Oykonim "birinci Ələt" deməkdir.

**Baş Əmirxanlı** *oyk., mür.* Dəvəçi r-nunun Əmirxanlı (keçmiş Şıxlı) i.ə.v.-də kənd. Əmirxanlı çayının sahilində, Yan silsiləsinin şm. ətəyindədir. Etnotoponimdir. Oykonim "yuxarı Əmirxanlı kəndi" deməkdir.





**Baş Əmirxanlı** *hidr., sadə*. Dəvəçi r-nunda Baş Əmirxanlı kəndindən bir qədər q.-də min. bulaq. Ərazinin adı ilə adlandırılmışdır.

**Baş Göynük** *oyk., mür.* Şəki r-nunun eyniadlı i.ə.v.-də kənd. Şin çayının (Əyriçayın qolu) sol sahilində, Qoçumınq silsiləsinin şm.-q. ətəyindədir. Toponim çox vaxt Köynük variantında da işlənir. XIX əsrin əvvəllərində Göynük adlı kənddən bir qrup ailə ayrılaraq 10 km aşağıda düzənlik sahədə yeni məntəqə (Aşağı Göynük) yaratdıqdan sonra toponimin əvvəlinə *baş* sözü əlavə edilmişdir. Ehtimal edilir ki, Göynük yaşayış məntəqəsini orta əsrlərdə Kiçik Asiyada adı çəkilən Göynük mahalından və ya eyniadlı qaladan gəlmiş ailələr salmışlar. Oykonim "yuxarıda yerləşən Göynük kəndi" deməkdir. *Göynük/göyrük* Azərb. toponimiyasında "yaşıl sahə, otlu sahə" mənasını ifadə edir. *Köynük* variantı isə "kənd, el, məskun yer" mənasını bildirir.

**Baş Göynük** *hidr., sadə*. Şəki r-nunda çay. Şin çayının sol qoludur. Suvarma üçün istifadə olunur. Adını ərazidəki eyniadlı kənddən almışdır.

**Baş Güneypəyə** *oyk., mür.* Ağdam r-nunun Çıldıran i.ə.v.-də kənd. Qavartu çayının sahilində, dağ ətəyindədir. Oykonim *baş* (yuxarı), *güney* (cənub, gün düşən yer) və *pəyə* (burada yaşayış məntəqəsi) komponentlərindən düzəlib, "yuxarıda yerləşən Güneypəyə kəndi" mənasındadır.

**Baş Kəldək** *oyk., mür.* Şəki r-nunun Baş Küngüt i.ə.v.-də kənd. Küngüt çayının sahilindədir. Keçmiş adı Kəldək olmuşdur. Həmin kəndin bir qrup ailəsi Aşağı Kəldək məntəqəsini bina etdikdən sonra toponimin əvvəlinə *baş* sözü əlavə olunmuşdur. Baş Gəldək variantında da qeydə alınmışdır. Azərb. toponimiyasında *kəldək* "daşlı sahə", *gəldək* "məhsuldar yer", "dincə qoyulmuş torpaq sahəsi" kimi izah olunur. Oykonim "yuxarı Kəldək kəndi" mənasındadır.

**Baş Küngüt** *oyk., mür.* Şəki r-nunun eyniadlı i.ə.v.-də kənd. Küngüt çayının (Əyriçayın qolu) sahilində, Qızılqaya dağının ətəyindədir. Ərazidə orta əsrlərə aid Küngüt qalası var. Toponimin ikinci komponenti XIII əsrdə monqol işğallarında iştirak etmiş türkdilli *kinqit* tayfasının adını əks etdirir. Etnotoponimdir. Oykonim "yuxarı Küngüt kəndi" deməkdir.

**Baş Qafqaz** *or., mür.* Qafqaz bərzəxində ən hündür sıra dağlar. Şm.-q.-dən c.-ş.-ə doğru 1100 km məsafəyə qədər uzanır. Suayrıcı silsiləsi də adlanır. Burada *baş* sözü "böyük" mənasını ifadə edir.

**Baş Qaraçanlı** *oyk., mür.* Kəlbəcər r-nunun Orta Qaraçanlı i.ə.v.-də kənd. Uluxan çayının sahilində, dağətəyi ərazidədir. Etnotoponimdir. *Baş* türkmənşəli topoformant kimi ümumtürk toponimiyasında mürəkkəb toponim yaradıcılığında geniş istifadə olunur. "Əsas", "birinci", "böyük", "üst", "yuxarı" mənalarını bildirir. *Baş* komponenti dağ, qaya zirvələrinin, çay, bulaq mənbələrinin adlandırılmasında istifadə olunur və Sibir, Çin, Orta Asiya, Qafqaz, Balkanlar, Kiçik Asiya, Ukrayna, Volqaboyu, Rusiyanın Mərkəzi Qaratorpaq, Qazaxıstan, Azərbaycan və s. əhatə edən geniş Avrasiya regionunda təsadüf edilir. Konkret olaraq bu oykonim də "yuxarı" mənasına uyğundur.

**Baş Qərvənd** *oyk., mür.* Ağdam r-nunun Qərvənd i.ə.v.-də kənd. Xaçın çayının sağ sahilində, Qarabağ düzündədir. Keçmiş adı Kəkilbəyli Qərvənd olmuşdur. Kəkilbəy qərvəndlərin bu kənddə məskunlaşmış hissəsinin başçısının adıdır. Yaşayış məntəqəsi vaxtilə Qışlaq adlı yerdə salınmışdır. Burada *baş* komponenti "böyük" mənasını ifadə edir. Qərvənd etnotoponimdir. Kəbirli tayfasının bir qolunun adıdır.

**Baş Qışlaq** *oyk., mür.* Goranboy r-nunun Buzluq i.ə.v.-də kənd. Buzluq çayının sol sahilində, Murovdağ silsiləsinin şm.-ş. yamacındadır. Oykonim "yuxarıda, yüksəkdə olan qışlaq" deməkdir. Kəndin əhalisi vaxtilə Gədəbəy r-nunun Çaldaş, Çalburun və Dəyəqarabulaq kəndlərindən köçüb gəlmiş ailələrdən ibarətdir.

**Baş Layski** *oyk., mür.* Şəki r-nunun eyniadlı i.ə.v.-də kənd. Cunut çayının sahilində, Baş Qafqaz silsiləsinin c. ətəyindədir. Oykonim *Baş* və *Layski* (Laskıqaya adından) komponentlərindən düzəlib, "Layski yaşayış məntəqəsinin yuxarı hissəsi" deməkdir.

*Layski* komponenti Laysqi, Laski, Laysıqı variantında da qeyde alınmışdır

**Baş Şabalıd** *oyk., mür* Şeki r-nunun Baş Göynük i e v -de kend Şin çayı sahilinde, dağ yamacındadır Keçmiş adı Şabalıd olmuşdur XIX esrin evvellerinde bu kendden çıxmış aileler terefinden Aşağı Şabalıd yaşayış menteqesi yarandıqdan sonra keçmiş kend indiki adla tanınmışdır Oykonim *baş* (yuxarı) ve *Şabalıd* (kend adı) komponentlerinden düzelib, "yuxarıda yerleşen Şabalıd kendi" demekdir

**Baş Şabalıd** *hidr , sada* Şeki r-nunda çay. Şin çayının sol qoludur Suvarma üçün istifade olunur Adını erazideki eyniadlı kendden almışdır

**Baş Zeyzit** *oyk., mür* Şeki r-nunun Zeyzit i e v -de kend Zeyzit çayının sahilinde Baş Qafqaz silsilesinin c eteyindedir Baş Zezit variantında da qeyde alınmışdır Oykonim "yuxarı Zeyzit kendi" demekdir

**Başarat** *oyk mür* Qubadlı r-nunun eyniadlı (keçmiş Şıxavan) i e v -de kend Kiçik Hekeri çayının sağ sahilinden bir qeder aralı, Qarabağ silsilesinin eteyindedir Oykonim *baş* (yuxarı) ve *arat* (dince qoyulmuş sahe) komponentlerinden düzelib Görünür, r.-nun erazisinde bir vaxtlar Aşağı Arat adlı kend de mövcud olmuşdur Menbelerin melumatına göre, kendin evvelki sakinleri XVIII esrin sonlarında Türkiyeye köçmüşler İndiki ehalisi ise XIX esrde yaxınlıqdakı Hürneyit kendinden köçen ailelerdir R-nun erazisinde eyniadlı dağ da var XVI esre aid bir senedde Başaratbey şexs adı da qeyde alınmışdır

**Başbaşı** *oyk , mür* Naxçıvan r-nunda Naxçıvan şeher i e v -de qesebe Arazboyu düzenlikdedir Oykonim *baş* (yuxarı, yükseklik) ve *başı* (üstü) komponentlerinden düzelib Araz çayının sahilindeki yükseklik oradan Naxçıvan şeherine teref açılmağa başlayır Tirenin en hündür yeri yerli ehali arasında *baş* adlanır Yaşayış menteqesi burada yerleşdiyi üçün Başbaşı (yüksekliyin başı) adlandırılmışdır

**Başdam** *oyk., mür* Deveçi r-nunun Zarat i e v -de kend Samur-Deveçi ovalığındadır Ətraf kendlere nisbeten yuxarıda salındığı üçün bele adlandırılmışdır Oykonim "baş terefde, yuxarıda salınmış yaşayış meskeni" menasına uyğundur

**Başkend** *oyk., mür.* 1 Kelbecer r-nunun Sınıqkilse i e v -de kend Murovdağ silsilesinin eteyindedir Yerli ehalinin verdiyi melumata göre, XIX esrin evvellerinde Laçın r-nunun Alxaslı kendinden gelmiş Hacı Əlemşah adlı bir şexs burada bine salıbmış Sonralar onun töremeleri bine yerinde daimi meskunlaşıblar Kend qonşu kendlere nisbeten yuxarıda yerleşdiyi üçün bele adlandırılmışdır; 2 Xocalı r-nunun Kosalar i e v -de kend Ballıca çayının sahilinde, Mıxtöken dağının eteyindedir, 3 Culfa r-nunda kend Oykonim *baş* ve *kend* komponentlerinden düzelib, "merkez, esas yaşayış menteqesi, yuxarıda, yüksekliklde olan kend" demekdir Ermenistan erazisinde Akunsk ve Vernaşen kendlerinin 1946-cı iledek, Artsvaşen kendinin ise 1978-ci iledek adları Başkend olmuşdur

**Başkend** *hidr , sada* 1 Culfa r-nunun Başkend kendi yaxınlığında min bulaqlar İki soyuq bulaqdan ibaretdir. Dadı şor-turş, terkibi karbonqazlıdır; 2 Culfa r-nunun Başkend kendi erazisinde çay Adını yerleşdiyi kendin adından almışdır

**Başkend aşırımı** *or , mür* Keçeldağ silsilesinde dağ aşırımı Gedebey r-nu ile Ermenistan serhedinde, Başkend kendi yaxınlığındadır Hün 2170 m Oronim *Başkand* (oyk ) ve *aşırımı* (keçidi) komponentlerinden düzelib

**Başkendsu** *hidr , mür* Gedebey r-nu erazisinde çay Başkend aşırımından axır Hidronim *Başkand* (or.) ve *su* (çay) komponentlerinden düzelib, "Başkend aşırımından axan çay" menasındadır

**Başlıbel** *oyk , mür* Kelbecer r-nunun eyniadlı i e v -de kend Başlıbel çayının sahilindedir Oykonim *başlı* (şiş uclu, yüksek zirvesi olan) ve *bel* (tirenin üstü) komponentlerinden düzelib 1917-ci ilde Baştıbel Seyidler variantında qeyde alınmışdır Yerli ehalinin verdiyi melumata göre, yaşayış menteqesini XIX esrde indiki Laçın r-nunun Seyidler kendinden gelmiş aileler saldığına göre evveller Seyidler ve ya Başlıbel Seyidleri adlanmışdır Toponim özünde kendin salındığı coğrafi relyefi eks etdirir

**Başlıbel** *hidr , sada* Kelbecer r-nunda çay Tutquınçayın sol qoludur Adını yerleşdiyi kendin adından almışdır.

**Batabat** *hidr , mür* 1 Şahbuz r-nunda Biçenek aşırımı yaxınlığında, 2100 m hündürlükde keçmiş bataqlıq yerinde süni suretde yaradılmış göl Yay dövründe gölden su Naxçıvan çayına axıdılır ve suvarma üçün istifade edilir; 2 Şahbuz r-nunda Qeleyli yaylağında 1700 m. hündürlükde min bulaq Soyuq ve içmeli sudur Hidronim *bat, -a* ve *bat* komponentlerinden düzelib, *batmaq* felinden emele geldiyi ehtimal olunur Türk dillerinde *bat/bad/bet* toponimik termin kimi "yükseklik, dağ döşü, dağ yamacı", eyni zamanda "çöküntü", "bataqlıq, göl", "girdab, burulğan" menalarını bildirir Hidronim "yükseklikde bataqlıq" ve ya "dağ döşünde su menbeyi" demekdir *Bat* komponentli coğrafi adlara başqa xalqların toponimiyasında da rast gelmek mümkündür Bataqay (Yakutiya), Bataysk (Rostov vilayeti), "Batken" (Qırğızıstan), Batimnisi, Batbakkara (Qazaxıstan), Batumi (Gürcüstan) ve s

**Batançay** *hidr , mür.* Zaqatala r-nu erazisinde çay Hidronim *batan* (yox olan, qerq olan, iten) ve *çay* komponentlerinden düzelib, "yox olan, iten çay" menasındadır

**Bayan** *oyk., sada* 1 Daşkesen r-nunun eyniadlı i e.v.-de kend Qoşqar çayının sol sahilinde, dağ eteyindedir; 2. Oğuz r-nunun Qumlax i.e v -de kend Xalxalçayın (Əlican çayının sağ qolu) sahilinde, Alazan-Heftaran vadisindedir 1917-ci ilde Boyan variantında qeyde alınmışdır Toponimiyada bu söz çox vaxt türk dillerindeki *bayan* (qadın, xanım, varlı, dövletli, zengin) sözü ile açıqlanılır Lakin nezere almaq lazımdır ki, qedim abidelerin dilinde *baya* (müasir Azerb dilinde "bayaq") sözü de işlenmişdir ki, bu da "evvelki, keçmiş, yaxın keçmiş" menasını ifade etmişdir Bundan başqa, hemin sözün *bayın* variantı da işlenmekdedir Qedim lüğetlerde *bayın* "al qırmızı gül növü" kimi izah edilir Tedqiqatçıların ekseriyyeti bu fikirdedir ki, bayan komponentli toponimler qaraqalpaq, uyğur ve qırğız xalqlarının terkibindeki *bayan* adlanan türk qebilesinin adı ile bağlıdır Monqolustanda Bayan-Tümen, Bayan-Uleqey, Bayan-Xara, Bayan-Xonqor, Cenubi Azerb -da Bayan, Bayandaş Buryat toponimiyasında Bayanqol ve s coğrafi adlar qeyde alınmışdır

**Bayandaş** *or , mür* Abşeron yarımadasının q. hissesinde, Müşfiqabad (keçmiş Pırekeşkül) kendinden c.-q -de yerleşen dağ. Hün 590 m Oronim *bayan* (etn ) ve *daş* (dağ, qaya) sözlerinden düzelib, "bayanlara mexsus dağ" demekdir Etnotoponimdir

**Bayandur** *hidr , sada* Laçın r-nunda çay Zabux çayının sağ qoludur Suvarma üçün istifade edilir Hidronim oğuz tayfalarından birinin adını daşıyır Etnotoponimdir Bayandır variantında da işlenir

**Bayandur** *oyk., sada.* Terter r-nunun Sehlaabad i e v -de kend Qarabağ düzündedir Yaşayış menteqesi Laçın r-nunun keçmiş Bayandur kendinden gelmiş ailelerin meskunlaşması neticesinde yaranmışdır Etnotoponimdir 1933-cü ilde Berde r-nunun Xoruzlu ve Güloğlular i e v -lerinde eyniadlı iki kend qeyde alınmışdır Ermenistanda Bayandur, Türkiyede Bayındur yaşayış menteqeleri vardır

**Bayandurlu** *oyk., düz* Terter r-nunun Xoruzlu i e v -de kend Qarabağ düzündedir Oykonim "bayandurlara mexsus yer ve ya Bayandur yaşayış menteqesinden köçüb gelenler" demekdir Etnotoponimdir

**Baydarlı** *oyk , sada* Qax r-nunun Qıpçaq i e v -de kend Düzenlikdedir Menbelerin verdiyi melumatlara göre, monqolların terkibinde *baydarlı*, Krım tatarlarının terkibinde ise *baydar* adlı tayfa olmuşdur Tedqiqatçılar bele hesab edirler ki, bu tayfa türkdilli olub, XIII esrden Azerb -da meskunlaşmışdır Menbelerden birinde Şeki vilayetinde bir sıra kendlerin gelir vergilerinin Baydar beye bağışlanması haqqında, diger menbede ise 1273-cü ilde monqol serkerdesi Əmir Baydar haqqında melumat verilir Bu iki senede esaslananlar toponimin şexs adından törediyini ehtimal edirler Lakin bütün hallarda Baydarlı etnotoponimdir

**Bayıl** *oyk , sada* Bakıda qesebe Türkdilli arealda (Orta Asiya, Qafqaz, Krım, Balkan

yarımadası və s ) geniş yayılmış və "təpə", "dağ döşü" mənalarında işlənən *bair/bayir/bayır* sözünün fonetik (r ~ l) variantıdır Ərazinin təpələrdən ibarət olması ilə əlaqədar bura Bayır/Bayıl adlandırılmışdır Burada XIII əsrdə suya qərq olmuş qəsrin xarabalıqları da Səbayıl ("Səngə-Bayıl" – Bayıl daşları) adlanmışdır Qeyd etmək lazımdır ki, *bayıl* sözü Azərb dilinin bəzi dialektlərində "arxac", "heyvan saxlanan yer" mənasında işlənməkdədir

**Bayıl burnu** *or*, *mür* Abşeron yarımadasının c -q hissəsində, Bakı buxtasındadır Bəzən Səbayıl burnu da adlanır Oronim *Bayıl* (yer adı) və *burun* (çıxıntı) sözlərindən düzəlib (-u mənsub şək -dir)

**Bayoba** *oyk mür* Xaçmaz r-nunun Yergüc i ə v -də kənd Samur-Dəvəçi ovalığındadır Yaşayış məntəqəsini XIX əsrin ortalarında Quba r-nunun Cek kəndindən köçüb gəlmiş ailələr salmışlar Yerli əhalinin verdiyi məlumata görə, obanın əsasını *Bay* adlı bir şəxs qoymuşdur Oykonim *bay* ("bəy" sözünün qədim variantı, müasir özbək, qazax, qırğız və s dillərdə "bay" formasında işlənməkdədir ) və *oba* komponentlərindən ibarət olub, "bəy kəndi, bəy obası" deməkdir

**Bayrambinə** *oyk., mür* Balakən r-nunun Talalar i ə v -də kənd. Oykonim *Bayram* (ş a.) və *binə* (müvəqqəti məskən) sözlərindən düzəlib, "Bayram ailəsinə məxsus məskən" deməkdir Yerli əhalinin məlumatına görə, yaşayış məntəqəsi vaxtilə Tülü kəndindən olan Bayram adlı şəxsin saldığı binə əsasında yarandığı üçün belə adlandırılmışdır

**Bayramdərə** *or sadə* Gədəbəy r-nu ərazisində dağ Dağ ərazidəki eyniadlı dərənin adı ilə adlandırılmışdır Dərə isə vaxtilə Bayram adlı şəxsin yaylaq yeri olmuşdur

**Bayramkoxalı** *oyk*, *düz* Qəbələ r-nunun Zalam i ə v -də kənd Göyçayın sahilində, Baş Qafqaz silsiləsinin ətəyindədir Oykonim *Bayramkoxa* (antrop ) və *-lı* (şək ) komponentlərindən düzəlib, kəndxuda, kəndin rəisi Bayram adlı şəxsin adı ilə bağlıdır *Koxa* "kəndxuda" sözünün fonetik cəhətdən təhrif olunmuş variantıdır Oykonim 1933-cü ildə Bayram Koxa variantında qeydə alınmışdır

**Bayramlı** *oyk*, *sadə*. 1 Bərdə r-nunun Otuzikilər i ə v.-də kənd. Qarabağ düzündədir Keçmişdə Bayramuşağı adlanan bu kənd otuzikilər tayfasının *bayramuşağı* oymağının burada məskunlaşması nəticəsində yaranmışdır, 2 Tovuz r-nunun Əsrik Cırdaxan i ə v -də kənd Əsrik çayının sahilində, dağ ətəyindədir Bəzən Əsrik (sahilində yerləşdiyi çayın adından) Bayramlı da adlanır Kəndin adı muğanlı tayfasının *bayramlı* tirəsinin adı ilə bağlıdır; 3 Şəmkir r-nunun eyniadlı i ə v -də kənd Keçmiş adı Qıraq Bayramlıdır Kəndi XIX əsrdə Tovuz r-nundakı Bayramlı kəndindən köçmüş ailələr Kür çayının qırağında saldığına görə belə adlandırılmışdır Kənd 1929-30-cu illərdə Kürün qırağından indiki əraziyə köçmüşdür Kollektivləşmə ilə əlaqədar 1930-cu ildə Kolxozkənd adlandırılan yaşayış məntəqəsinin əvvəlki adı 1992-ci ildən bərpa edilmişdir Etnotoponimdir 1917, 1933-cü illərdə bu oykonimlər Bayramalılar/Bayraməlilər, Bayramlılar, Bayramlar variantlarında da qeydə alınmışdır Türkmənistanın Marı vilayətində Bayraməli adlı şəhər və r-n vardır

**Bayramlı** *or*, *sadə* Şəmkir r-nunda dağ Ceyrançöl düzündə, Kürün sahilində yerləşir Dağın ətəyi keçmişdə Qazax qəzasında yaşamış *bayramlı* elinin qışlaq yeri olduğundan belə adlandırılmışdır

**Bayramovka** *oyk*, *düz* Saatlı r-nunun eyniadlı i ə v -də kənd Muğan düzündədir Çar hökumətinin, Rusiyanın mərkəzi quberniyalarından köçürdüyü kəndlilər 1910-cu ildə məskunlaşmış və bir müddət o dövrdə Rusiyanın Qafqazdakı canişini qraf İ V Vorontsov-Daşkovun adını daşımışdır 1924-cü ildən bolşevik *Əli Bayramovun* adı ilə adlandırılmışdır Rus mənşəli topoformantın (-ovka) işlədilməsi bəzi bölgələrdə olan slavyan mənşəli yer adlarının (Saratovka, Slavyanovka, İvanovka və s ) modellərinə əsaslanmışdır

**Baysal** *or*, *mür* Şərur r-nu ərazisində dağ Şərqi Arpaçayın sahilində, Axura kəndindən şm -da yerləşir Hün 1910 m Ermənistanla sərhəddir Türk dillərində *bay* "böyük", *sal* "qaya, daş" mənalarında işlənir Oronim "böyük qaya, böyük daş" deməkdir Türkdilli





xalqların toponimiyasında bu komponentli Bayjansay, Bayçunas, Bayaldır (Qazaxıstan), Bayçun (Özbəkistan), Baykal (İrkutsk vilayəti), Baytayqa (Tuva) və s coğrafi adlar qeydə alınmışdır

**Bazar** *oyk*, *sadə* Zaqatala r-nunun Çobankol i ə v -də kənd Yerli əhalinin məlumatına görə, kənd bazar (ticarət yeri) yanında salındığı üçün belə adlandırılmışdır Lakin tədqiqatçıların fikrincə, adı ilk dəfə 1392-ci ildə gürcü mənbələrində çəkilən bu toponim mənşəcə Şimali Qafqaz çöllərində yaşamış qıpçaq tayfalarından *bazarların* (*basarların*) adı ilə əlaqədardır Bazar komponentli toponimlərin XII-XIII əsrlərdə qıpçaqların Azərb -da məskunlaşması ilə əlaqədar yaranması ehtimal edilir Etnotoponimdir Qırğızıstanın Oş vilayətində Bazar-Korqan, Saratov vilayətində Bazar-Karabulak, Tacikistanda Bazardərə, Jitomir vilayətində Bazar, Krımda Karasubazar, Çində İslambazar, Tabakbazar, İranda Pırbazar, Bazarməhəllə, keçmiş Yuqoslaviyada Novi-Pazar, Bolqarıstanda Pazarcık, Pazartepe, Türkiyədə Pazarcık adlı yaşayış məntəqələri qeydə alınmışdır 1917-ci ildə Cavanşir qəzasının Dovşanlı bölgəsində Bazarkənd, 1933-cü ildə Sabirabad r-nunun Yolçubəyli i ə v -də Bazarlı adlanan kəndlərin olduğu haqda məlumat verilir

**Bazarçay** *hidr.*, *mür*. Qubadlı, Zəngilan Kəlbəcər r-larından və Ermənistan ərazisindən axan çay Qarabağ yaylasındakı Zalxa gölündən, 2040 m hündürlükdən başlanır. Həkəri çayı ilə birləşir, Araza tökülür Ermənistan ərazisində Vorotan adlanır Etnotoponim hesab olunur Azərb dilinin dialektlərində *bazara/basara* "əkin cərgələri arasındakı kiçik arx" mənasında işləndiyi faktını da nəzərdən qaçırmaq olmaz

**Bazardüzü** *or*, *mür* Baş Qafqaz silsiləsində, Azərb -la Dağıstan sərhədində dağ Üç zirvədən ibarətdir Ən yüksək zirvəsi 4466 m Türyan və Qusar çayları buradan başlanır Dağ öz adını ətəyində yerləşmiş və keçmişdə maldar ellərin yaylağı olmuş Şahnabad çayı dərəsində yerləşən Bazardüzü adlı düzənin adından almışdır Etnotoponim hesab olunur

**Bazarkənd** *oyk*, *mür* Kəlbəcər r-nunun Dovşanlı i ə v -də kənd Xaçın çayının sahilində, Qarabağ silsiləsinin ətəyindədir XIX əsrdə İrandan köçüb gəlmiş ermənilər burada yerləşdikdən sonra kəndin adı dəyişdirilərək Tısmaqa -hoğ, (ermənicə "meşə yeri") kimi rəsmiləşdirilmişdi 1992-ci ildə kəndin keçmiş adı bərpa edildi Etnotoponimdir

**Bazaryurd** *or mür* Baş Qafqaz silsiləsinin zirvələrindən biri, Qusar və Qəbələ r-ları sərhədində dağ Hün 4126 m Oronim *bazar* və *yurd* komponentlərindən düzəlib, "bazarların yurd yeri" deməkdir Etnotoponimdir

**Bcənəxut** *or*, *mür*. Xocalı r-nu ərazisində dağ Toponim beçenə (peçeneq) və monqol dilindəki xut (yaylaqda düşərgə) sözlərindən düzəlib, "maldar peçeneqlərin yaylaqda düşərgəsi" deməkdir Etnotoponimdir

**Becan** *hidr*, *sadə* Gədəbəy r-nunda çay Zəyəm çayının sol qoludur Müxtəlif ədəbiyyatlarda Bacan, Bacanka (Badjanka) variantlarında da işlənmişdir Azərb dilinin dialektlərində *bejan* (Cəbrayıl) "böyük lək" mənasını ifadə edir Hidronim "böyük budaq", "çayın böyük qolu" deməkdir

**Becərə** *oyk*, *sadə* İmişli r-nunun Becirəvan i ə v -də qəsəbə Becan variantında da işlənir 1933-cü ildə Əli Bayramlı r-nunun Poladtuğay i ə v -də Becarəkənt adlı yaşayış məntəqəsi qeydə alınmışdır Qədim türk dillərində, həmçinin Azərb dilində *beçara/becərə/beçara/becarə* sözü "artan, böyüyən, yetişən, yeniyetmə" mənalarını ifadə etmiş, hətta qədim abidələrin dilində Başara variantında antroponim kimi də işlənmişdir

**Bedağar** *oyk.*, *mür* Balakən r-nunun Qazma i ə v -də kənd Balakən çayının sahilində, Alazan-Həftəran vadisindədir Oykonim *be/bet* (avar "baş", "başlanğıc", "bir qədər yuxarı") və *dağar/dahar* (azərb "daşlı, çınqıllı yer") komponentlərindən düzəlib, "daşlı, çınqıllı yüksəklik" mənasındadır XVIII əsrə aid xəritələrdə Alazan çayının hər iki sahilində Bidiqar adlı yaşayış məntəqəsinin olduğu göstərilir

**Belyanov** *or*, *sadə* Qubadlı r-nu ərazisində dağ Ehtimal etmək olar ki, Qafqazda

və Zaqafqaziyada bir neçə mədən yatağını tapmış rus geoloqu D.S Belyankinin adı ilə bağlı yaranmışdır

**Beretbinə** *oyk., mür.* Balakən r-nunun Katex i ə v-də kənd. Alazan-Əyriçay çökəkliyindədir. Kəndin ərazisi vaxtilə Zaqatala r-nunun Qəbizdərə kəndinə aid binə yeri olmuşdur. Sonralar Qəbizdərədən çıxmış bir qrup ailənin burada məskunlaşması ilə daimi yaşayış məntəqəsinə çevrilmişdir. Daha sonralar kənd iki hissəyə bölünərək eyni adla yarısı Balakən, digər hissəsi isə Zaqatala r-nuna verilmişdir. Avar *peret* "xırda ağaclıq", "kol-kos" mənasını bildirir. Oykonim "ərazisi kol-kosdan ibarət olan binə, kənd" deməkdir

**Beşbarmaq** *or., mür.* Dəvəçi r-nu ərazisində dağ. Xəzər dənizi sahilində, Yan silsiləsinin c.-ş. qurtaracağındadır. Hün. 546 m. Beş çılpaq zirvədən ibarətdir. Burada qədim müdafiə səddinin bir hissəsi, qala və karvansara qalıqları qalmaqdadır. Xalq arasında müqəddəs hesab olunan Xıdırzində (Diri Xızır) piri buradadır. Ərəb mənbələrində Şirvan qayası, bəzən də Musa qayası adı ilə yad olunur. İlk dəfə Barmak adı ilə IX əsrdə müdafiə divarı kimi xatırlanır. XVIII əsrdə Quba xanlığında Barmaq mahalı olmuşdur. Dağ zirvələrinin əl barmaqlarına oxşamasına görə belə adlandırılmışdır. Şimali Qafqazda Beştau (Pyatiqorsk şəhəri yaxınlığında beşzirvəli dağ), Gürcüstanda Beştaşeni, Türkmənistanda Beşbarmaq (beş təpəli kiçik dağ) oronimləri qeydə alınmışdır

**Beşdəli** *oyk., mür.* 1. Sabirabad r-nunun Minbaşılı (Zalqarağac) i ə v-də kənd. Muğan düzündədir. Etnotoponimdir. 2. Zəngilan r-nunun Zəngilan şəhər i ə v-də (keçmiş Keçikli) kənd. Dağətəyi ərazidədir. Tədqiqatçıların fikrincə, şahsevənlərin ataxanlı qolunun *beşdəli* tirəsinin məskunlaşması nəticəsində yaranmış məntəqələrdəndir. Yerli əhalinin verdiyi məlumata görə isə, Ordubad r-nunun Tivi kəndindən gəlmiş beş dəliqanlı (igid) qardaş məskunlaşdığına görə kənd belə adlandırılmışdır. 1933-cü ildə Ağdaş r-nunun Qaradağlı i ə v-də də Beşdəlli adlanan kənd qeydə alınmışdır

**Beşevlər** *oyk., mür.* Şəki r-nunda qəsəbə. Turut düzündədir. 1905-ci ildə Ermənistandan zorla Azərb.-na köçürülən, buradan Qırğızıstanın Oş vilayətinə sürgün edilmiş, 1962-ci ildə isə oradan Şəki r-nuna qayıtmış azərb.-lı ailələr Şəki üzümçülük sovxozunun 2-ci şöbəsi yanında salmışlar. Qəsəbə ilk dəfə burada beş ev tikildiyinə görə belə ad almışdır

**Beşgöl** *hidr., mür.* Dəvəçi r-nu ərazisində göllər. Gilgilçayın sahilindədir. Bir-birinə yaxın beş göldən ibarətdir. Göllər qrupuna ad onların sayına görə verilmişdir

**Beştalı** *oyk., mür.* 1. Neftçala r-nunun Cəngən i ə v-də kənd. Kür çayının sol sahilində, düzənlikdədir. Tam adı Ərəb Beştalıdır. Yaşayış məntəqəsi XIX əsrin birinci yarısında Kürün sağ sahilindəki Beştalı kəndindən köçüb gəlmiş ərəbbaloğlan tayfasının *ərəbbeştalı* qoluna məxsus ailələr tərəfindən salınmışdır. 1933-cü ildə Beştalı Salyan və Beştalı Şirvan variantlarında qeydə alınmışdır. Etnotoponimdir. 2. Salyan r-nunun Kürqaraqaşlı i ə v-də kənd. Kür çayının sağ sahilində, düzənlikdədir. Yerli əhali arasında Yaxa (sahil) Beştəli də adlandırılır. XIX əsrə aid sənədlərdə Ərəb Beştalu və ya Beştalu kimi qeydə alınan bu yaşayış məntəqəsinin Ərəb Baloğlan və Ərəb Qardaşbəyli kəndlərinin camaatı tərəfindən salınması haqqında məlumat verilir. Oykonimin *beş* və *talı* ("tala" sözünün variantı) sözlərindən düzəldiyi və "beş tala" mənasını ifadə etdiyi ehtimal olunur. Türk dillərində *tal* və *tala* sözlərinin "düz", "kəndir", "qat, lay, mərtəbə" mənalarında işlənməsi də məlumdur

**Beşyataq** *or., mür.* Balakən r-nunda dağ. Baş Qafqaz silsiləsinin c. yamacında, Balakən çayının sağ sahilində yerləşir. Hün. 1228 m. Keçmişdə maldar ellərin yaylaq yerlərindən olmuşdur. Oronim *beş* və *yataq* (çay məcrası, qoyun yatağı) komponentlərindən düzəlib. Özbəkistanın Fərqanə vilayətində Beşarıx, Qaşqaradərə vilayətində isə Beşkənd şəhəri, Krımda Beşuy, Beşuy Eli, Beşqaran, Beştamak, Beşqurt və s. yaşayış məntəqələri qeydə alınmışdır. Nəzərə almaq lazımdır ki, türk dillərində *beş* sözünün "ağac budağı", "ağac şaxəsi", *yataq* sözünün isə "ev, tikili, heyvanların saxlandığı yer" mənalarında işlənməsi halı da geniş yayılmışdır







**Beyləqan** *oyk., sadə.* 1. Azərb.-da inzibati r-n. Kür-Araz ovalığında Mil düzünün ş.-q. hissəsində, İranla sərhəddə yerləşir. Mərkəzi Beyləqan şəhəridir. 2. Azərb.-da şəhər, eyniadlı r-nun mərkəzi. Mil düzündədir. Yaşayış məntəqəsi əvvəllər 5 №-li pambıqçılıq sovxozunun fəhlələri üçün salındığına görə Mil qrupunun 5 №-li sovxoz qəsəbəsi, 1939-cu ildən Jdanov adlanırdı. 1989-cu ildə yaşayış məntəqəsinə həmin ərazidə mövcud olan qədim Beyləqan şəhərinin adı verilmişdir. Beyləqan indiki Kəbirli kəndi yaxınlığında Örənqala xarabalığının yerində Azərb.-nın ən qədim şəhərlərindən biri olmuşdur. Toponimik tədqiqatlarda əsasən bu toponimi Altay dillərindəki *pilə* (düzən, açıq yer) sözündən və məkan bildirən *-qan* şəkilçisindən ibarət "düzənlik, çöl" mənasında Mil düzünün qədim adı kimi qəbul edirlər. Mənbələrdə Biləqan variantında da qeydə alınmışdır. 3. Ağcabədi r-nunun Boyat i ə v-də kənd. Qarabağ düzündədir. Yerli əhalinin verdiyi məlumata görə, əhalisi vaxtilə Beyləqan şəhərindən köçüb gəlmişdir. Kəndin adı Biloğan variantında da qeydə alınmışdır

**Beynəlmiləl** *oyk., sadə.* Dəvəçi r-nunun eyniadlı i ə v-də qəsəbə. Vəlvələ çayının sağ sahilindən bir qədər aralı Samur-Dəvəçi ovalığındadır. Ər. *beynəlmiləl* "millətlərarası" deməkdir. Sovet hakimiyyəti illərində yaranmış toponimlərdəndir. 1933-cü ildə Şəmkir r-nunun Dəllərcəyir i ə v-də də eyniadlı kənd qeydə alınmışdır

**Beynəltaxta** *or., mür.* Daşkəsən r-nunda dağ. Şahdağ silsiləsindən ayrılan qoldur. Gəncə çayı ilə Dəstəfur çayı arasında suayrıcıdır. Yay otlaqları kimi istifadə olunur. Oronim *beynəl* (beynəlmiləl sözündən) və *taxta* (yüksəklikdə üstü düzən yer) komponentlərindən düzəlib

**Bezmindağ** *or., mür.* Qubadlı r-nu ərazisində dağ. Həkəri və onun qolu Xoşgədik çayları arasında, Muradxanlı kəndindən ş.-dədir. Bizmindağ variantında da qeydə alınmışdır. Oronim *biz* (qəd. türk. "şiş"), *min* (qəd. türk. "burun") və *dağ* komponentlərindən düzəlib, "Şişburun dağ" deməkdir. Dağda Bizmin adlı qalanın qalıqları mövcuddur. Türkmənistan ərazisində Köpetdağın ətəyində Bezmein adlı şəhərin olduğu da məlumdur

**Bəcirəvan** *oyk., sadə.* 1. Bərdə r-nunun Xəsili i ə.v.-də kənd. Qarabağ düzündədir. 2. Cəlilabad r-nunun Komanlı i ə v-də kənd. Pirsə çayının (Göytəpə çayının qolu) sağ sahilində, Lənkəran ovalığındadır. 3. İmişli r-nunun Bəcirəvan i ə v-də kənd. Araz çayının sol sahilindən 2 km aralı, Mil düzündədir. 1933-cü ildə bu kəndin adı Bəcirəvanlı kimi qeydə alınmışdır. IX-XIV əsrlərə aid mənbələrdə Cənubi Azərb. ərazisində, Muğan düzündə Bacrəvan adlı şəhər haqqında məlumat verilir. Bu şəhər Muğanın mərkəzi şəhəri olmuşdur. Bəcirəvan adı c.-dan şm.-a əhalinin miqrasiyası ilə gətirilmişdir. Mənbələrdə Beşbarmaq dağı ətrafında Bəcirəvan kəndi, Muğanda Bəcirəvan çayı haqqında da məlumat var. Bəcirəvan toponimi haqqında müxtəlif fikirlərin söylənilməsinə baxmayaraq, bu sözün izahı hələ də mübahisəli olaraq qalır. *Bəcir* (əslində bəzir "kətan") və *van* (yer) komponentlərindən ibarət olan bu toponim "kətan yetişdirilən yer", "kətan istehsal olunan yer" deməkdir. Əsasən subtropik və mülayim qurşaqda yetişdirilən bu qiymətli bitki üçün Muğan əlverişli yer olmuşdur

**Bədəlan** *oyk., düz.* Masallı r-nunun eyniadlı i ə v-də kənd. Lənkəran ovalığındadır. *Bədəl* (ş.a.) və İran mənşəli cəm şəkilçisi *-an* formantından törədiyi ehtimal edilir. Bədəllər etnonimini əks etdirməsi də istisna deyil

**Bədəldərə** *oyk., sadə.* Oğuz r-nunda qəsəbə. Yaşayış məntəqəsi keçən əsrin 50-ci illərində Bədəldərəsi adlı yerdə salınmışdır. *Bədəl* (ş.a.) və *dərə* (çökək yer) komponentlərindən ibarət olan bu oronim ərazinin həmin şəxsin adı ilə bağlılığını bildirir

**Bədəli** *hidr., sadə.* Bərdə r-nunda arx, kanal. Əsli Bədəllidir. 1933-cü ildə Bərdə r-nunun Mehdixanlı i ə v-də *Bədəlli* kəndi qeydə alınmışdır. Hidronim öz adını bu kəndin adından almışdır. Etnohidronimdir

**Bədəlli** *oyk., sadə* Qobustan r-nunun eyniadlı i.ə.v.-də kənd. Pirsaat çayının sol sahilindən 6 km aralı, Mərəzə yaylasındadır. Əsl adı Şahbədəllidir. Sovet dövründə toponimin birinci komponenti atılmışdır. Yaşayış məntəqəsi XIX əsrin ortalarında Şirvanın dağlıq zonasında, Qobustanda yaşamış ərəbqədim tayfasının üç qolundan biri olan *şahbədəlli* tirəsinə mənsub ailələr tərəfindən salınmış və onların adı ilə adlandırılmışdır. Etnotoponimdir. 1933-cü ildə Ağdaş r-nunun Havarlı i.ə.v.-də Bədilli kəndi qeydə alınmışdır.

**Bədərə** *or., sadə* Əsgəran r-nunda dağ. Əsli Badaradır. Adını ərazidəki eyniadlı yaşayış məntəqəsindən almışdır.

**Bədərə** *hidr., sadə* Kəlbəcər və Əsgəran r-nlarından axan çay. Əsli Badaradır. Adını ərazidəki eyniadlı dağdan almışdır.

**Bədəşxan** *oyk., sadə* Babək r-nunun Yarımca i.ə.v.-də kənd. Naxçıvan düzündədir. Yerli tələffüz forması Badaşqandır. Tədqiqatçıların mülahizəsinə görə, *badaşqan* "qəlbən bir olanlar, yaxın, qohum" deməkdir. Tacikistanda Bədəxşan vilayəti var.

**Bədəvil** *oyk., mür.* Göyçay r-nunun Alpout i.ə.v.-də kənd. Şirvan düzündədir. Bəydəvil, Bədovil (1917), Bədövül (1961) variantlarında da işlənir. *Bədə* (Azərb. dilində 1. "qaçağan at", 2. "pis iyli su") və *vil* (yer, məkan, inzibati ərazinin bir hissəsi) sözlərindən düzəlib, "pis qoxulu suyu olan yer" mənasındadır. Azərb.-nın Şirvan zonasında yayılmış müalicəvi kükürdlü soyuq su obyektlərindən biri də kəndin ərazisində olduğu üçün belə adlanmışdır.

**Bədirqala** *oyk., sadə* Qusar r-nunun Bala Qusar i.ə.v.-də kənd. Qusar çayından 4 km aralı, Qusar maili düzənliyindədir. Keçmiş adı Bədirbədəlqala olmuşdur. Kəndin ərazisində orta əsrlərə aid qala xarabalığı mövcuddur. Yerli əhalinin verdiyi məlumata görə, kənd həmin qalanın adını daşıyır. Qalanı Bədirbədəl adlı şəxs tikdirmiş və bununla da yaşayış məntəqəsinin əsasını qoymuşdur. 1917, 1933, 1961-ci illərdə r-nun ərazisində Bədirqala kəndi ilə yanaşı Bədişqala kəndi də qeydə alınmışdır.

**Bədirli** *oyk., sadə* Cəlilabad r-nunun Qarazəncir i.ə.v.-də kənd. Dağətəyi düzənlikdədir. Yaşayış məntəqəsinin türkdilli təklə tayfasının *bədirli* nəslinin məskunlaşması nəticəsində meydana gəlməsi güman edilir. Etnotoponimdir. 1933-cü ildə Bərdə r-nunun Qaramanlı i.ə.v.-də, Bakı yaxınlığında Pirəkəşkül adlanan ərazidə də Bədirli kəndləri qeydə alınmışdır.

**Bəhliyan** *oyk., düz.* İsmayıllı r-nunun Keyvəndi i.ə.v.-də kənd. Baş Qafqaz silsiləsinin c. ətəyindədir. Kənd salındığı ərazinin adını daşıyır və oykonim tat dilindəki *bəhli* və *-an* komponentlərindən ibarət "gilaslı yer" mənalı söz kimi izah olunur.

**Bəhmənli** *oyk., sadə* 1. Füzuli r-nunda d.y. stansiyası və qəsəbə; 2. Beyləqan r-nunda kənd; 3. Zaqatala r-nunun Bəhmənli i.ə.v.-də kənd. Dağətəyi ərazidədir. 1992-ci ilədək Verxiyan adlanırdı. Etnotoponimdir. 1933-cü ildə Ağdam r-nunun İsmayılbəyli i.ə.v.-də Bəhmənlər adlı yaşayış məntəqəsi qeydə alınmışdır. *Bəhmənlilər* cavanşir tayfasının bir qoludur.

**Bəhramlıgöl** *hidr., mür.* Xanlar r-nunda göl. Etnotoponimdir. 1933-cü ildə Qarabağın dağlıq hissəsində Muğanlı adlanan yerdə Bəhrəmli kəndi qeydə alınmışdır.

**Bəhramtəpə** *or., mür.* İmişli r-nu ərazisində qədim yaşayış məskəni olan yüksəklik. Oronim *Bəhram* (Bəhrəmli yaşayış məntəqəsinin adından) və *təpə* komponentlərindən düzəlib, "Bəhrəmli kəndi ərazisində təpə" mənasındadır.

**Bəhramtəpə** *oyk., sadə* İmişli r-nunda ştq. Araz çayı sahilində, Mil düzündədir. Keçmiş adı Ağaxanlı, Nərimanabad (1931-ci ildən), Bəhramtəpə, Bir May (1960-cı ildən) olmuşdur. 1992-ci ildən yenidən Bəhramtəpə adlandırılmışdır. Adını ərazidəki yüksəklikdən almışdır.

**Bəhramtəpə** *hidr., sadə* Araz çayı üzərində, Bəhramtəpə kəndi yaxınlığında su qovşağı. Arazdan başlanan kanalları su ilə təmin edir. 1958-ci ildə istifadəyə verilən bu qurğu Muğan və Mil düzlərində suvarmaya xidmət edir. Adını yerləşdiyi qəsəbənin adından almışdır. Əfqanıstan ərazisində Beqram adlı qədim şəhər xarabalığı var.





**Bəhrud** *hidr., mür.* Ordubad r-nunda çay. Zəngəzur silsiləsindən axır. Fars dilində *behrud* "yaxşı çay" deməkdir. Hidronim çayın suyunun içməyə yararlı olduğunu bildirir.

**Bəhrud** *oyk., sadə* Ordubad r-nunun Biləv i.ə.v.-də kənd. Zəngəzur silsiləsinin ətəyindədir. Bəhrud çayının sahilində yerləşdiyi üçün həmin çayın adı ilə adlandırılmışdır.

**Bəxtiyarlı** *oyk., sadə* Qubadlı r-nunun Göyərçik i.ə.v.-də kənd. Bərgüşad çayının sahilində, dağlıq ərazidədir. Etnotoponimdir.

**Bəklə** *oyk., sadə* Hacıqabul r-nunun Nabur i.ə.v.-də kənd. Dağlıq ərazidədir. *Bəlgə* sözünün təhrif olunmuş formasıdır. *Bəlgə* əkin yerlərinin, otlaq, biçənək sahələrinin sərhədini bildirən nişandır. Belə bir nişan kəndin ərazisinə düşdüyü üçün və ya kənd nişanlanmış yerdə salındığı üçün belə adlandırılmışdır.

**Bələnidərə** *hidr., mür.* Quba r-nunda çay. Hidronim *bələn/bəlen* (aşırım) və *dərə* (mənfi relyef forması) sözlərindən düzəlib, "aşırımdan dərəyə tökülən çay" deməkdir.

**Bəlkə** *or., sadə* Ordubad r-nu ərazisində dağ. Yerli əhalinin dilində *Bəklə* kimi tələffüz olunan bu oronim "nişan, nişangah" mənasını bildirir.

**Bəlləbur** *or., mür.* Lənkəran r-nunda, Lənkəran şəhərinin c.-q.-də dağ. Yerli əhalinin dilində Bəlilebur kimi tələffüz olunan dağ adı "palıdlı dağ, üzərində palıd meşəsi olan dağ" kimi açıqlanır.

**Bəlləbur** *oyk., sadə* Lənkəran r-nunda, Lənkəran şəh. i.ə.v.-də kənd. Lənkəran çayının yuxarı axarında Bəlləbur dağının ətəyindədir. Dağın başında orta əsrlərə aid Bəlləbur qalasının xarabalığı qalmaqdadır. Kənd və təqribən 1 ha sahəni əhatə edən qala öz adını eyniadlı dağdan almışdır.

**Bəndələnçay** *hidr., mür.* Masallı r-nu ərazisində çay. Azərb. dilindəki *bəndələn* (sakitləşən, cilovlanan, tabe olan) və *çay* (su hövzəsi) sözlərindən düzəlib, "sakit çay" mənasındadır.

**Bəndovan** *or., mür.* Əli Bayramlı r-nunda, Xəzər dənizinin q. sahilində, Pirsaat burnundan c.-da burun (çıxıntı). Cənub-Şərqi Şirvan düzündədir. Bəndovan palçıq vulkanı buradadır. Xəzər dənizi səviyyəsindən 90 m yüksəkdədir. *Bəndovan* "suyu bəndə salan, suyun qarşısını kəsən" deməkdir. Orta əsrlərdə Azərb.-da suvarma işləri ilə əlaqədar vəzifə *bəndüvan* adlanırdı. Bəndüvançı içmə arxlarını təmir edir, suvarma suyunu kəndlilər arasında bölüşdürür, ondan düzgün istifadə olunmasına nəzarət edir, bəzən əkin sahələrini də qoruyurdu.

**Bəndovan** *oyk., sadə* 1. Bakı şəhəri, Qaradağ r-nunun Ələt qəsəbə i.ə.v.-də ştq. Xəzər dənizinin sahilindədir; 2. Azərb.-da dövlət yasaqlığı. Salyan r-nu ərazisində, c.-ş. Şirvan düzündədir. Sahəsi 30 min ha. 1961-ci ildə təşkil olunmuşdur. Yasaqlıqda ceyran, turac və su, bataqlıq, çöl quşları qorunur; 3. Azərb.-da orta əsrlərə aid yaşayış yeri. Qalıqları Bəndovan burnunda və dənizdə aşkar edilmişdir.

**Bənənyar** *oyk., sadə* Culfa r-nunun Əbrəqunis i.ə.v.-də kənd. Əlincə çayının (Arazın qolu) sağ sahilində, Zəngəzur silsiləsinin yamacındadır. Bəzi ədəbiyyatlarda Bənəniyar, Bənənigar kimi qeydə alınmışdır. Oykonim *bənən* (bələn) və *yar* (yarğan, dərə) komponentlərindən ibarət olub, "dağ boynunda yarğan, dağ aşırımında çuxur yer" mənalarını bildirir. Kəndin coğrafi mövqeyi oykonimin ifadə etdiyi mənaya uyğundur.

**Bənövşə** *hidr., sadə* Xanlar r-nu ərazisində çay. Murovdağ silsiləsinin şm. yamacından axır. Kürək çayını əmələ gətirən qollardan biridir. Uz. 9 km. Çay Bənövşəli adlı yaylaqdan axdığı üçün belə adlandırılmışdır. Fitohidronimdir.

**Bərcan** *oyk., mür.* Yardımlı r-nunun eyniadlı i.ə.v.-də kənd. Viləş çayının sol sahilindən 7 km aralı, Burovar silsiləsinin yamacındadır. Yerli əhalinin məlumatına görə, əsl adı Bəycandır. Guya kollektivləşmə illərində bəylərə münasibətin dəyişməsi ilə əlaqədar "y" səsi "r" səsi ilə əvəz olunmuşdur. Tədqiqatçılar isə oykonimi *bərc* (fars. "hündür tikili") və *-an* (məkan bildirən şək.) komponentlərindən ibarət "hündür tikili olan yer" mənalı söz kimi izah edirlər. Əslində, Bərcan Azərb.-da, Muğan vilayətində mövcud olmuş qədim Bərzənd (z ~ c) şəhərinin adındandır və "torpaq sahəsi" mənasındadır.

**Bərdalçay** *hidr., mür.* Zaqatala r-nu ərazisində çay. Hidronim bərd (Azərb. dilində "bərkimiş, möhkəmlənmiş", "hər hansı hamar sahədə bir qədər qalxmış, yüksəlmiş" mənasında, bərtik sözünün kökü), *al* (almaq felinin kökü) və *çay* (su hövzəsi termini) komponentlərindən ibarət olub, "mənbəyini yüksəkliklərdən alan çay" mənasını bildirir.

**Bərdə** *oyk., sadə.* 1. Azərb.-da inzibati r-n. Kür-Araz ovalığının q.-ində, Qarabağ düzündədir. Səthi düzənlikdir. R-nun ərazisindən Xaçın və Tərtər çaylarının qolları keçir. Mərkəzi Bərdə şəhəridir. 1930-cu ildə təşkil olunmuşdur. Adını eyniadlı qədim yaşayış məntəqəsindən almışdır; 2. Azərb.-da şəhər, eyniadlı r-nun mərkəzidir. Tərtər çayının sahilində, Qarabağ düzünün mərkəzindədir. Azərb.-nın ən qədim şəhərlərindən biridir. V əsrdə Qafqaz Albaniyasının paytaxtı, Xilafət dövründə (VII-IX əsrlər) mühüm ticarət və mədəniyyət mərkəzi olmuşdur. Ticarət yolunun üstündə yerləşdiyinə görə Azərb.-nın şm.-ında şəhərlərarası məsafələr Bərdə şəhərindən hesablanırdı. Mənbələrdə "kürd qapısı" adlanan Bərdə darvazası yaxınlığında yerləşən "Əl-Kurkiy" bazarı haqqında məlumat verilir. Qədimdə Hərum adlanan bu şəhər Sasanilər dövründə canişinlik mərkəzi olmuş və ətrafına divar çəkilmişdi. Bərdə adının yayılma arealı çox genişdir. Türkmənistanda Bardalık obası, Dağlıq Altayda Köhnə Bərdə r-nu, Qərbi Sibirdə Bərdə çayı, Perm vilayətində Bərdə adlı üç çay, Bardım adlı r-n, Çelyabinsk vilayətində Berdyauş yaşayış məntəqəsi, Zaporojye vilayətində Beryansk adlı şəhər və r-n, Novosibirsk vilayətində Berdsk d.y. stansiyası, Ermənistanda Berd qəsəbəsi və s. qeydə alınmışdır. Bərdə oykonimi Azərb. dilinin materialları əsasında "yüksəlmiş, möhkəmlənmiş şəhər, qala" mənasında izah oluna bilər; 2. Azərb.-da r-n. Kür-Araz ovalığının q.-də, Qarabağ düzündədir. R-nun ərazisindən Xaçın və Tərtər çaylarının qolları keçir. Mərkəzi Bərdə şəhəridir.

**Bərdə yasaqlığı** *or., mür.* Azərb.-da dövlət yasaqlığı. Bərdə və Ağdaş r-nları ərazisində, Kür çayının hər iki sahilindədir. Sahəsi 7,5 min ha-dır. 1966-cı ildə təşkil edilmişdir. Çöldonuzu, qırqovul və turac qorunur. Adını eyniadlı r-ndan almışdır. Bərdə (oyk.) və yasaqlıq (qoruq, qorunan ərazı) komponentlərindən ibarətdir (-ı mənsub. şək.-sidir).

**Bərdik** *or., sadə.* Culfa r-nu ərazisində dağ. Qazançı kəndindən c.-da, Əlincə çayının sahilindədir. Hün. 2048 m. Dağda qədim qala xarabalıqları var. Oronim "qurğu, tikili, qala" mənasındadır.

**Bərgüşad** *or., sadə.* Qubadlı və Zəngilan r-nları ərazisində sıra dağlar. Zəngəzur silsiləsindən ayrılan qol olub, Bazar və Oxçu çaylarının suayrıcını təşkil edir. Ən yüksək zirvəsi Aramazd (Ermənistanda. Hün. 3399 m.) adlanır. Azərbaycanda Ağoyuq düzünə qədər uzanan hissəsində ən yüksək zirvəsi Süsən dağıdır (Hün. 1304 m). Coğrafi ad kimi ilk dəfə XV əsrdə Azərb. şairi Bədr Şirvaninin əsərlərində çəkilir. *Bərgü* tayfa adı ilə bağlı olduğu güman edilir.

**Bərgüşad** *hidr., sadə.* Qubadlı r-nunda çay. Bazarçayın mənsəb hissəsindəki adıdır. Adını ərazidəki Bərgüşad çökəyinin adından almışdır.

**Bərgüşad** *oyk., sadə.* Ucar r-nunun eyniadlı i.ə.v.-də kənd. Şirvan düzündədir. 1917-ci ildə Cavanşir qəzasının Şirvanlı i.ə.v.-də, 1933-cü ildə Bərdə r-nunun eyniadlı i.ə.v.-də də Bərgüşat adlı yaşayış məntəqələri qeydə alınmışdır. Tədqiqatçılar bu oykonimi "bərgülərin kəndi" kimi izah edərək, etnotoponim hesab edirlər. Ukraynanın Vannitski vilayətində Bərşad adlı şəhər və r-nun olması faktı da məlumdur.

**Bərqov** *oyk., sadə.* Quba r-nunun Vəlvələ i.ə.v.-də kənd. Qusar maili düzənliyindədir. XIX əsrin ortalarına aid sənədlərdə indiki Birinci Nügədi kəndinə məxsus torpaq sahəsi kimi qeyd olunmuşdur. Həmin ərazi XIX əsrin sonlarında Zərqova kəndi əhalisinin istifadəsinə verilmişdir. Kəndin ərazisi Vəlvələçaydan çəkilmiş bəndlərlə suvarılır. Azərb. dilinin dialektlərində *bər* "axar suyun qarşısını kəsmək üçün mance, bənd" mənasında işlənir. Yerli əhalinin dilində Bərğov kimi tələffüz olunan oykonim "suyun bəndə salındığı yer və ya bəndə salınmış çay" mənasına uyğundur.





**Bərkdərə** *or., mür.* Şamaxı r-nu ərazisində, Mərəzə kəndindən c.-da yarğan. Oronim *bərk* (sərt) və *dərə* (mənfi relyef forması) komponentlərindən ibarət olub, "sərt yarğan" deməkdir.

**Bərkdərə** *hidr., sadə.* 1. Kəlbəcər r-nu ərazisində çay, 2. Şamaxı r-nunda çay. Bu çayların hər ikisi axdıqları dərələrin adları ilə adlandırılmışdır. Qazax r-nunun Daşsalahlı və Əli Bayramlı kəndləri arasında Bərkin ağzı dərəsi qeydə alınmışdır.

**Bəsitçay** *hidr., mür.* Zəngilan r-nu ərazisində çay. Araz çayının qoludur. Xalq arasında Balaçay da adlanır. Çayın Baharlı kəndindən axan hissəsi Baharlı, Rəzdərə kəndindən axan hissəsi isə Rəzdərə adlanır. Bu çayın axdığı Bəsitçay dərəsi (bəzi mənbələrdə Basutçay dərəsi) dövlət qoruğudur və burada nadir çinar ağacları qorunur. Tədqiqatçılar bu hidronimi monqol mənşəli *besut* tayfasının adı ilə bağlayırlar. Hidronim *basit* (*bəst* fars. "sığınacaq, toxunulmaz yer", İranda qədim adətə əsaslanan ərazı toxunulmazlığı hüququ; məbədlər, məscidlər, sərdabələr) və *çay* (su hövzəsi) komponentlərindən düzəlib, ərazinin toxunulmaz olduğunu bildirir. Tacikistanda Bəsid, Cənubi Azərb.-da Bəsit adlı kəndlərin olması məlumdur.

**Bəşərü** *hidr., mür.* Astara və Lənkəran r-nları ərazisində çay. Lənkəran çayının sağ qoludur. Uzunluğu 38 km. Talış silsiləsindən (1800 m yüksəklikdən) başlanır. Suvarmada istifadə edilir. Suyunun bir hissəsi kanalla Xanbulançay su anbarına axıdılır. Toponim talış dilindəki *baş* (qol) (-ə bitişdirici sait) və *rü* (çay) sözlərinin birləşməsindən düzəlib, "çay qolu" deməkdir.

**Bəşirabad** *oyk., mür.* Goranboy r-nunun Hazırəhmədli i.ə.v.-də kənd. Gəncə-Qazax düzənliyindədir. Yaşayış məntəqəsini XX əsrin əvvəllərində Cənubi Azərb.-nın Qaradağ mahalından gələrək Qarasuçu, Göynüyən, Hazırəhmədli və b. kəndlərdə rəncbərlik edənlər salmışdılar. 1924-cü ildə kənd partiya və dövlət xadimi Mirbəşir Qasımovun (1879-1949) şərəfinə Bəşirabad adlandırılmışdı. 1930-cu ildə burada Lenin adına kolxoz təşkil edildi və kəndin adı dəyişdirilərək Leninabad adlandırıldı. 1997-ci ildə yaşayış məntəqəsi Bəşirli adı ilə rəsmiləşdirilmişdir. 1933-cü ildə bu kəndlə yanaşı Sabirabad r-nunda da Bəşirabad adlı kənd qeydə alınmışdı.

**Bəşirbəyli** *oyk., sadə.* Salyan r-nunun Qaraçala qəsəbə i.ə.v.-də kənd. Cənub-Şərqi Şirvan düzündədir. Yaşayış məntəqəsi XIX əsrin 70-ci illərində Pirsaat çayı yaxınlığında yaşamış 22 ailədən ibarət *qubalı bəşirbəyli* tirəsinin məskunlaşması nəticəsində yaranmışdır. Bəşirbəy həmin tirənin başçısının adı olmuşdur. Etnotoponimdir.

**Bəybabalar** *oyk., sadə.* Ağdam r-nunun Xındırıstan i.ə.v.-də kənd. Qarabağ düzündədir. Yerli əhalinin verdiyi məlumata görə, yaşayış məntəqəsinin əhalisi Bəybaba adlı bir bəyin rəiyyətlərindən ibarət olduğu üçün belə adlandırılmışdır. Etnotoponimdir.

**Bəydəmirli** *oyk., sadə.* Gədəbəy r-nunun Çay Rəsullu i.ə.v.-də kənd. Dağ yamacındadır. Yerli əhalinin məlumatına görə, kənd vaxtilə Qazax r-nundan gəlmiş Bəydəmir oğlu Alı tərəfindən salınmış, onun adı ilə də adlandırılmışdır. Etnotoponimdir.

**Bəydəvil** b. a. x. Bədəvil.

**Bəydili** *oyk., sadə.* 1. Salyan r-nunun Sarvan i.ə.v.-də kənd. Bala Kür çayının sahilindədir. Tam adı Puta Bəydili ("Puta adlanan ərazidə yaşayan bəydillilər") olmuşdur. Çox vaxt Bəydilli variantında da yazıya alınmışdır; 2. Yevlax r-nunun Aşağı Bucaq i.ə.v.-də kənd. Kürsahili düzənlikdədir. Mənşəcə Səlcuq oğuzlarının *bəydili* tayfasının adını əks etdirir. I Şah Abbas dövründə bəydillilərin bir qismi Kirmana və Şiraza köçürülmüş, hal-hazırda da bu şəhərlərin ətrafında yaşayan, maldarlıq və əkinçiliklə məşğul olan bəydillilər öz adlarını regionun toponimiyasında və Bəqdili familiyasında yaşada bilmişlər. 1933-cü ildə Biləsuvar r-nunun Xırmandalı, Ağdaş r-nunun Havarlı i.ə.v.-lərində də Bəydilli yaşayış məntəqələri qeydə alınmışdır.

**Bəyəhmədyurd** *oyk., mür.* Xızı r-nunun eyniadlı i.ə.v.-də kənd. Xızı yaylasındadır. XIX əsrdə Xızı kəndindən çıxmış ailələrin məskunlaşması nəticəsində yaranmışdır. 1933-də Bəyəhməd Yurdu kimi qeydə alınmışdır. *Bəyəhməd* (ş. a.) və *yurd* komponent-

lərindən düzəlib "Bəyəhmədin yurdu, Bəyəhmədə məxsus yaşayış yeri" mənasındadır.

**Bəyi** *oyk.*, *sadə* Kürdəmir r-nunun Qocalı i.ə.v.-də kənd. Şirvan düzündədir. 1917 və 1933-cü illərdə Bəy variantında qeydə alınmışdır. Tədqiqatçıların fikrincə, "bəyə məxsus, bəy mülkü" mənasındadır. Xakas vilayətində Bey, Daşkənddə Bekabad, Türkmənistanda Bekdaş, Penza vilayətində Bekovo adlı yaşayış məntəqələri var.

**Bəyimdağ** *or.*, *mür.* Dəvəçi r-nu ərazisində, Zarat kəndindən c.-q.-də dağ. Hün. 936 m. *Bəyim* (Xeyran Nisə bəyim – Səfəvi dövlətinin siyasi həyatında mühüm rol oynamış, Səfəvi hökmdarı Məhəmməd Xudabəndənin arvadı, I Şah Abbasın anası olmuşdur. Mənbələrdə Məd-i Ülya kimi adı çəkilən bu qadın 1578/79-cu illərdə Şirvana hücum etmiş Krım xanının vəliəhdi Adil Gireyə və Osmanlı qoşunlarına qarşı vuruşan Səfəvi ordusuna bilavasitə rəhbərlik etmiş və Səfəvilər bu döyüşdə qələbə çalmışdı. Bu hadisədən sonra Şirvanda bir çox yer adları bu qadının adı ilə bağlanmışdı) və *dağ* komponentlərindən ibarətdir. Memorial toponim sayılır.

**Bəyimli** *or.*, *sadə* İsmayıllı r-nu ərazisində dağ. Ağasovqat dağının q. tərəfindədir. Burada Birinci və İkinci Bəyimli adlanan yay otlaqları vardır. Keçmişdə Ağsu r-nundakı Bəyimli kəndinin əhalisi bu dağdan yay otlağı kimi istifadə etdiyindən dağ həmin kəndin adını daşıyır.

**Bəyimli** *oyk.*, *düz.* 1. Ağsu r-nunun Ərəbsarvan i.ə.v.-də kənd. Girdiman çayının sahilində, düzənlikdədir. Kəndin ərazisi keçmişdə Bəyimli icmasının yaylaq yeri olmuşdur. 1917-ci ildə Bəyimxanımlı variantında qeydə alınmışdır; 2. Zərdab r-nunun eyniadlı qəsəbə i.ə.v.-də qəsəbə. Şirvan düzündədir. Yaşayış məntəqəsi keçən əsrin 20-ci illərində Bəyimli adlı ərazidə salınmışdır. Kəndin ərazisi əvvəllər Ağsu r-nunun Bəyimli kəndinə məxsus qışlaq yeri olmuşdur.

**Bəyimsarov** *oyk.*, *mür.* Tərtər r-nunun eyniadlı i.ə.v.-də kənd. İncəçayın sağ sahilində, Qarabağ düzündədir. XVIII əsrə aid sənədlərdə kəndin adı Sarov kimi qeydə alınmışdır. Yerli əhalinin verdiyi məlumata görə, yaşayış məntəqəsini Cənubi Azərb.-nın Sərab əyalətindən gəlmiş ailələr salmışdır. Sonralar bu kənd Qarabağ xanı Mehdiqulu xanın bacısı Azad bəyimə cehiz olaraq verildiyi üçün kəndin adının əvvəlinə *bəyim* sözü əlavə edilmişdir.

**Bəyqışlaq** *oyk.*, *mür.* Xaçmaz r-nunun Hülövlü i.ə.v.-də kənd. Samur-Dəvəçi ovalığındadır. Oykonim *bəy* və *qışlaq* komponentlərindən ibarət olub, "bəyə məxsus qışlaq", "bəyin qışlağı" deməkdir.

**Bəyli** *oyk.*, *düz.* Qəbələ r-nunun Quşlar i.ə.v.-də kənd. Şəki yaylasındadır. Yerli əhalinin dilində Beyli kimi işlənir. Keçmiş adı Yemişanlı olmuşdur. Oykonim "bəyə məxsus kənd" mənasında izah olunur. 1933-cü ildə Kürdəmir r-nunun Axtaçı i.ə.v.-də də Bəyli kəndi qeydə alınmışdır.

**Bəylik** *oyk.*, *düz.* Saatlı r-nunda kənd. Muğan düzündədir. Yerli əhalinin verdiyi məlumata görə, kəndin əhalisi keçmişdə bəy rəiyyəti olduğu üçün kənd belə adlanır. *Bəy* (titul) və *-lik* (mənsubiyyət bildirən şək.) komponentlərindən ibarət olan bu oykonim "bəyə məxsus kənd" mənasındadır. 1933-cü ildə Kəlbəcər r-nunun Əsrik i.ə.v.-də də Bəylik adlı kənd qeydə alınmışdır.

**Bəytəpə** *or.*, *mür.* Füzuli r-nu ərazisində dağ. R-n mərkəzindən şm.-ş.-də yerləşir. Hün. 275 m. Əsli Bəytəpəsidir. "Bəyə məxsus təpə", "hündür təpə" mənalarındadır.

**Bəzirgan** *or.*, *sadə* Qarabağ silsiləsində aşırım. Laçın və Şuşa r-nları sərhədində, Bəzirgansu çayının (Həkəri çayının qolu) mənbə hissəsindədir. Hün. 1633 m. Yamacları meşəlikdir. *Bəzirgan* orta əsrlərdə Şərq ölkələrində ticarətlə məşğul olan adamlara verilən addır. Fars *bazərgan* "tacir, sövdəgər" deməkdir. Çox güman ki, vaxtilə bu aşırım karvan yolunun üstündə olmuş və ticarətə xidmət etdiyindən bu adı almışdır.

**Bəzirgansu** *hidr.*, *mür.* Laçın r-nunda çay. Həkəri çayının sol qoludur. Uzunluğu 9 km. Çay öz mənbəyini Bəzirgan aşırımından aldığı üçün belə adlandırılmışdır.

**Bezirxana** *oyk.*, *mür.* Kəlbəcər r-nunun Zar i.ə.v.-də kənd. Qarabağ yaylasının ətəyindədir. Bəzən səhvən Vəzirxana şəklində də qeydə alınmışdır. Azərb. dilinin qərb





qrupu dialektlərində *bəzir* "kətan yağı, kətan toxumu" mənasında işlənir. Oykonim "kətan yağı və ya toxumu istehsal edilən yer" kimi izah oluna bilər. 1917-ci ildə Cavanşir qəzasında Birinci və İkinci Bəzirxana adlı iki kənd olmuşdur.

**Bıçaqçı** *oyk.*, *sadə* Zərdab r-nunun eyniadlı i.ə.v.-də kənd. Kürün sol sahilində, Şirvan düzündədir. 1917-ci ildə Biçaxçi variantında qeydə alınmışdır. Toponim qaraçıların *bıçaqçı* (pıçaqçı) tirəsinin adını əks etdirir. Hazırda pıçaqçılar Cənubi və Şərqi İranın dağ və yarımsəhra r-nlarında yaşayırlar.

**Bığır** *oyk.*, *sadə* Göyçay r-nunun eyniadlı i.ə.v.-də kənd. Yuxarı Şirvan kanalının sol sahilində, Şirvan düzündədir. 1917 və 1933-cü illərdə Buğur variantında qeydə alınmışdır. Tədqiqatçılara görə, Şamaxı r-nundakı Niyaldağın ətəyində yerləşən Buğurt qalası 1537-ci ildə dağıldıqdan sonra əhali köçüb indiki yerdə məskunlaşmışdır. Azərb. dilində və dialektlərində *bığır* "üçyaşar erkək dəvə", *buğur* "kök, qüvvətli, güclü"; "birlik" mənalarında işlənir.

**Bılıx** *oyk.*, *sadə* Qəbələ r-nunun Məlikli i.ə.v.-də kənd. Qaraçayın (Göyçayın qolu) sahilində, Alazan-Əyriçay çökəkliyindədir. Oykonim təhrif olunmuş toponimlərdən sayılır. Belə güman edilir ki, bu ad qədim türk dillərindəki *balik* (şəhər, divarla əhatə olunmuş qala) sözündəndir. Bu mülahizənin müəllifləri kəndin ərazisindəki qədim tikili xarabalıqlarına əsaslanırlar. Azərb. danışıq dilində *bılıx* "bala, balaca, yeni doğulmuş" mənalarında da işlənir.

**Bızqov** *or.*, *mür.* 1. Şahbuz r-nunun şm.-q.-ində, Ermənistanla sərhəddə dağ. Hün. 2470 m.; 2. Dəvəçi r-nu ərazisində dağ. Oronim "şiş uclu, iti uclu" mənasındadır. 1933-cü ildə Naxçıvanda Bizqov adlı yaşayış məntəqəsi də qeydə alınmışdır.

**Bibiheybət** *oyk.*, *sadə* Bakı şəhəri, Səbayıl r-nunda ştq. Abşeron yarımadasında, Xəzər dənizi sahilindədir. Keçmiş adı Şıx və ya Şıxlardır (buradakı məscidin ətrafında şeyxlər məskən saldığı üçün belə adlandırılmışdır). Sonralar bu ərazidə dəfn olunmuş fəhlə bolşevik Xanlar Səfərəliyevin şərəfinə Xanlar (1939-1991-ci illər) adlandırıldı. 1991-ci ildən buradakı Bibiheybət (Heybətin xanımı) türbəsinin adı ilə adlandırılmışdır. Türbədə şiələrin yeddinci imamı Museyi Kazımın qızı Hökumə və onun Heybət adlı nökəri dəfn olunmuşdur.

**Bibiheni** *oyk.*, *sadə* Lənk r-nunun Çayrud i.ə.v.-də kənd. Peştəsər silsiləsinin yamacındadır. Tədqiqatçılara görə, qismən təhrifə uğramış bu toponimin əsli Bibəhonidir. Toponim talış dilindəki *bib* (heyva) və *honi* (bulaq) sözlərindən ibarət olub, "heyvalı bulaq" mənasındadır. Kənd ərazidəki eyniadlı bulağın adını daşıyır. Bibiyanı (1917), Bibiyoni (1961) variantlarında da qeydə alınmışdır. Hidronimin *bibi* (fars "xanım") və *honi* (talış "bulaq") sözlərindən ibarət olub, "xanım bulağı" mənasında olduğunu da ehtimal etmək olar. Qazax r-nunun Xanlıqlar kəndi ərazisində Xanım bulağı adlı su obyekti məlumdur.

**Bico** *oyk.*, *sadə* Ağsu r-nunun eyniadlı i.ə.v.-də kənd. Ləngəbiz silsiləsinin ətəyindədir. Bicov variantında da işlənir. Kəndin yaxınlığında kükürdlü mineral bulaqlar var. Bu bulaqlara istinad edən tədqiqatçılara görə, kəndin adı tat dilindəki buc (qoxulu) və ov (su) sözlərindən düzəlib, "iyli su" mənasındadır.

**Bico** *or.*, *sadə* Ağsu r-nu ərazisində dağ. Ləngəbiz silsiləsində zirvə. Yerli əhali arasında Sarıqalan (Alan daşı) dağı da adlanır. Dağın adının eyniadlı yaşayış məntəqəsindən alındığı ehtimal olunur. Azərb. dilinin dialektlərində *bico* sözü "gödəkboylu, qısa, alçaq" mənalarında işlənir. Bu da oronimin "alçaq dağ" kimi izah olunmasına əsas verir. Yaxınlıqdakı kənd də öz adını bu dağdan ala bilər.

**Bicovdərəsi** *hidr.*, *mür.* Şamaxı və Ağsu r-nları ərazisində çay. Dərədə mineral su bulaqları var. Çay axdığı Bicov dərəsinin adını daşıyır. Başqırdıstanda Bijbulak yaşayış məntəqəsi və su obyekti qeydə alınmışdır.

**Biçənək** *oyk.*, *sadə* Şahbuz r-nunun eyniadlı i.ə.v.-də kənd. Naxçıvan çayının (Arazın qolu) sahilində, Zəngəzur silsiləsinin ətəyindədir. Yaşayış məntəqəsini XIX əsrin ikinci yarısında Rusiyadan köçürülmüş ailələr salmış və 1919-cu ilədək Karmalinovka ad-

landırılmışdır Ruslar 1919-cu ildə başqa yerə köçdükdən sonra kənddə erməni-azərbaycanlı milli münaqişəsi nəticəsində keçmiş İrəvan qəzasının Almalı və b kəndlərindən qovulmuş azərb -lar məskunlaşmışlar Bəzi tədqiqatçılara görə, kənd həmin vaxtdan ətrafdakı kənd icmalarının *biçənək yeri* olan Biçənək dağının adı ilə adlandırılmışdır Tədqiqatçıların əksəriyyəti isə toponimi *peçeneq* etnonimi ilə bağlayır

**Biçənək** *or sadə* Şahbuz r-nunda, Ermənistanın Sisyan r-nu ilə sərhəddə, Zəngəzur silsiləsində aşırım Hün 2425 m Ətrafı yaylaqdır Ermənistanda Sisyan aşırımı adlanır Qədim və orta əsrlərdə Naxçıvandan Arana gedən yol Biçənək aşırımından keçirdi Etnotoponim hesab edilir

**Biçənəkdərə** *hidr mür* Quba r-nu ərazisində çay Ağçayın sağ qoludur Çay Biçənəkdərə adlanan dərədən axdığı üçün həmin dərənin adı ilə adlandırılmışdır Etnotoponim hesab edilir

**Biçiqarbinə** *oyk. mür* Balakən r-nunun Püştətala i ə v -də kənd Oykonim *biçiqar* (avar "balaca, kiçik") və *binə* komponentlərindən düzəlib, "kiçik binə" mənasındadır

**Bideyiz** *oyk., sadə* Şəki r-nunun Baş Küngüt i.ə v -də kənd. Küngüt çayının (Əyriçayın qolu) sahilində, Alazan-Əyriçay çökəkliyindədir Baş Küngüt kəndindən çıxmış ailələr tərəfindən Bideyiz adlı yerdə salınmışdır Yerli əhalinin dilində *bidey* "xam yer, əkilməmiş yer" mənasındadır, *-ız* formantını isə qədim cəmlik əlaməti kimi qəbul etmək olar 1917-ci ildə Bideis variantında qeydə alınmışdır

**Bigül** *or , sadə* Şəki r-nu ərazisində dağ Yerli əhalinin məlumatına görə, toponim Bırgül adının təhrif olunmuş formasıdır *Bi* komponenti qəd abidələrin dilində "iti uclu, ülgüc" mənasında, *gül* komponenti isə türkdilli xalqların toponimiyasında *qul* variantında "yarğan, qaya" mənasında işlənir Bu baxımdan oronim "iti uclu qaya" kimi izah oluna bilər

**Bilabənd/Bilaband** *oyk , mür* Lerik r-nunun eyniadlı i ə v -də kənd Gəncəvü çayının (Lənkəran çayının qolu) sol sahilindən bir qədər aralı, Peştəsər silsiləsinin ətəyindədir. 1933-cü ildə Bılaband variantında qeydə alınmışdır. Türkdilli xalqların toponimiyasında *bil/bıl/bile/bila* variantlarında rast gəlinən birinci komponent "çıxıntı", "sıldırım", "uçurum", "yarğan" mənası daşıyır Bu söz bir çox Qafqaz dillərində də işlənir. *Bənd* komponenti isə müxtəlif fonetik variantlarda (*band/bend/bent*) Qafqaz, Orta Asiya, Balkanlar və Yaxın Şərq regionlarında geniş yayılmışdır "Sədd", "istehkam", "dağ" (talış ), "zirvə", "liman", "tərsanə" (fars ), "təpə" və s mənaları bildirir

**Bilavar/Bilavər** *oyk., mür* Lerik r-nunun Osyedərə i ə v -də kənd Peştəsər silsiləsinin ətəyindədir Oykonim talış dilindəki *bil* (bataqlıq, gölməçə) və *var* (yer) sözlərindən düzəlib, "bataqlıq yer" mənasındadır

**Bildağ** *hidr , mür* Dəvəçi r-nu ərazisində, Taxtakörpü çayının aşağı axını hövzəsində göl. Bu hidronim *bil* (türk dillərində "az maili çökəklik") *-dağ* (*dax/lax/laq*) komponentlərindən ibarət olub, "çuxur, çökəklik, gölməçə" mənasındadır Tat dilinin materialları əsasında da eyni mənanı ifadə edir (*bil* "gölməçə, bataqlıq").

**Bildirçinli** *oyk , sadə* Tərtər r-nunun Sarov i ə.v -də kənd İnceçayın sahilində, Qarabağ düzündədir Yerli əhalinin verdiyi məlumata görə, kənd Bildırçınlı adlanan ərazidə salınmışdır Ərazidə çoxlu *bildirçin* quşu olduğuna görə belə adlandırılmışdır Tədqiqatçılar isə Bildirçinli toponiminin etnotoponim olduğunu ehtimal edirlər

**Biləcəri** *oyk., sadə* Bakı şəhəri, Binəqədi r-nunda qəsəbə Abşeron yarımadasındadır 1936-cı ildə yaranmışdır Tarixi mənbələrin məlumatına əsaslanan tədqiqatçılara görə, yaşayış məntəqəsinin adı etnotoponim olub, türkdilli xəzərlərin *bələncər* tayfasının adını əks etdirir Bələncərlərin Azərb -na mıqrasiyası Sasani şahı Xosrov Ənuşirəvanın (531-579) Azərb -na köçürdüyü xəzərlərlə və VIII əsrin əvvəllərində ərəb əmiri Cərrah ibn Abdullahın Xəzər ölkəsinə hücum edərək onun üç paytaxt şəhərindən biri olan Bələncər şəhərindən Arana xeyli əhali köçürməsi ilə əlaqələndirilir Yaşayış məntəqəsinin coğrafi mövqeyinə əsaslanan digər tədqiqatçılar isə bu toponimi qədim türk





dillərindəki *belen* (aşırım, alçaq dağ) və *car/cari* (sıldırım, yarğan) komponentlərinin birləşməsi kimi "aşırımlı yarğan" mənasında izah edirlər Zəngilan r-nu ərazisində Biləcər (Biləncər) adlı yaylaq da vardır

**Biləğan** *oyk., sadə* Ağcabədi r-nunun Boyat i ə v -də kənd 1917-ci ildə Biləqan, 1933-cü ildə isə Biləxan variantında qeydə alınmışdır Oykonim Beyləqan toponiminin variantı olub, "düzənlik, çöl" deməkdir

**Biləsər** *oyk , mür*. Lənkəran r-nunun eyniadlı i ə v -də kənd Peştəsər silsiləsinin yamacındadır Talış dilində Biləsə şəklində tələffüz olunur Toponim talış dilindəki *bil* (bataqlıq, göl) və *sər* (baş) sözlərinin birləşməsindən (-ə bitişdirici saitdir) ibarət olub, "gölün baş tərəfində və ya kənarında olan kənd" kimi izah olunur

**Biləsər** *hidr , sadə* 1 Lənkəran r-nunun Biləsər kəndi yaxınlığında mineral bulaq Suyu soyuq, kükürdlüdür; 2 Lənkəran r-nu ərazisində çay Bəşəru çayının qoludur Biləsər kəndinin adındandır

**Biləsuvar** *oyk., mür* 1. Azərb -da inzibati r-n Muğan düzünün c hissəsində İran sərhədi boyunda yerləşir Mərkəzi Biləsuvar şəhəridir; 2 Azərb -da şəhər, eyniadlı inzibati r-nun mərkəzidir Muğan düzündə yerləşir İlk dəfə XIII əsrə aid mənbələrdə adı çəkilir Mənbələrin verdiyi məlumata görə, Sasani şahı Xosrov Ənuşirəvan (531-579) Kür-Araz ovalığına 10 min *suvar* yerləşdirmişdi Bu məlumat toponimin ikinci komponentinin etnonim olmasını təsdiqləyir *Bilə* komponenti toponimiyada "çöl", "səhra", "düzən" mənalarında da işlənir Bu baxımdan Biləsuvar toponimi etnotoponim olub, "Suvar düzü, suvarların yaşadığı düzənlik yer" deməkdir Yaşayış məntəqəsi 1938-ci ildə rus şairi A S Puşkinin şərəfinə Puşkin adlandırılmışdı 1992-ci ildən ərazinin qədim adı Biləsuvar özünə qaytarılmışdır

**Biləsuvar** *or , sadə* Biləsuvar r-nu ərazisində dağ. Adını yerləşdiyi ərazidən almışdır

**Bilev** *hidr , mür* Ordubad r-nunun Bilev kəndində min bulaq. Suyu soyuq və içməlidir Hidronim yerli əhalinin dilindəki *bil* (ovuc) və *av/əv* (su) sözlərindən düzəlib, "ovucla içilən su, bulaq suyu" mənasındadır

**Bilev** *oyk., sadə* Ordubad r-nunun eyniadlı i ə.v -də kənd Gilan çayının (Arazın qolu) sahilində, Zəngəzur silsiləsinin ətəyindədir Oykonim kəndin ərazisindəki eyniadlı bulağın adındandır Tədqiqatçılar kəndin adının ərazidəki dağlarda olan *bülöv* daşlarından götürüldüyünü ehtimal edirlər Lakin belə olduqda kəndin adı Bilev deyil, Bülövlü olmalı idi Oykonim mənbələrdə də Bilev kimi qeydə alınmışdır

**Bilevtəpə** *or , mür* Babək r-nu ərazisində dağ. Naxçıvan şəhərinin şm.-ındadır Hün 1033 m Oronim *Biləv* (ərazideki eyniadlı bulağın adı) və *təpə* (müsbət relyef forması) komponentlərindən düzəlib, "Bilev təpəsi" deməkdir Tədqiqatçılar vulkanik süxurlu bu dağda keçmişdə guya bülöv daşı əldə edildiyi üçün belə adlandığını ehtimal edirlər 1933-cü ildə r-nun ərazisində Bilevtəpə, Billava adlı yaşayış məntəqələri qeydə alınmışdır

**Bilgəh** *oyk., mür* Bakı şəhəri, Sabunçu r-nunun eyniadlı i ə v -də ştq (1937-ci ildən) Abşeron yarımadasının şm.-ında, Xəzər dənizi sahilindədir XI-XV əsrlərdə Xəzər dənizinin limanlarından olmuşdur Keçmiş Bilgəh kəndi indiki yaşayış məntəqəsinin q.-ində, Amburan burnunda yerləşirdi. Odur ki, bu burun indi də Köhnə Bilgəh adlanır Köhnə kəndin ərazisi bataqlıq, qamışlıq olduğuna görə əhali XIX əsrin əvvəllərində indiki yerə köçüb məskunlaşmış və yeni məntəqəyə də Bilgəh adı vermişdir Bilgəh toponimi tat dilindəki *bil* (bataqlıq, sucaq yer) və *gah* (yer) sözlərindən ibarət olub, "bataqlıq, qamışlıq, gölməçə" deməkdir Bu toponim müxtəlif mənbələrdə Bilgə, Bilgah, Bilgəh, Bildı (bataqlıq kənd) variantlarında qeydə alınmışdır Keçən əsrin 60-cı illərinədək Quba r-nunun Rük i ə v -də də Bilgəh (Bilgah) adlı kənd olmuşdur

**Bili** *oyk , sadə* Astara r-nunun Siyaku i ə v -də kənd Dağətəyi ərazidədir Toponim tat dilindəki *bil* (sucaq, bataqlıq sözündən) və *-i* topoformantının birləşməsindən ibarət "bataqlıq yerdə salınmış kənd" mənalı söz kimi izah olunur Yerli əhalinin dilində

*bili* "ördek" menasında işlenir Bu baxımdan oykonim Zengılan r-nundakı Ördekli oykoniminin sinonimidir.

**Bilici Qorqan** *oyk*, *mür* Deveçi r-nunun Pırebedıl i.e.v -de kend. Dağeteyı erazıdedir 1917-ci ilde Bilice şeklinde qeyde alınmışdır 1933-cü ilde erazıde Bilici qazma adlı kend de olmuşdur Yaşayış menteqesi 1783-cü ilde Qubalı Feteli xanın Qarabağdan getırdiyı *bilici* tayfasının meskunlaşması neticesinde yaranmışdır Kengerlilerın bir qolu olan *bilicilərın* adı ile erazıde dörd yaşayış menteqesi qeyde alınmışdır. Dağ Bilici, Düz Bilici, Bilici Sursur ve Bilici Qorqan Bunlardan birı (Bilici Sursur) hal-hazırda mövcud deyil Kend Qorqan kendinın yaxınlığında yerleşdiyine göre bu adı almışdır Etnotoponimdir Dağıstanda Bilici adlı qesebenin olduğu da melumdur

**Bilici dağı** *or*, *mür* Deveçi r-nu erazisinde dağ Oronim kengerlilerın bilici tayfasının adını eks etdırır

**Bilistan** *oyk*, *mür* İsmayıllı r-nunun Keyvendi i e v -de kend Baş Qafqaz silsilesinin c eteyındedir Toponim tat dilindeki *bil* (sucaq yer, bataqlıq, çökeklık) ve -*stan* (yer, mekan) komponentlerınin bırleşmesi kimı "çökeklik yer" menasında ızah edilir

**Bilne** *oyk*, *düz* Yardımlı r-nunun Vergedüz i e v -de kend Peşteser silsilesinin eteyındedır Lerık r-nunda da Aşağı ve Yuxarı Bilne kendlerı var Toponim talış dilindeki *bıl* (bataqlıq, sucaq yer) sözü ve -*nə* topoformantının birleşmesinden emele gelib, "bataqlıqda yaşayış yerı" menasındadır.

**Bilneçay** *hidr*, *mür* Lerık r-nu erazisınde çay. Lenkeran çayının menbe hissesinin adıdır. Ərazisinden axdığı Bilne kendinin adı ile adlandırılmışdır

**Bine** *oyk*., *sadə* 1 Bakı şeherı, Əzızbeyov r-nunun eyniadlı i e v -de kend ve qesebe (1936) Abşeron yarımadasındadır Yaşayış menteqesinin erazisi keçmişde Nardaran kendinin ekin sahesi ve heyvan saxladıqları yer olmuşdur Sonralar müxtelif erazilerden köçüb gelmiş ailelerın burada meskunlaşması neticesinde kend yaranmışdır 1917-ci ilde kendin adı Bine-Kürkend şeklinde qeyde alınmışdır *Binə* sözü toponimiyada hem ayrılıqda, hem de topokomponent kimi geniş yayılaraq "kendden kenarda, mövsümi teserrüfat meqsedile salınan müveqqeti yaşayış yerı, yurd", müveqqeti yaşayış yerlerı böyüyüb kende çevrıldikde ıse "daimı yaşayış yerı" menalarında işlenir; 2. Xocavend r-nunun Domı i e v -de kend Dağ eteyındedir. 1992-ci iledek Domı adlandırılmışdır *Domı* sözü de *binə* sözüne yaxın "oturmaq, ayağını qatlayıb aşağı çökmek" menaları ile bağlıdır

**Bine** *or*., *sadə*. Şerur r-nu erazısinde dağ. Ehtimal etmek olar ki, etraf kendlerde yaşayan ehali dağdan yaylaq, bine yerı kimi istifade etdiyinden dağ bu adı almışdır.

**Bine Xocavar** *oyk*, *mür* Masallı r-nunun Banbaşı i e v -de kend Lenkeran ovalığındadır Yaşayış menteqesi keçmişde Xocavar (ındı mövcud deyıl) kendının bıne yerı olmuşdur XIX esrın axırlarında kendin ehalısi bıne yerınde meskunlaşaraq yenı yaşayış menteqesinın esasını qoymuşdur Toponim "Xocavar kendine mexsus bıne" menasındadır

**Binebey** *oyk*., *mür*. Astara r-nunun Siyaku i e v -de kend Peştaser silsilesinin eteyındedir Kendın adının "beye mexsus bıne, yurd, mesken" menasında olduğu ehtımal olunur Bu baxımdan oykonım Beylık (Saatlı) oykoniminin sinonimidır

**Binederesi** *oyk*, *mür* Xocavend r-nunun eynıadlı i e v -de kend Dağeteyi erazıdedır XIX esrde gelme ermeniler burada meskunlaşdıqdan sonra kendin adı tehrıf olunaraq Banazur adlandırılmış, 1992-ci ilden ıse ındıkı adı berpa olunmuşdur Keçen esrın evvellerınde Qubadlı qezasında Binederesi kendi qeyde alınmışdır Oykonim "müveqqeti yaşayış menteqesi olan dere" menasındadır

**Bineler** *oyk*., *sadə* Ağdaş r-nunun Güvekend i e v -de kend. Şırvan düzündedir Menbelerin verdiyı melumata göre, keçmışde yayı Şekı r-nunun Daşağıl ve Geldek kendlerı arasındakı Ağcaqala adlı yerde, qışı ise Kür sahilinde, Abad ve Pireze Qaraoğlan kendlerı arasındakı erazide keçirmiş *binələr* adlı elatın adındandır Sonralar hemin elat Muncuqlu, Qaraağac ve Tava adlı yataqların etrafında meskunlaşıb ındikı kendin esasını qoy-







muşdur Yeni salınmış yaşayış menteqesi de hemin elatın adı ile adlandırılmışdır Etnotoponimdir 1933-cü ilde oykonim Binecer variantında qeyde alınmış, Kürdemır r-nunun Padar i e.v -de ıse Binecık adlı kend olmuşdur

**Bineqedi** *oyk*., *mür* 1 Bakı şeherınde inzibati r-n Abşeron yarımadasının q hissesinde yerleşir Bileceri, Xocasen, Bineqedi, Demegül yaşayış menteqelerı r-nun erazisindedir. Merkezı Bıneqedı qesebesidir Keçen esrde bir müddet Kırov r-nu da adlanmışdır; 2 Bıneqedı r-nunun eyniadlı i e v -de şıq Abşeron yarımadasındadır Bineqedi Abşeronun en qedim yaşayış menteqelerınden, eyni zamanda en qedim neft rayonlarındandır XIX esre aid menbelerde Bineqazı varıantında da qeyde alınmışdır Tedqiqatçıların fikrınce, hemçinin yerli ehalinin melumatına göre, toponım *binə* ve *qadı/qadi* (ereb dilinde "qazı")/*qazı* sözlerının birleşmesinden ibaret olub, "qazının binesi, qazıya mexsus bine" menasındadır Lakin toponimın ikıncı komponenti *qadi* gedik sözünün fonetık varıantı kimı "dağda çökek yer, aşırım, dağlar arasında düzengah", *qazi* ise gez(i) sözünün fonetik varıantı kimi "gediyin en alçaq hissesi" menalarında da qebul edilır

**Bineqedigölü** *hidr*, *mür* Abşeron yarımadasının şm -q hissesınde, Bineqedi kendi ile Masazır kendi arasında yerleşir Axarsız şor göldür Bıneqedişor da adlanır *Binəqədi* ve *göl* komponentlerınden (-ü mensub şek ) ibaret olub, "Bineqedi erazisinde olan göl" demekdir

**Bioyq** *or*, *mür* Şeki r-nu erazisinde dağ Baş Qafqaz silsilesının c yamacındadır Hün 2204 m Oronımin düzgün varıantı Bioyuqdur Tedqiqatçılar türk dillerındekı *bi* (madyan) ve Azerb. dılındekı *oyuq* (mağara, kaha, quyu) komponentlerının birleşmesinden emele gelmiş bu sözü "madyan mağarası, madyan quyusu" kimi ızah edirler

**Bir May** *oyk*, *mür* İmişli r-nunda şıq B a x Behramtepe

**Bir nömreli Mayak** *oyk*, *mür* Neftçala r-nunun Banke qesebe i e v -de qes Cenub-Şerqi Şirvan düzündedir Yaşayış menteqesi Banke Balıq Kombinatının esas veteqesi yerleşen I №-li Mayak yaxınlığında salındığı (1966) üçün bele adlandırılmışdır

**Bireliçay** *hidr*, *mür* Şerur r-nunda çay Arpaçayın (Araz hovzesi) qoludur Biroçay varıantında da qeyde alınmışdır Hidronim *birə* (toponimiyada iki ve daha artıq çay ve ya çay qolunun birleşmesinden yaranan çay adlarında özünü gösteren topoformant) ve *çay* sözlerinden düzelib, "birleşmiş, qovuşub birlikde axan çay" demekdir Rusiyanın Xabarovsk vilayetinde Bira ve Böyük Bira (Amurun sol qolu, Kuldur ve Sutar çaylarının birleşmesinden emele gelmişdir) çayı ve bu çayın sahilinde Bira, Birakan qesebelerı, Ermenistanda Birekevan, Xakas vilayetinde Birıkçul qesebelerının adları da bu sözle bağlıdır 1933-cü ilde İsmayıllı r-nunun Heftesiyab i e v -de Biradır, Salyan r-nunun Çuxanlı i.e v -de Bıratman adlı yaşayış menteqelerı de qeyde alınmışdır

**Birinci Ağalı** *oyk*, *mur* Zengılan r-nunun Ağalı i e v -de kend Hekerı çayının sol sahilinde, dağeteyi düzenlıkdedir Kend yerli ehali arasında Böyük Ağalı, yaxud Aşağı Ağalı kimi de tanınır Azerb toponimiyasında "birıncı" komponenti "evvelinci", "ilkın", "baş", "aşağı ve ya yuxarı", "böyük" menalarını verır Ağalı komponenti ise burada meskunlaşmış neslin adıdır Etnotoponimdir

**Birinci Alxasova** b a x Alxasova

**Birinci Alıbeyli** *oyk* *mür* Zengilan r-nunun Alıbeyli i e v -de kend. Hekeri çayının sahilinde, Bergüşad silsilesinin eteyindedir Kendin erazisi evveller Ağdam r-nunun Alıbeyli kendinin yaylaq yerı olmuşdur. Sonralar hemin kendden köçüb gelmiş aileler yaylaq yerınde meskunlaşmış, yeni kende de öz evvelki adlarını vermişler

**Birinci Alıcanlı** *oyk* *mür*. Zerdab r-nunun Çalı i e.v -de kend Şirvan düzündedir Kendin sakinlerı vaxtile Ağsu r-nundakı Tekle kendinden geldiklerıne göre Tekle Alıcanlısı adı ile de tanınır Sopenkova adlanan bu yer XIX esrde *Alıcan* adlı ilxı sahibine mexsus olmuş, sonralar bu erazide salınan yaşayış menteqesi de Alıcanlı adlandırılmışdır "Birıncı" komponenti ise oykonimi eynıadlı kend adından ferqlendirmek üçün elave olunmuşdur

**Birinci Aral** *oyk., mür* Ağdaş r-nunun Xosrov i.ə.v.-də kənd. Şirvan düzündədir. Yaşayış məntəqəsi XIX əsrin ikinci yarısında yaxınlıqdakı Şəmsabad kəndindən ayrılmış ailələrin xəzinə (dövlət) torpağı sayılan Aral adl. torpaq sahəsində məskunlaşması nəticəsində yaranmışdır. Əvvəllər Təzəkənd, bir qədər sonra Təzə Şəmsabad adlandırılan bu kənd yerli əhalinin dilində Aral Bir (yeni Birinci Aral) də adlanır. *Aral* sözü türkdilli xalqların toponimiyasında "bitkili torpaq sahəsi", "quru", "ada" və s. mənalarda işlənmişdir. Sözün "ayrılmış", "kənar" mənaları da vardır. Qazaxıstan və Özbəkistan ərazisində yerləşən dəniz və Amudərya çayının mənsəbindəki adalı sahə də Aral adlanır.

**Birinci Aratkənd** *oyk., mür* Ağsu r-nunun Ərəbuşağı i.ə.v.-də kənd. Şirvan düzündədir. Keçmişdə Şirvandakı Gorus mahalının tərkibində olduğu üçün Gorus Aratkənd adlanırdı. XX əsrin 30-cu illərində həmin kənddən çıxan bir qrup ailə İkinci Aratkənd yaşayış məntəqəsini saldıqdan sonra Gorus Aratkənd Birinci Aratkənd adlandırıldı. Burada "birinci" komponenti "ilk, mənbə" mənalarını daşıyır. Bəzi tədqiqatçılar bu toponimin ikinci komponentini monqol mənşəli *oyrat* tayfa adının fonetik dəyişikliyə uğramış forması hesab edirlər. Azərb.-da xalq coğrafi termini olan *arat* relyefin mənfi hissələrində olan şorlaşmış torpaqların yuyulub təmizlənməsi prosesinə, dağdibi rayonlarda isə dincə qoyulmuş, əkilməyən torpaqlara deyilir. Deməli, kənd vaxtilə Gorus mahalının dincə qoyulmuş torpaq sahələrində salındığı üçün belə adlandırılmışdır. 1992-ci ilədək kəndin adı Maşadqanlı olmuşdur.

**Birinci Aşıqlı** *oyk., mür* Beyləqan r-nunun Əlinəzərli i.ə.v.-də kənd. Yuxarı Qarabağ kanalından 4 km aralı, Mil düzündədir. Mülahizələrə görə, kəndin adı keçmişdə Mil-Qarabağ düzlərində yaşamış xələc tayfasının *aşıqlı* tirəsinin adı ilə bağlıdır. Birinci komponenti isə yaşayış məntəqəsinin adını digər kənd adlarından fərqləndirmək üçün əlavə edilmişdir.

**Birinci Biləcik** *oyk., mür* Şəki r-nunun Aşağı Göynük i.ə.v.-də kənd. Alazan-Əyriçay çökəkliyindədir. Keçmişdə Biləcik adlanan bu kənd XVIII-XIX əsrlərdə İran əsarətinə və çarizmə qarşı mübarizə mərkəzlərindən biri olmuşdur. Kollektivləşmə illərində buradan köçmüş ailələr indiki İkinci Biləcik kəndini saldıqdan sonra Birinci Biləcik adlandırılmışdır. Biləcik kəndinin ilk sakinləri mənşəcə Türkiyənin *Biləcik* mahalından çıxmış və orta əsrlərdə burada məskunlaşmış ailələr hesab olunurlar.

**Birinci Çağan** *oyk., mür* Şamaxı r-nunun Dədəgünəş i.ə.v.-də kənd. Dağətəyi ərazidədir. Kənd Çağan mineral bulağının yaxınlığında *məmmədsəlimli* nəsli tərəfindən salındığı üçün əvvəllər Çağan Məmmədsəlimli adlanmışdır. Sonralar bu kənd yalnız bulağın adı ilə adlandı. *Çağan* türk-monqol dillərində "ağsu" deməkdir.

**Birinci Dərəşam** *oyk., mür* Babək r-nunun Nehrəm i.ə.v.-də kənd. Araz çayı dərəsindədir. Toponimin ikinci komponenti Dərəşam X əsrə aid mənbələrdən məlumdur. Dərəşam adlanan yerdə sonralar d.y. stansiyası və yaşayış məntəqəsi yaranmışdır. *Dərə* və *şam* komponentlərindən düzəlmiş bu söz "qamışlı dərə" mənasındadır. Toponimin birinci komponenti isə onu eyniadlı digər kənd adlarından fərqləndirməyə xidmət edir.

**Birinci Ərəbcəbirli** *oyk., mür* Göyçay r-nunun Şəhadət i.ə.v.-də kənd. Bozdağ silsiləsinin ətəyindədir. Kəndin adı 1917-ci ildə Ərəb Cabirli, 1933-cü ildə Ərəb Cəbirli şəklində qeydə alınmışdır. Oykonimin ikinci komponenti Ərəbşamlı tayfasının XIX əsrdə 12 ailədən ibarət *ərəbcəbirli* tirəsinin adı ilə bağlıdır. Birinci komponent isə onu eyniadlı digər yaşayış məntəqəsindən ayırmağa xidmət edir. Etnotoponimdir.

**Birinci İmamverdili** *oyk., mür* Beyləqan r-nunun Bünyadlı i.ə.v.-də kənd. Mil düzündədir. Keçmişdə İmamverdili adlanan yaşayış məntəqəsindən İkinci İmamverdili kəndi ayrıldığı üçün bu adı almışdır. Etnotoponimdir.

**Birinci İpək** *oyk., mür* Laçın r-nunun Təzəkənd i.ə.v.-də kənd. Dağətəyi ərazidədir. 1933-cü ildə ərazidə Birinci, İkinci və Üçüncü İpək adlı üç kənd qeydə alınmışdır. Sonralar iki kəndin adı dəyişdirilmiş, yalnız Birinci İpək saxlanılmışdır.







**Birinci Qarademirçi** *oyk., mür.* Bərdə r-nunun Qarademirçi i.ə.v.-də kənd. Tərtər çayından 3 km aralı, Qarabağ düzündədir. Oykonimin birinci komponenti onu eyniadlı ikinci yaşayış məntəqəsinin adından fərqləndirməyə xidmət edir. İkinci komponent isə burada məskunlaşmış *qarademirçi* elatının adındandır. Etnotoponimdir.

**Birinci Qaralı** *oyk., mür* Neftçala r-nunun Aşağı Qaramanlı i.ə.v.-də kənd. Salyan düzündədir. Sonralar İkinci Qaralı kəndi yarandıqdan sonra Birinci Qaralı adlandırılmışdır (1917). Etnotoponimdir.

**Birinci Mahmudlu** *oyk., mür* Füzuli r-nunun Əhmədbəyli i.ə.v.-də kənd. Düzənlikdədir. Etnotoponimdir. Üç kənddən ibarət olan eyniadlı yaşayış məntəqələrini bir-birindən fərqləndirmək məqsədilə *birinci* komponentdən istifadə edilmişdir.

**Birinci Meyniman** *oyk., mür* Hacıqabul r-nunda kənd. Kür çayının sahilində, Şirvan düzündədir. XIX əsrə aid mənbələrdə Meneyman, 1933-cü ildə Meynəman şəklində qeydə alınmışdır. Yaşayış məntəqəsi Kür çayının üstündə balıq vətəgəsi əsasında yaranmışdır. İlk sakinləri Cənubi Azərb.-dan buradakı balıq vətəgələrində işləməyə gəlmiş azərb. ailələr olmuşlar. Sonralar ondan yeni məntəqə yaranmış və toponimin əvvəlinə *birinci* sözü əlavə edilmişdir. Meyniman komponentinin fars dilindəki "mehman" (qonaq, gəlmə) sözünün fonetik variantı olduğunu ehtimal etmək olar.

**Birinci Milli** *oyk., mür* Kəlbəcər r-nunun Sınıqkilsə i.ə.v.-də kənd. Tərtər çayının sahilində, Qoçdaş dağının ətəyindədir. Tədqiqatçılara görə, toponimin ikinci komponenti yürüklərin (Türkiyə) tərkibindəki *milli* tayfasının adı ilə bağlıdır. Yaşayış məntəqəsi 1920-ci illərdə İkinci Milli kəndindən ayrılmış ailələr tərəfindən salınmışdır.

**Birinci Nügədi** *oyk., mür* Quba r-nunun eyniadlı i.ə.v.-də kənd. Qaraçayın sol sahilində, Qusar maili düzənliyindədir. XVIII əsrə aid sənədlərin məlumatına görə, Quba şəhərinin əhalisinə mənsub bağ ərazilərində ailələrin məskunlaşması nəticəsində yaranan yaşayış məntəqəsi Nügədi (tat dilində "yeni kənd, təzə kənd") adlandırılmışdır. Sonralar kənd böyüyərək iki yerə ayrılmış və onları bir-birindən fərqləndirmək üçün adlarının əvvəlinə *birinci* və *ikinci* sözləri artırılmışdır.

**Birinci Paşalı** *oyk., mür* Hacıqabul r-nunun Udullu i.ə.v.-də kənd. Pirsaat çayının sahilində, dağətəyi sahədədir. Keçmişdə Paşalıkənd də adlanmışdır. Etnotoponim hesab olunur. 1876-cı ildə 36 ailədən ibarət olan bu kənd XIX əsrin axırlarında böyüyərək iki yerə ayrılmışdır. Bu kənddən İkinci Paşalı kəndi ayrıldıqdan sonra kəndin adının əvvəlinə *birinci* sözü artırılmışdır.

**Birinci Səmədxanlı** *oyk., mür* Masallı r-nunun Şərəfə i.ə.v.-də kənd. Lənkəran ovalığındadır. Etnotoponimdir. Əvvəllər Səmədxanlı adlandırılan bu kənddən sonralar başqa bir yaşayış məntəqəsi – İkinci Səmədxanlı ayrıldığı üçün kənd Birinci Səmədxanlı adlandırılmışdır.

**Birinci Şahsevən** *oyk., mür* Beyləqan r-nunun Şahsevən i.ə.v.-də kənd. Araz çayından 3 km aralı, Mil düzündədir. Daşburun stansiyası buradadır. Birinci komponent eyniadlı yaşayış məntəqələrini fərqləndirir. İkinci komponent isə etnotoponim olub, şahsevən tayfalar birliyinin adını əks etdirir.

**Birinci Şıxlı** *oyk., mür* Qazax r-nunun eyniadlı i.ə.v.-də kənd. Kür çayının sağ sahilində, Gəncə-Qazax düzənliyindədir. Kəndin adındakı birinci komponent onu ərazidəki İkinci Şıxlı kəndindən fərqləndirmək üçün artırılmışdır. İkinci komponent isə qazaxların *şıxlı* qolunun adını əks etdirir. Mənbələrdə 1537-ci ildə Şəmkirdən köçüb Qazax mahalına gələn Ağdolaqlı Məhəmməd ağanın oğlu Şıxı və onun övladları haqqında məlumat verilir.

**Birinci Şordəhnə** *oyk., mür* Ağdaş r-nunun Qəsil i.ə.v.-də kənd. Şirvan düzündədir. Toponimin ikinci komponenti *şor* (göl, şoran yer) və *dəhnə* (çayın dərənin dar hissəsindən düzənliyə çıxdığı yer) sözlərindən düzəlib, "şoran yerdə çay ağzı və yaxud çayın gölə töküldüyü yer" mənasındadır. Kəndin adındakı *birinci* sözü onu eyniadlı digər yaşayış məntəqəsindən fərqləndirmək üçün artırılmışdır.

**Birinci Tığıq** *oyk., mür* Laçın r-nunun Qarıkaha i.ə.v.-də kənd. Dağətəyi ərazidədir. Adını ərazidəki eyniadlı (Tiğik) dağdan

almışdır Yaşayış məntəqəsi bu dağın ətəyində yerləşir Sonralar Tığıq adlı ərazidə İkinci Tığıq kəndi yaranmış və Tığıq kəndlərini fərqləndirmək üçün əvvəlinə *birinci* sözü artırılmışdır

**Birinci Tiyaqanı** *oyk., mür* Masallı r-nunun Hişgədərə i ə v -də kənd Lənkəran ovalığındadır Kəndin yaxınlığındakı İkinci Tiyaqanı yaşayış məntəqəsi bu kəndin əsasında yaranmışdır Toponimin ikinci komponenti *tiyaqanı* talış dilində "tikanlı" mənasındadır

**Birinci Udulu** *oyk., mür* Hacıqabul r-nunun Udulu i ə v -də kənd Pirsaat çayının sol sahilində, Ləngəbiz silsiləsinin (Böyük Qafqaz) ətəyindədir Əvvəlki adı Cəngan olmuşdur Yaşayış məntəqəsinin adının şahsevənlərin *udulu* və ya xəzərlərin *edilli* tayfa adları ilə bağlı olması haqqında mülahizələr var Hər iki halda etnotoponimdir

**Birinci Yeddioymaq** *oyk., mür* Masallı r-nunun Yeddioymaq i.ə v -də kənd Viləş çayının sahilində, Lənkəran ovalığındadır Yaşayış məntəqəsi şahsevənlərin *yeddioymaq* qolunun Talış xanlığı dövründə burada məskunlaşması nəticəsində yaranmışdır Etnotoponimdir Oykonimin birinci komponenti "baş, əsas, mənbə" mənalarını bildirir

**Birinci Yeniyol** *oyk., mür* İsmayıllı r-nunun Təzəkənd i.ə.v.-də kənd. Dağətəyi ərazidədir Keçmiş adı Nügədi (tat "yeni kənd") olmuşdur 1935-ci ildən Yeni Yol (Sovet hakimiyyəti illəri üçün xarakterik adlardandır) adlandırılmışdır Sonralar həmin kənddən ayrılmış ailələr tərəfindən yeni yaşayış məntəqəsi (İkinci Yeniyol) yaranmış və bu oykonimin əvvəlinə *birinci* sözü artırılmışdır

**Birinci Yüzbaşılı** *oyk., mür* Ağdam r-nunun Xındırıstan i ə v -də kənd Qarabağ düzündədir Keçmişdə Yüzbaşılı adlanan bu kənddən XIX əsrdə başqa bir yaşayış məntəqəsi (İkinci Yüzbaşılı) ayrıldıqdan sonra kənd Birinci Yüzbaşılı adlandırılmışdır

**Birinci Zabrat** *oyk., mür* Bakı şəhəri, Sabunçu r-nu ərazisində d y stansiyası və yaşayış məntəqəsi Oykonim "Zabrat adlı yaşayış məntəqəsinin giriş hissəsi" mənasındadır

**Bist** *oyk., sadə* Ordubad r-nunun eyniadlı i ə v -də kənd Gilan çayı (Arazın qolu) ilə ona soldan birləşən Nəsiravaz çayı arasında, Zəngəzur silsiləsinin yamacındadır Oykoniminin fars *best* sözündən olub, "dərə, vadi" mənasında, təsərrüfatla əlaqədar yaranmışdır, "karvansara sahibi" mənasında işlənməsi haqqında mülahizələr var Lakin toponimiyada *Bist* adının fars "iyirmi" mənalı söz kimi kəndin yaranması ilə bağlılığı haqqındakı fikir daha ağlabatandır. Bu fikrə görə, kəndin əsası 20 ailə tərəfindən qoyulduğu üçün ona Bist (iyirmi ailə) adı verilmişdir

**Bist** *hidr., sadə*. Ordubad r-nunda min su bulaqları Bist kəndindən şm -da, Ələhi çayının sol sahilindədir İki bulaqdan ibarətdir Suyu soyuq və içməlidir Adını yaxınlığında yerləşdiyi kəndin adından almışdır

**Biu** *oyk., sadə* Astara r-nunun Siyaku i ə v -də kənd Lənkəran ovalığındadır Kənd öz adını yaxınlıqdakı min su bulağının adından almışdır Əsli Büyəov olan bu hidronim talış dilindəki *büy* (iy, qoxu) və *ov* (su) sözlərindən ibarət olub, "iyli, qoxulu su" mənasındadır

**Bizeyir** *oyk., mür* Lerik r-nunun Piresora i ə v -də kənd Dağətəyi ərazidədir Toponim talış dilindəki *biz* (keçi) və *zeyid* (saxlamaq) sözlərinin birləşməsindən əmələ gəlib, "keçi saxlanılan yer" mənasında izah olunur Əslində *biz* (dağ) və *yer* komponentlərindən ibarət toponim "dağətəyi sahə" mənasını bildirir

**Bizlan** *oyk., mür* İsmayıllı r-nunun Tircan i ə v -də kənd Baş Qafqaz silsiləsinin c -ş ətəyindədir Bəzi tədqiqatçılara görə, toponim İran dillərindəki *vis* (ev) və *lan* (hasar, divar) sözlərinin birləşməsindən əmələ gəlib "divarla əhatə olunmuş ev, hasarlı ev" mənasındadır Əslində *Bizlan* "dağla əhatə olunmuş" kimi izah edilməlidir

**Bobla** *oyk., sadə* Lerik r-nunun Dəstər i ə v -də kənd Dağlıq ərazidədir Kəndin ərazisindəki Bobla türbəsi pir hesab edilir Kənd öz adını pirin adından almışdır Talış dilindəki *baba/boba* (pir) və *-lə* (şək ) komponentlərindən düzəlmiş bu oykonim "pir yeri" mənasındadır

**Boblaband** *or., mür* Lənkəran r-nunda dağ Lənkəran çayının sağ sahilindədir Hün 664 m. Boboloband variantında da qeydə alınmışdır Oronim talış dilindəki *baba/bobo* (pir), *-lə* (-lı şək.) və *band* (təpə, kiçik dağ) komponentlərindən ibarət olub, "müqəddəs təpə, baba dağı" mənasındadır

**Boblaçay** *hidr., mür* Lənkəran r-nunda çay Lənkəran çayının qoludur. Adını ərazidəki eyniadlı dağdan almışdır

**Boğaz düzənliyi** *or., mür* Samur-Dəvəçi ovalığının Abşeron yarımadasına qovuşan və ondan Sumqayıt çayı ilə ayrılan hissədir Buradakı *boğaz* sözü "keçid" mənasında işlənmişdir Düzənlik Böyük Qafqazın c -ş qurtaracağı ilə dəniz arasında dar keçid təşkil etdiyinə görə belə adlandırılmışdır Boğaz düzənliyi susuz olub, bəzi yerləri şoranlıqdır Qış otlaqları kimi istifadə edilir

**Boğboğa** *or., sadə* Abşeron yarımadasında, Sabunçu qəs.-nin q -ində palçıq vulkanı Hün 87 m Palçıq vulkanları püskürərkən yer səthinə çıxan su, palçıq və qaz müxtəlif səslər çıxarır Belə vulkanlar əhali arasında *boğ-boğa* və ya *pilpilə* adlandırılır Boğboğa sözü vulkanın çıxardığı səsə müvafiq olaraq təqlidi təkrar xarakteri daşıyır

**Boğda** *or., sadə* Daşkəsən r-nunda dağ Şahdağ silsiləsinin şm yamacında, Şəmkir çayının sahilindədir Hün 3102 m Boqdağ variantında da qeydə alınmışdır Oronimin türk dilindəki "şiş papaq" mənalı boğtak sözündən olması ehtimal etmək olar *Boq* komponenti toponimiyada əsasən oronimiyada geniş yayılmışdır Dağıstanda Boqas dağ silsiləsinin, Buryat Muxtar Vilayətində Boxan r-nunun adı da bu komponentlə bağlıdır

**Boğurxan** *or., sadə* Əsgəran r-nu ilə Xocavənd r-nu sərhədində dağ. Köndələnçayın yaxınlığındadır Hün 1584 m Bağırxan, Bağırqan da adlanır Oronim orada müqəddəs sayılan Boğurxan qayasının adı ilə bağlıdır Qırmızı rəngli, vulkan mənşəli süxurdan ibarət olan bu qayanın başında qədim məbəd xarabalığı var Bu pirə sonsuz qadınlar müraciət edirlər Tədqiqatçılar belə güman edirlər ki, Boğurxan din xadimi olmuş və orada dəfn edildikdən sonra qəbri sitayiş yerinə çevrilmişdir

**Boladı** *oyk., mür* Lənkəran r-nunun eyniadlı i.ə v -də kənd Boladı çayının sahilində, Lənkəran ovalığındadır Yerli tələffüz forması Bolədidir Tədqiqatçılara görə, oykonim *bol* və talış dilindəki *di* (kənd) sözlərindən ibarət olub (-ə bitişdirici saitdir), "bolluq kəndi, varlı kənd" mənasındadır Yaşayış məntəqəsi həqiqətən də r-nun ən varlı və böyük kəndlərindən biridir

**Boladı** *hidr., sadə* Lənkəran və Masallı r-nlarında çay Mənbəyini Alaşar-Burovar silsiləsindən (860 m hündürlükdən) alır Əsas qolu Boradigah (Seydan) çayıdır Xəzər dənizinə tökülür Suvarmada istifadə olunur Yuxarı axınında Ülümrü, aşağı axınında Qumbaşı adlanır. Hidronim eyniadlı yaşayış məntəqəsinin adından yaranmışdır

**Bolçalı** *oyk., mür* Xanlar r-nunun eyniadlı i ə v -də kənd Qoşqar çayının (Kürün qolu) sol sahilində, Qaflanqala silsiləsinin ətəyindədir Oykonim *bol* (yüksəklik), *çal* (ətək) və -ı (mənsub şək ) komponentlərindən düzəlib, "dağətəyi" deməkdir

**Boldan** *or., mür* Lerik r-nunda, Lımər çayının mənbəyi yaxınlığında dağ Talış silsiləsinin zirvələrindən biridir Hün 1980 m Oronim "böyük dağ, yüksək dağ" mənasındadır İran yaylasının ş -ində, Pakistanda Bolan dağ keçidi (hün 1792 m), Xabarovsk vilayətində Bolon gölü, Gürcüstanda Bolnisi şəhəri, Türkiyədə Bolu ili və s qeydə alınmışdır

**Bolqar** *hidr., sadə* Yardımlı, Cəlilabad və Biləsuvar r-nlarının ərazisindən axan çay İran ərazisində Qaracadağın şm yamacından başlayıb Biləsuvar r-nunda Mahmudçala gölünə tökülür Orta axarında İranla sərhəd xəttini təşkil edir Yay fəslində suyu quruyur Suvarmada istifadə olunur. Üzərində Bolqarçay su anbarı yaradılmışdır (1965) Talışlar arasında Bolharu, VII əsrə aid mənbələrdə Baranrud, XIV əsrdə Bacrəvançay formasında qeydə alınmışdır Bolqarçay isə onun yuxarı axınının adıdır Toponimin erkən orta əsrlərdə Azərb -da məskunlaşmış türkdilli *bulqar* tayfasının adı ilə bağlılığı güman olunur

**Bolludərə** *oyk., sadə* Şəki r-nunda qəsəbə Düzənlikdədir Yaşayış məntəqəsi

Bolludərə adlı ərazidə salındığı üçün belə adlandırılmışdır Dərənin torpağı məhsuldar, bərəkətli olduğu üçün ona belə ad verilmişdir

**Boloboni** *or., mür* Lənkəran r-nu ərazisində dağ Balaband variantında da qeydə alınmışdır Oronim "hündür dağ" kimi izah olunur

**Bolsulu** *oyk., sadə* Beyləqan r-nunun Təzəkənd i.ə v.-də qəsəbə Orconikidze adına kanaldan 4 km aralı, Mil düzündədir Qəsəbə kanalın yaxınlığında, Bolsulu adlanan ərazidə salındığı üçün belə adlandırılmışdır Bəzi mənbələrdə Boluslu variantında da qeydə alınmışdır Gürcüstanın Bolnisi r-nu 1948-ci ilədək Bolus adlanırdı

**Bomadın** *or., mür* Lerik r-nu ərazisində, Limər çayının mənbəyi yaxınlığında dağ Talış silsiləsinin zirvələrindən biridir. Oronim türk dillərindəki *bom/bam* (yüksək) və dın/dın (düşərgə) sözlərindən düzəlib (-a bitişdirici saitdir), "yüksək yerdə dayanacaq, düşərgə" deməkdir

**Bondurcan** *or., düz* Abşeronda dağ Əsli Bondurcadır Oronim "təpə, dikdir" deməkdir

**Bonquşqaya** *or., mür* Qobustanda, Cəngi çayının aşağı axarından c.-da dağ Hün 503 m. Oronim *bonquşt* (tat *bünkuşt* "o tərəfdəki, o taydakı") və *qaya* (müsbət relyef forması) komponentlərindən düzəlib, "o tərəfdəki qaya" deməkdir Bəzən Boquş qaya variantında da qeydə alınmışdır

**Boradigah** *oyk., mür* Masallı r-nunun eyniadlı i.ə v.-də ştq. Boradigah çayının sahilində, Lənkəran ovalığındadır Toponim talış dilində Bırədiqo şəklində tələffüz olunur Tədqiqatçıların fikrincə, *bır* (böyürtkən kolu) və *diqo* (su çıxmayan əkin yeri, yüksəklik) sözlərindən ibarət olub, "böyürtkənli yüksəklikdə su çıxmayan əkin yeri" mənasındadır Lakin toponimin *bor/boz* (bitkisiz sahə) və *digah* (yaşayış yeri) komponentlərindən ibarət olub, "bozqır yerdə yaşayış məntəqəsi" mənasında olduğunu da düşünmək olar

**Boradigah** *hidr., sadə* Lənkəran r-nunda çay Boladi çayının sol qoludur Yuxarı axarında Seydan çayı adlanır Çay adını ərazisindən axdığı eyniadlı yaşayış məntəqəsindən almışdır.

**Boranıkənd** *oyk., mür* Salyan r-nunun Şorsulu i.ə v.-də kənd Bala Kür (Aquşa) çayının sahilində, Salyan düzündədir Tədqiqatçıların fikrincə, toponim *baranı* (etn.) və *kənd* sözlərindən düzəlib, etnotoponim hesab olunur Yaşayış məntəqəsini qaraqoyunluların *baranilər* tayfasına mənsub ailələrin saldığı güman edilir Oykonimi *boranı* (tərəvəz növü) və *kənd* sözlərinin birləşməsi kimi "boranı əkilən, yetişdirilən kənd" mənasında da izah edirlər

**Borbor** *oyk., sadə.* Dəvəçi r-nunun Rəhimli i.ə v.-də kənd Samur-Dəvəçi ovalığındadır 1917 və 1933-cü illərdə Burbur variantında qeydə alınmışdır 1917-ci ildə Şamaxı ərazisində də Borbor kəndinin olması haqqında məlumat verilir Tədqiqatçıların fikrincə, kənd XVIII əsrin axırlarında Qubalı Fətəli xanın Cənubi Azərb.-dan köçürüb gətirdiyi *borborlar* (baharlı tayfasının qolu) tərəfindən salınmışdır Abşeronda qeydə alınmış Borbərşor göl adı, Cənubi Azərb.-da, Urmiya şəhəri yaxınlığındakı Borbor yer adı da bu oykonimin paralelləridir

**Borispol** b a x Sərkərli.

**Borsunlu** *oyk., sadə* 1 Goranboy r-nunun eyniadlı i.ə v.-də kənd Gəncə-Qazax düzənliyindədir Yerli əhali tərəfindən Borsunnu kimi tələffüz olunur və belə bir məlumat verilir ki, guya vaxtilə Türkiyə ərazisində mövcud olmuş Borus mahalından gələnlər bu kəndi binə etmişlər Türkiyənin Diyarbəkr əyalətində Borsunqala adlı kənd də qeydə alınmışdır Tədqiqatçıların fikrincə, kəndin adı türkdilli *barsil* tayfasının adı ilə bağlıdır V-VIII əsrlərə aid mənbələrin məlumatına görə, IV əsrdən Xəzər dənizinin şm.-q. sahillərində yaşayan və Xəzər xaqanlığının siyasi həyatında mühüm rol oynayan barsilərin bir qismi sonralar Azərb.-na köçmüş, Kür çayı boyunca Aranda məskunlaşıb əkinçilik və maldarlıqla məşğul olmuşlar; 2. Tərtər r-nunun Sarov i.ə v.-də kənd İncəçay (Kürün sağ qolu) sahilində, düzənlikdədir Etnotoponimdir Keçən əsrdə Şəmkir r-nu ərazisində də Barsum adlı yaşayış məntəqəsi qeydə alınmışdır







**Bostançı** *oyk., sadə.* Xaçmaz r-nunun Dədəli i.ə v.-də kənd Samur-Dəvəçi ovalığındadır Oykonimi etnotoponim hesab edən tədqiqatçıların fikrincə, toponim *bostan* (qırğızlarda və özbəklərdə boston) tayfa adından və -çı mənsubiyyət şəkilçisindən düzəlib Bostançı oykonimi bu kənddə yaşayan əhalinin qədim məşğuliyyəti (tərəvəz yetişdirmə) ilə də bağlı ola bilər Ermənistanda Bostançı Xaraba, Gürcüstanda Bostançı, Özbəkistanda Bostanlık, Bustan, Tacikistanda Bustankala toponimləri qeydə alınmışdır

**Boşağadərəçay** *hidr., mür* Masallı r-nunun Babasər kəndi ərazisində çay Hidronim *başağ* (talış dilində *boşak* "qırğı"), *dərə* (mənfi relyef forması) və *çay* (su hövzəsi) komponentlərindən düzəlib, "qırğı dərəsindən axan çay" deməkdir

**Boşçalı** *oyk., sadə* Yevlax r-nunun Tanrıqulular i.ə v.-də kənd Düzənlikdədir Yaşayış məntəqəsini XVIII əsrdə Gürcüstanın *Borçalı mahalından* gəlmiş ailələrin saldığı güman edilir Etnotoponim olması da mümkündür

**Boşçallar** *oyk., sadə* İmişli r-nunun Sarıxanlı i.ə v.-də kənd Mil düzündədir Əsli Boşçalılardır Toponim özündə təklə tayfasının *boşçalı* tirəsinin adını əks etdirir

**Botoər** *hidr., sadə.* Balakən r-nunda çay Avar dilində *botor/beter* "mənbə, çayın mənbəyi" deməkdir

**Boyaqlı** *oyk., düz* Kəlbəcər r-nunda kənd. Tərtər çayının sahilində, dağətəyi ərazidədir XIX əsrdə Kəlbəcər kəndinin əhalisinin yaylaq yurdu olmuşdur Boyaq bitkiləri çox olduğu üçün yurd belə adlandırılmışdır Sonralar kəndin kəlbəvəli və mərdanlı nəsillərinə mənsub bir qrup camaatı yaylaq yurdunda məskunlaşmış, yeni yaşayış məntəqəsi yurdun adını saxlamışdır

**Boyanata** *or., sadə* Şamaxı r-nunda dağ Keçmişdə qaracüzlü tayfasına mənsub qışlaqlardan birinin adı olmuşdur Deyilənlərə görə, dağın adı oradakı *Boyan Ata* pirinin adı ilə bağlıdır

**Boyat** *oyk., sadə* 1 Ağcabədi r-nunun eyniadlı i.ə v.-də kənd Qarabağ düzündədir 1747-ci ildə Qarabağ xanı Pənahəli xan burada Bayat qalasını tikdirmişdi Toponim səlcuq oğuzlarının *boyat/bayat* tayfasının adını əks etdirir Dədə Qorqud, M Füzuli bayat tayfasından olmuşlar; 2 Neftçala r-nunun eyniadlı i.ə v.-də kənd Salyan düzündədir Toponim XIX əsrin axırlarında Şorsulu kəndindən köçüb pay torpaqlarında məskunlaşmış *boyat* tayfasına mənsub ailələrin adındandır; 3 Ucar r-nunun eyniadlı i.ə v.-də kənd Keçmişdə Boyat Məlik Umud adlanmışdır Məlik Umud orada məskunlaşmış *boyatların* başçısının adı olmuşdur Həmin ailələr 1846-cı ildə Çalıqışlaq adlı qışlaq yerində məskunlaşmış və yaşayış məntəqəsinə də öz adlarını vermişlər 4. Şamaxı r-nunun Çarhan i.ə v.-də kənd Kənd *boyat* tayfasının adını daşıyır Etnotoponimdir

**Boyəhməd** *oyk., sadə* Culfa r-nunun Ərəfsə i.ə v.-də kənd Zəngəzur silsiləsinin ətəyindədir Oykonim qazaxların *boyəhmədli* tayfasının adındandır Etnotoponimdir

**Boyəhmədli** *oyk., sadə* Ağdam r-nunun eyniadlı i.ə v.-də kənd Əvvəllər Qavartu Boyəhmədli adlanırdı 1795-97-ci illərdə baş vermiş siyasi hadisələrlə əlaqədar Qazax mahalından Qarabağa köçüb gəlmiş tayfalardan biri də *boyəhmədli* idi Kənd həmin tayfanın adını daşıyır Etnotoponimdir

**Boyəhmədli** *or., sadə* Ağdam r-nunun Boyəhmədli kəndi yaxınlığında dağ Hün 386 m Etnotoponimdir

**Boyxanlı** *oyk., sadə* Cəlilabad r-nunun eyniadlı i.ə v.-də kənd Burovar silsiləsinin ətəyindədir Etnotoponimdir 1917, 1933-cü illərdə Bayxanlı variantında qeydə alınmışdır

**Boykəndil** *oyk., mür* Lerik r-nunun Kirəvud i.ə v.-də kənd Peştəsər silsiləsinin şm.-ş. ətəyindədir Müxtəlif mənbələrdə Boykənil, Boykəndli, Boykanil, Boyqandul variantlarında qeydə alınmışdır Oykonim türk dillərindəki *bovqun/bovkan* (uzun) və *dul* (dərə) sözlərindən düzəlib, "uzun dərə" mənasındadır

**Boynəgər** *oyk., mür* Qubadlı r-nunun Hal i.ə v.-də kənd Bazarçayın sahilindədir Boyunəkər variantında da qeydə alınmışdır Kənd Boyunəkərə yeri adlı sahədə salındığı üçün həmin sahənin adını götürmüşdür Oykonim *boyun* (burada kotana qoşulan bir cüt öküz) və *əkər* (şumlanması asan olan, münbit

torpaq sahəsi) sözlərindən düzəlib, "kotana qoşulan öküzlə şumlanan sahə" mənasındadır

**Boyundağ** *or., mür.* Şəki r-nu ərazisində dağ. Küngüt çayının yuxarı axarındadır. Hün. 2191 m. Oronim *boyun* (dağ aşırımı) və *dağ* (müsbət relyef forması) komponentlərindən düzəlib, "aşırımlı dağ" deməkdir.

**Boyur** *oyk., sadə* Kəlbəcər r-nunda kənd. Dağətəyi ərazidədir. Toponim qədim türk sözü olan və "dağ döşü", "dağ yamacı" mənalarını bildirən *bair* sözünün yerli tələffüz formasıdır. Ərazini relyef cəhətdən təsvir edir.

**Bozağıl** *or., mür.* Şərur r-nunun şm.-q.-ində dağ. Hün. 1174 m. Oronim *boz* (bitkisiz sahə, yovşanlıq, boş görünən yer) və *ağıl* (yataq, qoyun saxlanılan yer) sözlərindən ibarət olub, "bitkisiz yerdə qoyun yatağı" mənasındadır.

**Bozalqanlı** *oyk., sadə* Tovuz r-nunun eyniadlı i.ə.v.-də kənd. Axınca çayının sahilində, Gəncə-Qazax düzənliyindədir. Etnotoponimdir. Toponim Azərb. xalqının etnogenezində iştirak etmiş qədim türkdilli *bozal/bızal* və *qanqlı/kanqlı* tayfalarının adı ilə əlaqədardır. Mənbələrdə bu oykonim Boz Bozalqanlı variantında da qeydə alınmışdır. Eyni zamanda, *bozalğan* yabanı bitki adıdır.

**Bozayran** *oyk., sadə.* 1. Cəlilabad r-nunun Gülməmmədli i.ə.v.-də kənd. Düzənlikdədir. XIX əsrə aid mənbədə Bozayranlı formasında qeydə alınmışdır. Sovet hakimiyyəti illərində Böyük Bozayran və Balaca Bozayran kəndlərinə ayrılmışdı. Böyük Bozayran kəndi ləğv edildikdən sonra 1972-ci ildə Balaca Bozayran kəndi rəsmi olaraq Bozayran adlandırılmışdır. Etnotoponim olduğu güman edilir; 2. Yardımlı r-nunun Yardımlı qəs. i.ə.v.-də kənd. Viləş çayının sağ sahilindən bir qədər aralı, Peştəsər silsiləsinin ətəyindədir. Yaşayış məntəqəsini Cəlilabad r-nunun Böyük Bozayran kəndindən köçüb gəlmiş ailələr salmışlar.

**Bozayran** *hidr., mür.* Yardımlı r-nunda soyuq sulu min. bulaqdır. *Boz* sözü hidronimlərin tərkibində "soyuq", "bulanıq" mənalarında, *ayran* komponenti isə "bulanıq su, turş su" mənalarında işlənir. Bozayran oykonimlərinin məhz bu bulağın adından törədiyini də ehtimal etmək olar. Özbəkistanın Daşkənd vilayətində Bozsu toponimi qeydə alınmışdır.

**Bozavənd** *oyk., mür.* Ağsu r-nunda kənd. Ağsu çayının sahilindən 2 km aralı, Şirvan düzündədir. Yaşayış məntəqəsinin adı XIX əsrdə Şamaxı r-nu ərazisindəki Pir İsfahan dağında yaşamış 64 ailədən ibarət *bozavənd* tayfasının adı ilə bağlıdır. İsmayıllı r-nunun Mollaisaqlı kəndi ilə Göyçay çayı arasında Bozavənd meşəsi adlı yer də vardır.

**Bozbinə** *oyk., mür.* Zaqatala r-nunun Əli Bayramlı i.ə.v.-də kənd. Alazan-Əyriçay çökəkliyindədir. Keçmişdə Yuxarı Tala kəndindən çıxmış ailələrin *Bozbinə* adlı yerdə məskunlaşması nəticəsində yaranmışdır. Oykonim "boza çalan, boş görünən sahədə binə" mənasındadır.

**Bozdağ** *or., mür.* 1. Abşeron yarımadasının q. hissəsində, Qobu qəsəbəsindən şm.-da böyük palçıq vulkanı. Hün. 243 m. Qobu Bozdağı da adlanır; 2. Abşeron yarımadasında, Hökməli qəsəbəsindən q.-də palçıq vulkanı. Hün. 255 m.; 3. Abşeron yarımadasının c.-q.-ində Güzdək qəsəbəsi yaxınlığında palçıq vulkanı. Hün. 309 m. Güzdək Bozdağı, Qanlıtəpə də adlanır; 4. Ağdam r-nunda, Xaçın çayının sağ sahilində dağ. Hün. 710 m.; 5. Goranboy r-nunun Qızılhacılı kəndindən şm.-ş.-də dağ. Hün. 196 m.; 6. Əli Bayramlı r-nunda, Bəndovan kəndindən şm.-da dağ. Hün. 113 m.; 7. Şəki r-nunun Şin kəndindən şm.-ş.-də Baş Qafqaz silsiləsinin zirvələrindən biri. Hün. 3032 m.; 8. Mingəçevir su anbarından c.-da, Gəncə çayından sağ tərəfdə dağ silsiləsi; 9. Gəncə şəhərindən başlayaraq əvvəlcə Kür çayının sağ sahili boyunca, sonra isə Şirvan düzünün şm. sərhədi üzrə enlik istiqamətində Girdiman çayının dərəsinə qədər 150 km məsafədə uzanan dağ silsiləsidir. Qocaşən-Göyçay silsiləsi də adlanır. Bu silsilə Kür, Əlican, Türyan, Göyçay çaylarının dərələri ilə ayrı-ayrı hissələrə parçalanmışdır. Silsilənin orta hündürlüyü 350-400 m olub, ən hündür zirvəsi Göyçay şəhəri yaxınlığında Qarğadərə zirvəsidir (1725 m); 10. Şəki r-nunda Daşüz silsiləsinin zirvəsi. Palçıq vulkanları ağımtıl rəngə çaldığına görə, dağlar seyrək bitkili, boz torpaq örtüyünə malik olduğuna görə, zirvələr isə süxurlarının ağımtıl-boz rəngdə olduğuna görə Bozdağ adını almışdır.







**Bozdağan** *oyk., sadə* Laçın r-nunun Şamkənd i.ə.v.-də kənd. Dağlıq ərazidədir. Tədqiqatçılar belə güman edirlər ki, toponim eyniadlı etnik qrupun adı ilə (*bozdoğan* şahin quşunun bir növüdür) bağlıdır. 1933-cü ildə Bozağan variantında qeydə alınmış bu toponim "otsuz, bitkisiz yer" mənasında da ola bilər. Türkiyədə Boz-Doğan, Ermənistanda Boztoğan adlı yaşayış məntəqələri qeydə alınmışdır.

**Bozfi** *or., sadə* Goranboy r-nunda dağ. Oronim *boz* (açıq rəng, qonur rəng, ala) və *fi* (ən qədim topoformantlardan olub Yerfi və b. oronimlərdə olduğu kimi, nadir hallarda təsadüf olunur və "şiş", "çıxıntı", "yüksəklik" mənalarını bildirir) komponentlərindən ibarət olub, "boz dağ" mənasındadır.

**Bozgüney** *oyk., mür.* Laçın r-nunun Vaqazin i.ə.v.-də kənd. Qarabağ silsiləsinin yamacındadır. Kənd Bozgüney adlı sahədə salındığına görə həmin yerin adı ilə adlandırılmışdır. Toponim *boz* (bitkisiz, quru yer) və *güney* (cənub, gün tutan yer) komponentlərindən düzəlib, "gün tutan quru yer" mənasındadır. *Boz* komponentli toponimlər ümumtürk toponimiyasında geniş areala malikdir. Özbəkistanda Boz, Bozatau, Bozsu, Qazaxıstanda Bozşakol, Bozbien, Boz təpəsi, Bozqır təpəsi, Gökboza, Cənubi Azərb.-da Boz, Krımda Boz, Bozqana, Ermənistanda Bozqala, Bozyoxuş və s. toponimlər bu areala daxildir.

**Bozlu** *oyk., sadə* 1. Kəlbəcər r-nunun Lev i.ə.v.-də kənd. Murovdağ silsiləsinin yamacındadır. Kənd XIX əsrin sonlarında Babaşlar kəndindən çıxmış *bozlu* adlı nəslin məskunlaşması nəticəsində yaranmışdır; 2. Laçın r-nunun Mirik i.ə.v.-də kənd. Minkənd çayının (Həkəri çayının qolu) sol sahilində, Qarabağ yaylasındadır. Keçmiş adı Bozlu Ağcakənd olmuşdur. XVIII əsrdə Dərələyəz mahalından gəlib burada məskunlaşmış *bozlu* (bozulu) tayfasının adındandır. XIX əsrdə kəndin əhalisi hazırda Bozlu gövşəni, Bozlu çöpü (Minkəndin q.-ində) adlanan yerdən Minkənd çayının sol sahilindəki indiki yerə köçmüşdür. Etnotoponimdir.

**Bozpapaqlar** *oyk., sadə* Ağdam r-nunun Seyidli i.ə.v.-də kənd. Qarabağ düzündədir. Tədqiqatçıların fikrincə, oykonim cavanşir tayfasına mənsub *bozpapaqlar* tirəsinin adını daşıyır və etnotoponimdir.

**Bozyer** *or., mür.* Goranboy r-nunda yüksəklik. Xalq arasında Bozaran da adlanır. Yamacları yarğanlara parçalanmışdır. Hün. 194 m. Oronim *boz* (yarımsəhra, zəif bitki örtüklü, bozqır) və *yer* (əslində *yar* qədim türk mənşəli söz olub "yarğan", "dərə" mənalarında işlənir) komponentlərinin birləşməsindən düzəlib, "bozqır torpaqlı yarğan" mənasındadır.

**Böyük Ağdaş** *or., mür.* Gədəbəy r-nunun c. hissəsində dağ. Hün. 3031 m. Coğrafi ad "ağ rəngli böyük qaya" deməkdir.

**Böyük Alagöl** *hidr., mür.* Kəlbəcər r-nunda, 2750 m. hündürlükdə şirin sulu, axarlı göl. Alagöllər qrupunda ən böyük göldür. Sahəsi 5 kv. km. Azad çayı bu gölə tökülür. Kiçik bir qolla Kiçik Alagöllə birləşir. Mal-qaranı suvarmaq üçün istifadə olunur. Eyniadlı digər göldən fərqləndirmək üçün, eyni zamanda həcminin böyüklüyünə görə belə adlandırılmışdır. *Ala* komponenti burada ətrafdakı qaya və yamacların sudakı əksini bildirir.

**Böyük Alagöl** *or., sadə* Kəlbəcər r-nu ərazisində dağ. Dağ öz adını ətəyindəki eyniadlı gölün adından almışdır.

**Böyük Alatəmir** *oyk., mür.* Qax r-nunun Qaxıngiloy i.ə.v.-də kənd. Dağətəyi ərazidədir. Yerli əhalinin məlumatına görə, yaşayış məntəqəsini Qaxingiloy kəndindən çıxmış ailələr vaxtilə *Alatəmir* adlı şəxsə məxsus torpaq sahəsindəki binə yerində saldığına görə belə adlanmışdır.

**Böyük Bəhmənli** *oyk., mür.* Füzuli r-nunun eyniadlı i.ə.v.-də kənd. Quruçayın (Arazın qolu) sahilində, düzənlikdədir. 1917-ci ildə Böyük Boyimanlı şəklində qeydə alınmışdır. Etnotoponimdir. *Bəhmənlilər* Qarabağ xanlığının həyatında mühüm rol oynamış cavanşirlərin bir qoludur. *Böyük* sözü kəndin adına onu eyniadlı oykonimdən fərqləndirmək üçün əlavə edilmişdir.

**Böyük Bəyli** *oyk., mür.* Ağdam r-nunun Üçoğlan i.ə.v.-də kənd. Qarabağ düzündədir.

Əsli *Böyükbəylidir* Keçmiş adı Böyükbəy Tərəkəmə olmuşdur XIX əsrin sonunda Üçoğlan kənd icmasına mənsub bir qrup tərəkəmə elat öz bəylərinin adları ilə Tərəkəmə Abdulbəy, Tərəkəmə Böyükbəy, Tərəkəmə Mirzəbəy və Tərəkəmə İmamqulubəy adlanırdı Sonralar toponimin tərkibindən tərəkəmə sözü düşmüş və kənd bəyin adı ilə adlandırılmışdır Etnotoponimdir

**Böyük Dəhnə** *oyk*, *mür* Şəki r-nunun eyniadlı i ə v -də kənd Acınohur gölündən 10 km aralı, Turut çölündədir. Oykonim böyük (ölçü bildirir) və *dəhnə* (fars "çay ağzı, keçid, suyun əsas mənbədən ayrıldığı yer, suvarma kanalının ağzı, sukeçirən yer, arx başı, arx başında bənd") komponentlərindən düzəlib, "böyük arx başı" mənasındadır

**Böyük Dəkkə** *oyk*, *mür* Zərdab r-nunun İsaqbağı i ə v -də kənd. Şirvan düzündədir Yaşayış məntəqəsini hacıəsədli nəslinə mənsub ailələr salmışlar Kənd böyük olduğuna görə və Bala Dəkkə kəndindən (hazırda Təzəkəndlə birləşdiyinə görə kənd ləğv olunmuşdur) fərqləndirmək məqsədilə belə adlandırılmışdır "Böyük oba, oymaq" mənasındadır

**Böyük Əmili** *oyk*, *mür* Qəbələ r-nunun Həcallı i ə v -də kənd Qaraçayın sahilindən 2 km aralı, Əmirvan silsiləsinin c ətəyindədir Birinci komponent oykonimi indi mövcud olmayan Kiçik Əmili kəndindən fərqləndirmək üçündür *Əmili* komponenti isə toponimiyada türk mənşəli kaymakların (qaymaqların) yeddi qolundan biri olan *imi* (imək) etnonimi ilə əlaqələndirilir

**Böyük Gədik** *or*, *mür*. Qazax r-nunda dağ Coğaz çayının sol sahilində yerləşir Hün 130 m Oronim *böyük* (ölçü bildirir) və *gədik* (silsilənin batıq hissəsi, hündür dağarası yol) komponentlərindən düzəlib

**Böyük Gərdin** *or* *mür* Qazax r-nunun q -ində, Ermənistanla sərhəddə dağ Hün 1137 m Oronimin ikinci komponenti *gərdənə* termininin təhrif olunmuş formasıdır *Gərdənə* uca dağ silsilələri arasında maili səhəyə deyilir Oronimin birinci komponenti isə obyekti ölçü cəhətdən təsvir edir

**Böyük Gilətağ** *oyk*, *mür* Zəngilan r-nunun Gilətağ i ə v -də kənd Oxçu çayının (Arazın qolu) sol sahilindən 10 km aralı, Bərgüşad silsiləsinin ətəyindədir Keçmiş adı İydəli Gilətağ olmuşdur Bəzən Böyük Gilyataq variantında da təsadüf edilir XIX əsrə aid mənbələrdə isə Kıratağ variantında qeydə alınmışdır Kəndin ərazisi keçmişdə Xocahan (Qubadlı r-nu) bəylərinə məxsus olmuşdur Kıratağ kəndinin əkin sahəsi az olduğu üçün onun camaatı bu ərazini Xocahan bəylərindən almış və əkin yerinə çevirmişdir XIX əsrin ortalarında Kıratağdan bəzi ailələr köçərək burada həmişəlik məskunlaşmışlar Yeni yaşayış məntəqəsi də keçmiş kəndin adı ilə adlandırılmışdır *Böyük* sözü eyniadlı yaşayış məntəqələrini fərqləndirmək üçün artırılmışdır Toponimik termin kimi *gıla/kirə* komponenti "əkilməmiş sahə", "daş-kəsəkli yer", *tağ* sözü isə "gilli yer, bitkisiz, otsuz yer" mənalarında işlənir

**Böyük Göl** *hidr* *mür* Kəlbəcər r-nu ərazisində göl Tərtər çayının mənbə hissəsində, Sarımsaqlı dağının c -ş -indədir Göl sahəsinin böyüklüyünə görə belə adlandırılmışdır

**Böyük Göyüşlü** *oyk.*, *mür*. Bərdə r-nunun Kolayır i ə v -də kənd Qarabağ düzündədir Etnotoponimdir Kəndin *göyüşlü* nəsli tərəfindən salınması güman edilir 1933-cü ildə kəndin adı Böyük Göyüc kimi qeydə alınmışdır Birinci komponent yaşayış məntəqəsini Kiçik Göyüşlü kəndindən fərqləndirmək üçün əlavə edilmişdir

**Böyük Həmyə** *oyk*, *mür* Siyəzən r-nunun Həmyə i ə v -də kənd Samur-Dəvəçi ovalığındadır Keçmiş adı Ərəb Həmyə olmuşdur *Həmyə* ərəb dilindəki *həmyun* sözündən olub, "himayə edən" deməkdir *Böyük* fərqləndirici sözdür

**Böyük Hərami** *or*, *mür* Şamaxı r-nunda dağ Pirsaat çayının orta axarlarından sağda yerləşir, yarğanlarla parçalanmışdır. *Hərami* (oğru, soyğunçu, qaçaq) deməkdir Görünür, dağda qaçaq-quldurların gizlənməsi ilə bağlıdır Oronimin birinci komponenti isə dağın sahəsinin həcmini ifadə edir

**Böyük Həsən Nanoy** *or*, *mür*. Şəmkir r-nunun ərazisində dağ Şahdağ silsiləsinin şm yamacında, Şəmkir çayı ilə onun sağ qolu Qoşqar çayının suayrıcında yerləşir Hün





2672 m. XIX əsrdə bu ərazidə eyniadlı kənd də qeydə alınmışdır Oronim Həsənnənə variantında aşıq ədəbiyyatında tərənnüm olunmuşdur. Həsənnənə Həsənbaba oronimi ilə birlikdə vəsf edilmişdir *Nanoy* dialektlərdəki *nanük/naniy/nanıx* (aciz, zəif, kiçik) sözünün yerli tələffüz formasıdır Həsənbaba – "böyük Həsən", Həsənnanoy isə "kiçik Həsən" deməkdir Oronimin birinci komponenti isə, görünür, iki hissədən ibarət olan bu dağın böyük hissəsinin adlandırılmasında iştirak edir

**Böyük Xınıslı** *oyk.*, *mür* Şamaxı r-nunun Şamaxı şəhər i.ə v -də kənd Xınıslı çayının (Zoğalavay çayının qolu) sağ sahilində, Meysəri silsiləsinin (Böyük Qafqaz) ətəyindədir. Əvvəllər r-nun ərazisində Kiçik Xınıslı (və ya Dərə Xınıslısı) kəndi də olmuşdur İndi bu kənd Şamaxı şəhərinin bir məhəlləsidir Orta əsrlərdə Türkiyədə Xınıslı adlı şəhər və vilayət olmuşdur Səlcuqilər, Səfəvilər dövlətlərinin siyasi həyatında mühüm rol oynamış *xınıslıların* adını daşıyır Etnotoponimdir

**Böyük Xoşdarlı** *oyk*, *mür* Tovuz r-nunun Yanıqlı i ə v -də kənd. Çınqıl silsiləsinin ətəyindədir Yaşayış məntəqəsi dağlıq ərazidə, Zəyəm çayının hər iki sahilində vaxtilə mövcud olmuş karvan yolunun üstündə Xan körpüsünün üstündəki keçid yolu ağzında yerləşir. Qədim mənbələrdə *qoş/koş/xoş* fonetik tərkibləri iki mənada qeydə alınmışdır "köç, köçəri" və "ağıl" (isti hava şəraitində qoyun-quzu saxlanan yer), *-dar* fars mənşəli olub, isimlərə qoşularaq vəzifə bildirən substantiv isimlər yaradan şəkilçidir *-lı* isə varlıq bildirir Toponimin izahı yaşayış məntəqəsinin karvan (köç) yolunun ağzında yerləşməsi ilə bağlıdır

**Böyük İşıqlı** *or*, *mür* Laçın r-nunun c -q -ində, Ermənistanla sərhəddə dağ Qarabağ yaylasında ən yüksək zirvələrdən biridir Hün 3552 m Yamacında İşıqlı Qaragölü yerləşir *İşıqlı* komponenti dağın (başı daim qarla örtülü olduğundan) işıq saçdığını, parıldadığını bildirir

**Böyük Kəhrizli** *oyk*, *mür* Ağcabədi r-nunun Kəhrizli i ə v -də kənd Qarqar çayının sol sahilindən 2 km aralı, Qarabağ düzündədir Ərazidəki Bala Kəhrizli kəndindən fərqləndirmək üçün belə adlandırılmışdır *Kəhriz* "içməli suyu olan quyu, bulaq" deməkdir

**Böyük Kəngərli** *oyk.*, *mür* Kürdəmir r-nunun eyniadlı i ə v -də kənd Yuxarı Şirvan kanalının sahilində, Şirvan düzündədir Etnotoponimdir Birinci komponent ərazinin sahəsinin genişliyini bildirir

**Böyük Kəsik** *or*, *mür* Qazax r-nunda Qarayazı çölünə doğru uzanmış alçaq sıra dağlardır Ən hündür nöqtəsi 330 m Oronim *böyük* və *kəsik* (dağ sırasının alçaq hissəsi, təbii kəsilmiş yer) komponentlərindən düzəlib, "Kəsik dağının hündür hissəsi, zirvəsi" deməkdir

**Böyük Kəsik** *oyk*, *sadə* Ağstafa r-nunun Sadıqlı i ə v -də qəsəbə Yaşayış məntəqəsi adını eyniadlı dağın adından almışdır

**Böyük Kirs** *or* *mür* Laçın, Xocavənd və Şuşa r-nlarının sərhədində dağ Hün 2725 m Qarabağ silsiləsində ən yüksək zirvələrdən biridir Allı çayı Böyük Kirsdən başlanır Kiçik Kirs oronimindən fərqləndirmək məqsədilə belə adlandırılmışdır *Kirs* toponimik termin kimi "şiş təpə, sıldırım dağ" mənalarında işlənir

**Böyük Kolatan** *oyk* *mür* Masallı r-nunun eyniadlı i ə v -də kənd Viləş çayının sağ sahilindən 6 km aralı, Lənkəran ovalığındadır Külətan variantında da qeydə alınmışdır Əvvəllər bu ərazidə bir Kolatan kəndi mövcud idi Sonralar indiki Kiçik Kolatan yaşayış məntəqəsi yarandıqda keçmiş Kolatan kəndi Böyük Kolatan adlandırılmışdır Talış dilində "meşədə təmizlənmiş, açılmış sahə" (tala) *külət* adlanır

**Böyük Qacar** *oyk* *mür* Bərdə r-nunun Şirvanlı i ə v -də kənd Qarabağ düzündədir Oykonim *qacar* tayfa adı ilə bağlı yaranmışdır *Böyük* sözü toponimi digər eyniadlı yaşayış məntəqələrindən fərqləndirmək üçün əlavə edilmişdir 1933-cü ildə Böyük Qəcər variantında qeydə alınmışdır

**Böyük Qafqaz** *or*, *mür* Qafqazda dağ sistemi Qara dənizlə Xəzər dənizi arasındadır Şimali Qafqazı Cənubi Qafqazdan ayırır *Böyük* burada fərqləndirici, eyni zamanda ölçü bildirən sözdür

**Böyük Qaladərəsi** *oyk., mür.* Şuşa r-nunun eyniadlı i.ə.v.-də kənd. Qarabağ silsiləsinin ətəyindədir. Keçmiş adı Köhnəkənd, Sovet hakimiyyəti illərində Kirov, Metsqaladərəsi olmuşdur. 1992-ci ildən bu adla rəsmiləşdirilmişdir. Oykonim "Qala (Şuşa nəzərdə tutulur) dərəsindəki böyük kənd" deməkdir.

**Böyük Qaramurad** *oyk., mür.* Gədəbəy r-nunun eyniadlı i.ə.v.-də kənd. Qaramurad çayının (Zəyəm çayının qolu) sahilində, Şahdağ silsiləsinin ətəyindədir. Toponim *Qaramurad* şəxs adı ilə bağlıdır. Birinci komponent yaşayış məntəqəsini həcm cəhətdən eyniadlı digər yaşayış məntəqəsindən fərqləndirir.

**Böyük Qarasu** *hidr., mür.* Kürdəmir və Ucar r-nları ərazisində Göyçay çayının daşqın sularından əmələ gəlmiş göl-bataqlıq. *Böyük* (iri) və *qarasu* (yeraltı sular) sözlərindən düzəlib "Yeraltı sulardan qidalanan böyük göl" deməkdir.

**Böyük Qışlaq** *oyk., mür.* Tovuz r-nunun eyniadlı i.ə.v.-də kənd. Əsrik çayının (Axınca çayının qolu) sol sahilində, Murğuz silsiləsinin (Kiçik Qafqaz) ətəyindədir. Yerli əhalinin verdiyi məlumata görə, kəndi XVIII əsrin sonu, XIX əsrin əvvəllərində Qarabağdan köçüb gəlmiş ailələr *qışlaq* yerində salmışlar. Ona görə də kənd belə adlandırılmışdır. *Böyük* sözü isə kəndi eyniadlı digər yaşayış məntəqələrindən fərqləndirməyə xidmət edir.

**Böyük Qəbu** *hidr., mür.* Şəki r-nu ərazisində çay. Hidronim "böyük dərə" mənasındadır.

**Böyük Qoşqar** *hidr., mür.* Daşkəsən r-nu ərazisində çay. Şəmkir çayının sağ qoludur. Çay öz adını Qoşqar dağının adından almışdır. Birinci komponent isə eyniadlı iki su hövzəsini bir-birindən fərqləndirmək, eyni zamanda hövzənin uzunluğunu, həcmini bildirmək məqsədilə artırılmışdır.

**Böyük Qubah** *or., mür.* Balakən r-nu ərazisində, Baş Qafqaz silsiləsinin qolu üzərində zirvədir. Balakən çayı ilə Mazım çayının suayrıcını təşkil edir. Hün. 2101 m. Oronim "böyük qübbə, böyük yüksəklik, bürc" deməkdir.

**Böyük Mərcanlı** *oyk., mür.* Cəbrayıl r-nunun eyniadlı i.ə.v.-də kənd. Araz çayının sol sahilindən 2 km aralı, düzənlikdədir. Keçmiş adı Mərcanlı olmuşdur. Yaşayış məntəqəsini XIX əsrdə Qarabağ xanı İbrahimxəlil xanın oğlu Cəfərqulu xanın mülkü olmuş Lənbəran kəndindən (Bərdə r-nu) köçürülmüş *mərcanlı* nəslinə mənsub ailələr Maralyan kəndinin ərazisində salmışlar. Sonralar Mərcanlı kəndindən köçən bir qrup ailə Yuxarı Mərcanlı kəndinin əsasını qoydular. Qarşılığı Cocuq Mərcanlı olmuşdur.

**Böyük Mişovdağ** *or., mür.* Əli Bayramlı r-nunun c.-ş. hissəsində dağ. Hün. 292 m. Türk dillərində *mışa* "ayrı", "arakəsmə" mənalarında işlənmişdir. Oronim "uzun arakəsmə dağ" deməkdir.

**Böyük Murovdağ** *or., mür.* Balakən r-nu ərazisində dağ. R-n mərkəzindən şm.-ş.-də yerləşir. Hün. 3381 m. Böyük Mourov variantında da qeydə alınmışdır. *Murov* komponenti toponimiyada "suayrıcı" mənasında işlənir. *Böyük* komponenti isə dağı eyniadlı digər dağ adından fərqləndirmək üçün əlavə edilmişdir. Oronim "böyük suayrıcı dağı" deməkdir.

**Böyük Muruq** *oyk., mür.* Qusar r-nunun Əcəxur i.ə.v.-də kənd. Yan silsiləsinin (Böyük Qafqaz) ətəyindədir. Yerli əhali arasında Çexi Murux da deyilir. Güman etmək olar ki, *murux-muxur* sözünün fonetik dəyişikliyə uğramış formasıdır. Toponimiyada *Muxur* "keçə alaçıq" mənasında işlənir. Oykonim "böyük oba, böyük aul" mənasındadır.

**Böyük Oriyat** *oyk., mür.* Neftçala r-nunun eyniadlı i.ə.v.-də kənd. Düzənlikdədir. 1933-cü ildə Böyük Oryad variantında qeydə alınmışdır. Keçmişdə Kürün sağ sahilində Köhnə Oriyat, sol sahilində isə Yeni Oriyat adlı iki kənd olmuşdur. Köhnə Oriyat sonralar Böyük Oriyat adı ilə əvəz olunmuşdur. Etnotoponimdir. Monqolların *uryat* tayfasının adındandır. Keçmiş Şəki və Quba xanlığında da Oriyat adlı yaşayış məntəqələri olmuşdur.

**Böyük Pirəli** *oyk., mür.* Qəbələ r-nunun eyniadlı i.ə.v.-də kənd. Topalançayın (Türyan çayının qolu) sahilində, Alazan-Həftəran vadisindədir. 1933-cü ildə Böyük Pirəli variantında qeydə alınmışdır. Keçmiş adı *Pirəlili* olmuşdur. Etnotoponimdir. XIX əsrdə bu kənddən çıxmış ailələr Kiçik Pirəlli (Cocuq Pirəli də adlanır) kəndini saldıqdan sonra əvvəlki kənd Böyük (əsas) Pirəli adlanmışdır.

**Böyük Siyəki** *or., mür.* Abşeron yarımadasında dağ. Sumqayıt şəhəri ərazisində Kənda çayı ilə Çigil çayı arasında yerləşir. Hün. 792 m. Dağın adı tat dilində "böyük qara dağ" kimi izah olunur.

**Böyük Söyüdlü** *oyk., mür.* Oğuz r-nunun eyniadlı i.ə.v.-də kənd. Türyan çayının sağ sahilindən 6 km aralı, Daşüz silsiləsinin ətəyindədir. XIX əsrin əvvəllərinə aid sənədlərdə Söyüt formasında qeydə alınmışdır. XIX əsrin ortalarında həmin kənddən Bala Söyüdlü (hazırda mövcud deyil) adlı başqa bir yaşayış məntəqəsi yarandıqdan sonra əvvəlki kənd Böyük Söyüdlü adlandırılmışdır. Bəzi tədqiqatçıların fikrincə, toponim uyğurların *soyat* tayfasının adındandır.

**Böyük Suval** *or., mür.* Qusar r-nunda, Qusar çayının sol sahilində dağ. Hün. 1906 m. Oronim *böyük* və *suval* (ləzgi dilində "dağ") sözlərindən ibarət olub, "böyük dağ" deməkdir.

**Böyük Şamlıq** *oyk., mür.* Tovuz r-nunun Qərbli i.ə.v.-də kənd. Kiçik Qafqaz dağlarının yamacındadır. Kəndin yaxınlığındakı Şəkərbəy dağlarının yamacları şam ağacları ilə zəngin olduğu üçün belə adlandırılmışdır. Buradakı *böyük* sözü ərazinin həcmcə genişliyini bildirir.

**Böyük Tağlar** *oyk., mür.* Xocavənd r-nunun eyniadlı i.ə.v.-də kənd. Dağətəyi ərazidədir. XIX əsrdə burada gəlmə ermənilər yerləşdirildikdən sonra kəndin adı tədricən erməniləşdirilərək Metstağlar (*mets* ermənicə "böyük" deməkdir) kimi rəsmiləşdirilmişdi. Toponimin əsasını təşkil edən *taq/tağ* sözü türk dillərində "sahə", "məhəllə", "yer" mənasındadır, *-lar* cəm şəkilçisi, *böyük* isə fərqləndirici sözdür. 1992-ci ildən kəndin adı özünə qaytarılmışdır.

**Böyük Tava** *or., mür.* Xəzər dənizində Abşeron arxipelaqı adalarından biridir. Pirallahı adası ilə Çilov adası arasında yerləşir. Uzunluğu 550 m., eni 180 m.-ə yaxındır. Şm. hissəsi daşlıq, c. hissəsi qumluqdur. *Tava* coğrafi termin olub, "sal daş, yastı daş" mənasında işlənir. Adaya ad onun relyef xüsusiyyətinə görə verilmişdir. *Böyük* komponenti fərqləndirici xüsusiyyətə malikdir.

**Böyük Turut** *or., mür.* Şəki yaylasının q. hissəsində dərə. Dərədən Turut çayı axdığı üçün belə adlanır. Tədqiqatçıların fikrincə, Turut, Tərtər, Sərsur, Turtu, Turtur variantlarında qeydə alınmış bu toponimin iki min illik tarixi var. Qarabağın böyük çayı sayılan Tərtər Turutun paralellərindən biridir. *Tərtər* qıpçaq tayfalarından birinin adıdır.

**Böyük Umalla** *or., mür.* Balakən r-nunda dağ. Oronim *böyük* və *umalla* (umumal/umumul Qafqaz dillərində "ata" deməkdir) komponentlərindən düzəlib, "böyük ata" mənasındadır.

**Böyük Zirə** *or., mür.* Xəzər dənizində, Bakı arxipelaqında ada. Bakı buxtasını dənizdən ayıran adalardan ən böyüyüdür. Toponimin tərkibindəki *zirə* komponenti ərəb dilindəki *cəzirə* (ada, yarımada) sözündəndir. XVIII əsrin əvvəllərində Xəzərin q. sahillərinə, Bakı üzərinə yürüş edən I Pyotrun gəmiləri Bakı arxipelaqına daxil olduqda topoqraflar adanı Nargin (Baltik dənizində Fin körfəzindəki eyniadlı adanın adı) adlandırmışdılar. Sonralar bu ad elə də rəsmiləşdirilmişdi.

**Böyükdaş** *or., mür.* Ağdərə r-nunda, r-n mərkəzindən c.-da dağ. Hün. 833 m. Mənbələrdə Böyükdaş variantında da qeydə alınmışdır. Oronim birinci variantda eyniadlı iki dağın həcmcə böyüyünü, ikinci variantda isə dağın (daşın) böyüklüyünü göstərir.

**Böyükçay** *hidr., mür.* Zaqatala r-nu ərazisində çay. Çay ərazidəki su obyektlərinə nisbətən uzunluğu ilə fərqləndiyinə görə bu adı almışdır.

**Böyükdaş** *or., mür.* Qaradağ (Bakı) r-nunda, Qobustan qəs.-də və Duvannı d.y. stansiyasından 4 km q.-də, Abşeron yaşlı əhəngdaşı ilə örtülü dağ və tunc dövrü yaşayış yeri. Zirvəsi yastıdır, hər tərəfdən 10-15 m hündürlükdə uçurumla əhatə olunmuşdur. Ehtimal ki, qədim qobustanlılar Böyükdaşın zirvəsindən vəhşi heyvanları qovub uçuruma salmaq üçün təbii tələ, sonralar qonşu qəbilələrin hücumundan qorunmaq məqsədilə

yaşayış yeri – qala kimi istifadə etmişlər Kiçikdaş dağından hündür olduğu üçün belə adlandırılmışdır

**Böyükdağ** *or. mür.* 1. Abşeron yarımadasının mərkəzi hissəsində palçıq vulkanıdır Hün. 110 m. Kiçik dağ palçıq vulkanından çökəkliklə ayrılır; 2. Lerik r-nu ərazisində dağ. Dağ yüksək, böyük olmasına görə belə adlandırılmışdır

**Böyükdüz** *or. mür.* Babək r-nu ərazisində düz. Araz çayının sol sahili boyu uzanır. Düzənliyin ümumi meyli Arazın yatağına doğrudur. Yarımsəhra təbiətə malik olan bu ərazidən qış otlağı kimi istifadə edilir. Oronim düzün sahəsinin genişliyini bildirir. Ərazidə Böyükdüz dağı da vardır. Hün. 957 m. Coğrafi obyekt geniş ərazini əhatə etdiyi üçün belə adlandırılmışdır.

**Böyükdüz** *oyk., sadə* Babək r-nunda kənd. Böyükdüz adlı sahədə salındığı üçün belə adlandırılmışdır

**Böyüknohur** *hidr., mür.* Quba r-nu ərazisində göl. *Böyük* və *nohur* (monqol "göl") sözlərindən ibarət olan bu hidronim obyektin sahəsinin böyüklüyünü bildirir

**Böyükşor** *hidr., mür.* Abşeron yarımadasının mərkəzi hissəsində axarsız şor göldür. Səviyyəsi sabit deyildir. Sahəsi 10 kv. km. Yod istehsal edir. Keçən əsrin 40-cı illərinədək göldən duz çıxarılırdı. Abşeronda bütün duzlu sahələrə, göllərə *şor* deyilir. Sahəsinin nisbətən genişliyinə görə bu adı almışdır

**Böyükşor** *oyk., sadə* Bakı şəhərində qəsəbə. Böyükşor gölünün yaxınlığındadır. Adını eyniadlı göldən almışdır

**Böyüktala** *oyk., mür.* Balakən r-nunun Hənifə i.ə.v.-də kənd. Alazan-Əyriçay çökəkliyindədir. Böyük Tala adlı sahədə salındığına görə kənd həmin yerin adı ilə adlandırılmışdır. *Tala* "meşədə ağacsız yer, açıqlıq" deməkdir. Talanın sahəsinin böyüklüyü oykonimdə əks olunmuşdur

**Brazmançay** *hidr., mür.* Cəlilabad r-nunda çay. Hidronim *bır* (talış dilində "qol", "budaq"), *azman* (böyük) və *çay* (su hövzəsi) komponentlərindən ibarət olub, "böyük çayın qolu" deməkdir

**Brne** *hidr., sadə* Yardımlı r-nu ərazisində çay. Hidronim *bır* ("qol", "budaq") və *-ne* (Azərb. toponim yaradıcılığında iştirak edən topoformant. Müq. et. Xılxına, Kırna, Bilnə, Zərnə, Zərdənə və s.) komponentlərindən düzəlib, "qol" (burada çay qolu) deməkdir. Altayda qeydə alınmış Barnaul toponiminin birinci komponenti bu hidronimlə paralellik təşkil edir.

**Bucaq** *hidr., sadə* Oğuz r-nu ərazisində çay. Etnohidronimdir. Türkdilli bulqarların bir qolu olan *bucaqların* adındandır. Qax r-nunun İlisu kəndində *bucaq tabun* adlı nəsil qeydə alınmışdır

**Bucaq** *oyk., sadə* Oğuz r-nunun eyniadlı i.ə.v.-də kənd. Daşağıl çayının sol sahilində, Baş Qafqaz silsiləsinin ətəyindədir. XIX əsrdə kəndin ərazisində Güllü Bucaqlı adlı icma olmuşdur. Sonralar onların bir hissəsi Daşağıl kəndi yaxınlığında yerləşdiyinə görə Bucaq Daşağıl, digər hissəsi isə Muxas kəndi yaxınlığında olduğuna görə Muxas Bucaqlı adlanmışdır. Kənd Qozluçayın sahilində yerləşdiyinə görə Qozlu Bucaq da adlanırdı. Etnotoponimdir. Türkiyədə Bucaq, Moldovada Bucaq çölü və Bucaq adlı yaşayış məntəqəsi var

**Buçaydərə** *hidr., mür.* Oğuz r-nu ərazisində çay. Hidronim *bu* (qədim türk dillərində "buxar", "su buxarı", "suyun üzərində duman"), *çay* (su hövzəsi) və *dərə* (mənfi relyef forması) sözlərindən düzəlib, "dumanlı çay dərəsi" deməkdir

**Budaqdərə** *oyk., sadə* Laçın r-nunun Şəlvə i.ə.v.-də kənd. Qarabağ yaylasındadır. Kənd Budaqdərəsi adlı yerdə salındığı üçün belə adlandırılmışdır. Etnotoponimdir. 1933-cü ildə İmişli (Qaradonlu) r-nu ərazisində Budaqlı adlı kənd də qeydə alınmışdır

**Buduq** *or., sadə* Quba r-nunun Buduq kəndi yaxınlığında dağ. Hün. 2045 m. Etnotoponimdir

**Buduq** *oyk. sadə* Quba r-nunun eyniadlı i.ə.v.-də kənd. Qaraçayın sol sahilindən 2 km aralı, Yan silsiləsinin yamacındadır. Azərb-nın qafqazdilli etnik qruplarından biri olan *buduqluların* məskun olduğu kəndlərdən biridir. Etnotoponimdir

**Buduq** *hidr., sadə* Quba r-nunun Buduq kəndi yaxınlığında min. bulaq. Kükürd qoxulu 2 isti bulaqdan ibarətdir. Etnotoponimdir





**Buxovludağ** *or., mür.* Zaqatala r-nu ərazisində dağ. Türk dillərində *buk/bux* "meşə", *bukov* "meşə ilə örtülmüş" mənalarında işlənir. Oronim "meşə ilə örtülmüş dağ" deməkdir

**Buğadaş** *or., mür.* Şuşa r-nunun Zarıslı kəndindən c.-da dağ. Hün. 2154 m. Turşsu qəsəbəsi ilə Zarıslı kəndinin sərhədindədir. Oronim *buğa* (erkək maral və ya ümumiyyətlə iribuynuzlu heyvanların erkəyi) və *daş* (qaya, dağ) komponentlərindən düzəlib. Dağ ətrafında tez-tez buğa görünməsinə görə bu adı almışdır. Özbəkistanda Buka, Rusiyanın Çita vilayətində Bukaçaça, Ukraynada Bukaçay toponimləri qeydə alınmışdır

**Buğdadağsu** *hidr., mür.* Gədəbəy r-nu ərazisində çay. Mənbəyini Daşkəsən r-nundakı Boğda dağının ətəyindən aldığına görə çay belə adlandırılmışdır. Hidronimdə dağın adı bir qədər təhrifə uğramışdır (o ~ u)

**Bulaqotağı** *oyk., sadə* Ağdaş r-nunun Qəsil i.ə.v.-də kənd. Şirvan düzündədir. 1917-ci ildə oykonim Bulaqyatağı şəklində qeydə alınmışdır. Güman etmək olar ki, coğrafi adın əsli elə budur. Oykonim *bulaq* (yeraltı suların yerin üstünə təbii çıxışı) və *yataq* (mənbə) sözlərindən düzəlib, "bulağın mənbəyi, çıxdığı yer" deməkdir

**Bulanıq** *hidr., sadə* Goranboy r-nu ərazisində çay. Çayın suyu tutqun, bulanıq olduğu üçün belə adlandırılmışdır

**Bulanıqçay** *hidr., mür.* 1. Dəvəçi r-nu ərazisində çay; 2. Balakən r-nu ərazisində çay. Hidronim *bulanıq* (tutqun, çirkli) və *çay* (su hövzəsi) sözlərindən düzəlib, çay suyunun keyfiyyətini, rəngini bildirir

**Bulanıqsu** *hidr., mür.* 1. Qax r-nu ərazisində çay. Qurmux/Kürmük çayını əmələ gətirən qollardan biridir; 2. Ağdərə r-nunda çay. Keşişkənd çayı da adlanır. Bəzi mənbələrdə Bulanıqsu variantında da qeydə alınmışdır. Suyu bulanıq, tutqun, qeyri-şəffaf olduğu üçün belə adlandırılmışdır

**Bulduq** *oyk., sadə* Sabirabad r-nunun Ulacalı i.ə.v.-də kənd. Kür çayının sahilində, Muğan düzündədir. Kəndin adı türk dillərindəki *bulunluq* sözünün təhrif formasıdır. Oykonim *bulun* (künc, çay körfəzi, buxta, çay döngəsi) və -duq (-luq) komponentlərindən ibarət olub, "çay döngəsi" mənasındadır. Kənd həqiqətən Kür çayının sahilində, onun bulunduğu, buruldüğu yerdədir

**Bulla** *or., sadə* Bakı arxipelaqında ən böyük adadır. Ada palçıq vulkanının püskürməsindən əmələ gəlmişdir və hazırda burada fəaliyyətdə olan vulkan var. Adada qoruq təşkil edilmişdir. Digər adı Xərə Zirədir. Oronim XVIII əsrdən etibarən Xəzər sahillərində kəşfiyyatla məşğul olmuş avropalıların adaya verdiyi addır. *Bulla* latın dilində "girdə yer, halqa" deməkdir

**Buludlu** *oyk., sadə* İmişli r-nunun Təklə i.ə.v.-də kənd. Düzənlikdədir. Kənd təklələrin *buludlu* (*bulutlu*) nəslinin adını daşıyır. Etnotoponimdir

**Buludyer/Buludyeri** *or., mür.* Quba r-nunda dağ. Qaraçay və Babaçay çaylarının suayrıcında yerləşir. Hün. 2254 m. Dağın adı zirvəsinin tez-tez buludla örtülməsi ilə əlaqədardır. Etnotoponim də ola bilər

**Bulutan** *oyk., sadə.* Xocavənd r-nunun eyniadlı i.ə.v.-də kənd. Qarabağ silsiləsinin ətəyindədir. 1823-cü ilin məlumatına görə, kənd cəmi bir ailədən ibarət məntəqə olmuşdur. Etnotoponimdir

**Bum** *hidr., sadə* 1. Qəbələ r-nunda çay. Türyan çayının sol qoludur. Baş Qafqaz silsiləsinin c. yamacından (3400 m. hündürlükdən) başlanır. Uzunluğu 51 km. Suvarma üçün istifadə olunur. Çayda bəzən güclü sel hadisələri də olur; 2. Qəbələ r-nunun Qəmərvan kəndindən 5 km. şm.-da Bum çayı dərəsində min. bulaq. Kükürd qoxuludur. Müalicə üçün istifadə edilir

**Bum** *oyk., sadə* Qəbələ r-nunun eyniadlı i.ə.v.-də kənd. Bum çayı sahilində, Kümə dağının ətəyindədir. Türk dillərində *bum/bom* "çayın dərəsi, çətin keçilən yeri" kimi izah olunur. Yaşayış məntəqəsi yerləşdiyi ərazinin adını daşıyır

**Bunud** *oyk. sadə* Qəbələ r-nunun Vəndam i.ə.v.-də kənd. Baş Qafqaz silsiləsinin ətəyindədir. XIX əsrin əvvəllərində Vəndam kəndindən yaranmış dörd kiçik məntəqədən (Nohurqışlaq, Seyidqışlaq, Həzrə və Bunud) biridir. Yerli əhali oykonimi Bulud kimi tələffüz edir. Kənd əvvəllər *Buludun suyu* adlı kiçik çayın sahilində salınmış, sonralar buraya

köçürülmüşdür Adını kende vermiş çay de öz adını *buludlu* neslinden almışdır

**Buratepe** *or*, *mür* Gedebey r-nu ile Ermenistanın Vardenis r-nu serhedinde, Şahdağ silsilesinde aşırım Hün 2880 m Şemkır çayının hövzesinden Göyçe gölü hövzesine geden quru yolu bu aşırımdan keçir Azerb. dilinin dialektlerinde *bura* sözü "dönge, aşırım" menalarında işlenir, *tapa* ise müsbet relyef formasıdır Başqırdıstanda Bura, Ermenistanda Burakan adlı yaşayış menteqeleri qeyde alınmışdır.

**Burkandul** *oyk.*, *sada* Lerik r-nunun Nüvedi i e v -de kend. Peştaser silsilesinin eteyindedir 1508-ci ilde Berkandul, 1917-ci ilde Burxandul, 1933-cü ilde Burqandul, 1961-ci ilde Brkandul variantlarında qeyde alınmışdır Tedqiqatçılar kendin adını talış dilindeki *bır* (böyürtken kolu) ve *kandul* (mağara, oyuq) sözleri esasında "böyürtkenli dere, oyuq" kimi izah edirler Rusiyanın Maqadan vilayetinde de Burkandya adlı yaşayış menteqesi var

**Burovar** *oyk.*, *sada* Celilabad r-nunun Lekin i e v -de kend Burovar silsilesinin yamacındadır Kend erazideki eyniadlı silsilenin adını daşıyır

**Burovar** *or* *mür* Lenkeran ve Celilabad r-nları erazisinde, Talış dağ sisteminde silsile Oronim talış dilindeki *bur* (hündür, yüksek) ve *var* (yer) sözlerinden düzelib, "hündür yer, yükseklik" menasındadır

**Burovdal** *or* *mür* İsmayıllı r-nu erazisinde dağ Adını erazideki eyniadlı yaşayış menteqesinden almışdır

**Burovdal** *oyk*, *sada* İsmayıllı r-nunun Heftesov i e v -de kend Babadağın eteyindedir Yerli ehali arasında Babaderesi ve ya Piredere de adlanır Oykonim *burov* (yükseklik) *dal /dul* (dere) sözlerinden düzelib, "dağın deresi" demekdir

**Bursut** *oyk*, *sada* Astara r-nunun Asxanakeran i e v -de kend Dağeteyi erazidedir Oykonimi tedqiqatçılar "alış-veriş yeri, bazar" menasında izah edirler Altayda Bursol adlı yaşayış menteqesi, Türkiyede Bursal şeheri var

**Buruc** *oyk*, *sada* Terter r-nunun Sarıcalı i e v -de kend Dağeteyi düzenlikdedir İlk defe XVI esre aid menbelerde Bürunciru variantında tesadüf olunur 1917-ci ilde Cavanşir qezasında Teze Bruc ve Bruc Hesenqaya adlı iki yaşayış menteqesi, Lenkeran qezasında Burçalı, 1933-cü ilde Zengilanda Burcalılar adlı kendler qeyde alınmışdır Menbelerin melumatına göre, kend evveller Ağdere r-nunun Şorbulaq adlı erazisinde olmuşdur 1918-ci ilde ermeni quldurları zamanı ehali indiki eraziye köçmüş, yeni yaşayış menteqesine evvelki adı verilmişdir. Ərazide Buruc adlı ekin yeri de var Kendin ehalisi kolanı tayfasına mensub ailelerden ibaretdir Azerb dilinin yerli dialektlerinde *burusux* "eyri, tutqun", *buruz* "edavet, kin", "acıqlı, kinli" menalarında işlenmekdedir.

**Buruq** *oyk.*, *sada* Lerik r-nunun Kirevud i.e.v -de kend Burovar silsilesinin yamacındadır Türkdilli komanların *buruk* tiresinin adı ile elaqelendirilir. XIX esrde Şimali Qafqazda Üç Buruqlu kendi qeyde alınmışdır

**Burunki** *or.*, *sada* Xezer denizinin adalarından biri "Çıxıntı" menasındadır

**Burunqovaq** *oyk.*, *sada* Xanlar r-nunun Poylu i e v -de kend Qabırrı çayının sahilinde, ovalıqdadır. XIX esrin sonunda iri mülkedar nesli olan Şahmalıyevlerin tabeliyinden çıxan Samux ehalisinin bir hissesi Qabırrı çayının aşağı axarında, çayın buruldugu yerdeki Burunqovaq adlı yerde mesken salmışdı Qovaqlıq indi de qalır Kend hemin yerin adı ile adlandırılmışdır *Burun* komponenti toponimiyada "çıxıntı" menasında işlenir 1917-ci ilde oykonim Burun Qonçaq variantında qeyde alınmışdır Ukraynada Burin, Qazaxıstanda Burunday, Şimali Osetiyada Buron adlı yaşayış menteqeleri de mövcuddur

**Burunlu** *oyk*, *sada* 1 Zengilan r-nunun Şayıflı i e v.-de kend Oxçu çayının (Arazın qolu) sahilinde, dağeteyi erazidedir Zengezur silsilesinde Xüstub dağının tirelerinden birinin sert döngeli çıxıntısında yerleşdiyi üçün bele adlanır Kendi derzili tayfasına mensub aileler salmışlar Yerli ehali terefinden Büründü kimi teleffüz edilir; 2 Zerdab r-nunun Melikli i e v -de kend Şirvan düzündedir Yaşayış menteqesi Burunlu adlı yerde salındığı üçün bele adlandırılmışdır







Kür çayı evveller bu eraziden keçirmiş ve onun sert eyildiyi yere Burunlu deyilmişdir Kendi XIX esrde müskürlü icmasına mensub aileler saldığına göre Burunlu Müskürlüsü de adlanmışdır

**Burunsuval/Burunoval** *or*, *mür* İsmayıllı r-nu erazisinde dağ Devebatan çayının sol sahilindedir Hün. 1110 m. Oronim *burun* (çıxıntı) ve *suval* (lay daş, tava, dağ) komponentlerinden düzelib, "dağ burnu" demekdir

**Burvend** *oyk*, *sada* Sabirabad r-nunun Xilemirzeli i e v -de kend. Kürün sol sahilinde, Şirvan düzündedir XIX esrde xilemirzeli tayfasının burada *Burvand* adlı oymağı olmuşdur. Sonralar oymaq böyüyerek kende çevrilmişdir 1917-ci ilde kendin adı Buravend kimi qeyde alınmışdır Etnotoponimdir

**Burzubend** *oyk.*, *sada*. Astara r-nunun Kijeba i e v -de kend. Lenkeran ovalığındadır Əsl adı Barzeband olmalıdır Toponim talış dilindeki *barz* (uca, hündür, yüksek) ve *band* (dağ, tepe) sözlerinden ibaret olub, "kiçik dağ", "tepe" menasındadır Kend öz adını eyniadlı dağdan almışdır Başqırdıstanda Burzyan adlı r-n da mövcuddur

**Burzunbul/Bürzünbül** *oyk*, *sada* Yardımlı r-nunun Hamarkend i e v -de kend Vileş çayının sahilinde. Peştesar silsilesinin yamacındadır Yerli ehalinin verdiyi melumata göre, kend orada mövcud olmuş Pirzumbul pirinin adındandır Müxtelif illerde Burzumbuli (1917), Bürzünbül (1933) variantlarında qeyde alınmışdır

**Buynuz** *oyk*, *sada* İsmayıllı r-nunun Topçu i e.v -de kend Buynuz dağının eteyinde, Alazan-Əyriçay çökekliyindedir Yaşayış menteqesi keçmişde Qızır ve Qerce kendlerinden köçüb gelmiş ailelerin meskunlaşması neticesinde yaranmışdır Kend adını Buynuz dağının adından almışdır Türk dillerinde *buynuz* sözü "ön, qabarıq hisse, çıxıntı" menalarında işlenmişdir Dağın adını mal buynuzuna oxşaması ile de elaqelendirirler

**Buzbulaq** *or*, *sada* İsmayıllı r-nu erazisinde dağ Dağ öz adını buradakı bulağın adından almışdır Bele ehtimal edirler ki, bulağa ad suyunun soyuq olması ile elaqedar verilmişdir *Buz/bus* sözü qedim türk dillerinde "dağ çıxıntısı", "burun" menalarında da işlenmişdir

**Buzduxqar** *oyk*, *mür* Kelbecer r-nunda qesebe Adını erazideki dağın adından almışdır

**Buzluq** *hidr*, *sada* Goranboy r-nu erazisinde çay Kürek çayının sağ qoludur Menbeyini Murovdağ silsilesinin şim yamacından (3360 m hündürlükden) Buzluq adlı yerden alır Uzunluğu 33 km Bala Kürek çayı da adlanır Adını öz menbeyinin adından almışdır Rusiyada Xopyor ve Samara çaylarının sol qolları da Buzulik adlanır

**Buzluq** *oyk*, *sada* Goranboy r-nunun eyniadlı i e v -de kend Buzluq çayı sahilinde, Murovdağ silsilesinin eteyindedir Kend adını Buzluq çayının adından almışdır Başqırdıstanda Buzdak, Rusiyanın Orenburq vilayetinde Buzuluk adlı yaşayış menteqeleri qeyde alınmışdır

**Buzluq** *or* *sada* Kelbecer r-nu erazisinde dağ Hün 2390 m Dağın quzey yerlerinde, qayalar arasında yay feslinde de buz olduğu üçün bele adlandırılmışdır Keçmişde dağ yaylaq yeri olmuşdur Dağın erazisinde Buzxana adlı yer de var

**Buzovdağ** *or* *mür* Şemkir r-nunda dağ Ceyir çayı ile Şemkir çayının suayırıcında yerleşir Hün 1671 m Dağda keçmişde buzovlar üçün ayrılmış otlaq sahesi olduğuna göre bele adlandırılmışdır Oronim rus dilinde tertib edilmiş xeritelerde *Telvaçi buqor* (Buzov Tepesi) kimi qeyde alınmışdır

**Buzovna** *oyk* *sada* Bakı şeheri, Əzizbeyov r-nunda ştq (1937-ci ilden) Xezer denizi sahilindedir Azerb -nın qedim yaşayış menteqelerindendir Toponimi qedim *bozakların* (bozoğuzların) adı ile elaqelendirirler Ehtimal etmek olar ki, deniz sahilinde yerleşen yaşayış menteqesi "çıxıntı, burun" menalı *buz* sözü ile bağlıdır

**Bülbüle** *oyk* *sada* Bakı şeheri, Suraxanı r-nunda ştq (1936-cı ilden). XIX esre aid menbede Bilbile kimi qeyd olunur Şor gölünün kenarındadır *Pilpila* (neftli qazın köpüklenib çıxdığı yer, palçıq vulkanı) sözünün tehrif forması hesab olunur Pirsaat çayı sahi-

linde Pilpile adlı palçıq püskürən kiçik dağ da var

**Bülbülüdağ** *or. mür* Şəki r-nu ərazisində dağ 1917-ci ildə Lənkəran qəzasında Bülbülü adlı yaşayış məntəqəsi qeydə alınmışdır Oronim "palçıq vulkanı" mənasında ola bilər Bu söz *bılbıla* formasında "ilğım" mənasında da işlənir

**Bülbültəsəv** *hidr., mür* Ağdərə r-nunda göl Gölün ilğımla bağlı olması güman edilir

**Büllurbulaq** *oyk., sadə* Xızı r-nunda kənd. Baş Qafqaz silsiləsinin ətəyindədir Vaxtilə burada gəlmə molokan ailələri yaşamış və yaşayış məntəqəsini buradakı bulağın adı ilə *Çistıy klyuç* adlandırmışlar Sonralar əhali yaşayış məntəqəsini tərk edib ətraf ərazilərə yayılmışdı. 1988-1989-cu illərdə Ermənistandan didərgin salınmış azərb ailələri burada yerləşdirilmiş və keçmiş dağ kəndi yenidən abadlaşdırılmışdır. Kənd öz adını ərazidəki saf bulaqdan almışdır

**Bülüdül/Bülüldül** *oyk., mür* Lerik r-nunun Osyedərə i ə v -də kənd Peştəsər silsiləsinin ətəyindədir Tədqiqatçılar toponimi *Bolı* (şəxs adı) və *dul* (hündür təpələr arasında çökəklik) komponentlərinin birləşməsi kimi "Bolının çökəkdəki sahəsi" mənasında izah edirlər Azərb -da yetişən *bülül* adlı lobyaya oxşar bitki növü də vardır Güman ki, *bülül* və *dul* (dərə) sözlərindən ibarət olan oykonimi "bülül yetişən dərə" mənasında da izah etmək olar

**Bülüldüz** *oyk., mür* Laçın r-nunun Təzəkənd i ə v -də kənd. Qarabağ silsiləsinin ətəyindədir Yaşayış məntəqəsi Ayıbazar və keçmiş İpək kəndindən çıxmış ailələrin Bülüldüz adlı yerdə məskunlaşması nəticəsində yaranmışdır Toponim haqqında söylənilən fikirlərdən onun "hamar düzənlik" mənasında olduğu anlaşılır Lakin bu, fitotoponim də ola bilər Oykonim 1933-cü ildə Bülüldüzü variantında qeydə alınmışdır

**Bülövlük** *oyk., düz* Laçın r-nunun Qoşası i ə.v -də kənd Mıxtökən silsiləsinin (kiçik Qafqaz) ətəyindədir Bəzi tədqiqatçıların fikrincə, oykonim *bülöv* (kəsici alətləri itiləyən daş) sözündən və çoxluq, yer, məkan bildirən *-lük* şəkilçisindən düzəlib, "bülöv daşı olan yer" mənasındadır Lakin dağlarda bitən ağ çiçəkli yabanı dərman bitkisinin adı da *bülöylüdür* Xırda heyvanların ayaqlarındakı xəstəliyi bu otla müalicə edirlər Güman ki, dağətəyi zonada yerləşən kəndin ərazisində *bülöylü* otunun zəngin olduğuna görə kənd belə adlandırılmışdır

**Bünyadabad** *oyk., mür* Yevlax r-nunun Nemətabad i ə.v -də kənd Qarabağ düzündədir 1926-cı ildən kəndin ərazisində vaxtilə (1918) Ermənistandan qovulmuş bir qrup azərb ailə məskunlaşmışdır Yaşayış məntəqəsi keçmiş inqilabçı Bünyad Sərdarovun (1889-1919) adını daşıyır Kənd bir müddət burada təşkil edilmiş Telman adına kolxozun adı ilə Telmankənd də adlanmışdır

**Bünyadlı** *oyk., sadə* 1 Beyləqan r-nunun eyniadlı i ə v -də kənd. Yuxarı Qarabağ kanalından 2 5 km aralı, Mil düzündədir Keçmiş adı Molla Bünyadlıdır *Mollabünyadlı* Mil düzündə yaşamış eyvazalılar (yaxud əmiralılar) adlı nəslin bir tirəsinin adıdır Etnotoponimdir; 2 Xocavənd r-nunda kənd Qarabağ silsiləsinin ətəyindədir Yaşayış məntəqəsi 1840-cı ildə Cənubi Azərb -nın Qaradağ mahalından köçüb gəlmiş ailələrin məskunlaşması nəticəsində yaranmışdır Etnotoponimdir 1917-ci ildə Bünyatlı variantında qeydə alınmış bu yaşayış məntəqəsi ilə yanaşı Lənkəran qəzasında Bünyatallar kəndinin olması haqqında da məlumat verilir

**Bürgütü** *or., sadə* Şəki r-nu ərazisində dağ. Daşüz silsiləsinin şm kənarındadır Oronim *Berkutlu* adının təhrif olunmuş forması hesab edilir, "berkut quşu olan dağ" kimi izah olunur

**Bürsülüm** *oyk., mür* Lerik r-nunun eyniadlı i ə v -də kənd Limər çayının (Lənkəran çayının qolu) sağ sahilində, Peştəsər silsiləsinin yamacındadır Yaşayış məntəqəsi XIX əsrin sonlarında Anzolu, Təngəbin və b kəndlərdən çıxmış ailələrin onlara məxsus qışlaq yerində məskunlaşması nəticəsində yaranmışdır Oykonim *bür/bürmə* (qalın kolluq) və *sülüm* (tikanlıq) sözlərindən düzəlib Oykonim qışlaq yerinə xas olan "kollu, tikanlı sahə" deməkdir





# Cc

**Cabanı** *oyk., sadə* Şamaxı r-nunda kənd. Dağətəyi ərazidədir Oykonim oğuz tayfalarından birinin adını əks etdirir Etnotoponimdir Çepni, Çebni, Cabani variantlarında Azərb ərazisində geniş arealda yayılmışdır Şərqi Avropa düzənliyində də rast gəlinir

**Cabanı** *hidr., sadə*. Şamaxı r-nunda, Cabanı kəndinin c -unda min. bulaqlar Suyu soyuq və kükürdlü olub, 12 bulaqdan ibarətdir Yerli əhali tərəfindən müalicə məqsədilə istifadə edilir Adını yerləşdiyi kəndin adından almışdır

**Caballıq** *or., düz.* Oğuz r-nu ərazisində dağ Əsli Caballıxdır *Caballıx* "çəkillik", "cır tut ağacları olan yer" deməkdir Fitooronimdir

**Cadar** *oyk., sadə.* Quba r-nunun Rustov i.ə v -də kənd Baş Qafqaz silsiləsinin ətəyindədir Kənd Rustov kəndinin keçmiş məhəllələrindən birinin adı ilə adlanır Etnotoponimdir Zaqatala r-nu ərazisində də Caddar nəsli qeydə alınmışdır

**Cafalı** *hidr., düz* İsmayıllı r-nu ərazisində çay Girdiman çayının sol qoludur Bəzən Qədçilə, bəzən də Cəfələ adlanır Xalq etimologiyasına görə, leysan zamanı çay daşaraq ətraf əhaliyə əzab-əziyyət verdiyi üçün Cəfalı adlandırılmışdır Azərb dilinin bir çox dialektlərində *cabal/caval* (*cafal*) cır tut ağacına deyilir Güman ki, çay öz adını ətrafındakı çəkillikdən və ya cır tut ağacları olan sahədən almışdır

**Cağadüz** *oyk. sadə* Xocavənd r-nunun eyniadlı i.ə v -də kənd Dağətəyi ərazidədir Sonralar burada məskunlaşmış ermənilər onu Sərkisaşen (Sərkis kəndi) kimi rəsmiləşdirmişdilər 1992-ci ildən kəndin keçmiş adı bərpa edilmişdir Kənd öz adını ərazidəki eyniadlı düzənlikdən almışdır *Cağa/çağa* (kiçik) və *düz* (mənfi relyef forması) sözlərindən düzəlib, "kiçik düz" deməkdir

**Cağanqaya** *or., mür* Oğuz r-nunda dağ Etnooronimdir Abşeronda Şağan (kənd), Qazaxıstan ərazisində Çağan, Sarışağan (qəsəbə), Dağlıq Altayda Şaqani (göl), Şimali Çində Tsaqan və s toponimlər bu etnonimlə bağlıdır

**Cağazur** *oyk., sadə* 1 Laçın r-nunun Malıbəy i.ə v -də kənd Qarabağ yaylasındadır; 2 Şərur r-nunun Yaycı i ə.v -də kənd Dərələyəz silsiləsinin ətəyindədir 2003-cü ildən Şahbulaq adı ilə rəsmiləşdirilmişdir *Cağa* (kiçik) və *zur* (yüksəklik) komponentlərindən ibarət olan bu oykonimlər ərazinin coğrafi mövqeyini əks etdirir

**Cahangirbəyli** *oyk., düz* Zəngilan r-nunun eyniadlı i.ə v -də kənd Oxçu çayının sahilindədir Yaşayış məntəqəsi XIX əsrdə Tərəkəmə (indiki Məmmədbəyli) kəndindən köçüb gəlmiş Cahangirbəy adlı şəxs tərəfindən salındığı üçün belə adlandırılmışdır Oykonim "Cahangir bəyə məxsus kənd" deməkdir Antropotoponimdir

**Cahanlı** *hidr sadə* Dəvəçi r-nunda çay Gilgil çayının sağ qoludur Hidronim *cahanlı* nəslinin adını daşıyır

**Cahanlıarx** *hidr., mür* Zaqatala r-nunda çay Tala çayından ayrılıb sol tərəfdən Qanıx çayına tökülür Hidronim *cahanlı* (etn.) və *arx* (çay qolu) komponentlərindən düzəlib

**Cahidli** *oyk., sadə* Tovuz r-nunun Vahidli i ə v -də kənd Etnotoponimdir

**Cahud** *hidr., sadə* Quba və Xaçmaz r-nlarında çay Etnotoponimdir

**Caqar** *oyk., sadə* Qusar r-nunun Zindanmuruq i ə v -də kənd Qızılqaya dağının (Böyük Qafqaz) yamacındadır Bəzi tədqiqatçıların fikrincə, toponim türk dillərindəki *caqar* (qaladan kənarda divarla əhatə olunmuş, möhkəmləndirilmiş yer) sözü ilə bağlıdır Lakin *caqar* sözü dilimizdə "cadarlanmaq" mənasında da işlənir. R-nun ərazisində çəkilmiş və 1973-cü ildə istifadəyə verilmiş Caqar-Cibir kanalı bu ərazilərin həqiqətən də susuz olduğunu göstərir Samur çayından başlanan bu kanal 45 6 km uzunluğa malik olub, Qusar r-nu ərazisində 4 min ha torpaq sahəsinin suvarılmasına xidmət edir

**Caqarqışlaq** *oyk., mür* Qusar r-nunun Zindanmuruq i ə v -də kənd Dağətəyi düzənlikdədir Oykonim *Caqar* (kənd adı) və *qışlaq* komponentlərindən düzəlib Kənd Caqar kəndinə məxsus keçmiş qışlaq yerində salındığı üçün belə adlandırılmışdır

**Calair/Calair** *or. sadə* Quba r-nunda dağ. Baş Qafqaz silsiləsinin zirvəsidir. Hün. 2800 m. Etnotoponimdir.

**Calut** *oyk., sadə* Oğuz r-nunun Oğuz şəhər i.ə.v.-də kənd. Alazan-Həftəran vadisindədir. Caluq variantında da qeydə alınmışdır. *Cal/cil* Azərb.-də "sucaq yer", "otlu bataqlıq", "çay qollarının birləşdiyi yer"ə deyilir. Toponim coğrafi obyektin landşaftı haqqında məlumat verir.

**Camal** *or., mür.* Şahbuz r-nunda dağ. Zəngəzur silsiləsində, Şahbuz və Salvardı çaylarının mənbə hissəsində zirvədir. Hün. 3200 m. Dağda Camal qalası adlanan xarabalıq var. Yerli əhalinin verdiyi məlumata görə, bu qalada Camal adlı bir igid səngər düzəldib yadelli işğalçılara qarşı vuruşmuşdur.

**Camaldin** *oyk., mür.* Culfa r-nunun Ərəzin i.ə.v.-də kənd. Əlincə çayının sahilində, dağ ətəyində yerləşir. Kənddə XII əsrə aid Əliməmməd ibadətgahı var. Camaldin Camaləddin şəxs adının təhrifə uğramış forması hesab olunur. Əslində, *Camal* (ş.a.) və *din/dın* (düşərgə, yaylaq) komponentlərindən ibarət olub, adını Camal yaylağının adından almışdır.

**Camanşəir** *oyk., mür.* Lənk r-nunun Əliabad i.ə.v.-də kənd. Oykonim *caman* (yaşıllıq, əkin sahəsi) və *şair* (ər. "arpa") sözlərindən düzəlib, "arpa sahəsi, arpa əkilən yer" deməkdir.

**Camış talası** *or., mür.* Tovuz r-nunda tala. Otlaq kimi camışlar üçün ayrıldığından belə adlandırılmışdır.

**Camışdağ** *or., mür.* Kəlbəcər, Xanlar və Goranboy r-nları sərhədində dağ. Murovdağ silsiləsinin ən yüksək zirvəsidir. Hün. 3722 m. Zirvənin şm. yamacında qədim buzlaşmanın izlərini bildirən moren qalıqları vardır. Əhali tərəfindən *qayma* adlanan bu daşlar uzaqdan nəhurda oturmuş camışlara oxşayır. Metafor oronimdir.

**Camlar** *hidr., sadə* Xaçmaz r-nunda çay. Vəlvələ çayından ayrılıb Xəzər dənizinə tökülür. Uzunluğu 7 km. Suvarma üçün istifadə edilir. Əsl adı Comalardır. Keçmişdə çayın sahilində *comalar* (bir qrup təsərrüfatçı qohum ailələrin müvəqqəti yaşayış yeri) yerləşdiyinə görə belə adlandırılmışdır.

**Campara** *hidr., mür.* Zaqatala r-nunda çay. Muxax çayından ayrılaraq sol tərəfdən Qanıx (Alazan) çayına tökülür. Suvarma üçün istifadə edilir. Hidronim fars *çəmənpira* sözündən olub, "gözəl, çəməni bəzəyən" deməkdir.

**Canaxır** *oyk., sadə* Xaçmaz r-nunun Hülövlü i.ə.v.-də kənd. Samur-Dəvəçi ovalığındadır. Yaşayış məntəqəsini Quba r-nunun Əlik kəndindən çıxmış ailələr Canaxır adlanan yerdə salmışlar. Kənd əvvəllər Aşağı Əlik də adlanmışdır. Azərb. dilinin əksər dialektlərində *cana* sözü "yararsız, pis", *xır* isə "əkin sahəsi" mənalarında işlənir. Oykonim "əkin sahəsi üçün yararsız yer" mənasındadır.

**Canallı** *oyk., sadə* Qazax r-nunun Əzizbəyli i.ə.v.-də kənd. Gəncə-Qazax düzənliyindədir. Qazax tayfalarından biri olan *canalıların* adını daşıyır. Etnotoponimdir.

**Canavarlı** *oyk., düz.* Bərdə r-nunun Mehdixanlı i.ə.v.-də kənd. Qarabağ düzündədir. Kəndin ərazisi keçmişdə meşəlik olmuşdur. Güman edildiyinə görə, ərazidə çoxlu canavar olduğundan kənd bu adı almışdır. Zootoponimdir.

**Canbar** *oyk., sadə* Zəngilan r-nunun eyniadlı i.ə.v.-də kənd. Dağ ətəyində yerləşir. Cambar variantında da qeydə alınmışdır. Oykonimi *çanbər* (dairə) sözü ilə əlaqələndirirlər.

**Canbaz** *or., sadə* Goranboy r-nu ərazisində dağ. Kürək və Buzluq çaylarının suayrıcında yerləşir. Hün. 1896 m. Fars *canbaz* "oyunbaz, kəndirbaz, at minicisi, at dəllalı" deməkdir.

**Candar** *hidr., sadə* Ağstafa r-nunun Gürcüstanla sərhədində şirin sulu göldür. Dəniz səviyyəsindən 289 m. yüksəklikdədir. Gürcüstan ərazisində çəkilmiş kanalla Kürdən qidalanır. Suvarmada istifadə edilir. Gölün yeri əvvəllər Candar dərəsi adlanırdı. 1883-cü ilədək Candar dərəsi və ətrafındakı Kiçik Kəsik, Böyük Kəsik adlı yerlər Şıxlı kəndinin qışlaq yeri olmuşdur. XIX əsrdə Gürcüstanda Candar adlı iki kənd, Salyan r-nunda keçmiş Cındırlı (indiki Abadkənd), Türkiyədə Candar oğulları və s. bu toponimin yayılma arealından xəbər verir. *Candar* orta əsrlərdə Şərqdə, o cümlədən Azərb.-da uzun müddət saray vəzifələrindən biri olmuş, "keşikçi, mühafizəçi, cangüdən" mənasında işlənmişdir. Saraydakı xidmətlərinə görə candarlara verilən pay torpaqları onların vəzifə adları ilə də adlandırılmışdır.

**Canhəsən** *oyk., mür.* Xocalı r-nunun Kosalar i.ə.v.-də kənd. Qarabağ silsiləsinin yamacındadır. Antropotoponimdir.

**Canqulu** *or., sadə* Füzuli r-nunda dağ. Köndələnçayın aşağı axarından sol tərəfdə yerləşir. Hün. 292 m. *Marcanqulu* (balıqqulağı) sözünün qısaldılmış forması olub, dağ süxurunu təyin edir.

**Canyataq** *oyk., mür.* Tərtər r-nunun eyniadlı i.ə.v.-də kənd. Dağətəyi ərazidədir. Tədqiqatçıların fikrincə, bu toponim türk dillərindəki *con/cona* (iki çayarası çöl) və *yataq* sözlərindən düzəlib, "iki çay arasındakı sahədə yerləşən yataq" mənasındadır. Keçən əsrin əvvəllərində bu toponim Canıyataq variantında qeydə alınmışdır. Güman ki, maldarlıqla məşğul olan Canı adlı şəxsə məxsus olan bu yataq onun adını daşımışdır.

**Car** *oyk., sadə* Zaqatala r-nunun eyniadlı i.ə.v.-də kənd. Silban və Bəkməz çayları sahilində, dağətəyi ərazidədir. Toponim qədim türk mənşəli söz olub, "sıldırım", "sahil", "sıldırımlı dik qaya", "uçurum", "yarğan", "dərə" mənalarında işlənən yar sözünün dialekt formasını mühafizə edir. Qədim Azərb. toponimlərindəndir. Kənd öz adını eyniadlı qayadan almışdır. Yaşayış məntəqəsi XVI əsrdə avarların Car adlı yerdə məskunlaşması nəticəsində yaranmışdır. Mənbələrdə Çingızqala adı ilə də verilmişdir. Kəndin yaxınlığında XIII əsrdə tikilmiş bu qalanın bərpaçısı Murtuzəli Çingız oğlu (XVIII əsr) olmuşdur. Qala onun adı ilə tanınır. XIX əsrə aid məlumata görə, kənd 14 məhəllədən ibarət olmuşdur.

**Cardam** *oyk., mür.* Ağdaş r-nunun Nehrəxəlil i.ə.v.-də kənd. Şirvan düzündədir. Yerli əhalinin məlumatına görə, kəndi Zaqatala r-nunun Car kəndindən köçüb gəlmiş ailələr salmışlar. Oykonim "Carlıların evi" deməkdir.

**Carxaçı** b.a.x. Çarxaçı.

**Carlı** *oyk., düz.* Kürdəmir r-nunun eyniadlı i.ə.v.-də kənd. Şirvan düzündədir. Zaqatala r-nunun Car kəndindən köçüb gəlmiş ailələr tərəfindən salındığı üçün belə adlandırılmışdır.

**Cavad** *oyk., sadə* Sabirabad r-nunun eyniadlı i.ə.v.-də kənd. Kür çayının sahilində, Şirvan düzündədir. Kənd orta əsrlərdə keçid məntəqəsi rolu oynamış və Cavad keçidi adı ilə qeydə alınmışdır. Mənbələrdən Şəhər yeri adı ilə də məlumdur. Oykonim XVI əsrdə Kür və Araz çaylarının qovşağında yerləşən tarixi Cavad şəhərinin adını yaşadır. Tədqiqatçılar bu toponimi ərəb dilindəki "cavas" (keçid) sözü ilə əlaqələndirirlər.

**Cavadçala** *hidr., mür.* Muğan düzünün c.-unda bataqlıq göldür. 1896-cı ildə Araz çayının daşması nəticəsində Ağçala və Mahmudçala gölləri ilə birlikdə yaranmışdır. Göl keçmiş *Cavad qəzasının* ərazisində yerləşdiyi üçün belə adlandırılmışdır.

**Cavadlar** *oyk., sadə* Xocalı r-nunun Kosalar i.ə.v.-də kənd. Dağətəyi ərazidədir. Etnotoponimdir.

**Cavahirli** *oyk. düz.* Ağdam r-nunun Göytəpə i.ə.v.-də kənd. Kiçik Qafqaz dağlarının ətəyindədir. Qarabağ xanı İbrahim Xəlil xanın arvadı *Cavahir xanıma* bağışlanmış (1828) mülklərdən olan bu kəndin adı "Cavahir xanıma məxsus" mənasındadır.

**Cavidabad** *oyk., mür.* Babək r-nunun eyniadlı i.ə.v.-də kənd. Arazboyu düzənlikdədir. 1963-1964-cü illərdə burada Araz çayı üzərində su qovşağı tikilərkən r-nun Qaraçuq və Bulqan kəndləri öz əvvəlki yerlərindən o vaxta qədər əkin sahələri olan indiki əraziyə köçürülmüş və qəsəbə tipli kənd salınmışdır. Azərb. şairi və dramaturqu *Hüseyn Cavidin* (1882-1941) şərəfinə kəndə Cavidabad adı verilmişdir. Memorial toponimdir.

**Cek** *oyk., sadə* Quba r-nunun Əlik i.ə.v.-də kənd. Baş Qafqaz silsiləsinin yamacındadır. Qrız etnik qrupunun bir qolunun adındandır. Etnotoponimdir.

**Cerabert** b.a.x. Çiləburt.

**Ceyranbatan** *hidr. sadə* Abşeron r-nu ərazisində su anbarı. Ceyranbatan gölü əsasında 14 m. hündürlükdə bənd vasitəsilə yaradılmış, 1956-cı ildə istifadəyə verilmişdir. Suyunu Samur-Dəvəçi kanalından alır. Abşeron kanalı buradan başlanır. Suvarmada,

Bakı və Sumqayıt şəhərlərinin su təchizatında istifadə edilir Hidronim "ceyran keçə bilməyən" mənasında olub, su hövzəsinin dərinliyinin səviyyəsini göstərir

**Ceyranbatan** *oyk., sadə* Abşeron r-nunda ştq Ceyranbatan su anbarının kənarında salınmışdır (1959) Adını eyniadlı göldən almışdır

**Ceyrançöl** *or., mür* 1 Kür çayının sol sahili boyunda, Gürcüstanla sərhəddə sıra dağlar; 2 Ceyrançöl silsiləsindən şm -da dərə; 3 Kür və Qabırrı çaylarının arasında, Çobandağ, Palantökən, Gödək Qılınc silsilələri ilə əhatə olunmuş düzənlikdir. Düzənlikdə axar su yoxdur və qış otlağı sahəsi kimi istifadə olunur Keçmişdə burada çoxlu *ceyran* olduğu üçün belə adlandırılmışdır

**Ceyrançöl** *oyk., sadə* Ağstafa r-nunun Poylu i ə v -də qəsəbə Ağstafa qoyunçuluq sovxozunun malikanəsi yanında salınmış bu yaşayış məntəqəsi 1965-ci ildən ərazidəki eyniadlı düzənliyin adı ilə adlandırılmışdır

**Ceyrandağ** *or., mür* Şuşa r-nu ərazisində dağ Qarqar çayının yaxınlığında yerləşir Hün 713 m Zootoponimdir Dağın adı oradakı meşədə yerləşən *Ceyran pirinin* adındandır Rəvayətə görə, bu yerdə ceyran bir uşağa süd verərək onu xilas etmişdir

**Ceyrankeçməz** *hidr., sadə* Qobustan və Xızı r-nları ərazisində çay Xəzər dənizinə tökülür Uzunluğu 100 km Yağış suları ilə qidalanır İlin çox vaxtı quru olur R-nun ərazisində eyniadlı min bulaq da var Hidronim "ceyran keçə bilməyən" mənasında olub, çayın dərinlik səviyyəsini bildirir

**Ceyrankeçməz** *oyk., sadə* Qobustan r-nunun Dərəkənd i.ə.v -də kənd Kəndin ərazisi əvvəllər Xilmilli kəndinin qışlaq yeri olmuş, sonralar daimi yaşayış məntəqəsinə çevrilmişdir Kənd adını eyniadlı çaydan almışdır

**Ceyranlar** *oyk düz* Qobustanda Kiçikdaş dağ sahəsində Daş dövrünə aid düşərgə Ceyran rəsmlərinin çoxluğuna, həmçinin real və nəfis çəkilməsinə görə Ceyranlar adlanır

**Ceyranlı** *oyk sadə* Dəvəçi r-nunun Əmirxanlı i ə v -də kənd Əmirxanlı çayının sahilində, Yan silsiləsinin ətəyindədir Keçmiş adı Aşağı Əmirxanlı olmuşdur Kənd *Ceyranotlayan* adlı talada salındığı üçün 1965-ci ildən adı dəyişdirilmiş və Ceyranlı kimi rəsmiləşdirilmişdir

**Cəbrayıl** *oyk., sadə.* 1 Azərb.-nın c -q -ində, Araz çayının sol sahilində inzibati r-n Mərkəzi Cəbrayıl şəhəridir; 2 Azərb -da şəhər Eyniadlı r-nun mərkəzidir Qarabağ silsiləsinin ətəyindədir R-nun ərazisində *Cəbrayıl ata* adlı məşhur pir var Deyilənlərə görə, əfşarların nüfuzlu şəxslərindən biri olan Cəbrayıl XVI əsrdə yaşamış və bu pirdə dəfn olunmuşdur R-ndakı kəndlərdən altısı da Cəbrayıl atanın oğlanlarının adları ilə adlandırılmışdır (Mırzəcan, Maşan, Alıkeyxalı, Yarəhməd, Xubyar, Həsən) Antropotoponimdir

**Cəbrayıl** *or sadə* Cəbrayıl və Füzuli r-nlarında, Araz çayı dərəsi boyunca yerləşən təpəli düzənlik Adını yerləşdiyi ərazinin adından almışdır

**Cəfərabad** *oyk., mür* 1 Cəbrayıl r-nunun Qarxun i ə v -ində kənd. Arazboyu düzənlikdədir. Yaşayış məntəqəsini 1806-cı ildə Rusiya himayəsinə keçmiş Xoy hakimi Cəfərqulu xana məxsus ailələr salmış və kəndi də xanın adı ilə adlandırmışlar; 2 Şəki r-nunun eyniadlı i.ə v -də kənd Alazan-Əyriçay çökəkliyindədir Kəndin əsasını çar I Aleksandr tərəfindən Şəki xanı təyin edilmiş xoylu Cəfərqulu xan qoymuşdur XIX əsrin sonunda kənd icmasına Cəfərabad-Xoy və Cəfərabad-Şəki adlı iki yaşayış məntəqəsi daxil idi Hal-hazırda bu kəndlərdən biri Cəfərabad, digəri isə Xoylu adlanır Bu kəndlərin bünövrəsini əslən dumbuli tayfasından olan Cəfərqulu xanla birlikdə buraya gələn ailələr (əsasən şəkkaki tayfasına mənsub idilər) qoymuşdular Oykonim *Cəfər* (Cəfərqulu xana işarədir) və *abad* (kənd) komponentlərindən düzəlib Antropotoponimdir

**Cəfərbəyli** *oyk., sadə* Ağcabədi r-nunun Hacıbədəlli i.ə v -də kənd Düzənlikdədir Tam adı Tərəkəmə Cəfərbəylidir Keçmişdə Qiyambalı (Qiyamballı, Gənbəllu) da adlanmışdır Oykonim kəbirlilərin *cəfərbəyli* tirəsinin adı ilə bağlıdır. Etnotoponimdir

**Cəfərxan** *oyk., sadə* Saatlı r-nunun Sarıcalar i ə v -də kənd Muğan düzündədir Oykonim *cəfərxanlı* nəslinin adı ilə bağlıdır Bu nəslin nümayəndələri Babək r-nunun Hacıvar, Ordubad r-nunun Üstüpü kəndlərində də qeydə alınmışdır Etnotoponimdir

**Cəfərxanlı** *oyk., sadə.* Cəlilabad r-nunun Üçtəpə i ə v -də kənd. İncəçayın sahilindədir Oykonim *cəfərxanlı* nəslinin adı ilə bağlıdır Etnotoponimdir

**Cəfərli** *oyk., sadə* 1 Ağsu r-nunun Kəndoba i ə v -də kənd Şirvan düzündədir; 2. Cəlilabad r-nunun Astanlı i ə v -ində kənd. Burovar silsiləsinin ətəyindədir Yaşayış məntəqələri muğanlı tayfasının *cəfərli* tirəsinin məskunlaşması nəticəsində yaranmışdır; 3 İmişli r-nunun eyniadlı i ə v -də kənd. Mil düzündədir Yaşayış məntəqəsi sarıxanlı tayfasının *cəfərli* tirəsinin məskunlaşması nəticəsində yaranmışdır; 4 Gədəbəy r-nunun Əliismayıllı i ə v -də kənd Şahdağ silsiləsinin ətəyindədir Keçmiş adı Mollacəfərlidir Yaşayış məntəqəsinin XIX əsrin sonlarında Kiçik Qaramurad kəndindən köçüb gəlmiş *Molla Cəfər* adlı şəxs tərəfindən salındığı haqqında məlumat verilir; 5 Qazax r-nunun eyniadlı i ə v -də kənd Dağətəyi ərazidədir Yaşayış məntəqəsi qazaxların qafarlı tayfasının bir qolu olan *cəfərli* elinin məskunlaşması nəticəsində yaranmışdır Etnotoponimdir

**Cəfəryaylaq** *or., mür* Qəbələ r-nu ərazisində, Dəmiraparan çayı ilə Bum çayı arasında şm -dan c -a doğru uzanan sıra dağlar Cəfərabad kəndinin və ya Cəfərqulu xanın şəxsi yaylaq yerləri olduğu üçün bu adı almışdır Oronim *Cəfər* (Cəfərqulu xan) və *yaylaq* (yay düşərgəsi) sözlərindən düzəlib Antropotoponimdir

**Cəhir** *hidr., sadə* Gədəbəy və Şəmkir r-nları ərazisində çay Kürün sağ qoludur Cəyir variantında da işlənmişdir Hidronim "çay yatağı" mənasındadır

**Cəhri** *oyk sadə* Babək r-nunun eyniadlı i ə v -də kənd Cəhri çayının sahilində, dağətəyi ərazidədir Oykonim xalq toponimik termini olan *cəhir/cühür* sözünün fonetik dəyişməsi olub, "çayın alçaq sahili" deməkdir

**Cəhri** *hidr., sadə* 1 Babək r-nu ərazisində çay Naxçıvan çayının sağ qoludur Mənbəyini Ermənistan ərazisindəki Gəlinqaya dağından (2320 m yüksəklikdən) alır Qar və yağış sularından qidalanır Suvarma üçün istifadə edilir Çay adını ərazisindən axdığı kəndin adından almışdır; 2 Babək r-nunun Cəhri kəndindən ş -da min bulaq Suyu soyuq, dadı turşməzədir Yerli əhali tərəfindən müalicə üçün istifadə edilir Bulaq adını yerləşdiyi kəndin adından almışdır

**Cəlair** *or., sadə* Quba r-nu ərazisində dağ. Baş Qafqaz silsiləsinin zirvəsidir Hün. 2800 m Etnotoponimdir

**Cəlair** *oyk., sadə* 1 Ağsu r-nunun Kəndoba i ə v -də kənd Şirvan düzündədir; 2 Qax r-nunun Sarıbaş i ə v -də kənd Qafqaz silsiləsinin yamacındadır; 3 Cəlilabad r-nunun eyniadlı i ə v -də kənd Burovar silsiləsinin ətəyindədir Yaşayış məntəqələri türkdilli *cəlair/cəlayir* tayfasının adını daşıyır Etnotoponimdir

**Cəlib** *or., sadə* Ağsu r-nu ilə İsmayıllı r-nu sərhədində, Niyaldağ silsiləsinin c -unda dağ Hün. 2318 m Yerli əhali arasında Cilb dağı da adlanan bu dağın Qafqaz Albaniyasına məxsus qədim cilblərin adı ilə bağlı olması ehtimal edilir Azərb dilinin bəzi dialektlərində *cəlı/cəlib* sözü "tək, yalqız" mənalarında işlənir Oronimin bu mənada olması da güman etmək olar

**Cəlilabad** *oyk., mür* 1 Azərb -da inzibati r-n Q -dən İranla həmsərhəd olub, Muğan düzünün c hissəsini və talış dağlarının şm -ş hissəsini tutur Mərkəzi Cəlilabad şəhəridir Keçmiş adı Astraxanbazar olmuşdur; 2 Azərb -da şəhər, eyniadlı r-nun mərkəzidir Mışar çayının sahilində, Muğan düzündədir İlkin adı Hasıllı (Asıllı) olmuşdur Vaxtilə bu ərazidə həftədə bir dəfə təşkil olunan böyük mal-qara bazarı olduğuna görə sonralar yaşayış məntəqəsi Asıllıbazar adlandırılmışdır 1945-ci ildə buraya Həştərxandan xeyli rus ailəsi köçürüldü və həmin vaxtdan yaşayış məntəqəsi Astraxanbazar adlanmağa başladı 1967-ci ildə *Cəlil Məmmədquluzadənin* (1866-1932) anadan olmasının 100 illiyi münasibətilə yaşayış məntəqəsinə Cəlilabad adı verildi Memorial toponimdir

**Cəlilkənd** *oyk., mür* Şərur r-nunun eyniadlı i ə v -də kənd Şərur düzündədir Keçmiş adı Baş Noraşen olmuşdur 1961-ci ildə görkəmli mütəfəkkir *Cəlil Məmmədquluzadənin*

şərəfinə bu kəndə Cəlilkənd adı verilmişdir. Memorial toponimdir.

**Cəlilli** *oyk., sadə.* 1. Tovuz r-nunun Düz Cırdaxan i.ə.v.-də kənd. Gəncə-Qazax düzənliyindədir. Keçmiş adı Haqverdibəyli olmuşdur; 2. Kəlbəcər r-nunun Seyidlər i.ə.v.-də kənd. Yaşayış məntəqəsini Gədəbəy r-nunun Ağcakənd kəndindən köçmüş ailələr salmışlar. *Cəlil Məmmədquluzadənin* şərəfinə adlandırılan kəndlərdir. Memorial toponimdir.

**Cəmcəmli** *oyk., sadə.* Qobustan r-nunun Mərəzə i.ə.v.-də kənd. Dağətəyi ərazidədir. Etnotoponimdir.

**Cəmillər** *oyk., sadə.* Şuşa r-nunun Şırlan i.ə.v.-də kənd. Dağətəyi ərazidədir. Kəndin yaxınlığında eyniadlı göl də var. Yaşayış məntəqəsi XVIII əsrin axırlarında Qazax mahalından Qarabağa köçmüş *cəmilli* tayfasına mənsub ailələr tərəfindən salınmışdır. Etnotoponimdir.

**Cəmilli** *oyk., sadə.* 1. Xocalı r-nunun Ballıca i.ə.v.-də kənd. Dağətəyi ərazidədir. Kəndi 1991-ci ildə ermənilər yandırmışlar; 2. Tərtər r-nunun Dəmirçilər i.ə.v.-də kənd. Qarabağ düzündədir. Etnotoponimdir.

**Cəmiyyət** *oyk., sadə.* Xocavənd r-nunun eyniadlı i.ə.v.-də kənd. Dağətəyi ərazidədir. Vaxtilə gəlmə ermənilər burada məskunlaşdıqdan sonra kəndin adını da dəyişdirib Nıjkı adlandırmışdılar. 1992-ci ildən yaşayış məntəqəsinin keçmiş adı bərpa edildi. *Cəmiyyət* ər. "birlik", "camaat", "yığın" deməkdir.

**Cəngan** *oyk., sadə.* 1. Cəlilabad r-nunun eyniadlı i.ə.v.-də kənd. Burovar silsiləsinin ətəyindədir; 2. Neftçala r-nunun eyniadlı i.ə.v.-də kənd. Kür çayının sahilində, Cənub-Şərqi Şirvan düzündədir; 3. Sabirabad r-nunun Muğan Gəncəli i.ə.v.-də kənd. Kür çayının sahilindədir; 4. Salyan r-nunun Kür Qaraqaşlı i.ə.v.-də kənd. Kür çayının sahilində, Salyan düzündədir. Mustafabəyli, Birinci Rəncbərlər adları ilə də tanınır. Qaradolaqların *cəngan* tirəsinin adı ilə bağlı olduğu ehtimal edilir. *Cəngan* sözü "döyüş meydanı, vuruş yeri" mənalarında da işlənir.

**Cəngəmiran** *oyk., mür.* Lerik r-nunun Lerik qəs. i.ə.v.-də kənd. Dağlıq ərazidədir. Yerli əhali tərəfindən Canqamiyon adlandırılır, *cəng* (vuruş, döyüş) və *miyon* (talış "meydan") komponentlərinin birləşməsi kimi "döyüş meydanı" mənasında izah edilir.

**Cəngəvud** *oyk., mür.* Lerik r-nunun Vızəzəmin i.ə.v.-də kənd. Peştəsər silsiləsinin yamacındadır. Oykonim *cəngan* (etn.) və talış dilindəki *vut* (yer) sözündən ibarət olub, "cənganların yeri" kimi izah olunur.

**Cəngi** *or., sadə.* Qobustan ərazisində dağ. Cəngi və Kəndə çayları arasındadır. Hün. 581 m. Etnotoponimdir.

**Cəngi** *hidr., sadə.* Sumqayıt çayının orta axarının adıdır. Etnotoponimdir.

**Cəngisər** *or., mür.* Lerik r-nunda dağ. Peştəsər silsiləsinin zirvəsidir. Hün. 1925 m. Oronim *cəngi* (etn.) və tat dilindəki *sər* (baş, zirvə) sözlərindən düzəlib, "cəngi zirvəsi" deməkdir. Etnotoponimdir.

**Cənubi** *oyk., sadə.* Bakı şəhəri, Əzizbəyov r-nunda qəsəbə. Xəzər dənizi sahilindədir. Keçmiş adı Şüvəlan mayakı yanında qəsəbə olmuşdur. 1965-ci ildən Cənubi Azərb.-nın şərəfinə Cənubi adlandırılmışdır.

**Cəyirli** *oyk., sadə.* 1. Bərdə r-nunun Güloğlular i.ə.v.-də kənd. Qarabağ düzündədir; 2. Göyçay r-nunun Çərəkə i.ə.v.-də kənd. Şirvan düzündədir. Yaşayış məntəqəsini Şamaxı r-nunun eyniadlı kəndindən ayrılmış ailələr salmışlar; 3. Şamaxı r-nunun eyniadlı i.ə.v.-də kənd. Dağətəyi ərazidədir; 4. Şəki r-nunun Suçma i.ə.v.-də kənd. Şəki yaylasındadır. Etnotoponimdir.

**Cəyirli** *or., sadə.* Şamaxı r-nunda, Cəyirli kəndi ərazisində palçıq vulkanı. Adını yerləşdiyi kəndin adından almışdır.

**Cəyli** *oyk., sadə.* Kürdəmir r-nunun eyniadlı i.ə.v.-də kənd. Şirvan düzündədir. Boz Ulus tayfalarından *cəklərin* adı ilə əlaqələndirilir və etnotoponim hesab edilir. Azərb. dilinin bəzi dialektlərində isə *cey* sözü "tayfa, nəsil" mənasında işlənir.

**Cıdır düzü** *or., mür.* Şuşa şəhərinin ş.-ində dağın üstündə düz. Cıdır düzü Ağzıyastı qaya, Üçmıx, Qırxpilləkən, Gəlin qayası, Xəzinə qayası, Topxana adlı sıldırım qayalar və meşələrlə əhatə olunmuş mənzərəli yerdədir. Vaxtilə (1935-ci ilədək) burada müntəzəm olaraq *cıdır* yarışları keçirildiyi üçün belə adlandırılmışdır.





**Cığatelli** *oyk., sadə.* Qəbələ r-nunun Həmzəli i.ə.v.-də kənd. Alazan-Əyriçay çökəkliyindədir. Oykonim 1917-ci ildə Cığataylı, 1933-cü ildə isə Cıqatallı şəklində qeydə alınmış, tədricən Cığatelli variantına düşmüşdür. Əslində *Cığataylı* olan bu coğrafi ad etnotoponimdir və "cığataylıların məskunlaşdığı kənd" deməkdir.

**Cılfır** *oyk., sadə.* Qubadlı r-nunun Göyərçin i.ə.v.-də kənd. Bərgüşad silsiləsinin yamacındadır. Yaşayış məntəqəsi XIX əsrin sonlarında Göyərcik kəndindən köçmüş ailələr tərəfindən Cılfır meşəsi adlanan ərazidə salınmışdır. Kənd həmin meşənin adını daşıyır. Azərb. dilinin dialektlərində *cılfır* "cəngəllik, kol-koslu yer" deməkdir.

**Cırdaxan** *oyk., sadə.* Yevlax r-nunun Varvara i.ə.v.-də kənd. Qarabağ düzündədir. XIX əsrdə Tovuz r-nunun Əsrik Cırdaxan kəndindən gəlmiş bir qrup ailə indiki ərazidə Cırdaxanlı adlı məntəqə salmışdır. Kollektivləşmə illərində Məşədialılar və Naibli məntəqələri ilə birləşdirildikdən sonra yaranmış kənd Cırdaxan adlandırılmışdır. Etnotoponimdir. Qızılbaş tayfalarından biri olan *cırdaxanlıların* adındandır. Toponimin arealı Azərb.-da Tovuz, Bərdə, Xanlar, Şəmkir, Qazax r-nlarını əhatə edir.

**Cırıqtəpə** *or., mür.* Tovuz r-nu ərazisində dağ. Yanıqlı kəndindən şm.-dadır. Hün. 1082 m. Əsl adı Çırıktəpədir. Etnotoponimdir. Oronim *çirik* (etn.) və *təpə* (müsbət relyef forması) sözlərindən düzəlib. Azərb. şairi M.V.Vidadi də *çırıklı* elindən olmuşdur. Görünür, dağ *çırıklı* elinə məxsus yaylaq yurdu olduğundan Çırıktəpə adlandırılmışdır.

**Cırkürd** *oyk., mür.* Göyçay r-nunun Bığır i.ə.v.-də kənd. Şirvan düzündədir. Yaşayış məntəqəsini Türkmən kəndindən köçüb gəlmiş ailələr salmışlar. Oykonim *cır* (kiçik) və *kürd* (etn.) komponentlərindən ibarət olub, "kürdlərin az hissəsi", "kiçik kürd kəndi" mənasındadır. Etnotoponimdir.

**Cibir** *oyk., sadə.* Qusar r-nunun Piral i.ə.v.-də kənd. Dağətəyi ərazidədir. Yaşayış məntəqəsi Dağıstanın Axtı r-nundakı *Çeper* kəndindən köçüb gəlmiş ailələrin məskunlaşması nəticəsində yaranmışdır. Kəndin sakinləri yeni yaşayış məntəqəsinə öz köhnə adlarını vermişlər.

**Cicimli** *oyk., sadə.* Laçın r-nunun eyniadlı i.ə.v.-də kənd. Həkəri çayının sahilində, Qarabağ yaylasındadır. Yaşayış məntəqəsi əslində Aşağı Cibikli və Yuxarı Cibikli adlanan iki hissədən ibarətdir. Kənd Yuxarı Cibiklidəki *Cicim ocağı* adlı pirin adı ilə adlandırılmışdır. Ermənistanın Sisyan r-nunda Cicimli kəndi qeydə alınmışdır.

**Cicimli** *hidr., sadə.* Kəlbəcər r-nu ərazisində çay. Çay öz adını ərazidəki *Cicim ocağı* adlanan pirdən almışdır.

**Cidagin** *hidr., sadə.* Oğuz r-nunda çay. Ağçayın qoludur. Hidronim "qarşısı alınmış, bəndə salınmış, cidarlanmış" mənasındadır.

**Ciğatay** *oyk., sadə.* Xaçmaz r-nunun Qaraçı i.ə.v.-də kənd. Ağçayın sahilində, dağətəyi düzənlikdədir. Toponim türkdilli *cağatay/cığatay* tayfasının adındandır. XVIII əsrin sonlarında Qubalı Fətəli xanın Qarabağdan bəzi elləri, o cümlədən *cağatayları* Quba xanlığında yerləşdirməsi nəticəsində yaranmışdır. Etnotoponimdir.

**Cikədi** *or., mür.* Quba r-nu ərazisində dağ. Dağda qədim yaşayış məntəqəsinin xarabalıqları var. Oronim *cik* (qədim türk dillərində "dar dərə", "yarğan", "sıldırım") və *di* (tat dilində "kənd") sözlərindən düzəlib, "yarğanda, dar dərədə kənd" mənalı qədim yaşayış məntəqəsinin adını daşıyır.

**Cil** *hidr., sadə.* 1. Lənkəran r-nu ərazisində göl. Gamışovan mərdosuna bitişik olan bu göl hazırda qurudulmuş və çay əkin sahəsinə çevrilmişdir; 2. Lənkəran r-nu ərazisində çay. Mənbəyini Lənkəran dağlarından alır, Gamışovan mərdosuna tökülür. Adını ərazidəki keçmiş gölün adından almışdır. Hidronim "bataqlıq" mənasındadır.

**Cil** *oyk., sadə.* Lənkəran r-nun Şağləsər i.ə.v.-də kənd. Cil çayının sahilində, Lənkəran ovalığındadır. Oykonim "bataqlıq yer", "sucaq yer" mənasındadır. Kənd öz adını hazırda qurudulmuş eyniadlı göldən almışdır.

**Cilən** *oyk., sadə.* Xocavənd r-nunun Arakül i.ə.v.-də kənd. Qarabağ silsiləsinin ətəyindədir. Yaşayış məntəqəsini 1840-cı ildə Ermənistanın Qafan r-nunun Balx kəndindən və Cənubi Azərb.-nın Qaradağ mahalından

köçüb gəlmiş erməni ailələri Cilan adlı yerdə salmışdılar *Cilan* "bataqlıq, sucaq yer" deməkdir Kənd öz adını salındığı yerin adından almışdır

**Cillik** *oyk., sadə* Balakən r-nunun Qazma i.ə v -də kənd Alazan Əyriçay çökəkliyindədir Yaşayış məntəqəsi Cillik adlanan yerin yaxınlığında salındığı üçün belə adlandırılmışdır *Cil* bataqlıqda, rütubətli yerdə bitən bitkinin adıdır Ərazı bu bitki ilə örtüldüyü üçün belə adlandırılmışdır

**Cilovdarlı** *oyk., sadə* Tovuz r-nunun Xatınlı i ə v -də kənd Gəncə-Qazax düzənliyindədir Etnotoponimdir *Cilovdarlılar* vaxtilə şahsevənlər hərbi ittifaqına daxil olmuş, I Şah Abbasın hakimiyyəti illərində (XVII əsrin əvvəlləri) Gəncəbasara gəlmişlər *Cilovdarlıq* səfəvilər dövründə xüsusi vəzifə olmuş və bu vəzifənin icrası ayrılıqda bir tayfaya tapşırılmışdır Mənbələrdə *cilovdarlar* oğuzların bəydili tayfasının bir qolu kimi qeyd olunur *Cilovdar* "cilov tutan, cilov verən", "ordunun ön hissəsində gedən" deməkdir Füzuli r-nundakı Qazaxlar kəndinin məhəllələrindən biri də Cilovdarlı adlanır

**Cilovxanlı** *oyk., sadə* Zərdab r-nunun Çalı i ə v -də kənd Şirvan düzündədir Cılovxan variantında da qeydə alınmışdır Etnotoponimdir Yaşayış məntəqəsi muğanlı tayfasının *cilovxanlı* tirəsinin məskunlaşması nəticəsində yaranmışdır Yerli əhlinin verdiyi məlumata görə, bu nəsil Salyan r-nu ərazisindən gəlmişdir Babək r-nunun Cəhri kəndi ərazısində Cilovxanlı məhəlləsi qeydə alınmışdır XVIII əsrdə Qarabağda İbrahim xana məxsus mülklərdən birinin adı, İrəvan quberniyasının Aleksandropol qəzasında bir kəndin adı da Cilovxan olmuşdur

**Cimcimax** *oyk., sadə* Zaqatala r-nunun Gözbaraq i ə v -də kənd. Alazan-Əyriçay çökəkliyindədir Qax-Zaqatala zonasında *cimcimax/cimcimey* sözü "bataqlıq" mənasında işlənir Kəndin adı onun coğrafi mövqeyi ilə bağlıdır

**Cimcimli** *oyk., sadə* Bərdə r-nunun Mehdixanlı i ə v -də kənd Qarabağ düzündədir Cıcimli variantında da qeydə alınmışdır Kəndin ərazisi Laçın r-nunun Cimcimli kəndinə aid qışlaq yeri olmuşdur XX əsrin əvvəllərində bu kənddən köçüb gəlmiş ailələr qışlaq yerində məskunlaşmışlar *Cecim* Azərb.-nın bir çox zonalarında, o cümlədən Qarabağda toxunan parça, yaxud xovsuz xalça növüdür Qədimdən azərb -ların məişətində geniş istifadə olunan cecimin istehsalı ilə məşğul olanların adındandır

**Cimi** *hidr sadə* 1 Quba r-nunda çay Baş Qafqaz silsiləsindən başlanır Babaçayla birləşərək Vəlvələ çayını əmələ gətirir; 2 Quba r-nunda min. bulaqlar Cimi çayının mənsəb hissəsində yerləşir İki isti və bir soyuq bulaqdan ibarətdir Suyu kükürdlüdür Yerli əhali isti bulaqlardan müalicə məqsədilə istifadə edir *Cimi* xalq dilində "narın, nazik su şırnağı" mənasında işlənir

**Cimi** *oyk., sadə* Quba r-nunun Qonaqkənd qəsəbə i ə v -də kənd Cimi çayının (Vəlvələçayın qolu) sahilində, dağətəyi ərazidədir Yerli əhalinin məlumatına görə, kənd XVI əsrdə bir neçə dağ kəndindən köçmüş ailələrin bir yerə cəmləşməsi nəticəsində yaranmış və ərəb dilindəki *cəm* sözü ilə Cəmi adlandırılmışdır Əslində isə kənd öz adını ərazideki min bulaqların adından almışdır

**Cincar** *hidr., sadə* Zaqatala r-nu ərazisində çay Tala çayının sağ qoludur Çayın adı ətrafında bitən bitkinin adındandır *Cincar* yarpağının formasına görə gicitkənə oxşayan çoxillik ot bitkisidir Fitotoponimdir

**Cincartala** *oyk., mür* Balakən r-nunun Hənifə i ə v -də kənd Balakən çayının sahilində, Alazan-Əyriçay çökəkliyindədir Toponim *cincar* (bitki) və *tala* (ətrafa nisbətən fərqli sahə) sözlərindən düzəlib, "cincar otu bitən tala" mənasındadır Kənd salındığı ərazinin adını daşıyır

**Cindağ** *or., mür* Ordubad r-nu ərazisində dağ. Parağa kəndinin c -undadır Hün 1774 m Etnotoponimdir *Cin/çen* (erkən orta əsrlərdə Ermənistan və Gürcüstan ərazısində yaşamış türkdilli tayfa) və dağ (müsbət relyef forması) sözlərindən düzəlib Tovuz r-nunun Düz Qırıxlı kəndindən 4-5 km aralı kiçik təpəliklərin əhatəsində Cinlidərə adlanan qədim yaşayış yeri var Gürcüstanın Baş keçid r-nunda da Cinlibinə adlı yer qeydə alınmışdır Mənbələrin verdiyi məlumata görə, ilkin türk dövründən başlamış XVIII əsrə qədər Gürcüstan





ərazısindən Şəmkirə qədər Kür boyunca *cinli* tayfaları yaşamış, XVIII əsrin sonlarında isə gürcü çarının təbəliyindən çıxaraq kəngərlilərlə birlikdə Qarabağ mahalına köçmüşlər

**Cindar** *oyk., sadə* Quba r-nunun Rustov i ə v -də kənd. Baş Qafqaz silsiləsinin ətəyindədir Etnotoponimdir Rustov kəndinin keçmiş məhəllələrindən birinin adı olmuşdur Müharibədən sonrakı illərdə məhəllə böyüyərək kəndə çevrilmişdir

**Cinli Boluslu** *oyk., mür* Goranboy r-nunun eyni adlı i ə v -də kənd Gəncə-Qazax düzənliyindədir Etnotoponimdir XVIII əsrdə Gürcüstandan Qarabağa köçmüş cinlilərin adı ilə bağlıdır Toponim "Bolnisidən gəlmiş *cinlilər*" mənasındadır

**Cinli Zeynallı** *oyk., mür* Goranboy r-nunun Cinli Boluslu i ə v -də kənd. Etnotoponimdir

**Cinlidağ** *or., mür* Goranboy r-nunun c -ş -ində dağ. Hün 145 m Etnotoponimdir

**Cinlik** *oyk., düz.* Ağdam r-nunun Əlimədətli i ə v -də kənd Xaçın çayının sahilində, dağ ətəyindədir Yaşayış məntəqəsi XVIII əsrin sonlarında Qazax mahalından Qarabağa köçmüş *cinli* tayfasına mənsub ailələrin məskunlaşması nəticəsində yaranmışdır Etnotoponimdir

**Cirdək** *oyk., düz* Tovuz r-nunun Çatax i ə.v -də kənd Dağlıq ərazidədir *Cir* (qədim türk dillərində *çir*) dialekt və şivələrimizdə "kiçik, balaca" mənasında işlənmişdir *-dək* məkan, yer bildirən şəkilçidir Oykonim "kiçik, balaca yaşayış yeri" mənasını bildirir Kənd həqiqətən də sahəsinə görə çox kiçikdir

**Cirimbel** *oyk., sadə* Yardımlı r-nunun Şəfəqli i ə v -də kənd Peştəsər silsiləsinin ətəyindədir Oykonim *pirembel* etnoniminin təhrifə uğramış formasıdır

**Coqara** *oyk., sadə* Lənk r-nunun Qosmalyan i ə v -də kənd Oykonim *coğa* (Azərb dilinin bir çox dialektlərində "nəsil, tayfa") və *-ra* (-lar şəkilçisinin təhrifə uğramış forması) komponentlərindən düzəlib, "tayfalar, nəsillər" deməkdir Kənd, güman ki, bir neçə nəslin məskunlaşdığı yerdir

**Coğaz** *hidr sadə* Ermənistan və Azərb -da çay Ermənistan ərazısindən 2000 m hündürlükdən başlayıb, Qazax r-nundan keçərək sol tərəfdən Ağstafa çayına tökülür Qazax r-nunun Əskipara kəndi yaxınlığından axdığına görə Əskipara çayı da adlanır Qədim Azərb dilindəki coğa (qol, tayfa, nəsil) sözündən olub "qollar" deməkdir Burada "z" qədim cəmlik əlamətidir Coqas, Coğas variantlarında da qeydə alınmışdır

**Comərd** *oyk., sadə* Kəlbəcər r-nunun Kılsəli i ə v -də kənd Tutqunçayın (Tərtər çayının qolu) sahilində, Qonqur dağının ətəyindədir Kəndin ərazısi XX əsrin əvvəllərinədək Ermənistanın Sisyan r-nundakı *Comərdli* kəndinə məxsus binə olmuşdur Sonralar həmin kənddən ayrılmış ailələr binə yerində məskunlaşaraq köhnə yaşayış məntəqəsinin adını yeni yaşayış məntəqəsinə vermişlər Comərdli sözündəki *-li* komponenti düşmüşdür

**Coni** *oyk. sadə* Lənk r-nunun Tülüconi i ə v -də kənd. Peştəsər silsiləsinin ətəyindədir Talış dilində *coni* "yersiz, torpaqsız" kimi izah olunur Oykonim kəndin ərazısində əkinə yararlı torpağın olmaması ilə bağlıdır

**Corat** *oyk., sadə* Sumqayıt şəhər i ə v -də qəsəbə Xəzər dənizi sahilindədir Toponim XIII əsrdə monqolların tərkibində Ön Asiyanın işğalında iştirak etmiş *curyat* tayfasının adındandır Etnotoponimdir XIX əsrdə Şəmşədil mahalında (indiki Tovuz r-nu ərazisində) Coratlı adlı kənd qeydə alınmışdır

**Corlu** *oyk., sadə* Qəbələ r-nunun Mirzəbəyli i ə v -də kənd. Alazan-Əyriçay çökəkliyindədir Kəndin adı peçeneqlərin *cor* tayfa adı ilə əlaqələndirilir və "corlar yaşayan kənd" kimi izah edilir Toponimi Çovurlu çayının adı ilə bağlayanlar da var Hər iki halda etnotoponimdir Şəki r-nunun Kış kəndinin məhəllələrindən biri də Cor adlanır

**Coryurd** *or., mür* Yardımlı r-nu ərazisində dağ Tədqiqatçılara görə, toponim *cor* (peçeneqlərə aid tayfa) və *yurd* komponentlərindən düzəlib "corlara məxsus yurd yeri" deməkdir Azərb dilinin dialektlərində *cor* sözü eyni zamanda "təpə" mənasında da işlənir Odur ki, oronim yaylaq yeri kimi istifadə olunan bu dağda insanların toplaşması ilə də bağlı ola bilər

buradan almışdır *Çırpılı* "quru kol-kos", "ağacın budanmış nazik çubuqları" mənasındadır

**Çiçəkli** *or., düz* 1 Kəlbəcər r-nunda dağ, 2 Babək r-nunda dərə Oronim "çiçəklə örtülmüş" mənasındadır Fitotoponimdir

**Çiçəkli** *oyk., düz* 1 Gədəbəy r-nunun İnəkboğan i ə v -də kənd Haçaqaya dağının ətəyindədir Kəndin əhalisi keçmişdə Fındıqlı kəndi yaxınlığında Arıtəpə adlı yerdə yaşamış, XIX əsrin əvvəllərində isə Arıqıran çayının sahilində yerləşən indiki əraziyə köçmüşdür Kənd çayın adı ilə Arıqıran adlandırılmışdır Yaşayış məntəqəsinin ilk sakinləri keçmiş Qazax qəzasından, Ermənistanın Qaraqoyunlu, Gəncə qəzasının Qarasaqqal kəndlərindən köçüb gələnlər olmuşdur 1991-ci ildən rəmzi olaraq *Çiçəkli* adlandırılmışdır; 2 Sabirabad r-nunun Muğan Gəncəli i ə v -də kənd Muğan düzündədir Keçmiş adı Çullu olmuşdur Yaşayış məntəqəsinin adı guya yaxşı səslənmədiyinə görə dəyişdirilmişdir Rəmzi məna daşıyır

**Çiçi** *hidr., sadə* Quba r-nu ərazisində çay Şabran çayının sol qoludur *Çiçi* türk dillərində "təzə, tər" mənasındadır

**Çiçi** *oyk. sadə* Quba r-nunun eyniadlı i ə v -də kənd Dağətəyi ərazidədir Adını ərazidəki eyniadlı çaydan almışdır Bəzi tədqiqatçılara görə, toponim tat dilindəki *çu* (ağac) və Azərb dilindəki *-çi* (peşə-sənət bildirən şək ) komponentlərindən düzəlib, "odunçu, ağac məmulatı hazırlayan" mənasındadır

**Çiçibinə** *oyk., mür* Zaqatala r-nunun Mətsəx i ə v -də kənd "Təzə binə, təzə kənd" mənasındadır

**Çidibaş** *or., mür* Zaqatala r-nu ərazisində dağ. Əsl adı Çədibaşdır R-nun Sabunçu kəndinin şm -q -ində Çədilər adlı yer var Çədi saxur dilində bitki (qıjı bitkisi) adıdır Oronim "Çədilər yerinin başı, yuxarısı" mənasındadır

**Çigil** *hidr., sadə* Şamaxı və Xızı r-nları ərazisində çay Sumqayıt çayının sol qoludur Mənbəyini Dubrar dağının yamacından (1650 m hündürlükdən) alır Başlıca olaraq, yağış və yeraltı sulardan qidalanır Hidronim karluqların tərkibinə daxil olan türkdilli *çigil* tayfasının adı ilə bağlıdır Etnotoponimdir Türkmən oğuzları Amuderyadan Çinə qədərki ərazidə yaşayan şərq türklərini *çigillər* adlandırırdılar

**Çigil** *or., sadə* 1 Xəzər dənizində, Bakı arxipelaqında ada Bəndovan burnundan c -ş -də, Səngi Muğan adasından c -q.-dədir Palçıq vulkanları nəticəsində yaranmışdır Sahilləri dəniz ləpələri ilə müntəzəm yuyulduğu üçün ruslar adaya Oblivnoy (şirəli, şirələnmiş) adı vermişdilər; 2 Çigil adasında eyniadlı palçıq vulkanı. Oğuzların tərkibində Azərb -na gəlmiş *çigillərin* adı ilə bağlıdır Etnotoponimdir

**Çiləbürt** *oyk., mür* Tərtər r-nunun Çardaqlı i ə v.-də kənd Dağətəyi ərazidədir Caraberd, Craberd variantlarında da qeydə alınmışdır. Oykonim *çilə* (topa, yığın, nəsil) və *bürt/berd/bard* (əsli er olan bu söz "qala, hasar, divar" mənalarında başqa dillərə də keçmişdir) komponentlərindən düzəlib, "insanlara aid qala və ya icma, kənd" mənasındadır Ermənilər bu kəndi Cerabert kimi rəsmiləşdirmişdilər 1992-ci ildən kəndin indiki adı bərpa edilmişdir

**Çiləgir** *oyk., sadə* 1 Qusar r-nunun Urva i ə v -də kənd. Qusar çayının sahilində, Qusar maili düzənliyindədir; 2 Xaçmaz r-nunun Aşağı Zeyd i ə v -də kənd Samur-Dəvəçi ovalığındadır, 3 Xaçmaz r-nunun Nərəcan i ə v -də kənd Məzarçayın sol sahilində, Samur-Dəvəçi ovalığındadır Tədqiqatçıların ehtimalına görə, kəndin adı XVI əsrdə Anadoluda yaranmış Boz Ulus tayfa ittifaqına daxil olan *çilaxir* tayfasının adı ilə bağlıdır Etnotoponimdir

**Çiləgir** *or., sadə* Quba r-nu ərazisində dağ Çağacıq çayı ilə Qaraçayın suayrıcında yerləşir Hün 993 m. Etnotoponimdir

**Çiləgir** *hidr., sadə* Quba r-nu ərazisində çay Etnotoponimdir

**Çilət** *or., sadə* Kəlbəcər r-nunun Çıldıran kəndindən c -da dağ. Hün 1561 m Çilet variantında da qeydə alınmışdır *Çilət* "çiskin, sis, qatı duman" mənasındadır

**Çilgəz** *or. mür* Laçın və Kəlbəcər r-nları ərazisində dağ Mıxtökən silsiləsinin ş. hissəsində zirvədir Hün 2362 m Toponim *çil/cil* (sucaq yer, bataqlıq) və *gəz* (gədiyin ən alçaq yeri, dağ belində aşırım) sözlərindən düzəlib, "ətəyində sucaq yer, bulaq olan aşırım" mənasındadır Dağın ətəyində, Laçın r-nu ərazisində eyniadlı bulaqlar var

**Çilgəz** *hidr., sadə* Laçın r-nu ərazisində, *Çilgəz* dağının ətəyində min. bulaqlar Adını eyniadlı dağdan almışdır

**Çiliş/Çiriş** *or., sadə* Şəki r-nu ərazisində dağ Baş Qafqaz silsiləsinin zirvəsidir Hün 3242 m *Çiliş/çiriş* dialektlərimizdə "sürüşkən", "şirəli" mənalarında işlənir Azərb -da *çiriş* adlı bitki növü də var

**Çilligöl** *hidr., mür* Xanlar r-nu ərazisində göl Hidronim *çilli* (su sahəsinin ümumi zahiri görünüşü) və *göl* (su obyekti) komponentlərindən düzəlib, "səthi çilli, xallı görünən göl" deməkdir

**Çilov** *or. sadə* Xəzər dənizində, Abşeron arxipelaqında ada Tədqiqatçıların verdiyi məlumata görə, keçmiş adı Ronis, sonralar isə Şahilan olmuşdur Xəzər dənizi səviyyəsinin enməsi nəticəsində Ördək (Urunos) adası ilə birləşmişdir Üç tərəfdən sualtı riflərlə əhatələnmiş adanın səthi əsasən qumluq və daşlıqdır Yerli əhalinin verdiyi məlumata görə, Abşeron balıqçıları, xüsusilə Zirə və Türkan kəndlərinin əhalisi buradan balıq tutmaqla yanaşı, yaz vaxtı otlaq kimi də istifadə edir Orta əsr ərəb səyyahları bu adada ov heyvanlarının (xüsusilə ceyran) zənginliyindən və adanın qış otlağı kimi istifadə olunmasından söhbət açırlar Oronim "çilli, xallı" mənasındadır Bu da adadakı heyvanların zahiri görünüşünü əks etdirə bilər Ada keçən yüzillikdə Jiloy da adlanmışdır

**Çilov** *oyk., sadə* Bakı şəhəri Əzizbəyov r-nu ərazisində ştq Çilov adasında yerləşdiyi üçün adanın adını daşıyır

**Çimən** *oyk., sadə* Füzuli r-nunun Cuvarlı i ə v -də kənd Dağətəyi ərazidədir Əsl adı Çəməndir Yaşayış məntəqəsi *çamanlikda* (yaşıl otla örtülmüş sahədə) salındığı üçün belə adlandırılmışdır Oykonim *çamanli* tayfasının adından da ola bilər Şahbuz r-nunun Biçənək və Keçili kəndlərində Çiminyurd adlı yerlər qeydə alınmışdır

**Çimkar** *or., mür* Xanlar r-nu ərazisində dağ Gəncə və Kürək çaylarının suayrıcında yerləşir Hün 1400 m Oronim *çim* (tamam, tamamilə) və *kar* (daş) komponentlərindən düzəlib, "daşlıq" mənasındadır

**Çinar** *oyk., sadə* Cəlilabad r-nunun Cəngan i.ə v -də kənd Oykonim *çinar* ağacının adı ilə bağlıdır Kəndin ərazisində çinar ağaclarının zəngin olduğunu bildirir

**Çinar** *hidr. sadə* Cəlilabad r-nu ərazisində min bulaq. Eyniadlı kəndin ərazisində olduğu üçün bulaq kəndin adını daşıyır

**Çinarlar** *oyk., sadə* Dəvəçi r-nunun Düz Bilici i ə v -də kənd Dağətəyi ərazidədir Yaşayış məntəqəsini XIX əsrdə Quba qəzasının Gümür kənd icmasına mənsub ailələr *Çinarlar* adlı yerdə əvvəlcə oba kimi salmış, sonralar isə daimi yaşayış məntəqəsinə çevirmişlər Oykonim "çinar ağacı ilə zəngin" deməkdir

**Çinarlı** *oyk., sadə* 1 Biləsuvar r-nunun Mircəlal i ə v -də kənd Muğan düzündədir Yaşayış məntəqəsi XIX əsrin sonlarında Rusiyanın mərkəzi quberniyalarından köçürülmüş rus ailələrinin məskunlaşması nəticəsində yaranmışdır Kənd əvvəllər Velikoknyazevka, bir qədər sonra Novoqrajdanovka adlandırılmışdır Ərazisindəki çinar ağaclarının çoxluğuna görə 1991-ci ildən *Çinarlı* adı ilə rəsmiləşdirilmişdir; 2 Qax r-nunun Qum i ə v -də kənd Baş Qafqaz silsiləsinin yamacındadır Yaşayış məntəqəsi XVII əsrdə Dağıstanın Saxur mahalından köçüb gəlmiş əhalinin *Çinarlı* adlanan yerdə məskunlaşması nəticəsində yaranmış və salındığı ərazinin adı ilə adlandırılmışdır; 3 Şəmkir r-nunun eyniadlı i ə v -də qəsəbə Dağətəyi düzənlikdədir Yaşayış məntəqəsini XX əsrin əvvəllərində Azərb -na köçürülmüş almanlar salmış və 1931-ci ilədək Yelenendorf, sonralar Georgiyevsk, 1941-ci ildən Leninfeld, 1962-ci ildən isə Lenin adlandırılmışdır 1947-49-cu illərdə Ermənistandan zorla qovulmuş azərb ailələr burada yerləşdirilmişdir 1992-ci ildən *Çinarlı* adı ilə rəsmiləşdirilmişdir Rəmzi məna daşıdığı güman edilir

**Çinartala** *oyk. mür* Xaçmaz r-nunun Qusarçay i ə v -də kənd Samur-Dəvəçi ova-

lığındadır Yaşayış məntəqəsi Quba r-nunun Qırız kəndindən gəlmiş ailələr tərəfindən *Çinarlı tala* adlanan yerdə salınmışdır Oykonim "çinar ağacları olan tala" mənasındadır

**Çinqar** *or mür* Böyük Qafqazda dağ Oronim *çin* (sıra, cərgə) və *qar/kar* (yüksəklik, dağ) sözlərindən düzəlib, "dağ silsiləsi" deməkdir

**Çinqar** *hidr., sadə* Zaqatala r-nu ərazisində çay Adını eyniadlı dağdan almışdır

**Çiragidzər** b a x Çıraqdərə

**Çiraqlı** *oyk., sadə* Şamaxı r-nunun Sabir i ə v -də kənd. Ləngəbiz silsiləsinin ətəyində, Pirsaat çayının sahilindədir Qızılbaşların *çıraqlı* tayfasının adını əks etdirir Etnotoponimdir

**Çiraquz** *oyk., sadə* Xocavənd r-nunun eyniadlı i ə v -də kənd Qarabağ silsiləsindədir Oykonim Çiraqlı, Çiraqlar toponimlərinin variantı olub, "çıraq tayfası yaşayan kənd, çiraqlılara məxsus kənd" deməkdir

**Çirgilçay** *hidr., mür* Zaqatala r-nu ərazisində çay Əliabad çayının şm -ından başlayıb, Qanıx çayına çatmamış itir Qafqaz dillərində (lak dili) *çiri* "kiçik, balaca" deməkdir, *gil* Azərb dilinin dialektlərində "arx, çay qolu" mənalarında işlənir Hidronim "kiçik arx, kiçik çay qolu" mənasındadır

**Çirvalıq** *hidr sadə* Xocalı r-nu ərazisində çay Azərb dilinin dialektlərində müxtəlif variantlarda işlənən bu söz "su şırnağı", "şəlalə" mənasındadır

**Çitaxlı** *oyk., düz* 1 Ağdam r-nunun Qərvənd i ə v -də kənd Qarabağ silsiləsinin ətəyindədir, 2 Daşkəsən r-nunun eyniadlı i ə v -də kənd Murovdağ silsiləsinin ətəyindədir; 3 Laçın r-nunun Alxaslı i ə v -də kənd Hocazsu çayının sahilində, dağətəyi ərazidədir Oykonim "qarğıdan hörülmüş çəpərlə əhatələnmiş" və ya "qarğıdan hörülmüş daxmaları olan kənd" mənasındadır

**Çitaq** *oyk., sadə* Siyəzən r-nunun Ağbaş i ə v -də kənd *Çitaq* "qarğıdan hörülmüş çəpər"dir Azərb -nın bir çox kəndlərində belə çəpərlərdən indi də istifadə olunur

**Çiyni** *oyk., sadə* 1 Ağsu r-nunun Ərəbşərvan i ə v -də kənd Şirvan düzündədir, 2 Ucar r-nunun Qaradağlı i ə v -də kənd, 3 Ucar r-nunun Kiçik Qaladərəsi (keçmiş Kirovkənd) i.ə v.-də kənd. Şirvan düzündədir Oykonim *çiyni* tayfasının adını əks etdirir Etnotoponimdir. XVI əsrdə qızılbaş tayfalarından biri olan və mənşəcə qacar tayfasına mənsub *çiyniləri* Səfəvi Şah Təhmasib (1524-76) üsyankar xarakterlərinə görə ölkənin müxtəlif ərazilərində yerləşdirmişdi İran ərazisində *çiynilər* daha geniş yayılmışdılar

**Çoban Abdallı** *oyk., mür* Samux r-nunun eyniadlı i.ə v -də kənd. Kürəkçayın sahilində, Gəncə-Qazax düzənliyindədir. Etnotoponimdir. Yaşayış məntəqəsi *çobanlar* və ya *çobanilərin abdallı* tirəsinin məskunlaşması nəticəsində yaranmışdır

**Çobanbaba** *or., mür* Qəbələ r-nu ərazisində dağ Baş Qafqaz silsiləsindən ayrılmış qollardan biridir Dağda *Çobanbaba* adlı pir mövcuddur Dağ keçmişdə sitayiş yeri olan bu pirin adını daşıyır Oronim "müqəddəs çoban" mənasındadır

**Çobançeşmədağ** *or., mür* Qobustan ərazisində yüksəklik. Ceyrankeçməz çayının orta axarından soldadır. Hün 315 m Oronim *Çobançeşmə* (dağda olan bulağın adı) və *dağ* (müsbət relyef forması) sözlərindən düzəlib, "Çoban bulağı olan dağ" mənasındadır

**Çobançuxur** *or., sadə* Babək r-nu ərazisində dağ. Dağ sahəsindəki *Çoban çuxuru* (dərəsi) oroniminin adı ilə bağlıdır

**Çobandağ** *or., mür* 1 Ağdam r-nunun Qiyaslı kəndindən şm -q.-də dağ. Hün 627 m., 2 Gədəbəy r-nunun c -unda dağ. Şəmkir çayı ilə onun qolunun suayrıcında yerləşir Hün 2502 m ; 3 Gədəbəy və Şəmkir r-nlarının sərhədində dağ Hün 1734 m , 4 Qazax və Tovuz r-nları arasında sıra dağlar Gürcüstanla sərhəddə, Kür və Qabırrı çaylarının suayrıcında yerləşir Ən hündür zirvəsi Çobandağdır (894 m) Ursoğlu da adlanır Dağın ərazisi keçmişdə Qazax qəzasında yaşayan ellərin yaylaq yerləri olmuşdur Çobandağ oronimləri bu dağlarda çobanların yayda qoyun sürüləri saxlaması ilə bağlıdır

**Çobangərəhməz** *oyk., sadə* Kəlbəcər r-nunun Əsrik i ə v -də kənd. Tutquçayın (Tərtər çayının qolu) sahilində, Qonqur da-





ğının ətəyindədir Kəndin ərazisi keçmiş İrəvan quberniyasının *Çobangərəkməz* kəndinin qışlaq yeri olmuşdur Yaşayış məntəqəsi sonralar həmin kənddən ayrılmış ailələrin daimi məskunlaşması nəticəsində yaranmışdır R-nun ərazisində eyniadlı min bulaq da vardır Hidronim *Çobangörükməz* variantında da qeydə alınmışdır Oykonim "çoban gərək olmayan" mənasındadır

**Çobankənd** *oyk., mür* Gədəbəy r-nunun eyniadlı i ə v -də kənd Dağətəyi ərazidədir Yerli əhalinin məlumatına görə, inqilabdan əvvəl Novoivanovka kəndində şəxsi təsərrüfatlarda çobanlıq edənlərə 1925-ci ildə Ağalar adlanan bu yerdə torpaq sahəsi verilmişdi 1925-1926-cı illərdə bir neçə çoban öz ailələri ilə birlikdə burada məskunlaşaraq kəndin əsasını qoydular Ona görə də kənd *Çobankənd* adlandırılmışdır

**Çobankol** *oyk. sadə* Zaqatala r-nunun eyniadlı i ə v -də kənd *Çobankol* və ya *çobançökdürən* adlı kol bitkisinin adındandır Kənd bu bitki ilə zəngin olan ərazidə salındığı üçün belə adlandırılmışdır Fitotoponimdir

**Çobansığnaq** *oyk., mür* Tovuz r-nunun Sarıtala i ə v -də kənd. Kiçik Qafqaz dağlarının ətəyindədir Yaşayış məntəqəsinin *Sığnaq dağında* çobanların yurd yeri olmuş ərazidə salındığı üçün belə adlandırılması ehtimal olunur Oykonimi *çobanilar* tayfa adı ilə bağlayanlar da var Kəndin adının qədim yaşayış məskəni kimi qala tikililəri ilə zəngin olan *Sığnaq dağının* və ərazidəki *Çobandağ silsiləsinin* adından olması da mümkündür

**Çobaz** *hidr., sadə* Oğuz r-nu ərazisində çay Hidronim *çopuz* (gödəkcə, qısa yapıncı) sözünün fonetik variantı olub, "gödək çay" mənasındadır

**Çocuxmərcanlı** *oyk., mür* Cəbrayıl r-nunun Çaxırlı i.ə v -də kənd Yaşayış məntəqəsi XIX əsrdə Cavadağa Cavanşirə məxsus ərazidə salınmışdır Etnotoponimdir *Mərcanlı* tayfa adını özündə əks etdirir Burada *çocuq* sözü yaşayış məntəqəsini Böyük Mərcanlı kəndindən fərqləndirməyə xidmət edir Oykonim "kiçik Mərcanlı kəndi" mənasındadır

**Çoxqar** *or mür* Şəki r-nu ərazisində dağ Əyriçayın yuxarı axarından soldadır Hün 739 m Tədqiqatçıların fikrincə, əslində Çıxqar olan bu oronim qədim türk dillərindəki *çik* (kənar, qıraq) və *kar* (dağ) sözlərindən düzəlib, "kənar dağ" mənasındadır

**Çoladağ** *or., mür* Ağdam r-nu ərazisində dağ Qiyaslı kəndindən q -dədir Hün 904 m. Oronimin etnotoponim olması və II əsrdə hunların tərkibində Qafqazda məskunlaşmış türkmənşəli *çol/çul* tayfasının adı ilə bağlılığı ehtimal edilir Azərb dilinin dialektlərində *çola* "hamar olmayan", "kələ-kötür yer", "təpəlik" mənalarında işlənir Oronim "səthi hamar olmayan dağ" mənasındadır

**Çolaxlı** *oyk., sadə* Şəki r-nunun Cəfərabad i ə v -də kənd Əyriçayın sahilindədir Əsl adı Çolaqlıdır Etnotoponimdir

**Çolpan** *or., sadə* Gədəbəy r-nu ərazisində dağ Azərb -nın qərb r-nlarında *çolpan* sözü "təpəlik, kiçik dağlıq" mənasında işlənir R-nun Eymır kəndində Çolpan qayası, Daşkəsən r-nunda Çolpan yalı, Tovuz r-nunda Çolpan dərəsi kimi mikrotoponimlər qeydə alınmışdır Türkdilli xalqlarda *çolpan* dan ulduzu Zöhrənin (Veneranın) adıdır Etnotoponim olması da mümkündür Qırğızıstanın Koçkar r-nunda Çolpon kəndi, İssık-Kul vilayətində Çolpan-Ata şəhəri var

**Çolpan** *hidr., sadə* Gədəbəy r-nu ərazisində çay Şəmkir çayının qoludur Arıqdam kəndinin ərazisindən axdığı üçün Arıqdam çayı da adlanır Çay başlanğıcını Çolpan dağından aldığına görə belə adlandırılmışdır

**Çomaxtur** *oyk mür* Şərur r-nunun Yengicə i ə v -də kənd Şərur düzündədir Çomaxdur, Çamaxtur variantlarında da qeydə alınmışdır Güman ki, əsli *Çumaxdar* olan bu oykonim "şadaraçı" deməkdir

**Çomrədərə** *hidr mür* Zaqatala r-nu ərazisində çay Katex çayı hövzəsindədir Hidronim *çomra* (bulanıq) və ya *çəmrə* (dumanlı, çiskinli) və *dərə* (çay dərəsi) komponentlərindən düzəlib, "bulanıq çay dərəsi" və ya "dumanlı, çiskinli dərə" kimi izah olunur Çay axdığı dərənin adı ilə adlandırılmışdır

**Çopaqansu** *hidr mür* Oğuz r-nunda çay Əsli Çapağansudur Şəki r-nu ərazisində çay Çapağan adlanır Hidronim "sürətlə axan su" mənasındadır

**Çopurlu** *oyk., sadə* Kəlbəcər r-nunun Lev i ə v -də kənd. Lev çayının sahilində, Murovdağ silsiləsinin ətəyindədir Keçmiş adı Çopur Hüseynlidir Yerli əhalinin məlumatına görə, yaşayış məntəqəsini Daşkəsən r-nunun Qabaqtəpə kəndindən köçmüş Çopur Hüseyn adlı şəxs saldığına görə belə adlandırılmışdır Qazax r-nunun Qaymaqlı kəndində *çopurlular* tayfası qeydə alınmışdır Bu səbəbdən oykonimin etnotoponim olması da mümkündür

**Çorçorbinə** *oyk., mür* Balakən r-nunun Qullar i ə v -də kənd Mazım çayının sahilində, dağətəyi ərazidədir Kənd əvvəllər Şorşor adlanan binənin ərazisində salınmışdır Oykonim *çorçor* (avar "kiçik şəlalə") və *binə* komponentlərindən ibarət olub, "kiçik şəlaləli binə" deməkdir

**Çorman** *oyk., sadə* 1 Kəlbəcər r-nunun Əsrik i ə v -də kənd Qonqur dağının ətəyindədir Yerli əhalinin verdiyi məlumata görə, kəndi vaxtilə indiki Xanlar r-nunun Balçılı kəndindən çıxmış ailələr Çorman meşəsi adlanan sahədə saldıqlarına görə meşənin adı ilə adlandırılmışdır; 2 Laçın r-nunun Şamkənd i ə v -də kənd. Qarabağ silsiləsinin ətəyindədir Oykonimin türk mənşəli *orman* (meşə) sözünün variantı olduğu ehtimal edilir Bəzi tədqiqatçılara görə, Çorman etnotoponimdir, *çor* tayfasının adını əks etdirir

**Çormanlı** *oyk., sadə* Kəbəcər r-nunun Vanklu i ə v -də kənd Xaçın çayının sahilində, Qarabağ silsiləsinin ətəyindədir XIX-XX əsrlərdə Dovşanlı və Venq kəndlərindən gəlmiş ermənilər burada məskunlaşdıqdan sonra kəndi Qarnakar (erm *qarna* oyuq, sərhəd nişangahı və *kar*-daş) adlandırmışdılar 1992-ci ildən kəndin adı Çormanlı kimi rəsmiləşdirilmişdir Etnotoponimdir

**Çovdar** *or., sadə* Daşkəsən r-nu ərazisində dağ Çovdar kəndindən c -dadır Hün 1733 m. Oronim haqqında tədqiqatçılar müxtəlif mülahizələr irəli sürürlər Bəzi tədqiqatçıların fikrincə, dağ vaxtilə burada əsasən *çovdar* bitkisi əkildiyinə görə belə adlandırılmışdır Tədqiqatçıların bir qismi isə belə hesab edir ki, oronim *çodar* (davar alverçisi) sözü ilə bağlıdır Guya yaylaq yeri olan bu dağa əvvəllər tez-tez çodarlar gələrmiş Tədqiqatçıların böyük əksəriyyəti oronimi səlcuq-oğuzların *çaudar/çovuldar/çaundur* tayfa adı ilə bağlayırlar Zəngilan r-nunda Araza tökülən Oxçuçayın keçmiş adı da Çaundur olmuşdur. Bu çayın ətrafı keçmişdə Çaundur mahalı adlanmışdır

**Çovdar** *oyk., sadə* 1 Daşkəsən r-nunun eyniadlı i ə v -də kənd Çovdar dağının şm yamacındadır Yaşayış məntəqəsinin 1869-cu ildə yaranması haqqında məlumat verilir Adını ərazidəki eyniadlı dağdan almışdır Etnotoponimdir; 2 Kəlbəcər r-nunun Başlıbel i ə v -də kənd Çovdar çayının (Tərtər çayının qolu) sahilindədir Etnotoponimdir

**Çöflügöl** *hidr., mür* Laçın r-nu ərazisində göl Hidronim *çöflü* (otlu) və *göl* komponentlərindən düzəlib, "otlu (yosunlu) göl" mənasındadır

**Çöhranlı** *oyk., düz* Kürdəmir r-nunun Xırdapay i ə v -də kənd Şirvan düzündədir Yerli əhalinin verdiyi məlumata görə, vaxtilə burada çoxlu ceyran sürüləri olduğundan kəndin adı *Ceyranlı* imiş, sonralar təhrif olmuşdur. Əslində, kəndin adı *Çöküranlı* olmalıdır Oykonim *çökür* (biçilmiş taxılın yerdə qalan hissəsi), *-an* (məkan bildirən şək.), *-lı* (şək ) komponentlərindən düzəlib Güman ki, kənd vaxtilə biçilmiş taxıl zəmisinin və ya biçənəyin yerində salınmışdır

**Çökək Xuluf** *oyk., mür* Şəmkir r-nunun Plankənd i ə v -də kənd. Dağətəyi ərazidədir 1917-ci ildə Gəncə qəzasında Xuluf adlı yalnız bir yaşayış məntəqəsi qeydə alınmışdır Oykonim "çökəkdə yerləşən Xuluf kəndi" mənasındadır

**Çökəkoba** *oyk., mür* Zaqatala r-nunun Göyəm i ə v -də kənd Alazan-Əyriçay çökəkliyindədir Vaxtilə Car kəndinə məxsus olan bu oba kollektivləşmə illərində daimi yaşayış məntəqəsinə çevrilmişdir Kənd çökəkdə yerləşdiyi üçün belə adlandırılmışdır

**Çöl Ağaməmmədli** *oyk., mür* Sabirabad r-nunun Əliləmbəyli i ə v -də kənd Muğan düzündədir Yaşayış məntəqəsini İmişli r-nunun Ağaməmmədli kəndindən ayrılmış ailələr salmışlar Oykonim *çöl* (bayır, əsas kənddən aralı) və *Ağaməmmədli* (əvvəlki yaşayış yerinin adı) komponentlərindən düzəlib, "kənardakı Ağaməmmədli kəndi" deməkdir





**Çöl Beşdəli** *oyk., mür* Sabirabad r-nunun eyniadlı i ə v -də kənd Muğan düzündədir Oykonim *çöl* və *Beşdəli* (etnotoponim) komponentlərindən düzəlib, "kənarda olan Beşdəli kəndi" deməkdir Burada *çöl* komponenti yaşayış məntəqəsini r-nun ərazisindəki Beşdəli adlı kənddən fərqləndirməyə xidmət edir

**Çöl Dəllək** *oyk., mür* Sabirabad r-nunda kənd Muğan düzündədir Oykonim *çöl* (düzənlik) və *Dəllək* (etnotoponim) komponentlərindən düzəlib, "çöldə, düzənlikdə yerləşən Dəllək kəndi" mənasındadır Toponimin birinci komponenti yaşayış məntəqəsini r-nun ərazisindəki Yaxa Dəllək kəndindən fərqləndirməyə xidmət edir

**Çöl Ərəb** *oyk., mür* Kürdəmir r-nunun Muradxan i ə v -də kənd. Şirvan düzündədir Oykonim *çöl* (düzənlik) və *Ərəb* (etnotoponim) komponentlərindən düzəlib, "düzənlikdə yerləşən Ərəb kəndi" mənasındadır Toponimin tərkibindəki birinci komponent yaşayış məntəqəsini keçmişdə bu ərazidə mövcud olmuş çoxsaylı *ərəb* komponentli (Ərəb Qaradağ, Ərəb Çəltikçi, Ərəb Sarvan, Ərəb Mehdibəy və b ) kəndlərdən fərqləndirməyə xidmət edir

**Çöl Qubalı** *oyk., mür* Kürdəmir r-nunun Ərəbqubalı i ə v -də kənd Şirvan düzündədir Toponimin birinci komponenti keçmişdə burada mövcud olmuş İçəri Qubalı kənd adının birinci komponentinin qarşılığıdır və "kənar" mənasındadır Toponimin ikinci komponenti isə, mütəxəssislərin fikrincə, *ərəbkufəli* etnoniminin təhrif olunmuş formasıdır Ərəb işğalları dövründə (VII əsr) İraqın Kufə mahalından köçürülmüş tayfalardan biri olan *ərəbkufəlilər* bu ərazidə məskunlaşmışdılar

**Çöl Quşçu** *oyk., mür* Dəvəçi r-nunun eyniadlı i ə v -də kənd Samur-Dəvəçi ovalığındadır Keçmişdə Aşağı Quşçu da adlanmışdır Dağ Quşçu toponiminin qarşılığıdır Oykonim *çöl* (düzəngah, aşağı) və *Quşçu* (etnotoponim) komponentlərindən düzəlib, "düzənlikdə olan Quşçu kəndi" mənasındadır

**Çöpədərə** *oyk., mür* Zəngilan r-nunun eyniadlı i ə v -də kənd Dağətəyi ərazidədir Çəpədərə variantında da qeydə alınmışdır Yerli əhalinin məlumatına görə, yaşayış məntəqəsi Cənubi Azərb -nın Çəpədərə kəndindən köçüb gəlmiş ailələr tərəfindən salınmışdır Tədqiqatçılara görə, toponim *çap* (türk dillərində "xırda daşlı və qumlu, bitkisiz dağ yamacı") və *dərə* (mənfi relyef forması) sözlərindən düzəlib, "xırda daşlı, qumlu, bitkisiz dərə" deməkdir

**Çörəkli** *oyk., sadə* Xocavənd r-nunun Güneşli i ə v -də kənd Dağətəyi ərazidədir Yaşayış məntəqəsi XIX əsrin əvvəllərində İrandan gəlmiş erməni ailələrinin Çörəkli adlı yerdə məskunlaşması nəticəsində yaranmışdır Ermənilər kəndi Hatsi (erm. "çörəkli") adlandırmışdılar 1992-ci ildən kəndin adı yenidən özünə qaytarılmışdır

**Çubuqlu** *oyk., düz* Qusar r-nunun Qusar şəhər i ə v -də kənd Qusar çayı sahilində, Qusar maili düzənliyindədir Yaşayış məntəqəsi 1965-ci ildə Təcrübə (bağçılıq) stansiyası yanında salınmışdır Oykonim *çubuq* (burada "şitil", "tıng") sözündən və *-lu* şək.-sindən ibarət olub "şitillik, tinglik" deməkdir

**Çudulu** *oyk., düz* Qax r-nunun Turaclı i ə v -də kənd Tədqiqatçılar oykonimi *çudul* (avar dilində "xarabalıq, sahibsiz yer") sözü əsasında "sahibsiz yer" kimi izah edirlər Əslində, *çu* (at) və *dul* (yer, dərə) komponentlərindən ibarət olan bu oykonim "atxana", "at saxlanan yer" mənasındadır Qəbələ r-nundakı Tövlə oykoniminin sinonimidir Kənd vaxtilə salındığı ərazinin adını daşıyır 1728-ci ildə İrəvan qubernìyasının İqdır nahiyəsində eyniadlı kənd qeydə alınmışdır

**Çudulubinə** *oyk., mür* Zaqatala r-nunun Yuxarı Tala i ə v -də kənd Alazan-Əyriçay çökəkliyindədir Kəndin ərazisi keçmişdə Yuxarı Tala kəndinin binə yeri olmuşdur Sonralar həmin kənddən köçən əhali binə yerində məskunlaşmışdır Oykonim yerli əhalinin dilində Çüdülübinə kimi tələffüz olunur *Çüdü* bu ərazidə bitən bitkinin adıdır "Çudulu kəndinə məxsus binə" mənasındadır

**Çuxadurmaz** *or*, *mür* Şəki r-nu ərazisində dağ Baş Qafqaz silsiləsinin zirvəsidir Hün 3597 m Oronim *çuxa* (kişi üst geyimi) və *durmaz* (sürüşən, düşən) komponentlərindən düzəlib "üstündə çuxa durmayan, yəni yamacları sürüşkən, sıldırım dağ" deməkdir

**Çuxadurmaz** *hidr*, *sadə*. Şəki r-nu ərazisində çay Kiş çayının sol qoludur Mənbəyini Baş Qafqaz silsiləsinin c yamacından (3280 m yüksəklikdən) alır Tez-tez sel hadisələri olur Adını eyniadlı dağdan almışdır

**Çuxanlı** *oyk*, *sadə* 1 Salyan r-nunun eyniadlı i ə v -də kənd Kür çayının sahilində, Cənub-Şərqi Şirvan düzündədir Keçmiş adı Süleymankənd olmuşdur 1872-ci ildə baş vermiş zəlzələ nəticəsində Şamaxı qəzasının Çuxanlı kəndindən köçmüş ailələr burada məskunlaşmışdılar Bu vaxta qədər kəndin ərazisi Şirvanın dağlıq zonasında yaşayan *çuxanlı* tayfasının qışlağı olmuşdur; 2 Qobustan r-nunun Təklə i ə v -də kənd Acıçayın mənbə hissəsində, dağlıq ərazıdədir *Çuxanlı* tayfasının adı ilə bağlıdır Etnotoponimdir

**Çuxur Qəbələ** *oyk*, *mür* Qəbələ r-nunun Mırzəbəyli i ə v -də kənd Yaşayış məntəqəsi qədim Qəbələ şəhərinin xarabalıqlarının yaxınlığında çökək yerdə yerləşdiyi üçün Çuxur Qəbələ adlanır. Qədim şəhərin xarabalığı nisbətən yüksəkdədir

**Çuxurəzəmi** *oyk* *mür* Dəvəçi r-nunun eyniadlı i ə v -də kənd Dağətəyi ərazidədir Oykonim *çuxur* (çökək) və *zəmi* (fars "yer") sözlərindən düzəlib (*-ə* burada bitişdirici saitdir), "çuxur yer, çökək yer" deməkdir Kənd həqiqətən də çökək yerdə salınmışdır

**Çuxurməhlə** *oyk*, *mür* Ağdam r-nunun Xıdırlı i ə v -də kənd Dağətəyi ərazıdədir Oykonim *çuxur* (çökək) və *məhlə* (məhəllə, kəndın bir hissəsi) komponentlərindən düzəlib, "çuxurda, çökəkdə olan məhəllə" mənasındadır

**Çuxuroba** *oyk*, *mür* Xaçmaz r-nunun Qımılqışlaq i ə v -də kənd Samur-Dəvəçi ovalığındadır Oykonim *çuxur* (çokək) və *oba* (kəndin bir hissəsi) komponentlərindən düzəlib, "çuxurda olan oba" mənasındadır Kənd həqiqətən də çökəkdə yerləşir Kollektivləşmədən sonra oba daimi yaşayış məntəqəsinə çevrilmişdir

**Çuxurtumas** *or*, *mür* Qəbələ r-nu ərazisində dağ, Baş Qafqaz silsiləsinin zirvəsidir Hün 3576 m Dağ vaxtilə burada mövcud olmuş eyniadlı kəndin adı ilə adlandırılmışdır Oykonim Dağ Tumas (Cəbrayıl r-nu) adının qarşılığıdır

**Çuxuryurd** *oyk*, *mür* Şamaxı r-nunun eyniadlı i ə v -də kənd. Çuxuryurd çökəkliyindədir Yaşayış məntəqəsi XIX əsrin birinci yarısında rus ailələrinin köçürülməsi nəticəsində yaranmışdır Əvvəllər yaylaq yeri olmuş bu ərazı çuxurda, çökəklikdə yerləşir Oykonim "çökəklikdə yurd yeri" mənasındadır

**Çuxuryurd** *hidr*, *sadə* Şamaxı şəhərindən şm -da, Çuxuryurd kəndinin yaxınlığında mın bulaqlar Müalicə üçün ıstifadə olunur Adını yaxınlığındakı yaşayış məntəqəsindən almışdır

**Çuqak** *or*, *sadə* Balakən r-nu ərazisində dağ Baş Qafqaz silsiləsinin zirvəsidir Hün 2761 m Avar *çuqak* "bünövrə", "əsas", "başlanğıc" deməkdir

**Çullu** *oyk*, *sadə* 1 Ağdam r-nunun Quzanlı i ə v -də kənd, 2 Ağdam r-nunun Maqsudlu i ə v -də kənd Qarabağ düzündədir; 3. Cəbrayıl r-nunun Dağ Tumas i.ə v -də kənd Gəyən çölündədir Tədqiqatçıların fikrincə, oykonimin düzgün variantı Çolludur və bu ad özündə hun mənşəli *çol* tayfasının adını əks etdirir Cənubi Azərb ərazisində də Çullu adlı kənd qeydə alınmışdır

**Çullutəpə** *or*, *mür* Abşeronda dağ və palçıq vulkanı Etnotoponimdir

**Çumalar** *oyk*, *sadə* Bərdə r-nunun Qarademırçi i ə v -də kənd Qarabağ düzündədir Əsl adı Cumalardır Yaşayış məntəqəsi *cumalar* nəsli tərəfindən salındığına görə həmin nəslin adını daşıyır Etnotoponimdir

**Çurki** *or*, *sadə*. Abşeron arxipelaqında ada Toponimiyada *çur/çuru* "çınqıl", "qum və çınqılla örtülmüş dayaz yer" mənalarında işlənmişdir, *ki* isə tat "yüksəklik, dağ" deməkdir Oronim adanın süxurlarını təyin edir

**Çuruxçuqke** *or*, *mür* Dağlıq Qarabağda aşırım Oronim *çurux* (*çurka* – çılpaq qayalıq) və *çuqke* (qırğız dilində *çoku*, özbək dilində *çukki* "zirvə, dağın başı" deməkdir) komponentlərindən düzəlib, "çılpaq zirvə" mənasındadır

**Çutorvaş** *hidr*, *mür* Qusar r-nu ərazisində çay *Çutor* (buz, qarla örtülmüş) və *vaş* (*baş* sözünün fonetık variantı) komponentlərindən ibarət olan bu hidronim ərazıdəki dağın adındandır, "buzla örtülü zirvə" deməkdir

**Çuturdağ** *or*, *mür* Quba r-nu ərazisində dağ. Oronim *çutur* (buzlu, qarla örtülmüş) və *dağ* (müsbət relyef forması) komponentlərindən düzəlib, "zirvəsi qarla örtülü dağ" mənasındadır

**Çuvaldağ** *or*, *mür* Bakı şəhərində dağ Qədim məişət əşyası olan *çuvala* bənzədiyinə görə belə adlandırıldığı güman edilir Etnotoponim olması da mümkündür

**Çuvaş** *oyk*, *sadə* Astara r-nunun Siyaku i ə v -də kənd Lənkəran ovalığındadır Etnotoponimdir

**Çükəş** *oyk*, *sadə* Astara r-nunun Pəlikəş i ə v -də kənd Dağətəyi ərazıdədir Talış dilindəki *çü* (ağac, taxta) və *kəş* (qoşqu ləvazimatı) sözlərindən düzəlib. Görünür, qoşqu ləvazımatının taxtadan olan hissəsi bu kənddə düzəldiyi üçün kənd belə adlandırılmışdır

**Çünəxanlı** *oyk*, *sadə* Cəlilabad r-nunun Astanlı i ə v -də kənd Burovar silsiləsinin ətəyindədir Əsl adı Çumaxanlıdır Yaşayış məntəqəsi XIX əsrin sonlarında muğanlı tayfasına mənsub *çumaxanlı* nəslinin məskunlaşması nəticəsində yaranmışdır

**Çünzəli** b a x Cünzəli

# Dd

**Dabaqlı** *or., sadə* Culfa r-nu ərazisində dağ silsiləsi. Şahbuz r-nu ilə sərhəddədir. Dağın zirvəsinin *tabağa* (məişətdə işlədilən ağac qab) oxşarlığı ilə əlaqədar olaraq belə adlandırılması ehtimal edilir. Güman etmək olar ki, dağın adı vaxtilə ərazidəki *dabbaqxananın* (dəri aşılanan emalatxana) adından yaranmış, yaxud vaxtilə burada Dabbaqlı adlı yaşayış məntəqəsi olmuş, dağ da həmin kəndin adı ilə adlandırılmışdır.

**Dabaltçay** *hidr., mür.* Zaqatala r-nu ərazisində çay. *Dabalt* (dialektlərimizdə *davall dabal* sözü "cəld, iti" mənalarında işlənir) və *çay* (su hövzəsi) komponentlərindən ibarət olan hidronim "sürətlə axan çay, iti çay" mənasındadır.

**Dabanbulaq** *hidr., mür.* Şamaxı r-nu ərazisində bulaq. *Daban* (dağın, qayanın aşağı hissəsi) və *bulaq* (su obyekti) komponentlərindən düzəlib, "dağın aşağı hissəsində qaynayan su" mənasındadır. *Daban* komponenti toponimiyada geniş yayılmışdır. Ağdaban, Ağdabançay, Qaynaqdaban (Kəlbəcər), Dabansar (Ermənistan), Daken-Daban, Ulan-Daban, Turgen-Daban (Çin) və s.

**Daçılqan-Çaylaq** *hidr., mür.* Cəbrayıl r-nu ərazisində çay. Hidronim *daçılqan/daşılqan* (daşan, su basan) və *çaylaq* (çaybasan yer) komponentlərindən düzəlib, "daşan, ətrafı basan çay", "məcrasından çıxan çay" mənalarındadır.

**Dadaşbəyli** *oyk., sadə* Sabirabad r-nunun Qara Güney i.ə.v.-də kənd. Kür çayının sahilində, düzənlikdədir. Yaşayış məntəqəsi XIX əsrdə Yuxarı Dadaşbəyli və Aşağı Dadaşbəyli adı ilə iki müstəqil hissədən ibarət olmuş, Sovet hakimiyyəti illərində birləşmişdir. Oykonim ərəbbaloğlan tayfasının *dadaşbəyli* tirəsini əks etdirir. Kənddə bu tirəyə mənsub ailələr məskunlaşmışlar. Etnotoponimdir.

**Dadaşlı** *oyk., sadə* Ağdam r-nunun Xındırıstan i.ə.v.-də kənd. Dağətəyi düzənlikdədir. Yaşayış məntəqəsi *dadaşlı* nəslinin məskunlaşması nəticəsində yaranmışdır. Etnotoponimdir.

**Daduri** *or., mür.* Dəvəçi r-nu ərazisində dağ. Tədqiqatçılara görə, oronim Dudahan adının təhrifə uğramış formasıdır. Dağın adı tat dilindəki *du* (iki) və *dahar* (qaya) sözlərindən düzəlib (*-i* mənsub. şəkilçisidir), "iki qayalı dağ" mənasındadır.

**Dağ Bilici** *oyk., mür.* Dəvəçi r-nunun Düz Bilici i.ə.v.-də kənd. Dağlıq ərazidədir. Oykonimin birinci komponenti (*dağ*) onu digər eyniadlı oykonimdən (Düz Bilici) fərqləndirməyə xidmət edir, ikinci komponent isə kəngərlilərin *bilici* tayfasının adını əks etdirir, "dağlıq ərazidə olan Bilici kəndi" deməkdir.

**Dağ Ceyir** *oyk., mür.* Şəmkir r-nunun eyniadlı i.ə.v.-də kənd. Ceyir çayının (Kür çayının qolu) sahilində, dağlıq ərazidədir. Yerli əhalinin məlumatına görə, yaşayış məntəqəsini XIX əsrin əvvəllərində Ermənistan ərazisindən və Qarabağdan köçüb gəlmiş ailələr salmışlar. Yaşayış məntəqəsi adını yerləşdiyi dağlıq ərazidən və Ceyir çayının adından almışdır.

**Dağ Xilə** *oyk., mür.* Salyan r-nunun Navahı i.ə.v.-də kənd. Salyan düzündədir. XX əsrin əvvəllərində Şamaxı qəzasında *xilə* adlı köçəri maldar tayfa yaşayırdı. 1933-cü ildə Dağ Xilə və Xıləmirzəli adlı iki daimi yaşayış məntəqəsi qeydə alınmışdır. Oykonimin birinci komponenti onu eyniəsaslı digər oykonimdən (Xiləmirzəli) fərqləndirməyə xidmət edir.

**Dağ Kəsəmən** *oyk., mür.* Qazax r-nunun eyniadlı i.ə.v.-də kənd. Ağstafa çayının sağ sahilində, Gəncə-Qazax düzənliyindədir. Kənd dağa yaxın ərazidə yerləşdiyi üçün və ərazidəki Qıraq Kəsəmən kəndindən fərqləndirmək məqsədilə belə adlandırılmışdır. *Kasaman* qazaxların bir tayfasının adıdır. Oykonim "dağ ətəyində olan Kəsəmən kəndi" mənasındadır.

**Dağ Kolanı** *oyk., mür.* Qobustan r-nunun Quşçu i.ə.v.-də kənd. Pirsaat çayından 3 km aralı, dağətəyi ərazidədir. Yaşayış məntəqəsi *kolanı* tayfasının dağlıq ərazidə məskunlaşması nəticəsində yaranmışdır. Kəndin ərazisində XI-XII əsrlərə aid qədim yaşayış yerinin xarabalığı qalır. Oykonim "dağlıq ərazidə yerləşən Kolanı kəndi" mənasındadır.







**Dağ Qılıçlı** *oyk., mür.* Kəlbəcər r-nunda kənd. Dikyurd yaylasının ətəyindədir. Oykonimin birinci komponenti (*dağ*) kəndin yerləşdiyi coğrafi mövqeyi bildirir, ikinci komponent isə etnotoponimdir. "Dağlıq ərazidə, dağ ətəyində olan Qılıçlı kəndi" mənasındadır.

**Dağ Quşçu** *oyk., mür.* Dəvəçi r-nunun eyniadlı i.ə.v.-də kənd. Gilgilçayın sağ sahilindən 6 km aralı, Baş Qafqaz silsiləsinin ətəyindədir. Oykonimin birinci komponenti (*dağ*) onu digər eyniadlı oykonimdən (Çöl Quşçu) fərqləndirməyə xidmət edir. İkinci komponent isə *quşçu* tayfa adını əks etdirir. "Dağlıq ərazidə olan Quşçu kəndi" mənasındadır. Kənd Qələnov dağının yaxınlığında yerləşir.

**Dağ Maşanlı** *oyk., mür.* Cəbrayıl r-nunun Dağ Tumas i.ə.v.-də kənd. Qarabağ silsiləsinin ətəyindədir. Yaşayış məntəqəsi *maşanlı* (və ya *maçanlı*) tayfasının dağlıq ərazidə məskunlaşması nəticəsində yaranmışdır. Oykonim "dağlıq ərazidə yerləşən Maşanlı kəndi" mənasındadır. Kənd bu adla r-nun ərazisindəki Maşanlı və ya Araz Maşanlısı kəndindən fərqlənir.

**Dağ Tumas** *oyk., mür.* Cəbrayıl r-nunun eyniadlı i.ə.v.-də kənd. Qarabağ silsiləsinin ətəyindədir. Keçmiş adı Tumas olmuşdur. Sonralar bu kənddən ayrılmış ailələr Tumaslı (Bərdə və Şərur r-nları), Çaytumas (Qubadlı r-nu) kəndlərini saldıqdan sonra, birini digərindən fərqləndirmək məqsədilə dağ yamacında yerləşən bu kənd Dağ Tumas adlandırılmışdır.

**Dağ Tumas** *or., sadə* Cəbrayıl r-nu ərazisində dağ. Qarabağ silsiləsinin c.-q. ətəklərində zirvədir. Hün. 1579 m. XX əsrin əvvəllərində Tumaslı dağı adı ilə qeydə alınmışdır. Sonralar Dağ Tumas kəndinin adı ilə adlandırılmışdır. Dağın yüksək yerində Tumasata adlı sərdabə – pir də var.

**Dağ Üzü** *oyk., mür.* Yardımlı r-nunun Çay Üzü i.ə.v.-də kənd. Peştəsər silsiləsinin yamacındadır. Keçmiş adı İlkin Üzü olmuşdur. İnqilabdan əvvəl burada Üzü adlı bir kənd olmuşdur. Bu kənddən çıxmış ailələr sonralar çay sahilində yeni yaşayış məntəqəsi salmış və onu Çay Üzü adlandırmışdılar. Dağ yamacındakı əvvəlki Üzü kəndi isə Dağ Üzü adını almışdır.

**Dağ Üzü** *hidr., sadə* Yardımlı r-nunda çay. Dağ Üzü kəndinin ərazisindən axdığı üçün bu kəndin adını almışdır. Dağüzçay variantında da qeydə alınmışdır.

**Dağaralı** *or., mür.* Xızı r-nu ərazisində, Baş Qafqaz silsiləsində zirvə. Hün. 1276 m. Oronim "arahda, kənarda yerləşən dağ" mənasındadır.

**Dağayataq** *hidr., sadə* Abşeron yarımadasının şm.-q. hissəsində axarsız şor göl. Alçaq dağlıq ərazidədir. Keçmişdə həmin ərazidə qışda qoyun yataqları olmuşdur və ərazi də Dağayataq (yəni "dağ döşündə yataq") adlanmışdır. Göl öz adını yerləşdiyi ərazidən almışdır. Hidronim Dağyataq, Dağyatağı variantlarında da qeydə alınmışdır.

**Dağdağan** *oyk., sadə* Xocalı r-nunun Harov i.ə.v.-də kənd. Qarabağ silsiləsinin ətəyindədir. Toponim Azərb.-da bitən və qədimdən müqəddəs, pis qüvvələrdən qoruyucu hesab edilən dağdağan ağacının adı ilə bağlıdır. Fitotoponimdir. Azərb.-da bu bitkinin adı ilə Dağdağan dağı (Xanlar və Şahbuz r-nları), Dağdağanlı dərə (Oğuz, Qəbələ, Qubadlı, Zəngilan, Qazax, Cəlilabad r-nları), Dağdağanlı Qobu (Şəki), Dağdağanlıdüz (Cəbrayıl), Dağdağan təpəsi (Xocavənd) və s. oronimlər də qeydə alınmışdır.

**Dağdağan** *hidr., sadə* Ağcabədi və Ağdam r-nları ərazisində çay. Qarqar çayının qoludur. Adını ərazidəki eyniadlı kəndin adından almışdır.

**Dağdöşü** *oyk., sadə* Xocavənd r-nunda kənd. Dağətəyi ərazidədir. XIX əsrə aid sənədlərdə Tağ kimi qeydə alınmış bu kəndin adı XX əsrdə Tyak variantında işlənmişdir. Bəzi tədqiqatçılar bu coğrafi adı türk dillərində "sığınacaq", "köçəbə", "oba" mənasında işlədilən *tövək* sözü ilə əlaqələndirirlər. 1992-ci ildən coğrafi mövqeyinə görə Dağdöşü adını almışdır.

**Dağlı** *oyk., sadə* Quba r-nunun Qırmızı Qəsəbə i.ə.v.-də kənd. Qudyal çayının sahilində, dağətəyi ərazidədir. Yaşayış məntəqəsi Böyük Vətən müharibəsindən sonrakı illərdə dağlıq ərazidə alma bağlarının salınması ilə əlaqədar sovxoz işçiləri üçün varadılmışdır.

**Dağlıq Qarabağ Muxtar Vilayəti** (DQMV) Azərb -da, Kiçik Qafqazın ş hissəsində yerləşir 1923-cü il iyulun 7-də təşkil edilmişdir Beş inzibati r-nu (Laçın, Xocalı, Şuşa, Xocavənd, Kəlbəcər), iki şəhəri, iki yüz iyirmi kənd və qəsəbəni əhatə edən dağlıq ölkədir Dəniz səviyyəsindən orta hündürlüyü 1100 km -dir Şm.-dan və q -dən ölkənin böyük bir hissəsini tutan Murovdağ (ən hündür zirvəsi Böyük Kirsdir Hün. 2725 m.) sıra dağları ilə əhatə olunmuşdur Həmin sıra dağlar ş -ə doğru tədricən alçalır və çay dərələri ilə çox parçalanmış yüksəkliklər (150-500 m ) şəklində Kür-Araz ovalığına qovuşur DQMV-də tez-tez zəlzələ hadisələri baş verir Çayları tropik dağ çayları olub, Kürün hövzəsinə daxildir. İri çayları Tərtər, Xaçın, Qarqar, Quruçay, Köndələnçaydır

**Dağüstü** *oyk., mür* Quba r-nunun Buduq i ə v -də kənd Yan silsiləsinin (Böyük Qafqaz) yamacındadır Oykonim "dağ üstündə salınmış kənd" mənasında olub, kəndin yerləşdiyi coğrafi mövqeyi bildirir

**Dağyurd** *oyk., mür* Xocalı r-nunun eyniadlı i ə v -də kənd XIX əsrin 90-cı illərində İrandan köçüb gəlmiş erməni ailələrinin Dağyurd kəndində məskunlaşmasından sonra Sarışen/Sorışen (dağkənd) adlandırılmış, 1992-ci ildən kəndin əvvəlki adı bərpa edilmişdir Oykonim "dağda salınmış yurd" mənasındadır

**Dahar** *oyk., sadə* İsmayıllı r-nunun Müdri i.ə.v -də kənd Girdiman çayının sahilində, dağətəyi ərazidədir Keçmiş adı Dahar Mulux olmuşdur Yaşayış məntəqəsi Mulux kəndindən çıxmış ailələrin Dahar adlı yerdə məskunlaşması nəticəsində yaranmışdır Tat dilində *dahar* "qaya", xalq terminologiyasında isə coğrafi termin kimi "daşlı, çınqıllı yer", "təpə", "alçaq və yastı dağ" mənalarında işlənir Dahar komponentli toponimlər r-nun ərazisində geniş yayılmışdır Köhnədahar, Sərdahar, Dahardağ, Dahardağ dərəsi və s

**Dainəkadzor** *hidr. mür* Xocavənd r-nu ərazisində çay Kiçik Həkəri (Əkərə) çayının qoludur Danakidzor variantında da qeydə alınmışdır. Hidronim *dainak* (*daylax* sözünün təhrif forması) və *dzor* (erm "dərə") komponentlərindən düzəlib, "daylax dərəsi" mənasındadır Azərb. dilində *daylaq* birillik at balasıdır Görünür, keçmişdə bu çayın yaxınlığında daylaq yetişdirildiyi üçün çay bu adı almışdır

**Dal Dikqal** *or., mür* Şəki r-nu ərazisində dağ Oronim *dal* (arxa tərəf, dal tərəf), *dik* (şaquli istiqamətdə olan, hündür yer, yüksəklik) və *qal* (qədim türkdilli yazılı abidələrin dilində "dik" sözünün sinonimi kimi işlənmişdir Qafqaz dillərindəki "təpə" mənalı *kval* sözünün də bu sözdən törədiyi güman edilir) komponentlərindən düzəlib, "arxada olan dik, hündür yer" və ya "arxası hündür dağ" deməkdir

**Dalaqo** *oyk., düz* Quba r-nunun Gilezi i ə v -də qəsəbə Yaşayış məntəqəsi eyniadlı qışlaq yerində salınmışdır Oykonim *dala* (Azərb dilindəki "tala" sözünün tat dilində tələffüz forması) komponentindən və məkan bildirən *-qo* şəkilçisindən düzəlib, "talalıq, tala yeri" mənasındadır

**Dalğalı** *oyk., düz* Xaçmaz r-nunun Nabran i ə v -də qəsəbə Xəzər dənizinin ləpədöyən sahilində yerləşdiyi üçün belə adlandırılmışdır

**Dalıqaya** *oyk., mür* Quba r-nunun Rük i ə v -də kənd Dağətəyi ərazidədir Oykonim "arxası qaya olan" mənasındadır

**Damarçın** *hidr , düz* Şəki r-nu ərazisində çay Aşağı axarında Kiş çayı adlanır Çayda tez-tez sel hadisələri baş verir. Şəki şəhəri yaxınlığında çayın üzərində iki SES tikilmişdir Aşağı axarında suvarma üçün geniş istifadə olunur Hidronim *damar* (toponimik termin kimi "çay yatağı, axar su hövzəsi, çay, çay qolu, arx" mənalarında işlənir) və *-çın* (qədim element olub, *-cıq* şək -sinə uyğundur) komponentlərindən düzəlib, "kiçik çay", "çay qolu", "çay yatağı" deməkdir

**Dambulaq** *oyk., sadə* Laçın r-nunun Şəlvə i ə v -də kənd Mıxtökən silsiləsinin yamacındadır Oykonim eyniadlı bulağın adı ilə adlandırılmışdır Bulağın adı isə *dam* (üstü örtülü, tikili) və *bulaq* (su obyekti termini) komponentlərindən düzəlib, "üstü bağlı bulaq", "üstündə tikili olan bulaq" deməkdir

**Damcılı** *oyk., sadə* Xanlar r-nunun Qızılca i ə v -də kənd Dağətəyi ərazidədir Kənd qonşu Qızılca kəndi ilə birləşmişdir Yaşayış məntəqəsi adını kəndin ərazisindəki Damcılı bulağının adından almışdır Bulağın adı suyunun damcı-damcı axması ilə əlaqədardır Qazax r-nunun Daş Salahlı kəndi ərazisində, Avey dağının lap dibində damcı-damcı axan və Damcılı adlanan bulaq da mövcuddur







**Damğalı** *oyk., sadə* Kəlbəcər r-nunun Kolataǧ i ə v -də kənd. Dağətəyi ərazidədir XIII əsrdə monqol yürüşlərində iştirak etmiş, sonralar Azərb ərazisində məskunlaşmış *damğalı* tayfasının adı ilə bağlı olduğu ehtimal edilir Etnotoponimdir

**Damlamaca** *oyk., sadə* Qobustan r-nunun Dərəkənd i ə.v -də kənd Kəndin ərazisində Damlamaca adlı mağara var Yaşayış məntəqəsi həmin mağaranın adını daşıyır Dilimizdə *damlama* sözü "daldalanacaq", "sığınacaq" mənalarında işlənir Mağaranın adı da bu məna ilə bağlıdır

**Danaçı** *oyk., sadə* Zaqatala r-nunun eyniadlı i ə v -də kənd Qarasu çayının (Qanıx çayının qolu) sahilində, Alazan-Əyriçay çökəkliyindədir Oykonim XII əsrin ortalarında Səlcuq oğuzlarının tərkibində Azər -na gəlmiş türk mənşəli *dana* (özbək, qaraqalpaq, qazax, qırğız və türkmənlərdə *tana*) tayfasının adından və mənsubluq bildirən *-çı* şəkilçisindən ibarət olub, "dana tayfasına mənsub olanlar" deməkdir

**Danaçıbaşı** *or mür* Oğuz r-nu ərazisində dağ Daşağıl çayı ilə Xalxal çayının hövzələri arasında yerləşir Hün 2726 m Oronim *Danaçı* (kənd adı) və *baş* (yuxarı tərəf) sözlərindən düzəlib (burada *-ı* mənsub şək.-sidir), "Danaçı kəndinin yuxarı tərəfi" deməkdir

**Danaqırançöl** *or , mür* 1 Qazax r-nunun şm -q. hissəsində dağ Ermənistanla sərhəddədir Hün 608 m , 2 Danaqırançöl dağının ətəyində çöl Dağ öz adını ətəyindəki çölün adından almışdır Çölün adı isə burada bitən *danaqıran* otunun adındandır *Danaqıran* soğanaqlı bitkidir Tərkibində zəhərli alkoloid olduğundan heyvanlar onu yemir.

**Danaqırt** *oyk , sadə* Ordubad r-nunun Dırnıs i ə v -də kənd Vənənd çayının (Arazın qolu) sahilində, dağətəyi ərazidədir Danaqırd variantında da qeydə alınmışdır *Danaqırt* xırda yabanı otdur Kənd öz adını ərazinin bitki örtüyündən almışdır

**Danayerçay** *hidr , mür* Xanlar r-nu ərazisində çay R-nun ərazisindəki Danayeri kəndindən axdığı üçün kəndin adı ilə adlandırılmışdır

**Danayeri** *oyk , mür* Xanlar r-nunun Qızılca i ə v -də kənd Gəncə-Qazax düzənliyindədir. Yaşayış məntəqəsi əvvəllər dana saxlanılan və Danayeri adlandırılan yerdə salındığı üçün həmin sahənin adını almışdır Oykonimi türkdilli *dana* (*tana*) tayfasının adı ilə də bağlayırlar

**Dandıx** *oyk., sadə* Qəbələ r-nunun Tikanlı i.ə v -də kənd. Zəngəlqaya dağının ətəyindədir. Yaşayış məntəqəsini XIX əsrin əvvəllərində Tikanlı kəndindən köçüb gəlmiş ailələr Dandıx adlı yerdə salmışlar *Danlıq* coğrafi termin kimi "bozqır, otsuz yer", "quru yer", "çılpaq yer" mənasındadır *Dan* sözünün "quru" mənasına Abşeron yarımadasındakı Danşor gölünün adında da rast gəlmək olar

**Danquli** *hidr , sadə* Xəzər hövzəsində çay Azərb dilinin dialektlərində *danqıl/danqul/danqıl* "boş", "başdansovdu", "hərdənbir", *danqır* "daz"; *danqar* "böyük vanna, hövzə" mənalarında işlənir (burada *-i* mənsubluq bildirir) Hidronim "arabir axan, müntəzəm axmayan çay" və ya "böyük hövzəyə tökülən çay" kimi izah oluna bilər

**Darçay** *hidr , mür* Xocalı r-nu ərazisində çay Qarqar çayının sol qoludur Çay yuxarı axınında dar dərələrdən keçdiyi üçün belə adlandırılmışdır Hidronim *dar* (ensiz) və *çay* (su obyekti) komponentlərindən ibarət olub, "ensiz çay" mənasındadır

**Dardərə** *oyk., sadə* Daşkəsən r-nunun Əhmədli i ə v -də kənd Dəstəfur çayının (Gəncə çayının qolu) sol sahilindən 2 km aralı, dağ ətəyindədir Keçmiş adı Mollalı və ya Molla Məmməd olmuşdur Kənd Dardərə adlanan yerdə salınmışdır Oykonim kəndin yerləşdiyi ərazinin coğrafi mövqeyini təyin edir, "Dardərədə salınmış kənd" mənasındadır

**Dardoqqaz** *oyk , sadə* Zaqatala r-nunun Göyəm i ə v -də kənd Düzənlikdədir Keçmiş adı *Ulam* (qəd türk "keçid" mənasındadır) olmuşdur Yaşayış məntəqəsi XVIII əsrdə Dağıstandan gəlmiş avar ailələrinin Dardoqqaz adlı yerdə məskunlaşması nəticə-

sində yaranmışdır Toponim *dar* (keçilməsi çətin olan) və *doqqaz* (qapı, keçid) sözlərindən düzəlib, "dar keçid" deməkdir

**Darğalar** *oyk sadə* Bərdə r-nunun Kələntərli i ə v -də kənd. Qarabağ düzündədir Yaşayış məntəqəsini *darğalar* nəslinə mənsub ailələr saldığı üçün belə adlandırılmışdır Nəsil isə adını keçmişdə nəsli vəzifə sayılan "darğalıq"dan almışdır *Darğa/daruğa/darugaçı* (monqol *daruxu* "sıxmaq", "daraltmaq", məcazı mənada "möhürləmək") orta əsrlərdə monqol istilasına məruz qalmış ölkələrdə, o cümlədən Azərb -da monqol xanının vergi toplayan və əhalini siyahıya alan nümayəndəsi, inzibati məmur olmuşdur Əsasən hökmdar tərəfindən təyin edilən *darğalar* lazım gəldikdə yerli əhalidən yardımçı hərbi hissələr təşkil edir, asayişi qoruyurdular Qızıl Ordada onlar *baskak*, bəzi Şərq ölkələrində isə *şəhnə* adlanırdılar Vəzifə adı kimi Darğaməlik (Ordubad r-nu) oykoniminda saxlanılmışdır

**Darıdağ** *or , mür* 1 Cəbrayıl r-nunun c -q hissəsində dağ Hün 765 m, 2 Culfa r-nu ərazisində dağ Əlincə və Gilan çaylarının suayrıcında yerləşir Hün 1923 m; 3 Gədəbəy r-nu ərazisində dağ Güman edilir ki, toponimiyada Darı qobusu (İmişli), Darı dərəsi (Füzuli), Darı düzü (Ovuz), Darı yeri (Bərdə, İmişli, Yevlax, Göyçay, Şəki) və s mikrotoponimlər də daxil olmaqla *darı* komponentli toponimlər dənli bitki adı ilə əlaqədardır Lakin dilimizdə "qumdaşı", "su ayrılan, su bölünən yer" mənasında da *darı* sözü işlənir ki, bu da xüsusilə oronimlərə xas xüsusiyyətlərdir

**Darıdağ** *hidr , sadə* Culfa r-nu ərazisində, Culfa şəhərindən şm -ş -də, Şorlu çay dərəsində min bulaqlar Dəniz səviyyəsindən 800-900 m hündürlükdə, Darıdağ mərgümüş yatağı yaxınlığındadır Yüksək minerallaşmış, karbon qazlı suyunda mərgümüş vardır Əsəb, dəri və s xəstəliklərin müalicəsində istifadə edilir Hidronim ərazidə yerləşən eyniadlı dağın adından yaranmışdır

**Darılıq** *oyk , düz* Cəlilabad r-nunun Ağdaş i ə v -də kənd Burovar silsiləsinin ətəyindədir Yaşayış məntəqəsi XIX əsrdə maldarlıqla məşğul olan bir qrup ailənin Darılıq adlı yerdə məskunlaşması nəticəsində yaranmışdır Oykonim "darı əkilən yer" mənasındadır Fitotoponimdir Qax r-nunun Güllük kəndində də Darılıq sahəsi adlı yer qeydə alınmışdır

**Darquba** *oyk., mür.* Lənkəran r-nunun Kərgəlan i ə.v -də kənd Bəşəru çayının sahilində, Lənkəran ovalığındadır Kəndin adı XIX əsrə aid sənədlərdə Darğakənd, 1917-ci ildə Darğaoba, 1933-cü ildə isə Darquba variantında qeydə alınmışdır Talış dilində Daqova kimi tələffüz edilir Oykonim *darğa* (etnonim) və *oba* (el, nəsil, kənd) komponentlərindən düzəlib, "darğalar kəndi" deməkdir Etnotoponimdir

**Darvadağ** *or , mür* Gədəbəy r-nunda dağ Şahdağ silsiləsinin şm yamacındadır Hün 1756 m. Əsli Tavuradağdır Tədqiqatçılar bu oronimin qəd türk dillərindəki *tavur/tabur* (köç arabalarının düşərgə yeri, dayanacaq) sözündən olduğunu söyləyirlər Qədim türklər uşaqlar, qadınlar və qocaların mindikləri arabaları, habelə sağmal heyvanları nisbətən yüksək yerdə, çay və ya bulaq kənarında açır və arabaları dairəvi surətdə bir-birinə bənd edirdilər. Belə düşərgə *tabur/tavur* adlanır və qəfil hücumlardan müdafiə xarakteri daşıyırdı

**Darvazbinə** *oyk , mür.* Balakən r-nunun Qazma i.ə v -də kənd Alazan-Əyriçay çökəkliyindədir Oykonim *darvaz* ("keçid", "açıq yer", "körpü", "iki bağ arasında çəpərdən keçid yeri") və *binə* ("müvəqqəti yaşayış yeri" "alaçıq", "kənd") komponentlərindən düzəlib, "keçiddə olan binə" mənasındadır XX əsrin əvvəllərində Gürcüstan ərazisində Darvaz (Darbazi) adlı iki yaşayış məntəqəsi, Cavanşir qəzasında (Qarabağ) isə Darvaz adlı xarabalıq qeydə alınmışdır

**Darvin Bankəsi** *or mür* Bakıdan 45-50 km şm.-ş -də, Pirallahı adasından şm.-da, Xəzər dənizinin q. sahilindədir İngilis alimi, təbiətşünas Çarlz Darvinin (1809-82) şərəfinə adlandırılmışdır Memorial toponimdir

**Daryurd** *oyk., mür* Gədəbəy r-nunun Əliismayıllı i ə v -də kənd Şahdağ silsiləsinin dağ tirələrindən birinin üstündədir. Kənd əvvəllər Salahlı adı ilə Novosaratovka kəndinin yaxınlığında olmuşdur XIX əsrin ortalarında Novosaratovka kəndi salındıqdan







sonra əhali həmin yerdən köçərək buradakı yurd yerlərində məskunlaşmışdır Tədqiqatçılar oykonimi "darısqal, dar yurd" kimi izah edirlər Yerli əhalinin məlumatına görə, kəndin əsl adı Töryurddur *Tör* qəd türk dillərində "yüksək dağlıq ərazidə yerləşən otlaq" mənasındadır Bu söz Azərb dilinin qərb dialektində "yuxarı, baş" mənasında saxlanılmaqdadır.

**Daş Göytəpə** *or , mür* Mil düzünün q. hissəsində süni qurulmuş təpədir Hün 36 m Oronim *daş* (təpənin süxurlarını bildirir) və *Göytəpə* (eyniadlı başqa oronimin adı) komponentlərindən düzəlib, "daşlı Göytəpə" deməkdir.

**Daş Salahlı** *oyk., mür* Qazax r-nunun eyniadlı i ə v -də kənd. Avey dağının ətəyindədir Oykonim *daş* (ağ rəngli, əhəng tərkibli daşlıq sahədə yerləşdiyinə görə) və *Salahlı* (etnotoponim) komponentlərindən düzəlib, "daşlıq sahədə yerləşən Salahlı kəndi" mənasındadır

**Daş Veysəlli** *oyk., mür* Cəbrayıl r-nunun Minbaşılı i ə v -də kənd Gəyan çölündədir Oykonim *daş* (qayalıq, daşlıq) və *Veysəlli* (etnotoponim) komponentlərindən ibarət olub "daşlıq, qayalıq ərazidə olan Veysəlli kəndi" deməkdir Oykonimin birinci komponenti kəndin relyefini təyin etməklə bərabər yaşayış məntəqəsini r-nun ərazisindəki Göyərçin Veysəlli kəndindən fərqləndirməyə də xidmət edir

**Daş Zirə** *or , mür* Xəzər dənizində ada Bakı arxipelaqına daxildir Böyük Zirə və Qum adaları yaxınlığındadır Vulf adası da adlanır Oronim *daş* (ərazisi daşlıq olduğuna görə) və *zirə* (ər *cəzirə* sözündən olub "ada" deməkdir) komponentlərindən ibarət olub, "daşlı ada" mənasındadır

**Daşağıl** *hidr , sadə* 1 Abşeron yarımadasının q -ində şor göl Gölün adı keçmişdə onun sahilindəki qışlaq yerində qoyunların salındığı daş ağılların olması ilə bağlıdır. 2 Oğuz və Şəki r-nları ərazisində çay Yerli əhali tərəfindən *Uluçay* (qədim çay) da adlanır Çay Baş Daşağıl kəndinin yaxınlığından axdığı üçün belə adlandırılmışdır

**Daşaltı** *oyk sadə* Şuşa r-nunun eyniadlı i ə v -də kənd Daşaltı (Zarıslı) çayının (Qarqar çayının qolu) sahilində, Qarabağ silsiləsinin ətəyindədir Daşaltı ətrafda yaşayan əhalinin Xəznədağ adlandırdığı mağaranın adıdır Kənd XVIII əsrdə Qarabağ xanı İbrahimxəlil xanın Zəngəzur qəzasının Düzəburd kəndindən gəlmiş erməni və azərb ailələri Şuşa qalasının c divarlarının ətəyindəki dərədə, *Daşaltı* ("qayaaltı" mənasında) adlanan yerdə məskunlaşdırması nəticəsində yaranmışdır Kənd yerləşdiyi obyektin adını daşıyır

**Daşaltı** *hidr , sadə.* Şuşa r-nu ərazisində çay Qarqar çayını əmələ gətirir Zarıslı çayı da adlanır Çayın adı ərazisindən axdığı eyniadlı kəndin adı ilə bağlıdır

**Daşarx** *oyk sadə* Şərur r-nu ərazisində d y stansiyası və qəsəbə Stansiya ərazidəki eyniadlı arxın adındandır.

**Daşbaşı** *oyk. mür* 1 Xocalı r-nunda kənd. Dağətəyi ərazidədir Oykonim *daş* (burada "qaya" mənasındadır) və *başı* (üstü) sözlərindən düzəlib, "qaya üstündə kənd" deməkdir; 2 Xocavənd r-nunda kənd. Qarabağ silsiləsinin ətəyindədir Yerli əhalinin verdiyi məlumata görə, yaşayış məntəqəsini Xocalı r-nunun Daşbaşı kəndindən köçüb gəlmiş ailələr saldığı üçün kənd onların keçmiş yaşayış məntəqələrinin adını daşıyır

**Daşbaşı** *or mür* Ordubad r-nu ərazisində dağ Bilev kəndindən c -da, Düylün və Vənənd çaylarının suayrıcında yerləşir Hün 1707 m Çılpaq qayalıq dağdır Dağın zirvəsi bütöv sal daşdan ibarət olduğuna görə belə adlanmışdır Oronim "başı, zirvəsi daş" mənasındadır

**Daşbulaq** *hidr sadə* Xocalı r-nu ərazisində çay Çay öz adını eyniadlı bulaqdan almışdır Hidronim *daş* (daşlıq) və *bulaq* (su obyekti) sözlərindən düzəlib, "daşlı yerdən çıxan bulaq" mənasındadır

**Daşbulaq** *or , sadə* Xocalı r-nu ərazisində dağ Dağ öz adını eyniadlı bulaqdan almışdır

**Daşbulaq** *oyk sadə* 1 Xocalı r-nunun eyniadlı i ə v -də kənd Bədərə çayının (Qarqar çayının qolu) sahilində. Qarabağ silsiləsinin ətəyindədir Kənd yaxınlıqdakı eyniadlı coğrafi obyektlərin adı ilə adlandırılmışdır; 2 Şəki r-nunun Qaradağlı i ə v -də kənd

Daşüz silsiləsinin ətəyindədir XIX əsrin əvvəllərində Qarabağdan çıxmış ailələrin Daşbulaq adlı yerdə məskunlaşması nəticəsində yaranmışdır, 3 Şəmkir r-nunun İrmaşlı i ə v -də kənd Dağ ətəyındədir; 4 Şəmkir r-nunun Dəllər Cəyır i ə v -də kənd Gəncə-Qazax düzənliyindədir Yaşayış məntəqələri ərazilərındəki eyniadlı bulaqların adı ilə adlandırılmışdır

**Daşburun** *oyk , sadə* Beyləqan r-nu ərazisində d y. stansiyasıdır Adını ərazidəki eyniadlı yüksəklikdən almışdır. Türkiyə ərazisində də Daşburun adlı kənd var

**Daşburun** *or , mür* Şərur r-nu ərazisində dağ Sədərək ştq -ndən şm -dadır Hün 1240 m Oronim *daş* (qaya) və *burun* (dağın irəli çıxmış hissəsi) komponentlərindən düzəlib, "daşlı, qayalı dağ çıxıntısı" və ya "irəli çıxmış qaya" mənasındadır

**Daşçölü** *or , mür* Qobustanın c -ş hissəsində düzənlik Qaradağ d y stansiyasının şm -ında yerləşir Ərazisi daşlıq olduğu üçün bu adı almışdır

**Daşdəmirbəyli** *oyk , sadə* Ağsu r-nunun Çaparlı i ə v.-də kənd Şirvan düzündədir Kəndin adı keçmişdə Kür çayı sahilində və Şirvan düzündə maldarlıqla məşğul olmuş mərzili tayfasının *daşdəmirbəyli* tirəsinin adındandır XIX əsrin 70-ci illərində 10 ailədən, əsrin sonlarında isə cəmi 7 aılədən ibarət kiçik icma olan *daşdəmirbəylilərin* adı ilə bağlı 1933-cü ildə Kürdəmir və Quba r-nları ərazisində iki kənd qeydə alınmışdır

**Daşduz** *oyk. sadə* Naxçıvan şəhər i ə v -də qəsəbə Dağətəyi ərazidədir Daimi əhalisi yoxdur Naxçıvan daş duz mədəni burada olduğu üçün qəsəbə belə adlanmışdır

**Daşgil** *or , mür* Abşeron yarımadasında, Ələt d y stansiyasından şm -da püskürən palçıq vulkanı Püskürmə zamanı çoxlu gil və xırda qumdaşı çıxdığına görə vulkan belə adlandırılmışdır

**Daşkənd** *oyk., mür* 1 Xocalı r-nunun eynıadlı i ə v -də kənd Qarabağ silsiləsindədir XIX əsrdə İrandan gəlmə erməni ailələri burada məskunlaşdırıldıqdan sonra kənd Daşuşen (daşlıq kənd) adlandırıldı 1992-ci ildən kəndin keçmiş adı özünə qaytarılmışdır; 2 Yardımlı r-nunun Yardımlı qəs ı ə v -də kənd. Peştəsər silsiləsinin ətəyindədir Oykonim *daş* (burada "qaya") və *kənd* (yaşayış məntəqəsi) komponentlərindən düzəlib, "qayada yerləşən kənd" mənasındadır Özbəkistanda Daşkənd adlı vilayət və yaşayış məntəqəsi var

**Daşkəsən** *or , mür* 1 Cəbrayıl r-nu ərazisində dağ. Yerli əhali bu dağı Daşkəsən təpəsi adlandırır Dağın (təpənin) üstü daşlıq və qayalıqdır Ətraf kəndlərin əhalisi əvvəllər ev tikmək üçün bu daşlardan kəsib aparırmış. Bu səbəbdən də dağ Daşkəsən adlandırılmışdır; 2 Salyan r-nu ərazisində dağ Böyük Mişov dağından ş -də yerləşir Hün 129 m Oronim *daş* və *kəsən* (kəsilən, çıxarılan) sözlərindən düzəlib, "daş kəsilən, çıxarılan yer" mənasındadır

**Daşkəsən** *oyk , mür* 1 Azərb.-da inzibati r-n 1930-cu ildə təşkil edilmişdir 1956-cı ilədək Dəstəfur r-nu adlanmışdır 1963-cü ildə ləğv edilərək ərazisi Xanlar r-nuna verilmiş, 1965-ci ildən isə yenidən müstəqil r-n olmuşdur. C -q -də Ermənistanla həmsərhəddir. Səthi şm -dan c -a doğru yüksək dağlıq sahədən ibarət olub, dərin dərələrlə çox parçalanmışdır Ən hündür nöqtəsi Hınaldağdır (3373 m) Faydalı qazıntılarla çox zəngindir Bütün Qafqazda ən böyük dəmır filizi yataqları bu r-nda yerləşir Daşkəsən şəhəri yaxınlığında kobalt, Zəylik kəndi yaxınlığında alunit və barıt çıxarılır R-nun ərazisindən Kür çayının sağ qolları olan Gəncə, Şəmkir, Qoşqar çaylarının yuxarı axarları keçir Adını ərazidəki eyniadlı yaşayış məntəqəsindən almışdır; 2 Azərb -da şəhər, eyniadlı r-nun mərkəzi Qoşqar çayının sol sahilində, dəniz səviyyəsindən 1600 m hündürlükdə yerləşir 1930-cu ildə burada dəmir filizi çıxarılması ilə əlaqədar salınmışdır Daşkəsən kəndi əsasında yaranmışdır Oykonim "daş (dəmir filizi) çıxarılan yer" mənasındadır; 3. Daşkəsən r-nunun eyniadlı qəsəbə i ə.v -də ştq Qoşqar çayının (Kürün qolu) sahilində, Murovdağ silsiləsinin ətəyindədir 1937-ci ildə Qoşqar çayının sahilində kobalt istehsalı ilə əlaqədar salınmış və Kobalt qəsəbəsi adlandırılmışdır 1942-ci ildən rəsmən Daşkəsən adlanır; 4 Cəbrayıl r-nunun Süleymanlı i ə v -də kənd Qarabağ





silsiləsinin ətəyindədir Yaşayış məntəqəsi Daşkəsən təpəsi adlı yerin ş -ində salındığına görə belə adlandırılmışdır

**Daşkəsən** *hidr , sadə* Daşkəsən r-nu ərazisində çay Qoşqar çayının qoludur Daşkəsən kəndinin yaxınlığından axdığı üçün belə adlandırılmışdır

**Daşlı** *or , düz* 1. Xəzər dənizində, Bakı arxipelaqında ada Səngi-Muğan adasından c -ş -dədir XVIII əsrin birinci yarısında I Pyotrun Xəzərsahili əyalətlərə hərbi səfəri zamanı rusların tərtib etdiyi xəritədə ada Kamen Svyatoqo İqnatıya (Müqəddəs İqnati dağı) adlandırılmışdı Ada müqəddəs İqnati günündə tədqiq edildiyindən həmin adla adlandırılmışdır Sonralar oronimin tərkibindəki "müqəddəs" sözü düşmüşdür Daşlı adı adanın relyefi ilə əlaqədardır; 2 Gədəbəy r-nu ərazisində dağ Yerli əhali arasında Daşdıdağ kimi tələffüz olunur Dağın ərazisi daşlı, qayalı olduğuna görə belə adlandırılmışdır; 3. Şamaxı r-nu ərazisində dağ Yerli əhalinin dilində Daşdı variantında səslənir Dağın adı onun ərazısının daşlı olması ilə əlaqədardır

**Daşlı** *oyk , düz* Laçın r-nunun eynıadlı ı ə.v -də kənd Şəlvə çayının (Həkəri çayının qolu) sahilində, Çalbayır silsiləsinin ətəyindədir Kəndin ərazısı XIX əsrdə Zəngəzur qəzasında yaşamış qaraçorlu tayfasının əliyanlı qolunun qışlaqlarından biri olmuşdur Sonralar həmin tayfaya mənsub ailələrin məskunlaşması nəticəsində qışlaq daimi yaşayış məntəqəsinə çevrilmişdir Kənd daşlı ərazidə salındığına görə belə adlandırılmışdır

**Daşlı Çalğan** *oyk , mür* Siyəzən r-nunun Yenikənd i ə.v.-də kənd Baş Qafqaz silsiləsinin ətəyındədir Oykonim *daşlı* və *Çalğan* (etnotoponim) komponentlərindən düzəlib, "daşlıq ərazidə olan Çalğan kəndi" mənasındadır Oykonimin birinci komponenti kəndi r-nun ərazisində olan Orta Çalğan kəndindən fərqləndirməyə xidmət etməklə yanaşı, kəndin ərazisini relyef cəhətdən təyin edir

**Daşqaya** *or , mür* Abşeron arxipelaqında ada Ada əsasən qaya süxurlarından ibarət olduğu üçün belə adlandırılmışdır Digər adı Rifdir *Rif* (alm "sualtı qaya, təpə") dəniz dayazlığında bir qədər üzə çıxan sualtı qayadır Bu ad adaya rus dənizçiləri tərəfindən verilmişdir

**Daşlıbərə** *or , mür* Şəki r-nu ərazisində dağ Baş Qafqaz silsiləsinin yamacındadır Hün. 2225 m Şəki r-nundan Dağıstana gedən keçidlərdən biridir Oronim *daşlı* (daşlıq) və *bərə* (keçid, çıxacaq yol, aralıq) komponentlərindən düzəlib, "daşlı yol, daşlıq ərazidə olan keçid" deməkdir

**Daşlıca** *oyk , düz* Qəbələ r-nunun Zarağan i ə v -də kənd Qaraqobu çayı sahilində, dağətəyi ərazidədir Çox vaxt Daşca variantında işlənir Kəndin ərazisi xırda daş və çınqıldan ibarət olduğu üçün belə adlandırılmışdır

**Daşlıçay** *hidr mür* Şəki r-nu ərazisində çay Adını ərazidəki *daşlı* komponentli oronimlərdən almışdır

**Daşlıdərə** *or , mür* Şəkı r-nu ərazisində dağ Oronim dağı relyef cəhətdən təyin edir

**Daşlıtəpə** *or , mür* 1 Bakı şəhəri, Qaradağ r-nu ərazisində yüksəklik Zirvəsi sal daşlarla örtülü olduğundan bu adı almışdır; 2. Xocalı r-nu ərazisində dağ Zirvəsi daşlı olduğuna görə dağa bu ad verilmişdir Relyeflə bağlı olan *daşlı* komponenti türkdilli xalqların toponimiyasında geniş yayılmışdır

**Daşlıyataq** *oyk , mür* Dəvəçi r-nunun Beynəlmiləl i ə v -də kənd Baş Qafqaz silsiləsinin ətəyindədir Kəndin ərazısı keçmişdə qoyun yatağı olmuşdur Oykonim yatağın daşlıq ərazidə yerləşdiyini bildirir Sonralar yaranmış yaşayış məntəqəsi yatağın adı ilə adlandırılmışdır

**Daşmərdan** *or mür* Qobustanda palçıq vulkanı Pirsaat çayının sol sahilində, Umbakı neft yatağı yaxınlığındadır Hün 513 m Vulkan mənşəli daşlıq sahədən yerli əhali daş karxanası kimi istifadə etdiyi üçün Daş mədəni adlandırılmışdır Daşmərdan Daş mədəni adının təhrif forması hesab edilir

**Daştalıcar** *oyk , mür* Lənkəran r-nunun Məmusta ı ə v -də kənd Lənkəran ovalığındadır Tədqiqatçılar bu oykonımı Daştəliğcar adının təhrifə uğramış variantı hesab edirlər Oykonım talış dilindəki *daşt* (çöl), *lığ* (cıl, bataqlıq) və *car* (yer) sözlərindən ibarət olub (-*a* bitişdirici saitdir), "cillik, bataqlıq olan çöl" mənasındadır

**Daştatük** *oyk., mür.* Lənkəran r-nunun Biləsər i.ə.v.-də kənd. Peştəsər silsiləsinin ətəyindədir. Bəzən Daştutak variantında da qeydə alınan bu oykonimin düzgün variantı Daştətükdür. Kəndin adı talış dilindəki *daşt* (çöl, düzən) və *tük* (çəltik sahəsi) sözlərindən düzəlib (-*ə* bitişdirici saitdir), "çəltik əkilən çöl" deməkdir. Keçmişdə çəltik həyətyanı, yaxud da kəndin kənarında əkinə yararlı sahələrdə becərilirdi. Əhali belə sahələri *daştətük* adlandırırdı. Tədricən həmin əkin sahəsi yaşayış məntəqəsinə çevrilmiş və kənd də əkin sahəsinin adı ilə adlandırılmışdır.

**Daştəpə** *or., mür.* Xocalı r-nu ərazisində dağ. Oronim *daş* və *təpə* sözlərinin birləşməsindən düzəlib, "çoxlu daş olan yüksəklik" deməkdir.

**Daşuçan** *or., mür.* Şəki r-nu ərazisində dağ. Baş Qafqaz silsiləsinin zirvəsidir. Hün. 3192 m. Oronim *daş* və *uçan* (*uçmaq* felindən) komponentlərindən düzəlib, "daş düşən" mənasındadır. Görünür, dağın adı aşınma və sürüşmə nəticəsində zirvədən daşların qoparaq yerə düşməsi, aşağıya yuvarlanması ilə bağlıdır.

**Daşuşen** b. a. x. Daşkənd.

**Daşüz** *or., mür.* Acınohur ön dağlığında, Alazan-Əyriçay vadisinin c. hissəsi boyunca enlik istiqamətində uzanan tirədir. Hün. 600-1110 m. Tirənin orta hissəsindən Mingəçevir su anbarına tökülən Qanıx (Alazan) çayının dərəsi keçir. Qanıx və Göyçay çayları arasında yerləşən silsilənin səthi daşlıq olduğu üçün Daşüz adını almışdır. Oronim "üzü daşlı, səthi daş olan" deməkdir.

**Daşüz** *oyk., sadə.* Şəki r-nunun Qaradağlı i.ə.v.-də qəsəbə. Əyriçayın (Qanıx çayının qolu) sol sahilində, Daşüz silsiləsinin ətəyindədir. Adını ərazidəki Daşüz (bəzən Daşyüz kimi də qeydə alınır) silsiləsinin adından almışdır. XX əsrin əvvəllərində kəndin ərazisində Ədil xanın at ilxısının tövlələri olmuşdur. 1923-cü ildə burada 71 nömrəli atçılıq zavodu təşkil edilmiş, 1951-ci ildən isə buraya Samux r-nunun Qırmızı Samux sovxozundan camışlar gətirilərək camışçılıq sovxozu yaradılmışdı. Müxtəlif illərdə Tovla, Tavla, Orconikidze adına sovxozun nəzdində qəsəbə də adlandırılmışdır.

**Davaradibi** *oyk., mür.* Lerik r-nunun Tikəbənd i.ə.v.-də kənd. Peştəsər silsiləsinin ətəyindədir. Oykonim *Davar* (*Tavar*/*Davar* dağının ətəyində olduğu üçün həmin dağın adındandır) və *dib* (ətək, aşağı hissə) komponentlərindən düzəlib (burada -*a* bitişdirici sait, -*i* mənsub şək.-sidir), "Davar dağının ətəyi, dibi" mənasındadır. Davardibi variantında da qeydə alınan bu oykonim yerli əhalinin dilində Dəvrəbın kimi tələffüz olunur. *Bın* talış dilində "ətək, dib" deməkdir.

**Davaradibi** *hidr., sadə.* Lerik r-nu ərazisində çay. Lənkəran çayının sağ qoludur. Başlıca olaraq yağış sularından qidalanır. Aşağı axarında qismən suvarmada istifadə edilir. Davardibi, Davardiş variantlarında da qeydə alınmışdır. Davaradibi kəndinin ərazisindən axdığı üçün kəndin adını daşıyır. Azərb. dilində *davar* "qoyun, keçi", "mal-qara", həmçinin "qoyunçuluqla, maldarlıqla məşğul olan adam" mənasında işlənir. Dilimizdə bu sözün Tavra variantına da təsadüf edilir.

**Davarlı** *oyk., sadə.* Daşkəsən r-nunun Qabaqtəpə i.ə.v.-də kənd. Qabaqtəpə çayının sahilində, dağətəyi ərazidədir. Kəndin adı bu ərazidə qoyunçuluq və maldarlıqla məşğul olan əhalinin yaşaması ilə bağlı yaranmışdır.

**Davıdonu** *oyk., sadə.* Lerik r-nunun Nüçi i.ə.v.-də kənd. Peştəsər silsiləsinin ətəyindədir. Oykonim Davıd (Davud şəxs adının yerli tələffüz formasıdır) və talış dilindəki *honi* (bulaq) sözlərindən düzəlib. Yaxınlığındakı bulağın adını (Davud bulağı) daşıyır.

**Davudlu** *oyk., düz.* 1. Ağdaş r-nunun Güvəkənd i.ə.v.-də kənd. Şirvan düzündədir. Yaşayış məntəqəsinin Səfəvi hökmdarı I Şah Abbasın (1587-1629) vəziri Allahverdi xanın oğlu Qarabağ bəylərbəyisi *Davuda* məxsus ailələrin məskunlaşması nəticəsində yaranması ehtimal olunur; 2. Qubadlı r-nunun Novlu i.ə.v.-də kənd. Gorus çayının (Bərgüşad çayının qolu) dərəsində, dağətəyi ərazidədir. Yaşayış məntəqəsi Qarabağ bəylərbəyisi olmuş *Davuda* məxsus ailələrin məskunlaşması nəticəsində yaranmışdır. Sonralar burada sofulu tayfasına mənsub ailələrin də məskunlaşması haqqında məlumat verilir.

**Davudoba** *oyk., mür.* Quba r-nu ərazisində kənd. Düzənlikdədir. Yaşayış məntəqəsi XIX əsrin ortalarında Quba qəzasının Yergüc kəndində Davud adlı şəxsə məxsus qışlaq yerində yaranmışdır. Oykonim "Davuda məxsus oba" mənasındadır.





**Davyanı** *or., düz.* Şəki r-nu ərazisində dağ. Oronim *dabanlı* sözünün yerli tələffüz forması olub, "aşırımlı", "astanalı" mənasındadır.

**Dayıkazımlı** *oyk., sadə.* Kürdəmir r-nunun Axtaçı i.ə.v.-də kənd. Şirvan düzündədir. Yaşayış məntəqəsi keçmişdə Şirvan düzündə yaşamış *dayıkazımlı* nəslinin məskunlaşması nəticəsində yaranmışdır. Etnotoponimdir.

**Dayıkənd** *oyk., mür.* Salyan r-nunun Sarvan i.ə.v.-də kənd. Salyan düzündədir. Ədəbiyyatlarda Daykənd variantında verilmişdir. Tədqiqatçıların fikrincə, kəndin əsl adı Dəyəkənddir. Azərb. dilində *dəyə* "daxma, koma, yaylaq" və ya "qışlaqda müvəqqəti yaşayış evi, alaçıq" mənasındadır. Belə ehtimal edilir ki, kənd köhnə dəyələri olan qış yurd yerində salındığına görə Dəyəkənd adlanmış, sonralar isə toponim dəyişikliyə uğrayaraq indiki şəklinə düşmüşdür. Lakin keçən əsrin əvvəllərində Azərb. ərazisində Daykənd və Daylaxlı adlı bir neçə kənd qeydə alınmışdır ki, bunlar da atçılıqla bağlı yaranan coğrafi adlardır. Dayıkənd oykonimini də bu coğrafi adlardan biri hesab etmək olar. *Day* birillik at balasıdır.

**Deqadi** *oyk., mür.* Astara r-nunun Şuvi i.ə.v.-də kənd. Lənkəran ovalığındadır. Tədqiqatçıların fikrincə, oykonim talış dilindəki *de* (iki), *qalka* (ev) və *di* (kənd) komponentlərindən düzəlib, "iki evli kənd" mənasındadır. Kəndin əsasını iki ailə qoyduğu üçün belə adlandırılmışdır.

**Deqdevix** *or., sadə.* Abşeronda dağ. Oronimin rus dilindəki *deqtyavıy* sözündən olub, "qətranlı" mənasını ifadə etməsi ehtimal olunur.

**Delavnəbend** *or., mür.* Astara r-nu ərazisində dağ. Talış dilinin materiallarına əsasən "dağın dibi, dağın ətəyi" kimi izah olunur.

**Deşdahat** *oyk., mür.* Qubadlı r-nunun Başarat i.ə.v.-də kənd. Qarabağ silsiləsinin ətəyindədir. Yaşayış məntəqəsini vaxtilə Böyük Hat (indiki Hat) kəndindən ayrılmış ailələr Deşt adlanan yerdə saldığına görə belə adlandırılmışdır. Oykonim *daşt* (İran dillərində "çöl") və *Hat* (toponim) komponentlərindən düzəlmiş bu coğrafi ad "çöldə yerləşən Hat kəndi" mənasındadır. Dəştəhat variantında da qeydə alınmışdır.

**Deyindağ** *or., mür.* Gədəbəy r-nu ərazisində dağ. Keçəldağın yaxınlığındadır. Tədqiqatçıların ehtimalına görə, oronimin birinci komponenti qədim türk dillərindəki *teqin* (şahzadə) sözünün fonetik dəyişikliyə uğramış formasıdır, "şahzadə dağı" mənasındadır. Azərb. dilinin qərb qrupu dialektində "deyin" sözü "arzu, dilək", "günah, təqsir", "borc" mənalarında işlənir. Görünür, qədim türklərdə olduğu kimi, müqəddəs sayılan dağa hər hansı diləklə müraciət olunduğundan dağ bu adı almışdır.

**Deyran** *hidr., sadə.* Şamaxı r-nu ərazisində çay. Çay başlandığı yerin adı ilə adlandırılmışdır. *Deyrı-muğan* (zərdüştilərin və atəşpərəstlərin ibadət yeri) sözünün qısaldılmış forması olduğunu ehtimal etmək olar. Ərəb sözü olan *deyr* "monastır, kilsə", məcazi mənada "şərab satılan yer" mənalarında da işlənir. Tədqiqatçılar hidronimi "məbəd yeri" kimi izah edirlər.

**Dəburçay** *hidr., mür.* Lerik r-nu ərazisində çay. Hidronim *dəbur*/*dəbir* (talış. "əyilmək, çönmək") və *çay* (su obyekti) komponentlərindən düzəlib, "döngəli çay, əyri çay" deməkdir.

**Dəcəl** *oyk., sadə.* Cəbrayıl r-nunun Şükürbəyli i.ə.v.-də kənd. Düzənlikdədir. Yerli əhalinin verdiyi məlumata görə, kəndi Şıxalıağanın qardaşı Əhmədxan salmışdır. Kəndin adı 1917-ci ildə *Dejaq* variantında qeydə alınmışdır. *Dəjək* sözü dialektlərimizdə "nişangah" mənasında işlənir.

**Dədəgünəş** *oyk., sadə.* Şamaxı r-nunun eyniadlı i.ə.v.-də kənd. Ağsu çayının sol sahilindən bir qədər aralı, dağətəyi ərazidədir. Kənd adını oradakı *Dədəgünəş pirinin* adından almışdır. Yerli əhali bu piri Pir-Sultan Dədəgünəş adlandırır. Dədəgünəş türbəsi 1602-1603-cü illərdə tikilmişdir. Türbənin kitabəsinə görə, orada Dədəgünəş (Əfzələddin Xaqaninin əmisinin ləqəbi) nəslindən Şeyx Dədəqulunun oğlu Şeyx Məhəmməd dəfn olunmuşdur. Rəvayətə görə, Dədəgünəş

quduzluğa tutulmuş xəstələri müalicə edirmiş. Odur ki, vəfatından sonra türbəsi müqəddəsləşdirilmişdir. Zəngin təbiəti və müalicə suları ilə məşhur olan Dədəgüneş orta əsrlərdə məşhur elm mərkəzlərindən biri olmuşdur və Xaqaninin əmisi Kafiəddin Ömər Osman oğlu bu mərkəzin hörmətli alimlərindən idi.

**Dədəli** *oyk., sadə.* 1. Ağsu r-nunun Ərəbmehdibəy i. ə. v.-də kənd. Şirvan düzündədir. Yaşayış məntəqəsini XIX əsrin ortalarında *ərəbdədəli* tayfasına mənsub ailələr keçmiş qışlaq yerində salmışlar. Sonralar toponimin tərkibindəki ərəb komponenti düşmüşdür; 2. Füzuli r-nunun eyniadlı i. ə. v.-də kənd. Qarabağ silsiləsinin ətəyindədir. Yaşayış məntəqəsi *dədəli* nəslinə mənsub ailələr tərəfindən salındığı üçün belə adlandırılmışdır; 3. Xaçmaz r-nunun eyniadlı i. ə. v.-də kənd. Qusar çayının sahilində, Samur-Dəvəçi ovalığındadır. Oykonim ilk dəfə XVIII əsrə aid mənbədə qeyd olunmuşdur. Əsl adının *Ərəbdədəli* olduğu söylənilir. 1933-cü ildə Astara r-nunun Şüvi i. ə. v.-də Dədəli adlı yaşayış məntəqəsi qeydə alınmışdır.

**Dəhnə** *hidr., sadə.* 1. Quba r-nu ərazisində çay. Gümür çayının qoludur; 2. Şəki r-nunun c. hissəsində çay. Aşağı axarında Qarasu adlanır. XIX əsrdə Daşağıl çayından Acınohur çölünə çəkilmiş kanalın başlanğıcının (*Dəhnənin*) adı ilə adlandırılmışdır. Tədqiqatçılar toponimiyada dəhnə sözünü fars dilindən Azərb. dilinə keçmiş "ağız, başlanğıc" mənalı söz kimi qəbul edirlər. Dilimizdə *dəhnə* sözü coğrafi termin kimi "dərənin dar hissəsindən çayın düzənliyə çıxdığı yer", "çayın dənizə, gölə və ya digər su obyektlərinə töküldüyü yer" mənalarında da işlənir.

**Dəhnə** *or., sadə.* 1. Dəvəçi r-nu ərazisində dağ. Dağın adı ərazidəki Ağzıbirçala (Dəvəçi, Şabran, Taxtakörpü çayları bu gölə tökülür və göldən dənizə Qaradəhnə çayı axır) gölü ilə bağlıdır; 2. Şərur r-nunun q.-ində, Arazın yatağı yaxınlığında dağ. Hün. 1152 m. Dağ Şərqi Arpa çayının dar dərələrdən axaraq Şərur düzünə çıxdığı yerdə yerləşdiyinə görə bu adı almışdır.

**Dəhnə** *oyk., sadə.* 1. Dəvəçi r-nunun Çuxurəzəmi i. ə. v.-də kənd. Oykonim ərazidəki Ağzıbirçala gölünün mövqeyi və ya eyniadlı dağın adı ilə bağlıdır; 2. Quba r-nunun Rustov i. ə. v.-də kənd. Rustov çökəkliyindədir. Kəndin tam adı Dəhnə Püstəqasım olmuşdur. Kənd Rustov kəndinə gedən yolun başlanğıcında, iki dağ arasından keçən yeganə keçiddir. Bu keçid eyni zamanda Qələşdov enişinin başlanğıcıdır. Kəndin adı da onun coğrafi mövqeyi ilə bağlı yaranmışdır.

**Dəhnəxəlil** *oyk., mür.* Ağdaş r-nunun eyniadlı i. ə. v.-də kənd. Türyançayın sahilində, Şirvan düzündədir. Oykonim *dəhnə* (ağız, başlanğıc) və *xəlil* (Şirvan zonasında geniş ərazidə yayılmış xəlilli tayfasının adından) komponentlərindən düzəlib. Türyançay Ağdaş şəhəri yaxınlığında, Bozdağdan düzənə çıxdıqdan sonra sağa burularaq indiki yatağı ilə axır. Köhnə yatağında çayın düzənə çıxdığı yer vaxtilə *Dəhnə* adlanmış, oykonimin birinci komponenti də buradan yaranmışdır. Kəndin adı "dəhnədə yerləşən Xəlilli kəndi" mənasındadır.

**Dəhrəv** *oyk., sadə.* Xocalı r-nunun Daşbulaq i. ə. v.-də kənd. Qarabağ silsiləsinin yamacındadır. Keçmiş adı Qayabaşı olmuşdur. Kənd coğrafi mövqeyi ilə əlaqədar olaraq belə adlandırılmışdı. XIX əsrin əvvəllərində Cənubi Azərb.-nın Dəhrəv kəndindən gəlmə erməni ailələri burada məskunlaşdıqdan sonra yaşayış məntəqəsini Dəhrəv (*dəhərəv* sözündən olub, "təpəlik" deməkdir) adlandırmışdılar. 1992-ci ildən kəndin adı Qayabaşı kimi rəsmiləşdirilmişdir.

**Dəhrəz** *oyk., sadə.* Xocalı r-nunun Ağbulaq i. ə. v.-də kənd. Qarabağ silsiləsinin yamacındadır. Keçmiş adı Qayabaşı olan bu kənd XVIII əsrdə Qarabağ xanlarına məxsus mülk idi. XIX əsrin əvvəllərində Cənubi Azərb.-dan gəlmə erməni ailələri burada məskunlaşdıqdan sonra yaşayış məntəqəsi bu adı almışdır. Oykonim fars dilindəki *dəhliz* sözünün variantı kimi "ensiz, dar keçid" mənasındadır.

**Dəkkəoba** *oyk., mür.* Zərdab r-nunun Dəli Quşçu i. ə. v.-də kənd. Şirvan düzündədir. Əvvəlki adı Məcidoba olmuşdur. Yaşayış məntəqəsi XIX əsrdə indiki Böyük Dəkkə kəndindən ayrılmış ailələrin məskunlaşması nəticəsində yaranmışdır. Oykonim "Dəkkə kəndinin obası" mənasındadır. "Oba, oymaq" mənasında olan *dəkkə* sözü Benqaliyanın ən qədim şəhərlərindən biri və paytaxtı olan Dakka şəhərinin adında da qorunub saxlanmışdır.

**Dələli** *oyk., düz.* Cəlilabad r-nunun Qarakazımlı i. ə. v.-də kənd. Burovar silsiləsinin ətəyindədir. Oykonim türk mənşəli *tele* tayfasının fonetik dəyişikliyə uğramış adından və mənsubiyyət bildirən *-li* şəkilçisindən ibarətdir. Etnotoponimdir.

**Dələyəniz** *or., sadə.* Qobustan r-nunda Duvannı d. y. stansiyasından c.-q.-də fəaliyyətdə olan palçıq vulkanıdır. Konusunun hündürlüyü 25 m-ə çatır. *Dələ* (Azərb. dilinin dialektlərində "ayran", "pinti", "pıs", "iri", "kobud", "açıq" mənalarında işlənir) və *yanız* (bənzərlik bildirir, *qarayanız* sözündə olduğu kimi) komponentlərindən ibarət olan bu oronim "ayrana bənzər" mənasında olub, yer altından püskürüb çıxan palçığı təyin edir. Dəlyanız variantında da qeydə alınmışdır.

**Dəliçay** *hidr., mür.* Şamaxı və Xaçmaz r-nlarında çaylar. Hidronim *dəli* (burada suyun sürətini, gurultusunu göstərir) və *çay* (su obyekti) komponentlərindən ibarət olan hidronim "coşqun, əsəbi, gurultulu çay" mənasındadır.

**Dəlidağ** *or., mür.* 1. Kəlbəcər r-nunda dağ. Mıxtökən silsiləsinin zirvəsidir. Hün. 3618 m. Zirvənin şm. yamaclarında qədim buzlaşmanın izləri vardır; 2. Laçın r-nunda, Mıxtökən silsiləsinin ş. hissəsində zirvə. Hün. 2246 m; 3. Zəngilan r-nu ilə Cəbrayıl r-nu sərhədində dağ. Hün. 428 m. Bu dağlar və bu adla adlandırılmış digər yüksəkliklər dağın ərazisində tez-tez havanın dəyişməsi, gözlənilmədən yağış və qar yağması, tufan və dağ uçqunlarının olması ilə əlaqədar belə adlandırılmışlar.

**Dəlidağsu** *hidr., mür.* Kəlbəcər r-nu ərazisində çay. Başlıbel çayının qoludur. Aşağı axarında Qaraxançay adlanır. Hidronim *Dəlidağ* (mənbəyini bu dağın ərazisindən aldığı üçün) və *su* (çay) komponentlərindən düzəlib, "Dəlidağdan başlayan çay" deməkdir.

**Dəlikdaş** *or., mür.* Xocalı r-nunun ş.-ində dağ. Qarabağ silsiləsinin q. yamacında zirvədir. Hün. 2304 m. Vulkan mənşəlidir. Qayalarında təbii oyuqların olması ilə əlaqədar dağ belə adlandırılmışdır. *Daş* komponenti burada "qaya" mənasındadır. Türkdilli xalqların toponimiyasında *dəlik* komponentini əvəz edən *deşik* sözünə təsadüf edilir: Deşikdaş (Özbəkistanın Surxandərya vilayətində Barsuktaq dağında paleolit dövrünə aid mağara), Deşikqala (Qaraqalpaq Respublikasının Turtqul r-nunda qədim dövrə aid qəsr xarabalığı) və s.

**Dəlikdağ** *or., mür.* 1. Qobustanın c.-ş.-ində dağ. Ceyrankeçməz çayının orta axarından solda yerləşir. Hün. 328 m. Dəliklidağ da adlanır; 2. Ordubad r-nu ərazisində dağ. Yamaclarında təbii *oyuqları* (*dəliklər*) olduğu üçün dağlar belə adlandırılmışdır.

**Dəliqarlıtəpə** b. a. x. Dilağardatəpə.

**Dəliqobu** *hidr., mür.* Xaçmaz r-nu ərazisində çay. Yaz ayları sel hadisəsi ilə əlaqədar qobuda güclü daşqınlar olduğuna görə yerli əhali çayı *dəli* (coşqun) adlandırır. Hidronim "qobudan axan coşqun çay" mənasındadır.

**Dəliquşçu** *oyk., sadə.* Zərdab r-nunun eyniadlı i. ə. v.-də kənd. Kür çayından 3 km. aralı, Şirvan düzündədir. Kəndi quşçu tayfasının *dəliquşçu* tirəsinə mənsub ailələr saldığı üçün kənd onların adı ilə adlandırılmışdır. Hazırda kəndin məhəllələrindən biri Dəliquşçu döngəsi adlanır. Etnotoponimdir.

**Dəliqoşqar** *hidr., mür.* Daşkəsən r-nu ərazisində çay. Hidronim *dəli* (burada "coşqun") və *Qoşqar* (çay adı) komponentlərindən düzəlib, "coşqun Qoşqar" deməkdir.

**Dəliməmmədli** *oyk., düz.* Goranboy r-nunda şəhər. Gəncə-Qazax düzənliyindədir. Şəhər 1958-ci ilədək mövcud olan eyniadlı ştq. əsasında yaranmışdır. Tədqiqatçıların məlumatına görə, toponim *dəli* (burada "igid, qoçaq"), *Məmməd* (şəxs adı) və *-li* (mənsubluq şək.-si) komponentlərindən düzəlib, "igid Məmmədin nəslindən olanlar" mənasındadır. Müxtəlif ədəbiyyatlarda Dəlməmmədli variantında da qeydə alınmışdır.

**Dəlləklər** *oyk., sadə.* Yevlax r-nunun Qaramanlı i. ə. v.-də kənd. Qarabağ düzündədir. Keçmiş adı Vəlibəyli olmuşdur. R-nun İsmayılabad kəndində Dəlləklilər məhəlləsi, Qaraoğlan kəndində isə Dəlləkli oymağı

coğrafi adlarının olması güman etməyə əsas verir ki, kənddə həmin oymaqdan və ya məhəllədən gəlmiş ailələrin məskunlaşması nəticəsində yaşayış məntəqəsi bu adı almışdır Etnotoponimdir.

**Dəlləkli** *oyk., sadə.* 1 Quba r-nunun Vladimirovka i ə v -də kənd. Qusar maili düzənliyindədir Çarizmin köçürmə siyasəti nəticəsində Rusiyanın mərkəzi quberniyalarından XIX əsrin birinci yarısında köçürülmüş rus ailələri burada məskunlaşdıqdan sonra kəndə Petropavlovka adı verilmişdi 1992-ci ildən kəndin keçmiş adı bərpa edilmişdir; 2. Masallı r-nunun Qarğalı i ə v -də kənd Lənkəran ovalığındadır; 3 Tovuz r-nunun Qəribli i ə v -də kənd. Kiçik Qafqaz dağlarının yamacındadır; 4 Yardımlı r-nunun Yardımlı qəsəbə i ə v -də kənd. Yardımlı çökəkliyindədir; 5 Zəngilan r-nunun Çəpədərə i ə v -də kənd Dağətəyi ərazidədir Yaşayış məntəqələrini *dəlləkli* nəslinə mənsub ailələr saldığı üçün belə adlandırılmışdır Etnotoponimdir Keçmişdə mərzili və ərəbbaloğlan icmalarının tərkibində *dəlləkli* tirəsi qeydə alınmışdır

**Dəllər** *or sadə* Şərur r-nu ərazisində dağ. Keçmişdə maldar tayfaların yaylaq yeri olmuşdur Etnotoponimdir Dağın adı *dəlilər/dəllər* tayfasının adı ilə bağlıdır

**Dəllər** *hidr. sadə* Xızı r-nu ərazisində çay Tuğ çayının sağ qoludur Çayın adı *dəllər* tayfasının adı ilə bağlıdır Etnotoponimdir

**Dəllər** *oyk., sadə* 1 Ağsu r-nunun Qaraqoyunlu i ə v -də kənd Şirvan düzündədir; 2 Saatlı r-nunun Nərimanov i ə v -də kənd Arazın sahilində, Mil düzündədir Keçmiş adı Əlimirzəbəyli olmuşdur; 3 Şəmkir r-nunun eyniadlı qəsəbə i ə v -də ştq Gəncə-Qazax düzənliyindədir. Keçmiş adı Tərs Dəllər (Tərsçayın sahilində yerləşdiyinə görə) olmuşdur Keçmişdə Qubadlı r-nundakı Həmzəli kəndi də Dəllər Həmzəlisi adlanmışdır Oykonimlər özündə qədim türk tayfalarından olan *tələlərin* adını əks etdirir Tələlər VII-VIII əsrlərdə tokuz-oğuz adı ilə də adlanmışlar Qıpçaqların və xəzərlərin tərkibində Azərb -na gəlmiş tələlər *dəlilər/dəllər* variantında bir çox coğrafi adlarda öz izlərini saxlamışlar Gürcüstanda Dəllər, Telavi, Ermənistanda Dalar (Dəlilər) oykonimləri də bu tayfanın adı ilə bağlıdır

**Dəllər Cəyir** *oyk., mür* Şəmkir r-nunun eyniadlı i ə v -də kənd Cəyir çayının sahilində, Gəncə-Qazax düzənliyindədir Kəndi Cəyir çayının yuxarı axarı boyunda, dağlıq ərazidə yerləşən Dağ Cəyir kəndindən fərqləndirmək məqsədilə yaxınlıqdakı Dəllər kəndinin adından istifadə olunmuşdur Oykonim "Dəllər kəndi yaxınlığındakı Cəyir kəndi" mənasındadır.

**Dəllər Cırdaxan** *oyk., mür* Şəmkir r-nunun eyniadlı i ə v -də kənd Gəncə-Qazax düzənliyindədir. Keçmiş adı Hacıələkbərli olmuşdur Cırdaxan kəndini keçmiş Qazax qəzasında eyniadlı kəndlərdən fərqləndirmək məqsədilə yaxınlıqdakı Dəllər kəndinin adından istifadə olunmuşdur Oykonim "Dəllər kəndi yaxınlığındakı Cırdaxan kəndi" mənasındadır

**Dəlmətala** *oyk. mür* Ağcabədi r-nunda kənd Kür-Araz ovalığındadır Oykonim *dəlmə* (yerli əhalinin dilində "quzu saxlanılan yer") və *tala* (ətrafa nisbətən fərqli yer) komponentlərindən düzəlib, "quzu saxlanılan tala" mənasındadır

**Dəmbəlov** *oyk. mür* Masallı r-nunun Qodman i ə v -də kənd Dağətəyi ərazidədir Yerli əhali oykonimi Dəmbəlovu kimi tələffüz edir Yaşayış məntəqəsi XIX əsrin əvvəllərində Cənubi Azərb -dan gəlmiş kalışların (talışların qolu) Dəmbəlovu adlı yerdə məskunlaşması nəticəsində yaranmışdır Oykonim talış dilindəki *dəmbo* (xoş iy), *lev* (kənar) və *ov* (su) sözlərindən ibarət olub, "xoş iyli su kənarı" kimi izah olunur Kəndin adı, sözsüz ki, ərazidəki istiliyi 50 dərəcə olan bulaqla bağlıdır Oykonimi "yerdən qaynayıb çıxan su kənarı" kimi də izah etmək olar

**Dəmiraparançay** *hidr. mür* Qəbələ r-nu ərazisində çay Türyan çayının sol qoludur Mənbəyini Baş Qafqaz silsiləsinin c yamacından (3850 m yüksəklikdən) alır, bir hissəsi Türyan, digər hissəsi Göyçay çaylarına axıdılır Tez-tez çayda sel hadisələri baş verir Çay Qəbələ şəhəri yaxınlığında Xan yolu adlı yerdə qədimdə mövcud olmuş dəmir körpünü dağıtdığına görə belə adlandırılmışdır Yerli əhali arasında Körpüaparan, Fil





dərəsində Vəndam çayına birləşdikdən sonra Fil çayı adlanır Şəki və Qusar r-nlarında da eyniadlı çaylar vardır

**Dəmərcik** *hidr., düz* Şəki r-nu ərazisində çay Əsli Dəmərcıqdır Hidronim *dəmər* (burada "çay qolu") və *-cıq* (kiçiltmə bildirən şək ) komponentlərindən düzəlib, "kiçik çay qolu" deməkdir

**Dəmirçi** *oyk., sadə* 1 Sədərək r-nunun eyniadlı i ə v -də kənd Şərur düzündədir Oykonimin türkdilli *dəmirçilər* tayfasının adı ilə bağlı olması ehtimal edilir; 2 Şamaxı r-nunun eyniadlı i ə v -də kənd Pirsaat çayının sahilində, Baş Qafqaz silsiləsinin ətəyindədir Kənd əvvəllər Künəçayın (Dibçay) sahilində salındığına görə *Künəçay* adlanmışdır Əhən kəndindən gəlmiş dəmirçi ailələri əvvəlcə mövsümi xidmətlə əlaqədar el yolunun kənarında müvəqqəti yurd, sonralar isə daimi yaşayış məntəqəsi salmışdılar Kəndin adı sakinlərin məşğuliyyəti ilə əlaqədardır

**Dəmirçi** *or. sadə* Şamaxı r-nu ərazisində palçıq vulkanı Dəmirçi kəndindən 2 5 km c -ş -də yerləşir Ərazisində yerləşdiyi kəndin adını daşıyır

**Dəmirçiçay** *hidr. mür* Şamaxı r-nu ərazisində çay Pirsaat çayının qollarından biridir Dəmirçi kəndinin yaxınlığından axdığı üçün belə adlandırılmışdır

**Dəmirçidam** *oyk. mür* Kəlbəcər r-nunun Seyidlər i ə v -də kənd. Dağətəyi ərazidədir Yaşayış məntəqəsini XIX əsrin əvvəllərində Gədəbəy r-nunun Şınıx kəndindən gəlmiş ailələr keçmiş *dəmirçi damının* (dəmirçixananın) yanında saldıqları üçün belə adlandırılmışdır Köç yolunun kənarında yerləşən dəmirçixanada dəmirçilər yaylağa qalxan və qışlağa qayıdan elatlara mövsümi xidmət göstərirdilər

**Dəmirçidərəsi** *hidr. mür* Yardımlı r-nu ərazisində çay Hidronim Talış silsiləsinin ş yamacındakı Dıman çökəkliyində müvəqqəti axarı olan dərənin adı ilə bağlıdır Çayın sahilindəki Qaravuldaş adlı yerdə kənd xarabalığı (keçmişdə mövcud olmuş Dəmirçi kəndi) var Çayın və dərənin adları da həmin kəndin adındandır

**Dəmirçilər** *oyk sadə* 1 Xocalı r-nunun Qarabulaq i ə v -də kənd Qarabağ silsiləsinin ətəyindədir; 2 Qazax r-nunun Birinci Şıxlı i ə v -də kənd. Gəncə-Qazax düzənliyindədir; 3 Qazax r-nunun eyniadlı i ə v -də kənd Coğaz çayının sahilində, dağ ətəyindədir; 4 Qubadlı r-nunun Dondarlı i ə v -də kənd Bazarçayın sahilində, dağətəyi ərazidədir; 5 Tərtər r-nunun eyniadlı i ə v -də kənd Qarabağ düzündədir Yaşayış məntəqəsinə 1918-ci ildə baş vermiş erməni-azərbaycanlı qırğını ilə əlaqədar olaraq indiki Xocalı r-nunun Dəmirçilər kəndindən köçüb gəlmiş ailələr salmışdılar Yaşayış məntəqələri *dəmirçilər* nəslinə mənsub ailələrin məskunlaşması nəticəsində yaranmışdır XVI əsrdə qızılbaş tayfaları sırasında adları çəkilən *dəmirçilər* sonralar qazax tayfa birliyinin ən qüdrətli tirələrindən biri olmuşdur

**Dəmirçitəpə** *or. mür* Quba r-nu ərazisində dağ Qaraçayla Qudyal çayı arasındakı sıra dağlar üstündəki zirvələrdən biridir Tədqiqatçılar oronimi buradakı təpələrdən birində yaylağa gedən elat camaatına mövsümi xidmət göstərmək üçün dəmirçilərin müvəqqəti yurdu olması ilə əlaqələndirirlər Etnotoponim olması da mümkündür

**Dəmirli** *or. sadə* 1 Ordubad r-nu ərazisində dağ. Ermənistanla sərhəddə, Zəngəzur silsiləsində zirvədir Hün 3364 m. 2 Şamaxı r-nu ərazisində sıra dağlar Pirsaat çayının aşağı axarında, Səbətdüzündən ş -dədir Oronimləri dağ süxurlarının *dəmirə* oxşaması, orada bitən *dəmirotu* bitkisinin adı və ya *dəmirli* nəslinin adı ilə əlaqələndirirlər

**Dəmirli** *oyk sadə* Tərtər r-nunda kənd Dağətəyi ərazidədir Yerli əhali arasında Dəmirlər kimi də işlənir Digər adı Xoruzlu (kəngərlilərin bir qolu olan xoruzlu kəngərlisinin adı) olmuşdur Oykonim orada məskunlaşmış *dəmirli* nəslinin adı ilə adlandırılmışdır

**Dəmirlidağ** *or. mür* 1 Cəlilabad r-nu ərazisində dağ. 2 Gədəbəy r-nu ərazisində dağ Yerli əhali arasında Dəmirlik dağı adlanır Dağın ərazisində *dəmir* qırıntılarının olması və ya burada *dəmirotu* bitkisinin bitdiyinə görə belə adlandırılması ehtimal olunur

**Dəmirtəpə** *or., mür.* Qazax r-nu ərazisində dağ. Oronimin birinci komponenti "möhkəm, bərk" mənasındadır. Tədqiqatçılar dağın adını *Dəmir* şəxs adı ilə də əlaqələndirirlər.

**Dəmlər** *or., düz.* Şərur r-nu ərazisində dağ. Oronim *dəm* (Azərb. dilinin Naxçıvan dialektində "dəlik, deşik" mənasında işlənir) və *-lər* (cəmlik şək.-si) komponentlərindən düzəlib, "qayalarında çoxlu deşik olan dağ" mənasındadır. Bu baxımdan Dəmlər Deşikdaş, Dəlikdaş, Dəlikdağ oronimlərinin sinonimidir.

**Dənizkənarı** *oyk., mür.* Bakı şəhəri Qaradağ r-nunun eyniadlı qəsəbə i.ə.v.-də şiq. Xəzər dənizi sahilindədir. Sahil qəsəbəsi də adlanır. Yaşayış məntəqəsi 1930-cu ildə Qaradağ Sement Zavodunun tikintisi ilə əlaqədar salınmışdır. Qəsəbə dəniz sahilində yerləşdiyi üçün belə adlandırılmışdır.

**Dər** *oyk., sadə.* Ordubad r-nunun Aza i.ə.v.-də kənd. Gilan çayının sağ sahilində, Zəngəzur silsiləsinin ətəyindədir. Tədqiqatçılar bu oykonimi ərəb dilindəki *deyr* (məbəd, monastır) sözü ilə əlaqələndirir və güman edirlər ki, bu coğrafi ad kəndin ərazisində qədim məbəd xarabalıqlarının olduğunu bildirir. Əslində, Zəngəzur silsiləsinin ən yüksək zirvəsi olan Qapıcıq dağının r-nun ərazisində yerləşməsi "qapı", "keçid" mənalı Dər toponiminin də yaranmasına səbəb olmuşdur. Fars dilində *dər* "qapı" deməkdir.

**Dərə Cənnətli** *oyk., mür.* Şəki r-nunun Suçma i.ə.v.-də kənd. Daşüz silsiləsinin yamacındadır. R-nun ərazisində *cənnətli* tayfa adı ilə bağlı digər kənd adından (Təpə Cənnətli) fərqləndirmək məqsədilə nisbətən çökəkdə olan bu kənd Dərə Cənnətli adlandırılmışdır.

**Dərə Gilətağ** *oyk., mür.* Zəngilan r-nunun Gilətağ i.ə.v.-də kənd. Bərgüşad silsiləsinin ətəyindədir. Yaşayış məntəqəsini 1918-ci ildə Böyük Gilətağ kəndindən çıxmış ailələr salmışlar. Oykonim *dərə* (çökək) və *Gilətağ* (kənd adı) komponentlərindən düzəlib, "dərədə yerləşən Gilətağ kəndi" mənasındadır. Toponimin birinci komponenti onu eyniadlı digər yaşayış məntəqəsindən fərqləndirmək məqsədilə əlavə edilmişdir.

**Dərə Zarat** *oyk., mür.* Siyəzən r-nunun Zarat i.ə.v.-də kənd. Ataçayın sağ sahilindən 3 km aralı, Yan silsiləsinin (Böyük Qafqaz) yamacındadır. XIX əsrdə Zarat kəndindən çıxmış ailələrin dərədə saldığı yaşayış məntəqəsidir. Bəzən Yenikənd də adlandırılmışdır. Oykonim "dərədə salınmış Zarat kəndi" deməkdir.

**Dərəkənd** *oyk., mür.* 1. Xocavənd r-nunun eyniadlı i.ə.v.-də kənd. Qarabağ silsiləsinin ətəyindədir. XIX əsrdə ermənilər burada məskunlaşdırıldıqdan sonra kəndin adı *Zamzur* (*zam/çam* qədim türk dillərində "bataqlıq" və *zur* İran dillərində "dərə") kimi rəsmiləşdirilmişdi. 1992-ci ildən kənd yerləşdiyi mövqeyə görə Dərəkənd adlandırıldı. 2. Qobustan r-nunun eyniadlı i.ə.v.-də kənd. Dağətəyi ərazidədir. Keçmiş adı Mərəzəli Dərəkənd olmuşdur. Yaşayış məntəqəsi keçmiş Mərəzə (indiki Nəriman kəndi) kəndindən köçmüş ailələrin Zəngidərə çayının (Pirsaat çayının qolu) dərəsində məskunlaşması nəticəsində yaranmışdır. 3. Şərur r-nunun Siyaqut i.ə.v.-də kənd. Şərur düzündədir. Oykonim *dərə* (çökək) və *kənd* (yaşayış məntəqəsi) komponentlərindən düzəlib, "dərədə yerləşən kənd" deməkdir. Kəndin XIX əsrdə salınması haqqında məlumat var.

**Dərəqazma** *or., mür.* Quba r-nu ərazisində dağ. Oronim dağın ətəyindəki dərədə keçmişdə yay mövsümündə müvəqqəti yaşayış evlərinin (qazmaların) olması ilə bağlı yaranmışdır, "dərəsində qazmalar olan dağ" deməkdir.

**Dərəqışlaq** *oyk., mür.* Kəlbəcər r-nunun Kəlbəcər qəsəbə i.ə.v.-də kənd. Dağlıq ərazidədir. Kəndin ərazisi keçmişdə Dalqılıclı kəndinin qışlaq yeri olmuş və dərədə yerləşdiyinə görə Dərəqışlaq adlandırılmışdır. Yerli əhalinin verdiyi məlumata görə, kəndi XIX əsrdə qılıclı tirəsindən olan Hüseynalı adlı şəxs saldığına görə bəzən Hüseynalılar da adlanır.

**Dərələyəz** *or., mür.* Nax.MR-in şm.-ş. hissəsində, Azərb.-nın Ermənistanla sərhədində dağ silsiləsi. Bazarçay (Bərgüşad), Şərqi Arpaçay və Naxçıvan çayı hövzələrinin suayrıcısıdır. Silsilənin ən hündür zirvəsi Qalınqayadır (2789 m). Dağlardan tarixən





yay otlaqları kimi geniş istifadə olunmuşdur. Tədqiqatçıların fikrincə, dağın adı *dərə* və *Alagöz* oroniminin təhrif variantı *ləyəz* komponentlərindən düzəlib, "Alagöz dərəsi" mənasındadır. Vaxtilə dağın ətəklərində yaşamış Azərb. elləri *alagözlü* adlanırdı. Ermənistan ərazisində Ayotsdzor və ya Vayk silsiləsi adlanır.

**Dərəmirzik** *hidr., mür.* Daşkəsən və Xanlar r-nları ərazisində çay. Gəncə çayının sol qoludur. Mirzik kəndinin dərəsindən axdığı üçün çay bu adı almışdır.

**Dərəşam** *hidr., mür.* Culfa r-nu ərazisində min. bulaqlar. Araz çayının sahilində Dərəşam d.y. stansiyası yaxınlığındadır. Üç böyük və bir neçə kiçik bulaqdan ibarət olub, suyu turş-şordur. Hidronim *dərə* (çuxur) və *şam/çam* (sucaq yer, bataqlıq) komponentlərindən düzəlib, "dərədə sucaq yer, bataqlıq" mənasındadır.

**Dərəşam** *or., sadə.* Culfa r-nu ərazisində dağ. Adını ərazidəki eyniadlı bulaqlardan almışdır.

**Dərinaxmaz** *hidr., mür.* Zərdab r-nu ərazisində göl. Mənbələrdə Dəmiaxmaz variantında da qeydə alınmışdır. Tədqiqatçılar bu hidronimi *dərin* və *axmaz* (axarsız göl) komponentlərinin birləşməsi olaraq "dərin göl, gölməçə" kimi izah edirlər.

**Dərk** *hidr., sadə.* 1. Quba r-nunda çay. Vəlvələ çayının sol qoludur. Azərb. dilinin dialektlərində *dər* "dar keçid", *dərgə* "çay üzərində ağacdan düzəldilmiş keçid, körpü", İran dillərində *dərğ* "bənd, barı" mənalarında işlənir. Hidronim "bənd, körpü" mənasındadır. 2. Quba r-nunun Dərk kəndinin c.-q. hissəsində min. bulaq. Suyu soyuq və kükürdlüdür. Adını ərazidəki eyniadlı çaydan almışdır.

**Dərk** *oyk., sadə.* Quba r-nunun Yerfi i.ə.v.-də kənd. Dərk çayı sahilində, Yan silsiləsindədir. Çox vaxt Dərgavar variantında qeydə alınır. Oykonim *dərk* (bənd, körpü) və *varvar* (qarşı tərəf) komponentlərindən düzəlib, "körpünün, bəndin qarşı tərəfi" mənasındadır.

**Dərnəgül** *or., mür.* Bakı şəhəri Binəqədi r-nu ərazisində coğrafi ərazi. Tədqiqatçılar bu oronimi Dornağıl (uzaqda, kənarda malqara saxlanılan yer) sözünün təhrif olunmuş variantı hesab edirlər. Əslində isə bu coğrafi ad mənbələrdə qeydə alınmış Dəlannaur toponiminin Dərnigöl/Dərnəgül variantıdır və ərazidəki çoxlu göllərin olması ilə əlaqədar yaranıb, "böyük göl" deməkdir.

**Dərvişlər** *oyk., sadə.* Şərur r-nunun eyniadlı i.ə.v.-də kənd. Arpa çayının sahilində, Şərur düzündədir. Etnotoponimdir. *Dərvişlər* nəslinin bu kənddə məskunlaşması ilə bağlı yaranmışdır.

**Dərvişli** *oyk., sadə.* Biləsuvar r-nunun Amankənd i.ə.v.-də kənd. Düzənlikdədir. Keçmişdə r-nun ərazisindəki Ağdam adlı qala xarabalıqlarının adı ilə Ağdamkənd adlanmışdır. Kəndin ərazisi əvvəllər *dərvişbəyli* tayfasına məxsus qışlaq olmuşdur. Sonralar həmin tayfaya mənsub ailələr qışlaq yerində məskunlaşaraq buranı daimi yaşayış məntəqəsinə çevirmiş, kəndə də öz adlarını vermişlər. Tədricən Dərvişbəyli adındakı *bəy* sözü düşmüş və Dərvişli şəklini almışdır.

**Dəryavar** *oyk., mür.* Yardımlı r-nunun Yardımlı qəsəbə i.ə.v.-də kənd. Peştəsər silsiləsinin ətəyindədir. Yerli əhali oykonimi Dəreyovo kimi tələffüz edir. XIX əsrə aid ədəbiyyatda isə kəndin adı Dərikı formasında qeydə alınmışdır. Tədqiqatçılara görə, kəndin adı Talış zonasında XIII əsrdən məlum olan qədim *Drık* mahalının adından, *-yə* birləşdirici hissəsindən və *var* (yer, məskən) sözlərindən ibarət olub, "Drık mahalından gələnlərin məskəni" mənasındadır. Kəndin ilk sakinləri də elə Drık mahalından köçüb gəlmiş ailələr olmuşlar.

**Dərzili** *oyk., sadə.* Cəbrayıl r-nunun Qumlaq i.ə.v.-də kənd. Göyan çölündədir. Oykonim XIX əsrin ikinci yarısında Zəngəzur qəzasında maldarlıqla məşğul olmuş *dərzili* tayfasının adını əks etdirir. Etnotoponimdir. XIX əsrə aid məlumatlara əsasən, *dərzili* tayfası Bəyəlı, Bəmik, Gümarlı, Gün, Çənsbər, Qaragöl, Kırxılı, Quşilər, Pirveysli, Razgah, Şərəkən adlı yaşayış məntəqələrində yaşayırdılar.

**Dəstə** *oyk., sadə.* Ordubad r-nunun eyniadlı i.ə.v.-də kənd. Vənənd çayının (Arazın qolu) mənsəbində, Zəngəzur silsiləsinin ətəyindədir. Tədqiqatçıların fikrincə, oykonim fars dilindəki *dəstə* sözündən olub, "kənd,

"bağ, mülk" deməkdir Kənd adını ərazidəki eyniadlı bulağın adından almışdır

**Dəstə** *hidr., sadə* Ordubad r-nunda min bulaqlar Dəstə kəndindən 2 km. q.-də, Arazın sol sahilində iki qrup bulaqdır Suyu soyuq, dadı şor-turşməzədir Azərb dilinin dialektlərində *dastamaldastamal/dasmal* "su arxı", "su novu" deməkdir

**Dəstəfur** *hidr., mür* Daşkəsən r-nunda çay Gəncə çayının sol qoludur. Mənbəyini Qoşqar dağının şm yamacından (2800 m yüksəklikdən) alır Dərin dar dərələrlə axır Suvarma və dəyirmanların hərəkətə gətirilməsi üçün istifadə edilir Hidronim *dasta* (su arxı, çay) və *fur* (şəlalə, gur su, fışqırtı ilə çıxan çay) komponentlərindən düzəlib, "gur sulu çay" mənasındadır

**Dəstəfur** *oyk., sadə* Daşkəsən r-nunun eyniadlı i.ə.v.-də kənd Dəstəfur çayının sahilində, Başkənd-Dəstəfur çökəkliyindədir Digər yerli adı Qızıltaxçadır Adını sahilində yerləşdiyi eyniadlı çaydan almışdır Dəstəfur variantında da qeydə alınmışdır XIX əsrdə kəndin ayrımlar tərəfindən salınması haqqında məlumat verilir. Daşkəsən r-nu 1956-cı ilədək Dəstəfur adlanmışdır

**Dəstəgül** *oyk., mür* Tərtər r-nunun Çaylı i.ə.v.-də kənd Qarabağ silsiləsinin ətəyindədir Keçmiş adı Dostahir kimi rəsmiləşdirilmişdi Yerli əhali kəndin adını Tahir adlı şəxslə bağlayır Tədqiqatçıların bir qismi toponimi XIX əsrdə qeydə alınmış qaraçorlu tayfa birliyinə daxil olan *dostagir* tirəsinin adı ilə, digər qismi isə alban hökmdarı Vaçaqanın (V əsr) qızı *Dastagülün* adı ilə əlaqələndirir və guya kəndin vaxtilə bu şahzadənin yay iqamətgahı olduğunu söyləyirlər Əslində, oykonim *dasta* (su arxı) və *hır* (axar) komponentlərindən ibarət olub, "axar su kənarında kənd" mənasını daşıyır Kəndin Kürəkçayın qollarından birinin kənarında yerləşməsi və Çaylı adlanan sovetliyin tərkibində olması da bu fikri təsdiqləyir

**Dəstəmaçay** *hidr., mür* Qəbələ r-nu ərazisində çay Vəndam çayının qoludur Keçmiş adlarından biri Qaraçay olmuşdur Hidronimi Dəstəmaz variantında qəbul edənlərin fikrincə, keçmişdə ziyarətə gedənlər çayın sahilində dəstəmaz aldıqlarına görə çay belə adlandırılmışdır Əslində, hidronim *dasta* (arx, çay) və *maz* (ayrım, ayrılan yer, sərhəd) komponentlərindən düzəlib, "çaydan ayrılan qol" deməkdir Sonralar çayın adına yenidən "çay" sözü artırılmış, bu sözün təsirilə "z" səsi düşmüş, "ə" səsi isə "a" səsinə keçmişdir

**Dəstər** *oyk., sadə* Lənk r-nunun eyniadlı i.ə.v.-də kənd. Ləmər çayının (Lənkəran çayının qolu) sahilində, Peştəsər silsiləsinin yamacındadır Yerli əhali Duster kimi tələffüz edir Kəndin ilk sakinləri Cənubi Azərb.-dan gəlmiş talışlar olmuşlar Tədqiqatçıların məlumatına görə, kəndin əhalisi oturaq həyata keçdikdən sonra maldarlıq məhsullarını taxıla dəyişir, taxılı əl dəyirmanında üyüdürdülər Hər ailədə əl dəyirmanı olduğundan onların məskunlaşdığı ərazi də Dasdar (talış "əl dəyirmanı, kirkirə") adlandırılmışdır

**Dəstər** *oyk., sadə* Astara r-nunun Asxanakəran i.ə.v.-də kənd Dağətəyi ərazidədir Tədqiqatçıların ehtimalına görə, oykonim kəndin ilk sakinlərinin Zərdüşt dininə mənsubiyyəti ilə əlaqədardır və fars dilindəki dəstər (çalma, əmmamə) sözündəndir Əslində, toponim Dəstər coğrafi adının yerli tələffüz formasıdır

**Dəvəbatan** *hidr., mür* İsmayıllı və Göyçay r-nları ərazisində çay Çay dərəsi kolluq və bataqlıq olmuş, sonralar üstündə Aşağı Bayramlı su anbarı tikilmişdir Suvarma məqsədilə suyu tamamilə anbara axıdılır. Vaxtilə karvan yolu ilə Qəbələ tərəflərə gedən dəvələrin burada batması çayın belə adlanmasına səbəb olmuşdur Şəki r-nu ərazisində isə Dəvəbatan adlı göl qeydə alınmışdır

**Dəvəboynu** *or., sadə* 1 Qax r-nunun şm.-ş.-ində dağ Hün 2888 m., 2 Ordubad r-nunda dağ Ermənistanla sərhəddə Zəngəzur silsiləsinin zirvəsidir Hün 3560 m., 3 Yardımlı r-nunda dağ Talış sıra dağlarından ayrılan qolun üstündə yerləşir Hün 2088 m Dağlara ad xarici görünüşünə (dəvə boynuna oxşadığına) görə verilmişdir Oronim tərkibindəki *boynu/boyun* sözü coğrafi termin kimi "dağ aşırımı" mənasını bildirir

**Dəvəboyun** *or., sadə* Acınohur ön dağlığında, Qocaşen silsiləsinin şm.-q. hissəsində aşırım Hün 235 m Oronim "dağ aşırımı" mənasındadır





**Dəvəçi** *oyk., sadə* 1 Azərb.-da inzibati r-n Şm.-dan Xaçmaz r-nu, q.-dən Quba r-nu, c.-dan Sumqayıt, ş.-dən Xəzər dənizi ilə həmsərhəddir Samur-Dəvəçi kanalı r-nun ərazisindən keçir R-n 1930-cu ildə təşkil edilmiş, 1963-cü ildə ləğv edilərək ərazisi Abşeron r-nuna verilmiş, 1965-ci ildən yenidən müstəqil r-n olmuşdur Mərkəzi Dəvəçi şəhəridir; 2 Azəb.-da şəhər Eyniadlı r-nun mərkəzidir Dəvəçi çayının sahilində, dağətəyi ərazidədir Bu ərazi keçmişdə dəvə karvanlarının dayanacaq yeri olmuş və burada həftəbazarı keçirilmişdir Dəvə alveri yeri olduğu üçün 1944-cü ilədək Dəvəçi-bazar da adlanmışdır Şəhər 1944-1961-ci illərdə mövcud olmuş eyniadlı şıq əsasında yaranmışdır

**Dəvəçi** *hidr., sadə.* Dəvəçi r-nundan axıb Ağzıbirçala gölünə tökülən çay Mənbəyini Yan silsiləsindəki Gümürdağın yamaclarından (1530 m. hündürlükdən) alır Pirəbədil və Zahlıq çaylarının birləşməsindən əmələ gəlir Suvarma üçün istifadə edilir Çay adını ərazisindən axdığı eyniadlı yaşayış məntəqəsindən almışdır

**Dəvəçuxur** *or., sadə.* Goranboy r-nu ərazisində dağ Adını ərazidəki eyniadlı göldən almışdır

**Dəvədaşı** *oyk., sadə* Kəlbəcər r-nunun Çıldıran i.ə.v.-də kənd Yaşayış məntəqəsini qonşu Dovşanlı kəndindən çıxmış ailələr Dəvədaşı adlı yerdə salmışlar Kəndə ermənilər tərəfindən Poqosoqomer (erm "Poqosun tövlələri, pəyələri") adı verilmişdir 1992-ci ildən kəndin keçmiş adı bərpa edilmişdir *Dəvəgözü daşı* mineralının adı ilə bağlı olması ehtimal edilir

**Dəvəlidağ** *or., mür* Qobustanda palçıq vulkanı Səngəçal d.y. stansiyasının şm.-q. tərəfindədir Hün 235 m Davalıdağ variantında da qeydə alınmışdır Zahiri görünüşcə ikihörgüclü dəvəyə oxşadılmasına görə vulkan belə adlandırılmışdır Qacarların bir qolu *davalıların* adı ilə bağlı etnooronim olması da mümkündür

**Dəyəqarabulaq** *oyk., mür* Gədəbəy r-nunun eyniadlı i.ə.v.-də kənd Şahdağ silsiləsinin (Kiçik Qafqaz) ətəyindədir Yerli əhalinin məlumatına görə, kəndi XVIII əsrin axırlarında yaxınlıqdakı keçmiş Qarabulaq (indiki Rüstəm Əliyev) kəndindən ayrılmış ailələr yurd yerində saldığına görə belə adlandırılmışdır *Dəyə* sözü "koma, daxma, yaylaq və ya qışlaqda müvəqqəti yaşayış evi" mənasında olub, kəndi r-nun ərazisindəki Qarabulaq adlı başqa bir kənddən fərqləndirməyə xidmət edir

**Dəyirli** *or., düz.* Quba r-nu ərazisində dağ Azərb dilində və dialektlərində "dəyir" sözü "yumru, girdə, gödəkboylu, düyün" mənalarında işlənir *Dəyir* və *-li* (şək.) komponentlərindən düzəlmiş oronim "yumru, girdə başlı dağ" mənasındadır

**Dəyirmandağ** *or., mür* Gədəbəy r-nu ərazisində dağ 1940-cı illərədək burada dəyirman daşları çıxarılırmış Dağın adı da buradan yaranmışdır Yerli əhali arasında Mədəndağ adı ilə də tanınır

**Dəyirmandağ** *oyk., sadə* Gədəbəy r-nunun Gərgər i.ə.v.-də kənd Dəyirmandağın ətəyindədir Keçmiş adı Koruşdu olmuş və ərazidəki eyniadlı bulaqla birlikdə koruşdu nəslinin adını daşımışdır Sonralar Dərələyəz mahalından muradlı nəslinə mənsub, Qarabağdan qaraqoyunlulara mənsub, Dağıstandan gümüşlü nəslinə mənsub ailələr gələrək bu kənddə məskunlaşmışlar Kənd ətəyində yerləşdiyi dağın adını daşıyır

**Dəyirmanlı** *oyk., düz* Kürdəmir r-nunun Yenikənd i.ə.v.-də kənd Şirvan düzündədir Oykonim "dəyirman olan yer" mənasındadır

**Dəyirmantəpə** *or., mür* Füzuli r-nu ərazisində dağ Araz çayının sahilindədir Dağın ətəyində əvvəllər dəyirman olduğundan belə adlandırılmışdır Dağın adı buradan aparılan iri dəyirman daşları ilə də bağlı ola bilər Xaçmaz r-nunun Maşıoba və Çuxuroba kəndləri arasında iki məntəqədən ibarət orta əsrlərə aid yaşayış yeri də Dəyirmantəpə (digər adı Xırmantəpə) adlanır

**Dəyirmanyanı** *oyk., mür* Laçın r-nunun Mığıdərə i.ə.v.-də kənd Qarabağ silsiləsinin ətəyindədir Keçmiş adı Dəyirmandərəsi olmuşdur Kəndi XIX əsrdə Məlikpəyəsi kəndindən dənkanlı imamverdiuşağı və Malxələf kəndindən ibrahimuşağı nəsillərinə mənsub ailələr Dəyirman çayının (Həkəri çayının qolu) dərəsində, köhnə dəyirmanın

yanında saldıqları üçün yaşayış menteqesi əvvəlcə Dəyirman dərəsi, sonralar isə Dəyirmanyanı adlandırılmışdır

**Dəymədağlı** *oyk sadə* 1 Bərdə r-nunun Şirvanlı i ə v -də kənd. Qarabağ düzündədir Çox vaxt Dəymədağıldı variantında işlənir Tədqiqatçıların ehtimalına görə, oykonim XIX əsrdə Cavad qəzasında yaşamış kəbirlilərin arıqməhəmmədli tayfasının eyniadlı tirəsinin adı ilə bağlıdır 16 ailədən ibarət olan bu tirə Ağburun adlı yerdə yaşamışdır XIX əsrdə Azərb -da bu tirənin adını daşıyan 6 kənd olmuşdur; 2 Qax r-nunun Almalı i ə v -də kənd Alazan-Əyriçay çökəkliyindədir Oykonim *dəymədağlı* tirəsinin adı ilə bağlıdır Etnotoponimdir, 3 Oğuz r-nunun Sincan i ə v -də kənd. Alazan-Əyriçay çökəkliyindədir Keçmiş adı Dəymədağlı Molla Vəli olmuşdur Yaşayış məntəqəsi Mollalı (əsl adı Mollavəli) kəndindən çıxmış *dəymədağlı* tayfasına mənsub ailələrin məskunlaşması nəticəsində yaranmışdır Etnotoponimdir Mənbələrdə bu etnonimin *dəmyədağlı* variantına da təsadüf olunur *Dəmyə* (əkilməmiş, xam, yüksək məhsuldarlıqlı) və *dağlı* (dağlıq ərazidə yaşayan) komponentlərdən ibarət olan bu etnonim "xam torpaqlı dağlıq ərazidə yaşayanlar" mənasındadır Tədqiqatçılar bu sözü *dəymə* (dağ ətəyində mal-qaranın saxlandığı yer) və *dağ* komponentlərinin birləşməsi kimi qəbul edirlər

**Dəymədərə** *oyk., sadə* Oğuz r-nunun Padar i ə v -də kənd Dəymədərə çayının (Qalaçayın qolu) sahilində, Alazan-Əyriçay çökəkliyindədir Kənd Dəymədərə adlı yerdə salındığı üçün həmin dərənin adını daşıyır Oronim *dəymə* (mal-qaranın saxlandığı yer) və *dərə* (mənfi relyef forması) komponentlərindən düzəlib, "mal-qara saxlanan dərə" mənasındadır

**Dırnıs** *oyk , mür* Ordubad r-nunun eyniadlı i ə v -də kənd Vənənd çayının (Arazın qolu) sahilində, Zəngəzur silsiləsinin ətəyindədir XIX əsrə aid ədəbiyyatda Dernis variantında qeydə alınmışdır Oykonim ərəb dilindəki *derideyr* (məbəd, monastır) və *naus* (zərdüşti qəbirləri üstündə tikili) komponentlərinin birləşməsi kimi izah olunur Əslində, oykonim r-nun ərazisindəki Qapıcıq adlı dağ aşırımı ilə bağlı yaranmış çox qədim dil vahididir Bir çox qədim dillərdə *dura* (yunan), *duar* (gürcü və osetin), *dvaras* (hind), *drunk* (qədim fars) və s sözlər "qapı", "qapılar", "dağ keçidi" mənalarında işlənmişdir

**Dıryan** *oyk , mür*. Lənkəran r-nunun Gəgiran i ə v -də kənd. Düzənlikdədir Kəndin adı yerli əhali tərəfindən Dırıon kimi tələffüz edilir Talış dilindəki *değiron* sözündən olub, "dağa gedən yollar" və ya "iki yol" mənasında olduğu güman edilir

**Dızdılıq** *or , mür* Lerik r-nu ərazisində dağ. Veri kəndindən c -q -dədir Hün. 2328 m Oronim Dızdilinq sözünün təhrifə uğramış formasıdır Talış dilində *dız* (qala), *di* (kənd) *linq/linc* (yüksəklik, dağ) komponentlərindən düzəlib, "qala kəndində olan dağ" mənasındadır Dağda doğrudan da qədim qala xarabalıqları var

**Dızdipək** *oyk , sadə* Lerik r-nunun Dəstər i.ə v.-də kənd Talış silsiləsinin yamacındadır Oykonim həmin ərazidəki Dızdılıq dağının adının təhrif olunmuş formasıdır

**Diadin** *oyk , mür* Şərur r-nunun İbadulla i ə v -də kənd Düzənlikdədir Tədqiqatçıların ehtimalına görə, oykonim *tey* (qədim türk dillərində "təpə") və *din* (istirahət yeri, dincəlmək üçün yer) komponentlərindən düzəlib, "yaylaq təpə" mənasındadır 1933-cü ildə kəndin adı Diyadın variantında qeydə alınmışdır

**Dib** *oyk , sadə* Siyəzən r-nunun Zarat i ə v -də kənd Samur-Dəvəçi ovalığındadır Kənd Beşbarmaq (Xıdırzində) dağının ətəyində (dibində) yerləşdiyinə görə belə adlandırılmışdır *Dib* sözü toponimiyada "ayaq", "aşağı" komponentlərinin sinonimi kimi işlənir Müqayisə et Dib Arızır-Baş Arızır (Naxçıvan, 1933).

**Dibanaxçay** *hidr , mür* Oğuz r-nu ərazisində çay Hidronim "dayaz çay, dibi görünən çay" mənasındadır

**Dibanbil** *or , mür* Lənkəran r-nunda, Ülyasa silsiləsində aşırım Hün 1890 m Divanbil variantında da qeydə alınmışdır Oronim *dib* (ətək, aşağı) və *ənbil* (göl) sözlərindən düzəlib, "ətəyində göl olan dağ" deməkdir

**Dibaşil** *or , mür* Lənkəran r-nunda dağ Oronim talış dilindəki *dibaldıba* (ekiz, ikili)







və *şil* (çıxıntı, buynuz, bığ) sözlərindən düzəlib, "iki çıxıntılı, haça dağ" deməkdir

**Dibətli** *or , düz* Xocavənd r-nu ərazisində dağ Böyük Kirs dağının c.-q.-ində yerləşir Hün 2140 m Əsli Dibəklidir *Dibək* duz, yarma, çəltik və s döymək üçün içi oyulmuş daş və ya kötükdür Yaylaqda daşlardakı oyuqlardan heyvanlar üçün yem qabı kimi də istifadə edilirdi Dağda belə təbii oyuqlar olduğuna görə Dibəkli adlandırılmışdır.

**Dicə** *oyk., mür* Lerik r-nunun Tükəbinə i.ə.v -də kənd Peştəsər silsiləsinin ətəyindədir Oykonim talış dilindəki *di* (kənd) və *cəgə* (yer) sözlərindən düzəlib, "kənd yeri" mənasındadır

**Didivan** *or , sadə* Qazax r-nu ərazisində dağ və həmin dağdakı pirin adıdır. Tədqiqatçıların ehtimalına görə, dağın adı Didivan qalasının adındandır Qalanın adı isə qədim İran dillərindəki *didi* (qala) və *ban* (gözətçi, keşikçi, qoruqçu) sözlərindən ibarət olub, "gözətçi qalası" mənasındadır Lakin dağın aşağısında Didivan gölü yerləşir və dağın adı və qalanın adı da bu gölün adından ola bilər Qədim dillərdə *didi* "böyük", *van* isə "göl" mənasındadır Hidronim "böyük göl" kimi izah oluna bilər

**Didivar** *oyk , mür* Babək r-nunun Şıxmahmud i ə v -də kənd Naxçıvan çayı ilə Cəhriçayın qovuşduğu yerdədir Kəndin adı XVIII əsrin əvvəllərində Didəbad variantında qeydə alınmışdır Tədqiqatçıların bir qismi belə hesab edir ki, oykonim qədim İran dillərindəki *didi* (qala) və *var* (möhkəmləndirilmiş kənd, şəhər, yurd, məskən) sözlərindən ibarət olub, "qala kənd" mənasındadır Bəzi tədqiqatçılar isə oykonimi fars dilindəki *didi* (görüş, görüşmə) və *var* (yer, yurd, məskən) komponentlərinin birləşməsi kimi "iki çayın görüşdüyü yerdə kənd" mənasında izah edirlər

**Digah** *oyk , mür* 1 Abşeron r-nunda şıq Abşeron yarımadasındadır; 2 Quba r-nunun Amsar i ə v -də kənd Yan silsiləsinin ətəyindədir Alıc Digah da adlanır; 3 Quba r-nunun Xucbala i ə v -də kənd Quruçay və Qudyal çayı arasında, düzənlikdədir, 4 Lənkəran r-nunun Kərgəlan i ə v -də kənd Ovalıqdadır Kəndin ərazisi XIX əsrdə Şilvar kəndinin obası olmuşdur 1870-ci ilə aid sənədlərdə burada üç ev olduğu haqqında məlumat verilir Oykonim tat dilindəki *di* (kənd) və *gah* (yer) sözlərindən düzəlib, "kənd, kənd yeri" mənasındadır

**Digah** *hidr , sadə* Quba və Xaçmaz r-nları ərazisində çay Adını ərazisindən axdığı eyniadlı yaşayış məntəqəsindən almışdır

**Digahoba** *oyk , mür* Xaçmaz r-nunun Köhnə Xudat i ə v -də kənd Samur-Dəvəçi ovalığındadır. Oykonim *Digah* (kənd adı) və *oba* sözlərindən ibarət olub, "Digah kəndinin obası, digahlılara məxsus oba" mənasındadır Oba kollektivləşmə illərindən sonra daimi yaşayış məntəqəsinə çevrilmişdir

**Digə** *hidr , sadə* Astara r-nu ərazisində çay Çayın adı talış dilindəki *diyo* sözünün fonetik variantı olub, "dəniz, dərya" deməkdir Hidronimi fars dilindəki *digo* (qazan, qazıyan) sözü ilə də əlaqələndirirlər

**Digov** *oyk., mür* Lerik r-nunun Mistan i.ə v -də kənd Peştəsər silsiləsinin ətəyindədir Oykonim *Dıgah* coğrafi adının yerli tələffüz forması olub, "kənd yeri" mənasındadır

**Digovdərə** *hidr , mür* Lerik r-nu ərazisində çay Digövdərə variantında da qeydə alınmışdır Hidronim *Digov* (kənd adı) və *dərə* (çay dərəsi) komponentlərindən düzəlib, "Digov kəndinin dərəsindən axan çay" mənasındadır

**Dikdaş** *or , mür* 1 Gədəbəy və Ağdərə r-nları sərhədində dağ Hün 2520 m ; 2 Kəlbəcər r-nu ərazisində dağ, 3 Tovuz r-nunun c -unda, Böyük Qışlaq kəndindən q -də dağ Hün 1722 m Oronimlər dağların başındakı şaquli vəziyyətdə olan qaya parçaları ilə bağlı yaranmışdır

**Dikdaş** *oyk , sadə* Gədəbəy r-nunun Böyük Qaramurad i ə v -də kənd Şahdağ silsiləsinin ətəyindədir Kəndin əhalisinin Qazax r-nunun Dağ Kəsəmən kəndindən və Ağstafa r-nundan gəlib burada məskunlaşması haqqında məlumat var Kənd öz adını ərazidəki eyniadlı dağdan almışdır

**Dikpilləkən** *or mür* Kəlbəcər r-nunun q -ində, Ermənistanla sərhəddə dağ Hün 3449 m Dik pilləli qayalıqdan ibarətdir Dik yoxuşlu dağ pilləkənə oxşadığına görə bu adı almışdır

**Diqo** *oyk., mür.* Astara r-nunun Polikoş i.ə.v.-də kənd. Dağətəyi ərazidədir. Oykonim talış dilindəki *di* (kənd) və *qo* (yer) sözlərindən düzəlib, "kənd yeri" deməkdir.

**Dilağarda** *oyk., sadə.* Füzuli r-nunun eyniadlı i.ə.v.-də kənd. Köndələnçayın (Arazın qolu) sol sahilindən bir qədər aralı, Qarabağ silsiləsinin ətəyindədir. Oykonim qaraqoyunlu tayfa ittifaqına daxil olan *dilağarda* tirəsinin adı ilə bağlıdır. Etnotoponimdir. Əsasən maldarlıqla məşğul olan *dilağardalılar* əvvəllər Cənubi Azərb. və Talış zonasında yaşayırdılar. Sonralar onların bir hissəsi Azər.-nın şm.-ında məskunlaşmışdı. Yayı Talış silsiləsində, qışı isə Muğanda keçirən *dilağardalılar* Araz Dilağarda, Qobu Dilağarda kəndlərinin də bünövrəsini qoymuşlar.

**Dilağardatəpə** *or., mür.* Füzuli r-nu ərazisində dağ. Hün. 162 m. Bəzən səhv olaraq Dəliqarlıtəpə variantında da qeydə alınır. Dilağarda kəndi ərazisində olduğu üçün təpə kəndin adı ilə adlandırılmışdır.

**Diləli Müskənli** *oyk., mür.* Qubadlı r-nunun Dondarlı i.ə.v.-də kənd. Bərgüşad çayının sahilində, dağətəyi ərazidədir. R-nun ərazisindəki iki Müskənli kəndini fərqləndirmək üçün Diləli və Teymur komponentlərindən istifadə olunmuşdur. Tədqiqatçıların fikrincə, *Diləli* kürd mənşəli deləli tayfasının adını, *Müskən* isə orta əsrlərdə Özbəkistanda mövcud olmuş əyalətin adını əks etdirir. Ehtimal olunur ki, monqol işğalları və Teymurun yürüşləri zamanı Müskən əyalətinin əhalisinin bir qismi Azərb.-na köçərək burada məskunlaşmış, əyalətin adını da özləri ilə gətirmişdir.

**Dilənçilər** *oyk., sadə.* Bərdə r-nunun Yeni Daşkənd i.ə.v.-də kənd. Qarabağ düzündədir. Yaşayış məntəqəsini keçmiş Çıraqlı Qərvənd kəndindən köçmüş ailələr 1860-cı ildə xəzinə torpağına məxsus *Dilənçilər yeri* adlı ərazidə saldığına görə belə adlandırılmışdır.

**Dillavi** *or., sadə.* Lerik r-nu ərazisində dağ. Lerik kəndindən c.-q.-də Peştəsər silsiləsindədir. Hün. 1662 m. Etnotoponim hesab olunur.

**Dilman** *oyk., sadə.* Ağsu r-nunun Kalva i.ə.v.-də kənd. Niyaldağ silsiləsinin ətəyindədir. Kənd Türkmənçay sülh müqaviləsindən (1828-ci ildən) sonra Cənubi Azərb.-nın *Dilmar* mahalından köçüb gəlmiş 200 ailənin məskunlaşması nəticəsində yarandığına görə belə adlandırılmışdır.

**Dilmançay** *hidr., mür.* Ağsu r-nu ərazisində çay. Dilman kəndinin ərazisindən axdığı üçün həmin kəndin adı ilə adlandırılmışdır.

**Dindiçay** *hidr., mür.* Zaqatala r-nu ərazisində çay. Hidronim ərazidəki eyniadlı dağın adından yaranmışdır. *Dindi* (ərazidəki aşırım və zirvənin adı) və *çay* (su obyekti) komponentlərindən düzəlmiş bu hidronim "Dındi dağından axan çay" mənasındadır.

**Dindidağ** *or., mür.* Zaqatala r-nunda dağ və dağ aşırımı. Baş Qafqaz silsiləsindən keçir və Dağıstanla sərhəddə yerləşir. Hün. 2318 m. Bu aşırımdan Muxax çayının dərəsindən keçərək Samur çayının yuxarılarına quru yol gedir. Bu əlamətinə görə tədqiqatçılar dağın adını "tinləri olan dağ" kimi izah edirlər. Əslində, oronim *din* (dincəlmək üçün yer, düşərgə), *-di* (*-li* şəkilçisinin variantı) və *dağ* (müsbət relyef forması) komponentlərindən düzəlib, "dincəlmək üçün yeri olan dağ" deməkdir. Kəmidə Din, Dinyu, Vojdin coğrafi adları qeydə alınmışdır.

**Dirdağ** *or., mür.* Cəbrayıl r-nu ərazisində dağ. Araz çayının sahilindədir. Dağda Dirı kəndinin və qalasının xarabalıqları qalır. Yerli əhalinin məlumatına görə, XVIII–XIX əsrlərdə Dırı kəndinin əhalisi Cənubi Azərb.-nın Qaradağ mahalına köçmüşdür. Lakin sonralar onların bir qismi geri qayıdaraq indiki Zəngilan r-nu ərazisində Dirili adlı yaşayış məntəqəsinin əsasını qoymuşdur. Hazırda həmin kənd Muğanlı kəndinə birləşmişdir. Tədqiqatçıların fikrincə, toponim özündə Qafqaz Albaniyasında erkən orta əsrlərdə mövcud olmuş Trı əyalətinin və eyniadlı qalanın, yaxud monastırın adını əks etdirir. Zəngilan r-nunda, Oxçu çayının Araza töküldüyü yerdə Tin adlı qala var. Sonralar burada salınmış kənd də qalanın adı ilə adlandırılmışdır. XIX əsrə aid mənbələrdə həmin kənd Dırı kimi qeydə alınmışdır. Trı, Tiri və Dırı toponimləri eyni mənşəlidir. Suriya dilindəki *deyrə* (kilsə, monastır; Albaniyada xristianlığı da suriyalı legionerlər yaymışdılar) sözündən olması ehtimal olunur. Mərəzə r-nu ərazisində Dirbaba türbəsi mövcuddur. Şirvan-Abşeron memarlığına aid edilən türbə Dirbaba piri də adlanır. Türbə 1402-ci ildə qayada oyulmuş mağarada əhəngdaşından tikilmişdir. Xalqın dilində bu türbə ilə bağlı müxtəlif rəvayətlər gəzir. Dirdağ və Dirbaba oronimləri sinonim toponimlərdir.



**Disər** *oyk., sadə.* Ordubad r-nunun Vənənd i.ə.v.-də kənd. Vənənd çayı sahilində, Zəngəzur silsiləsinin ətəyindədir. Kəndin adı onun ş.-ində bir-birinə yaxın 300 m hündürlükdə olan və Disər adlanan iki kiçik dağın adından yaranmışdır. Oronim isə İran dillərindəki *di/do* (iki) və *sər* (baş, zirvə) sözlərindən düzəlib, "iki baş, iki zirvə" deməkdir.

**Divağac** *oyk., mür.* Lerik r-nunun Qosmalyan i.ə.v.-də kənd. Əsl adı Dibağacdır. Oykonim *dib* (ətək, dağın aşağı hissəsi) və *ağac* (meşə, ağaclıq) komponentlərindən düzəlib, "dağ ətəyində meşə" deməkdir.

**Divanlı** *oyk., sadə.* Bərdə r-nunun Güloğlular i.ə.v.-də kənd. Qarabağ düzündədir. Etnotoponimdir. Oykonim türkdilli *duvanlı* tayfasının adı ilə bağlıdır.

**Divanalılar** *oyk., sadə.* Füzuli r-nunun Qacar i.ə.v.-də kənd. Qarabağ silsiləsinin ətəyindədir. Etnotoponimdir. Qacarların *divanəlilər* tirəsinin adını əks etdirir.

**Divaşi** *or., mür.* Astara r-nunda dağ. Talış silsiləsinin zirvəsidir. Hün. 2013 m. Təngərud çayı hövzəsində qədim vulkanik günbəzvarı dağdır. Ehtimal etmək olar ki, Dibaşil oroniminin variantıdır.

**Diyallı** *oyk., mür.* İsmayıllı r-nunun eyniadlı i.ə.v.-də kənd. Niyaldağ silsiləsinin ətəyindədir. Oykonim *di* (tat. "iki") və *yal* (dağ beli) komponentlərindən ibarət olub, "iki yallı yerdə salınan kənd" mənasındadır. Kənd həqiqətən də iki qoşa zirvəsi olan dağın ətəyindədir. Cənubi Azərb. ərazisində də eyniadlı yer və vadi qeydə alınmışdır.

**Diyallı** *hidr., sadə.* İsmayıllı r-nunun Diyallı kəndindən 1 km şm.-q.-də min. bulaq. Suyu soyuq, dadı acı-şordur. Bulaq öz adını ərazisində yerləşdiyi yaşayış məntəqəsinin adından almışdır.

**Dizavar** *hidr., sadə.* Abşeron r-nu ərazisində çay. Tuğ çayının sağ qolu olub Sumqayıt ərazisindən axır. Dızevar, Dızabar variantlarında da qeydə alınmışdır. Tədqiqatçılar çayın adını Xızı yaxınlığında mövcud olmuş və VII əsrdə ərəblərin dağıtdığı qədim Dizəvar qalasının adı ilə bağlayırlar. Toponim *diza* (qədim İran dillərində "qala") və *var* (yer, məskən) sözlərindən ibarət olub, "qala kənd" mənasındadır.

**Dizaxlı** *oyk., düz.* Qəbələ r-nunun eyniadlı i.ə.v.-də kənd. Alazan-Əyriçay çökəkliyindədir. Oykonim ilk dəfə Cəfərqulu xan Xoylunun 1806-cı ilə aid fərmanında qeydə alınıb. Dizaq/Dizak Qarabağın qədim əyalətlərindən birinin adı olmuşdur. N.Gəncəvinin əsərlərində Dızaknak kimi xatırlanır. Orta Asiya ərazisində də Dizak (Cizak) adlı şəhər var. Oykonim "Dizak mahalından çıxanlar, dizaqlılar məskunlaşan kənd" mənasındadır.

**Dizdoni** *or., mür.* Lerik r-nu ərazisində dağ. Alaşar-Burovar silsiləsinin q. yamacında zirvədir. Hün. 1058 m. Tədqiqatçıların fikrincə, oronim *dızd/dızd* (oğrun, gizli) və *honi* (bulaq) komponentlərindən əmələ gəlib, "gizli bulaq" mənasındadır. Bu izah dağın ətəyindəki bulağın yerini tez-tez dəyişməsi, itib yenidən üzə çıxması ilə əlaqələndirilir.

**Dizə** *oyk., sadə.* 1. Culfa r-nunun Yaycı i.ə.v.-də kənd. Düzənlikdədir. Keçmiş adı Kərimqulu Dizə olmuşdur; 2. Ordubad r-nunun Vənənd i.ə.v.-də kənd. Zəngəzur silsiləsinin ətəyindədir. Keçmiş adı Cəfərxan Dizəsi olmuşdur; 3. Şərur r-nunun Cəlilkənd i.ə.v.-də kənd. Arpa çayının sahilində, Şərur düzündədir. Vaxtilə Baş Dizə, Kələntər Dizə, Qoşa Dizə, Kərimqulu Dizə, Oruc Dizə coğrafi adlarının əsasını təşkil edən *dizə* sözü qədim İran dillərində "divar, hasar", "möhkəmləndirilmiş şəhər", "qala divarı", "qala", "istehkam" mənalarında, bir sıra türk dillərinə, o cümlədən Azərb. dilinə keçərək "kənd" mənasında işlənir. Oykonimlərə əlavə edilən *baş*, *Kələntər*, *qoşa*, *Kərimqulu*, *Oruc* və s. komponentlər həmin yaşayış məntəqələrini bir-birindən fərqləndirməyə, coğrafi mövqelərini müəyyənləşdirməyə və vaxtilə kimə mənsub olduğunu göstərməyə xidmət edir.

**Dizədağ** *or., mür.* Kəlbəcər r-nu ərazisində dağ. İstisu qəsəbəsinin c.-ş.-indədir. Dizədağ oroniminin qismən təhrifə uğramış

formasıdır Oronim *dizə* (fars "qala") və *dağ* sözlərindən düzəlib, "qala dağ, qalası olan dağ" mənasındadır

**Dodustarı** *or., mür* Lənkəran r-nunda dağ. Alaşar-Burovar silsiləsinin c.-ş. qurtaracağında zirvədir Hün 492 m Oronim talış dilindəki *dodo* (yüksək, böyük) və azərb dilindəki *üstləri* sözünün yerli tələffüz forması olan *ustarı* komponentlərindən düzəlib, "dağların başı, üstü, zirvəsi" mənasında olduğunu ehtimal etmək olar

**Doquzul** *or., mür* Qusar r-nunda sıra dağlar Baş Qafqaz silsiləsinin Tufandağ zirvəsindən ayrılıb Qusar və Qudyal çaylarının suayrıcını əmələ gətirir Oronim avar dilindəki *tohruzul* sözündən olub, "zirvə, baş" deməkdir

**Dolanay** *or., sadə* Şərur r-nu ərazisində dağ Tədqiqatçılar oronimi "dolanbac, dolama, əyri-üyrü" mənasında izah edirlər Oronim dağın relyef quruluşunu təyin edir Etnotoponim olması da mümkündür

**Dolanlar** *oyk., sadə* Xocavənd r-nunun eyniadlı i.ə.v.-də kənd Qarabağ silsiləsinin yamacındadır Keçmiş adı Ərgünəş (Argünəş) olmuşdur. Kənd 1828-ci ildən sonra Cənubi Azərb.-dan köçüb gəlmiş ailələrin Ərgünəş adlı yerdə məskunlaşması nəticəsində yaranmışdır Ərgünəş ərazidəki dağın adıdır Dolanlar oykonimi etnotoponim olub, XIII əsrdə monqol işğallarında iştirak etmiş *dolon* tayfasının adını əks etdirir Bu tayfanın adı qırğızlar və özbəklər arasında da yayılmışdır

**Dolanlarçay** *hidr., mür* Xocavənd və Cəbrayıl r-nları arasında çay Hidronim *Dolanlar* (etnotoponim) və *çay* (su hövzəsi) komponentlərindən düzəlib, ərazisindən axdığı Dolanlar kəndinin adı ilə bağlıdır

**Dolu** *oyk., sadə* Astara r-nunun Pelikəş i.ə.v.-də kənd Dağətəyi ərazidədir Yerli əhalinin dilində Dolev adlanır Tədqiqatçılar oykonimi "zəminin hündür yerindən su axıtmaq üçün açılan yer" kimi izah edirlər, *doliv* sözü ilə əlaqələndirərək "ağac yarpağı" mənasında izah edənlər də var

**Dombabinə** *oyk., mür* Zaqatala r-nunun Əli Bayramlı i.ə.v.-də kənd Alazan-Əyriçay çökəkliyindədir Oykonim *dımba* (əyri, təpə, qövsvarı relyef forması) və *binə* (yaşayış məntəqəsi) komponentlərindən düzəlib, "qövsvarı relyef formasına malik olan yaşayış məntəqəsi" mənasındadır

**Domı** *hidr., sadə.* Xocavənd r-nu ərazisində çay Allı çayının sağ qoludur Suvarma üçün istifadə edilir. Azərbaycan dilinin qərb qrupu dialektlərində *domıldomu* "qısa, gödəkboy", "əyri, qozbel" mənalarında işlənir

**Domı** *oyk., sadə* Xocavənd r-nunun eyniadlı i.ə.v.-də kənd Ərazisindən axdığı eyniadlı çayın əyildiyi, burulduğu yerdə yerləşdiyi üçün yaşayış məntəqəsi bu adı almışdır

**Dondar Quşçu** *oyk., mür* Tovuz r-nunun eyniadlı i.ə.v.-də kənd Gəncə-Qazax düzənliyindədir 1968-ci ilədək r-nun ərazisində Dondar Azaflı adlı yaşayış məntəqəsinin olması məlumdur Oykonim *Dondar* (etnotoponim) və *Quşçu* (etnotoponim) komponentlərindən düzəlib, ərazidəki Quşçu adlı kəndlərı bir-birindən fərqləndirmək məqsədilə belə adlandırılmışdır

**Dondarlı** *oyk., sadə.* 1 Qubadlı r-nunun eyniadlı i.ə.v.-də kənd Bərgüşad çayının (Bazarçay) sahilində, Bərgüşad silsiləsinin ətəyindədir, 2 Tovuz r-nunun Sarıtala i.ə.v.-də kənd Dağətəyi ərazidədir Oykonim qədim türkdilli *dondar* tayfasının adı ilə bağlıdır Qədim yunan müəlliflərinin məlumatına əsasən, dondarlar Şimali Qafqaz çöllərində, Azov dənizi sahillərində yaşamışlar Sonrakı mənbələrdə dondarların Kuban çöllərində məskən salmaları haqqında məlumat verilir Tədqiqatçıların ehtimalına görə, dondarlar hunların tərkibində Albaniyaya gələrək orada məskunlaşmışlar "Kitabi-Dədə Qorqud" dastanlarında personajlardan birinin adı Doli Dondardır Qazax r-nunda Dondardağı, Qubadlı r-nunda Dondardərə oronimləri də bu etnonimlə bağlıdır Türkmənistan, Özbəkistan, Qazaxıstan, Türkiyə toponimiyasında da bu etnonimlə bağlı coğrafi adlara təsadüf olunur Udmurt MR-in Qlazov r-nunda X-XII əsrlərə aid edilən şəhər xarabalığı da Dondikar adlanır

**Donuzüton** *hidr., sadə* Masallı r-nu ərazisində mın bulaqlar Viləş çayının sağ sahilində yerləşən 22 kükürdlü bulaqdan ibarətdir Tədqiqatçıların ehtimalına görə, hidronim keçmişdə isti bulaqlardan birinə çöl donuzunun (qabanın) düşüb ütülməsi ilə əlaqədar yaranmışdır Əslində, hidronim bulaq suyunun hərarətinin yüksəkliyini bildirir Tədqiqatçıların məlumatına görə, Azərb ərazisində donuz komponentli oronimlərin sayı 300-dən artıqdır





**Dəərçibal** *or., mür* Balakən r-nu ərazisində dağ Baş Qafqaz silsiləsinin c. yamacında, Balakən və Katex çaylarının suayrıcında yerləşir Hün 2041 m Dərcabala variantında da qeydə alınmışdır Azərb. dilinin dialektlərində *dər* "yuxarı baş", "dudkeş", *dərbaldərcabala* "camışın ikiillik balası" mənalarında işlənir Bütün hallarda oronim "yuxarı baş, zirvə" mənası ilə bağlıdır

**Dəstəli** *oyk., sadə* Cəlilabad r-nunun Bayxanlı i.ə.v.-də kənd Dağətəyi ərazidədir Oronim yaşayış məntəqəsinin əsasını qoymuş *dəstəli* nəslinin adı ilə bağlıdır Etnotoponimdir

**Dostluq** *oyk., sadə.* Xaçmaz r-nunun Müqtədir i.ə.v.-də qəsəbə. Samur-Dəvəçi ovalığındadır 1965-ci ildə 6 nömrəli balıq vətəgəsi yanında salınmış və rəmzi olaraq belə adlandırılmışdır

**Dəstubozu** *or., mür* Sumqayıt şəhəri ərazisində dağ Sumqayıt çayından sağdadır Hün 473 m Tədqiqatçılar oronimi *Dostu* (şəxs adı) və *bozı* (təpə) sözlərinin birləşməsi hesab edir. "Dostu təpəsi" kimi izah edirlər Dilimizdə coğrafi termin kimi "bitkisiz sahə, yovşanlıq, boş görünən yer" mənasında *boz* sözü də işlənməkdədir

**Dəşulu** *oyk., düz* Cəbrayıl r-nunun Balyand i.ə.v.-də kənd Dağətəyi ərazidədir Yerli əhalinin verdiyi məlumata görə, vaxtilə Cənubi Azərb.-dan gəlmiş Dəşu və Şəyboy adlı iki qardaş burada məskunlaşaraq indiki Dəşulu və Şəyboy yaşayış məntəqələrinin əsasını qoymuşlar Oykonim *Dəşu* (ş.a.) və *-lu* (mənsub şək.-ci) komponentlərindən düzəlib, "Dəşuya məxsus kənd, dəşulular" deməkdir

**Dovralı** *oyk., düz* Daşkəsən r-nunun Qabaqtəpə i.ə.v.-də kənd Qabaqtəpə çayının sahilində, dağətəyi ərazidədir Azərb dilinin qərb qrupu dialektlərində *dovraltovraltövrə* sözləri "təpə", "yuxarı", "baş" mənalarında işlənir Oykonim "təpəli" mənasında olub Qabaqtəpə coğrafi adı ilə bağlıdır

**Dovşanlı** *oyk., sadə* Kəlbəcər r-nunun eyniadlı i.ə.v.-də kənd Xaçın çayının sahilində, Qarabağ silsiləsinin ətəyindədir XIX əsrdə bu kənddə yerləşmiş ermənilər onun adını dəyişib Araçadzor (ayı dərəsi) kimi rəsmiləşdirmişdilər 1917-ci ildə Dovşanlı altı qışlağı olan böyük kənd kimi qeydə alınmışdır Güman etmək olar ki, bu coğrafi ad *dovşanlı* nəslinin adı ilə bağlı olub, etnotoponimdir 1992-ci ildə kəndin keçmiş adı yenidən bərpa edildi *Dovşan* komponentli coğrafi adlar ümumtürk toponimiyasında, o cümlədən Qafqazda geniş yayılmışdır Dovşan dağı (Qəbələ), Dovşan düzü (Şəki r-nunun Orta Zəyzit kəndi), Dovşan dərəsi (Qəbələ, Zəngilan, Laçın və Masallı), Dovşan yaylağı (Ağsu), Dovşan təpəsi (Abşeron, İmişli, Gədəbəy), Dovşanlı (Türkiyə), Dovşanlı (Ermənistan) və s

**Dozular** *oyk., sadə* Xanlar r-nunun Çaylı i.ə.v.-də kənd Kürəkçayın sahilində, dağətəyi ərazidədir Keçmiş adı Birgöz Dozular olmuşdur XIX əsrə aid sənədlərdə Yelizavetpol (Gəncə) qəzasında *birgözdozular* adlı maldar elatın adı çəkilir Oykonim mənşəcə səfulu tayfasının tirələrindən biri olan *dozuların* adını əks etdirir

**Dönük Qırıqlı** *oyk., mür* Tovuz r-nunun eyniadlı i.ə.v.-də kənd Gəncə-Qazax düzənliyindədir Yerli əhalinin verdiyi məlumata görə, yaşayış məntəqəsini XVIII əsrin axırlarında Düz Qırıqlı kəndindən köçüb gəlmiş ailələr salmışlar Oronimin ikinci komponenti (*qırıqlı*) oğuz tayfalarından birinin adı ilə bağlıdır *Dönük* komponenti isə düz sözünün qarşılığı kimi "əks tərəf" və ya qədim dilimizin dil vahidi olan *tanuq* sözünün ifadə etdiyi "dik" mənası ilə əlaqədardır 1917-ci ildə həmin komponent Danuk variantında qeydə alınmışdır

**Dördçinar** *oyk., sadə* Füzuli r-nunun Horadiz i.ə.v.-də kənd Köndələnçayın sahilində, düzənlikdədir Kənd əvvəllər dörd uca çinar ağacı olan ərazidə salındığı üçün belə adlandırılmışdır 1917-ci ildə r-nun ərazisində Dördçinar Quzey və Dördçinar Üngütlü adlı iki yaşayış məntəqəsi qeydə alınmışdır

**Dördlər** *oyk., sadə* 1 Gədəbəy r-nunun İsalı i.ə.v.-də kənd Axınca çayının sahilində,

Şahdağ silsiləsinin ətəyindədir Yerli əhalinin verdiyi məlumata görə, yaşayış məntəqəsi dörd qardaşa (Sadıq bəy, Cəlal bəy, Alı bəy, Əmiraslan ağa) məxsus ailələrin məskunlaşması nəticəsində yarandığından belə adlandırılmışdır; 2 Neftçala r-nunun Xolqarabucaq i ə v -də kənd. Salyan düzündədir; 3 Neftçala r-nunun Boyat i ə v -də kənd. Salyan düzündədir XIX əsrdə Xolqarabucaq kəndindən çıxmış bir qrup ailənin həmin kəndə məxsus pay torpağında məskunlaşması nəticəsində yaranmışdır Məskunlaşmış ailələr Mehdi, Zeynal, Kəlbəli Nəcəf və Xansuvar adlı dörd qardaşa məxsus olduğuna görə yaşayış məntəqəsi belə adlandırılmışdır Oykonimin etnotoponim olması da mümkündür Tatarıstanda Dürt Öylə, Krımda Dört, Dört Sakal və b coğrafi adlar qeydə alınmışdır

**Dördtəpə** *or , mür* Ağdam r-nunun Cavahirli kəndi yaxınlığında yüksəklik Hün 301 m Dağ onu əhatə edən təpələrin sayına görə Dördtəpə adlandırılmışdır

**Dördüncü Barak** *oyk., mür* Ağcabədi r-nu ərazisində kənd Yuxarı Qarabağ kanalından bır qədər aralı, Mil düzündədir Oykonim *dördüncü* və *barak* (taxtadan tikilmiş ev) komponentlərindən düzəlib Sovet hakimiyyəti illərində yaranmış Qırmızı Budka tipli oykonimlərdəndir

**Dövlətəlibəyli** *oyk , düz* Cəlilabad r-nunun Kürdlər i ə v -də kənd Dağətəyi ərazidədir Yaşayış məntəqəsini XIX əsrdə maldarlıqla məşğul olmuş, sahibkar *Dövlətəli* bəyə məxsus ailələr saldıqları üçün belə adlandırılmışdır "Dövlətəlibəyə məxsus olanlar" deməkdir

**Dövlətyarlı** *oyk , sadə* Füzuli r-nunun eyniadlı i ə v -də kənd Köndələnçayın (Arazın sol qolu) sahilində, Qarabağ silsiləsinin ətəyindədir Kəndi *dövlətyarlı* nəslindən olan ailələr saldığı üçün belə adlandırılmışdır Etnotoponimdir

**Drmbon** b a x Heyvalı

**Dulyamçay** *hidr , mür* Masallı r-nu ərazisində çay Dülyam hidroniminin variantıdır Hidronim *Dülyam* dağının adından və *çay* komponentindən düzəlmişdir

**Dunay** *oyk , sadə* Xaçmaz r-nunun Nabran i ə v -də kənd Avropanın ikinci böyük çayı olan Dunay çayının adı ilə adlandırılmışdır Coğrafi ad Sovet hakimiyyəti illərində rəmzi olaraq verilmiş adlardan olub, 1960-cı illərdən məlumdur Bəzən Duray variantında da qeydə alınmışdır

**Durandağ** *or , mür* Qobustanda dağ Pirsaat çayının aşağı axarından solda yerləşir Hün. 308 m *Duran* (dik) və *dağ* (müsbət relyef forması) komponentlərindən düzəlmiş bu oronim toponimiyadakı Dıkdaş oronimlərinin sinonimidir

**Durqan** *oyk., sadə* Lerik r-nunun Şingədulan i ə v -də kənd Alaşa çayının sahilində, Burovar silsiləsinin ətəyindədir Bəzi tədqiqatçılar bu oykonimi Düğon toponimının təhrif forması hesab edir, *düğ* (Zərdüşt dininin təriqət davamçılarına verilən ad) və *on* (cəmlik bildirən şək ) komponentlərinə ayıraraq izah edirlər Əslində, bu coğrafi ad həmin ərazi üçün yad olmayan *dolan/dulan* tayfa adı ilə bağlı etnotoponimdir

**Durovdağ** *or mür* Cənub-Şərqi Şirvan düzünün c hissəsində fəaliyyətdə olan palçıq vulkanıdır Hün 30 m Oronim *durov* (dibinə palçıq çökmüş) və *dağ* (müsbət relyef forması) komponentlərindən düzəlib, "dibinə palçıq çökmüş, ətəyinə palçıq axmış dağ" mənasındadır

**Durubahar** *or , sadə* Kəlbəcər r-nunda dağ Dağın ətəklərində çox vaxt gül-çiçək olduğu üçün, "təmiz bahar, yaz" mənalı bu adı almışdır.

**Duruca** *hidr , düz* 1 Qəbələ r-nu ərazisində çay Dəmiraparan çayının sağ qoludur Suvarma üçün istifadə edilir Hidronim Duruğa variantında da qeydə alınmışdır; 2 Şəki r-nu ərazisində çay Əyriçayın sağ qoludur. 3 Qax r-nu ərazisində çay *Duru* (saf, şəffaf) və *-ca* (şiddətləndirmə bildirir) komponentlərindən düzələn bu hidronim "suyu şəffaf olan çay" mənasındadır

**Duruca** *or sadə* Oğuz r-nu ərazisində dağ Oronim ərazisindən axan Duruca çayının adı ilə adlandırılmışdır Durucaçay variantında da qeydə alınmışdır

**Duvannı** *or sadə* Xəzər dənizində, Bakı arxipelaqında ada Səngəçal burnundan ş -dədir Vulkan mənşəli yüksəkliyin hündürlüyü 45 m -dir Zənbil adası da adlanır





Oronim orta əsrlərdə qıpçaqların tərkibində Azərb -na gəlmiş türkdilli *duvan* tayfasının adını əks etdirir İndiki Qobustan qəsəbəsinin adı da əvvəllər Duvannı (Duvanlı) olmuşdur Etnonim Qərbi Sibir, Monqolustan, Altay, Qazaxıstan, Qırğızıstan, Özbəkistan, Krım toponimiyasında çox geniş arealda yayılmışdır

**Duvannı** b a x. Qobustan

**Duvaryan** *oyk , mür* İsmayıllı r-nunun Axan i ə v -də kənd Girdiman çayının sahilində, Qabandağın şm -q hissəsindədir Oronim tat dilindəki *duvar* (yoxuş, yamac) və *-an* (yer) komponentlərindən düzəlib, "yoxuşlu yer, maili yer" mənasındadır Coğrafi ad obyektin relyefi haqqında məlumat verır

**Duzan** *or , sadə* Şamaxı r-nu ərazisində dağ. Qozluçayla Çigil çayının suayrıcısıdır Hün 1238 m Əsl adı Böyük Düzəndağıdır Dağa səthi düz, hamar olduğuna görə belə ad verilmişdir

**Duzdağ** *or , mür* 1. Babək r-nu ərazisində dağ. Zəngəzur silsiləsinin dağətəklərində yerləşir Hün 1173 m Bu dağda böyük duz yataqları var Arxeoloji materiallar burada hələ e ə 1 minilliyin əvvəllərində duz çıxarıldığını göstərir Dağın adı buradakı duz yataqları ilə əlaqədar yaranmışdır; 2 Salyan r-nu ərazisində püskürən palçıq vulkanı Kür çayının sağ sahilindədir Hün 12 m Adını ərazidəki eyniadlı göldən almışdır; 3 Yevlax r-nu ərazisində dağ Bir neçə alçaq, hamar, çox aşınmış yüksəklikdədir Hün 275 m Bəzi ədəbiyyatlarda Düzdağ variantında verilmişdir Dağın ətrafı dümağ şoran torpaqdır Yerli əhalinin verdiyi məlumata görə, keçmişdə həmin torpağın şoran üzünü yığır və xüsusi üsulla duz əldə edirdilər Buna görə də dağ Duzdağ adlandırılmışdır

**Duzdağ** *oyk , sadə* Yevlax r-nunun Nemətabad i ə v -də qəsəbə Düzənlikdədir 1924-cü ildə salınmış bu qəsəbədəki ilk müvəqqəti evlər neft kəşfiyyatı dəstəsinə məxsus olmuşdur Sonralar burada yerləşən 8 nömrəli sovxozun malikanəsi əsasında abad yaşayış məntəqəsi yaranmışdır 1965-ci ildən qəsəbə yaxınlığındakı Duzdağın adı ilə adlandırılmışdır

**Duzdağ** *hidr düz* Salyan r-nu ərazisində şor göl Gölün ətrafı ağ şoran torpaq örtüyündən ibarətdir *Duzdağ* "duzlu, duzlaq, şor" mənalı *Duzlaq* coğrafi adının yerli tələffüz formasıdır

**Duzluaxmaz** *hidr , mür* Ağdaş r-nunun c -unda axarı olmayan göldür Hidronim *duzlu* (şor sulu) və *axmaz* (axarı olmayan göl) komponentlərindən düzəlib, "suyu şor axarsız göl" deməkdir

**Dübəndi** *oyk , mür* Bakı şəhəri Əzizbəyov r-nunun Zirə qəsəbə i ə v -də qəsəbə Keçmiş adı Təkqışlaq olmuşdur Adını ərazidəki eyniadlı yerdən almışdır Oykonim tat dilindəki *dü* (iki) və *bəndi* (sədd, bağlanmış yer, qarşısı alınmış yer) komponentlərindən düzəlib, "iki sədd" deməkdir

**Dübir** *hidr , mür* Lerik r-nu ərazisində çay Lənkəran çayının sağ qoludur Hidronim talış dilindəki *dü* (iki) və *bir* (kəsik, yarıq) sözlərindən düzəlib, "iki yatağı olan çay" mənasındadır

**Dübrar** *or , mür* Xızı r-nunun Altıağac kəndinin şm -q hissəsində, Baş Qafqaz silsiləsinin iki çıxıntıdan ibarət zirvəsidir Hün 2209 m Bu zirvə ş -ə doğru getdikcə qollara ayrılır. Oronim tat dilindəki *dü* (iki) və *brar* (qardaş) sözlərindən düzəlib, "iki qardaş" mənasındadır Zirvənin qoşa çıxıntısı bir-birinə bənzədiyi üçün belə adlandırılmışdır

**Dübrar** *hidr , sadə* Xızı r-nu ərazisində çay Qızılçayın sağ qoludur Çay öz adını ərazisindən axdığı Dübrar dağından almışdır

**Düdəngə** *oyk , mür* Şərur r-nunun Cəlilkənd i ə v -də kənd Arazboyu düzənlikdədir Oykonim İran dillərindəki *dü* (iki) və *dangə* (məhəllə, şəhərin hissəsi) sözlərindən düzəlib, "iki məhəlləli kənd" mənasındadır

**Düdükçü** *oyk sadə* Xocavənd r-nunun Edilli i ə v -də kənd Qarabağ silsiləsinin ətəyindədir Keçmiş adı Kolatağ olmuşdur Yerli əhalinin verdiyi məlumata görə, yaşayış məntəqəsində *düdükçü* nəslinə mənsub ailələr məskunlaşdığı üçün belə adlandırılmışdır

**Dükanlar** *oyk , sadə* Şuşa r-nunun Xəlfəli i ə v -də kənd Dağlıq ərazidədir Yerli əhalinin verdiyi məlumata görə, vaxtilə yaşayış məntəqəsində bir neçə dükan olduğu üçün belə adlandırılmışdır

**Düldül** *or sadə* Şəmkir r-nu ərazisində dağ Hün 975 m Dağın adı oradakı at aya-

ğının izinə oxşayan daşla və həmin daşın guya Həzrət Əlinin Düldül atının izi olması inamı ilə əlaqədardır

**Dülyam** *or., mür.* Lerik r-nu ərazisində dağ. Oronim talış dilindəki *dü* (iki) və *lyam* (yaylaq) komponentlərindən düzəlib, "iki yaylaq" mənasındadır

**Dünyamalılar** *oyk., sadə.* Beyləqan r-nunun eyniadlı i.ə.v.-də kənd. Mil düzündədir. Yaşayış məntəqəsi Mil düzündə yayılmış xələc tayfasının *dünyamalılar* nəslinin məskunlaşması nəticəsində yaranmışdır. Kəndin keçmiş adı da Xələc olmuşdur

**Dürriyə** *oyk., mür.* Astara r-nunun Pəlikəş i.ə.v.-də kənd. Dağətəyi ərazidədir. Talışca Dırıyə kimi tələffüz olunur. Tədqiqatçıların fikrincə, bu oykonim talış dilindəki dü/dı (iki) və rıyə (yol, cığır) sözlərindən ibarət olub, "iki yol ayrıcında salınmış kənd" mənasındadır

**Düyərli** *oyk., sadə.* 1. Tərtər r-nunun Səhləabad i.ə.v.-də kənd. Qarabağ düzündədir; 2. Şəmkir r-nunun eyniadlı i.ə.v.-də kənd. Zəyəm çayının (Kürün qolu) sahilində, Gəncə-Qazax düzənliyindədir. Oykonim oğuzların *dügər/düyər* tayfasının adını əks etdirir. Səlcuq oğuzlarının yürüşlərində fəal iştirak etmiş *düyərlərin* adı Türkiyə və Türkmənistan toponimiyasında da əks olunmuşdur

**Düylün** *oyk., mür.* Ordubad r-nunun Aza i.ə.v.-də kənd. Düylün çayının (Arazın qolu) sahilində, dağətəyi ərazidədir. XIX əsrin ortalarında burada Düylün və Düylündizə adlı iki kənd vardı. Düylündizə kəndi hazırda Dızə adı ilə mövcuddur. Tədqiqatçıların fikrincə, oykonim *dü* (fars "iki") və *Gilan* komponentlərindən ibarət olmalıdır. Ehtimal ki, kəndin əhalisi Gilandan gəlmədir. Ordubadın 20 km.-liyində Xarabagilan (yerli əhali Xarabacilan adlandırır) adlı xarabalıq var. Arazın sol qollarından biri Düylün, digəri Gilan adlanır

**Düylün** *hidr., sadə.* Ordubad r-nunda çay. Arazın sol qoludur. Mənbəyini Zəngəzur silsiləsinin c.-q. yamaclarından (2400 m. hündürlükdən) alır. Aşağı hissəsində suvarma üçün istifadə edilir. Düylün kəndinin yaxınlığından axdığı üçün belə adlandırılmışdır

**Düz Bilici** *oyk., mür.* Dəvəçi r-nunun eyniadlı i.ə.v.-də kənd. Dəvəçi çayının sahilində, Yan silsiləsinin (Böyük Qafqaz) ətəyindədir. Yaşayış məntəqəsi vaxtilə Quba xanı Fətəli xanın Qarabağdan köçürüb gətirdiyi kəngərlilərin *bilici* tayfasının məskunlaşdığı kəndlərdəndir. Kənd düzənlik sahədə yerləşdiyindən və eyniadlı digər kənd (Dağ Bilici) adından fərqləndirmək üçün belə adlandırılmışdır

**Düz Çırdaxan** *oyk., mür.* Tovuz r-nunun eyniadlı i.ə.v.-də kənd. Gəncə-Qazax düzənliyindədir. R-nun ərazisində Cırdaxan adlı iki kəndi fərqləndirmək üçün Əsrik çayının sahilindəki kənd Əsrik Cırdaxan, düzənlikdəki kənd isə Düz Cırdaxan adlandırılmışdır

**Düz Qırıqlı** *oyk., mür.* Tovuz r-nunun eyniadlı i.ə.v.-də kənd. Gəncə-Qazax düzənliyindədir. Oykonim *düz* və *Qırıqlı* (oğuz tayfalarından biri olan *qırıqların* adını əks etdirən etnotoponim) komponentlərindən düzəlib. Kənd düzənlikdə salındığına görə və Dönük Qırıqlı kəndindən fərqləndirmək məqsədilə belə adlandırılmışdır

**Düz Rəsullu** *oyk., mür.* Gədəbəy r-nunun Çay Rəsullu i.ə.v.-də kənd. Kiçik Qafqaz dağlarının şm. yamacındadır. Oykonim *düz* və *Rəsullu* (r-nun ərazisində məskunlaşmış rəsullu nəslinin adını əks etdirən etnotoponim) komponentlərindən düzəlib, "düzənlikdə salınmış Rəsullu kəndi" mənasındadır. Toponimin birinci komponenti kəndin relyefini təyin etməklə onu ərazidəki Çay Rəsullu kəndindən fərqləndirməyə xidmət edir

**Düzağa** *or., sadə.* Xocavənd r-nunun şm. hissəsində, Xocavənd və Xocalı r-nlarının sərhədi boyunca uzanan dağ silsiləsi. Ən hündür zirvəsi 1397 m.-dir. Oronimin Qarabağın qədim Dızaq mahalının adından olduğu ehtimal edilir

**Düzbilici** *hidr., sadə.* Salyan r-nu ərazisində min. bulaqlar. Düzbilici kəndindən c. və ş.-də iki qrup bulaqdır. Suyu soyuqdur. Hidronim eyniadlı kəndin adından yaranmışdır

**Düzdağ** *or., mür.* Şərur-nu ərazisində dağ. Dağın səthi hamar olduğu üçün bu adı almışdır





**Düzənlik** *oyk., sadə.* Salyan r-nunun Qaraçala i.ə.v.-də qəsəbə. Cənub-Şərqi Şirvan düzündədir. Yaşayış məntəqəsi 1 nömrəli sovxozun 6-cı şöbəsinin malikanəsi əsasında yaranmışdır. Qəsəbə düzənlik ərazidə yerləşdiyinə görə belə adlandırılmışdır

**Düzqışlaq** *oyk., mür.* Ağstafa r-nunun eyniadlı i.ə.v.-də kənd. Gəncə-Qazax düzənliyindədir. Keçmişdə Kor Xəlfəli də adlanırdı. Yaşayış məntəqəsi XIX əsrdə xəlfəli nəslinin Düzqışlaq adlı yerdə məskunlaşması nəticəsində yaranmışdır. Oykonim *düz* (düzənlik) və *qışlaq* komponentlərindən düzəlib, "düzənlikdə yerləşən qışlaq" mənasındadır və ərazidəki Köhnəqışlaq kəndindən fərqləndirmək məqsədilə belə adlandırılmışdır

**Düzyurd** *oyk., mür.* Gədəbəy r-nunun Dəyə Qarabulaq i.ə.v.-də kənd. Gədəbəy çayının sahilində, Başkənd-Dəstəfur çökəkliyindədir. Yaşayış məntəqəsini XX əsrin əvvəllərində həmin r-ndakı Gergər (əsli Qarqar) kəndindən köçüb gəlmiş huydumlu və qırtdanlı nəsillərinə mənsub ailələr *Düzyurd* adlı ərazidə salmışlar. Coğrafi ad obyekti relyef cəhətdən təyin edir

**Dzerjinovka** *oyk., sadə.* Şamaxı r-nunun eyniadlı i.ə.v.-də kənd. Dağətəyi ərazidədir. Keçmiş adı Cabanı olmuşdur. Kənd Cabanı yaylasının yamacında yerləşdiyi üçün belə adlandırılmışdı. XIX əsrin 30-cu illərində burada Rusiyadan gəlmə rus ailələri məskunlaşmış, rəsmən Nikolayevsk adlandırılsa da, yerli əhali arasında Rus Cabanısı kimi tanınmışdır. Sovet hakimiyyəti illərində dövlət və partiya xadimi F.E. Dzerjinskinin (1877-1926) şərəfinə belə adlandırılmışdır. Memorial toponimdir

# Ee

**Eçarə** *oyk., sadə* Cəlilabad r-nunun Kürdlər i.ə v.-də kənd. Burovar silsiləsinin şm.-ş. ətəyindədir. Tədqiqatçılar bu oykonimi "üzüaşağı yol" mənasında izah edirlər.

**Edilli** *oyk., sadə* Xocavənd r-nunun Edilli i.ə v.-də kənd. Qarabağ silsiləsinin c.-ş. ətəyindədir. Etnotoponimdir. Toponim qırğızların *edilli* tayfa adını özündə əks etdirir. Xəzərlərin üç paytaxt şəhərindən birinin adı İdil, Volqa çayının keçmiş adlarından biri İtil olmuşdur. Hal-hazırda Türkiyənin Qars əyalətində Edilli adlanan kənd mövcuddur.

**Edişə** *oyk., sadə* 1. Cəlilabad r-nunun Hovuzbulaq i.ə v.-də kənd. Burovar silsiləsinin ətəyindədir; 2. Xocavənd r-nunun Xocavənd i.ə v.-də kənd. Dağətəyi ərazidədir. Etnotoponimdir. Keçən əsrdə Şimali Qafqazda Edişe adlı dörd kənd qeydə alınmışdır. Edişə adlı tayfanın XII-XIII əsrlərdə qıpçaqların tərkibində Şimali Qafqazdan Azərb.-na gəlmələri ehtimal olunur. XIX əsrdə Qars əyalətində Edişə adlı yaşayış məntəqəsi olmuşdur. Gürcüstan ərazisindəki Edisə toponimi də bu etnonimlə bağlıdır.

**Egeryurd** *or., mür.* Kəlbəcər r-nu ərazisində dağ. Hün. 2167 m. Oronim haqqında tədqiqatçıların bir qismi xalq etimologiyasına əsaslanaraq belə ehtimal edirlər ki, dağ uzaqdan at yəhərinə oxşadığına görə Yəhərdağ adlanmış, rusdilli xəritələrdə isə təhrif olunaraq Eqeryurd kimi qeydə alınmışdır. Tədqiqatçıların digər qismi isə bu fikirdədir ki, toponim qədim türk dillərindəki *eqer* (yayda ev heyvanlarının saxlandığı düşərgə) və *yurd* komponentlərindən düzəlib, elatların yaylaq yurdları ilə bağlı yaranmış coğrafi addandır.

**Elabad** *oyk., mür.* Ağsu r-nunun Gürcüvan i.ə v.-də kənd. Gürcüvan platosundadır. Oykonim *el* və *abad* komponentlərindən düzəlib, "el yurdu" mənasındadır.

**Eldar** *or., düz.* Samux r-nu ərazisində dağ. Ellər adı ilə paralel işlənir. Mənası "elli, elləri olan" deməkdir. Acarıstanda Ellər, Ermənistanda Ellər, Elli coğrafi obyektləri qeydə alınmışdır.

**Eldarçöl** *or., mür.* Azərb.-da (Xanlar r-nu) və Gürcüstanda çöl. Mingəçevir su anbarından şm.-q.-də Qabırrı (İori) və Qanıx (Alazan) çaylarının aşağı axarında yerləşir. Q. hissəsi Gürcüstan ərazisinə daxildir. Qış otlaqları kimi istifadə edilir. Çöl öz adını ərazidəki eyniadlı dağdan almışdır.

**Eldəydaş** *or., mür.* Tərtər r-nu ərazisində dağ. Murovdağ silsiləsindədir. Hün. 2150 m. Elbəydaş variantında da qeydə alınmışdır. Tədqiqatçıların ehtimalına görə, dağ Elbəy adlı şəxsin yurd yeri olduğundan belə adlandırılmışdır. Oronim *el* (camaat, kökü bir nəsildən olan əhali qrupu, regional əhali), *-dək* (gəzdək, güzdək tipli terminlərdə olduğu kimi *-laq/-lıq* şəkilçisinə uyğundur) və *daş* (burada "dağ, qaya") komponentlərindən düzəlib, "elin cəmləşdiyi dağ", "yaylaq yurdu" mənasındadır. Qazaxıstanda Eltay, Krımda Eltok, Elteg toponimləri qeydə alınmışdır.

**Elgədik** *or., mür.* İsmayıllı r-nu ərazisində dağ. Oronim *el* (camaat) və *gədik* (hündür dağlar arasında yol, dağ keçidi, aşırım) komponentlərindən düzəlib, "dağlar arasından, aşırımdan keçən el yolu" və ya "el yolunun üstündə olan dağ keçidi" deməkdir.

**Ellicə** *or., düz.* Xocavənd r-nu ərazisində dağ. Tədqiqatçıların fikrincə, oronim qismən təhrifə uğramış Ellicə coğrafi adıdır. Keçmişdə burada maldarlıqla məşğul olmuş ellərə məxsus yaylaqlar yerləşdiyi üçün dağ belə adlandırılmışdır. Toponim *el* (camaat) *-li* (varlıq, mənsubluq bildirən şək.) və *-cə* (burada bolluq bildirir) komponentlərindən düzəlib, "ellərin yurdu", "ellərə aid yurd" mənasındadır.

**Elləroyuğu** *or., mür.* Tovuz r-nu ərazisində dağ. Ceyrançöldə, Kür və Qabırrı (İori) çayları arasındadır. Hün. 610 m. Tədqiqatçılara görə, oronim *Eldaroyuğu* adının təhrif olunmuş formasıdır. Dağ oradakı nadir eldar şamı ağacının bitməsi ilə məşhurdur. *Oyuq* komponentini tədqiqatçılar "sərhəddə qoyulmuş nişangah" mənasında izah edirlər. Dağ həqiqətən də Azərb.-la Gürcüstanın sərhədində təbiətin yaratdığı dik qoyulmuş nişangahdır.

**Elvar** *or., mür.* Xanlar r-nunda dağ. Gəncə çayından sağ tərəfdə yerləşir. Hün. 1251 m.





Keçmişdə yaylaq yeri olmuşdur. Oronim *el* (camaat) və *var* (burada "yer, məskən") sözlərindən düzəlib, "el-obanın məskəni", "elin cəm olduğu, yığıldığı yer" mənasındadır.

**Elyasalılar** *oyk., sadə* Kəlbəcər r-nunun Seyidlər i.ə v.-də kənd. Murovdağ silsiləsinin ətəyindədir. Yerli əhalinin dilində Ellazalılar variantında işlənən bu oykonim haqqında belə ehtimal edilir ki, Elyasalı (Ellazalı) adlı bir şəxs XIX əsrdə indiki Gədəbəy r-nunun Arıqdam kəndindən gələrək Güneydamı adlanan bu yerdə kəndin bünövrəsini qoymuşdur. Kənd də onun adı ilə adlanmışdır. 1917-ci ildə kəndin adı Ellazallar variantında qeydə alınmışdır. Qeyd edək ki, qazax tayfalarının içərisində *ellazalı* nəslinin adına təsadüf edilir. Gürcüstanın Bolnisi r-nunda keçmiş El kəndinin 1948-ci ildən adı Elias Sopeli adlanır. Oykonim bütün hallarda etnotoponimdir.

**Emir** *oyk., sadə* Gədəbəy r-nunun Poladlı i.ə v.-də kənd. Dağətəyi ərazidədir. Bəzən Əmir variantında qeydə alınmışdır. Oykonim *eymur* tayfasının adı ilə bağlıdır, etnotoponimdir.

**Engelskend** b.a x. İrmaşlı

**Enli** *or., düz.* Goranboy r-nu ərazisində dağ. Dağ üzərindəki fərqləndirici əlamətə görə belə adlandırılmışdır. Azərb. dilinin qərb qrupu dialektlərində *en* "nişan, marşır, işarə" mənasında işlənir və heyvanların qulaqlarına vurulan *damğaya* deyilir. Oronim "damğalı dağ" mənasındadır. Qazaxıstanda Enbek, Mari Respublikasının Şemurşen r-nunda Entnel toponimləri qeydə alınmışdır.

**Erkec/Erkeç** *oyk., sadə* Goranboy r-nunun eyniadlı i.ə v.-də kənd. Murovdağ silsiləsinin ətəyindədir. Tədqiqatçıların fikrincə, oykonim türk dillərindəki *erkeç/arxac* (dağın yamacı, ətəyi) sözünün fonetik şəkli olub, "dağ yamacında, arxacda salınmış kənd" mənasındadır. Azərb. dilinin dialektlərində sürünün qabağını çəkən yaşlı erkək keçiyə də *erkəç* deyilir.

**Erməni Borısı** b.a x. Borü

**Esurqi** *or., sadə* Dəvəçi r-nunda Gilgilçayın sağ sahilində zirvədir. Hün. 1420 m. Oronim, güman ki, dilimizin qədim dil vahidlərindən sayılan *esuruk/asrük* sözünün fonetik variantıdır və "qızğın, coşqun, azğın" mənalarındadır.

**Eşlə** *oyk., sadə* Lənkəran r-nunun Rvo i.ə v.-də kənd. Lənkəran çayının sahilində, Talış dağlarının ətəyindədir. 1917-ci ildə Aşla variantında qeydə alınmışdır. Tədqiqatçıların ehtimalına görə, *eşlə/aşlə* nəsil, tayfa adıdır.

**Eşşəkmeydan** *or., mür.* Zəngəzur silsiləsində dağ aşırımı. Azərb.-nın Ordubad r-nu ilə Ermənistanın Qacaran r-nu arasında sərhəd təşkil edir. Keçmişdə maldar elatların yaylaq kimi istifadə etdikləri aşırımın üstü meydanı xatırladan böyük hamar sahədən ibarətdir. Yerli əhalinin verdiyi məlumata görə, yaylağa gələnlərin qoşqu heyvanlarını əsasən eşşək təşkil etdiyi üçün aşırım belə adlandırılıb. Eşşəkləri adətən müəyyən müddətə burada dincə buraxardılar və həmin əraziyə də Eşşəkmeydanı deyərdilər. Oronim burada bitən *eşşəkotu* adlı yabanı bitki ilə də bağlı ola bilər.

**Etilər** *or., sadə* Quba r-nu ərazisində dağ. Əsl adının Yeddilər olduğu söylənilir. Deyilənlərə görə, dağ öz adını vaxtilə oradakı sitayış yeri olan Yeddilər pirinin adından almışdır.

**Evoğlu** *oyk., sadə* 1. Ağdam r-nunun Qaradağlı i.ə v.-də kənd. Qarabağ düzündədir; 2. Tərtər r-nunun eyniadlı i.ə v.-də kənd. Qarabağ düzündədir. Etnotoponimdir. Səlcuq oğuzlarının *iva/yivə* tayfa adından və etnonim yaradıcılığında iştirak edən *oğlu* (nəsli) komponentindən ibarətdir. 1823-cü ilə aid bir sənəddə yalnız Ağdam r-nundakı Evoğlu kəndinin adı çəkilir və bildirilir ki, bu nəsil Qaradağlı tayfasına mənsubdur. Qaradağlılar isə kəngərlilərin qaraxanlı tayfasının bir qoludur. Bu sənədə əsasən məlum olur ki, Tərtər r-nundakı Evoğlu kəndini sonralar Ağdamın eyniadlı kəndindən köçmüş ailələr salmışlar. Vaxtilə qızılbaşlar, sonralar isə şahsevən tayfa birləşməsinə daxil olan *evoğlular* Səfəvilər dövlətinin siyasi və ictimai həyatında müəyyən rol oynamışlar. Odur ki, hazırda Cənubi Azərb.-nın Xoy şəhristanında 32 kəndi əhatə edən Evoğlu dehistanı mövcuddur.

**Eymur** *oyk., sadə* Ağdaş r-nunun eyniadlı i.ə v.-də kənd. Kür çayının sahilində, Şirvan

düzündədir Oykonim türkdilli *eymur* tayfasının adı ilə bağlıdır Etnotoponimdir *Eymurlar* və ya *əmirlərlimirlər* XII əsrdə səlcuq yürüşlərində fəal iştirak etmiş, Səfəvilər dövlətinin ictimai və siyasi həyatında müəyyən rol oynamışlar Gədəbəy r-nunda yaşayan eymurların (əmirlərin) adı ilə bağlı Emir çayı, Emir kəndi, Emir Bozdağı və s. coğrafi adlara rast gəlmək mümkündür

**Eynallı** *oyk*, *sadə* Ağstafa r-nunun Köçəsgər i ə v -də kənd Həsənsu çayının sahilində, Gəncə-Qazax düzənliyindədir Oykonim *inallı* etnoniminin təhrif olunmuş formasıdır və özündə XII-XIII əsrlərdə Kiçik Asiyada yaranmış *inallı* (Səlcuq İbrahim İnalın adındandır) tayfasının adını əks etdirir Etnotoponimdir

**Eynəltaxta** *or*, *mür* Daşkəsən r-nu ərazisində dağ. Şahdağ silsiləsindən ayrılan qoldur Gəncə çayı ilə Dəstəfur çayının suayrıcındadır Yay otlaqları kimi istifadə olunur Beynəltaxta variantında da qeydə alınmışdır Tədqiqatçılar oronimi *Eynal* (ş a ) və *taxta* (dağlıq ərazidə düz yer) sözlərinin birləşməsi kimi "Eynalın yaylaq yurdu" mənasında izah edirlər Əslində, oronim *eynallı/inallı* tayfa adı ilə bağlı olub, "inallılara məxsus yaylaq yurdu" deməkdir. Etnotoponimdir

**Eynibulaq** *oyk*, *sadə* Siyəzən r-nunun Ağdaş i ə v -də kənd Samur-Dəvəçi ovalığındadır Kənd adını ərazidəki eyniadlı bulaqdan almışdır Hidronim isə *eyni* (ər "göz, çeşmə") və *bulaq* (azərb "çeşmə, qaynaq") komponentlərindən düzəlib, "gözlü bulaq" deməkdir

**Eyvazalılar** *oyk* *sadə* 1 Beyləqan r-nunun eyniadlı i ə v -də kənd Mil düzündədir, 2 Goranboy r-nunun Cinli Boluslu i ə v -də kənd Gəncə-Qazax düzənliyindədir Bəzi ədəbiyyatlarda səhvən Eyvazlılar variantında qeydə alınmışdır Yerli əhalinin məlumatına görə, yaşayış məntəqəsini XIX əsrin axırlarında indiki Qazax r-nunun ərazisindən gəlmiş Eyvazalı adlı şəxs saldığına görə belə adlandırılmışdır. Lakin qazax tayfalarının bir qolu olan *eyvazalılar* (yerli tələffüz formasında ayvazalılar) Qazax r-nunun Xanlıqlar kəndində bu gün də yaşamaqdadır Oykonim etnotoponim olub, *eyvazalılar* nəslinin adını əks etdirir 1933-cü ildə Qaradonlu (İmişli) r-nu ərazisində də Eyvazallar adlı kənd qeydə alınmışdır

**Eyvazxanbəyli** *oyk*, *sadə* Ağdam r-nunun Maqsudlu i ə v.-də kənd Dağətəyi ərazidədir 1835-ci ildə Ərəb Eyvazxan adı ilə qeydə alınmışdır *Eyvazxan* yerli bəylərdən Məmmədxanbəyin oğlu olmuşdur (hazırda kənddəki nəsillərdən biri məmmədxanbəyli adlanır) 1826-cı ildə İrana qaçan Eyvazxan sonralar geri qayıtmış və çar hökuməti ona məxsus olan Şelvə, Təməküt, Əlimməmməd kəndlərini, İsaq Pənah Sərkar köçünü yenidən özünə qaytarmışdı Bundan sonra kənd Eyvazxanbəyli ("Eyvazxan bəyə məxsus kənd" mənasında) adlandırılmışdır

**Eyvazkəsdi** *or*, *sadə* Masallı r-nunun ərazisində dağ Alaşar-Burovar silsiləsinin ş. yamacındadır Hün 485 m Dağın adını yaxınlıqdakı eyniadlı meşənin adı ilə bağlayan tədqiqatçıların ehtimalına görə, Eyvaz adlı bir şəxs meşəni kəsib təmizlədiyindən meşə belə adlandırılmışdır Əslində Eyvazkəsdi oronimi eyvazuşağı, eyvazoğulları etnoniminin sinonimi olan *eyvazkəsli* (*eyvazın* törəməsi) nəslinin adıdır Oronim etnotoponimdir

**Eyvazlı** *oyk*, *sadə* 1 Ağdam r-nunun Quzanlı i ə v -də kənd Düzənlikdədir, 2 Qubadlı r-nunun Novlu i ə v -də kənd Dağlıq ərazidədir Tədqiqatçılar bu oykonimləri oğuz tayfa ittifaqına daxil olan təklələrin (sonralar şahsevənlərin) tərkibinə daxil olmuş *eyvazlı* tirəsinin adı ilə bağlayırlar Etnotoponimdir Şərur r-nunun Tənənəm kəndində Eyvazlı məhəlləsi, Ağstafa r-nunun Saloğlu kəndində ayvazlı nəsli qeydə alınmışdır





# Əə

**Əbilcə** *oyk*, *düz* Qubadlı r-nunun Kavdadıq i ə v -də kənd Qara çayın sahilindədir Toponim *Əbil* şəxs adına *-cə* şəkilçisini əlavə etməklə yaranmışdır, "Əbilə məxsus yer" mənasındadır

**Əbilçay** *hidr*, *mür* Qusar r-nunda çay Hidronim *Əbil* (ş.a ) və *çay* (su hövzəsi) komponentlərindən düzəlib Xüsusi mülkiyyətçiliklə bağlı yaranan toponimlərdəndir

**Əbilyataq** *oyk*, *mür* Xaçmaz r-nunun Niyazoba i ə v -də kənd Samur-Dəvəçi ovalığındadır Quba r-nunun Giləzi kəndinə məxsus yataq olmuş, sonralar daimi yaşayış məskəninə çevrilmişdir Oykonim *Əbil* (ş a ) və *yataq* (mal-qaranın saxlanılması üçün müxtəlif tikililəri olan xüsusi sahə) sözlərinin birləşməsindən əmələ gəlmişdir

**Əbrəqunis** *oyk*, *mür* Culfa r-nunun eyniadlı i ə v -də kənd Əlincə çayının (Arazın qolu) sağ sahilində, Zəngəzur silsiləsinin şm.-q ətəyindədir Kənddə orta əsrlərə aid qəbiristan, kilsə, qəbiristanda XV-XVI əsrlərə aid daş qoç fiqurları var. Əbrəkənis variantında da qeydə alınmışdır Bəzi tədqiqatçılara görə, toponim fars dilindəki *bura* (qala, iç qala) və ərəb dilindəki *kunis* (*kənisə* sözündən təhrif olub, "məbəd, kilsə" mənasındadır) sözlərindən ibarətdir

**Əcəxur** *oyk*, *mür* Qusar r-nunun eyniadlı i ə v -də kənd Köpərçayın sahilində, dağətəyi ərazidədir Əcəhur variantında da qeydə alınmışdır Bəzi tədqiqatçılara görə, kənd ləzgi dilində *acə* (hündür) və *xur* (kənd) sözlərindən ibarət olub, "hündürlükdə olan kənd" mənasındadır Digər tədqiqatçılara görə, kənd şəxs adı ilə (Hacıxur) bağlıdır və yaşayış məntəqəsinin vaxtı ilə konkret olaraq hansı şəxsə mənsub olduğunu göstərir

**Əcəxuroba** *oyk*, *mür* Qusar r-nunun eyniadlı i ə v -də kənd Yan silsiləsinin ətəyindədir Əcəxur kəndinə məxsus oba yerində salınmışdır Oykonim "Əcəxur kəndinin obası" deməkdir

**Əcəldağ** *or*, *mür* Qəbələ r-nunda dağ Dağdan yaylaq kimi istifadə olunur Oronim burada baş vermiş bədbəxt hadisə ilə əlaqədar adlandırılmışdır

**Əcəmi** *oyk*, *sadə* Yevlax r-nunun Xaldan i ə v -də kənd Ər *əcəmi* "ərəb olmayan adam, iranlı" deməkdir Etnotoponimdir

**Ədilli** b a x Edilli.

**Əfəndilər** *oyk*, *sadə* 1 Cəbrayıl r-nunun Horovlu i ə v -də kənd. Düzənlikdədir Yaşayış məntəqəsi Qubadlı r-nunun *Əfəndilər* kəndindən ayrılmış seyidlər nəslinə mənsub ailələrin Kühülyataq adlı binə yerində məskunlaşması nəticəsində yaranmış və əvvəllər Kühülyataq da adlandırılmışdır; 2 Qubadlı r-nunun Həmzəli i ə v -də kənd Həkəri çayının sahilində, İncə düzündədir Keçmiş adı Türk Əfəndilər olmuşdur XIX əsrdə kəndin yaxınlığında Kürd Əfəndilər adlı kənd də mövcud olmuşdur Yerli əhalinin verdiyi məlumata görə, vaxtilə Türkiyədən gəlmiş Məmməd Əfəndi adlı bir nəfər bu kəndin bünövrəsini qoyduğuna görə onun adı ilə adlanmışdır Etnotoponimdir Bu nəslin nümayəndələrinə Qazax r-nu ərazisində də rast gəlmək olar.

**Əfətli** *oyk*, *sadə* Ağdam r-nunun eyniadlı i ə v -də kənd Qarqar çayının sol sahilindən 2 km aralı, Qarabağ düzündədir Keçmiş adı Məşədilər olmuşdur Kəndin adı *avatlı* tayfa adının təhrif olunmuş formasıdır XIX əsrdə r-nun ərazisində *əfətlilərin* adı ilə bağlı Əfətli Böyükbəy, Əfətli Müqəddəmbəy və Əfətli Əynyataq adlı üç yaşayış məntəqəsi qeydə alınmışdır

**Əhən** *oyk*, *sadə* İsmayıllı r-nunun eyniadlı i ə v -də kənd Niyaldağ silsiləsinin ş. ətəyində, Lahıc çökəkliyindədir Kəndin əhalisi Lahıc kəndindən çıxmış ailələrdən ibarətdir *Əhən* tat dilində "dəmir" deməkdir Tədqiqatçılar kəndin adını onun əhalisinin qədimdən dəmirçiliklə məşğul olması ilə əlaqələndirirlər

**Əhmədabad** *oyk* *mür* 1 Goranboy r-nunun Muzdurlar i ə v -də kənd Gəncə-Qazax düzənliyindədir Keçmiş adı Tatlar olmuşdur Yerli əhalinin verdiyi məlumata görə, Avazlı kəndində Həsən bəy və Məşədi Möhsün bəyə Cənubi Azərb -dan gəlib rəncbərlik edənlərə 1924-26-cı illərdə daimi məskunlaşmaq üçün torpaq sahəsi ayrılmışdı Bu tor-

paq sahəsində salınmış yeni yaşayış məntəqəsi həmin rəncbərlərdən biri olan Seyid Əhmədin adını daşıyırdı, 2 Sabirabad r-nunun eyniadlı i ə v -də kənd Muğan düzündədir; 3 Tovuz r-nunun Yanıqlı i ə v.-də kənd Çınqıldağ silsiləsinin ətəyindədir Oykonimlər "Əhmədin saldığı kənd, Əhmədə aid kənd" mənasındadır

**Əhmədağalı** *oyk*, *sadə* Ağdam r-nunun Qərvənd i ə v -də kənd Dağətəyi düzənlikdədir Keçmiş adı Əhmədağalı Muğanlı olmuşdur Kənd Xəlil, Saday və Əvəz adlı bəylərə məxsus olduğundan keçmişdə *Bəylik* də adlanmışdır *Əhmədağalı* həmin bəylərin mənsub olduğu nəslin adıdır.

**Əhmədalılar** *oyk*, *sadə* Füzuli r-nunun eyniadlı i ə v -də kənd Muğan düzündədir Etnotoponimdir Kəndin ərazisində Əhmədalılar türbəsi yerləşir

**Əhmədavar** *oyk*, *mür* Ağdam r-nunun Qasımlı i ə v -də kənd Dağətəyi düzənlikdədir Toponim *Əhməd* şəxs adına *var* topoformantını əlavə etməklə yaranmışdır (*-a* mənsubluq bildirir), "Əhmədə məxsus yurd" deməkdir

**Əhmədbəyli** *oyk* *düz* Füzuli r-nunun eyniadlı i ə v -də kənd Köndələnçayın (Araz çayının qolu) sol sahilində, düzənlikdədir Kənd *Əhməd* adlı bəyin adı ilə adlandırılmışdır

**Əhmədxan** *or*, *sadə* Şamaxı r-nunda dağ. Ləngəbiz silsiləsinin c -q -indədir Dağ keçmişdə *Əhmədxan* adlı şəxsin yaylağı olmuşdur Dağda Əhmədxan çadırı adlı yer də var

**Əhmədli** *oyk* *sadə* 1 Daşkəsən r-nunun Əmirvar i ə v -də kənd Murovdağ silsiləsinin ətəyindədir, 2 Daşkəsən r-nunun eyniadlı i ə v -də kənd Murovdağ silsiləsinin ətəyindədir Şahsevənlərin *əhmədli* tirəsinin adı ilə bağlıdır, 3 Beyləqan r-nunun eyniadlı i ə v -də kənd Mil düzündədir Şahsevənlərin *əhmədli* tirəsinə mənsub ailələrin məskunlaşması nəticəsində yaranmışdır, 4 Bakı şəhəri Xətai r-nunda ştq Abşeron yarımadasındadır 1936-cı ildə təşkil edilmişdir Tədqiqatçılara görə, XVIII əsrdə muğanlı tayfasının *əhmədli* tirəsinin Şorbulaq adlı yerdə məskunlaşması nəticəsində yaranmışdır, 5 Laçın r-nunun eyniadlı i ə v -də kənd Ağoğlan çayının (Həkəri çayının qolu) sahilində, Qarabağ yaylasındadır Keçmiş adı Molla Əhmədli olmuşdur Kənd XIX əsrin ikinci yarısında Varazğun yeri adlanan ərazidən buraya köçmüşdür. Kəndin adını *Molla Əhməd* şəxs adı ilə bağlayırlar; 6 Masallı r-nunun Təzə Alvadı i ə v -də kənd Lənkəran ovalığındadır Keçmiş adı Sultan Əhmədli olmuşdur Şahsevənlərin *əhmədli* tirəsinin adı ilə bağlıdır; 7 Şamaxı r-nunun Hacılı i.ə.v.-də kənd Pirsaat çayının sahilində, Çobançatladan dağının ş -indədir. XIX əsrdə salınmış olan bu kəndin adını *Əhməd* şəxs adı ilə bağlayırlar; 8 Şəmkir r-nunun Çardaqlı i ə v -də kənd Dağ yamacındadır Yaşayış məntəqəsi XIX əsrdə Şiştəpə kəndindən ayrılmış *əhmədli* nəslinə mənsub ailələr tərəfindən salınmışdır

**Əhmədli** *hidr*, *sadə* 1 Laçın r-nunun Əhmədli kəndi yaxınlığında min bulaq 1635-1655 m hündürlükdə, çoxdebitli 7 bulaqdan ibarətdir; 2 Laçın r-nunda çay Orta axarında Ağoğlan və ya Minkənd, aşağı axarında isə Zabux adlanır Etnotoponimdir

**Əhmədoba** *oyk* *mür* Xaçmaz r-nunun eyniadlı i ə v -də kənd Samur-Dəvəçi ovalığındadır Oykonim "Əhmədə məxsus oba" mənasındadır Oba sonralar daimi yaşayış məntəqəsinə çevrilmişdir

**Əxşam** *oyk*., *sadə* Yevlax r-nunun Havarlı i ə v -də kənd Şirvan düzündədir Əsl adı Axşamdır *Axşam* türkdilli xalqlarda "düşərgə, dayanacaq" deməkdir Ərəb dilində işlənən *axşam* sözü isə "köçəri tayfa, alaçıqda yaşayan tayfa" mənasındadır

**Əjdaha dağı** *or*, *mür* Şərur r-nunda dağ Mifozoonim əsasında formalaşmışdır

**Əjdaha qayası** *or*, *mür* Qubadlı və Kəlbəcər r-nlarında qaya Mifik varlığa oxşarlığına görə adlandırılıb

**Əjdaha yalı, Əjdaha kahası** *or* *mür* Laçın r-nunda yerləşən bu coğrafi obyektlərin adı mifozoonim əsasında yaranmışdır

**Əkbərməhlə** *oyk*, *mür* Astara r-nunun Asxanakəran i ə.v -də kənd Dağlıq ərazidədir Oykonim *Əkbər* (ş a ) və *məhəllə* (kəndin bir hissəsi) komponentlərindən düzəlib, "Əkbərə məxsus məhəllə, yer" deməkdir





**Əkinçi** *oyk*, *düz* Kürdəmir r-nunun Topalhəsənli i ə v -də qəsəbə. Şirvan düzündədir Sovet hakimiyyəti illərində salınmış bu qəsəbə Azərb -nın maarifçisi, təbiətşünas alimi H Zərdabinin (1842-1907) nəşr etdirdiyi "Əkinçi" qəzetinin (1875-77) şərəfinə adlandırılmışdır

**Ələhi** *oyk*, *düz* Ordubad r-nunun Bist i ə v -də kənd Zəngəzur silsiləsinin yamacındadır Tədqiqatçıların fikrincə, toponim qədim türk dillərində işlənən *əlik* (çökəklik) sözü ilə əlaqədar yaranmışdır və kəndin coğrafi mövqeyi ilə bağlıdır Kəndin ərazisində eyniadlı bulaq da var

**Ələhi** *hidr*, *düz* Yardımlı r-nunda min bulaq Suyu soyuq, azdebitli bulaqdır Hidronimi *əlik* (çökəklik) sözü ilə əlaqələndirirlər

**Ələkçi** *oyk*, *sadə* Laçın r-nunun Şamkənd i ə v -də kənd Dağətəyi ərazidədir Kənd XIX əsrdə qasımuşağı (digər adı kürdhacı) adlı tayfanın oturaqlaşması nəticəsində yaranmışdır. Kəndin adı həmin tayfaya məxsus olan *ələkçi* nəslinin adı ilə bağlıdır

**Ələkçi** *hidr* *sadə* Kəlbəcər r-nunda çay Etnotoponimdir

**Ələkli** *oyk*., *sadə* Şərur r-nunun Xanlıqlar i ə v -də kənd Şərur düzündədir Etnotoponimdir

**Ələsgər** *oyk* *sadə* Zaqatala r-nunun Gözparaq i ə v -də kənd Qaraçayın sahilindədir Yaşayış məntəqəsi XVII əsrdə Dağıstandan gəlmiş saxur ailələrinin məskunlaşması nəticəsində yaranmışdır Kəndin adı *Ələsgər* şəxs adı ilə bağlıdır

**Ələsgərli** *oyk*, *sadə* 1 Füzuli r-nunun Mırzəcamallı i ə v -də kənd. Dağətəyi ərazidədir Toponim "Ələsgərin nəslindən olanlar" mənasındadır; 2 Şəmkir r-nun eyniadlı i ə v -də kənd. Zəyəm çayının sahilində, Kiçik Qafqaz silsiləsinin ətəyindədir Keçmiş adı Badakənd ("samanlıqda olan kənd") olmuşdur 1990-cı ildə kəndin adı Aşıq Ələsgərin şərəfinə Ələsgərli adlandırılmışdır Memorial toponimdir

**Ələt** *oyk*, *sadə* Bakı şəhəri Qaradağ r-nunun eyniadlı i.ə v -də ştq Xəzər dənizi sahilində, düzənlikdədir Toponim türk-monqol mənşəli oyrat tayfasının *ələt* qolunun adından yaranmışdır Etnotoponimdir

**Ələt burnu** *or*, *mür* Bakıda dağ tirəsi Sanqaçal və Pirsaat burunları arasında, Qaradağ ərazisində yerləşir Dağ tirəsi Xəzər dənizinə doğru uzanır, üzərində Dılyəniz adlı palçıq vulkanı var Oronim *ələt* etnoniminə *burun* (qurunun, dağın və ya qayanın sivri bucaq şəklində uzanmış hissəsi) sözünü əlavə etməklə yaranmışdır

**Ələtli** *oyk*., *düz* Hacıqabul r-nu ərazisində kənd Kəndin ilk sakinləri *Ələt* qəsəbəsindən köçüb gəlmələrdir Oykonim "Ələtdən olanlar, Ələtdən gələnlər" mənasındadır

**Ələzəpin** *oyk* *mür* Lənkəran r-nunun Biləsər i ə v -də kənd Peştəsər silsiləsinin yamacındadır Oykonim talış dilindəki *əlƏzə* (göy ot, göyərti, yaşıllıq) və *pin/bın* (ətək, dib) komponentlərindən düzəlib, "yaşıl dağ ətəyi" mənasındadır

**Əli Bayramlı** *oyk*, *mür* 1 Azərb -da şəhər Kür çayının sahilində, Şirvan düzündədir Keçmişdə ərazisindəki kəndlərdən birinin adı ilə Ərəb Şahverdi, 1796-cı ildə Qafqaza hücum etmiş Rusiya qoşunlarının komandanı, çar generalı V Zubovun şərəfinə Zubovka adlandırılmışdır 1938-ci ildə ətrafdakı kəndlər və kiçik yaşayış məntəqələri birləşdirilərək ştq elan edilmişdi Zubovka adı da dəyişdirilərək inqilabçı bolşevik *Əli Bayramovun* (1889-1920) adı ilə adlandırılmışdır; 2 Kəlbəcər r-nunun Zar i ə v -də kənd Keçmiş adı Mollabayramlı olmuşdur İnqilabçı *Əli Bayramovun* adı ilə adlandırılmışdır, 3 Qazax r-nunun eyniadlı i ə v -də kənd Düzənlikdədir Keçmiş adı Aslanbəyli olmuşdur Yaşayış məntəqəsi inqilabçı *Əli Bayramovun* adı ilə adlandırılmışdır; 4 Samux r-nunun eyniadlı i ə v -də kənd Keçmiş adı Əhmədbəyli olmuşdur; 5 Samux r-nunun Lək i ə v -də kənd Gəncə-Qazax düzənliyindədir Keçmiş adı Şəmçizadə olmuşdur Yaşayış məntəqəsini keçən əsrin 20-ci illərində Cənubi Azərb -dan köçüb gəlmiş ailələr salmışlar İnqilabçı *Əli Bayramovun* adı ilə adlandırılmışdır. 6 Zaqatala r-nunun eyniadlı i ə v -də kənd Alazan-Əyriçay çökəkliyindədir XX əsrin 30-cu illərində iki çay sovxozunun təşkili ilə əlaqədar olaraq

Rusiyadan və ətraf kəndlərdən köçüb gələn ailələrin məskunlaşması nəticəsində yaranmışdır İnqilabçı *Əli Bayramovun* adı ilə adlandırılmışdır Memorial toponimdir

**Əliabad** *oyk., mür* 1 Babək r-nunun eyniadlı i ə v -də kənd. Dağ ətəyindədir Sovet hakimiyyəti illərində bir müddət erməni bolşeviki A F Myasnikovun adı ilə adlandırılmışdı 1991-ci ildən Əliabad adı ilə rəsmiləşdirilmişdir; 2 Biləsuvar r-nunun Xırmandalı i ə v -də kənd Muğan düzündədir, 3 Cəlilabad r-nunu Kürdlər i ə v -də kənd. 3 Burovar silsiləsinin ətəyindədir; 4 Lənk r-nunun Nüvədi i ə v -də kənd Dağətəyi ərazidədir; 5 Lənk r-nunun Vəri i ə v -də kənd Peştəsər silsiləsinin yamacındadır Oykonimlər "Əlinin kəndi, Əliyə məxsus yaşayış məntəqəsi" mənasındadır; 6 Zaqatala r-nunun eyniadlı i ə v -də kənd Alazan-Əyriçay çökəkliyindədir Kənd İlisu hakimi *Əlibəy Sultanın* adını daşıyır Sultan bu kəndin əsasını qoymuş və ingiloy ailələrini buraya yerləşdirmişdi Sonralar azərb -lar da burada məskunlaşmışlar

**Əliağalı** *oyk., sadə* Ağdam r-nunun Əlimədədli i ə v -də kənd. Xaçın çayının sahilində, dağətəyi düzənlikdədir Yaşayış məntəqəsi *əliağalı* nəslinin məskunlaşması nəticəsində yaranmışdır Etnotoponimdir

**Əlibənd** *or., mür* Astara r-nunda dağ Oronim *Əli* (ş a ) və *bənd* (kiçik dağ, təpə) komponentlərindən düzəlib, "Əli təpəsi" mənasındadır

**Əlibəyqışlaq** *oyk., mür.* Quba r-nunda kənd Qusar maili düzənliyindədir XIX əsrdə kəndin ərazisi Zizik kəndinin bəylərindən biri olan *Əlibəy Zizikskiyə* məxsus qışlaq yeri idi Kəndin ilk sakinləri də Zizik kəndindən köçmüş ailələr olmuşdur

**Əlibəyli** *oyk., sadə* 1 Qax r-nunun eyniadlı i ə v -də kənd Kürmük çayının sahilində, Alazan-Həftəran vadisindədir İlisu sultanı *Əlibəy Sultanın* (XVII əsrin sonu-XVIII əsrin əvvəli) adı ilə bağlıdır Yaşayış məntəqəsi Əlibəyə məxsus ərazidə ingiloy ailələrinin məskunlaşması nəticəsində yaranmışdır Kəndin yaxınlığındakı dağ da Əlibəyli adlanır; 2 Tovuz r-nunun eyniadlı i ə v -də kənd Tovuz çayının sahilində, dağətəyi ərazidədir

Kənd Qışlaq və Təpəbaşı adlanan iki hissədən ibarətdir Yerli əhalinin verdiyi məlumata görə, yaşayış məntəqəsi *Əlibəy* adlı şəxsə aid qışlaq yerində salındığı üçün belə adlandırılmışdır; 3 Zərdab r-nunun Gəlmə i.ə.v -də kənd Kür çayının sahilində, Şirvan düzündədir Əsl adı Abbasəlibəylidir Etnotoponimdir.

**Əlican** *hidr., sadə* Oğuz, Şəki, Yevlax r-nlarında çay Kürün sol qoludur Baş Qafqaz silsiləsinin c yamacından (3500 m hündürlükdən) başlanır Xalxal və Oğuz çaylarının birləşməsindən əmələ gəlir. Çayın qədim adı Avant olmuşdur *Əlican*, tədqiqatçıların fikrincə, XIII əsrdə monqolların yürüşündə iştirak etmiş *elcikin* tayfa adının təhrif olunmuş variantıdır Hər iki halda hidronim etnotoponimdir

**Əlicanlı** *oyk., sadə* Sabirabad r-nunun Cavad i.ə v -də kənd Kur çayının sahilində, Şirvan düzündədir Etnotoponimdir

**Əlifdağ** *or., mür.* Abşeron r-nunda dağ Dağın adı ərəb əlifbasındakı *əlif* hərfindən götürülüb Ehtimal ki, dağın quruluşu ilə bağlıdır

**Əliismayıllı** *oyk düz* Gədəbəy r-nunun eyniadlı i ə v -də kənd Şahdağ silsiləsinin ətəyindədir Keçmiş adı Alınabat olmuşdur 1930-cu ilin qışında həmin kənddə öldürülmüş *Əli İsmayılovun* (bolşevik Qasım İsmayılovun qardaşı) adı ilə adlandırılmışdır Memorial toponimdir

**Əlik** *oyk., sadə* Quba r-nunun eyniadlı i ə v -də kənd Ağçayın (Qudyal çayının qolu) sağ sahilində, Yan silsiləsinin c -q ətəyindədir Azərb -nın qafqazdilli etnik qruplarından biri olan qrızların məskunlaşdığı qədim kəndlərdən biridir Kür adlandırılan kiçik dağ çayının sahilindəki çökəklikdə salınmışdır Tədqiqatçıların fikrincə, oykonim xakas, tuvin, şor və Sibir türklərinin dilində "kənd, aul, ulus" mənalarında işlənən *al* sözünə kiçiltmə bildirən *-ik* şək -çisini əlavə etməklə, yaxud "hündürlük, yüksəklik, zirvə" mənasında işlənən *alık* sözündən yaranmışdır Digərlərinə görə, Əlik kənd adı türk dillərində "dağlarda çuxur, çökək" mənalarında işlənən *alık* sözü ilə bağlıdır Bu fikir kəndin coğrafi mövqeyinə uyğundur





**Əlik** *hidr., sadə* Quba r-nu ərazisində çay Çay öz adını ərazisindən axdığı Əlik kəndinin adından almışdır

**Əlikənd** *oyk., mür* 1 Göyçay r-nunun Mırtı i ə v -də kənd Şirvan düzündədir, 2 Ucar r-nunun eyniadlı i ə v -də kənd Şirvan düzündədir; 3 Ucar r-nunun Qazıqumlaq i ə v -də kənd Şirvan düzündədir. Oykonim "Əliyə məxsus kənd, Əlinin kəndi" mənasındadır.

**Əlikömək təpəsi** *or., mür* Cəlilabad r-nunda Üçtəpə kəndində, İncəçayın sağ sahilində (e.ə IV minilliyə aid) qədim yaşayış yeri Oronim *Əlikömək* (ş a ), *təpə* (müsbət relyef forması) və *-si* (mənsub şək ) komponentlərindən düzəlib

**Əliqasımlı** *oyk., sadə* Cəlilabad r-nunda kənd İncəçayın sağ sahilindən 4 km aralı, Burovar silsiləsinin şm -ş. ətəyindədir Etnonim əsasında formalaşmışdır

**Əliqulu** *oyk., sadə* Laçın r-nunun Pircahan i ə v -də kənd Şəlvə çayının (Həkəri çayının qolu) sahilində, Mıxtökən silsiləsinin yamacındadır Keçmiş adı Əliqulukənd olmuşdur *Əliqulular* nəslinin adı ilə bağlıdır Etnotoponimdir

**Əliqulular** *oyk., sadə* İmişli r-nunun eyniadlı i ə v -də kənd Mil düzündədir Yaşayış məntəqəsinin adı mənşəcə şahsevənlərin təklə tayfasının *əliqulular* nəslinin adı ilə bağlıdır Etnotoponimdir

**Əliquluuşağı** *oyk., sadə* Qubadlı r-nunun Teymurmüskənli i ə v -də kənd Dağətəyi ərazidədir Keçmiş adı Qarabaşlı olmuşdur Kənd əvvəllər bir qədər aralıda yerləşirdi Sonralar Qarabaşlı kəndindən *əliquluuşağı* nəslinə mənsub ailələr indiki ərazidə kəndin bünövrəsini qoymuşlar Kənd həmin nəslin adını daşıyır Etnotoponimdir

**Əlilambəyli** *oyk., düz* Sabirabad r-nunun eyniadlı i ə v -də kənd Muğan düzündədir Kənd XIX əsrdə *Əlilambəy* adlı sahibkara məxsus ailələrin məskunlaşması nəticəsində yaranmışdır

**Əlimədədli** *oyk., sadə* 1 Ağdam r-nunun eyniadlı i ə v -də kənd Qarabağ silsiləsinin ətəyindədir. 2 Xanlar r-nunun Quşqara i ə v -də kənd Gəncə-Qazax düzənliyindədir Yaşayış məntəqələri kolanı tayfasına mənsub *əlimədədli* obasının məskunlaşması nəticəsində yaranmışdır Etnotoponimdir

**Əliməmmədoba** *oyk., mür.* Quba r-nunun Hacıhüseynli i ə v -də kənd Qusar maili düzənliyindədir Yaşayış məntəqəsi Küsnət kəndindən olan *Əliməmməd* adlı şəxsə məxsus oba yerində salınmışdır Oykonim "Əliməmmədə məxsus oba" mənasındadır

**Əlimərdanlı** *oyk., sadə* 1 Ağdam r-nunun Şıxbaba i ə.v -də kənd Qarqar çayının sahilində, Qarabağ düzündə yerləşir, 2 Tovuz r-nunun eyniadlı i ə v -də kənd Tovuz çayının sahilində, Xunan düzündədir 1925-ci ildə Səmədbəy, 1939-cu ildə isə Mansurlu kəndlərinin əhalisi bu kəndə köçürülmüşdür Oykonim *əlimərdanlı* nəslinin adını əks etdirir, etnotoponimdir

**Əlinağılar** *oyk düz* Gədəbəy r-nunun Çaldaş i ə v -də kənd Yerli əhalinin verdiyi məlumata görə, yaşayış məntəqəsini XIX əsrin əvvəllərində Sadıqlı (indiki Ağstafa r-nunda) kəndindən gəlmiş *Əlinağı* adlı şəxs salmışdır Oykonim "Əlinağıya məxsus kənd" mənasındadır

**Əlincə** *or düz.* Culfa r-nunun ərazisində eyniadlı çayın sağ sahilində dağ. Hün 1811 m, vulkan mənşəlidir Dağda yerləşən Əlincə qalası da sıldırım qayalığın üstündədir Qalanın Şahtaxtı adlanan sahəsində bişmiş kərpicdən tikilmiş binaların xarabalıqları qalmaqdadır VII əsrə aid mənbələrdə qalanın adı Erıncak, XIII əsrə aid mənbələrdə isə Alınca variantlarında çəkilir Qala Eldəgizlər dövründə mühüm hərbi istehkam olmuşdur "Kitabi-Dədə Qorqud" dastanlarında da Əlincə qala-istehkam kimi göstərilir Elxanilərin, Cəlairilərin, Teymurilərin, Qaraqoyunluların, Ağqoyunluların, Səfəvilərin hakimiyyəti dövründə baş verən hadisələrlə bağlı qalanın adı tez-tez çəkilir Feodal çəkişmələri və müharibələri nəticəsində qala dağıdılmışdır Bəzi tədqiqatçılar dağın adının monqolların yürüşündə iştirak etmiş *elcikin* tayfasının adı ilə bağlı olduğunu yazırlar Bir qrup alimlərin fikrincə görə, toponim türk dillərindəki *aluncik* (meydança, düz) sözündəndir Oronimi *alan* tayfa adı ilə də bağlayırlar

**Əlincəçay** *hidr mür* Culfa r-nunda çay Arazın sol qoludur Zəngəzur silsiləsində

Dəmirli dağın yamacından (2800 m hündürlükdən) başlanır Xəznədərə və Ləkətəksu çaylarının birləşməsindən əmələ gəlir Çay adını yaxınlığındakı *Əlincə* dağının adından almışdır

**Əlinəzərli** *oyk*, *sadə* Beyləqan r-nunun eyniadlı i ə v.-də kənd Mil düzündədir Oykonim *əlinəzərli* nəslinin adı ilə bağlı yaranmışdır Etnotoponimdir

**Əlisoltanlı** *oyk*. *düz* Saatlı r-nunun eyniadlı i ə v.-də kənd Araz çayının sağ sahilində, Muğan düzündədir Kəndin adının *Əlibəy Sultanın* (İlisu sultanı) adı ilə bağlı olması ehtimal edilir

**Əliuşağı** *oyk*. *sadə* Xanlar r-nunun Zazalı i ə v -də kənd. Gəncə-Qazax düzənliyindədir Yerli əhali kəndin adını Alıuşağı kimi tələffüz edir və həmin formada da işlədir Oykonim *alıuşağı* nəslinin adını əks etdirir, etnotoponimdir

**Əliyanlı** *oyk* *sadə* Bərdə r-nunun Kələntərli i ə v -də kənd Yaşayış məntəqəsi Qubadlı r-nunda yaşayan qaraçorlu tayfasının *əliyanlı* qolunun məskunlaşması nəticəsində yaranmışdır. Əliyanlı etnonimi hələ XII əsrdən məlumdur Orta əsrlərdə Arazbar mahalında da bu adda kənd mövcud olmuşdur

**Əliyar** *oyk*, *sadə*. Şəki r-nunun Aydınbulaq i ə v -də kənd Şəxs adı əsasında formalaşmışdır

**Əliyetməzli** *oyk*, *sadə* İmişli r-nunun Məmmədli i ə v -də kənd Oykonim muğanlı tayfasının *əliyetməzli* tirəsinin adı ilə bağlıdır Etnotoponimdir

**Əliyoxuşu** *or* *mür* Laçın r-nunda dağ Oronim *Əli* (ş a ) və *yoxuş* (coğrafi nomen) komponentlərindən düzəlib (*-u* mənsub şək -si), "Əlinin yoxuşu" mənasındadır

**Əlliarx** *hidr*, *mür* Bərdə r-nunda arx Hidronim *əlli* miqdar sayına *arx* coğrafi nomenini əlavə etməklə yaranmışdır, çay qollarının sayının çoxluğunu bildirir

**Əlməkolu** *oyk* ,*mür* Siyəzən r-nunun Dağ Quşçu i ə v -də kənd Əlməkolu dağının ətəyindədir Oykonim *əlməkolu* bitkisinin adındandır

**Əlvənd** *oyk*, *sadə* Zərdab r-nunun eyniadlı i ə v -də kənd Kür çayı sahilində, Şirvan düzündədir Keçmiş adı Böyükkənd olmuşdur Yaşayış məntəqəsi keçmişdə Beyləqan şəhəri ətrafında yaşamış *əlvənd* nəsli tərəfindən salınmışdır

**Əmbərçay** *hidr*., *mür* Qax r-nunda çay Türk dillərində *ambar* "su anbarı", "məhsuldar torpaq" və s mənalarında işlənir Tədqiqatlar *ambar* sözünü etnonim hesab edirlər Azərb dilinin bəzi dialektlərində *əmbərə* "kiçik, dayaz arx", *əmbərçu* "bostan sulamaq üçün su şırımı" mənalarında işlənir Hidronim *əmbər* (dayaz arx) və *çay* (su hövzəsi) komponentlərindən düzəlib, "dayaz çay, suyu az olan çay" deməkdir Bu fikri hazırda Əmbərçayın quruyaraq Qanlı Qobu adlanması faktı da təsdiq edir XIX əsrdə Qafqazda Kutaisi quberniyasının Raçin qəzasında Ambar, Tiflis quberniyasının Tioneti qəzasında Ambarısxevi, Tiflis quberniyasının Borçalı qəzasında Ambarlu, Zaqatala dairəsində Əmbərçay və s toponimlər qeydə alınmışdır Dağlıq Altayda Ambarlu adlı çay vardır

**Əmbərçay** *oyk*, *mür* Qax r-nunun Muğal i ə.v -də kənd Dağətəyi ərazidədir Oykonim hazırda Qanlı Qobu adlanan keçmiş *Əmbərçayın* adı ilə bağlıdır

**Əmbilgöl** *hidr*, *mür* Dəvəçi r-nunda göl Şabran çayının yuxarı axını hövzəsindədir Gölün adı ərəb dilindəki *am* (camaat, icma), tat dilindəki *bil* (bataqlıq) və Azərb dilindəki *göl* sözlərindən ibarət olub, "icmaya məxsus göl" mənasındadır

**Əminli** *oyk*, *düz* Masallı r-nunun Qarğalıq i ə v -də kənd Lənkəran ovalığındadır Oykonim *əminli/eminli* nəslinin adı ilə bağlı olub, etnotoponimdir

**Əmir** b a x Emir

**Əmiranlar** *oyk*, *sadə* Xocavənd r-nunun Xocavənd qəsəbə i ə v -də kənd Əsli Əmiralılardır Yaşayış məntəqəsini *əmiralı* nəslinə mənsub olan ailələr saldığı üçün belə adlandırılmışdır

**Əmirarx** *oyk*, *sadə* Ağdaş r-nunun Güvəkənd i ə v -də kənd Kənd XIX əsrin sonlarında Əmirarx adlı arxın kənarında bir qrup ailənin məskunlaşması nəticəsində yaranmışdır Arxın adı Şirvan düzündə yaşamış türkdilli *eymur* tayfasının adı ilə bağlıdır Etnotoponimdir





**Əmiraslanlı** *oyk*., *düz* Gədəbəy r-nunun Şəkərbəy i ə v -də kənd Dağətəyi ərazidədir Yaşayış məntəqəsini keçən əsrin 20-ci illərində Emir kəndindən çıxmış cinaboy nəslindən olan Əmiraslan adlı şəxs salmışdır Oykonim *Əmiraslan* (ş a ) və *-lı* (mənsubluq bildirir) komponentlərindən düzəlib, "Əmiraslana məxsus kənd" mənasındadır

**Əmircan** *oyk*, *sadə* 1 Bakı şəhəri Suraxanı r-nunda ştq Abşeron yarımadasındadır Yaşayış məntəqəsi XX əsrin əvvəllərinə qədər Xilə adlandırılmışdır Tədqiqatçılar bu oykonimi ərəb işğalları dövründə İraqın Xilə əmirliyindən Azərb -na köçürülmüş ərəb tayfasının adı ilə bağlayırlar Əmircan oykonimini isə tədqiqatçılar orta əsrlərdə Şirvan dövlətində yüksək vəzifələrdən biri olan *əmirhacla* əlaqələndirirlər Qəsəbədə XIV əsrə aid abidələrdən biri olan Nizaməddin məscidinin kitabəsində Şirvan dövlətində yüksək mənsəb sahibi olmuş Əmir Nizaməddin Əmirhac adlı şəxs haqqında məlumat verilir Dövlət tərəfindən təsdiq olunan *əmirhac* vəzifəsinin sahibi Məkkəyə ziyarətə gedənlərə başçılıq edərmiş. 2 Qax r-nunun Muğal i ə v -də kənd Dağətəyi ərazidədir XIX əsrə aid mənbələrdə Əmircanlı variantında qeydə alınmışdır Yaşayış məntəqəsi XVIII əsrdə İlisu və Sarıbaş kəndlərindən çıxmış ailələrin məskunlaşması nəticəsində yaranmışdır *Əmircanlı* orada məskunlaşmış bir nəslin adıdır

**Əmircan** *hidr*, *sadə* Bakı şəhəri Suraxanı r-nunda müalicəvi mineral bulaq Bulağın adı Əmircan kəndinin adından götürülüb

**Əmirxanlı** *oyk*, *sadə* Zəngilan r-nunun Bartaz i ə v -də kənd Keçmiş adı Püşənli olmuşdur Yerli əhalinin məlumatına görə, yaşayış məntəqəsini XIX əsrdə püşənli tayfasına mənsub *Əmirxan* adlı bir nəfər salmışdır Əslində, *əmirxanlı* şahsevən tayfa ittifaqına daxil olan tayfalardan birinin adı olub, Dəvəçi r-nu ərazisində də qeydə alınmışdır Etnotoponimdir

**Əmirxanlı** *or*, *sadə* Dəvəçi r-nu ərazisində yüksəklik Baş Əmirxanlı kəndində yerləşdiyi üçün belə adlandırılmışdır Etnotoponimdir

**Əmirxanlı** *hidr*., *sadə* Dəvəçi r-nunda çay Baş Əmirxanlı kəndi yaxınlığından axdığı üçün belə adlandırılmışdır Etnotoponimdir

**Əmirli** *oyk*, *düz* Bərdə r-nunun Xanərəb i ə v -də kənd. Qarabağ düzündədir. *Emirli* tayfasının adındandır. Etnotoponimdir

**Əmirməhmud** *oyk*., *sadə* Ağdaş r-nunun Şəmsabad i ə v -də kənd. Şirvan düzündədir Yerli əhalinin verdiyi məlumata görə, yaşayış məntəqəsi XVIII əsrdə *Əmirməhmud* adlı şəxs tərəfindən salınmışdır

**Əmirtürbə** *oyk*, *sadə* Masallı r-nunun Güllütəpə i ə v -də kənd Burovar silsiləsinin ətəyindədir Kənd *Əmir türbəsi* adlı türbənin yaxınlığında yerləşdiyi üçün belə adlandırılmışdır

**Əmirvan** *oyk*, *mür* Qəbələ r-nunun Məlikli i ə v.-də kənd Qaraçay və Göyçay çaylarının sahilindədir Oykonim *Əmir* (ş a ) və *van* (burada "ev, yer" mənasındadır) komponentlərindən düzəlib, "Əmirə məxsus yer, kənd" deməkdir

**Əmirvar** *oyk*, *mür* Daşkəsən r-nunun eyniadlı i ə v -də kənd Qabaqtəpə çayının sahilində, dağətəyi ərazidədir Oykonim *Əmir* (ş a ) və *var* (yer) sözlərindən düzəlib, "Əmirin yeri" mənasındadır Belə güman edilir ki, kəndin ərazisi əvvəllər Əmir adlı şəxsin köç yeri olmuş, sonralar isə daimi yaşayış məntəqəsinə çevrilmişdir

**Əmirvar** *hidr*, *sadə* Daşkəsən r-nunda çay Çay Əmirvar kəndinin ərazisindən axdığı üçün kəndin adı ilə adlandırılmışdır

**Əmirvarlı** *oyk* *sadə* Cəbrayıl r-nunun Şükürbəyli i ə v -də kənd Yaşayış məntəqəsinin keçmiş adı Hüseynbəyli olmuşdur Kənd *əmirvarlı* nəslinin məskunlaşması nəticəsində yaranmışdır

**Əmirzeyidli** *oyk*, Beyləqan r-nunun Birinci Şahsevən i ə v -də kənd Əsl adı Əmirseyidlidir Toponim kəndin əsasını qoymuş *əmirseyidli* nəslinin adı ilə bağlıdır Etnotoponimdir

**Ənbilgöl** b a x Əmbilgöl

**Əncir qayası** *or* *mür* Zəngilan r-nunda qaya Fitonimik oronimdir

**Əncirdağ** *or* *mür* Dəvəçi r-nunda dağ *Əncir* (meyvə ağacı) və *dağ* (müsbət relyef forması) komponentlərindən düzəlib, "əncir

"bitən dağ" mənasındadır Fitonimik oronimdir

**Əncirli dərə** *or., mür.* Qaradağ r-nunda dərə, Qubadlı r-nunda dərə, Zəngilan r-nunda dərə; Cəbrayıl r-nunda dərə Fitonimik oronimdir

**Əncirli döş** *or. mür.* Cəbrayıl r-nunda dağ. Oronim bitki adına *döş* ("dağın, təpənin yuxarı hissəsi ilə ətəyi arasındakı sahə", "dağ yamacının yuxarı və orta hissələri arasında qalan hissə", "yamacın yuxarı hissəsi") sözünü əlavə etməklə yaranmışdır

**Əngəxaran** *oyk., sadə* Şamaxı r-nunun Dzerjinovka i.ə.v.-də kənd Baş Qafqaz silsiləsinin ətəyindədir Əngəxaran kəndinin ərazisində orta əsrlərə aid yaşayış yeri və qəbiristanlıq mövcuddur Kəndin əhalisi indiki əraziyə təqr 300-400 il əvvəl Şamaxının 50 km şm.-q.-indəki eyniadlı kənddən köçüb gəlmişdir Yerli əhali arasında keçmiş Əngəxaran kəndinin ərazisi Binə Əngəxəran adı ilə tanınır Zarat Xeybəri kəndindən şm.-q.-də, Yeddi qardaş platosundadır Toponim, ehtimal ki, *ahəngəran* sözündən olub, "dəmirçilər" mənasını daşıyır Toponimi tat dilindəki *əng* (arı) sözündən və *-an* şək.-sindən ibarət "arı saxlanılan yer" mənasında da yozurlar Kəndin ərazisində eyniadlı dağ və min bulaqlar var.

**Əngəxaran** *hidr., sadə* Şamaxı r-nunda min bulaq Köhnə Əngəxaran kəndinin xarabalığı yaxınlığında yerləşir Suyu soyuq və kükürdlü olub, iki bulaqdan ibarətdir. Hidronim bulağın yerləşdiyi kəndin adından yaranmışdır

**Əngəxaran** *or. sadə* Şamaxı r-nunun Əngəxaran kəndi ərazisində dağ Hün. 1380 m Dağın adı yerləşdiyi kəndin adından götürülmüşdür

**Əngəvul** *oyk., sadə* Yardımlı r-nunun Vergədüz i.ə.v.-də kənd Peştəsər silsiləsinin ətəyindədir Bəzi tədqiqatçılar Əngəvül toponimini İran illərində "üzümlük", "üzümlü təpə" anlamında izah edirlər Oykonimin *əng* (İran dillərində "arı", "bal arısı") və talış dilindəki *vil* (çiçək, gül) sözlərindən ibarət olub (-*ə* bitişdirici saitdir), "arıçiçəyi (gülü) olan yer" mənasını bildirdiyini də yazırlar.

**Əniq** *oyk., sadə* Qusar r-nunun eyniadlı i.ə.v.-də kənd Qusar çayının sahilində, Yan silsiləsinin ətəyindədir 1843-cü ilə aid sənəddə Anıxkənd formasında qeyd olunmuşdur Oykonimin ləzg "məskən" mənasında olan *niq* sözündən yarandığı ehtimal olunur

**Əniqoba** *oyk., mür.* Qusar r-nunun Əniq i.ə.v.-də kənd. Baş Qafqaz silsiləsinin ətəyindədir Yaşayış məntəqəsinin vaxtı ilə Əniq kəndindən ayrılmış ailələr oba yerində salındığı üçün belə adlandırılmışdır

**Ərçivan** *oyk.,* Astara r-nunun eyniadlı i.ə.v.-də kənd Ərçivan çayının sahilində, Lənkəran ovalığındadır Toponimi tədqiqatçılar müxtəlif cür izah edirlər 1 *Arçion* (*araçion*) toponiminin dəyişilmiş variantı olub, "mişarçəkənlər yeri" deməkdir; 2. Talış dilindəki *arc* (dəyirman) və *van* (məskən, ev, yaşayış yeri) sözlərindən (-*i* bitişdirici saitdir) ibarət olub, "dəyirman yeri" mənasını bildirir; 3 Türk dillərindəki *arça* (ardıc ağacı) və məkan bildirən *van* sözlərindən əmələ gəlib, "ardıc ağacı bitən yer" mənasındadır

**Ərçivan** *hidr., sadə* Astara r-nu ərazisində çay Çay adını eyniadlı kəndin adından almışdır

**Ərçiman** b a x. Arçiman

**Ərdəbilə** *oyk.,* Lerik r-nunun Kirəvud i.ə.v.-də kənd. Burovar silsiləsinin yamacındadır Kəndi Cənubi Azərb.-nın Ərdəbil mahalından gəlmiş ailələr salmışlar Toponim Ərdəbil sözünə talış dilindəki -*ə* cəm şək.-sini əlavə etməklə yaranmışdır, "ərdəbillilər" deməkdir Bəzi tədqiqatçılar Ərdəbil toponimini "müqəddəs su" (İran dillərində *arta/arda* – müqəddəs) mənasında izah edirlər Qədimdə Ərdəbildə müalicə əhəmiyyətli su olmuşdur Başqa ehtimala görə, Ərdəbil qədim türk dillərində "dağ", "dağlıq", "dağ kəndi" mənasında işlənən *art* sözünə talış dilində "bataqlıq" mənasında işlənən *bil* sözünü əlavə etməklə yaranmışdır

**Ərdəşəvə** *oyk., mür* Laçın r-nunun Təzəkənd i.ə.v.-də kənd Tədqiqatçılar toponimin kürd dilində *ardaş* (ardıc ağacı) və *va* (yer) sözlərindən ibarət olduğunu yazırlar Toponim "ardıclı yer" mənasını daşıyır

**Ərdəşəvi** b a x Ardaşava

**Ərdəşəvəsu** b a x Ardaşavasu

**Ərəb** *oyk., sadə* 1 Ağdaş r-nunun Kükəl i.ə.v.-də kənd Şirvan kanalının sahilində, düzənlikdədir Yaxınlığında XVIII əsrə aid





Surxay qalasının qalıqları var; 2 Xaçmaz r-nunun Qələğan i.ə.v.-də kənd Samur-Dəvəçi ovalığındadır. 3 Laçın r-nunun Fətəlipəyə i.ə.v.-də kənd Dağətəyi ərazidədir Yaşayış məntəqəsinin bağırbəyli tayfasına mənsub ailələr *Ərəbdüzü* adlanan yerdə salmışlar; 4 Masallı r-nunun Xırmandalı i.ə.v.-də kənd Lənkəran ovalığındadır Yaşayış məntəqələri özündə *ərəb* etnonimini əks etdirir VII əsrdən ərəb işğallarının başlaması ilə əlaqədar Xilafətin tərkibinə daxil olan ərazilərə, o cümlədən Azərb.-na xeyli ərəb tayfası köçürülmüşdü Mənbələrin məlumatına görə, təkcə xəzər-ərəb müharibələri dövründə Hişam ibn Mərvan 731-ci ildə şm sərhədlərini qorumaq üçün Azərb.-da Şamdan (Suriya) gəlmiş 40 min ərəb ailəsi yerləşdirmişdi Ərəblərin Azərb.-na köçürülməsi sonralar kütləvi hal almışdı Gələn ərəblərin əksəriyyəti Şam, Mosul, Diar, Rəbiə, Yəmən, Xeybər, Xillə, Kufə, Bəsrə və s dairələrdən idi XIX əsrə aid məlumata görə, Zaqafqaziyada ərəb komponentli kənd adlarının 29-undan 19-u Bakı quberniyasında idi

**Ərəbbəsrə** *oyk., mür* Yevlax r-nunun Şilyan i.ə.v.-də kənd Şirvan düzündədir Keçmiş adı İkinci Ərəbşəki olmuşdur Toponim *ərəb* etnonimindən və *Bəsrə* (indiki İraqda şəhər) sözlərindən ibarət olub, "bəsrəli ərəb, Bəsrədən olan ərəblər" mənasındadır

**Ərəbcəbirli** *oyk., mür.* Göyçay r-nunun Şəhadət i.ə.v.-də kənd Şirvan düzündədir Kənd orta əsrlərdə *ərəb* mənşəli ailələrin məskunlaşması nəticəsində yaranmışdır Etnotoponimdir

**Ərəbxana** *oyk., mür* Kürdəmir r-nunun Mollakənd i.ə.v.-də kənd Şirvan düzündədir Əsl adı Ərəb Xanədandır Oykonim *ərəb* etnoniminə *xanədan* (İran dillərində "ev, mənzil", "nəsil") sözünü əlavə etməklə yaranmışdır, "ərəb nəsli, ərəb evi" mənasındadır Ermənistanın Gorus r-nunda da Ərəbxana adlı kənd olmuşdur

**Ərəbqardaşbəyli** *oyk. mür* Neftçala r-nunun Cəngən i.ə.v.-də kənd Cənub-Şərqi Şirvan düzündədir VIII əsrdə Azərb.-na köçürülmüş ərəb tayfalarından biri sonralar *ərəbqardaşbəyli* adlanmışdır Əvvəlcə Şirvanda yaşamış ərəbqardaşbəylərin bir hissəsi XIX əsrin ortalarında bura gəlib məskunlaşmışlar

**Ərəbqədim** *oyk., mür* Qobustan r-nunun eyniadlı i.ə.v.-də kənd Zəngidərə çayının (Pirsaat çayının qolu) sol sahilindən 4 km aralıda yerləşir Keçmiş adı Köhnə Ərəb olmuşdur XIX əsrdə Şirvanda yaşamış 205 ailədən ibarət *ərəbqədim* tayfasının adı ilə adlandırılmışdır Etnotoponimdir

**Ərəbqubalı** *oyk., sadə.* Kürdəmir r-nunun eyniadlı i.ə.v.-də kənd Şirvan düzündədir Tədqiqatçıların fikrincə, oykonim Ərəbkufəli adından təhrifdir. Mənşəcə VIII əsrdə İraqın Kufə mahalından Azər.-na köçürülmüş ərəb ailələrinin bir hissəsi burada *ərəbkufəli* (Kufədən çıxmış ərəblər) adı ilə adlanmışdır Yaşayış məntəqəsi bu ailələrin məskunlaşması nəticəsində yarandığı üçün belə adlanır

**Ərəblər** *oyk., düz* 1 Bərdə r-nunun Güloğlular i.ə.v.-də kənd Qarabağ düzündədir; 2. Dəvəçi r-nunun Gəndov i.ə.v.-də kənd Samur-Dəvəçi ovalığındadır Yaşayış məntəqələri vaxtilə Azərb.-da məskunlaşmış ərəblərin adı ilə bağlıdır. Oykonim *ərəb* etnoniminə -*lər* şək.-sini əlavə etməklə yaranmışdır

**Ərəbmehdibəyli** *oyk., mür* Ağsu r-nunun eyniadlı i.ə.v.-də kənd. Yuxarı Şirvan kanalının sahilində, Şirvan düzündədir XIX əsrdə Şirvanda maldarlıqla məşğul olmuş və *Mehdibəy* adlı sahibkara məxsus *ərəbmənşəli* ailələrin məskunlaşması nəticəsində yaranmışdır

**Ərəbocağı** *oyk., sadə* Ağdaş r-nunun Qoşaqovaq i.ə.v.-də kənd Bozdağ silsiləsinin ətəyindədir Oykonim *ərəb* etnoniminə *ocaq* (pir, müqəddəs yer) sözünü əlavə etməklə yaranmışdır Yaşayış məntəqəsi Ərəbocağı adlı pirin yanında salındığına görə belə adlanmışdır

**Ərəbsarvan** *oyk. sadə* Ağsu r-nunun eyniadlı i.ə.v.-də kənd Yuxarı Şirvan kanalından 4 km aralı, Şirvan düzündə yerləşir Toponim *ərəb* və *sarvan* (dəvə saxlayan, dəvəçi) sözlərindən yaranmışdır, "dəvə saxlayan ərəblər" mənasındadır *Ərəbsarvan* eyni zamanda keçmişdə dəvəçiliklə məşğul olmuş ərəb mənşəli kiçik icmalardan birinin adı olmuşdur

**Ərəbşalbaş** *oyk.*, *mür.* Qobustan r-nunun Təklə i.ə v.-də kənd. Baş Qafqaz silsiləsinin ətəyində, Sündü yaylasındadır. Keçmiş adı Ərəbcəbirli olmuşdur. 1853-cü ildə 50 ailədən ibarət olmuş *ərəbcəbirli* tayfası *Şalbaş* adlı xəzinə torpağında məskunlaşdığına görə belə adlandırılmışdır.

**Ərəbşahverdi** *oyk.*, *sadə*. 1. Göyçay r-nunun Yeniarx i.ə v.-də kənd. Şirvan düzündədir. 2. Qobustan r-nunun Qurbançı i.ə.v.-də kənd. Dağətəyi ərazidədir. *Ərəbşahverdi* XIX əsrdə ərəb mənşəli böyük tayfalardan birinin adı idi. 1870-ci ildə 250 ailədən ibarət olan bu tayfa sonralar üç hissəyə parçalanmışdı. İki hissədən ibarət olan *ərəbşahverdi* tayfasının 70 ailəlik bir hissəsi həmin illərdə Göyçay qəzasına köçərək indiki Ərəbşahverdi kəndinin əsasını qoymuşdu.

**Ərəbşəki** *oyk.*, *mür.* Ağdaş r-nunun Eymur i.ə v.-də kənd. Şirvan düzündədir. Keçmiş adı Qəribli olmuşdur. XIX əsrdə Nuxa qəzasında maldarlıqla məşğul olmuş, qışı Kür sahillərində, yayı isə *Şəki* ətrafında keçirmiş *ərəb* mənşəli tayfaya mənsub ailələrin məskunlaşması nəticəsində yaranmışdır.

**Ərəbuşağı** *oyk.*, *sadə*. Ağsu r-nunun eyniadlı i.ə v.-də kənd. Ağsu çayının sahilində, Şirvan düzündədir. Tədqiqatçılar yaşayış məntəqəsinin XIX əsrdə Cavad qəzasında maldarlıqla məşğul olmuş 58 ailədən ibarət *ərəbuşağı* adlı elin məskunlaşması nəticəsində yarandığını yazırlar. Etnotoponimdir.

**Ərəbyatağı** *or.*, *mür.* Cəbrayıl r-nunun c.-unda, Göyərçin Veysəlli kəndindən q.-də sıra dağlar. Oronim *ərəb* etnonimindən və *yataq* (mal-qaranın saxlanması üçün müxtəlif tikililəri olan sahə) sözünün birləşməsindən yaranmışdır. Güman edilir ki, dağdakı tikililərdən ərəb mənşəli ailələr yataq kimi istifadə etmişlər.

**Ərəbyengicə** *oyk.*, *mür.* Şərur r-nunun İbadulla i.ə v.-də kənd. Düzənlikdədir. Oykonim *ərəb* etnonimindən və *yengicə* (yeni, təzə) sözündən ibarət olub, "təzə ərəb kəndi, yaxud yeni salınmış ərəb kəndi" mənasındadır.

**Ərəfsə** *oyk.*, *sadə*. Culfa r-nunun eyniadlı i.ə v.-də kənd. Əlincə çayının sahilində, Zəngəzur silsiləsinin ətəyindədir. Ermənistanın Sisyan r-nunda azərb.-ların yaşadığı Ərəfsə adlı kənd olmuşdur. Tədqiqatçılar bu toponimin eradan əvvəl XIV əsrdə Kiçik Asiyada Xett (Het) dövlətinin hökmdarı II Murşilinin bir qayaüstü yazısında kiçik ölkə və qala kimi adı çəkilən *Aripsa* ilə əlaqədar olduğunu və Arıpsa adının yerli forması Ərəfsə (orta əsr erməni mənbələrində Arevis) adının Naxçıvan bölgəsinə gətirildiyini ehtimal edirlər. Digər tədqiqatçılara görə, Ermənistanın Sisyan r-nunda yerləşən Ərəfsəli kənd adı kəngərli tayfasının *ərəfsəli* tirəsinin adından əmələ gəlmişdir.

**Ərəfsə** *hidr.*, *sadə*. Culfa r-nunda mın bulaq. Əlincə çayının sağ sahilində yerləşir. Az debitli içməli soyuq suyu olan bulaqdır. Hidronim Ərəfsə kəndinin adından yaranmışdır.

**Ərəkit** *oyk.*, *mür.* İsmayıllı r-nunun Lahıc qəsəbə i.ə v.-də kənd. Niyaldağın ətəyindədir. Tədqiqatçılar toponimin tat dilində *ərə* (daş, qaya) və ərəb-fars mənşəli *qət* (tərəf, yer, səmt) sözlərinin fonetik formalarının birləşməsindən əmələ gəlib "qaya tərəfi, qayalıq, qaya səmti" mənasını bildirdiyini yazırlar. Lahıc qəsəbəsində Ərək adlı məhəllə olduğundan kəndin həmin məhəllədən çıxmış ailələrin məskunlaşması nəticəsində yaranması güman edilir.

**Ərəzin** *oyk.*, *düz.* Culfa r-nunun eyniadlı i.ə v.-də kənd. Əlincə çayının (Arazın qolu) sağ sahilindən 2 km aralı, dağətəyi düzənlikdədir. Mənbələrdə Arajkan, Arajank, Arospijan, Arasank variantlarında qeydə alınmışdır. Tədqiqatçıların fikrincə, oykonim *Araz* hidronimi və *-an* şəkilçisi (fonetik dəyişikliyə uğrayaraq -ın formasına düşmüşdür) əsasında yaranmışdır. XIX əsrdə İran və Türkiyədən buraya erməni ailələrinin köçürüldüyü haqqında məlumat verilir.

**Ərik dərəsi** *or.*, *mür.* Şəmkir r-nunda dərə. Toponim fitonim əsasında yaranmışdır.

**Ərikli** *oyk.*, *sadə*. Laçın r-nunun Kürdhacı i.ə v.-də kənd. Qarabağ silsiləsinin yamacındadır. Yaşayış məntəqəsini qasımuşağı (və ya kürdhacı) tayfasına mənsub ailələr keçmişdə ərik bağları olmuş *Ərikli* adlı yerdə saldıqları üçün belə adlanmışdır.

**Əriknaz** b.a x. Heriknaz

**Ərik təpəsi** *or.*, *mür.* Xocavənd r-nunda təpə. Fitonim əsasında yaranmışdır.





**Əriktaqə** *or.*, *mür.* Tovuz r-nu ərazisində çay dərəsi. *Ərikdağ* adının təhrif olunmuş forması olduğu güman edilir.

**Ərgüneş** b.a x. Argüneş

**Ərkivan** *oyk.*, *mür.* Masallı r-nunun eyniadlı i.ə v.-də kənd. Lənkəran ovalığındadır. Oykonim İran dillərindəki *ark* (qala) və *van* (məskən, ev, yaşayış yeri) sözlərindən düzəlib, "qala yeri" mənasındadır.

**Ərkivan** *hidr.*, *sadə*. Masallı r-nunda mın bulaqlar. Viləş çayının hər iki sahilində yerləşir. 27 isti bulaqdan ibarətdir. Qədim zamanlardan müalicə üçün istifadə edilir. Hidronim ərazidəki eyniadlı kəndin adından yaranmışdır.

**Ərməki** *oyk.*, *düz.* Quba r-nunun Amsar i.ə v.-də kənd. Düzənlikdədir. Toponim türk dillərindəki *irmak* (çay) sözünə *-i* şək.-sini əlavə etməklə yaranmışdır.

**Ərməkiqışlaq** *oyk.*, *mür.* Quba r-nunun Hacıhüseynli i.ə v.-də kənd. Oykonim *Ərməki* (kənd adı) və *qışlaq* sözlərindən düzəlib, "Ərməki kəndinin qışlağı" deməkdir.

**Ərmənət** *oyk.*, *düz.* Oğuz r-nunun Xalxal i.ə v.-də kənd. Qala dağının ətəyindədir. Keçmiş adı Oğuz yeri olmuşdur. Məşhur Oğuzlar qəbri bu ərazidə yerləşir. Kəndin əhalisi keçmiş Yazıqırağı kəndindən çıxmış ailələrdən ibarətdir. Oykonim, ehtimal ki, *orman* (meşə) sözünə *-ət* şəkilçisini əlavə etməklə yaranmışdır.

**Ərnik** *oyk.*, *sadə*. Laçın r-nunda kənd. Türk dillərində *ərin/erın* "dincəlmək üçün yer" mənasında işlənmişdir. Oykonimin *-ik* sonluğu isə *-lik* şəkilçisinin ixtisara uğramış formasıdır.

**Ərsilə** *oyk.*, *düz.* Yardımlı r-nunun Ərus i.ə v.-də kənd. Burovar silsiləsinin ətəyindədir. Tədqiqatçıların fikrincə, oykonim keçmişdə Lənkəran qəzasında maldarlıqla məşğul olmuş *ərus* adlı icmanın adından və talış dilində kiçiltmə bildirən *-lə* şək.-sindən ibarətdir.

**Ərşəli** *oyk.*, *sadə*. Kürdəmir r-nunun Pirili i.ə v.-də kənd. Şirvan düzündədir. Yaşayış məntəqəsinin adı *ərşəli* tayfasının adı ilə əlaqədar yaranmışdır. Ərşəlilər keçmişdə Quba və Şirvan zonasında yaşamışlar. Cənubi Azərb.-da Ərşə adlı tarixi mahal (Ərdəbilin şm.-q.-ində Qarasu çayı hövzəsində) mövcuddur. Şirvanda yaşayan ərşəlilərin həmin tarixi mahaldan köçüb gəlmələri güman edilir.

**Ərtəpə** b.a x. Artəpə

**Ərus** *oyk.*, *sadə*. Yardımlı r-nunun eyniadlı i.ə v.-də kənd. Burovar silsiləsinin ətəyindədir. XIX əsrin II yarısına aid mənbələrdə Lənkəran qəzasında *ərus* tayfasının yaşadığı göstərilir. Həmin tayfanın adı qıpçaqların arasında *orus* (uruz) şəklində çəkilir. Tədqiqatçılar Dədə Qorqud dastanlarının baş qəhrəmanlarından biri olan Aruz qocanı ərus tayfasından hesab edirlər.

**Ərziküş** *oyk.*, *sadə*. Siyəzən r-nunun eyniadlı i.ə v.-də kənd. Dağətəyi ərazidədir. Ərziquş variantında da qeydə alınmışdır. Kəndi XIX əsrin əvvəllərində Köhnə Quşçu kəndindən köçmüş ailələr özlərinə məxsus Ərzeküş adlı torpaq sahəsində salmışlar. Yerli əhalinin məlumatına görə, *Ərsəküş* "gəlin öldürülən yer" mənasındadır. Əslində, oykonim *ərz* (yer, məkan) və *küş* (yaxın) komponentlərindən ibarət olub, "yaxın yer" mənasındadır.

**Ərziküş** *hidr.*, *sadə*. Siyəzən r-nunda çay. Gilgil çayının sağ qoludur. Ərazisindən axdığı kəndin adındandır.

**Əsəbkəf** *or.*, *mür.* Babək r-nunda dağ. Hün. 1661 m. Oronim Asefkehv adından təhrif olunmuşdur. Əsədkef variantında da qeydə alınmışdır. Tədqiqatçıların fikrincə, *Asəf* (ər. "büt") və *kəf* (ər. *kəhı* "təbii mağara") sözlərindən yaranan toponim "büt mağarası" mənasını ifadə edir. Yerli əhali dağdakı mağaraya qədimdən ziyarətə gedir, qurbanlar kəsir. Dağdakı mağara ilə bağlı belə bir rəvayət vardır: Yunis peyğəmbərin dövründə üç nəfər müqəddəs şəxs bir itlə həmin mağaraya girmiş və orada ölmüşdür. Uzun müddətdən sonra dirilərək möcüzə sahibi olmuşdur. Digər rəvayətə görə, islamı qəbul etmiş təqib olunan bir qrup şəxs mağaraya girmiş, 300 il yuxuya getdikdən sonra ayılmışdır. Əslində, oronim ərəb dilindəki *əshab* (bir qrup adam) və *kəf* (mağara) komponentlərindən düzəlib, "mağara adamları" mənasındadır.

**Əsədabad** *oyk.*, *mür.* Yardımlı r-nunun Yardımlı qəsəbə i.ə v.-də kənd. Dağətəyi ərazidədir. XX əsrin əvvəllərində kəndin adı

Əsədkənd variantında qeydə alınmışdır Mənbələrdə XIX əsrin axırlarında burada Talış dağlarında yaşamış pirəmbel/perımbel tayfasına mənsub bir tirənin məskunlaşması haqqında məlumat verilir Oykonim bu tirənin başçısı *Əsədin* adı ilə adlandırılmışdır

**Əsədli** *oyk., sadə* 1 Cəlilabad r-nunun Ləkın i ə v.-də kənd Burovar silsiləsinin ətəyindədir Yaşayış məntəqəsini XIX əsrin axırlarında şahsevənlərin *əsədli* tirəsi salmışdır; 2 Sabirabad r-nunun Qaralar i ə v -də kənd Muğan düzündədir Yerli əhalinin verdiyi məlumata görə, yaşayış məntəqəsini XIX əsrdə Məmişlər (indiki Qaralar) kəndindən çıxmış *Əsəd* adlı şəxs və onun övladları saldığı üçün belə adlandırılmışdır

**Əsgərabad** *oyk., mür* Biləsuvar r-nunun Aşağı Cürəli i ə.v.-də kənd Bolqar çayının sahilində, Muğan düzündədir. Yaşayış məntəqəsi 1920-ci ildə Cənubi Azərb -dan gəlmiş bir qrup ailənin məskunlaşması nəticəsində yaranmışdır Güman edilir ki, bu ailələrin başçısı *Əsgər* adlı şəxs olmuşdur

**Əsgəran** *oyk., sadə* Xocalı r-nunda şəhər Qarqar çayının sahilində, Qarabağ silsiləsinin ətəyindədir. Toponim XVIII əsrdə Qarabağ xanlarından birinin (Pənahəli xan və ya Mehralı xan) tikdirdiyi Əsgəran qalasının adındandır Qala keçmişdə Əsgəran adlanan yerdə tikilmişdir Yerin adı isə qədim mənbələrdən məlum olan *əski* (köhnə, qədim) və *Aran* (Arran toponimi) komponentlərindən ibarət olub, "köhnə Aran, qədim Aran" deməkdir "Alban tarixi" əsərində bu yerin adı Mets Aran (Böyük Aran) kimi çəkilir

**Əsgərbatan nohur** *hidr., mür* Abşerondakı Ataçayın mənbəyi Hidronim baş vermiş hadisə ilə əlaqədar adlandırılıb

**Əsgərbəyli** *oyk., düz* Sabirabad r-nunun Qasımbəyli i ə v -də kənd Mil düzündədir Yaşayış məntəqəsi XIX əsrdə *Əsgərbəy* adlı şəxsə mənsub ailələrin məskunlaşması nəticəsində yaranmışdır

**Əsgülüm** *or., mür* Zəngilan r-nunda dağ Bəşdəli kəndinin şm-ında, Oxçu çayının sahilindədir El arasında Ərzirum dağı da adlanır Bəzi tədqiqatçılara görə, toponim Azərb dilindəki *əski* (qədim, köhnə) və *ulum/ulam* (keçid) sözlərindən ibarət olub, "köhnə keçid" mənasındadır





**Əski İqrığ** *oyk., mür* Quba r-nunun Quba şəhər i.ə v.-də kənd Qusar maili düzənliyindədir Oykonim *əski* (köhnə, qədim) və *İqrığ* (kənd adı) komponentlərindən düzəlib, "köhnə İqrığ kəndi" deməkdir

**Əskipara** *oyk., sadə* Tərtər r-nunun Qaraağacı i ə v -də kənd Dağətəyi düzənlikdədir Keçmiş adı Əskiparalı olmuşdur XIX əsrdə bu kənd Birinci Əskiparalı və İkinci Əskiparalı adlı iki hissədən ibarət idi Yerli əhalinin məlumatına görə, yaşayış məntəqəsini Qazax r-nunun Əskipara kəndindən köçüb gəlmiş ailələr salmışlar

**Əskipara** *hidr., sadə* Qazax r-nu ərazisində çay Coğaz çayının (Ağstafa çayı hövzəsi) sol qoludur Quqares çökəkliyinin yamacından (1850 m hündürlükdən) başlanır Hidronim Əskipara adlı yaşayış məntəqəsinin adından alınmışdır Hal-hazırda Aşağı Əskipara və Yuxarı Əskipara adlı iki kənddən ibarət olan qədim Əskipara kəndinin ərazisində XIV əsrə aid şəhər və ikicərgəli qala divarının xarabalıqları var Tədqiqatçılara görə, Qafqaz Albaniyasının qədim Xalxal şəhəri burada olmuşdur Toponim *əski* (köhnə, qədim) və *para* (hissə, kənd) komponentlərindən düzəlib, "köhnə kənd" mənasındadır

**Əsparəsti** b a x. Asparəsti

**Əsrik** *hidr., sadə* Tovuz r-nu ərazisində çay Axınca çayının qoludur Mənbəyini Şahdağı silsiləsinin c yamacından (1750 m. hündürlükdən) alır Çaydan suvarma və dəyirmanların hərəkətə gətirilməsi üçün istifadə olunur *Əsrik* qədim türk dillərində "coşqun, kükrəyən; sərxoş" mənalarında olub, çayın sürətli axınını əks etdirir

**Əsrik** *oyk., sadə* Kəlbəcər r-nunun eyniadlı i ə v -də kənd Dağətəyi ərazidədir XX əsrin əvvəllərində r-nun ərazisində Böyük Əsrik və Kiçik Əsrik adlı iki kənd qeydə alınmışdır Yerli əhalinin məlumatına görə, yaşayış məntəqəsini keçmişdə Tovuz r-nunun Əsrik Cırdaxan kəndindən köçüb gəlmiş dörd ailə salmışdır

**Əsrik Cırdaxan** *oyk., mür* Tovuz r-nunun eyniadlı i ə v -də kənd Əsrik çayının sahilində, dağətəyi ərazidədir Oykonim "Əsrik çayı kənarındakı Cırdaxan kəndi" mənasındadır



**Əşlə** b a x Eşlə

**Ətcələr** *oyk., sadə* 1. Cəlilabad r-nunun Gülməmmədli i ə.v -də kənd Burovar silsiləsinin ətəyindədir; 2 Masallı r-nunun Şərəfə i ə v -də kənd Lənkəran ovalığındadır; 3. Sabirabad r-nunun Haşımxanlı i ə v -də kənd Muğan düzündədir Yaşayış məntəqəsi XIX əsrdə Abdulyan kəndindən çıxmış bir qrup ailənin məskunlaşması nəticəsində yaranmışdır Tədqiqatçıların fikrincə, oykonim Azərb ərazisində yaşamış *atçılar* adlı tayfanın adının təhrif formasıdır Etnotoponimdir

**Ətyeməzli** b a x Atyeməzli

**Əvəcük** *oyk., düz* Qusar r-nunun Köhnə Xudat i ə v -də kənd. Qusar maili düzənliyindədir Tədqiqatçıların fikrincə, toponim *ova* (türk dillərində "düzən") və *-cıq* kiçiltmə bildirən şək -dən ibarət olub "kiçik düzən yer" mənasındadır Kəndin adının *əvə/yivə* tayfa adına *-cük* şək -sini artırmaqla yarandığını da ehtimal etmək olar

**Əvcədulan** *oyk., mür* Yardımlı r-nunun Vərgədüz i ə.v -də kənd. Peştəsər silsiləsinin ətəyindədir Oykonim monqol işğalları dövründə (XIII əsr) Azərb -na köçürülmüş türkdilli *dolon* tayfasının adı ilə bağlıdır Oykonimin birinci komponenti *əvçə* Lənkəran zonasında "ailə, qohum, nəsil" mənasında işlənən *övlad* sözündəndir Beləliklə, Əvcədulan "dolonlar, dolon nəsli" deməkdir

**Əvcədulan** *hidr., sadə* Yardımlı r-nu ərazisində göl Eyniadlı kəndin ərazisində yerləşdiyi üçün belə adlandırılmışdır

**Əvəyil** *or., mür* Lerik r-nunda dağ. Azərb dilinin dialektlərində *əvə* "şiş, yumru" və *yil/il* "tirə" mənalarında işlənir Oronim "başı şiş, yumru dağ tirəsi" deməkdir

**Əvilə** *oyk., sadə* Lerik r-nunun Livədirgə i ə v -də kənd Dağətəyi ərazidədir Yerli əhalinin məlumatına görə, oykonim talış "qıjı" və ya "ayıdöşəyi" bitkisinin adı olan *avilə* sözündəndir Tədqiqatçıların fikrincə, *avilə* talış dilində "toplu, çoxluq, cəmlik" mənalarını bildirir

**Əyərək** *oyk., sadə* Laçın r-nunun Köhnəkənd i ə.v -də kənd Qarabağ silsiləsinin yamacındadır Əyrık, Əkərək, Aqaraq, Akarak variantlarında da qeydə alınmışdır Tədqiqatçıların fikrincə, oykonim mənşəcə şumer



dilinə aid olan *aqar/akar* (əkin yeri, əkilən sahə) sözü ilə bağlı olub, "sahibkar mülkü", "sahibkar təsərrüfatı" mənasındadır

**Əyin** *oyk., sadə* Qubadlı r-nunun Çardaxlı i ə v -də kənd Dağətəyi ərazidədir R-nun ərazisindəki Səngər dağı keçmişdə Əyın dağı adlanırdı Dağ öz adını buradakı bulağın adından almışdır Əyin sözü *eyn* (ər "göz, bulaq, çeşmə") sözünün təhrif olunmuş formasıdır Yaşayış məntəqəsi keçmiş Hacılı kəndindən köçmüş ailələrin Əyin dağının ətəyində məskunlaşması nəticəsində yaranmışdır

**Əylis** *hidr., sadə* Ordubad r-nu ərazisində çay Arazın sol qoludur Mənbəyini Zəngəzur silsiləsinin c -q yamacından (Dabaxlıdağdan 3100 m yüksəklikdən) alır Çayda güclü sel hadisələri baş verir Hidronim *Əylis* adlı qədim yaşayış məntəqəsinin (indiki Aşağı Əylis və Yuxarı Əylis) adından yaranmışdır

**Əyricə** *oyk., düz* Bərdə r-nunun Yeni Əyricə i ə v -də kənd Tərtər çayının sahilində, Qarabağ düzündədir Əsli Ayrıcadır Kəndin ərazisi Ağdam r-nunun Xıdırlı kəndinə məxsus əkin yeri olmuşdur Yaşayış məntəqəsi həmin kənddən çıxmış ailələrin ayrılaraq əkin yerində məskunlaşması nəticəsində yaranmışdır *Ayrıca* "kənddən ayrılmış, xüsusi icma təşkil etmiş" deməkdir

**Əyriçalaşor** *hidr., mür* Abşeron yarımadasının q hissəsində şor sulu göl Xırdalan qəsəbəsinin q -indədir Əyri formalı çalada (çökəklikdə) yerləşdiyi üçün göl belə adlandırılmışdır *Şor* komponenti Abşeron göllərinin adları üçün xarakterik olub, "göl" mənasındadır

**Əyriçay** *hidr., mür* 1 Oğuz, Şəki və Qax r-nları ərazisində çay Qanıx çayının sol qoludur Yuxarı hissəsində Daşağıl adlanır Böyük Qafqazın c yamaclarından axan Kış, Murdal, Şin, Küngüt və s dağ çayları bu çaya tökülür İlk dəfə VII əsrə aid mənbələrdə Kiş adı ilə qeydə alınmışdır. 2 İsmayıllı r-nunda çay Göyçay çayının sol qoludur Mənbəyini Baş Qafqaz silsiləsinin c ətəyindən (720 m yüksəklikdən) alır Hidronimlər çayların əyri formada qərbə tərəf axması ilə bağlı olaraq yaranmışdır

**Əyridağ** *or., mür.* Ordubad r-nunda dağ. Relyef quruluşuna görə adlandırılıb.

**Əyridərə** *oyk., sadə.* Gədəbəy r-nunun Hacılar i.ə.v.-də kənd. Dağətəyi ərazidədir. Keçmiş adı Hacımırzələr olmuşdur. Yaşayış məntəqəsi *Əyridərə* adlı yerdə Məşədi Məmay Hacı Mirzə oğlu tərəfindən salınmışdır.

**Əyrigüney** *or., sadə.* Şəki r-nu ərazisində dağ silsiləsi. R-nun şm.-ından c.-a doğru uzanır. Hün. 1658-2066 m. Dağ silsiləsi öz sahəsindəki *Əyrigüney* adlı yerin adı ilə adlandırılmışdır. Oronim *əyri* və *güney* (gün düşən tərəf) sözlərindən düzəlib.

**Əyrik** b.a.x. Əyərək.

**Əyriqaya** *or., mür.* Şəmkir r-nunda dağ. Oronim quruluşuna görə adlandırılmışdır.

**Əyritala** *oyk., mür.* Balakən r-nunun Hənifə i.ə.v.-də kənd. Alazan-Əyriçay çökəkliyindədir. Yaşayış məntəqəsi XIX əsrin sonlarında Əyriçayın sahilində yerləşən talada salındığı üçün belə adlandırılmışdır.

**Əyriyaylaq** *or., mür.* İsmayıllı r-nunda sıra dağlar. Baş Qafqaz silsiləsindən ayrılıb Göyçay və Pirsaat çaylarının suayrıcını təşkil edir. Ən yüksək zirvələri Qovdağ (2435 m.) və Əyriyaylaqdır (2285 m.). Oronim relyef cəhətdən təyin olunur.

**Əyrivəng** *oyk., mür.* Gədəbəy r-nunun İnəkboğan i.ə.v.-də kənd. Şahdağ silsiləsinin ətəyindədir. Yerli əhalinin məlumatına görə, kənd uçmuş, zəng qülləsi əyilmiş köhnə *vəngin* (*kilsənin*) yaxınlığında salındığına görə belə adlandırılmışdır.

**Əyyubbəyli** *oyk., sadə.* İsmayıllı r-nunun Qubaxəlilli i.ə.v.-də kənd. Gəncə yaylasının c.-q. ətəyindədir. Keçmiş adı Bədəlli olmuşdur. Yerli məlumata görə, *bədəlli* nəslinə mənsub ailələr *Əyyubbəy* adlı şəxsin rəiyyəti olduğundan kənd sonralar belə adlandırılmışdır.

**Əzgilli** *oyk., düz.* 1. Xanlar r-nunun Toğanalı i.ə.v.-də kənd. Kürəkçayın sahilində, Murovdağ silsiləsinin yamacındadır; 2. Zaqatala r-nunun Əli Bayramlı i.ə.v.-də kənd. Baş Qafqaz silsiləsinin yamacındadır. Yerli məlumata görə, oykonimlər bu kəndlərin ərazisində *əzgil* ağacının çox olması ilə bağlı yaranmışdır. Tədqiqatçılar belə güman edirlər ki, toponim erkən orta əsrlərdə qədim bulqar tayfa birliyinə daxil olan türkdilli *eskil/eşkil* tayfasının adı ilə bağlıdır.

**Əzgilli burun** *or., mür.* Kəlbəcər r-nunda dağ. Fitonimik oronimdir.

**Əzgilli dağ** *or., mür.* Qubadlı, Qəbələ, Laçın, Xocavənd r-nlarında dağ. Fitonimik oronimdir.

**Əzgilli dərə** *or., mür.* Ağsu, Qəbələ, Gədəbəy, Tovuz, Şəmkir, Şuşa r-nlarında dərə. Fitonimik oronimdir.

**Əzgilli dərə boğazı** *or., mür.* Gədəbəy r-nunda dağ. Fitonimik oronimdir. Oronim "Əzgilli dərə keçidi" mənasındadır.

**Əzgilli düz** *or., mür.* Qubadlı r-nunun Göyercik kəndi ərazisində düz. Fitonimik oronimdir.

**Əzgilli təpə** *or., mür.* Qəbələ r-nunun Nic kəndi ərazisində yüksəklik. Fitonimik oronimdir.

**Əzizabad** *oyk., mür.* Masallı r-nunun Qodman i.ə.v.-də kənd. Lənkəran ovalığındadır. Oykonim *Əziz* (ş.a.) və *abad* (kənd) komponentlərindən düzəlib, "Əzizə məxsus kənd" mənasındadır.

**Əzizbəyli** *oyk., sadə.* Qazax r-nunun eyniadlı i.ə.v.-də kənd. Ağstafa çayının sol sahilində, Gəncə-Qazax düzənliyindədir. Kənd *Məşədi Əzizbəyovun* şərəfinə adlandırılmışdır.

**Əzizbəyov** *oyk., sadə.* 1. Goranboy r-nunun eyniadlı i.ə.v.-də kənd. Gəncə-Qazax düzənliyindədir. Keçmiş adı Böyük Dəliməmmədli olmuşdur; 2. Xanlar r-nunun Yeni Əli Bayramlı i.ə.v.-də kənd. Gəncə-Qazax düzənliyindədir. Keçmiş adı Hacıməlik olmuşdur; 3. Şahbuz r-nunun Sələsüz i.ə.v.-də kənd. Naxçıvan çayının sahilində, dağ yamacındadır. Keçmiş adı Daylaqlı olmuşdur. Yaşayış məntəqələri *Məşədi Əzizbəyovun* şərəfinə adlandırılmışdır. Memorial toponimdir.

**Əznəbürd** *oyk., mür.* Babək r-nunun eyniadlı i.ə.v.-də kənd. Arazboyu düzənlikdədir. Əznəbird variantında da qeydə alınmışdır. Oykonim *əznə/azna* (türk dillərində "dar keçid") və *bürd/bird* (ər. "qala") komponentlərindən düzəlib, eyniadlı qala xarabalığının adındandır.





# Ff

**Fadılı** *oyk., sadə.* Xanlar r-nunun Lahıc i.ə.v.-də kənd. Pand silsiləsinin yamacındadır. Yerli əhalinin məlumatına görə, yaşayış məntəqəsinin əsasını *fadılı* nəslinə mənsub ailələr qoymuşlar. Oykonim 1917-ci ildə Fatılı variantında qeydə alınmışdır. Krımın Kuybışev r-nunda iki Fatı Sala yaşayış məntəqəsi var.

**Faxralı** *oyk., sadə.* Goranboy r-nunun eyniadlı i.ə.v.-də kənd. Gəncə-Qazax düzənliyindədir. Mənbələrin məlumatına görə, yaşayış məntəqəsini XVIII əsrdə baş vermiş siyasi hadisələrlə əlaqədar Gürcüstanın Borçalı mahalındakı *Faxralı* kəndindən köçüb gəlmiş ailələr salmışlar. Köçüb gələnlər köhnə yaşayış məntəqəsinin adını məskunlaşdıqları yeni kəndə vermişlər. Azərb. dilinin dialektlərində *faxralı* "ağıllı, bilikli, savadlı" deməkdir.

**Faldar** *hidr., sadə.* Zaqatala r-nunda çay. Tala çayından ayrılıb sol tərəfdən Qanıx çayına tökülür. Suvarma üçün istifadə edilir. Çay ərazisindən axdığı *Faldarlı* kəndinin adını daşıyır. Kəlbəcər r-nunda da eyniadlı çay qeydə alınmışdır.

**Faldarlı** *oyk., sadə.* Zaqatala r-nunun Qandax i.ə.v.-də kənd. Alazan-Əyriçay çökəkliyindədir. Müxtəlif illərdə gah Faldar, gah da Faldarlı variantında qeydə alınmış bu oykonim, tədqiqatçıların ehtimalına görə, *faldarlı* adlı nəslin burada məskunlaşması nəticəsində yaranmışdır.

**Farmaçtəpə** *or., mür.* Laçın r-nu ərazisində, Qarabağ yaylasında dağ. İldırımsu (Hocazsu çayının qolu) və Minkənd (Zabux) çaylarının suayrıcıdır. Hün. 2330 m. Yay otlağıdır. Yerli əhali bu dağı Fərməştəpə adlandırır. Dağın zirvəsi *fərmaşa* (*məfrəş, döşənəcək*) oxşadığı üçün belə adlandırılmışdır.

**Farux** *oyk., sadə.* Xocalı r-nunda kənd. Dağətəyi ərazidədir. Yaşayış məntəqəsinin əsasını *Farux* adlı şəxs qoyduğu üçün belə adlandırılması ehtimal edilir. Kəndin yaxınlığında Farux gölü və Farux yeri adlı obyektlər də qeydə alınmışdır. Oykonim 1907-ci və 1918-ci illərdə fəaliyyət göstərmiş müxtəlif millətlərin zəhmətkeşləri arasında beynəlmiləlçiliyi möhkəmləndirmək məqsədi güdən *Faruq* (hərfi mənası "Ədalət tərəfdarı") sosial-demokrat qrupunun adı ilə də bağlı ola bilər.

**Fatmabil** *hidr., mür.* Abşeronda göl. Hidronim Abşerondakı *Fatmayı* kəndinin adından və *bil* ("çuxur" burada "kiçik göl" mənasındadır) komponentlərindən düzəlib, "Fatmayı gölü" deməkdir.

**Fatmayı** *oyk., sadə.* Abşeron r-nunun eyniadlı i.ə.v.-də kənd. Abşeron yarımadasındadır. Bəzi mənbələrdə yaşayış məntəqəsinin XVIII əsrdə Salyan hakiminin dul qalmış qadını *Fatma xanımın* tabeliyində olan ailələr tərəfindən salındığı üçün belə adlandırılması fikri irəli sürülür. Oykonimin səfəvilər dövründə şiəliyin geniş yayılması ilə bağlı yaranması da mümkündür. Məlumdur ki, ərəb xəlifələri sülaləsindən biri islam dininin şiə məzhəbindən olan və Məhəmməd peyğəmbərin qızı, İmam Əlinin arvadı Fatimənin nəslindən hesab edilən *Fatimilər* idi. İmam Əlini özlərinə rəhbər tutan qızılbaşların dövründə belə toponimlərin yaranması mümkündür. Kəndin ərazisində XVIII əsrə aid Hacı Heybət məscidinin olması da bu versiyanın mümkünlüyünü təsdiqləyir. Krımın Baydar vadisində Fatmakoba adlı mağara düşərgəsi qeydə alınmışdır.

**Fazil** *oyk., sadə.* Şəki r-nunun Aşağı Küngüt i.ə.v.-də kənd. Əyriçayın sahilində, Alazan-Əyriçay çökəkliyindədir. Oykonim 1917-ci ildə Fazilli, 1933-cü ildə isə Fazılkənt variantında qeydə alınmışdır. Yerli əhalinin verdiyi məlumata görə, yaşayış məntəqəsinin əsasını *Fazil* adlı şəxs qoyduğuna görə kənd onun adını daşıyır.

**Fəxrəküş** *hidr., sadə.* Şamaxı r-nu ərazisində göl. Saqiyan kəndi yaxınlığında yerləşdiyi üçün Saqiyan gölü də adlanır. 730 m hündürlükdə yerləşir. Şirin sulu axarsız kiçik göldür. Mal-qaranı suvarmaq üçün istifadə edilir. Vaxtilə bu gölün kənarında Fəxrəküş adlı köç olmuş, sonralar dağıdılmışdır (1917-ci ilin məlumatına görə). Göl həmin köçün adını daşıyır. Coğrafi ad *faxri* (faxralı) və *küş* (bir hissə, parça) komponentlərindən düzəlib, "faxralıların bir hissəsi" deməkdir.

**Fərcan** *oyk., sadə* Qubadlı r-nunun eyniadlı i.ə.v.-də kənd. Dağətəyi ərazidədir. Əsl adı Fərəcandır. Keçmiş adı Sarallı Fərcan olmuşdur. Kənd sarallı tayfasının qışlaq yerində *fərcan* nəslinə mənsub ailələr tərəfindən salındığı üçün belə adlandırılmışdır.

**Fərəcan** *oyk., düz.* Laçın r-nunun Aşağı Fərəcan i.ə.v.-də kənd. Dağətəyi ərazidədir. Tədqiqatçıların məlumatına görə, kənd keçmişdə Fərəc adlanmışdır və Səfiyan kəndindən Fərəc adlı bir şəxsin yaxın adamları ilə köçüb məskunlaşması nəticəsində yaranmışdır. Sonralar *Fərəc* şəxs adının sonuna cəmlik bildirən *-an* şək.-si əlavə olunmuşdur. Oykonim "fərəclər" və ya "Fərəc yeri" mənasındadır.

**Fərəcullalı** *oyk., düz.* Cəlilabad r-nunun Cəngan i.ə.v.-də kənd. Dağətəyi ərazidədir. Keçmişdə Lənkəran qəzasında maldarlıqla məşğul olmuş pirəmbəl tayfasının 5-ci qoluna məxsus yeddi ailənin başçısı sahibkar *Fərəculla* olmuşdur. XIX əsrin axırlarında həmin ailələrin oturaqlaşması nəticəsində yaranmış yaşayış məntəqəsi Fərəcullanın adı ilə adlandırılmışdır.

**Fərəhli** *oyk., sadə* Qazax r-nunun Alpout i.ə.v.-də kənd. Gəncə-Qazax düzənliyindədir. Yaşayış məntəqəsi XIX əsrin II yarısında r-nun Ağköynək kəndindən köçüb gəlmiş ailələrin məskunlaşması nəticəsində yaranmışdır. Bəzi tədqiqatçılar oykonimin əslinin Fəxrəli olduğunu güman edirlər. XX əsrin əvvəllərində Qazax qəzasında Faxralı adlı qışlaq və Fərəhli adlı kənd qeydə alındığından bunlar ayrı-ayrı toponimlərdir. Türk dillərində *fərəhli* sözü "genişlik, açıq yer" mənasında işlənir. 1917-ci ildə Cavanşir qəzasında Fərəhqanlı adlı yaşayış məntəqəsi də qeydə alınmışdır.

**Fərraş** *oyk., sadə* Laçın r-nunun Vaqazin i.ə.v.-də kənd. Dağlıq ərazidədir. Yaşayış məntəqəsi XIX əsrdə Zəngəzur qəzasında maldarlıqla məşğul olmuş sarallı tayfasına məxsus ailələrin məskunlaşması nəticəsində yaranmışdır. Tədqiqatçılar bu oykonimi *Fərraş* şəxs adı və ya orta əsrlərdə saray xidmətçisi vəzifəsi ilə əlaqələndirirlər. Əslində, *fəraş* sözü Azərb. dilinin qərb qrupu dialektlərində heyvanlara və bitkilərə aid olub "tez böyüyən, iriləşən, vaxtından əvvəl yetişən" mənasında işlənir.

**Fərraş** *hidr., sadə* Laçın və Kəlbəcər r-nları ərazisində çay. Adını ərazisindən axdığı eyniadlı yaşayış məntəqəsindən almışdır.

**Fərzalı** *oyk., sadə* Gədəbəy r-nunun Arabaçı i.ə.v.-də kənd. Dağlıq ərazidədir. Yerli əhalinin məlumatına görə, yaşayış məntəqəsini Qarabağdan gəlmiş *Fərzalı* adlı şəxs saldığına görə kənd onun adı ilə adlandırılmışdır. 1917-ci ildə Cavanşir qəzasında Fərzalıbəyli (1933-cü ildə Bərdə r-nunda Fərzalılar), Qazax qəzasında Fərzalı, (1933-cü ildə Şəmkir r-nunda Fərzalı Quşçu) kəndləri də qeydə alınmışdır. Oykonim Xələc tayfalarının bir tirəsi olan *fərzalıların* adını əks etdirir. Etnotoponimdir.

**Fərzəli** *oyk., sadə.* Cəlilabad r-nunun Astanlı i.ə.v.-də kənd. Fərzəli çayının sahilində, düzənlikdədir. Tam adı Kərbəlayı Fərzəli olmuşdur. Yerli əhalinin məlumatına görə, *Kərbəlayı Fərzəli* həmin kənddə məskunlaşmış maldar ailələrin başçısının adı olmuşdur. XIX əsrin axırlarında həmin ailələrin qışlaq yerində oturaqlaşması nəticəsində yaranmış yaşayış məntəqəsi Fərzəlinin adı ilə adlandırılmışdır. Oykonim 1917-ci ildə Fərzili variantında da qeydə alınmışdır. Kəndin adı 2003-cü ildən Fərzili kimi rəsmiləşdirilmişdir.

**Fərzəli** *hidr., sadə* 1. Bərdə r-nu ərazisində göl. Keçmiş Fərzalıbəyli kəndinin ərazisində yerləşdiyi üçün göl belə adlandırılmışdır; 2. Cəlilabad r-nunun Fərzəli kəndi ərazisində çay. Adını ərazisindən axdığı kənddən almışdır.

**Fərzəlioba** *oyk., mür.* Xaçmaz r-nunun Köhnə Xudat i.ə.v.-də kənd. Samur-Dəvəçi ovalığındadır. 1917-ci ildə Hacı Fərzəlioba variantında qeydə alınmışdır. Oykonim *Fərzəli* (ş.a.) və *oba* komponentlərindən düzəlib, "Fərzəlinin obası, Fərzəliyə məxsus oba" mənasındadır. Keçmiş oba sonralar daimi yaşayış məntəqəsinə çevrilmişdir.

**Fətəlilər** *oyk., düz.* Kəlbəcər r-nunun Abdullauşağı i.ə.v.-də kənd. Moz çayının sahilində, dağətəyi ərazidədir. Keçmiş adı Qaraçanlı olmuşdur. Yerli əhalinin məlumatına görə, yaşayış məntəqəsini Laçın r-nunun Qaraçanlı kəndindən köçüb gəlmiş *Qara Fətəli* adlı bir şəxs saldığına görə belə adlanmışdır.





**Fətəlikənd** *oyk., mür.* Saatlı r-nunun eyniadlı i.ə.v.-də kənd. Muğan düzündədir. Yaşayış məntəqəsini XIX əsrin sonlarında çarizmin köçürmə siyasəti nəticəsində rus kəndliləri *Severskoye* (şimali) adı ilə salmışdılar. 1977-ci ildən yazıçı-dramaturq *Mirzə Fətəli Axundovun* şərəfinə Fətəlikənd adlandırılmışdır. Memorial toponimdir.

**Fətəlipəyə** *oyk., mür.* Laçın r-nunun eyniadlı i.ə.v.-də kənd. Dağətəyi ərazidədir. Yaşayış məntəqəsi *Fətəli* adlı şəxsə məxsus *pəyə* (tövlə) yerində salındığı üçün belə adlandırılmışdır. "Fətəlinin pəyəsi, tövləsi" mənasındadır. Kənddə indiyə qədər əsas təsərrüfat heyvandarlıqdır.

**Fətullaqışlaq** *oyk., mür.* Cəlilabad r-nunun Şiləvəngə i.ə.v.-də kənd. 1917-ci ildə Fətullalı qışlağı adı ilə qeydə alınmışdır. *Fətullalı* XIX əsrdə talış zonasında yaşamış canşalı (cahanşahlı) tayfasının tirələrindən biri olmuş, kəndin ərazisi də həmin tirəyə mənsub qışlaq yeri imiş. Sonralar daimi yaşayış məntəqəsinə çevrilən kənd köhnə adını saxlamışdır.

**Fındığan** *or., sadə* Xızı r-nu ərazisində dağ. Dağ eyniadlı yaşayış məntəqəsinin ərazisində yerləşdiyi üçün belə adlandırılmışdır.

**Fındığan** *oyk., düz.* Xızı r-nunun Xızı i.ə.v.-də kənd. Ataçayın sahilində, dağətəyi ərazidədir. Tat dilində Fınduğan kimi tələffüz edilir. Oykonim *fındıq* (meyvə ağacı) və *-an* (cəmlik, çoxluq bildirən şək.) komponentlərindən düzəlib, "fındıq ağacları çox olan yer, fındıqlıq" deməkdir.

**Fındıqlı** *oyk., düz.* Zaqatala r-nunun Maqov i.ə.v.-də qəsəbə. Qala və Katex çayları sahilindədir. 1965-ci ildə təşkil olunmuş 1 nömrəli fındıqçılıq sovxozu fəhlələri üçün salındığına görə belə adlandırılmışdır.

**Fındıqlı** *hidr., sadə* Gədəbəy r-nu ərazisində çay. Babacan (Bəcan, Bacanka da adlanır) çayının qoludur. Ruslar tərəfindən qeydə alınarkən Funduqlu, Fundullu kimi də yazılmışdır. Çay həmin r-nun ərazisindəki Fındıqlı yeri adlı sahədən (Novosaratovka kəndi yaxınlığındadır) axdığı üçün belə adlandırılmışdır. XIX əsrdə çayın sahilində salınmış Novosaratovka yaşayış məntəqəsi də bir müddət Fındıqlı adı ilə tanınmışdır. Kəndin rus əhalisi bu yerə *Orexovaya qora* da deyir.

**Fındıqlıqışlaq** *oyk., mür.* Yardımlı r-nunda kənd. Peştəsər silsiləsinin yamacında, Salavat çayı sahilindədir. Yaşayış məntəqəsi keçmişdə Fındıqlı adlanan qışlaq yerində salındığına görə belə adlandırılmışdır.

**Fırıq** *oyk., sadə.* Quba r-nunun Güləzi i.ə.v.-də kənd. Baş Qafqaz silsiləsinin yamacındadır. Yaşayış məntəqəsi XIX əsrin ortalarında Afurca kəndindən çıxmış ailələrin indiki yerdə məskunlaşması nəticəsində yaranmışdır. Tədqiqatçılara görə, oykonim ər. "təriqət", "məzhəb", "kütlədən ayrılmış bir qrup" və ya "bölük" mənasında işlədilən *fərəq* sözü ilə bağlıdır. Fırıq variantında da qeydə alınmışdır. Əslində, oykonim RSDFP-nın Bakı Komitəsi yanında bolşeviklərin qabaqcıl dağıstanlı fəhlələrlə birlikdə təşkil etdikləri *Fəruq* (ədalət tərəfdarları) sosial-demokrat qrupunun (1907) adı ilə bağlıdır. Bu qrupa rəhbərlik edən Qazıməmməd Ağasiyevin və Müqtədir Aydınbəyovun adları da Azərb. toponimiyasında əks olunmuşdur.

**Fıstıqlı** *oyk., düz.* Qax r-nunun Qum i.ə.v.-də kənd. Qapıçayın sahilində, Alazan-Əyriçay çökəkliyindədir. Kənd *fıstıq* ağacı çox olan ərazidə salındığı üçün belə adlandırılmışdır.

**Filfili** *oyk., sadə* Oğuz r-nunun eyniadlı i.ə.v.-də kənd. Dağətəyi ərazidədir. Yerli əhalinin məlumatına görə, keçmişdə zəlzələ nəticəsində Qaladağ yaşayış məntəqəsi dağıldıqdan sonra əhali Filfili adlı yerə köçüb məskunlaşmış və sonralar burada yaranmış kənd də həmin yerin adı ilə adlandırılmışdır. Tədqiqatçıların fikrincə, oykonim *filfil* (udin dilində "yabanı istiot") sözündən və -li mənsubiyyət şəkilçisindən ibarət olub, "istiotluq" mənasındadır.

**Filfili** *hidr., sadə* Oğuz r-nu ərazisində çay. Türyançayın qoludur. Ağçay, Qalaçay, Xaçmaz çayı da adlanır. Çay öz adını yaxınlığındakı eyniadlı kəndin adından almışdır.

**Filizçay** *hidr., mür.* Balakən r-nu ərazisində çay. Balakən çayının qoludur. Keçmiş adı Qarabçay olmuşdur. Çayın hövzəsində zəngin *filiz yatağı* aşkar edildikdən sonra Filizçay adlandırılmışdır.

**Finge** *oyk., düz.* Laçın r-nunun Təzəkənd i ə v -də kənd. Dağətəyi ərazidədir. Fingən variantında da qeydə alınmışdır. XIX əsrdə Fingə dağ və qışlaq adları kimi qeydə alınmışdır. Kənd eyniadlı dağın ətəyində salındığı üçün belə adlandırılmışdır. Oykonimi bitki adı kimi də izah edirlər. Tədqiqatçıların bir qismi bu fikirdədir ki, oykonim kürd dilindəki *fin* (soyuq, sərin) və *ga/gah* (yer, məkan) komponentlərindən düzəlib, "soyuq yer, sərin yer" deməkdir.

**Fioletovka** *oyk., düz.* Biləsuvar r-nunun Biləsuvar qəsəbə i ə v -də kənd. Muğan düzündədir. Yaşayış məntəqəsini XX əsrin əvvəllərində Rusiyanın mərkəzi quberniyalarından köçürülmüş rus ailələri salmışlar. İnqilabçı İ T Fioletovun (1883-1918) şərəfinə adlandırılmışdır. Memorial toponimdir.

**Firuzabad** *oyk., mür.* Xanlar r-nunun Quşqara i ə v -də qəsəbə. Gəncə-Qazax düzənliyindədir. Yaşayış məntəqəsi qoyunçuluğun inkişafı ilə əlaqədar 1949-cu ildə yaranmışdır. Qəsəbəyə akademik Firuz Məlikovun (1902-65) adı verilmişdir. Memorial toponimdir.

**Fitdağ** *or., mür.* İsmayıllı r-nu ərazisində dağ. Basqal kəndindən şm.-ş.-də yerləşir. Hün. 1810 m. Orta əsrlərdə Şirvanşahların yay iqamətgahı və sığınacağı olmuşdur. Dağın döşündə daşdan müdafiə səddi çəkilmişdir. Dağa qalxmaq üçün Haramçayın yatağından təqr. 1 km piyada və ya atla qalxmaq lazımdır. Burada Qanlıqaya adlanan ərazidə Şirvan xanı Mustafa xanın (1791-1829) tikdirdiyi qalanın xarabalıqları var. Bəzi tədqiqatçılar oronimi İran mənşəli *pat* (qoruyan, müdafiə edən) sözü ilə bağlayırlar. Qalanın adının dağın adından olması da ehtimal edilir. Oronim *fit* (uğultu, fışıltı) və *dağ* (müsbət relyef forması) komponentlərindən düzəlib, "uğuldayan, fışıldayan dağ" deməkdir.

**Fiy** *or., sadə.* Oğuz r-nu ərazisində dağ aşırımı. Azərb.-la Dağıstan arasındakı sərhəddə, Baş Qafqaz silsiləsindədir. Hün. 3156 m. Bu aşırımdan keçən yol Xalxal və Samur (Dağıstanda) çaylarının hövzələrini birləşdirir. Aşırım Dağıstanın Fuy kəndi istiqamətində olduğu üçün belə adlandırılmışdır. Avar dilində *puy* "üfürmə, üfülmə, boran, çovğun" deməkdir. Kəndin mövqeyi onun adı ilə uyğundur.

**Fuqanlı** *oyk., düz.* Cəbrayıl r-nunun Şükürbəyli i ə v -də kənd. Düzənlikdədir. Keçmiş adı İmambağı olmuşdur. Bəzən İmambaş variantında da qeydə alınmışdır. Yaşayış məntəqəsini əlməmmədli, əlikeyxalı, rüstəmlilər və şammədli nəsillərinə mənsub ailələr salmışlar. Belə ehtimal edilir ki, Naxçıvanda XV əsrdən məlum olan *Fəqan* qalasından köçüb gəlmiş ailələrin məskunlaşması nəticəsində yaranmış bu kəndin adı "Fəqan qalasından gələnlər" mənasındadır.

**Füzuli** *oyk., sadə.* 1. Azərb.-nın c.-ş.-ində, İranla sərhəddə inzibati r-n. Mərkəzi Füzuli şəhəridir. R-nun ərazisi çay dərələri və yarğanlardan, hündür hamarlanmış təpəliklərdən ibarətdir. Arazın sol qolları olan Köndələnçay, Quruçay, Qozluçay r-nun ərazisindən axır. R-nun keçmiş adı Qaryagin olmuşdur; 2. Azərb.-da şəhər, eyniadlı inzibati r-nun mərkəzi. Köndələnçayın sahilində, Qarabağ silsiləsinin ətəyindədir. Qədim adı Qarabulaq olmuşdur. XIX əsrin 30-cu illərində çar hökumətinin köçürmə siyasəti nəticəsində mərkəzi quberniyalardan köçüb gələn malakanlar Zəngəzur qəzasının Bazarçay kəndində yerləşmişdilər. Lakin çəyirtkə onların məhsullarını məhv etdiyi üçün sonralar kütləvi olaraq Cəbrayıl qəzasının Qarabulaq kəndi ərazisində məskunlaşdılar və yaşayış məntəqəsi Malakan adlandırıldı. 1905-ci ildə kəndə 1826-1828-ci illər Rusiya-İran müharibəsinin iştirakçısı, çar ordusu polkovniki Qaryaginin adı verilmişdir. 1959-cu ildən Məhəmməd Füzulinin (1494-1556) şərəfinə Füzuli adlandırıldı; 3. Xanlar r-nunun Kolayır i.ə v.-də kənd. Gəncə-Qazax düzənliyindədir. Sovet hakimiyyəti illərində bir müddət inqilabçı B Sərdarovun adı ilə Sərdarabad, sonralar M Füzulinin şərəfinə Füzuli adlandırılmışdır; 4. Şəmkir r-nunun Təzəkənd i ə v -də qəsəbə. Gəncə-Qazax düzənliyindədir. Keçmiş adı Əzizbəyov adına sovxozun 2 nömrəli malikanəsi olmuşdur. Yerli əhali arasında İkinci şöbə də adlanırdı. Yaşayış məntəqəsini 1925-ci ildə həmin r-nun Qaracəmirli kəndindən və Cənubi Azərb.-dan gəlmiş ailələr salmışlar. 1965-ci ildə M Füzulinin adı ilə adlandırılmışdır. Memorial toponimdir.





# Gg

**Gaftoni** b a x. Haftoni.

**Gamışdağ** b a x. Camışdağ.

**Gamışovan** *hidr., mür.* Lənkəran r-nunda şirin sulu göl. Cil və Gamışovan adlanan iki hissədən ibarətdir. Qumbaşı çayı vasitəsilə Qızılağac körfəzi ilə birləşir. Ləgər, Sudaşarı və Boradigah çayları bu gölə tökülür. Göldə balıq yetişdirilir. Keçən əsrdə çay əkin sahəsini artırmaq məqsədilə gölün, demək olar ki, yarısı qurudulmuşdur. Hidronim "Camış gölü" mənasındadır.

**Gargar** *or., sadə.* Quba r-nu ərazisində dağ. Qrız kəndi yaxınlığında, Qudyal çayının sahilindədir. Dağın yolu 92 döngədən keçib gedir. Oronim qrız dilindəki *karkar* (döngə, dolama yol) sözündən olub, "dolama dağ yolu" mənasındadır.

**Garsavan** *oyk., mür.* Yardımlı r-nunun Kürəkçi i ə v -də kənd. Ağdağyurdu dağının ətəyindədir. Yerli əhali kəndi Gərsəvə adlandırır. 1917-ci ildə də kənd Gərsava variantında qeydə alınmışdır. Belə ehtimal edilir ki, oykonim talış dilindəki *qars* (əkin yeri) və *ava* ("oba" sözünün təhrif variantı) sözlərindən düzəlib, "əkin yeri yanında salınmış oba" mənasındadır. Yaşayış məntəqəsinin adının etnotoponim kimi "gorus oba" mənasında olması da ehtimal edilir.

**Gavahın** *oyk., mür.* Xocavənd r-nunun eyniadlı i ə v -də kənd. Qarabağ silsiləsinin ətəyindədir. Kəndin adı 1992-ci ilədək Gavahan variantında qeydə alınmışdır. XIX əsrdə Şuşa qəzasında eyniadlı dağ və yaşayış məntəqəsi olmuşdur. Oykonim qədim türk dillərindəki *gav* (dağ yamacı, eniş, sürüşkən yer) və *ahın/axın* (yüksəklik, zirvə) komponentlərindən düzəlib, "dağ ətəyi" deməkdir.

**Gavan** *or., sadə.* Ordubad r-nu ərazisində dağ. Bilev kəndindən şm.-də yerləşir. Hün. 1716 m. Tədqiqatçılar dağın adını orada bitən *gəvən* bitkisinin adı ilə əlaqələndirirlər. Azərb. dilinin qərb qrupu dialektlərində *gavan* sözü "uçurum", "sıldırım yer" mənasında işlənir. Dağın mövqeyi bu məna ilə uyğun gəlir.

**Gavran** *oyk., mür.* Yardımlı r-nunun Şiləvəngə i ə v -də kənd. Moran və Pərimbel dağlarının ətəyindədir. Oykonim müxtəlif illərdə Qovran (1917), Govxan (1933), Kavran (1979) variantlarında qeydə alınmışdır. Tədqiqatçılara görə, kəndin adı İran dillərindəki *gav* (öküz, mal) və *ran* (mal-qara saxlanılan yer) sözlərindən düzəlib, "maldarların yeri" mənasını bildirir. Lakin ehtimal etmək olar ki, yaşayış məntəqəsi "atəşpərəstlər" mənasında olan *Govuran* adı ilə bağlıdır.

**Gecəgözlü** *oyk., sadə.* Füzuli r-nunun Aybasanlı i ə v -də kənd. Dağətəyi düzənlikdədir. Oykonim Qarabağda yaşamış cavanşir tayfasına mənsub *gecəgözlü* tirəsinin adını əks etdirir. Etnotoponimdir.

**Gecəzur** *oyk., mür.* Şahbuz r-nunun Gömür i ə v -də kənd. Təpəlikdədir. Tədqiqatçılara görə, kəndin adı *gecə* (qaranlıq) və fars dilindəki *zur* (dərə) sözlərindən düzəlib, "qaranlıq dərə" mənasındadır. 2003-cü ildən kəndin adı Ağbulaq kimi rəsmiləşdirilmişdir.

**Gədəmiş** *oyk., düz.* Daşkəsən r-nunun Zinzahal i ə v -də kənd. Murovdağ silsiləsinin ətəyindədir. Yerli əhalinin verdiyi məlumata görə, kəndi vaxtilə Qazax mahalından gəlmiş ailələr salmışlar. Ehtimala görə, oykonim "çılpaq təpəyə, gədiyə çevrilmiş yer" mənasındadır. 1992-ci ildən kəndin adı dəyişdirilərək Suqovuşan olmuşdur.

**Gəndərə** *oyk., sadə.* 1. İsmayıllı r-nunun Həftəsov i ə v -də kənd. Girdiman çayının sahilində, dağlıq ərazidədir. Girdiman çayının hövzəsi kəndin yerləşdiyi sahədə daha da genişləndiyi üçün çayın həmin hissəsi Gəndərə adlanır. Kəndin adı da buradandır; 2. Yardımlı r-nunun Astanlı i ə v -də kənd. Dağətəyi ərazidədir. Yaşayış məntəqəsi XIX əsrdə mövcud olmuş Çunduza kəndinin binə yeri olmuşdur. Sonralar binə tədricən kəndə çevrilmişdir. Kənd Gəndərə (geniş dərə) adlı yerdə yerləşdiyi üçün belə adlandırılmışdır.

**Gəndərəçay** *hidr., mür.* Daşkəsən r-nu ərazisində çay. Çay axdığı geniş çay dərəsinin adını daşıyır.

**Genişkənd** *oyk., mür.* Saatlı r-nunun Məmmədabad i ə v -də kənd. Düzənlikdədir. 1964-cü ilədək Ağayevka adlanırdı. Oykonim *geniş* və *kənd* komponentlərindən düzə-

lib, "böyük, geniş ərazidə yerləşən kənd" mənasındadır

**Genlik** *oyk., sadə* Zəngilan r-nunun Zəngilan şəhər i ə v -də kənd Oxçu çayının sahilində, dağətəyi ərazidədir Kənd salındığı Genlik adlı yerin adını daşıyır Oykonim "geniş yer" mənasındadır

**Gədəbəy** *oyk., sadə* 1 Azərb -nın q.-ində inzibati r-n Şahdağ silsiləsinin şm. yamacında, Ermənistanla sərhəddədir Mərkəzi Gədəbəy qəsəbəsidir. Səthi dağlıqdır Ən hündür yeri c -da Şahdağ silsiləsinin suayrıcında Qocadağ zirvəsidir (3317 m) R-nun ərazisində mis filizi yataqları var. Ərazisindən Şəmkir, Zəyəm çayları axır; 2 Eyniadlı r-nun mərkəzi, ştq Şahdağ silsiləsinin şm ətəyində, 1460 m yüksəklikdə, Mis çayının sahilində yerləşir. Yaxınlığındakı Mağara dağının ətəyindən XIX əsrdən mis filizi çıxarılır İlk dəfə XIII əsrə aid mənbədə, qədim erməni dilində Qetabak qalası şəklində qeydə alınmışdır Həmin qalanın xarabalıqları indiki Gədəbəy yaxınlığındadır Yaşayış məntəqəsi öz adını həmin qaladan almışdır. Toponim qədim türk dillərindəki *ket, gedik* (təpə) və *bək* (keşikçi, gözətçi) sözlərindən düzəlib, "müşahidə məntəqəsi", "keşikçi məntəqəsi" mənasındadır. Yaşayış məntəqəsi 1863-cü ildə Qazaxdan çıxmış ailələr tərəfindən salınmışdır

**Gədəbəy** *hidr., sadə* Gədəbəy r-nu ərazisində çay Şəmkir çayının sol qoludur Mənbəyini Şahdağ silsiləsinin yamaclarından, 1770 m yüksəklikdən alır Çay adını eyniadlı yaşayış məntəqəsindən almışdır

**Gədəyli** b a x Gidəyli

**Gədəzeyxur** *oyk., mür* Qusar r-nunun eyniadlı i.ə v -də kənd Qusar maili düzənliyindədir Yaşayış məntəqəsi XIX əsrin əvvəllərində Məhərrəmkənddən çıxmış ailələrin məskunlaşması nəticəsində yaranmışdır Oykonim *gədə* (çubuqdan hörülmüş alaçıq) və ləzgi dilindəki *zeyxur* (yeni kənd, təzə kənd) komponentlərindən düzəlib, "çubuqdan hörülmüş alaçıqları olan yeni kənd" mənasındadır R-nun ərazisində Çubuqlu adlı kənd də var

**Gədl** *or., sadə* Abşeron r-nu ərazisində dağ. Baş Qafqaz silsiləsinin zirvələrindən biridir Hün 1223 m Dağ adını yaxınlığında mövcud olmuş eyniadlı yaşayış məntəqəsindən almışdır Ehtimal ki, kəndin adı Giyodı olmuş, tədricən indiki şəkildə tələffüz edilmişdir Oykonim tat dilindəki *giyo* (ot, çəmən) və *di* (kənd) sözlərindən düzəlib, "çəmənli kənd" mənasındadır

**Gədik** *oyk., sadə* Quba r-nunun Vəlvələ i ə v -də kənd. Gədik çayının (Vəlvələ çayının qolu) sahilində, dağətəyi düzənlikdədir Keçmiş adı Gədik Seyidlər olmuşdur Sonralar oykonimin ikinci komponenti ixtisara uğramışdır Toponimik termin kimi *gədik* türk dillərində, o cümlədən Azərb dilində "hündür dağ, dağ keçidi, aşırım" deməkdir Kənd belə bir coğrafi mövqedə yerləşdiyi üçün Gədik adlandırılmışdır Oykonim "gədikdə yerləşən Seyidlər kəndi" mənasındadır

**Gədikdağ** *or., mür* Zəngəzur silsiləsində, Şahbuz r-nu ilə Ermənistanın sərhədində aşırım Hün 2700 m Oronim *gədik* və *dağ* komponentlərindən ibarət olub, "belində keçid, aşırım olan dağ" deməkdir

**Gədikdərə** *hidr., mür* Yardımlı r-nu ərazisində çay Çayın mənbəyi gədikdən alındığı üçün belə adlandırılmışdır

**Gədikqışlaq** *oyk., mür* Quba r-nunun Vəlvələ i ə.v -də kənd. Qusar maili düzənliyindədir Yaşayış məntəqəsi Gədik kəndinə məxsus qışlaq yerində salındığı üçün belə adlandırılmışdır Oykonim "Gədik kəndinin qışlağı" mənasındadır

**Gəgəli** *oyk., sadə* Ağsu r-nunun eyniadlı i ə v -də kənd Ləngəbiz silsiləsinin ətəyindədir Yerli əhali arasında Göyəli kimi tələffüz olunur. Göyəli variantında da qeydə alınmışdır Keçmişdə yayı Dağlıq Şirvanda, qışı isə bu kəndin ərazisində keçirmiş *gəgəli* tayfasına mənsub ailələrin XIX əsrdə burada məskunlaşması nəticəsində yaranmışdır Əhalinin əsli Göylər kəndindəndir

**Gəgiran** *oyk., düz* Lənkəran r-nunun eyniadlı i ə v -də kənd Burovar silsiləsinin ətəyindədir Gəgirli variantında da qeydə alınmışdır Tədqiqatçıların ehtimalına görə, oykonim XIII əsrdə monqolların tərkibində Azərb -na gəlmiş türk mənşəli *kukır* tayfasının adından və talış dilində cəmlik və məkan bildirən *-an* şəkilçisindən ibarət olub, "kukırların məskəni" mənasındadır Etnotoponimdir Talış dilində Qəqrən kimi tələffüz edilən oykonimi "əyri-üyrü yollar" mənasında da izah edirlər Muğanda kəsilmiş ağacdan qalxan pöhrəyə də *gəgir* deyirlər Güman ki, meşə zolağı ilə zəngin olan ərazidə yerləşən bu kənd kəsilmiş meşənin yerində salındığından belə adlandırılmışdır *Gəgir* və *-an* (burada yer) komponentlərindən düzəlmiş bu oykonim "kəsilmiş meşə yeri" mənasında da ola bilər.

**Gəl** *oyk., sadə.* Culfa r-nunun Kırna i.ə v -də kənd Dağlıq ərazidədir XIX əsrə aid mənbələrdə Gal Caracur (Kiçik Gal), sonrakı ədəbiyyatlarda Qal, Hal kimi də qeydə alınmışdır Azərb dilinin dialektlərində *gəl, gal, qal, hal* sözlərinin hamısı qoyunçuluqla bağlı işlənir *Gəl* daşdan tikilmiş qoyun tövləsidir

**Gələbədin** *oyk., mür* Ağcabədi r-nunun eyniadlı i ə v -də kənd. Qarabağ düzündədir Tədqiqatçılara görə, oykonim *qala* və *badiyə* (ər "çöl, düzən") komponentlərindən ibarət "qala düzü" və ya *kal* (əkindən sonra dincə qoyulmuş sahə) və *badiyə* komponentlərindən düzəlmiş "dincə qoyulmuş əkin sahəsi" mənasındadır Oykonim Azərb dilindəki *gələbə* (ağıl, tövlə, yataq) və *din* (düşərgə, yaylaq) komponentlərindən ibarət olub, "yatağı, tövləsi olan yaylaq" mənasında da ola bilər

**Gəlinqaya** *or., mür.* 1. Daşkəsən r-nu ərazisində qaya, 2 Kəlbəcər r-nu ərazisində dağ, 3 Laçın r-nu ərazisində dağ; 4 Şərur r-nu ərazisində dağ. Ermənistanla sərhəddədir Hün 2970 m Salvartı dağının yaxınlığında, Salvartı gölünün ş -ində günbəzvarı dağdır. Qalınqaya variantında da qeydə alınmışdır Tədqiqatçılara görə, bu qayalar zahiri formasına görə gəlinə oxşadığından və ya keçmişdə bir gəlinin özünü bu qayadan atması ilə əlaqədar belə oronimlər yaranmışdır Lakin Azərb -da *galin/kalin* buynuzlu qoyun növüdür Uzaq keçmişdən bəri maldar ellərə yaylaq olmuş bu dağların həmin qoyun növünün adı ilə adlandırılması mümkündür

**Gəlinqaya** *oyk., sadə* Daşkəsən r-nunun Qabaqtəpə i ə.v -də kənd. Dağətəyi ərazidədir Kənd Gəlin qayası adlı dağın yaxınlığında salındığı üçün belə adlandırılmışdır

**Gəlmə** *oyk., sadə* Zərdab r-nunun eyniadlı i ə.v -də kənd Qarasu çayının sahilində, Şirvan düzündədir Keçmişdə Zərdab Gəlmə, Gəlməkənd də adlandırılmışdır XIX əsrin ortalarında Zərdab kənd icmasından çıxmış rəncbər (cütçü, əkinçi) ailələrin məskunlaşması nəticəsində yaranmışdır Oykonim "Zərdabdan gəlmə, Zərdabdan gələnlər" mənasındadır

**Gəmiqaya** *or., mür* Ordubad r-nu ərazisində dağ Nəsirvaz kəndindən 7 km şm.-ş -dədir Qədim zamanlardan Arazın sol sahilindəki düzən və dağətəyi ərazilərdə yaşamış tayfaların yaylaq yeri olmuşdur 1968-ci ildə dağda e ə III-I minilliklərə aid qayaüstü rəsmlər aşkar olunmuşdur Oronim Naxçıvan zonasında geniş yayılmış "Nuhun gəmisi" haqqındakı əfsanə ilə əlaqədar olaraq yaranmışdır

**Gəmir** *or., sadə* Oğuz r-nu ərazisində dağ aşırımı Oğuz və Daşağıl çaylarının hövzələri arasındadır Tədqiqatçılar oronimi türk dillərində "dağ başında dar yarğan, uçurum yer" mənasında işlənən *kömür* sözü ilə əlaqələndirirlər Azərb -nın şm r-nlarında da *gəm* sözü "dar, kiçik" mənasında işlənir

**Gəncə** *oyk., sadə* 1 Azərb -da şəhər Kiçik Qafqazın şm -ş ətəyində, Gəncə-Qazax düzənliyindədir 1804-cü ildə Gəncə rus qoşunları tərəfindən işğal edildikdən sonra şəhərin adı dəyişdirilərək çar I Aleksandrın arvadının şərəfinə Yelizavetpol (Yelizaveta şəhəri) adlandırılmışdı Çar generalı P D Sisianov Gəncə adını işlədənlərə xüsusi cərimə kəsmişdi 1918-ci ildə Azərbaycan Demokratik Respublikası dövründə şəhərin keçmiş adı Gəncə bərpa edilmişdi 1935-ci ildə sovet partiya və dövlət xadimi S M Kirovun şərəfinə Kirovabad adlandırılmış, Azərb Respublikası Ali Sovetinin 30 dekabr 1989-cu il fərmanı ilə şəhərin qədim adı yenidən bərpa edilmişdir Azərb -nın qədim şəhərlərindən biri olan Gəncənin adı orta əsr ərəb mənbələrində Cənzə, erməni mənbələrində Qandzak, gürcü mənbələrində Qandza kimi işlənmişdir Gəncənin adı ilk dəfə 712/713-cü ildə kəsilmiş metal pul üzərində zərb edilmişdir Mühüm ticarət-karvan yolu üzərində yerləşən Gəncə Bərdədən

sonra Arranın ikinci şəhəri hesab olunurdu X əsrin ortalarında Arranın paytaxtı Bərdədən Gəncəyə köçürülmüşdü XVIII əsrin ortalarında şəhər Gəncə xanlığının mərkəzi olmuşdur Gəncə toponiminin mənşəyi haqqında müxtəlif fikirlər mövcuddur Tədqiqatçıların bir qismi toponimi pəhləvi dilində "xəzinə, məhsul saxlanılan yer" mənasında olan *kaznaka* sözü ilə, digər qismi isə dilimizdəki *gencə* (genişlik) sözü ilə bağlayırlar Son tədqiqatlara görə, Gəncə qədim türkdilli *gəncək* tayfasının adını əks etdirir. Gəncək tayfası haqqında ilk dəfə Mahmud Kaşğari (XI əsr) məlumat vermişdir Bu tayfanın adı qırğızlarda *kenje*, türkmənlərdə *gəncik*, qazaxlarda *gəncə* şəklində əks olunur Bu xalqların dillərində *gəncə* sözünün "yeni", "yenicə, yeni gələn" mənaları vardır Orta Asiyada Gəncək şəhəri, Gəncəlu çayı, Gəncə çayı, Şimali Qafqazda Gəncəaul, Gürcüstanda Gənceti, Kabarda-Balkarda Gəncə çayı, Gəncə yaşayış məntəqəsi, Tacikıstanda Gəncə, Qazaxıstanda Kenje arık, Gəncə Kançay, Türkmənistanda Gəncə Qarabağ və s bu etnonimin daha çox su obyektləri ilə bağlı olduğunu göstərir Zəngilan r-nunun Rəzdərə kəndi yaxınlığında Gəncəbert adlı qala xarabalığı da mövcuddur Gəncək tayfasının sakların tərkibində yaranmaları güman edilir Gəncə-Qazax zonasının qədim adı da Sakasena olmuşdur; 2 Xanlar r-nunun Zurnabad i ə v -də qəsəbə Azbiokombinatın yanında salınmışdır 1966-cı ildən Gəncə adlandırılmışdır Qəsəbə adını yaxınlığından axan Gəncəçayın və qədim Gəncə şəhərinin adından almışdır 2003-cü ildən qəsəbənin adı dəyişdirilərək Nizami olmuşdur

**Gəncəçay** *hidr , mür* Daşkəsən, Xanlar r-nları və Gəncə şəhəri ərazisində çay Kürün sağ qoludur Murovdağ silsiləsinin şm yamacından (2814 m hündürlükdən) başlanır Mingəçevir su anbarına tökülür Zivlən və Dəstəfur çayları Gəncəçayın qollarıdır Çayın üzərində Zurnabad SES var XIII əsrə aid mənbələrə əsasən Gəncəçayın qədim adı Daruran olmuşdur Bu hidronimin bəzi tədqiqatçılar İran dillərindəki *darya* (çay) və *Arran söz*lərinin birləşməsi kimi "Arran çayı" mənasında olduğunu ehtimal edirlər Hidronimin qədim türk dillərindəki "qəzəblənmiş, kükrəyən" mənalı *darılan* sözündən olduğunu da düşünmək olar Müasir Azərb dilində həmin söz "darıxan, sıxılan" mənasında işlənməkdədir. Gəncəçayın adı qədim *gəncəklərin* adı ilə bağlıdır Etnotoponimdir

**Gəncəli** *oyk., düz* 1 Xaçmaz r-nunun Niyazoba i ə v.-də kənd Samur-Dəvəçi ovalığındadır, 2 Salyan r-nunun Çuxanlı i.ə v -də kənd Cənub-Şərqi Şirvan düzündədir Oykonim *Gəncə* (şəhər adı) və mənsubluq bildirən *-li* komponentlərindən düzəlib, "Gəncədən olanlar" mənasındadır Yaşayış məntəqələrini Gəncə şəhərindən köçüb gəlmiş ailələr saldığına görə belə adlandırılmışdır

**Gəncəvi** *hidr , sadə* Lerik r-nu ərazisində çay Lənkəran çayının sağ qoludur Mənbəyini Kömürgöy dağının ş yamacından (200 m hündürlükdən) alır Gəncəvü variantında da qeydə alınmışdır Tədqiqatçılar çayın adını ərəb dilindəki *kanisə* (atəşpərəst məbədi) və talış dilindəki *vü* (yer) sözləri ilə bağlayıb, "atəşpərəstlərin məbədi olan yer" kimi izah edirlər. Əslində, hidronim "gəncəklərin yeri" mənalı *Gəncəvü* adlı ərazinin adından yaranmışdır

**Gənclər** *oyk., sadə* Quba r-nunun Hacıhüseynli i ə v -də qəsəbə Qusar maili düzənliyindədir Yaşayış məntəqəsi 1965-ci ildə Samur-Dəvəçi kanalının 2-ci məntəqəsi yanında, orada çalışan fəhlə və qulluqçular üçün salınmışdır Qəsəbə kanalın çəkilişində əmək fəallığı göstərmiş Azərb gənclərinin şərəfinə belə adlandırılmışdır

**Gəndəbil** *oyk., sadə* Zərdab r-nunun Şıxbağı i ə v -də kənd Şirvan düzündədir XIX əsrin ortalarında Zərdab kəndindən çıxmış ailələrin Gəndəbil adlı yerdə məskunlaşması nəticəsində yaranmışdır Gəndəbil eyni zamanda bu ərazidəki gölməçənin adıdır Bu coğrafi ad *gənd* (fars "pis qoxulu, iyli") və *bil* (bataqlıq, gölməçə) komponentlərindən düzəlib, "pis qoxulu gölməçə" deməkdir

**Gəndov** *hidr , mür* İsmayıllı r-nunda min bulaqlar Gəndov kəndi yaxınlığında, Girdimançayın sağ sahilində yerləşir Suyu soyuq və kükürdlüdür Yerli əhali arasında Gəndəb kimi tələffüz edilir Hidronim fars dilindəki





*gənd* (pis iyli, pis qoxulu) və *ov/ab* (su) sözlərindən düzəlib, "pis iyli su" deməkdir

**Gəndov** *oyk., sadə*. 1. Dəvəçi r-nunun eyniadlı i ə v -də kənd. Samur-Dəvəçi ovalığındadır. Tədqiqatçılar kəndin adını gah yaxınlığındakı çayın suyunun yaratdığı pis qoxulu gölməçələrlə, gah da cod sulu, içməyə yararsız, zəy acısı dadan bulağın suyu ilə bağlayırlar; 2 İsmayıllı r-nunun Təzəkənd i ə.v -də kənd. Girdiman çayının sahilində, dağətəyi ərazidədir Yaşayış məntəqəsi yaxınlığındakı kükürdlü suyu olan Gəndov min bulağının adı ilə adlandırılmışdır; 3 Lerik r-nunun Osyedərə i ə v -də kənd Peştəsər silsiləsinin ətəyindədir. Kənd öz adını yaxınlığındakı kükürd qoxulu bulaq suyundan almışdır

**Gəndu** *hidr , mür* Abşeronda çay Hidronim tat dilindəki *gənd* (pis qoxulu, iylənmiş) və *-u* (ab sözünün yerli tələffüz forması) komponentlərindən düzəlib, "pis qoxulu su" deməkdir Bu da çay suyunun ətrafda yaratdığı gölməçələrlə bağlıdır

**Gənzə** *hidr , sadə* Ordubad r-nu ərazisində çay Arazın sol qoludur Mənbəyini Zəngəzur silsiləsinin c -q yamacından (2700 m yüksəklikdən) alır. Çayda güclü sel hadisələri baş verir Mənbələrdə Qanza variantında da qeydə alınmışdır Tədqiqatçılar hidronimi ərəb dilindəki *kənisə* (atəşpərəst məbədi, kilsə) sözünün təhrif olunmuş forması hesab edirlər Hidronimin *Qanza* variantı isə qədim Azərb dilində "coşan", "məcrasından çıxan, qəzəblənən" mənalarında işlənmişdir Azərb dilinin şimal qrupu dialektlərində *qanza* turşumuş qatığa deyirlər

**Gənzə** *oyk , sadə* 1. İsmayıllı r-nunun Qoşakənd i.ə.v -də kənd Girdiman çayının sahilində, Çilbiki dağının c -undadır Kənd öz adını yaxınlığındakı Gənzədağın adından almışdır Dağın başında qədim məbəd xarabalıqları qalmaqdadır XIX əsrə aid mənbələrin məlumatına görə, r-nun ərazisindəki Ximran və Həftəsiab kəndləri yaxınlığında yanar odlar olmuş və əhali bu yerə sitayiş etmişdir. Tədqiqatçılar oykonimi ərəb dilindəki *kənisə* (atəşpərəst məbədi) sözünün təhrif olunmuş forması hesab edirlər; 2 Ordubad r-nunun Ordubad şəhər i ə v -də kənd Gənzə çayının sahilində, Zəngəzur silsiləsinin ətəyindədir Kənzə variantında da qeydə alınmışdır Kəndin ərazisində qədim məbəd qalıqları var Oykonimin məbəd qalıqları ilə bağlı yaranmış olması güman edilir

**Gənzək** *hidr , düz*. Kür çayının qollarından biridir "Kiçik Gənzə" mənasındadır Qazax adı ilə də qeydə alınmışdır

**Gəray** *oyk., sadə* Quba r-nunun Alpan i ə v -də kənd Qusar maili düzənliyindədir Keçmiş adı Girey olmuşdur Keçən əsrin 20-ci illərinə qədərki ədəbiyyatlarda Gerey variantına da təsadüf olunur Tədqiqatçılara görə, oykonim türk dillərindəki *gırə* (əkilən, şumlanan yer) sözündəndir. Əslində, oykonim *gəraybəyli* nəslinin adını əks etdirir, etnotoponimdir

**Gəraybəyli** *oyk , sadə* İsmayıllı r-nunun Qubaxəlilli i ə v -də kənd Qaraməryəm tirəsinin ətəyindədir Digər adı Müskürlü olmuşdur Yaşayış məntəqəsi *gəraybəyli* nəslinin məskunlaşması nəticəsində yaranmışdır Gəraybəylilər Müskürlü kənd sakinlərinin təmsil olunduğu nəslin adıdır Keçmiş Quba qəzasının dairələrindən biri də Müşkür adlanırdı və Qubadakı Gəray kəndi də bu dairəyə aid idi

**Gərçəbulaq** *or , sadə* Şəmkir r-nunun c -unda dağ. Dağ Çəyir kəndindən ş -də yerləşir Hün 1472 m Gercəbulaq variantında da qeydə alınmışdır Dağ ətrafındakı eyniadlı bulağın adını daşıyır Bulağın adı isə *Gər(cə)* (cır tut ağacı) və *bulaq* (su obyekti) komponentlərindən düzəlib, "cır tut ağacı və ya cır tut meşəsi olan yerdəki bulaq" deməkdir

**Gərəkli** *oyk., sadə* Balakən r-nunun Qullar i ə v -də kənd Balakən çayının sahilində, Alazan-Əyriçay çökəkliyindədir. 1992-ci ilədək kəndin adı Poştbinə olmuşdur Yaşayış məntəqəsini XIX əsrdə Dağıstandan gəlmiş *Gərəkhacı* adlı şəxs saldığına görə belə adlandırılmışdır Hazırda kənddəki məhəllələrdən biri *gərəkhacılar* adlanır Etnotoponimdir Poştbinə oykonimi isə vaxtilə burada olan poçt məntəqəsinin adındandır

**Gərənə** *oyk , sadə* Bərdə r-nunun Güloğlular i ə v -də kənd Qarabağ düzündədir Əsl adı Qaranüydür Gərənə bu adın təhrif forması hesab olunur Oykonim *qara* (burada "sıx" mənasındadır) və *nüy* (Azərb dilinin dialektlərində "çaysahili meşəlik" deməkdir)

sözlərindən düzəlib, "çaysahili sıx meşəlik" mənasındadır XIX əsrin məlumatlarına görə, əkin və bağ üçün təmizlənmiş meşə yeri də yerli əhali arasında *nüy* adlanırdı

**Gərəgəzan** *or*., *mür* Qusar r-nu ərazisində dağ Baş Qafqaz və Yan silsiləsində, orta dağlıq qurşaqdadır Bəzən Kerkezan variantında da qeydə alınmışdır Yerli əhalinin verdiyi məlumata görə, oronim ləzgi dilindəki gerger (vələmir) sözündəndir Lakin dağın vələmir bitkisi ilə heç bir əlaqəsi ola bilməz. Oronim əslində, *gərə* (cərgə, sıra), *gəz* (gədiyin, dağ keçidinin ən alçaq hissəsi) və *-an* (burada cəmlik bildirir) komponentlərindən düzəlib, "alçaq keçidləri olan dağ silsiləsi" deməkdir

**Gərgər** *oyk*., *sadə* Gədəbəy r-nunun eyniadlı i ə v -də kənd Orta dağlıq qurşaqdadır XIX əsrdə Qarqar variantında da qeydə alınmışdır Yaşayış məntəqəsinin eramızın əvvəllərində Qafqaz Albaniyasında yaşamış türkdilli *qarqar* tayfasının adı ilə bağlılığı ehtimal edilir

**Gərməçatax** *hidr*., *mür* Ermənistan ərazisindən başlayaraq Şahbuz və Naxçıvan r-nlarından axan çay Cəhri çayının sol qoludur Əsli Gırməçataxdır Hidronim *girmə* (çayın keçid yeri) və *çatax* (ikibaşlı, qoşa, bir-birinə bitişik) komponentlərindən düzəlib, "keçid yerində qoşalaşan çay" mənasındadır

**Gərməşöylü** *oyk*., *düz* Gədəbəy r-nunun Çay Rəsullu i.ə.v -də kənd Şahdağ silsiləsinin (Kiçik Qafqaz) şm yamacındadır Əsl adı Gərməşovludur Yerli əhali arasında Gərməşöylü kimi tələffüz edilir Yerli əhalinin məlumatına görə, kəndi Düzrəsullu kəndinin bünövrəsini qoymuş Rəsul adlı şəxsin oğlu Məşədi Nəbi salmışdır Kənddəki nəsillərdən biri də rəsullu adlanır Yaşayış məntəqəsi vaxtilə *gərməşov* ağacının çoxluq təşkil etdiyi sıx meşənin talasında salındığından belə adlandırılmışdır Hazırda kəndin ərazisində tək-tək gərməşov ağacına təsadüf olunur Tovuz r-nunda Gərməşoylu dağ, Gərməşovlu qobu oronimləri qeydə alınmışdır

**Gərmətük** *oyk*., *mür* Lənkəran r-nunun eyniadlı qəsəbə i ə v -də ştq Lənkəran çayının sahilində, Lənkəran ovalığındadır Oykonim yerli əhali tərəfindən Qamətük şəklində tələffüz edilir Yaşayış məntəqəsinin adı talış dilindəki *gərm* (isti) və *tük* (bicarlıq, çəltik əkilən yer) sözlərindən düzəlib (burada -ə bitişdirici saitdir), "isti yerdə çəltik sahəsi" deməkdir

**Gəvik** b a x. Göyük

**Gəyən** *or*., *düz* Cəbrayıl r-nu ərazisində, Araz çayı sahilində düzənlik, Mil düzünün bir hissəsidir Göyən çölü, Gəyən düzü də adlanır Çölün q hissəsi İncəçöl, ş hissəsi isə Çaxmaqçöl adlanır Bir fikrə görə, oykonimin əsli Göyən olmuşdur Kəndin ərazisi yazda və payızda göy otla zəngin olduğundan keçmişdə maldar tayfaların köç vaxtı dayanacaqları olmuşdur Oronim *göy* ("yaşıl ot" mənasında) sözündən və məkan bildirən *-an* şəkilçisindən əmələ gəlib, "göy otlaq, göylük" mənasını bildirir Başqa bir fikrə görə, *göyən* sözü coğrafi termin olub, "təpəliklərin üstündəki geniş sahə, çöl, düz" mənasındadır Cənubi Azərb -da da Göyən kəndi qeydə alınmışdır

**Gəyəçöl** *oyk*., *sadə* Masallı r-nunun Musakücə i ə v -də kənd Lənkəran ovalığındadır Yaşayış məntəqəsini təqr. XVIII əsrin ortalarında Ərkivan kəndindən çıxmış ailələr özlərinə məxsus otlaq sahəsində salmışlar Kənd salındığı ərazinin adı ilə adlandırılmışdır Oykonim *gəyə/gəgə* (etn ) və *çöl* (düz, otlaq sahəsi) komponentlərindən düzəlib, "gəgələrə məxsus otlaq sahəsi" deməkdir

**Gicən** *oyk*., *düz* Qusar r-nunun Düztahir i ə v -də kənd Qafqaz silsiləsinin yamacındadır Gecən variantında da qeydə alınmışdır Oykonim *gic* (sərt tirə, dərin yarğan, burulğan) sözündən və *-an* (məkan bildirir) şək -sindən ibarət olub, "sərt tirələrdən, dərin yarğanlardan ibarət yer" mənasındadır

**Gicəki** *or*., *mür* Bakı şəhəri, Qaradağ r-nunun q -ində dağ Qobustan ərazisindədir Hün 1050 m Hicəki, Hicakı variantlarında da qeydə alınmışdır Tədqiqatçılara görə, oronim İran dillərinə məxsus *gic* (dəli), *-ə* (bitişdirici sait) və *kıh/kuh* (dağ) hissələrindən ibarət olub, "dəli dağ" deməkdir Azərb oronimiyasında *gıcə* "dolanbac, burulğan" mənalarında işlənir Dağın ərazisində eyniadlı palçıq vulkanı da vardır





**Gicəl** *or*., *sadə* Qax r-nu ərazisində dağ İlisu kəndindən şm -ş -də, Baş Qafqaz silsiləsinin c yamacındadır Hün. 2680 m Oronim Gicə variantında da qeydə alınmışdır Yerli əhali arasında *gıcəl* kəndalaş bitkisinə deyilir Tədqiqatçılar oronimi bu sözlə əlaqələndirərək "kəndalaş bitən dağ" kimi izah edirlər

**Gidəyli** *oyk*., *sadə*. İsmayıllı r-nunun Hacıhətəmli i.ə v -də kənd Kəndin adı XIX əsrdə Haputlu Gidəyli kimi qeydə alınmışdır Haputlu adlı kəndlərin əhalisi Quba qəzasından gəlmələrdir Sonralar oykonimin birinci komponenti ixtisara uğramışdır *Gidəyli* komponenti isə etnotoponimdir Tədqiqatçılar göstərirlər ki, Orta Asiyanın ş -ində qırğız buqu qəbiləsində, həmçinin Altayda xemçik tuva tayfası tərkibində *gedey* tayfa adına rast gəlinir

**Gigəlzirvə** *or*., *mür* Qax r-nu ərazisində dağ Azərb dilinin bir çox dialektlərində *gigəl* (*kükəl*) sözü "yaşıllıq, otluq, alaqotu" mənasında işlənir. Oronim "zirvəsi otluq olan dağ" mənasındadır

**Gigidağ** *or*., *mür* Qobustanda palçıq vulkanı Hün. 176 m Qədim türk dillərində *gıgı/kıkı* "uğultu, xırıltı" mənasında işlənmişdir Dağın adı onun vulkan mənşəli olub, vaxtaşırı müəyyən səslər çıxarması ilə bağlıdır

**Gil** *or*., *sadə* Xəzər dənizində, Bakı arxipelaqında ada Palçıq vulkanının püskürməsindən əmələ gəlmişdir Gil Zirə, Süxtəki, Qlinyanı (rus "gil") adı ilə də qeydə alınmışdır Ada gilli süxurlardan ibarət olduğundan belə adlandırılmışdır

**Gil Zirə** b a x Gil adası

**Gilah** *oyk*., *sadə* Qusar r-nunun eyniadlı i ə v -də kənd Qusar maili düzənliyindədir Yaşayış məntəqəsi ləzgilərin məskunlaşdığı kəndlərdəndir Oykonim *gilək* etnoniminin bir qədər təhrifə uğramış formasıdır

**Gilahoba** *oyk*., *mür* Qusar r-nunun Gilah i ə v -də kənd Qusar maili düzənliyindədir Kəndin ərazisi Gilah kəndinə məxsus oba yeri olmuşdur Keçən əsrin 30-cu illərində Gilah kəndindən çıxmış bir qrup ailənin məskunlaşması nəticəsində yaranmışdır

**Gilan** *hidr*., *sadə* Ordubad r-nunda çay Arazın sol qoludur Zəngəzur silsiləsinin c -q. yamacı ilə axır Əsl dağ çayıdır Əsas qolu Parağadır. Mənbələrin məlumatına görə, Sasani şahı I Xosrov Ənuşirəvan (531-579) indiki Aşağı Aza, Yuxarı Aza və Dər kəndləri ərazisində İran Gilanından gətirilmiş əsirləri məskunlaşdırmışdı Sonralar bu ərazidə (Ordubaddan 16-17 km q -də) Gilan şəhəri yaranmışdır XIV əsrin sonunda Teymur Gilanı dağıtmış, I şah Abbas dövründə (1587-1629) isə şəhər tamamilə tənəzzülə uğramış, əhalisi Yuxarı Aza, Aşağı Aza və Dər ərazisinə köçmüşdü Gilanın xarabalığı xalq arasında Xarabagilan adı ilə tanınır Çayın adı da Gilan şəhərinin adı ilə bağlıdır Gilançay variantında da qeydə alınmışdır *Gilanlılar* və ya *giləklilər* İranda, Xəzər dənizinin c sahillərində yaşayan xalqın adıdır

**Gilançay** *oyk*., *sadə* Ordubad r-nunun Parağa i.ə v -də kənd Dağətəyi ərazidədir Yaşayış məntəqəsi adını ərazidəki Gilan çayının adından almışdır

**Gilar** *oyk*., *sadə* Yardımlı r-nunun Şəfəqli i ə v -də kənd Viləş çayının sol sahili ilə İran sərhədi arasında dağətəyi ərazidədir Yaşayış məntəqəsini irandilli *gil* tayfasına mənsub ailələr salmışlar Oykonimin tərkibindəki *-ar* cəmlik, nəsli mənsubiyyət bildirən şonluqdur Etnotoponimdir Qədim Volqa Bulqarıstanında XIII-XIV əsrlərdə Gilan şəhəri və gilan tayfası qeydə alınmışdır

**Gilədərə** *oyk*., *mür* Lerik r-nunda köç yeri Oykonim *gil* (gillər) və *dərə* (mənfi relyef forması) komponentlərindən düzəlib (*-ə* bitişdirici saitdir), "gillərə məxsus dərə" deməkdir

**Giləpərqə** *oyk*., *mür* Astara r-nunun Siyəku i ə v -də kənd Lənkəran ovalığındadır Yerli əhalinin məlumatına görə, yaşayış məntəqəsi XIX əsrin əvvəllərində salınmışdır Oykonimi tədqiqatçılar *gələpırqə* (talış "qoyun sürüsü otlayan yer, örüş") və ya *giləpərqə* (gül kimi yumşaq, gül kimi təmiz) sözlərinin təhrif olunmuş forması hesab edirlər Əslində, oykonim *gilələrin* adı ilə bağlıdır

**Giləşə** *oyk*., *sadə* Astara r-nunun Siyəku i ə v -də kənd Lənkəran ovalığındadır Oykonimin Azərb dilindəki *küləş* sözünün talışca "saman, samanlıq" mənasını verən *giləşə* variantında olması ehtimal edilir Yerli

əhalinin məlumatına görə, yaşayış məntəqəsi xırman olan sahədə, samanlıqda salındığı üçün belə adlandırılmışdır. Ərazidəki evlərin tikilməsində saman qarışdırılmış gil kərpiclərdən istifadə olunur Başqa bir fikrə görə, oykonim *Nilavışa* adının təhrif forması olub, "nil meşəsi" mənasındadır

**Gilezi** *oyk., mür* Xızı r-nunun eyniadlı i.ə v.-də kənd. Düzənlikdədir Əsl adının Gilyazı olduğu göstərilir Tədqiqatçıların fikrincə, oykonim *gil* və *yazı* (düzən) sözlərindən düzəlib, "gil torpaqlı düzən" mənasındadır XIV əsrdə Barmaq dağının yaxınlığında Gilezi adlı yer olduğu göstərilir. 1870-ci ildə kəndin yerində poçt məntəqəsi (çaparxana) vardı Sonralar poçt məntəqəsi d.y. stansiyasına, daha sonralar isə yaşayış məntəqəsinə çevrilmişdir Oykonimi "gellərin çölü, gellərin düzü" kimi də izah etmək olar

**Gilezi dili** *or. mür* Xəzər dənizinin q. sahilində, Samur-Dəvəçi ovalığının c.-ş. hissəsində çıxıntıdır Gilezi düzünün adı ilə adlandırılmışdır

**Gilgil** *hidr., mür* Siyəzən və Quba r-nları ərazisində çay. Mənbəyini Gülümdostu dağının yamacından (1980 m yüksəklikdən) alır, Xəzər dənizinə tökülür Suyu çox gilli olub, minerallaşmışdır Çayın hövzəsində isti və soyuq min bulaqlar vardır Əsl adının Gilgir olduğu söylənilir Hidronim *gil* və *ger* (tat. "olan", "saxlayan") sözlərindən düzəlib "bulanıq, gilli çay" mənasındadır

**Gilgilçay** *oyk., sadə* Siyəzən r-nunun Həmyə i.ə v.-də fəhlə qəsəbəsi Samur-Dəvəçi ovalığındadır Keçən əsrin ikinci yarısında yaranmışdır Yaşayış məntəqəsinin adı Gilgilçayın adı ilə bağlıdır

**Gillikdağ** *or., mür* Xanlar r-nu ərazisində dağ Hün 772 m Dağın ərazisində qədim yaşayış məskəni aşkar edilmişdir. Oronim *gillik* (gildən ibarət) və *dağ* (müsbət relyef forması) komponentlərindən düzəlmişdir Dağın adı Kilikdağ variantında da qeydə alınmışdır

**Gilvar** *oyk., mür* Dəvəçi r-nunun Pirəbədil i.ə v.-də kənd Yan silsiləsinin şm.-ş. ətəyindədir V əsrə aid erməni mənbəyində Qluar və ya Qlvar adlı yer və onun qluarlar adlanan əhalisi haqqında məlumat verilir Tədqiqatçılar oykonimi eranın əvvəllərində Gilandan köçmüş *gellərin* adı ilə bağlayırlar

**Gilyanov** *oyk., sadə* Quba r-nunun Zərqova i.ə v.-də kənd Şabran çayının sahilində, Baş Qafqaz silsiləsinin ətəyindədir Kəndin ərazisi keçmişdə Dərk kəndinin qışlağı olmuşdur Qışlağın adı oradakı *Kəlanov* bulağının adındandır Sonralar Dərk və ətraf kəndlərdən köçüb gəlmiş ailələr burada məskunlaşmışlar Toponim tat dilində *kala* (böyük) və *nov* (quyu, gölməçə) sözlərindən düzəlib, "böyük quyu, böyük göl" deməkdir

**Girdabad** *or., mür* Quba r-nu ərazisində dağ Qaraçay və Babaçayın suayrıcıdır Hün 2406 m Oronim *girdə* (yumru) və *bad* (yüksəklik, yamac, dağ döşü, dağ ətəyi) komponentlərindən düzəlib, "yumru dağ yamacı" mənasındadır

**Girdədo** *or., mür* Lənkəran r-nunda, Alaşar-Burovar silsiləsinin ş. yamacında zirvə Hün 824 m. Tədqiqatçılara görə, oronim talış dilindəki *girdə* (yumru, dəyirmi) və *do* (ağac) sözlərindən düzəlib, "dəyirmi meşəlik" mənasındadır Dağ ərazisindəki yumru, girdə formalı hündürlükdə ağaclıq olduğuna görə belə adlandırılmışdır

**Girdəlmilik** *or., mür* Oğuz r-nu ərazisində dağ Baş Qafqaz silsiləsinin c. yamacındakı zirvələrdən biridir Hün 2186 m Oronim *girdə* (tamamilə, büsbütün, başdan-başa) və *almalıq* (alma ağacları olan yer) komponentlərindən düzəlib, "başdan-başa almalıq olan yer" deməkdir Oronim dağın ətəyində cır alma meşəsinin olduğunu göstərir

**Girdə** *oyk., sadə.* Ağsu r-nunun Gürcüvan i.ə v.-də kənd Dağ yaylasındadır Kənd yaxınlığındakı Girdə dağın adı ilə adlandırılmışdır

**Girdə** *or., sadə* Şamaxı r-nu ərazisində, Ləngəbiz sıra dağlarının c.-ş.-ində zirvədir Dağ *girdə* (yumru, dəyirmi) formalı olduğuna görə belə adlandırılmışdır

**Girdəcə** *or., düz* Qəbələ r-nu ərazisində dağ Baş Qafqaz silsiləsinin c. yamacında, Qum və Tikanlı çaylarının suayrıcındadır Hün 1584 m Oronim *girdə* (yumru, dəyirmi) sözündən və *-cə* şək.-sindən düzəlib, "yumru relyef formalı yüksəklik" deməkdir





**Girdəni** *oyk., düz* Lənkəran r-nunun eyniadlı i.ə v.-də kənd Lənkəran ovalığındadır Keçmiş adı Rəzı Girdəni olmuşdur *Rəzi* talış "tənəklik, üzümlük" deməkdir Oykonim talış dilində Qırdəni şəklində tələffüz edilir Bəzi tədqiqatçılar kəndin adını *qırdə* (yığılmış, yığcam) sözündən və *-ni* (*-ma, -mə* inkarlıq ədatı) şək.-sindən ibarət "evləri dağınıq, pərakəndə kənd" kimi izah edirlər Lakin Azərb toponimiyasında *girdə* coğrafi termin kimi dairəvi relyef formasında olan hündürlüklərə deyilir *-ni* şəkilçisi *-li* (mənsubluq bildirir) şək.-sinin yerli tələffüz formasıdır R-nun ərazisində eyniadlı çay da var

**Girdiman** *hidr., sadə* İsmayıllı, Ağsu və Kürdəmir r-nları ərazisində çay Kürün sol qoludur Baş Qafqaz silsiləsinin, Babadağın c. yamaclarından (2900 m yüksəklikdən) başlanıb, Qaraməryəm yaylası qarşısında bir neçə qola ayrılır və Şirvan düzünə çıxır Aşağı axınında suyu kanalla Ağsu çayına axıdılır Çayda sel hadisələri olur Hidronim erkən orta əsrlərdə mövcud olmuş, Qafqaz Albaniyasının tərkibinə daxil olan Girdiman tarixi vilayətinin adındandır. Vilayətin adı isə Girdiman qalasının adından alınmışdır Tədqiqatçıların ehtimalına görə, bu qala İsmayıllı r-nunun Talıstan kəndi yaxınlığında, Ağçayın sahilində, sıldırım qaya üzərində yerləşən Cavanşir qalasıdır Fələki Şirvani (XII əsr) bu qalanı Gindimanqala adlandırmışdı Erməni mənbələrində Qardman kimi adı çəkilən bu əyalət Uti nahiyəsinin 6 əyalətindən biri olub, Girdiman hökmdarlığının mərkəzi idi Bəzi tədqiqatçılar toponimin İran mənşəli *karta* (qala) sözündən və məkan bildirən *-man* şəkilçisindən olduğunu söyləyirlər

**Girgican** *hidr., mür* Şuşa r-nu ərazisində çay Qarqar çayının sol qoludur Hidronim *gir* (keçilməsi çətin olan, burulğan) və *gican* (suyun dönən yeri) komponentlərindən düzəlib, "dönən və ya burulğanlı çay" deməkdir

**Girik** *oyk., sadə* Qusar r-nunun Həzrə i.ə v.-də kənd Samur çayının sahilindədir Yerli əhalinin məlumatına görə, oykonim ləzgi dilindəki *küyqu* sözündən olub, "çaytikanı" deməkdir *Girik* sözü Azərb dilinin dialektlərində "çayın keçid yeri", türk dillərində isə "genilmiş, dartılmış, uzanmış" mənalarında işlənir

**Girovdağ** *or., mür* Əli Bayramlı r-nu ərazisində dağ Kür çayından sol tərəfdə yerləşir Hün 128 m Qırovdağ, Kürovdağ, Gürovdağ variantlarında da qeydə alınmışdır Tədqiqatçılar oronimi "qırovlu dağ" kimi izah edirlər Əslində, dağın adı Kür çayının adı ilə bağlı olub "Kür çayının sahilindəki dağ" deməkdir

**Gomuşçu** *oyk, sadə* 1 Saatlı r-nunun Varxan i.ə v.-də kənd. Muğan düzündədir; 2 Salyan r-nunun Qarabağlı i.ə v.-də kənd. Kürün sahilində, Şirvan düzündədir Tədqiqatçılar oykonimləri şahsevənlərin *gomuşçu* tayfasının adı ilə əlaqələndirirlər

**Gomuşəndərə** *hidr., mür* Lerik r-nu ərazisində çay Yerli əhalinin dilində Qomuşəndə adlanır Hidronim *gomuş* (camış), *-ən* (cəmlik şək.-si) və *dərə* (burada "çay dərəsi") komponentlərindən düzəlib, "camışlar dərəsi" mənasındadır Çay öz başlanğıcını eyniadlı dərədən alır Etnotoponim olması da mümkündür

**Goradil** *or. mür* Abşeron r-nunda dağ Abşeron yarımadasındadır Horadil variantında da qeydə alınmışdır Tədqiqatçılara görə, oronim tat dilindəki *oura* (qala) və ərəb dilindəki *tel* (təpə) sözlərindən ibarət olub, "qala təpəsi" mənasındadır

**Goradil** *oyk., sadə* Abşeron r-nunun Fatmayı i.ə v.-də kənd Abşeron yarımadasındadır Yaşayış məntəqəsini vaxtilə Biləcəri və Masazırdan köçüb gəlmiş ailələr yaylaq yerində salmışlar Oykonim ərazidəki eyniadlı dağın adındandır

**Goran** *hidr., sadə* Goranboy və Yevlax r-nları ərazisində çay Kürək çayının sağ qoludur Mənbəyini Gamış dağının şm.-ş. yamacından (3100 m yüksəklikdən) alır Aşağı hissəsində iki qola ayrılır, qolları Qaraçay və Quru Goran adlanır Suvarma və dəyirmanların hərəkətə gətirilməsi üçün istifadə edilir Üzərində SES vardır Çay adını ərazisindən axdığı qədim Goran yurdunun adından almışdır Tədqiqatçılara görə *goran* türk dillərindəki *qurıun/qurqun* sözündən olub "düşərgə" mənasındadır

**Goran** *oyk., sadə* Goranboy r-nunun Cinli Boluslu i ə v -də qəsəbə və d y stansiyası Düzənlikdədir Yaşayış məntəqəsi öz adını d y stansiyasından, stansiya isə yaxınlığındakı çaydan almışdır

**Goranboy** *oyk, sadə* 1 Azərb -da inzibati r-n Kür-Araz ovalığının q -ində yerləşir R-n şm -dan alçaq Bozdağ silsiləsi, c -dan Kiçik Qafqazın ətəkləri arasındadır Mərkəzi Goranboy şəhəridir R-nun c -unda böyük müalicə əhəmiyyəti olan yanmayan neft mədəni (Naftalan) yerləşir R-nun ərazisindən Goran və Kürək çayları axır R-n 1938-91-ci illərdə Qasım İsmayılov adlandırılmışdır, 2 Azərb -də şəhər, eyniadlı r-nun mərkəzi Gəncə-Qazax düzənliyindədir Keçmiş adı Boyəhmədli olmuşdur Əvvəllər Goran Boyəhmədli adı ilə də tanınmışdır Toponim *Goran* (coğrafi ad) və *boyəhmədli* (əhmədli tayfası) komponentlərindən düzəlib, "boyəhmədli tayfası məskunlaşdığı Goran" deməkdir Sonralar toponimin tərkibindəki əhmədli komponenti düşmüş və Goranboy kimi rəsmiləşdirilmişdir

**Goranqala** *or mür* Şərur r-nu ərazisində dağ. Şərqi Arpaçayının sahilindədir Keçmişdə maldar ellərin yaylaq yeri olmuş bu dağın adı kəbirli tayfasına məxsus *goran* tirəsinin adı ilə bağlıdır Goranboy r-nundakı Goran düzü, həmin r-nun Qarqucaq kəndi ərazisindəki Goran dərəsi, Daşkəsən r-nunun Qaraqullar kəndi ərazisindəki Goranlının düzü, Şamaxı r-nunun Kolanı kəndi ərazisindəki Goran yurdu yer adları da bu tirənin adı ilə bağlı olub, etnotoponimdir

**Goranlı** *oyk, düz* Goranboy r-nunun eyniadlı i ə v -də kənd Gəncə-Qazax düzənliyindədir XIX əsrdə Qarabağ düzündə maldarlıqla məşğul olmuş *goran* tirəsinin adı ilə bağlıdır XIX əsrdə Goran çayının sol sahilində, indiki Qayadamı deyilən yerdə yerləşən kənd Goran adlanırdı XX əsrin əvvəllərində həmin kənd Kürəkçayın sağ sahilinə köçmüş və Goranlı (Gorandan gələnlər) adlanmışdır

**Gorazıllı** *oyk, sadə.* Füzuli r-nunun Qarakollu i ə v -də kənd Dağətəyi düzənlikdədir Tədqiqatçıların ehtimalına görə, oykonim etnotoponim olub, *gorazıllı* nəslinin adını əks etdirir

**Gorus Ayrıbənd** *oyk, mür* Kürdəmir r-nunun Karrar i ə v -də kənd Şirvan düzündədir Mənbələrin məlumatına görə, maldar tayfalardan biri olan *goruslar* XVI əsrdə qızılbaş tayfalarının tərkibində olmuş, Səfəvi şahları onların bir hissəsini Şirvanda yerləşdirdikdən sonra onlar müxtəlif zonalara yayılmışlar XVIII əsrdə Şirvan xanlığında Sulut, Nuran və Zərqava kəndlərini əhatə edən Gorus mahalı olmuşdur XIX əsrdə isə bu mahalın tərkibində Çaparlı, Abasxanlı, Ağarx kəndlərinin adı çəkilir Gorusların adına Gorus təpəsi (Ağcabədi r-nu, Hindarx kəndi), Gorusqum dağı (Qazax, İmişli) və s. oronimlərdə də rast gəlmək mümkündür Oykonim *gorus* (etn ) və *Ayrıbənd* (kanal adı) komponentlərindən düzəlib, "Ayrıbənd kənarında yaşayan goruslar" mənasındadır

**Gorusqum** *or, mür* 1 Qazax r-nu ərazisində dağ, 2 İmişli r-nu ərazisində dağ Oronim *gorus* (etn ) və *qum* (dağın süxuru) komponentlərindən düzəlib, "goruslara aid qum dağı" mənasındadır

**Govurarx** *hidr, mür* 1 Mil düzündə qədim suvarma kanalı Araz çayından Qarqar çayınadək uzanırdı E ə 1 minilliyin sonuna aid edilən bu arx monqol hücumları zamanı dağıdılmış, XVI əsrin sonunda Teymur tərəfindən bərpa edildiyindən onun mənsub olduğu tayfanın adı ilə Barlas adlandırılmışdır XVIII əsrdə Nadir şahın dövründə yenidən dağıdılmış bu arxın yatağında Sovet hakimiyyəti illərində Orconikidze adına kanal çəkilmişdir Kanal Mil düzünün suvarılmasına xidmət edir; 2 Muğan düzündə qədim suvarma kanalı Araz çayından başlayıb indiki Biləsuvar r-nu ərazisindən keçirdi Sasanilər dövründə çəkildiyi ehtimal edilir Kanalın kənarında salınmış bir neçə qədim yaşayış məskəninin qalıqları var Əvvəllər atəşpərəstlərə verilən *kəbr* adı sonralar türkdilli xalqlarda *kafir* və ya *gavur* kimi işlənərək, ümumiyyətlə "dinsiz" hesab edilən xalqlara aid edilirdi Hidronimlər "gavurların çəkdiyi arx" mənasındadır Azərb -da islam dan əvvəl tikilmiş bir çox qalalar, qurğular tikililər gavurların adı ilə adlandırılmışdır





Gavurqala (Naxçıvan, Ağdam, Oğuz, Şəki, Qəbələ), Gavurxana (Qəbələ r-nun Vəndam kəndi) və s Türkmənistan, Qaraqalpaq Respublikasının Biruni r-nunda da Gavurqala adlı toponimlər qeydə alınmışdır

**Göbəktələ** *oyk, sadə* İmişli r-nunun Rəsullu i ə.v -də kənd. Düzənlikdədir Keçmiş adı Talıbxanlı olmuşdur Yaşayış məntəqəsini daşqın nəticəsində Araz çayı sahilindəki Talıbxanlı kəndindən köçmüş ailələr Göbəktələ adlanan ərazidə salmışlar Oykonim *göbək* (burada "orta, mərkəz" mənalarındadır) və *tala* (ətrafa nisbətən fərqli yer) komponentlərindən düzəlib, "orta tala" deməkdir

**Gödək** *or, sadə* Tovuz r-nunun şm hissəsində sıra dağlar Ən yüksək zirvəsi Gürzün dağıdır Hün. 609 m Sıra dağlar çox hündür olmadığından belə adlandırılmışdır

**Gödəkdaş** *or, mür* Tovuz r-nunun şm hissəsində, Kür çayından solda sıra dağlar Oronim *gödək* (qısa, alçaq) və *daş* (burada "dağ, qaya") komponentlərindən düzəlib, obyektin hündürlüyünü təyin edir Sıra dağlar öz adını buradakı Gödəkdaş adlı qayanın adından almışdır

**Gödəkdərə** *oyk, sadə* Gədəbəy r-nunun Şəkərbəy i ə v -də kənd Dağlıq ərazidədir Yaşayış məntəqəsini XIX əsrin ortalarında yaxınlıqdakı Sarıhəsənli kəndindən qarqarlı nəslinə mənsub ailələr Gödəkdərə adlı yerdə salmışlar Sonralar Şəmkir r-nunun Qapanlı (indiki Məmmədalılar) kəndindən danaçılar nəslinə mənsub ailələr də buraya köçüb məskunlaşmışlar Kənd salındığı yerin adını daşıyır Güman etmək olar ki, bir zamanlar *gödəkli* nəslinə mənsub maldar ellər bu ərazidən otlaq kimi istifadə etmişlər

**Gödəkqobu** *oyk, mür* Zərdab r-nunun Məmmədqasımlı i ə.v -də kənd Şirvan düzündədir Keçmiş adı Gödəkqobu Müskürlüsü olmuşdur Yaşayış məntəqəsini XIX əsrdə qışı Gödəkqobu adlanan yerdə, yayı isə İsmayıllı r-nunun Qabandağ yaylağı ərazisində keçirən müskürlü tirəsinə mənsub ailələr salmışlar Kənd salındığı qışlaq yurdunun adı ilə adlanmışdır Oykonim *gödək* (qısa, balaca) və *qobu* (su yığılan çökək yer, kiçik dərə) sözlərindən düzəlib "kiçik dərə, kiçik qobu" mənasındadır Gödək komponentini xələclərin digər tirəsi olan *gödəklilərin* adı ilə də əlaqələndirmək olar

**Gödəklər** *oyk, sadə* 1 Beyləqan r-nunun Bünyadlı i ə v -də kənd Düzənlikdədir Yaşayış məntəqəsi keçmişdə yayı Bazarçay sahilindəki Güney adlı yerdə, qışı isə Mil düzündə keçirmiş xələclərin *gödəkli* tirəsindən kolbaşılar və nəzərli nəsillərinin özlərinə məxsus qışlaq yerində məskunlaşması nəticəsində yaranmışdır, 2 Qubadlı r-nunun Qubadlı qəsəbə i ə v -də kənd Bərgüşad çayının sol sahilindədir Yaşayış məntəqəsi keçmişdə Mil düzündə yaşamış *gödəklilərə* mənsub bir qrup ailənin burada məskunlaşması nəticəsində yaranmışdır 1933-cü ildə İmişli r-nunun Xələc i ə v -də Gödəklər adlı yaşayış məntəqəsi qeydə alınmışdır. Gödəklilər Şəkidə və Zaqatalada məhəllə adlarıdır Etnotoponimdir

**Gödəkli** *oyk., sadə* Xaçmaz r-nunun eyniadlı i ə v -də kənd Samur-Dəvəçi ovalığındadır XX əsrin əvvəllərində Rusiyanın mərkəzi quberniyalarından köçürülmüş ruslar burada məskunlaşdıqdan sonra yaşayış məntəqəsi Alekseyevka adlandırıldı 1992-ci ildə kəndin adı dəyişdirilərək xələclərin *gödəkli* tirəsinin adı ilə adlandırılmışdır

**Gödənçay** *hidr mür* Qəbələ r-nu ərazisində çay Hidronim *gödən* (burada "acgöz, tamahkar, qarınqulu" mənalarındadır) və *çay* komponentlərindən düzəlib, çayın daşaraq ətrafdakıları yuyub aparması ilə bağlı yaranmışdır

**Göhərli** *oyk, sadə.* İmişli r-nunun Qaradonlu i ə v -də kənd Muğan düzündədir Yaşayış məntəqəsi 1826-28-ci illərdə Rusiya-İran müharibəsindən sonra Cənubi Azərb -dan gəlmiş şahsevənlərin məskunlaşması nəticəsində yaranmışdır Kəndin adı XII-XIII əsrlərdə Ön Asiyada yaşamış, XVI əsrdə Anadoluda Boz Ulus tayfa ittifaqına daxil olmuş, sonralar şahsevənlərə qarışmış *göhərli* tayfasının adını əks etdirir Görünür, burada məskunlaşmış şahsevənlərin tərkibində göhərlilər də olmuşdur

**Gölələn** *oyk sadə* Xaçmaz r-nunun Qaraçı i ə v -də kənd Samur-Dəvəçi ovalığındadır Keçmiş adı Gölələnqışlaq olmuşdur Quba xanlarının fərmanlarında bu kəndin

tam adı qeyde alınmışdır Qışlağın erazisinde kiçik göl olduğundan bele adlandırılmışdır Sonralar burada yaranmış daimi yaşayış menteqesi qışlağın adını almışdır

**Gölyeri** *oyk., mür* Yardımlı r-nunun Bercan i.e.v.-de kend. Burovar silsilesinin yamacındadır Yaşayış menteqesi vaxtile qurumuş gölün yerinde salındığı üçün bele adlandırılmışdır

**Gömür** *hidr., sadə* 1 Şahbuz r-nu erazisinde min bulaqlar Soyuq, şor-turş sulu ("Narzan" tipli) 7 bulaqdır; 2 Şahbuz r-nunda çay Naxçıvan çayının sol qoludur Güclü sel hadiseleri baş verir, 3. Quba r-nu erazisinde çay Hidronimler "pik", "zirve", "hündürlükde olan yer" menalı *gömür* (*Kömür/Gümür/Qomur/Qumur* variantlarında da qeyde alınmışdır) sözündendir Bu coğrafi obyektlerin hamısı yükseklikde yerleşir

**Gömür** *oyk., sadə* Şahbuz r-nunun eyniadlı i.e.v.-de kend Orta dağlıq erazidedir Oykonim "dağ başında, hündürlükde olan yer" menasındadır

**Gömüratan** *hidr., mür* Abşeron yarımadasının şm.-q.-inde şor sulu göl Hidronim "Gömür çayı tökülen göl" demekdir

**Gömürdağ** *or., mür* 1 Kelbecer r-nunun q. hissesinde dağ İstisu qesebesi yaxınlığındadır Hün 3037 m Vulkan menşelidir; 2 Zengezur silsilesinin merkezi hissesinde dağ. Naxçıvanla Ermenistan serhedinde Qapıcıq dağından şm.-dadır Hün 3364 m Oronimler Kömürdağ variantında da qeyde alındığından tedqiqatçılar çox vaxt bu dağları *kömürle* (yanacaq) elaqelendirirler Əslinde, bu oronimler "pik, zirve" menası ile bağlıdır ve bunu hemin coğrafi obyektlerin malik olduğu yükseklik de tesdiq edir

**Gömürdehne** *oyk., mür* Quba r-nunun Qonaqkend i.e.v.-de kend Kömürçayın sahilinde, dağeteyi erazidedir Kend evveller Dehne adlanırdı Yaşayış menteqesi Gömürçayın düzene çıxdığı ağız hissede salınmışdır Oykonim *Gömür* (çayın adı) ve *dəhnə* (çayın dar yerden axaraq düzene çıxdığı sahe, ağız) komponentlerinden düzelib, "Gömürçayın dehnesi" menasındadır

**Gömürlüdağ** *or., mür* Şorur r-nu erazisinde dağ R-nun şm.-ında, Ermenistanla serheddedir Hün 2064 m. Oronim "zirveli dağ" menasındadır

**Göralx** *hidr., mür* Şemkir r-nu erazisinde çay. Əsli *Gölarxdır* Bu kiçik çay menbeyini gölden götürdüyü üçün Gölarx adlandırılmışdır

**Görüşlü** *or., sadə* Qazax r-nunun c.-unda dağ Hün 800 m *Görüş* qaşqayların böyük keşküli tayfasının 26 tiresinden biridir. Qaşqayların terkibinde olan bir çox tayfaların adına (maçanlı, zöhrablı, arıqlı, ceferbeyli, göyceli ve s.) Qazax r-nunda yaşayan ehalinin etnik adlarında tesadüf olunur Güman etmek olar ki, Görüşlü oronimi de *görüş* etnonimi ile bağlıdır

**Gövdadıq** *oyk., düz* Terter r-nunun Sarov i.e.v.-de kend. Kendin erazisi vaxtile Qubadlı r-nundakı Kavdadıq kendinin qışlaq yurdu olmuşdur XIX esrde yaşayış menteqesi Berde r-nundan gelmiş xelilliler, Laçın r-nundan gelmiş cicimliler ve Şuşa r-nundan gelmiş talalılar nesillerine mensub aileler terefinden salınmışdır Tedqiqatçılar bu oykonimi fars dilindeki *gövda* (arıq at, yabı) ve *-dıq* (*-lıq* şek.-sinin variantı) komponentlerinden ibaret "arıq atlar, yabılar üçün ayrılmış örüş yeri" menasında izah edirler

**Gövdere** *oyk., sadə* Lerik r-nunun Qosmalyan i.e.v.-de kend Dağeteyi erazidedir Tedqiqatçılar oykonimi Göydere coğrafi adının tehrife uğramış forması hesab edirler Azerb dilinin dialektlerinde *qav/gav/göv* mal-qara yeyen ota deyilir Talış *qo* sözü mal-qara menasında işleir Bütün hallarda toponim "mal-qara deresi" menası ile bağlıdır Yaşayış menteqesi eyniadlı derede salındığından bele adlandırılmışdır

**Göver** *oyk., düz* Yevlax r-nunun Malbinesi i.e.v.-de kend. Yuxarı Qarabağ kanalının sahilinde, Qarabağ düzündedir Oykonim "mal-qara üçün ayrılmış örüş yeri" menasındadır Köver variantında da qeyde alınmışdır

**Gövlüc** *oyk., düz* Ağsu r-nunun Gürcüvan i.e.v.-de kend Gürcüvan yastanındadır Tedqiqatçıların ehtimalına göre, kendin adı fars menşeli *kevil/kühül* (süni mağara) sözünden ve tat dilindeki *-üc* (bir şeyin bolluğunu bildirir) şek.-sinden ibaretdir Keçmişde kendin erazisinde yeraltı süni mağara





tipli evler *kevil/kühül* adlanırdı Bu tipli evler bir zamanlar Şamaxı qezası üçün xarakterik olmuşdur Oykonim "kevil tipli evlerin olduğu yer" menasındadır

**Gövşatlı** *oyk., sadə.* Füzuli r-nunun Hoqa i.e.v.-de kend Dağeteyi erazidedir Yaşayış menteqesi *qovşutlu* neslinin meskunlaşması neticesinde yaranmışdır Cebrayıl r-nunda oykonimin Qovşutlu variantı mövcuddur Kendin adı Kövşatlı, Kovşatlı variantlarında da qeyde alınmışdır

**Göy Beyrinçay** *hidr., mür* Oğuz r-nu erazisinde çay Hidronim *göy* (burada suyun rengi), *bəyrin/bəgrin* (qed. Azerb dilinde "kükreyen, coşan") ve *çay* (su hövzesi) komponentlerinden düzelib, "kükreyen göy çay" menasındadır

**Göyarx** *oyk., sadə.* Terter r-nunun Şıxarx i.e.v.-de kend. Qarabağ düzündedir Kendi XIX esrin ikinci yarısında Goranboy r-nunun Rus Borisi kendinden ayrılmış malakan rus aileleri Levanarx çayının kenarında salmışdılar Sonralar ermeniler kendin adını tehrif ederek Levonarx kimi resmileşdirmişdiler 1992-ci ilden kend Göyarx adlandırıldı 1933-cü ilde Kelbecer r-nunun Seyidlar i.e.v.-de Lev kendi qeyde alınmışdır Toponimiyada *lev* "kenar" menasında işlenir.

**Göybulaq** *oyk., sadə* Şeki r-nunun Ceferabad i.e.v.-de kend Serceli dağının eteyindedir Yerli ehalinin melumatına göre, yaşayış menteqesi XIX esrin evvellerinde Qarabağdan gelmiş ailelerin Göybulaq adlı yerde meskunlaşması neticesinde yaranmışdır Kend adını erazideki eyniadlı bulaqdan almışdır Göybulaq adlı bulaqlar Tovuz ve Balaken r-nlarında da qeyde alınmışdır

**Göyceli** *oyk., sadə.* Ağstafa r-nunun Vurğun ve Xetai i.e.v.-lerinde iki kend Gence-Qazax düzenliyinde yerleşirler XIX esrde bir qrup azerb. ehali ermeni tecavüzü neticesinde öz dede-baba yurdları olan *Göyçə* mahalından köçmeye mecbur olmuşdu Qazax mahalında meskunlaşan hemin ehali yeni yaşayış menteqelerine keçmiş yurdlarının adını vermişler

**Göycüçay** *hidr., mür* Xanlar r-nu erazisinde çay Suyu az olduğu üçün Goyçü (xesis) adlandırılmışdır

**Göyçay** *hidr., mür* Qebele, İsmayıllı, Göyçay, Ucar r-nları erazisinde çay Menbeyini Baş Qafqaz silsilesinin c. yamacından (1980 m yükseklikden) alır, Qarasu bataqlığına tökülür Başlıca qolları sağdan Qalacıq, Vendam, soldan ise Əyriçaydır Yuxarı axarında dar derelerden axır Şirvan düzüne çıxdıqdan sonra bir çox qollara ayrılır Göyçay şeheri bu çayın suyu ile techiz olunur Çayın üzerinde SES tikilmişdir Çayın adı yuxarı axınında suyunun göyümtül renge çalması ile elaqedardır

**Göyçay** *or., sadə* Kelbecer r-nu erazisinde dağ Adını erazisindeki eyniadlı çayın adından almışdır

**Göyçay** *oyk., sadə* 1 Azerb.-da inzibati r-n. Şirvan düzünün şm. hissesinde yerleşir R-nun merkezi Göyçay şeheridir; 2 Azerb.-da şeher, eyniadlı inzibati r-nun merkezidir. Şirvan düzünün şm.-ında, Göyçayın sağ sahilinde yerleşir Yaşayış menteqesi adını erazideki eyniadlı çaydan almışdır Şeherin yerinde keçmişde Potu kendine mexsus bağlar olmuşdur Aran r-nlarına yol buradan keçdiyine göre karvansara ve mal bazarı vardı Bazar Potu kendinin adı ile Potubazar adlanırdı Sonralar burada poçt menteqesi teşkil olunmuşdu 1851-ci ilde Göyçay menteqesinde 5 ev vardı Tedricen Şamaxı qezasından müxtelif aileler köçüb burada meskunlaşmışlar 1872-76-cı illerde Göyçay sahilinde 15 desyatinlik yerde planlı suretde şeherin inşasına başlanmış, tedricen inkişaf ederek abad ve yaraşıqlı şehere çevrilmişdir

**Göydağ** *or., mür* Xanlar r-nu erazisinde dağ Sert yoxuşlu aşırımı var Kepez dağı ile Sarısu kendi arasındadır Dağ alp çemenleri ile zengin olub, yaşıla (göy renge) büründüyü üçün bele adlandırılmışdır Qazax, Daşkesen, Gedebey, Tovuz, Oğuz (Filfili kendi), Şeki (Aydınbulaq kendi) r-nları erazilerinde de eyniadlı dağlar vardır Bu oronimlerin bir qismi dağ süxurlarının göy renge çalması ile bağlıdır

**Göydellekli** *oyk., mür* Ağsu r-nunun Ərebsarvan i.e.v.-de kend Şirvan düzündedir Kendin adı göy/köy (kend) ve *dəlləkli* (erebşamlı tayfasının tirelerinden birinin adı) sözlerinden düzelib, "kend dellekli ve ya del-

ləkli kənd" deməkdir Kənd keçmişdə Dəlləkli adlanan digər coğrafi obyektlərdən fərqləndirmək üçün belə adlandırılmışdır

**Göydərə** *oyk sadə* 1 Şamaxı r-nunun Ərəbqədim i ə v -də kənd Giceki dağının q -indədir Dərəyurdu da adlanır Kənd salındığı dərənin adını daşıyır Dərə yaşıl otlaqdan ibarət olduğu üçün belə adlandırılmışdır; 2 Kəlbəcər r-nunun Çaykənd i ə v -də kənd Dağətəyi ərazidədir Yerli əhalinin məlumatına görə, yaşayış məntəqəsini XIX əsrdə həmin r-nun Kilsəli kəndindən gəlmiş ailələr Göydərə adlı yerdə salmışlar Dərə isə süxurlarının rəngi göyə çaldığına görə belə adlandırılmışdır; 3 Culfa r-nunun Saltax i ə v -də kənd Əlincə çayının (Arazın qolu) sahilində, dağətəyi ərazidədir Keçmiş adı Qaradərə olmuşdur XIX əsrdə Cənubi Azərb -dan gəlmiş erməni ailələri burada məskunlaşdıqdan sonra yaşayış məntəqəsi Noraşen adlandırılmışdı 1992-ci ildən kəndin adı dəyişdirilərək Göydərə kimi rəsmiləşdirilmişdir Gədəbəy və Şəmkir r-nlarında eyniadlı coğrafi obyektlər qeydə alınmışdır

**Göydərəsiçay** *hidr mür*. Gədəbəy r-nu ərazisində çay. Hidronim *Göydərə* (r-nun ərazisində çay dərəsi), -si (mənsub şək -si) və *çay* (su hövzəsi) komponentlərindən düzəlib Çay eyniadlı dərədən axdığı üçün belə adlandırılmışdır

**Göydüşəntəpə** *or , mür* Qusar r-nu ərazisində dağ Əsli Gavduşantəpədir Hündürlüyü 12 m olan təpədən qədim yaşayış məskəninin qalıqları tapılmışdır. Gavduşan düzünün adındandır Gavduşan düzü Samur çayının c -ş -ində, Xəzərboyu ərazinin, Müşkür düzünün şm hissəsini əhatə edir Tarixi mənbələrə görə, 1774-cü ildə Gavduşan düzündə Dağıstan feodallarının birləşmiş qüvvələri ilə Qubalı Fətəli xanın qoşunu arasında vuruşma baş vermişdi Oronim *Gavduşan* (düzün adı) və *təpə* komponentlərindən düzəlib Gavduşan oronimi isə *gav* (ov heyvanı), *duş* (*dəşt* sözünün təhrif forması olub, "çöl, düz" deməkdir) və *-an* (məkan bildirən formant) sözlərindən düzəlib, "ovlaq, ov heyvanları olan düz" deməkdir

**Göyəbaxan** *oyk sadə* Tovuz r-nunun Qaradaş i ə v -də kənd Çınqıldağ silsiləsinin (Kiçik Qafqaz) ətəyindədir. Yerli əhalinin yozumuna görə, yaşayış məntəqəsi hər tərəfdən dağlarla əhatə olunduğundan və qonşu kəndlərdən görünmədiyindən belə adlandırılmışdır *Göyəbaxan* (Gora, Günəbaxan da adlanır) maldarlıqla əlaqədar təsərrüfat tikilisi olub, "yeni doğulmuş quzuların salındığı yer"ə deyilir.

**Göyəli** *oyk., sadə* Gədəbəy r-nunun eyniadlı i ə v -də kənd Orta dağlıq qurşaqdadır Əsli Gavalılıdır Yerli əhali arasında Göyəlli variantında işlənir Yaşayış məntəqəsi vaxtilə Qazax r-nunun Qazaxbəyli kəndindən gəlmiş Allahyar, Alı və Tanrıverdi adlı üç qardaşın ailələri tərəfindən salınmışdır Kənddəki nəsillərdən biri indi də allahyarlı adlanır Kənd *gavalı* ağaclarının çox olduğu ərazidə salındığı üçün belə adlandırılmışdır Keçən əsrdə Zəngilan r-nu ərazisində də eyniadlı kənd qeydə alınmışdır

**Göyəm** *oyk., sadə* Zaqatala r-nunun eyniadlı i ə v -də kənd Tala çayının sahilində, Alazan-Əyriçay çökəkliyindədir Kənd salındığı ərazidə çoxlu *göyəm* ağacları olduğundan belə adlandırılmışdır

**Göyəmli** *oyk. sadə* Gədəbəy r-nunun Çay Rəsullu i.ə v -də kənd İstidərə adlanan ərazidə, Köçdərə çayının (Axınca çayının qolu) sahilində, dağətəyi ərazidədir Yaşayış məntəqəsini XIX əsrdə Düz Rəsullu kəndindən ayrılmış ailələr *Göyəmli* adlanan yerdə saldığı üçün belə adlanmışdır Ərazidə çoxlu göyəm kolları var

**Göyəmtala** *oyk , mür* Balakən r-nunun Hənifə i ə v -də kənd Balakən çayının sahilindədir Oykonim *göyəm* (bitki növü) və *tala* (ətrafa nisbətən fərqli sahə) komponentlərindən düzəlib Kənd *göyəm* ağacları olan talada salındığı üçün belə adlandırılmışdır Tovuz r-nunda Göyəmli tala yer adı qeydə alınmışdır

**Göyər Abbas** *oyk , mür* Qubadlı r-nunun Göyərcik i ə v -də kənd Bərgüşad silsiləsinin yamacındadır Oykonimin birinci komponenti Göyərcik sözünün ellipsiyaya uğramış variantıdır İkinci komponent isə vaxtilə həmin məntəqənin adıçəkilən şəxsin tabeliyində olduğunu göstərir Kəndin adı "Abbasa məxsus Göyərcik kəndi" deməkdir





***Göyərcik*** *oyk , sadə* Qubadlı r-nunun eyniadlı i.ə.v -də kənd Bərgüşad silsiləsinin yamacındadır Yaşayış məntəqəsini XIX əsrin ortalarında qonşu Qiyaslı kəndindən köçüb gəlmiş ailələr salmışlar. Tədqiqatçıların bir qismi oykonimi "göylük, otluq, yaşıllıq" mənası ilə, digər qismi kürd dilindəki kuvar (arxac) sözü ilə, üçüncü qismi isə türkdilli *kuvarçı/kuarçi* tayfa adı ilə əlaqələndirir

**Göyərçin** *or , sadə* 1 Qazax r-nunda dağ; 2 Qobustanda palçıq vulkanı, 3 Cəbrayıl r-nunda dağ Tədqiqatçılara görə, bu oronimlər peçeneq tayfalarından biri olan *küyərçilərin* adını əks etdirir Türkiyənin Qars əyalətinin Kağızman qəzasında Göyərçin adlı iki kənd və bir dağ, keçmiş Cavad qəzasında Göyərçin adlı qışlaq, İrəvan qəzasında Göyərçin adlı xarabalıq, Quba r-nunun Gürzalı kəndində Göyərçin qayası, Laçın r-nunun Minkənd kəndində Göyərçinli təpə və s qeydə alınmışdır

**Göyərçin Veysəlli** *oyk., mür* Cəbrayıl r-nunun Şahvəlli i ə.v -də kənd. Düzənlikdədir Əsli Göyərcik Veysəllidir Oykonim *Göyərcik* (kənd adı) və *Veysəlli* (etnotoponim) komponentlərindən düzəlib, "Göyərcik kəndi yaxınlığındakı Veysəlli kəndi" deməkdir Birinci komponent eyni zamanda kəndin adını Daş Veysəlli kəndinin adından fərqləndirməyə xidmət edir

**Göyəzən** *or , mür* Qazax r-nu ərazisində dağ Coğaz çayının sağ sahilindədir Vulkan mənşəlidir Morfoloji xüsusiyyətinə və gözəlliyinə görə Mon-Pele tacından (Vest-hind adalarından biri olan Martinika adasında) sonra dünyada ikinci dağ sayılır Zirvəsi nisbətən düzən olub, geniş meydançanı xatırladır Burada orta əsrlərə aid yeddi bürclü qala divarları və dördkünc bina qalıqları, həmçinin bir neçə mağara aşkar edilmişdir. Göyəzən istehkamının IX-XII əsrlərə aid keşikçi məntəqəsi olması güman edilir Göyəzən dağının adı IX əsrə aid gürcü mənbəyində Kavazin şəklində qeydə alınmışdır Tədqiqatçıların ehtimalına görə, oronim türk dillərindəki *kava* (qaya, sıldırım) və *sın/sin* (dağ beli) komponentlərindən düzəlib, "sıldırımlı dağ beli" deməkdir Tovuz r-nunun Bala Şamlıq kəndində də şiş bir qaya Göyəzən adlanır

**Göygöl** *hidr , mür*. 1 Culfa r-nu ərazisində göl. Zəngəzur silsiləsinin c yamacında, təqr 3000 m hündürlükdə yerləşir Şirin sulu, axarlı kiçik göldür. Hər tərəfdən dağlarla əhatə olunmuşdur Yalnız q hissəsindəki dar çıxış yolundan Gilan çayının sol qolu Saqarsu çayı başlanır; 2 Daşkəsən r-nunda göl Şəmkir çayı hövzəsində, Hinaldağdan təqribən 4 km. q -də, 2470 m hündürlükdə yerləşir Əsasən Göygöl çayının suyu ilə qidalanır; 3 Xanlar r-nunda göl. Murovdağ silsiləsinin şm yamacında, 1556 m hündürlükdə yerləşir Gözəl mənzərəli, şirinsulu və axarlı göldür Gölə c tərəfdən Maral gölündən başlanan Yuxarı Ağsu çayı tökülür. Gölün şm tərəfindən isə Aşağı Ağsu çayı başlanır və sağ tərəfindən Kürək çayına tökülür Göl 1139-cu il sentyabrın 30-da baş vermiş güclü zəlzələ zamanı Kəpəz dağının bir hissəsinin uçaraq Ağsu çayının qarşısını kəsməsi nəticəsində əmələ gəlmişdir Ətrafdakı nadir və zəngin bitki örtüyünün, heyvanat aləminin və quşların qorunması, həmçinin göllərin büllur suyunun təmiz saxlanılması məqsədilə 1965-ci ildə Göygöl Dövlət Qoruğu təşkil edilmişdir Suyu şəffaf və göy rəngə çaldığına görə göl belə adlandırılmışdır; 4 Xanlar r-nunda göl Maral gölündən q -də yerləşir, 5 Gədəbəy r-nu ərazisində şirinsulu, axarlı göl Şəmkir çayının yuxarı axınındadır Meşəlik sahədə olduğuna və suyu göyümtül rəngə çaldığına görə belə adlandırılmışdır; 6. Ordubad r-nunda şirinsulu, axarlı göl Zəngəzur silsiləsinin c yamacında, 3065 m yüksəklikdədir Suyu şəffaf göyümtül rəngə çaldığına görə belə adlandırılmışdır; 7 Daşkəsən və Gədəbəy r-nları ərazisindən axan çay Mənbəyini eyniadlı göldən aldığı üçün belə adlandırılmışdır

**Göylər Çöl** *oyk mür*. Şamaxı r-nunun Göylər i ə v -də kənd Şirvan düzündədir Oykonimin birinci komponenti Səlcuq oğuzlarının salor tayfasına mənsub *göglər* qolunun adını əks etdirir, ikinci komponent isə kəndin düzənlikdə yerləşdiyini göstərir XIX əsrin ortalarına aid hadisələri əks etdirən mənbələrin məlumatına görə, Pirmərdəkan dağında yarımköçəri həyat keçirən 96 ailəli *göylər* tayfasından bir hissəsinin dağlıq zonada, digər hissəsinin isə düzənlikdə (çöl-

lükde) meskunlaşması neticesinde iki kend yaranmışdır. Oykonim "düzenlikde olan Göyler kendi" demekdir

**Göyler Dağ** *oyk., mür* Şamaxı r-nunun Göyler i e v -de kend Lengebiz silsilesinin şm eteyindedir Oykonim *Göylər/Göglar* (etnotoponim) ve *dağ* (dağlıq erazi) komponentlerinden düzelib, "dağlıq erazide olan Göyler kendi" demekdir

**Göymemmedli** *oyk., sadə* Şemkır r-nunun Çardaqlı i e v -de kend Dağeteyı erazıdedir Yaşayış menteqesini XIX esrde Şiştepe kendinden çıxmış aileler salmışlar Keçmış adı Göyçuxa Memmedli olmuşdur Etnotoponimdir. Tovuz r-nunda Göymemmedli deresi qeyde alınmışdır

**Göynohur** *hidr mür* Deveçi r-nu erazisinde göl Gilgil çayı hövzesindedir Hidronim *göy* (reng) ve *nohur* (göl) sözlerinden düzelib, obyektin suyunun rengini teyin edir

**Göynük** *oyk., sada* Culfa r-nunun Qazançı i e v -de kend Göynüksu çayının (Əlınca çayının qolu) sahilinde, Zengezur silsilesinin eteyindedir. *Göynük* "çemenlık, tala" demekdir Şeki r-nunda Göynük komponentli Baş Göynük ve Aşağı Göynük adlı ikı kend var

**Göynüksu** *hidr, mür* Babek r-nu erazisinde çay Çay adını yaxınlığındakı eyniadlı yaşayış menteqesinden almışdır.

**Göynüyen** *oyk. düz* Goranboy r-nunun Hazırehmedli i e v -de kend Düzenlikdedir Tedqiqatçılara göre, oykonimin birinci komponenti *göynük* Türkiye toponimiyasında da yayılmış coğrafi termindir ve "açıq yer, tala, çemenlik" menalarında işlenir Oykonimin sonundakı *-ən* ise cemlik ve mekan bildiren topoformantdır Bele olduqda, Göynüyen toponimi "talalar, çemenlikler" demekdir

**Göyrücük** *oyk. düz* Balaken r-nunun Xalatala i e v -de kend Alazan-Əyriçay çökekliyindedir Əsl adı Göyrüşlüdür Kendin adı hemin erazideki *göyrüş* ağaclarının bolluğu ile elaqedar yaranmışdır

**Göyrüşlü** *or, düz* Qazax r-nu erazisinde dağ Qoruşlu variantında da qeyde alınmışdır Yerli ehali arasında Göyrüşdü adı ile tanınır Dağa bu ad erazisindeki *göyrüş* ağacları ile elaqedar verilmişdir

**Göyşaban** *oyk., mür.* Lenkeran r-nunda kend Xezer denizi sahilinde, Lenkeran ovalığındadır Keçmiş adı Gomuşavan olmuşdur Yerli ehali arasında kendin adı indi de bele adlandırılır XIX esre aid menbelerde Gomuşavan haqqında melumat verilir Keçmişde kendin erazisi geniş sucaqlıq ve qamışlıq olduğundan burada çoxlu camış saxlanılırdı Odur ki, kendin adı da "camış saxlanılan yer" menasında olan bu adla adlandırılmışdı. XIX esrin ikinci yarısında Suxumiden gelmiş Novo Afon monastırının keşişleri yaşayış menteqesine Olxovka adı verdiler *Olxov* bu erazide biten qızılı rengli cil bitkisinin bir növünün adıdır İcaredar keşişler quru balığı istehsal etmek üçün hemin bitkini yığıb yandırırdılar. 1992-ci ilde Olxovka adı leğv edilerek Göyşaban kimi resmileşdirildi 1933-cü ilde oykonim Gomşavan variantında qeyde alınmışdır

**Göytala** *oyk., sadə* Şuşa r-nunun eyniadlı i e v -de kend Yağlıdere çayının (Hekeri çayının qolu) sahilinde, Qarabağ silsilesinin yamacındadır. XIX esrde gelme ermeniler burada yerleşdikden sonra kendi Qanaçtala adlandırmışdılar (*qanaç* erm "göy, yaşıl" demekdir) 1991-ci ilde kendin keçmiş adı berpa edilmişdir Kend salındığı erazinin adını daşıyır *Göytala* "yaşıl çemen" demekdir

**Göytepe** *or, mür* 1 Celilabad r-nu erazisinde dağ Alaşar-Burovar silsilesinden ayrılan qolun zirvesidir Hün 250 m, 2 Qazax r-nunun Gürcüstanla serhedinde dağ Hün. 831 m, 3. Mil düzünün şm.-ş hissesinde süni qurulmuş tepedir Hün 3 m Yaxınlığında Daş Göytepe adlı başqa bir süni tepe var; 4 Tovuz r-nu erazisinde tepe. Dağ süxurları göyümtül renge çaldığı üçün bele adlandırılmışdır Ağsu, Laçın, Zengilan, Şeki, Yevlax, Deveçi, Bilesuvar, Zaqatala, Salyan, Abşeron r-nlarında da eyniadlı yüksəklikler qeyde alınmışdır

**Göytepe** *hidr, sadə* Celilabad ve Masallı r-nları erazisinde çay Qızılağac körfezinin etrafındakı çeyilliye tökülür Çay menbeyini aldığı Göytepe dağının adı ile adlandırılmışdır

**Göytepe** *oyk, sadə* 1 Celilabad r-nunun eyniadlı i e v -de kend Lenkeran ovalığındadır 1840-cı ilde Rusiyanın yeritdiyi siyasetin neticesi olaraq buradakı azerb ehali qovulmuş, Saratov ve Orenburq quberniyalarından köçürülmüş rus aileleri kendde meskunlaşmışdılar Gelen ruslar özleri ile getirdikleri Prişib adını kende vermişdiler 2001-ci ilden kendin adı Göytepe kimi resmileşdirilmişdir Kend erazideki eyniadlı dağın adını daşıyır; 2 Ağdam r-nunun eyniadlı i e v -de kend Qarabağ düzündedir. Yaşayış menteqesi Göytepe adlı yüksekikde salındığı üçün hemin tepenin adı ile adlandırılmışdır; 3. İsmayıllı r-nunun Qalıncaq i.e v -de kend Dağeteyi erazidedir Kend Göytepe adlı erazide salındığı üçün bele adlandırılmışdır

**Göyük** b a x Köyük

**Göyüzbulaq** b a x Kövüzbulaq

**Göyyal** *oyk, sadə* Qubadlı r-nunun Fercan i e v -de kend Dağlıq erazidedir Toponim *göy* (yaşıl) ve *yal* (dağ beli) komponentlerinden düzelib, "yaşıl dağ beli" menasındadır Kend salındığı erazinin adını daşıyır

**Göyyurdçay** *hidr, mür* Gedebey r-nu erazisinde çay Gedebey qesebesi erazisinde Qarasu çayına (Şemkir çayının qolu) qovuşur Çay Göyyurd dağının eyniadlı deresinden axdığına göre bele adlanır Dağın adı süxurlarının göy rengli olması ve buradakı yaylaqlarda evveller ehalinin yurd salması ile bağlı yaranmışdır

**Gözelcedağ** *or, mür* Göyçay r-nunda dağ. Dağın menzereli yamacı yaylaq kimi istifade edildiyinden bele adlandırılmışdır Gözelce yaylaq kimi de adlanır

**Gözlübulaq** *oyk, sadə* Şeki r-nunun Orconikidze qesebe i e v -de kend Menbelerin melumatına göre, yaşayış menteqesi XIX esrde Qarabağdan buraya köçürülmüş aileler terefinden salınmışdır Bezi tedqiqatçılara göre, kendin esl adı *Qozlubulaqdır* Kendin adı erazideki eyniadlı bulağın adından götürülmüşdür Keçen esrde Kelbecer r-nunun Otaqlar i e v -de Gözlübulaq, Celilabad r-nunun Qoşabulaq i e v -de Gözbulaq adlı yaşayış menteqeleri qeyde alınmışdır

**Gözparaq** *oyk mür* Zaqatala r-nunun eyniadlı i e v -de kend Baş Qafqaz silsilesinin eteyindedir Yerli ehali arasında ve hemçinin keçmiş inzibati-erazi bölgülerinde Gözbarak variantında işlenir Tedqiqatçıların bir qismine göre, oykonim *göz* (bulaq, qaynaq) ve *paraq* (mal-qara saxlamaq üçün hasarlanmış yer) sözlerinden ibaret olub, kendin erazisindeki Göz adlandırılan Xave (Xavene çayının menbeyi) ve Hamam adlı kükürdlü bulaqlarla bağlıdır Tedqiqatçıların diger qismi ise bele hesab edir ki, kendin adı eslinde *Gazparaq* olmalıdır ve "gezde yerleşen paraq" menasındadır

**Gurbulaq** *oyk., sadə* Daşkesen r-nunun eyniadlı i e v -de kend Dağeteyi erazidedir Yaşayış menteqesini 1922-ci ilde Zeylik kendinden çıxmış aileler Gurbulaq adlanan yaylaq yerinde salmış, sonralar Şaumyan adlandırılmışdı 1991-ci ilden erazinin keçmiş adı özüne qaytarılmışdır Oykonim erazideki gur sulu bulaqlarla bağlı yaranmışdır

**Gursulu** *oyk. sadə* Ağsu r-nunun Gürcüvan i e v -de kend Kend yerleşdiyi erazide gur sulu bulaqların olmasına göre bele adlandırılmışdır

**Güdecühür** *oyk., mür* Sabırabad r-nunun eyniadlı i e v -de kend. Kür çayının sahilinde, Muğan düzündedir Qaratdı da adlanmışdır Oykonim *güda* (qısa, gödek) ve *cühür* (çayın, gölün alçaq sahili) sözlerinden düzelib "qısa çay sahili erazi" demekdir Kend çayın alçaq sahilinde yerleşdiyine ve bu sahil mesafece gödek olduğuna göre bele adlandırılmışdır

**Gügevar** *oyk., mür* Yardımlı r-nunun Porsova i e v -de kend. Meşeli dağların arasında, nisbeten düzenlik erazidedir Yerli ehali terefinden Kogavar variantında da işlenir Oykonim "yaşıllıq, otlaq" kimi izah olunur

**Gügüleband** *or mür* Lenkeran r-nunda dağ Beşeru çayının sağ sahilindedir Hün 529 m. Oronim *küyül* (oyuq, deşik) ve *band* (kiçik dağ) komponentlerinden düzelib (burada *-ə* mensubluq bildirir), "oyuqlu, deşikli dağ" menasındadır

**Gülablı** *or sada* Ağdam r-nunda dağ Qarabağ silsilesinden Qarabağ düzüne doğru uzanan qol üstünde zirvedir Hün 500 m Müxtelif ehtimallara gore, oronim müharibe illerinde sabun ovezine işledilen xüsusi gil növü olan gılabının (abı gil) buradan çıxarılması ile, Gülab adlı bir tacirin adı ile ve yaxud buradakı güllerden xüsusi "gül suyu"

hazırlanması ilə bağlı olaraq yaranmışdır Qubadlı r-nunun Mahrızlı kəndində Gülablı bağı, keçən əsrdə Ağdam r-nunda Abdal Gülablı, XIX əsrdə İrəvan quberniyasının Üçkilsə (Eçmiədzin) qəzasında azərb.-lar yaşayan Gülablı kəndinin qeydə alınması bu adın etnotoponim olmasından xəbər verir

**Gülablı** *oyk., sadə* Ağdam r-nunun Gülablı i.ə.v.-də kənd Qarabağ silsiləsinin şm.-ş. ətəyindədir Yerli əhali kəndin adını əkinə verilən ikinci suyun xalq arasındakı adı olan "gülab"la əlaqələndirir Əslində, oykonim yaxınlığındakı Gülablı dağının adı ilə bağlı olub, etnotoponimdir

**Gülaxlıca** *or., düz* Tovuz r-nunda dağ Tovuz və Axınca çaylarının suayrıcında yerləşir Hün 706 m Dağın ətəyində yonca əkildiyi üçün belə adlanmışdır. Azərb.-nın kənd təsərrüfatı r-nlarında *gülah/güləh* "ikinci və üçüncü dəfə biçilən, çalınan yonca"ya deyilir Oronim Qulaxlıca variantında da qeydə alınmışdır

**Gülanlıq** *or., düz* Quba r-nu ərazisində dağ Buduq kəndindən ş.-də yerləşir Hün 2141 m Coğrafi ədəbiyyatda Qulanlıq variantında da qeydə alınmışdır Oronim *gülən* (yaylaqda topa halında bitən ot növü) sözündən və *-lıq* şəkilçisindən düzəlib, "gülən otu çox olan dağ, gülən bitən dağ" mənasındadır

**Gülbəxt** *or., sadə* Abşeron yarımadasının c.-q.-ində, Şonqar qəsəbəsi yaxınlığında fəaliyyətdə olan palçıq vulkanıdır Hün 150 m Palçıq vulkanı adını yaxınlığındakı Gülbəxt adlı qışlaqdan almışdır Güman edilir ki, qışlaq vaxtilə məxsus olduğu şəxsin adını daşıyır

**Güleymər** *hidr., sadə.* Culfa r-nunda min bulaq. Hidronim "deşikdən süzülən su" mənasındadır Yerli əhalinin dilində *külöv/külöy* sözü "aşsüzən" mənasında da işlənir

**Güləbənd** *hidr., sadə* Lənkəran r-nunda min bulaqlar Soyuq sulu bulaqlardır Güləbənd kəndi və yüksəkliyi yaxınlığında yerləşdiyi üçün belə adlandırılmışdır *Güləbənd* toponimi "güllü dağ" mənasındadır

**Güləbatlı** *oyk., sadə* Tərtər r-nunun Sarıcalı i.ə.v.-də kənd Qarabağ düzündədir 1933-cü ildə eyniadlı kənd Bərdə r-nunun Seydimli i.ə.v.-də qeydə alınmışdır Belə ehtimal edilir ki, kəndin ərazisi güllük, çiçəklik olduğundan yaşayış məntəqəsi belə adlandırılmışdır

**Güləbird** *oyk., sadə.* Laçın r-nunun eyniadlı i.ə.v.-də kənd. Həkəri çayının sahilində, dağətəyi ərazidədir Keçmiş adı Qaraçanlı olmuşdur Qaraçanlı kənddə məskunlaşmış nəslin adıdır Yaşayış məntəqəsi yerli əhali arasında Govurqala adı ilə tanınan Güləbird qalasının yaxınlığında yerləşdiyi üçün belə adlanmışdır Güləbird qalasının adı isə "gil qalası, gillərə məxsus qala" deməkdir

**Güləh** *oyk., sadə* 1 Dəvəçi r-nunun Ağbaş i.ə.v.-də kənd Dağlıq ərazidədir; 2 Dəvəçi r-nunun Çuxurəzəmi i.ə.v.-də kənd Düzənlikdədir Yaşayış məntəqələri XIX əsrdə Quba r-nunun Xaltan kəndindən çıxmış ailələrin Güləh adlı yerdə məskunlaşması nəticəsində yaranmışdır *Gülah* "yoncalıq" deməkdir Kəndin ərazisində eyniadlı göl və min bulaq da vardır Toponimi "gilli yer" kimi izah edənlər də var

**Güləsər** *hidr., sadə* Lerik r-nunda min bulaqlar Eyniadlı kəndin yaxınlığında yerləşdiyi üçün belə adlanmışdır Qosələr, Kosalar variantlarında da qeydə alınmışdır. Azdebitli, soyuq sulu, və kükürdlü bulaqlardır Müalicə üçün istifadə edilir

**Güləzi** *oyk., mür* Quba r-nunun eyniadlı i.ə.v.-də kənd. Vəlvələçayın sahilindədir Keçmiş adı Güləziqışlaq olmuşdur Əvvəllər Afurca kəndinə məxsus qışlaq yeri idi Tədqiqatçılara görə, kəndin adı *gül* (gil) və *zi* (tat "yer", "sahil", "kənar") sözlərindən düzəlib (*-ə* birləşdirici saitdir), "gilli yer" mənasındadır Kəndin ərazisinin torpağı həqiqətən gillikdir

**Gülgəzli** *oyk., düz* Bərdə r-nunun Kolayır i.ə.v.-də kənd Qarabağ düzündədir Yerli əhalinin məlumatına görə, Gülgəz adlı bir qadının övladı tərəfindən salındığı üçün kənd belə adlandırılmışdır

**Güllücə** *or., düz* Xocavənd r-nu ərazisində, Qarabağ silsiləsinin c. hissəsində dağ aşırımı Ziyarət zirvəsindən bir qədər şm.-da yerləşir Hün 2387 m Maldar ellərin yaylaq yurdlarından biri olan Güllücə gül-çiçəklə zəngin olduğu üçün belə adlandırılmışdır

**Güllücə** *oyk., sadə* Ağdam r-nunun eyniadlı i.ə.v.-də kənd Qarabağ düzündədir Yaşayış məntəqəsi adını ərazidəki eyniadlı dağdan almışdır





**Güllük** *oyk., sadə* Qax r-nunun eyniadlı i.ə.v.-də kənd Alazan-Əyriçay çökəkliyindədir Yaşayış məntəqəsi XVII əsrdə Dağıstanın Saxur kəndindən köçüb gəlmiş ailələrin Güllük adlanan yerdə məskunlaşması nəticəsində yaranmışdır Toponim "gül, çiçək olan ərazi" mənasındadır

**Güllülü** b.a.x. Külüllü

**Güllütəpə** *oyk., sadə* Masallı r-nunun eyniadlı i.ə.v.-də kənd Burovar silsiləsinin ətəyindədir XIX əsrin 70-ci illərində r-nun Xallıcalı kəndindən və Cənubi Azərb.-dan gəlmiş ailələrin Güllütəpə adlı yüksəklikdə məskunlaşması nəticəsində yaranmışdır Toponim "güllü, çiçəkli təpə" mənasındadır

**Gülməmmədli** *oyk., sadə* 1 Cəlilabad r-nunun eyniadlı i.ə.v.-də kənd Burovar silsiləsinin ətəyindədir. Kənd burada məskunlaşmış *gülməmmədli* nəslinin adını daşıyır; 2 Goranboy r-nunun Goranlı i.ə.v.-də kənd Keçmiş adı Eminəlilər olmuşdur Yerli əhalinin məlumatına görə, yaşayış məntəqəsini vaxtilə Gədəbəydən gəlmiş miskinli elatına mənsub Eminəli adlı şəxs bina etmiş və ona görə də kənd bir müddət onun, sonralar isə oğlu *Gülməmmədin* adı ilə adlandırılmışdır Oykonim "Gülməmmədin nəslindən olanlar" deməkdir

**Güloğlular** *oyk., sadə* Bərdə r-nunun eyniadlı i.ə.v.-də kənd Qarabağ düzündədir. Əsli Gülüoğlulardır Yaşayış məntəqəsi *gülüoğlular* nəslinin məskunlaşması nəticəsində yarandığı üçün belə adlandırılmışdır Türkiyə ərazisində də eyniadlı coğrafi obyektlər qeydə alınmışdır

**Gülövşə** *oyk., sadə* Yevlax r-nunun Aşağı Bucaq i.ə.v.-də kənd Düzənlikdədir Keçmiş adı Gülövşə Ərəb olmuş, sonralar oykonimin tərkibindəki *ərəb* komponenti düşmüşdür Oykonimi şəxs adı ilə də əlaqələndirirlər *Gülövşə* eyni zamanda Şirvan zonasında yetişdirilən nar növünün adıdır

**Gültəpə** *oyk., sadə* 1 Quba r-nunun Tüləkəran i.ə.v.-də kənd Böyük Qafqaz dağlarının ətəyindədir Keçmiş adı Təkyə Şıxı (Şeyxlərə məxsus təkyə) olmuşdur 1965-ci ildə kəndin adı dəyişdirilərək yaxınlıqdakı təpənin adı ilə Gültəpə (güllü-çiçəkli təpə) adlandırılmışdır; 2 Babək r-nunun Şamuxlu i.ə.v.-də kənd. Arazboyu düzənlikdədir 2003-cü ildən Kültəpə kimi rəsmiləşdirilmişdir

**Gülşənabad** *oyk., mür* Babək r-nunun Cəhri i.ə.v.-də kənd Cəhri çayının sahilində, dağətəyi ərazidədir Yaşayış məntəqəsinin keçmiş adı Şeytanabad olmuş, Sovet hakimiyyəti illərində dəyişdirilmişdir Oykonim "güllük, lalezar, çəmənlik" mənalarındadır

**Gülümdostu** *or., sadə* Şamaxı və Quba r-nları sərhədində dağ Baş Qafqaz silsiləsinin zirvəsindədir Hün 2713 m Yerli əhalinin məlumatına görə, dağ vaxtilə *Gülümdostu* adlı bir şəxsin otlaq yeri olduğu üçün belə adlandırılmışdır

**Gülürdağ** *or., mür* Quba r-nu ərazisində dağ Qonaqkənd kəndindən şm.-ş.-də yerləşir Hün 1621 m. Əsl adının Gülüldağ olması və *gülül* adlı bitkinin adından yaranması ehtimal edilir Bu fikrə görə, oronim "gülüllü dağ" mənasındadır

**Gülüstan** *or., sadə.* 1 Şamaxı r-nu ərazisində dağ Şamaxı şəhərinin şm.-q.-indədir Dağın adı buradakı Şirvanşahlara məxsus qədim Gülüstan qalasının adındandır Yerli əhalinin məlumatına görə, qalanın adı "güllük, gül bitən yer" mənasındadır Qalanın adı XI əsrdə Kuvilmiyan kimi qeydə alınmışdır Tədqiqatçılar bu toponimi fars dilindəki *kuvil* (yeraltı sığınacaq, yeraltı ev) və *mian* (orta, mərkəz) sözlərinin birləşməsi olaraq "yeraltı sığınacaqların mərkəzi" kimi izah edirlər Qalada yeraltı yolu olan tikili qalıqları hələ də qalmaqdadır; 2 Şəmkir r-nunda dağ Dağ öz adını İncəçayın sahilindəki qədim Gülüstan qalasının adından almışdır

**Gülüstan** *oyk., sadə* Goranboy r-nunun eyniadlı i.ə.v.-də kənd. Murovdağ silsiləsinin yamacındadır Kənd İncəçayın sahilindəki qədim Gülüstan qalasının adı ilə adlanmışdır

**Gülüzənbinə** *oyk., mür* Balakən r-nunun Hənifə i.ə.v.-də kənd Alazan-Əyriçay çökəkliyindədir Yaşayış məntəqəsi XIX əsrdə yaranmışdır Tədqiqatçılara görə, kəndin adı *Gülüzən* (şəxs adı) və *binə* sözlərindən düzəlib, "Gülüzənin binəsi" mənasındadır Lakin kəndin adının buradakı ucsuz-bucaqsız gül bağları ilə əlaqədar olması da mümkündür

**Gülyataq** *oyk., mür.* Tərtər r-nunun Canyataq i.ə.v.-də kənd. Qarabağ silsiləsinin ətəyindədir. Keçmişdə Külətaq variantında da qeydə alınmışdır. Oykonim *gül* və *yataq* (qoyun saxlanılan yer) sözlərindən düzəlib, "güllü, çiçəkli yataq" mənasındadır. Yaşayış məntəqəsi Canıbəy adlı şəxsə məxsus eyniadlı yataqda salındığı üçün belə adlandırılmışdır.

**Gülyatan** *oyk., sadə.* Astara r-nunun Kakalos i.ə.v.-də kənd. Xəzər dənizi sahilində, Lənkəran ovalığındadır. Külütan variantında da qeydə alınmışdır. Güman etmək olar ki, oykonim *külətən* (meşədə yandırılmış, əkin üçün hazırlanmış yer) sözündəndir. Kənd salındığı ərazinin adı ilə adlandırılmışdır.

**Gümbidağ** *or., mür.* Şamaxı r-nunda dağ. Xilmilli kəndindən şm.-dadır. Hün. 1289 m. Oronim *gümbi* (daş çıxarmaq üçün istifadə edilən iri, ağır çəkic) və *dağ* komponentlərindən düzəlib "daş çıxarılan dağ" mənasındadır.

**Gümgürdağ** *or., mür.* Quba r-nu ərazisində dağ. Baş Qafqaz silsiləsindədir. Hün. 2713 m. Oronim *gümgür* (*güngür* sözündən olub "qəzbel" deməkdir) və *dağ* komponentlərindən düzəlib, "qəzbel dağ" mənasındadır.

**Gümürgöy** *or., mür.* Lerik r-nunda dağ. Talış silsiləsinin zirvəsidir. Hün. 2494 m. Oronim *gümür* (*gömür* sözünün yerli tələffüz formasıdır, "dağ başında dar yarğanlı, uçurumlu yer" deməkdir) və talış dilindəki *kuy* (dağ) komponentlərindən düzəlib, "dar yarğanlı dağ" mənasındadır.

**Gümüşlü** *oyk., sadə.* Şərur r-nunun Yəyci i.ə.v.-də qəsəbə. Dərələyəz silsiləsinin ətəyindədir. Yaşayış məntəqəsi 1964-cü ildə Gümüşlü filiz idarəsi yaxınlığında salındığına görə belə adlandırılmışdır.

**Gümüşlü** *hidr., sadə.* Quba r-nunda çay. Cimi çayının sağ qoludur. Etnotoponimdir.

**Günbəzdağ** *or., mür.* Qubadlı r-nu ərazisində dağ. Bazarçaydan sol tərəfdə yerləşir. Hün. 1002 m. Dağ oradakı günbəzvari qədim tikilinin olması ilə əlaqədar belə adlandırılmışdır.

**Gündüzqala** *or., sadə.* Qusar r-nunda dağ. Oronim dağın ərazisindəki qədim Gündüzqalanın adından yaranmışdır. Qalanın adı isə qədim türk tayfası *gündüzlənin* adını daşıyır.

**Gündüzqala** *oyk., sadə.* Qusar r-nunun Gədəzeyxur i.ə.v.-də kənd. Qusar maili düzənliyindədir. Oykonim ərazideki eyniadlı qalanın adını daşıyır.

**Güneyçartar** *oyk., mür.* Xocavənd r-nunun Güneyxırman i.ə.v.-də kənd. Qarabağ silsiləsinin ətəyindədir. Güneyçarpaz variantında da qeydə alınmışdır. Oykonim *güney* (güntutan, cənub) və *çartar/çartaz* (dağda uçurum, yarğan) komponentlərindən düzəlib, "cənubda yerləşən yarğanlı dağ" mənasındadır. Kənd yerləşdiyi ərazinin coğrafi mövqeyi ilə bağlı adlandırılmışdır.

**Güneyçay** *hidr., mür.* Qəbələ r-nunun ərazisində çay. Hidronim "güneydən, cənubdan axan çay" mənasındadır.

**Güneyxırman** *oyk., mür.* Xocavənd r-nunun eyniadlı i.ə.v.-də kənd. Qarabağ silsiləsinin ətəyindədir. Yaşayış məntəqəsini Güneyçartar kəndindən çıxmış ailələr keçmiş əkin yerində salmışdılar. Gəlmə ermənilər kəndin adını Güneyqaler (*qaler* erm. "xırman" deməkdir) kimi rəsmiləşdirmişdilər. 1992-ci ildən kəndin keçmiş adı özünə qaytarılmışdır. Oykonim *güney* (gün tutan yer) və *xırman* (taxıl zəmisi, taxıl döyülən yer) komponentlərindən düzəlib, "güneydəki, cənubdakı xırman" mənasındadır.

**Güneykənd** *oyk., mür.* Daşkəsən r-nunun Qabaqtəpə i.ə.v.-də kənd. Dağətəyi ərazidədir. Yaşayış məntəqəsi güneydə, cənubda yerləşdiyi üçün belə adlandırılmışdır.

**Güneyqaler** b.a.x. Güneyxırman.

**Güneyməhlə** *oyk., mür.* Quba r-nunun Rustov i.ə.v.-də kənd. Çağacıq çayının sahilindədir. Yaşayış məntəqəsi Rustov kəndinin məhəlləsi kimi yaranmış, sonra müstəqil kəndə çevrilmişdir. Oykonim "güneydə yerləşən məhəllə, kənd" mənasındadır.

**Güneypəyə** *oyk., mür.* Kəlbəcər r-nunun Qılıclı i.ə.v.-də kənd. Şərqi Göyçə silsiləsinin ətəyindədir. Kəndin ərazisi əvvəllər Qılıclı kəndinin qoyun binəsi olmuşdur. Yaşayış məntəqəsi XIX əsrdə Qılıclı kəndindən gəlmiş ailələrin güneydə yerləşən bu binədə məskunlaşması nəticəsində yaranmışdır.

**Günəbaxan** *or., sadə.* 1. Gədəbəy r-nunda dağ. Şahdağ silsiləsinin zirvəsidir. Hün. 2526 m.; 2. Tovuz r-nunda dağ. Böyük Qışlaq kəndindən c.-da yerləşir. Hün. 2044 m. Bu yüksəkliklər üzü günəşə doğru olduğundan belə adlandırılmışdır.

**Günəhir** *oyk., sadə.* Lənkəran r-nunun Gegiran i.ə.v.-də kənd. Dağətəyi ərazidədir. Tədqiqatçılara görə, oykonim bir qədər təhrifə uğramış, əslində Quynahir olmalıdır. Talış dilində *quynahir* "qatı, sıx duman" deməkdir. Kəndin ərazisi ilin çox vaxtı dumanlı, çənli olduğundan belə adlandırılmışdır.

**Günəş** *oyk., sadə.* Beyləqan r-nunun Örənqala i.ə.v.-də qəsəbə. Mil düzündədir. Yaşayış məntəqəsini 1954-cü ildə Cəbrayıl r-nunun Sirik və Nüsüs kəndlərindən köçüb gəlmiş ailələr Komsomolun 50 illiyi adına üzümçülük sovxozunun Örənqala şöbəsinin malikanəsi yanında salmışdılar. 1965-ci ildə qəsəbəyə rəmzi olaraq Günəş adı verilmişdir.

**Günəşli** *oyk., sadə.* 1. Dəvəçi r-nunun Beynəlmiləl i.ə.v.-də kənd. Samur-Dəvəçi ovalığındadır. Yaşayış məntəqəsi keçmiş SSRİ Konstitusiyası sovxozunun 2 nömrəli malikanəsi yanında salınmışdır. 1965-ci ildə rəmzi olaraq Günəşli adlandırılmışdır; 2. Bakı şəhəri, Suraxanı r-nu ərazisində yaşayış massivi. Əhmədli yaylasındadır; 3. Xaçmaz r-nunun Nabran i.ə.v.-də kənd. Xəzər dənizi sahilində, Samur-Dəvəçi ovalığındadır. 4 nömrəli Yalama balıq vətəgəsi yanında salınmışdır. 1965-ci ildə kəndə rəmzi olaraq Günəşli adı verilmişdir; 4. Xocavənd r-nunun Xocavənd qəsəbə i.ə.v.-də kənd. Dağətəyi ərazidədir. Keçmiş Adı Norəşen ("yeni kənd" mənasında) olmuşdur. XIX əsrdə Cənubi Azərb.-nın Qaradağ mahalından köçüb gəlmiş erməni ailələrinin məskunlaşması nəticəsində yaranmışdır. 1992-ci ildən rəmzi olaraq Günəşli adlandırılmışdır; 5. Şəmkir r-nunun Saler i.ə.v.-də kənd. Dağətəyi ərazidədir. Yaşayış məntəqəsini XIX əsrin ortalarında Rusiyadan köçürülmüş kəndlilər Novotroitskoye adı ilə salmışlar. Kənd salındığı ərazinin adı ilə bir müddət Günəşli kimi tanınmışdır. Sonralar knyaz Qolitsının adı ilə Qolitsıno adlandırılmışdır. Siyasi hadisələrlə əlaqədar 1918-ci ildə kəndin sakinləri Şimali Qafqaza köçmüşlər. Sonralar Ermənistanın Noyemberyan r-nundan Gədəbəyin mis mədənlərinə işləməyə gəlmiş erməni ailələri burada məskunlaşmışdı. 1929-cu ildə Qolitsınoda Martuni adına kolxoz yaradılmış və kəndə də Martuni (A.F.Myasnikovun təxəllüsü) adı verilmişdir. 1990-cı ildə yaşayış məntəqəsinin adı dəyişdirilərək yenidən Günəşli adlandırılmışdır. Oykonim oğuz türkmənlərinin tərkib hissələrindən biri olan *günəşli* (*gündaşlı*) oymağının adı ilə bağlıdır.

**Günəvşa** *oyk., mür.* Siyəzən r-nunun Ərzıküş i.ə.v.-də kənd. Dağlıq ərazidədir. Yerli əhali kəndin adını Günəşə variantında tələffüz edir. Tədqiqatçılara görə, oykonim tat dilindəki *kun* (dib, alt) və *üşə* (meşə) sözlərindən düzəlib, "meşənin ətəyi, dibi" mənasındadır.

**Günəyaydağ** *or., mür.* Qax r-nunda dağ. Baş Qafqaz silsiləsinin c. yamacındadır. Əsli Günəxaydağdır. Bəzi tədqiqatçılara görə, Günəxay oronimi qədim türk dillərindəki *gün* və *axay* (batan yer) sözlərindən düzəlib, "günbatan" deməkdir. Başqa bir fikrə görə, toponim qismən təhrifə uğramış, əslində Güneyxay olmalıdır. Türk dillərindəki *güney* və ləzgi dilindəki *xay* (uçurum) sözlərindən düzəlmiş bu oronim "güneydə olan uçurumlu dağ" mənasındadır.

**Güngörməz** *or., sadə.* Şamaxı r-nu ərazisində dağ. Dağın şm. tərəfinin Pirsaat çayına baxan hissəsi dik qayadan ibarət olduğu üçün burada günəşin qabağı tutulduğundan və xeyli ərazi daim kölgədə qaldığından belə adlanır. Dağda eyniadlı müdafiə istehkamı və qala qalıqları var. Ağdərə r-nunda eyniadlı dağ, Zəngilan r-nunun Qarababa kəndində isə eyniadlı dərə mövcuddur.

**Günqışlaq** *oyk., mür.* Zəngilan r-nunun Canbar i.ə.v.-də kənd. Dağətəyi ərazidədir. Əsl adı Güneyqışlaqdır. Keçmiş adı Düşmənli olmuşdur. Yaşayış məntəqəsi günəşli qışlaq yerində salındığı üçün belə adlandırılmışdır.

**Günnüt** *oyk., sadə.* Şərur r-nunun Cəlilkənd i.ə.v.-də kənd. Şərur düzündədir. Keçmiş adı Günnüt Cəfərli olmuşdur. Yaşayış məntəqəsini cəfərli nəslinə mənsub ailələr Günnüt adlı yerdə salmışlar. Toponimiyada *günnüt* sözünü "çəmən, düzən", *günnük* sözünün təhrif forması kimi "gün vurun yer", "güzdək, son bahar yaşıllığı, payız otlağı"

mənaları və nəhayət monqolların tərkibində Naxçıvana gəlmiş *günnüt* tayfasının adı ilə bağlayırlar

**Gürcə** *or., sadə* Oğuz r-nu ərazisində dağ Baş Qafqaz silsiləsinin c. yamacındadır Hün. 2587 m. Oronim Gürcü etnoniminin təhrif variantı hesab edilir "Gürcü dağı" kimi izah olunur

**Gürcülü** *oyk., düz* Qubadlı r-nunun Novlu i.ə.v.-də kənd Bərgüşad silsiləsinin yamacındadır Yaşayış məntəqəsinin salınması haqqında iki ehtimal mövcuddur Bir ehtimala görə, kəndin ilk sakinləri vaxtilə Gürcüstandan gəlmiş azərb. ailələr olduğu üçün belə adlandırılmışdır Digər ehtimala görə, mülkədarlar gürcü əsirlərini öz torpaq sahələrində işlətmiş, sonralar onların geri qayıtmasına baxmayaraq, kənd Gürcülü adlandırılmışdır

**Gürcüvə** *oyk., mür* Ağdaş r-nunun Məşədi i.ə.v.-də kənd Şirvan düzündədir Əsl adı Gürcüobadır 1917-ci ildə Gürcüabad variantında qeydə alınmışdır Yaşayış məntəqəsi XIX əsrin əvvəllərində Nuxa qəzasından gəlmiş ingiloy ailələrinin məskunlaşması nəticəsində yaranmışdır Oykonimin tərkibindəki *gürcü* etnik adı da əslində gürcü dilinin dialektində danışan ingiloylara aiddir

**Gürcüvan** *oyk., mür* Ağsu r-nunun eyniadlı i.ə.v.-də kənd Gürcüvan yastanındadır Mənbələrin məlumatına görə, yaşayış məntəqəsini Gürcüstandan gəlmiş erməni ailələri saldığı üçün belə adlandırılmışdır

**Gürdəh** *oyk., mür* Quba r-nunun Rük i.ə.v.-də kənd Dağətəyi düzənlikdədir Yaşayış məntəqəsi XIX əsrdə sahibkar Ağabəy Sadıqova məxsus qışlaq yerində əhalinin məskunlaşması nəticəsində yaranmışdır *Gürdəh* Girdəxanı adının təhrif olunmuş formasıdır Oykonim *girdə* (yumru, dairəvi) və tat dilindəki *xari* (yer, torpaq, sahə) sözlərindən düzəlib, "yumru yer" deməkdir

**Gürgan** *oyk., sadə* Bakı şəhəri Əzizbəyov r-nunda ştq Xəzər dənizi sahilində, Abşeron yarımadasındadır Qəsəbə Zirə kəndindən ş.-də yerləşən Gürgan burnunun adı ilə adlandırılmışdır Qədimdə bu ərazidə Gürgan şəhəri olmuşdur Xəzər dənizinin suyunun qalxması ilə şəhər suya qərq olmuş, sonralar suyun səviyyəsinin enməsi ilə yenidən üzə çıxmışdır Zirədən ş.-ə gedən qədim yol Gürgan yolu, yaxınlıqdakı üzümlüklər isə Gürgan bağları adlanır Şəhər *girgan* tayfasının məskunlaşması nəticəsində yaranmışdır Girganlar Xəzərin c.-q. sahilində yaşamışlar Belə ehtimal edilir ki, girganların müəyyən hissəsi Xəzər sahili boyu hərəkət etmiş və Abşeronda məskunlaşmışlar

**Gürgan burnu** *or., mür* Abşeron yarımadasının ş.-ində, Zirə kəndindən təqr. 5 km ş.-də burun Yerli əhali Şəhri Girgan da adlandırır Burunun adı vaxtilə burada mövcud olmuş qədim Gürgan şəhərinin adındandır

**Gürzallar** *oyk., sadə* Goranboy r-nunun eyniadlı i.ə.v.-də kənd Dağətəyi ərazidədir Yerli əhalinin məlumatına görə, yaşayış məntəqəsini Qazax mahalından köçüb gəlmiş *gürzallar* nəslinə mənsub ailələr saldığı üçün belə adlandırılmışdır

**Gürzəçıxtəpə** *or., mür* Biləsuvar r-nunda dağ Oronim "gürzə çıxan təpə" mənasındadır

**Gürzün** *or., sadə* Tovuz r-nunda dağ Gödəkdaş silsiləsinin zirvəsidir. Hün. 609 m Ədəbiyyatlarda Gürzündağ, Gürzan zirvəsi variantlarında da qeydə alınmışdır Oronim ərazidəki *Kürsan* kəndinin adının təhrif formasıdır Bu qədim kəndin adı da mənbələrdə Gurzan, Kırzan, Krzan və s. kimi qeyd olunur

**Güvədliçay** *hidr., mür* Lənkəran r-nu ərazisində çay Əsli Güvənliçaydır Hidronim *güvəndli* (etn.) və *çay* komponentlərindən düzəlib, "güvəndlilərə məxsus çay" deməkdir Etnotoponimdir

**Güvəndik** *oyk., sadə* Tovuz r-nunun Çeşməli i.ə.v.-də kənd. Dağətəyi ərazidədir Oykonimi *göyənlik* (otluq) sözü ilə və ya *Güvəndik* şəxs adı ilə bağlayırlar Əslində, kəndin adı *güvəndli/güvəndlik* nəsil adı ilə bağlıdır 1933-cü ildə kəndin adı Güyəndilər variantında qeydə alınmışdır

**Güvənli** *oyk., sadə*. Lənkəran r-nunun Aşağı Nüvədi i.ə.v.-də kənd Lənkəran çayının sahilindədir *Güvəndli* nəsil adı ilə bağlı olub, etnotoponimdir 1933-cü ildə Gədəbəy r-nunda Güvənlı adlı kənd qeydə alınmışdır

**Güvlnnı** *or., sadə* Abşeronda dağ *Güvəndli* nəslinin adı ilə bağlı olub, etnotoponimdir





**Güyüm** *oyk., sadə* İsmayıllı r-nunun Diyallı i.ə.v.-də kənd Niyaldağ silsiləsinin ətəyindədir *Güyüm* su daşımaq üçün istifadə edilən "mis səhəng"dir Bir çox sənətkarlıq sahələrinin inkişaf etdiyi İsmayıllı r-nunun bu kəndində, güman ki, güyüm düzəltməklə məşğul olmuşlar

**Güzdək** *oyk., sadə* Bakı şəhəri Abşeron r-nunda ştq. və d.y. stansiyası Qəsəbə 1959-cu ildə neft yataqlarının istismar edilməsi ilə əlaqədar olaraq salınmışdır Qəsəbənin ərazisi Abşeron kəndlərinin qışda qoyun saxladıqları yer olmuşdur. Buradakı ağıllar (yerli əhali arasında *xəmbək* adlanır) indi də qalmaqdadır Oykonim türk dillərində geniş yayılmış *güz/küz* (payız) sözündən və məkan bildirən *-dak/-lak* şək.-sindən ibarət olub, "payız otlağı, payız binəsi, payızlıq" deməkdir

**Güzəndağ** *or., mür* Qazax r-nu ilə Ermənistanın sərhədində dağ Oronim *güz/küz* (qəd. türk dillərində "payız"), *-ən* (yer, məkan) və *dağ* (müsbət relyef forması) komponentlərindən düzəlib, "payız otlağı olan dağ" mənasındadır.

**Güznüt** *oyk., sadə* Babək r-nunun Nehrəm i.ə.v.-də kənd. Düzənlikdədir Naxçıvan dialektində *güznüt* "payız əkini" deməkdir Kəndin ərazisində payızlıq əkin aparıldığından belə adlandırılmışdır

# Hh

**Hacallı** *oyk., sadə* 1 Goranboy r-nunun Qarqucaq i.ə.v.-də kənd Gəncə-Qazax düzənliyindədir; 2 Qəbələ r-nunun eyniadlı i.ə.v.-də kənd. Şəki-Qəbələ yaylasının Hacallı düzündədir; 3. Samux r-nunun Lək i.ə.v.-də kənd Gəncə-Qazax düzənliyindədir 4 Tərtər r-nunun Soyulan i.ə.v.-də kənd Qarabağ düzündədir; 5 Tovuz r-nunun Əlibəyli i.ə.v.-də kənd Tovuz çayının sahilində, dağətəyi ərazidədir Keçmiş adı Şəmşədil olmuşdur Yaşayış məntəqəsi 1515-ci ildə qızılbaşların zülqədər tayfasının şəmsəddinli qolunun məskunlaşması nəticəsində yarandığı üçün XIX əsrin əvvəllərinə qədər Şəmşədil adlanmışdır; 6 Zəngilan r-nunun eyniadlı i.ə.v.-də kənd. Düzənlikdədir Yaşayış məntəqələri *hacıllı/hacıalılı* tayfasının məskunlaşması nəticəsində yaranmışdır. Etnotoponimdir

**Hacalılı** *oyk., sadə* Bərdə r-nunun 1 Mehdixanlı i.ə.v.-də kənd, 2 Xəsili i.ə.v.-də kənd, 3 Şatırlı i.ə.v.-də kənd Qarabağ düzündədir Yerli əhali arasında Hacallı formasında işlənir Yaşayış məntəqələrini *hacıalılı* tayfasına mənsub ailələr saldığı üçün belə adlandırılmışdır

**Hacı Qaraqaşlı** *oyk., mür* Dəvəçi r-nunun Çöl Quşçu i.ə.v.-də kənd. Samur-Dəvəçi ovalığındadır XVIII əsrin axırlarında Quba xanı Fətəli xanın (1757-89) Qarabağdan köçürüb gətirdiyi *qaraqaşlı* tayfasına mənsub ailələrin məskunlaşması nəticəsində yaranmışdır *Hacı* həmin ailələrin başçısının adı olmuşdur

**Hacı Zeynalabdin** *oyk., sadə* Sumqayıt şəhər i.ə.v.-də qəsəbə Xəzər dənizi sahilindədir 1911-ci ildə Xaçmaz r-nunun Şollar kəndindən Bakıya su kəmərinin çəkilməsi ilə əlaqədar Qumlutəpə adlı ərazidə suvarma üçün nasos stansiyasının tikintisinə başlanmışdı Stansiyaya xidmət edənlər məskunlaşdıqdan sonra yaşayış məntəqəsini Nasoslu adlandırmışdılar Su kəməri çəkilməsindən, layihələşdirilməsindən tutmuş nasos stansiyasının tikilməsinə qədər Bakı milyonçusu *Hacı Zeynalabdin Tağıyevin* (1838-1924) vasitəsi hesabına başa gəlmişdi Buna görə də 1990-cı ildə qəsəbəyə H.Z.Tağıyevin adı verildi

**Hacıağabəyli** *oyk., sadə* Göyçay r-nunun Yeniarx i.ə.v.-də kənd Şirvan düzündədir Yaşayış məntəqəsini XIX əsrdə Şirvanda yaşayan *ağabəyli* elatına mənsub və başçısı *hacı* olan ailələr saldığına görə belə adlandırılmışdır Oykonim "ağabəylilərin hacıya mənsub hissəsi" mənasındadır

**Hacıağalar** *oyk., sadə* Quba r-nunun Rustov i.ə.v.-də kənd Rustov çökəkliyindədir Kəndi XIX əsrin ortalarında *Hacıağa* adlı bir nəfər saldığı üçün onun adı ilə adlandırılmışdır

**Hacıalılar** *oyk., sadə* 1 Gədəbəy r-nunun Poladlı i.ə.v.-də kənd Dağətəyi ərazidədir; 2 Şəmkir r-nunun Çardaqlı i.ə.v.-də kənd *Hacıalılı* tayfasının məskunlaşması nəticəsində yaranmış yaşayış məntəqələridir

**Hacıalmuradlı** *oyk., sadə* İmişli r-nunun Xəlfəli i.ə.v.-də kənd Muğan düzündədir Oykonim *hacıalmuradlı* nəslinin adını daşıyır

**Hacıbəbir** *oyk., sadə* Sabirabad r-nunda kənd Muğan düzündədir Yaşayış məntəqəsini XIX əsrin ortalarında *Hacı Bəbir* adlı şəxsin başçılıq etdiyi tirəyə mənsub ailələr saldığı üçün belə adlandırılmışdır

**Hacıbədəlli** *oyk., sadə* Ağcabədi r-nunun eyniadlı i.ə.v.-də kənd. Düzənlikdədir Yaşayış məntəqəsi kəbirli tayfasının *hacıbədəlli* tirəsinin özlərinə məxsus qışlaq yerində məskunlaşması nəticəsində yaranmışdır Etnotoponimdir

**Hacıbəyli** *oyk., sadə*, Bərdə r-nunun Qaradəmirçi i.ə.v.-də kənd Tərtər çayının sahilində, Qarabağ düzündədir Yaşayış məntəqəsi XIX əsrin axırlarında *Hacıbəya* məxsus torpaq sahəsində salındığı üçün belə adlanmışdır Bayat tayfasının tirələrindən biri də *hacıbəyli* adlanır

**Hacıcavadlı** *oyk., düz* Cəlilabad r-nunun Ağdaş i.ə.v.-də kənd Göytəpə çayının sahilindədir Yerli əhalinin məlumatına görə, yaşayış məntəqəsini XVIII əsrdə Cənubi Azərb.-dan gəlmiş İbrahim, Hacı Cavad və İsrafil adlı üç qardaş salmışdır Kənd əvvəllər İbrahimli, sonralar isə Hacı Cavadlı adlanmışdır Oykonim "Hacı Cavada məxsus kənd" mənasındadır







**Hacıəbdürrəhimoba** *oyk., mür* Xaçmaz r-nunun Dədəli i.ə.v.-də kənd Samur-Dəvəçi ovalığındadır Yaşayış məntəqəsini Quba r-nunun Qırız kəndindən olan Hacı Əbdürrəhim adlı şəxs keçmiş qışlaq yerində salmışdır Qışlaq kollektivləşmədən sonra daimi yaşayış məntəqəsinə çevrilmişdir Oykonim *Hacı Əbdürrəhim* (ş.a.) və *oba* komponentlərindən düzəlib, "Hacı Əbdürrəhimə məxsus oba" mənasındadır

**Hacıələkbərli** *oyk., düz* Gədəbəy r-nunun Gərgər i.ə.v.-də kənd Dağlıq ərazidədir Yerli əhalinin məlumatına görə, kəndi vaxtilə Gəncə şəhərinin ətrafındakı kəndlərin birindən gəlmiş *Hacı Ələkbər* adlı şəxs yaylaq yurdunda saldığına görə həmin şəxsin adı ilə adlandırılmışdır

**Hacıəhmədli** *oyk., düz* Bərdə r-nunun Otuzikilər i.ə.v.-də kənd Qarabağ düzündədir Oykonim *Hacı Əhməd* (ş.a.) və *-li* (mənsub.şək.-si) komponentlərindən düzəlib, "Hacı Əhmədə məxsus kənd" mənasındadır

**Hacıəhmədoba** *oyk., mür* Xaçmaz r-nunun Əhmədoba i.ə.v.-də kənd Məzarçayın sahilində, Samur-Dəvəçi ovalığındadır Yaşayış məntəqəsini XIX əsrin ortalarında Quba r-nunun Qırız kəndindən olan *Hacı Əhməd* adlı bir şəxs keçmiş qışlaq yerində salmışdır Kollektivləşmədən sonra daimi yaşayış məntəqəsinə çevrilmişdir Oykonim "Hacı Əhmədə məxsus oba" mənasındadır

**Hacıəlibəy** *oyk., sadə* Xaçmaz r-nunun Yergüc i.ə.v.-də kənd Samur-Dəvəçi ovalığındadır Keçmiş adı Hacıəlibəyqışlaq olmuşdur Yaşayış məntəqəsini XIX əsrdə Yergüc kəndindən çıxmış ailələr salmışlar Kənd *Hacıəlibəya* məxsus ailələrin məskunlaşması nəticəsində yarandığına görə belə adlandırılmışdır

**Hacıəmir aşırımı** *or., mür* Astara r-nu ərazisində dağ aşırımı Belə ehtimal edilir ki, aşırım vaxtilə yaxınlığında *Hacı Əmir* adlı şəxsin yurd yeri olmasına görə belə adlandırılmışdır

**Hacıhəsənli** *oyk., sadə* Tovuz r-nunun Kirən i.ə.v.-də kənd Əsrik çayının sahilində, dağlıq ərazidədir Oykonim *hacıhəsənli* nəslinin adını əks etdirir

**Hacıhətəmli** *oyk., sadə* İsmayıllı r-nunun eyniadlı i.ə.v.-də kənd Dağətəyi ərazidədir XIX əsrin əvvəllərində Quba r-nunun Hapıt kəndindən çıxmış ailələrin məskunlaşması nəticəsində yaranmışdır Hacı Hətəm bu məntəqənin əsasını qoymuş haputluların başçısının adı olmuşdur Əvvəllər maldar həyat tərzi keçirən *hacıhətəmlilər* 1846-cı ildə oturaqlaşmış və məntəqə də onların adı ilə adlandırılmışdır

**Hacıhüseynli** *oyk., sadə* Quba r-nunun eyniadlı i.ə.v.-də kənd Qusar maili düzənliyindədir XIX əsrdə Rusiyadan gəlmiş rus ailələri burada məskunlaşdıqdan sonra kəndə Yelenovka adı verilmişdi 1992-ci ildə kəndin keçmiş adı bərpa edilmişdir *Hacıhüseynli* yaşayış məntəqəsinin əsasını qoymuş nəslin adıdır

**Hacıxanlı** *oyk., sadə* Laçın r-nunun Şəlvə i.ə.v.-də kənd Dağətəyi ərazidədir XIX əsrin əvvəllərində gəlmə ermənilər yerləşdirildikdən sonra salındığı ərazinin adı ilə Zorkeşin/Zorkeşiş adlandırılmışdı Kəndin ərazisi əvvəllər mənşəcə qarabayramlı tayfasının *hacıxanlı* tirəsinin qışlaqlarından biri olmuş, sonralar daimi yaşayış məntəqəsinə çevrilmişdir 1992-ci ildə kəndin adı dəyişdirilərək Hacıxanlı olmuşdur

**Hacıisaoba** *oyk., mür* Xaçmaz r-nunun Qımılqışlaq i.ə.v.-də kənd Samur-Dəvəçi ovalığındadır Yaşayış məntəqəsi XIX əsrin ortalarında Quba r-nunun Qırız kəndindən köçmüş ailələrin keçmişdə *Hacı İsa* adlı bir şəxsə məxsus qışlaq yerində məskunlaşması nəticəsində yaranmışdır Oykonim "Hacı İsaya məxsus oba" mənasındadır

**Hacıiskəndərli** *oyk., düz* Dəvəçi r-nunun Ağbaş i.ə.v.-də kənd Samur-Dəvəçi ovalığındadır Keçmişdə Hacıiskəndərqışlaq adlanırdı Yaşayış məntəqəsi Hacı İskəndər adlı bir şəxsin keçmiş qışlaq yerində məskunlaşması nəticəsində yaranmışdır Oykonim "Hacı İskəndərə məxsus kənd" deməkdir

**Hacıismayıllı** *oyk., sadə* Cəlilabad r-nunun Xəlilli i.ə.v.-də kənd. Muğan düzündədir Yaşayış məntəqəsi XIX əsrin əvvəllərində Şatırlı kəndindən köçmüş ailələrin məskunlaşması nəticəsində yaranmışdır *Hacıismayıllı* kəndin əsasını qoymuş nəslin adıdır

**Hacıkənd** *oyk., mür.* Gəncə şəhəri tabeliyində şıq. Dağətəyi ərazidə, meşə içərisində iqlim kurortudur. Yaşayış məntəqəsi 1870-ci ildə Hacı Mirqasım və onun qardaşlarının malikanəsi əsasında salınmışdır. Sonralar indiki Xanlar şəhərində yaşamış alman kolonistləri burada tikinti-abadlıq işləri apararaq onu öz yaylaq-kurort məskənlərinə çevirmişdilər. Oykonim *Hacı* (Mirqasımın titulu) və *kənd* komponentlərindən düzəlib, "Hacının kəndi, Hacının mülkü" deməkdir.

**Hacıqabul** *oyk., sadə.* Azərb.-da inzibati r-n. Şirvan düzündədir. Mərkəzi Qazıməmməd (keçmiş Hacıqabul) şəhəridir. Yerli əhalinin məlumatına görə, Məkkədən (Həcc ziyarətindən) gələn hacıların burada qarşılanması və qəbul edilməsi ilə əlaqədar yaşayış məntəqəsi belə adlandırılmışdır.

**Hacıqabul** *hidr., sadə.* Şirvan düzünün ş hissəsində, Kür çayının sol tərəfində göl. Gölə su Qarasudan və Kür çayından buraxılır. C. hissəsində Şorşor kanalı vasitəsilə Kür çayı ilə birləşir. Gölün ətrafı bataqlıq və qamışlıqdır. Göl yaxınlıqdakı Hacıqabul (indiki Qazıməmməd) yaşayış məntəqəsinin adı ilə adlanmışdır.

**Hacıqayıb** *oyk., sadə.* Quba r-nunun Hacıhüseynli i.ə.v.-də kənd. Qudyal çayının sahilində, Qusar maili düzənliyindədir. Keçmiş adı Hacıqayıbqışlaq olmuşdur. XIX əsrin ortalarında Qrız kəndindən köçüb gəlmiş ailələrin məskunlaşması nəticəsində yaranmışdır. *Hacı Qayıb* yaşayış məntəqəsini salmış şəxsin adıdır.

**Hacıqazma** *oyk., mür.* Xaçmaz r-nunun Əhmədoba i.ə.v.-də kənd. Samur-Dəvəçi ovalığındadır. XIX əsrin ortalarında Sumaqova kəndindən köçmüş ailələrin məskunlaşması nəticəsində yaranmışdır. Oykonim *Hacı* (ş.a.) və *qazma* (qəd. ev tipi) komponentlərindən ibarət olub, "Hacıya məxsus qazma" mənasındadır.

**Hacıqədirli** *oyk., sadə.* 1. Ağsu r-nunun Ərəbsarvan i.ə.v.-də kənd. Şirvan düzündədir; 2. Şamaxı r-nunun Bağırlı i.ə.v.-də kənd. Şirvan düzündədir. XIX əsrdə Şamaxı qəzasında maldarlıqla məşğul olmuş 84 ailədən ibarət bir elat *hacıqədirli* adlanırdı. Onlar yayı Dağlıq Şirvanda, qışı isə Şirvan düzündə keçirirdilər. XIX əsrin sonlarında oturaqlaşmağa başlayan hacıqədirlilər bu yaşayış məntəqələrində məskunlaşmışdılar.

**Hacıqəhrəmanlı** *oyk., sadə.* Əli Bayramlı r-nunun Əli Bayramlı şəhər i.ə.v.-də şıq. Kür çayının sahilində, düzənlikdədir. Yaşayış məntəqəsini 1870-ci ildə burada oturaqlaşmış *hacıqəhrəmanlı* nəsli saldığına görə belə adlandırılmışdır.

**Hacıqərvənd** *oyk., sadə.* Tərtər r-nunun Seydımli i.ə.v.-də kənd. Qarabağ düzündədir. Keçmiş adı Acı Kərrvənd olmuşdur. Kənd əvvəllər *Acıdüzü* adlanan yerdə *qərvənd* tayfasına mənsub ailələrin məskunlaşması nəticəsində yaranmış, sonralar acı komponentinin əvvəlinə tələffüzdə *h* səsi artırılmışdır.

**Hacıqurbanoba** *oyk., mür.* Xaçmaz r-nunda kənd. Qudyal çayının sahilində, Samur-Dəvəçi ovalığındadır. Oykonim *Hacı Qurban* (ş.a.) və *oba* komponentlərindən düzəlib, "Hacı Qurbana məxsus oba" mənasındadır. Kəndi XIX əsrin ortalarında Quba r-nunun Qrız kəndindən olan Hacı Qurban adlı şəxs keçmiş qışlaq yerində salmışdır.

**Hacılar** *oyk., sadə.* 1. Ağdaş r-nunun Yuxarı Nemətabad i.ə.v.-də kənd. Şirvan düzündədir; 2. Ağcabədi r-nunun Boyat i.ə.v.-də kənd. Düzənlikdədir; 3. Bərdə r-nunun Mustafaağalı i.ə.v.-də kənd. Qarabağ düzündədir. Yerli əhali arasında Hacallı kimi işlənir; 4. Gədəbəy r-nunun eyniadlı i.ə.v.-də kənd. Dağətəyi ərazidədir. Yerli əhalinin məlumatına görə, yaşayış məntəqəsini İmamverdi oğlu *Hacı Həzrətqulu* adlı şəxs saldığı üçün belə adlanır. Hacının babası Qüdrətquluxan İranın Güney kəndindən gəldiyi üçün kəndin adı el arasında Güneykənd kimi də işlənir; 5. Xaçmaz r-nunun Qalağan i.ə.v.-də kənd. Samur-Dəvəçi ovalığındadır; 6. Laçın r-nunun eyniadlı i.ə.v.-də kənd. Qarabağ yaylasındadır. XIX əsrdə Qarıqışlaq kəndinin binə yerlərindən biri olan bu ərazidə Hacı qəbri adlanan yer də var; 7. Tovuz r-nunun Çatax i.ə.v.-də kənd. Əsrik çayının (Axınca çayının qolu) sahilində, Kiçik Qafqaz dağlarının yamacındadır. Yaşayış məntəqələri qızılbaşların zülqədər tayfasının *hacılar* tirəsinə mənsub ailələrin məskunlaşması nəticəsində yarandığı üçün belə adlandırılmışdır. Etnotoponimdir.





**Hacılı** *oyk., sadə.* 1. Cəbrayıl r-nunun eyniadlı i.ə.v.-də kənd. Dağətəyi ərazidədir. Yaşayış məntəqəsi *hacılı* tirəsinə mənsub ailələrin Dübar adlı sahədə məskunlaşması nəticəsində yaranmışdır; 2. Füzuli r-nunun Böyük Bəhmənli i.ə.v.-də kənd. Düzənlikdədir; 3. Şamaxı r-nunun eyniadlı i.ə.v.-də kənd. Dağətəyi ərazidədir. Yaşayış məntəqəsi təklə tayfasının tağıbəyli, şəkərbəyli, ədəqli, seyidəhmədli, mehralı, mollaməhərrəmli və mahmudlu tirələrindən ibarət olmuş *hacılı* qoluna mənsub ailələrin məskunlaşması nəticəsində yaranmışdır.

**Hacılıkənd** *oyk., mür.* Göyçay r-nunun Qarabaqqal i.ə.v.-də kənd. Şirvan düzündədir. Tədqiqatçılara görə, oykonim XVI əsrdə Şirvanda məskunlaşmış qızılbaşların zülqədər tayfasına mənsub *hacılar* tirəsinin adını əks etdirir. Hacalıkənd variantında da qeydə alınmışdır.

**Hacımahmudlu** *oyk., düz.* Yevlax r-nunun Qaramanlı i.ə.v.-də kənd. Qarabağ düzündədir. Kəndi *Hacı Mahmud* adlı şəxs saldığına görə belə adlandırılmışdır.

**Hacıman** *oyk., mür.* Ağsu r-nunun Kalva i.ə.v.-də kənd. Düzənlikdədir. Yaşayış məntəqəsi Cənubi Azərb. ərazisindən köçüb gəlmiş ailələrin məskunlaşması nəticəsində yaranmışdır. Oykonimin *Hacı* (ş.a.) və *man* (ev, mənzil, məskən) komponentlərindən ibarət olub, "Hacının mülkü" mənasını ifadə etməsi ehtimal edilir. Lakin kəndin adının etnotoponim olması da istisna deyil.

**Hacıməmmədli** *oyk., sadə.* Ağdam r-nunun Əfətli i.ə.v.-də kənd. Düzənlikdədir. Yaşayış məntəqəsi kəbirlilərin ulubabalı qoluna mənsub *hacıməmmədli* (tam adı *hacıməhəmmədhüseynli*) tirəsinin Ağburun adlı yerdə məskunlaşması nəticəsində yaranmışdır; 2. Cəlilabad r-nunun Şiləvəngə i.ə.v.-də kənd. Lənkəran ovalığındadır. Yaşayış məntəqəsi *hacıməmmədli* tirəsinin məskunlaşması nəticəsində yaranmışdır. Etnotoponimdir.

**Hacıməmmədoba** *oyk., mür.* Xaçmaz r-nunun Pirquluoba i.ə.v.-də kənd. Samur-Dəvəçi ovalığındadır. Kənd XIX əsrdə Quba r-nunun Hənit kəndindən olan *Hacı Məmməd* adlı bir şəxsə məxsus keçmiş qışlaq yerində salınmışdır. Kollektivləşmədən sonra qışlaq daimi yaşayış məntəqəsinə çevrilmişdir. Oykonim "Hacı Məmmədə məxsus oba" deməkdir.

**Hacımərdan** *or., sadə.* Hacıqabul r-nunda, Qobustanın c.-ş. hissəsində fəaliyyətsiz palçıq vulkanıdır. Hacı Mərdan adlı şəxsin adı ilə bağlılığı ehtimal edilir. Əslində oronim ərazidəki *Mərdan* komponentli (Daşmərdan, Peşmərdan) yüksəklik adlarından biridir. Oronimin birinci komponenti isə Hacıqabul adı ilə bağlıdır.

**Hacımustafalı** *oyk., sadə.* İmişli r-nunun Cəfərli i.ə.v.-də kənd. Kür çayının sahilində, Muğan düzündədir. Oykonim *hacımustafalı* (və ya *mollamustafalı*) nəslinin adındandır.

**Hacısamlı** *oyk., sadə.* Laçın r-nunun Kürdhacı i.ə.v.-də kənd. Şəlvə çayının sahilindədir. Kənd qədimdən Qarabağda yaşamış qaraçorlu tayfasına mənsub *hacısamlı* tirəsinin məskunlaşması nəticəsində yaranmışdır. Mənbələrin məlumatına görə, XIX əsrin 30-cu illərində *hacısamlıların* bir hissəsi Naxçıvanda yaşayırdı.

**Hacıselli** *oyk., sadə.* Yevlax r-nunun Havarlı i.ə.v.-də kənd. Şirvan düzündədir. Yerli əhali tərəfindən Hajselli, Hayselli kimi də tələffüz edilir. Kəndin adı *hacıselli* nəslinin adı ilə bağlıdır.

**Hacısəmədli** *oyk., düz.* Ağsu r-nunun Qaraqoyunlu i.ə.v.-də kənd. Düzənlikdədir. Oykonim Hacı Səməd (ş.a.) və -li (mənsub.şək.-si) komponentlərindən düzəlib, "Hacı Səmədə məxsus kənd" mənasındadır.

**Hacışəkər** *oyk., sadə.* Siyəzən r-nunun Ərzıküş i.ə.v.-də kənd. Baş Qafqaz silsiləsinin ətəyindədir. Keçmiş adı Hacışəkərqazma olmuşdur. Kənd vaxtilə *Hacı Şəkər* adlı şəxsin qazması (binəsi) əsasında yarandığından belə adlandırılmışdır.

**Hacıtəpə** *oyk., sadə.* Masallı r-nunun Xırmandalı i.ə.v.-də kənd. Lənkəran ovalığındadır. Tədqiqatçılara görə, oykonim təhrifə uğramış *Haçatəpə* oronimindən olub, ərazidəki haça (qoşa zirvəli) təpənin adından yaranmışdır.

**Hacıturalı** *oyk., düz.* Ağdam r-nunun Əfətli i.ə.v.-də kənd. Qarabağ düzündədir. Yerli əhalinin məlumatına görə, kəndin adı qismən təhrifə uğramış, əslində Hacıturablı olmuş-

dır Oykonim *Hacı* Turab (ş a ) və *-lı* (mənsub şək -si) komponentlərindən düzəlib, "Hacı Turaba məxsus kənd" mənasındadır

**Hacıuşağı** *oyk sadə* Ağsu r-nunun Kəndoba i ə v -də kənd. Düzənlikdədir Kəndi *hacıuşağı* nəslinə mənsub ailələr saldığı üçün belə adlandırılmışdır

**Hacıvar** *oyk., mür* Babək r-nunun Yarımca i ə v -də kənd Naxçıvan çayının sahilində, Arazboyu düzənlıkdədir Oykonim *Hacı* (ş a ) və İran mənşəli *var* (yer, kənd) komponentlərindən düzəlib, "Hacıya məxsus kənd" mənasındadır

**Hacıvəlli** *or , sadə* Şamaxı r-nu ərazisində palçıq vulkanı Etnotoponimdir

**Haçadağ** *or , mür* Qazax r-nu ərazisində yüksəklik Həsənsu çayından sol tərəfdədir Hün 298 m Dağın adı zirvəsinin haça formalı olması ilə bağlıdır

**Haçaqaya** *or , mür* Gədəbəy r-nu ərazisində dağ. Şahdağ silsiləsının şm yamacında zirvədir Hün 2124 m Dağın zirvəsi uzaqdan haça şəklində göründüyünə görə belə adlandırılmışdır Dağda eyniadlı pir də var

**Haçaqaya** *oyk , sadə* Xanlar r-nunun Bolçalı i ə v -də kənd Dağətəyi ərazidədir Yaşayış məntəqəsi yaxınlığındakı Haçaqaya dağının adı ilə adlandırılmışdır

**Haçatala** *oyk , mür* Qusar r-nunun Gilah i ə v -də kənd Qusar maili düzənliyindədir Oykonım *haça* (ikiyə ayrılan) və *tala* (meşədə açıq sahə) sözlərindən düzəlib "haçalanan tala" mənasındadır

**Hadrut** *oyk , mür* Xocavənd r-nunun eyniadlı qəsəbə i.ə v -də ştq 1939-cu ilədək adı Dizaq olmuşdur. Qozluçayın dərəsində, Arqu dağının ətəyindədir XIX əsrdə Ağoğlan kimi qeydə alınmışdır Oykonim İran dillərindəki ha (ara), du (iki) və rud (çay) komponentlərindən düzəlib, "iki çayın arası" mənasındadır

**Haftoni** *hidr , mür* Lənkəran r-nu ərazisində min bulaqlar. Lənkəran şəhərindən 12 km şm -q -də, Talış dağlarının ətəyindədir Yeddi bulaqdan ibarətdir Müalicə məqsədilə istifadə olunur Hidronim talış dilindəki *haft* (yeddi) və *honi* (bulaq) sözlərindən düzəlib, "yeddi bulaq" deməkdir Gaftoni variantında da qeydə alınmışdır

**Haftoni** *oyk., sadə* 1 Lerik r-nunun Nücü i ə v -də kənd. Dağətəyi ərazidədir; 2 Lənkəran r-nunun eyniadlı i ə v -də ştq Dağətəyi ərazidədir; 3 Lənkəran r-nunun Girdəni i.ə v.-də kənd. Lənkəran ovalığındadır Bu kəndlər ərazideki Haftoni min. su bulaqlarının adını daşıyır

**Haqnəzər** *oyk., sadə*. Laçın r-nunun Təzəkənd i ə v -də kənd. Qarabağ silsiləsinin yamacındadır Kəndin keçmış adı Haqnəzərdərəkənd olmuşdur Yaşayış məntəqəsini Ərdəşevə kəndindən köçüb gəlmiş ailələr salmışlar *Haqnəzər* orada ilk dəfə məskunlaşmış şəxsin adıdır.

**Hal** *oyk., sadə* Qubadlı r-nunun eyniadlı i ə v -də kənd. Dağlıq ərazidədir Ədəbiyyatlarda Kol, Gal, Gəl, Xal, Qal variantlarında da qeydə alınmışdır B a x. Gəl (Gülfa)

**Hallavar** *oyk., mür* Oğuz r-nunun Qumlaq i ə.v -də kənd Baş Qafqaz silsiləsinin ətəyində, Alazan-Əyriçay çökəkliyindədir Yerli məlumata görə, oykonim "hündür yer" mənasındadır

**Hamamçay** *hidr , mür* 1 Daşkəsən r-nu ərazisində çay Qoşqar çayının qoludur; 2 Quba r-nu ərazisində çay Qaraçayın sağ qoludur Çaylar suyunun isti və buxarlı olduğuna görə belə adlandırılmışlar, 3 Qax r-nu ərazisində çay Kürmük (Qurmux) çayının sol qoludur Mənbəyini Baş Qafqaz sıra dağlarının c yamaclarından (3350 m. yüksəklikdən) alır İsti sulu min. bulaqlardan (Maqbulaq, Oğlanbulaq, Qızbulaq) qidalandığına görə çay belə adlandırılmışdır

**Hamamdağ** *or , mür* 1 Bakı yaxınlığında, Ələt d y stansiyasından c -q.-də fəaliyyətdə olan palçıq vulkanı Hün 22 m., 2 Hacıqabul r-nu ərazisində dağ. Pirsaat burnu yaxınlığında yerləşir Hün 59 m Oronimlər burada qaynayaraq çıxan vulkanların istiliyinə görə belə adlandırılmışlar

**Hamamdüzü** *or , mür* Daşkəsən r-nu ərazisində düzənlik Hamamçay bu düzənlikdən axdığı üçün belə adlandırılmışdır

**Hamarat** *oyk., sadə* Lerik r-nunun Dəstər i ə v.-də kənd Peştəsər silsiləsinin ətəyindədir Kənd salındığı ərazinin adı ilə adlandırılmışdır *Hamarat* toponimik termin kimi "düzən, səthi hamar və ya hamarlanmış yer" mənasındadır





**Hamarkənd** *oyk., mür*. Yardımlı r-nunun eyniadlı i ə v -də kənd Peştəsər silsiləsinin ətəyindədir Oykonim *hamar* (düzən) və *kənd* sözlərindən düzəlib, "düzənlikdə yerləşən kənd" mənasındadır. Yaşayış məntəqəsi həqiqətən də düzənlikdə salınmışdır

**Hamarqışlaq** *oyk., mür* Cəlilabad r-nunun Xəlilli i.ə v -də kənd. Dağətəyi düzənlikdədir Hamarava variantında da qeydə alınmışdır Yaşayış məntəqəsini Burovar kəndindən çıxmış ailələr XIX əsrin ortalarında salmışlar. Oykonim *hamar* (düzənlik) və *oba*, yaxud *qışlaq* (maldarların müvəqqəti yaşayış yeri) komponentlərindən düzəlib, "düzənlik sahədə salınmış oba, qışlaq" mənasındadır

**Hamarmeşə** *oyk., mür* Lerik r-nunun Vızəzəmin i ə v -də kənd Lənkəran çayının sahilindədir Keçmış adı *Otuzuncu kilometr* olmuşdur Yaşayış məntəqəsi Lənkəran-Lerik avtomobil yolunun 30 km -liyində yerləşdiyinə görə belə adlandırılmışdır Oykonim "düzənlikdə olan meşə" mənasındadır

**Haməşam** *oyk., mür* Astara r-nunun eyniadlı i ə v -də kənd Bəşərü çayının sahilində, dağətəyi ərazidədir Oykonim *hamo* ("hamar" sözünün talış dilindəki tələffüz forması) və *şam* (talış "çayın buruldüğu yerdə yaranmış qövsvari yer") sözlərindən düzəlib, "çayın buruldüğu yerdə yaranmış qövsvarı hamar yer" mənasındadır.

**Hapıt** *oyk sadə* Quba r-nunun Əlik i ə v -də kənd. Baş Qafqaz silsiləsinin yamacındadır Azərb -nın qafqazdilli etnik qrupu olan qrızların məskunlaşdığı kəndlərdəndir Özlərini *hər* adlandırırlar Kəndin adı Ptolemeyin (II əsr) Albaniya şəhərləri sırasında qeyd etdiyi Xabota ilə əlaqələndirilir Azərb dilinin dialektlərində həm *hapıtdı*, həm də *hər* sözü "tələsik, vaxtından tez" mənalarında işlənir

**Hapıt** *hidr , sadə* Quba r-nu ərazisində, Baş Qafqaz silsiləsinin ətəyində min bulaq Bulaq yaxınlığındakı eyniadlı kəndin adını daşıyır

**Hapıtlı** *oyk., sadə* 1 Ağdaş r-nunun Aşağı Ləki i ə v -də kənd Şirvan düzündədir Yaşayış məntəqəsi XIX əsrdə Quba r-nunun Hapıt kəndindən çıxmış ailələr tərəfindən salınmışdır Mənbələrin verdiyi məlumata görə, XIX əsrin ortalarında Göyçay qəzasında 736 *haputlu* ailəsinin məskunlaşdığı Haputlu Məlikli, Haputlu Gıdeyli, Haputlu Nətəs Qacar, Haputlu Hacıhətəmli, Haputlu Mollaqasımlı kəndləri var idi

**Haputuçuran** *or., sadə* Oğuz r-nu ərazisində dağ Baş Qafqaz silsiləsində, Dağıstanın sərhədindədir Hün 4032 m Qədim zamanlardan Quba r-nunun Hapıt kəndinin əhalisinin Azərb -nın şm.-q. zonasına getmək üçün istifadə etdiyi dağ yolunun üstündədir Yerli əhalinin məlumatına görə, bir nəfər hapıtlı burada yıxılıb həlak olduğu üçün dağ belə adlanmışdır

**Harami** *or , sadə*. Şamaxı r-nu ərazisində dağ Udullu kəndinin c -q -indədir Yaxınlığında qədim yaşayış məskəni mövcuddur Dağ vaxtilə bu ərazidə məskən salmış qaçaqların yurdu olduğu üçün belə adlandırılmışdır Harami ər "yolkəsən, soyğunçu, quldur" deməkdir

**Haramtala** *or , mür* Quba r-nu ərazisində dağ Qudyal çayının sağ sahilindədir Hün 1539 m Oronim *haram* ("harami" sözündən olub, "quldur, qaçaq" mənasındadır) və *tala* (meşədə açıq sahə) komponentlərindən düzəlib, "qaçaq talası" mənasındadır

**Haran** b a x Aran (Lerik)

**Harov** *oyk., sadə* Xocalı r-nunun eyniadlı i ə v -də kənd Dağətəyi ərazidədir Yaşayış məntəqəsi Cənubi Azərb -nın Horov kəndindən gəlmiş ailələrin məskunlaşması nəticəsində yaranmışdır Tədqiqatçılara görə, İran dillərindəki *hor* (isti) və *ov* (su) sözlərindən düzəlmiş bu toponim "isti su" mənasındadır

**Hasıllı** *oyk , sadə* Cəlilabad r-nunun Xolilli i ə v -də kənd Dağətəyi düzənlikdədir Belə güman edilir ki, oykonim şamlı tayfalarından olan *asıllı/osolluların* adı ilə bağlıdır Həmin tayfalar Quba və Şirvan zonasında da yaşamışlar Zaqatala r-nunun Çobankol kəndində Asıllar məhəlləsi, Muğanlı kəndində asıllı nəsli, Qazax r-nunda hasıllı tayfası qeydə alınmışdır

**Haşımxanlı** *oyk dür* Sabirabad r-nunun eyniadlı i ə v -də kənd. Kür çayının sahilində, Muğan düzündədir Yaşayış məntəqəsinin adı Şamaxı xanı Mustafa xanın (1790/91-1820) qardaşı *Haşım xanın* adı ilə bağlıdır Rusiya-

İran müharibəsindən (1826-28) sonra Cənubi Azərb -dan köçüb gəlmiş və Rusiya tərəfdarı olan Haşım xanın tabeliyinə verilmiş bir qrup ailə burada məskunlaşmış və kənd onun adı ilə adlanmışdır R-nun ərazısində eyniadlı göl də var 2004-cü ildə kəndin adı Həşimxanlı kimi rəsmiləşdirilmişdir.

**Hat** *oyk , sadə* Qubadlı r-nunun Başarat i ə v -də kənd Qarabağ silsiləsinin ətəyindədir Keçmiş adı Böyük Hat olmuş, yaxınlığındakı Kiçik Hat kəndinin əhalisi buraya köçürüldükdən sonra, *böyük* komponenti ixtisara uğramışdır Yaşayış məntəqəsini əliyanlı tayfasına mənsub ailələr salmışlar Tədqiqatçılara görə, oykonim *had* (kənar, qıraq) sözündəndir

**Hatsi** b a x Çörəkli

**Havalı** *oyk., sadə* Zəngılan r-nunun Məmmədbəyli i ə v -də kənd Araz çayının sahilində, düzənlikdədir Yerli əhalinin məlumatına görə, yaşayış məntəqəsini XIX əsrdə Cənubi Azərb -dan gəlmiş Hava (Həvva adının yerli tələffüz forması) adlı bir qadının övladları buna etdiyi üçün belə adlandırılmışdır Oykonimi Azərb toponimiyasında "yaxşı iqlimli" mənasında işlənən *yelli* topokomponentinin sinonimi kimi də qəbul etmək olar

**Havarlı** *oyk , düz* Yevlax r-nunun eyniadlı i ə v -də kənd Şirvan düzündədir Kəndin ərazısində *havar* adlanan qamış növünün bitməsi ilə əlaqədar olaraq yaşayış məntəqəsi belə adlandırılmışdır

**Həvuslu** *oyk , sadə* Cəbrayıl r-nunun eyniadlı i ə v -də kənd Düzənlikdədir Yerli əhalinin məlumatına görə, yaşayış məntəqəsini *havuslu* tirəsinə mənsub ailələr saldığına görə belə adlanmışdır Havıslı, Hovuzlu variantlarında da qeydə alınmışdır Azərb. dilinin dialektlərində *havıs* kotanın açdığı şırıma deyilir

**Havzova** *oyk , mür* Lənkəran r-nunun Girdəni i ə v -də kənd Talış dağlarının ətəyindədir 1917-ci ildə Havzaul variantında qeydə alınmışdır Bəzi tədqiqatçılara görə, oykonim *havza* (talış "yaşıl") və *oba/ova* sözlərindən düzəlib, "yaşıl oba, yaşıl kənd" deməkdir Lakin güman etmək olar ki, kənd adını ərazidəki eyniadlı mineral bulaqdan almışdır

**Havzova** *hidr , mür* Lənkəran r-nunun Havzova kəndi yaxınlığında min bulaq Talış dağlarının ətəyindədir Hələ qədimdən yerli əhali dəri xəstəliklərinin müalicəsində bu sudan istifadə edir Son vaxtlar burada pansionat, müalicə tikililəri salınmışdır Əsəb, yel və dəri xəstəliklərinin müalicəsində istifadə olunur Hidronim "su hövzəsi" mənasındadır

**Hayad** *oyk., sadə* Kəlbəcər r-nunun Dovşanlı i ə v -də kənd. Dağlıq ərazıdədir Ayad variantında da qeydə alınmışdır Keçmiş adı Axmaxlı olmuşdur Bu ad axmaxlı nəslinin adı ilə bağlı idi *Ayalılar* isə elmi ədəbiyyatda tatarların tərkib hissəsi kimi göstərilir. Qubadlı r-nu ərazısində Ayadı Tağa adlı dağ qeydə alınmışdır

**Hazırəhmədli** *oyk., sadə* Goranboy r-nunun eyniadlı i ə.v -də kənd Gəncə-Qazax düzənliyindədir Oykonim qızılbaşların zülqədər tayfasının *hazırlı* qolunun və həmin qolun *əhmədli* tirəsinin adını əks etdirir Etnotoponimdir

**Herher** b a x Qarqar

**Heriknaz** *oyk., sadə* Gədəbəy r-nunun Şəkərbəy i ə v -də kənd Dağətəyi ərazidədir Yerli əhalinin məlumatına görə, yaşayış məntəqəsini XIX əsrdə Tərtər çayı boyundan gəlmiş və kolanı tayfasından olan Ocaqqulu adlı şəxs salmışdır Sonralar kənd onun arvadı *Heriknazın* (*Ərkınazın*) adı ilə adlandırılmışdır Kəndin adı Ərıknaz variantında da qeydə alınmışdır

**Heşan** *oyk., sadə* Xocavənd r-nunun eyniadlı i ə v -də kənd Qarabağ silsiləsinin ətəyindədir 1992-ci ilədək adı Aşan olmuşdur *Heşan* "taxıl dərzlərinin vəllə döyülməsi, dərzlərin döyüldüyü yer, xırman" deməkdir Kənd xırman yaxınlığında salındığı üçün belə adlandırılmışdır

**Hetavan** b a x· Qozlukörpü

**Hetovlar** *oyk., sadə* Balakən r-nunun Qalalar i ə v -də kənd. Alazan-Əyriçay çökəkliyindədir Yaşayış məntəqəsi Talalar kəndindən köçüb gəlmiş *hetov* nəslinə mənsub ailələrin məskunlaşması nəticəsində yaranmışdır Etnotoponimdir.

**Heybət** *oyk , sadə* Bakı şəhəri Qaradağ r-nunun Şubanı qəsəbə i ə v -də qəsəbə Yaşayış məntəqəsi adını ərazidəki *Bibiheybət məscidinin* adından almışdır





**Heydərli** *oyk , sadə* Gədəbəy r-nunun Şəkərbəy i ə.v -də kənd Dağətəyi ərazıdədir Yerli əhalinin məlumatına görə, yaşayış məntəqəsini XIX əsrin axırlarında həmin r-nun ərazisindəki Dikdaş kəndindən köçüb gəlmiş *heydərli* nəslinə mənsub ailələr saldığı üçün belə adlandırılmışdır

**Heyran** *hidr , sadə* Şamaxı r-nu ərazisində çay Kələnov yaylasından başlanır Çay hazırda həm də Hacıməmmədin yaylağı adlanan Heyran yaylağının adı ilə adlandırılmışdır Oronim və hidronim oğuzların *heyranlı* tayfasının adını əks etdirir

**Heysugözəl** *or , mür* Ordubad r-nunda dağ Oronimin "canlı suyu olan gözəl dağ" mənasında olması ehtimal edilir Güman ki, dağ buradakı min bulaqlara görə belə adlandırılmışdır

**Heyvalı** *oyk., düz* Kəlbəcər r-nunun eyniadlı i ə v -də kənd Qarabağ silsiləsinin ətəyindədir XIX əsrdə Cənubi Azərb -dan gəlmiş erməni ailələri burada yerləşdikdən sonra kənd Drmbon (Heyvalı toponimindən erm -yə kalkadır) kimi rəsmiləşdi 1992-ci ildə kəndin keçmiş adı bərpa edildi Oykonim "heyva ağacları olan yer" mənasındadır

**Heyvanohur** *or , sadə* İsmayıllı r-nunda dağ Göyçay çayının sol sahilindədir Hün 813 m Oronim ərazıdəkı eyniadlı gölün adını daşıyır Hidronim *heyva* (meyvə ağacı) və *nohur* (göl) komponentlərindən düzəlib, "heyvalı göl" deməkdir

**Həbibkənd** *oyk , mür* Xaçmaz r-nunun Pirquluoba i ə v -də kənd Samur-Dəvəçi ovalığındadır Oykonim *Həbib* (ş.a ) və *kənd* sözlərindən düzəlib, "Həbibə məxsus kənd" mənasındadır

**Həftəxuni** b a x Həftoni

**Həftəsov** *hidr , mür* İsmayıllı r-nunun Həftəsov kəndi yaxınlığında, Girdimançayın sağ sahilində min bulaqlar Suyu soyuq və kükürdlüdür Yerli əhali tərəfindən müalicə məqsədilə istifadə edilir Hidronimin düzgün variantının Həftəsiyab olduğunu söyləyirlər Hidronim *həft* (yeddi), *-ə* (bitişdirici sait), *siyab* (qara su) komponentlərindən düzəlib, "yeddi qara su mənbəyi, bulağı" mənasındadır

**Həftəsov** *oyk., sadə.* İsmayıllı r-nunun eyniadlı i ə v -də kənd Girdiman çayının sahilində, Niyaldağ silsiləsinin yamacındadır Yaşayış məntəqəsi kəndin ərazisindəki eyniadlı min bulaqların adını daşıyır

**Həkəri** *hidr , sadə* Laçın, Qubadlı və Zəngilan r-nları ərazısində çay Arazın sol qoludur Mənbəyini Mıxtökən silsiləsinin c -ş yamaclarından (2580 m yüksəklikdən) alır Bərgüşad (Bazarçay) çayı ilə birləşərək Araza tökülür Üzərində üç SES tikilmişdir Yuxarı axarında Şəlvə (eyniadlı kəndin adından) adlanır Keçmiş adı Alban (Ağvan) olmuşdur IX-XII əsrlərə aid ərəb mənbələrində Arrançay adlanır və Araza töküldüyü göstərilir Əkərə də adlanır Görünür, sonralar kürddilli *həkəri* tayfasının ətraf ərazidə məskunlaşması ilə əlaqədar tədricən həmin tayfanın adı ilə tanınmağa başlamışdır

**Həkəri** *oyk., sadə* 1 Qubadlı r-nunun Muradxanlı i ə v -də kənd Həkəri çayının sahilində, dağətəyi ərazidədir Həkəri adı hələ qədim mənbələrdən məlumdur Alban (Qafqaz) tarixçisi Movses Kalankatlı Babək hərəkatı ilə əlaqədar 831-ci il hadisələrindən bəhs edərkən Həkəri qalasının adını çəkib Həmin qala hazırda Qalacıq adı ilə məlumdur *Həkəri* kürddilli tayfa adıdır Hazırda həkərilər əsasən Türkiyə və İranda yaşayırlar. 2 Zəngılan r-nunun Hacallı i ə v -də qəsəbə Göyən çölündə, Həkəri çayının Araza töküldüyü yerin yaxınlığındadır Qəsəbə 1950-ci illərdə Həkəri d y stansiyası yanında salınmış və həmin stansiyanın adı ilə adlandırılmışdır

**Həmənçay** *hidr mür* Daşkəsən r-nu ərazisində çay Əsl adının Əmənçay olduğu göstərilir Tədqiqatçılara görə, çay öz adını Səfəvilər dövlətinin həyatında mühüm rol oynamış türkdilli otuzikilər tayfasının *əmən* qolunun adından almışdır Çay əmənlilərin yaylaq yerlərindən axdığı üçün belə adlandırılmışdır

**Həmənli** *oyk , sadə* Goranboy r-nunun Xınalı i ə v -də kənd Kürəkçayın sahilində Gəncə-Qazax düzənliyindədir Yerli əhalinin məlumatına görə kəndin adı mənşəcə

Qazax mahalından olan *həmənli* nəslinin burada məskunlaşmasından yaranmışdır *Həmənlilər* keçmiş Gəncə xanlarının nəslindən olub, Qaramusalı kəndində yaşayan Məmməd xana məxsus Xanlıq adlanan bu ərazidən ilxı saxlamaq üçün qışlaq kimi istifadə edirdilər Sonralar həmənlilər bu ərazini xandan satın alaraq XIX əsrdə burada daimi məskunlaşmışlar

**Həmşəri** *or*, *sadə* Şəmkir r-nu ərazisində dağ. Oronim Cənubi Azərb -dan gəlmiş ailələrin bu ərazidə məskunlaşması nəticəsində yaranmışdır *Həmşəri* (həmşəhərli) gəlmələrin bir-birinə müraciət forması olmuş, sonralar isə ətrafdakı əhali də onlara bu adla müraciət etmişdir Ərazidə Tatlar adlı yaşayış məntəqəsi də var

**Həmşirə** *hidr*, *sadə* Cəlilabad r-nu ərazisində çay Həmşəri, Astraxanka, Amşarınka, Həməşara variantlarında da qeydə alınmışdır Tədqiqatçılara görə, düzgün variant Həməşərədir Hidronim Lənkəran qəzasının Səbidağ nahiyəsində yaşamış *həmaşərə* tayfasının adı ilə bağlıdır XIX əsrin axırlarında azərb -lərdən ibarət olan həmin tayfa icması 7 kənddən 366 evdən təşkil olunmuşdu Həsilli (indiki Cəlilabad şəhəri) yaxınlığındakı Həmşərə kurqanı da bu tayfanın adı ilə bağlıdır

**Həmyəli** *oyk*, *sadə* Şamaxı r-nunun Dzerjinovka i ə v -də kənd Pirsaat çayının sahilində, dağlıq ərazidədir Keçmiş adı Ərəb Həmyə olmuşdur Yaşayış məntəqəsi bura köçürülmüş ərəb tayfalarının məskunlaşması nəticəsində yaranmışdır *Həmyə* sözünün ərəb dilindəki *həmyun* (müdafiə etmək, himayə etmək) sözündən olması ehtimal edilir Görünür, toponimin ilkin mənası "müdafiəçi ərəblər" mənasında olmuşdur

**Həmzəqər** *or*, *mür* Zaqatala r-nunda dağ. Baş Qafqaz silsiləsinin c yamacında zirvədir Hün 1910 m Oronim *həmzə* (həmzəli nəslinin adı) və *qor/qar* (dağ) komponentlərindən düzəlib, "həmzəli dağı" deməkdir

**Həmzəli** *hidr*, *sadə* Qəbələ r-nu ərazisində çay Dəmiraparan çayının sağ qoludur Mənbəyini Baş Qafqaz silsiləsinin c yamacından (3140 m yüksəklikdən) alır Tez-tez sel hadisələri baş verir Keçmiş adı Qulçay olmuşdur Belə ehtimal edilir ki, bu ad qədim türk mənşəli *qul* tayfasının adından və *çay* sözündən düzəlmişdir Keçmişdə çayın suyundan Həmzəli kəndinin əhalisi suvarmada istifadə etdiyindən çay yaşayış məntəqəsinin adı ilə adlandırılmışdır

**Həmzəli** *oyk*, *sadə* 1 Qəbələ r-nunun eyniadlı i ə v -də kənd. Həmzəli çayının sahilində, Alazan-Əyriçay çökəkliyindədir. Yaşayış məntəqəsi *həmzəli* nəslinin məskunlaşması nəticəsində yaranmışdır Kəndin ərazisindəki Şeyx Molla Məhəmməd və Qeybi baba adlı müqəddəs sayılan pirlərin övladları hesab edilən *həmzəlilər* keçmişdə əvvəlcə Şəhnə yolu və Yurd yeri adlı yerlərdə yaşamış, sonra indiki kəndin ərazisində məskunlaşmışlar; 2 Qubadlı r-nunun eyniadlı i.ə v -də kənd Həkəri çayının sahilindədir Dəlilər Həmzəlisi adı ilə də tanınır Yaşayış məntəqəsini vaxtilə indiki Qarakişilər kəndinə birləşmiş Həmzəli (Korlar Həmzəlisi) kəndindən çıxmış ailələr saldığı üçün belə adlanmışdır; 3 Şərur r-nunun Axura i ə.v -də kənd Arazboyu düzənlikdədir. Kəndi *həmzəli* nəslinə mənsub ailələr saldığı üçün belə adlandırılmışdır Etnotoponimdir

**Hənifə** *oyk*, *sadə* Balakən r-nunun eyniadlı i ə v -də kənd Balakən çayının sahilindədir. Oykonim kəndin ilk sakinlərindən olan *Hənifə* adlı bir şəxsin adı ilə bağlıdır

**Hərtis** *oyk*, *sadə* Qubadlı r-nunun Fərcan i ə v -də kənd Dağlıq ərazidədir Yaşayış məntəqəsi öz adını ərazidəki Hərtis dağının adından almışdır.

**Hərtis** *or*, *sadə* Qubadlı r-nu ərazisində, Bərgüşad silsiləsinin c -ş qurtaracağında zirvə Qartikiz, Xartiüz variantlarında qeydə alınmışdır Oronimin metal alətləri itiləmək üçün istifadə edilən xart, yaxud *qart* (bülöv) daşının adından və *üz* (üst) sözlərindən ibarət olub, "xartdaşı olan dağ" mənasında olduğu ehtimal edilir

**Həsənabad** *oyk*, *mür* Neftçala r-nunun eyniadlı i ə v -də ştq Kür çayı sahilində, Salyan düzündədir Sovet hakimiyyəti illərində Sovetabad adlandırılmışdı 1992-ci ildə Sovetabad qəsəbəsinə 26 Bakı Komissarları qəsəbəsi də birləşdirilərək Həsənabad kimi rəsmiləşdirilmişdir Oykonim Həsən (ş a ) və *abad* (kənd) komponentlərindən düzəlib, "Həsənə məxsus kənd" deməkdir

**Həsənbinə** *oyk*, *mür* Zaqatala r-nunun Əli Bayramlı i ə v -də kənd Qaraçayın sahilindədir Yaşayış məntəqəsinin yerində əvvəllər Yuxarı Tala kəndindəki əncələr (mənşəcə qıpçaqların əncə tayfasına mənsub) tabunundan (nəslindən) *Həsən* adlı şəxsin binəsi olmuş və həmin ərazi Həsənbinəsi adlanmışdır Sonralar həmin tabundan bir sıra ailələr burada həmin adla daimi yaşayış məntəqəsi salmışlar

**Həsənxanlı** *oyk*, *sadə* Ağdam r-nunun Əfətli i ə v -də kənd Qarabağ düzündədir Kəndi *həsənxanlı* nəslinə mənsub ailələr saldığına görə belə adlandırılmışdır Etnotoponimdir

**Həsənqala** *oyk*, *sadə* 1 Qusar r-nunun Bala Qusar i ə v.-də kənd. Qusar çayı sahilində, Qusar maili düzənliyindədir Oykonim ərazidəki eyniadlı qədim qalanın adından yaranmışdır; 2 Xaçmaz r-nunun Qusarçay i ə v -də kənd Samur-Dəvəçi ovalığındadır Yaşayış məntəqəsi Qusar r-nunun Həsənqala kəndindən köçmüş ailələrin məskunlaşması nəticəsində yarandığı üçün belə adlandırılmışdır

**Həsənqaya** *oyk*, *sadə* 1 Bərdə r-nunun Mehdixanlı i ə v -də kənd Qarabağ düzündədir Böyük Vətən müharibəsi illərində kənd dağıdılmışdı 1948-1949-cu illərdə Ermənistandan zorla qovulmuş azərb ailələr burada məskunlaşmış və yaradılmış yeni yaşayış məntəqəsi köhnə kəndin adını qəbul etmişdir; 2 Tərtər r-nunun Şıxarx i ə v -də kənd Dağətəyi ərazidədir Keçmiş adı Buruc olmuşdur Yaşayış məntəqələri Həsənqaya adlı yerdə salındığına görə belə adlandırılmışdır

**Həsənqaya** *or* *mür* Daşkəsən r-nunda dağ *Həsən* (ş a ) və *qaya* (daş, dağ) komponentlərindən düzəlib, "Həsən qayası" deməkdir

**Həsənqaydı** *oyk* *mür* Cəbrayıl r-nunun Şükürbəyli i ə v -də kənd Düzənlikdədir Vəlixanlı adı ilə də tanınır Kəndi XIX əsrdə maldarlıqla məşğul olan vəlixanlı tirəsinə mənsub ailələr salmışlar Yaşayış məntəqəsi Həsənqaydı adlı köhnə kənd yerində salınmışdır Toponimin Həsənqayadın oroniminin təhrif forması olduğu güman edilir *Həsən* (ş a ), *qaya* (yüksəklik, dağ) və *din* (yaylaq, düşərgə) komponentlərindən düzəlib, "Həsənqaya yaylağı" mənasındadır

**Həsənqoca** *oyk*, *sadə* Xaçmaz r-nunun Susayqışlaq i ə.v -də kənd Samur-Dəvəçi ovalığındadır Yaşayış məntəqəsinin adı ərazisindəki eyniadlı pirin adından götürülmüşdür

**Həsənlər** *oyk*, *düz* Kəlbəcər r-nunun Keşdək i ə.v -də kənd Şərqi Göyçə silsiləsinin ətəyindədir Yerli əhalinin verdiyi məlumata görə, yaşayış məntəqəsi XIX əsrdə Keşdək kəndindən *Qara Həsən* adlı bir şəxs (Vəlioğlu kimi də tanınırdı) ona məxsus binə yerində saldığına görə belə adlanmışdır Hazırda kənddə yaşayan nəsillərdən biri *həsənuşağı* adlanır Kəndin ərazisində eyniadlı çay da var

**Həsənli** *or* *sadə* Gədəbəy r-nunda dağ. Şəmkir və Mahu çaylarının suayrıcıdır Hün. 2596 m Dağ həmin sahədə yaylaq yurdu olmuş *həsənli* tirəsinin adı ilə adlandırılmışdır

**Həsənli** *oyk*, *sadə* 1 Bərdə r-nunun Qaradəmirçi i ə v -də kənd. Yuxarı Qarabağ kanalının sahilində, Qarabağ düzündədir; 2 Cəbrayıl r-nunun Soltanlı i ə v -də kənd Arazboyu düzənlikdədir Kənd yerli əhali arasında Hasanlı adı ilə tanınır Yerli əhalinin məlumatına görə, yaşayış məntəqəsini əfşar tayfasından olan Cəbrayıl (XVI əsrdə yaşamışdır) adlı şəxsin altı oğlundan biri *Həsən* salmışdır; 3 Cəlilabad r-nunun Astanlı i ə v -də kənd Həsənli çayının sahilində Burovar silsiləsinin ətəyindədir; 4 Masallı r-nunun eyniadlı i ə v -də kənd Lənkəran ovalığındadır; 5 Sabirabad r-nunun Cavad i ə v -də kənd Kür çayının sahilində, Şirvan düzündədir; 6 Salyan r-nunun Yenikənd i ə v -də kənd Cənub-Şərqi Şirvan düzündədir; 7 Tovuz r-nunun Çeşməli i ə v -də kənd Əsrik çayının sol sahilində, Göyəbaxan silsiləsinin ətəyindədir Yaşayış məntəqələri *həsənli* nəslinin məskunlaşması nəticəsində yaranmışdır Etnotoponimdir

**Həsənriz** *oyk* *sadə* Kəlbəcər r-nunun eyniadlı i ə v -də kənd Tərtər çayının sol tərəfində, Həsənriz çökəkliyindədir Keçmiş adı *Atərk/Hatərk* qalası olmuşdur Tədqiqat-

çıların ehtimalına görə, *aterk* türk dillərindəki *atrak* (çayın mənsəbə töküldüyü yer) sözünün fonetik variantıdır. XIII əsrdən sonra Xaçın knyazı Həsən Cəlalın adı ilə Həsənrız adlanmışdır 1992-ci ildə kəndin adı Həsənrız kimi rəsmiləşdirilmişdir

**Həsənsu** *hidr*, *mür* Qazax r-nu ərazisində çay Kür çayının sağ qoludur Mənbəyini Murğuz sıra dağlarının şm yamacından (2660 m yüksəklikdən) alır Hidronim *həsən/əsən* (sağlam, içməyə yararlı) və *su* komponentlərindən düzəlib, "sağlam su" deməkdir

**Həsənsu** *oyk*., *sadə* Ağstafa r-nunun Vurğun i ə v.-də kənd Keçmiş adı Alekseyevka, Sovet hakimiyyəti illərində S M Kirovun (1886-1934) şərəfinə Kirovka adlanmışdır 1942-ci ildən buraya ətraf kəndlərdən yerli əhali köçmüşdür 1991-ci ildən kəndin adı dəyişdirilərək yaxınlıqdakı çayın adı ilə Həsənsu adlandırılmışdır

**Həsin** *oyk*., *sadə* Astara r-nunun Siyaku i ə v -də kənd. Pensər çayının sahilində, Lənkəran ovalığındadır Tədqiqatçılar bu oykonimi "möhkəmləndirilmiş yer" kimi izah edirlər

**Həşəmədi** *or*, *sadə* Şamaxı r-nu ərazisində sıra dağlar Pirsaat çayının orta axarından ş -də yerləşir Tədqiqatçılara görə, oronim qismən təhrifə uğramışdır Əslində *Xoşəməddin* olmalıdır Yerli əhalinin verdiyi məlumata görə, Xoşəməddin və Kəmaləddin qardaş olmuş və sonralar onlara məxsus yaylaqların yerləşdiyi bu dağlar onların adları ilə adlanmışdır

**Hətəmlər** *oyk*, *sadə* 1 Laçın r-nunun Daşlı i ə v -də kənd Dağətəyi ərazidədir; 2 Tovuz r-nunun Qərbli i ə v -də kənd Zəyəm çayının sahilində, dağlıq ərazidədir Yaşayış məntəqələri *hatəmlər* nəslinin məskunlaşması nəticəsində yarandığı üçün belə adlandırılmışdır

**Həzi Aslanov** *oyk* *sadə* Ağstafa r-nunun Köçvəlli i.ə v -də qəsəbə Ceyrançöldədir Meyvə tingliyi sovxozu yanında salınmışdır Tank qoşunları qvardiya general-mayoru, iki dəfə Sovet İttifaqı Qəhrəmanı *Həzi Aslanovun* (1910-45) şərəfinə adlandırılmışdır Memorial toponimdir

**Həziabad** *oyk*, *mür* Cəlilabad r-nunun Komanlı i ə v -də kənd Burovar silsiləsinin yamacındadır Oykonim *Həzi* (Həzi Aslanov) və *abad* (kənd) komponentlərindən düzəlib, "Həzi kəndi" deməkdir Memorial toponimdir

**Həzrə** *oyk*., *sadə* 1 Qəbələ r-nunun Vəndam i ə v -də kənd. Alazan-Əyriçay çökəkliyindədir Keçmiş adı Vəndam Həzrəsi olmuşdur Kənddə yerli əhalinin Övliya türbələri adlandırdığı, XIV əsrə aid müqəddəs hesab edilən Şeyx Bədrəddin və Şeyx Mənsur türbələri var Kəndin adı həmin türbələrlə bağlıdır Ərəb dilində *həzr* "ocaq, pir" deməkdir; 2 Qusar r-nunun eyniadlı i ə v -də kənd Qusar maili düzənliyindədir Keçmiş adı Quryan olmuşdur Yaşayış məntəqəsinin adı ərəb dilindəki *həzr* (ocaq, pir) sözü ilə bağlıdır Oykonim kəndin ərazisindəki məscidlə və bu məsciddə dəfn edilmiş Şeyx Cüneydin qəbri ilə əlaqədardır Qızılbaş tayfalarına arxalanan Şeyx Cüneyd (1447-60) "din uğrunda mübarizə" şüarı ilə Dağıstana hərbi yürüşlər təşkil edirdi 1460-cı ildə Samur çayı sahilində, bu kəndin yerində Şirvanşah I Xəlilullahın (1417-62) qoşunları onu məğlub etdi, şeyx öldürüldü Şiələr Şeyx Cüneydi orada dəfn etdilər Səfəvilər hakimiyyətə keçdikdən sonra 1544-cü ildə Şeyx Cüneydin qəbri üstündə məscid tikdirmişdilər Sonralar Səfəvi I Təhmasibin (1524-76) orada saldığı kənd də Həzrə adlandırılmışdı

**Həzrəoba** *oyk*., *mür* Qusar r-nunun Həzrə i ə v -də kənd Qusar maili düzənliyindədir Kənd keçmişdə Həzrə kəndinə məxsus qışlaq yerində salınmışdır Kollektivləşmədən sonra daimi yaşayış məntəqəsinə çevrilmişdir Oykonim "Həzrə kəndinin obası" mənasındadır

**Hırəmə** *oyk*, *mür* Lerik r-nunun Lerik qəsəbə i ə v -də kənd Dağlıq ərazidədir Oykonim talış dilindəki *hır* (əkin) və *həmə* (hamar yer) sözlərindən ibarət "hamar sahədə əkin yeri" və ya talış dilindəki hır (duman, çən), *-ə* (bitişdirici sait) və *mə* (çökmüş) komponentlərindən ibarət "dumanlı, çənli" mənalarında olan söz kimi izah olunur

**Hicaki** b a x Gicoki





**Hil** *oyk*, *sadə* Qusar r-nunun eyniadlı i ə v -də kənd Qusar maili düzənliyindədir Bəzi tədqiqatçılara görə, oykonim özündə qədim Qafqaz Albaniyasında yaşamış *gel* tayfasının adını əks etdirir XIX əsrdə Hiloba, Tulab, Köçərqaş, Tumalar, Tamuskən, Survanbəy, Xıdırbəy qazmaları, Gileykək, Ətək və s obaların əraziləri bu kəndə məxsus olmuşdur

**Hiloba** *oyk*, *mür* Qusar r-nunun Hil i ə v -də kənd Qusar maili düzənliyindədir Oykonim *Hil* (kənd adı) və *oba* komponentlərindən düzəlib, "Hil kəndinin obası, qışlağı" deməkdir Kənd keçmişdə Hil kəndinə məxsus qışlaq yeri olmuşdur Kollektivləşmədən sonra daimi yaşayış məntəqəsinə çevrilmişdir

**Hinadəli** *or*, *mür* Şərur r-nu ərazisində dağ Tananam kəndindən şm -ş -də yerləşir Hün 2098 m Belə ehtimal etmək olar ki, oronim Hindilli adının təhrif forması olub, "böyürtkənli dağ" mənasındadır

**Hinaldağ** *or* *mür*. Daşkəsən r-nu ərazisində dağ Şahdağ silsiləsinin c -ş qurtaracağındadır Bu zirvədən ş -də Murovdağ silsiləsi başlanır Hün 3373 m. Oronimin türkdilli *inal* etnonimi ilə əlaqədar olması ehtimal edilir

**Hindarx** *oyk*., *sadə* Ağcabədi r-nunun eyniadlı i ə v -də kənd Qarabağ düzündədir Oykonimin yaranması ilə bağlı bir çox rəvayətlər mövcuddur Yerli əhalinin məlumatına görə, yaşayış məntəqəsi XVI əsrdə yaranmışdır Guya dahi Azərb şairi Füzulinin yeznəsi olan bir nəfər hindli Boyat kəndinin yaxınlığından bu kəndin ərazisinə arx çəkdirmiş və həmin arxın ətrafında yaranan yaşayış məntəqəsi də onun şərəfinə Hindarx adlanmışdır Sonralar guya Füzulinin atası Süleyman kişi ilə hindarxlılar arasında nifaq düşdüyündən o, kürəkəninin bələdçiliyi ilə ailəsini də götürüb İraqa köçmüşdür Füzulinin o vaxt beş yaşı olduğu söylənilir Digər yerli məlumata görə, Hind Vəli adlı bir nəfər arx çəkmiş və arx sonralar onun adı ilə Hindarx adlanmışdır Arxın bir nəfər hindistanlı mühəndisin çəkməsi ilə əlaqədar belə adlandırılması haqqında da rəvayət vardır Bəzi tədqiqatçıların fikrincə, hidronim sanskrit dillərindəki *ind* (böyük çay, əsas çay) sözündəndir *Hind* sözü dilimizdə tarixən "qara" mənasında işlənilmişdir Kəndin yaxınlığından axan arx da hazırda Qarasu adlanır Əslində, Hindarx Qarasu hidroniminin sinonimidir Kənd də öz adını həmin arxın adından almışdır

**Hinqar** *oyk*., *sadə*. Ağsu r-nunun Gürcüvan i ə v -də kənd Keçmiş adı İnqar olmuşdur Oykonim *anqar* sözünün Azərb dilinin fonetik qanunlarına uyğunlaşdırılmış formasıdır. Tədqiqatçılara görə, bu söz türk-monqol dillərində "yarıq", "ağız", "qapı", "keçid", "dərə" mənalarında işlədilmişdir Türk dillərində *anqar* "geniş vadi" mənasındadır Sözün əvvəlinə "h" samitinin artırılması Azərb dilinin dialekt və şivələrində təsadüf olunan fonetik hadisədir

**Hintağlar** b a x Köhnə Tağlar

**Hişgədərə** *oyk*., *sadə* Masallı r-nunun eyniadlı i ə v -də kənd Lənkəran ovalığındadır Oykonim İran dillərindəki *hişk/xişk* (quru) və Azərb dilindəki *dərə* (çay dərəsi) komponentlərindən düzəlib, "quru dərə, quru çay dərəsi" mənasındadır Yaşayış məntəqəsi eyniadlı dərənin yaxınlığında yerləşdiyi üçün belə adlandırılmışdır Eyniadlı yaşayış məntəqəsi Siyəzən r-nunda da qeydə alınmışdır

**Hivəri** *oyk*, *mür* Lerik r-nunun Qosmalyan i ə v -də kənd. Peştəsər silsiləsinin ətəyindədir Hovarı, Hovəri variantlarında da qeydə alınmışdır Belə ehtimal edilir ki, oykonim talış dilindəki *hü* (dağıdılmış, uçurulmuş) və *var* (yer, kənd, qala, möhkəmləndirilmiş yer) sözlərindən düzəlib, "dağıdılmış kənd" mənasındadır Yaşayış məntəqəsi köhnə kənd yerində salındığına görə belə adlandırılmışdır

**Hocaz** *oyk* *sadə* Laçın r-nunun eyniadlı i ə v -də kənd Hocaz çayının sahilində, Qarabağ yaylasındadır Kəndin q -ində Hocazduşı adlı dağ da var Kənd öz adını eyniadlı çaydan almışdır

**Hocazsu** *hidr* *mür* Laçın r-nu ərazisində çay Həkəri çayının sağ qoludur Yuxarı axınında İldırımsu, aşağı axınında Qaranlıqçay adlanır Çay öz başlanğıcını Hocaztəpə dağından alır Hidronimin ərazidəki Qoşasu adının variantı olması ehtimal edilir

**Hocaztəpə** *or mür* Laçın r-nu ərazisində dağ Yerli əhali arasında Hocazdaşı adı ilə tanınır Oronim Hoçaz çayının adı ilə bağlıdır

**Hoqa** b a x Üçbulaq

**Honuba** *oyk. mür* Yardımlı r-nunun Porsova i ə v -də kənd Dağətəyi ərazidədir Oykonim talış dilindəki *honu* (bulaq) və *uba* (Azərb. dilindən həmin dilə keçmiş *oba* sözünün fonetik şəkli) sözlərindən ibarət olub, "bulaq yaxınlığındakı oba" mənasındadır

**Honuba Şıxlar** *oyk., mür* Yardımlı r-nunun Porsova i ə v -də kənd Dağətəyi ərazidədir Yaşayış məntəqəsi XIX əsrdə Honuba kəndindən çıxmış *şıxlar* nəslinə mənsub ailələrin bu ərazidə məskunlaşması nəticəsində yaranmışdır

**Hopurlu** *oyk., sadə.* Kəlbəcər r-nunun Zəylık i ə v -də kənd Qarabağ yaylasındadır Toponimin kürd mənşəli şeylanlı tayfasının *hopurlu* tirəsinin adından olduğu ehtimal edilir Yerli əhalinin məlumatına görə, yaşayış məntəqəsini XIX əsrdə Laçın r-nunun Mirık kəndindən köçüb gəlmiş Hopur Hüseyn adlı şəxs saldığına görə belə adlandırılmışdır Çopurlu variantında da qeydə alınmışdır

**Horadil** *or., mür* Şamaxı r-nu ərazisində dağ silsiləsi Qozluçay və Çigil çaylarının suayrıcındadır Dağ silsiləsi oradakı eyniadlı zirvənin adı ilə adlandırılmışdır Tədqiqatçıların fikrincə, oronimin əsli Ouratel olmalıdır Bu coğrafi ad fars dilindəki *oura* (qala) və *ərəb* dilindəki *tel* (təpə) sözlərindən düzəlib, "qala təpəsi" mənasındadır

**Horadiz** *oyk., mür* Füzuli r-nunun eyniadlı qəsəbə i ə v -də ştq Araz çayının sol sahilində, düzənlikdədir Oykonim İran dillərindəki *oura* (qala, möhkəmləndirilmiş yer) və *dizə* (qala) sözlərindən ibarətdir, "qala kənd" mənasındadır

**Horavar** *oyk., mür* Yardımlı r-nunun Vərgədüz i ə v -də kənd Viləş çayının sahilində, dağətəyi ərazidədir Oykonim fars dilindəki *oura* (qala) və *var* (yer, məskən) sözlərindən düzəlib, "qala yeri" mənasındadır Hıravar variantında "dumanlı yer" mənasında da izah olunur

**Horid** *or., sadə* Balakən r-nu ərazisində dağ Baş Qafqaz silsiləsinin zirvələrindən biridir Hün. 3005 m. Oronim Azərb toponimiyasındakı coğrafi terminlərdən biri olan *hert/hort* sözündəndir və "yarğanın, uçurumun yuxarı hissəsi" mənasındadır

**Horonu** *oyk., sadə* Yardımlı r-nunun Yolocaq i ə v -də kənd Viləş çayının sahilində, Qələbaşı dağının yamacındadır Oykonim talış dilindəki *hor* (mal yemləmək üçün təknə) və *honi* və ya *honu* (bulaq) sözlərinin birləşməsindən əmələ gəlib, "təknəli bulaq" mənasındadır Yaşayış məntəqəsi salındığı ərazidəki bulağın adı ilə adlandırılmışdır

**Horovlu** *oyk düz* Cəbrayıl r-nunun eyniadlı i ə v -də kənd Düzənlikdədir Yaşayış məntəqəsini XIX əsrdə Cənubi Azərb -nın Horov kəndindən gələn ailələr saldığı üçün belə adlanmışdır Xocalı r-nunda Harov adlı kənd var

**Hovarl** b a x Hivəri

**Hovil** *oyk., sadə* Lerik r-nunun Siyov i ə v -də kənd Peştəsər silsiləsinin ətəyindədir Oykonim talış Hiyəvil kimi tələffüz edilir Tədqiqatçılara görə, talış dilindəki *hı* (zəmi), *-yə* (birləşdirici şək ) və *vıl* (gül) komponentlərindən ibarət olan oykonim "gül zəmisi" mənasındadır

**Hovuzbulaq** b a x Kövüzbulaq

**Hovuzlu** b a x Havuslu

**Hökməli** *oyk., sadə* Abşeron r-nunun eyniadlı qəsəbə i ə v -də ştq 1937-ci ildə salınmışdır Belə ehtimal edilir ki, yaşayış məntəqəsi vaxtilə orada məskən salmış *Hökməli* adlı şəxsin adını daşıyır

**Hövsan** *oyk sadə* Bakı şəhəri Suraxanı r-nunda ştq Xəzər dənizi sahilindədir Yerli əhalinin məlumatına görə, keçmişdə kəndin ərazisində iki hovuz olduğuna görə Hövuzan adlandırılmışdır Mənbələrə görə, oykonim *hovuz* sözü və məkan bildirən *-an* şək -sindən ibarət olub, "hovuzlar" və ya "hovuz yeri" mənasındadır Bəzi tədqiqatçılara görə, yaşayış məntəqəsinin adı ərəb dilindəki *husn* (qala, istehkam) sözündəndir Əslində, kənd dəniz sahilində, hövzədə yerləşdiyi üçün belə adlandırılmışdır

**Hövsan burnu** *or mür* Abşeron yarımadasının c -unda, Hovsan kəndindən c -da dənizə uzanan çıxıntı Oronim ərazidəki eyniadlı yaşayış məntəqəsinin adından və *burun* (çıxıntı) sözündən düzəlmişdir







**Hübü** *oyk., sadə* Lerik r-nunun Tülüconi i ə v -də köç Ləgər çayının sahilində, Talış silsiləsinin yamacındadır Oykonimin *Hübeydə* şəxs adının qısaldılmış şəkli olması güman edilir

**Hücü** *oyk., sadə* Lerik r-nunun Çayrud i ə v -də kənd Dağətəyi ərazidədir Qucu variantında da qeydə alınmışdır Kənd XIX əsrdə salınmışdır Oykonim talış "su arxları çəkilmiş yer" və ya "yeni arx" mənalarında izah edilir

**Hülövlü** *oyk., sadə* Xaçmaz r-nunun eyniadlı i ə v -də kənd Qaraçayın sahilində, Samur-Dəvəçi ovalığındadır Bəzi tədqiqatçılara görə, toponim təhrifə uğramışdır Oykonim özündə qəd türkdilli karluqların *gelo* (gelu) tayfasının (üç oğuz da adlanırdılar) adını əks etdirir (*-lu* mənsub şək -sidir) XIII əsrdə monqol yürüşlərində iştirak etmiş karluqların bir hissəsi sonralar Azərb -nın şm.-ş zonasında məskunlaşmışdı Bunu Sumqayıt çayının bir qolu olan Çigil çayının adı da sübut edir Çigil karluqların başqa bir qolunun adıdır *Gelu* tayfasının adını Şəki şəhərindəki Güleyli məhəlləsinin, Abşeron yarımadasındakı Küleyli dağının adı ilə də bağlayırlar Türkiyədə bu etnonim Gelubolu toponimində özünü göstərir

**Hürüuşağı** *oyk sadə* Yevlax r-nunun Tanrıqulular i ə v -də kənd Kürəkçayın sahilində, düzənlikdədir Yerli əhalinin məlumatına görə, yaşayış məntəqəsi Qazax r-nu ərazisindən köçüb gəlmiş *hürüuşağı* adlı nəslin məskunlaşması nəticəsində yarandığı üçün belə adlandırılmışdır

**Hüseynabad** *oyk., mür* Lerik r-nunun Qosmalyan i ə v -də oba Peştəsər silsiləsinin ətəyindədir 1886-cı ilə aid mənbədə Kolvoz icmasının tərkibində yeddi tüstüdən ibarət kiçik kənd kimi qeydə alınmışdır Yaşayış məntəqəsini vaxtilə *Hüseyn* adlı şəxs və onun övladları saldığına görə belə adlandırılmışdır

**Hüseynalılar** *oyk., sadə* 1 Bərdə r-nunun Mustafaağalı i ə v -də kənd Qarabağ düzündədir Yerli əhali arasında Soynalılar kimi də işlədilir *Hüseynalılar* nəslinin adını daşıyır. 2 Cəbrayıl r-nunun Hacılı i ə v -də kənd Arazboyu düzənlikdədir Yaşayış məntəqəsi inqilabdan əvvəl Cəbrayıl qəzasının hacılı icmasına mənsub *hüseynalılar* tirəsinin məskunlaşması nəticəsində yaranmışdır Etnotoponimdir

**Hüseynallar** *oyk., sadə* Ağdam r-nunun Əlimədədli i ə v -də kənd. Xaçın çayının sahilindədir Keçmiş adı Hüseynalı olmuşdur Yaşayış məntəqəsi boyəhmədli tayfasının *hüseynalı* tirəsinə mənsub ailələrin özlərinə məxsus qışlaq yerində daimi məskunlaşması nəticəsində yaranmışdır

**Hüseynbəyli** *oyk., düz* Bərdə r-nunun Şirvanlı i ə v -də kənd Qarabağ düzündədir Yaşayış məntəqəsi XIX əsrdə *Hüseyn* bəy adlı şəxsə məxsus qışlaq yerində maldarlıqla məşğul olan ailələrin məskunlaşması nəticəsində yaranmışdır Əvvəllər həmin ərazi Hüseynbəy Tərəkəmə adlanırdı Füzuli r-nu ərazisində də eyniadlı yaşayış məntəqəsi qeydə alınmışdır

**Hüseynhacılı** *oyk., düz* Masallı r-nunda kənd. Viləş çayının sahilində, Lənkəran ovalığındadır Yaşayış məntəqəsi *hacılı* tayfasından *Hüseynağa* adlı şəxsə məxsus ailələrin məskunlaşması nəticəsində yaranmışdır Keçmişdə Hüseynhacıyan da adlanırdı

**Hüseynxanlı** *oyk., düz* Zərdab r-nunun Gəlmə i ə v -də kənd. Türyan çayının sahilində, Şirvan düzündədir Kəndi vaxtilə *Hüseynxan* adlı şəxs saldığına görə onun adı ilə adlandırılmışdır Burada *-lı* mənsubluq bildirən şəkilçidir

**Hüseynqulular** *oyk. sadə* Tovuz r-nunun Qaradaş i ə v -də kənd Axınca çayının sahilində, Çınqıldağ silsiləsinin (Kiçik Qafqaz) ətəyindədir Kənd *hüseynqulular* nəslinin məskunlaşması nəticəsində yarandığı üçün belə adlandırılmışdır

**Hüseynli** *oyk düz* Tərtər r-nunun eyniadlı i ə v -də kənd Qarabağ düzündədir Kəndin əhalisi oykonimi Hüsənnili kimi tələffüz edir Yerli əhalinin məlumatına görə, kəndi vaxtilə şahsevən *Məşədi Hüsən* adlı şəxs saldığına görə belə adlanmışdır Məşədi Hüsənin qəbri hazırda kəndin köhnə qəbiristanındadır Kəndin yaxınlığındakı köhnə qışlaq yurdu da Məşədi Hüsənlər qışlağı adlanır

**Hüseynuşağı** *oyk., sadə* Qubadlı r-nunun Kavdadıq i.ə.v.-də kənd. Həkəri çayının sahilində. Yazı düzündədir. Yaşayış məntəqəsini *hüseynuşağı* (hazırda xudaverdilər adlanır) nəslindən olan ailələr saldığı üçün belə adlanmışdır. Sonralar Qarabağdan əbilli və Dağıstandan xələflilər nəslinə mənsub ailələr də köçüb bura gəlmişdilər.

**Hüsülü** *oyk., sadə.* 1. Ağcabədi r-nunun eyniadlı i.ə.v.-də kənd. Qarabağ düzündədir. XIX əsrin əvvəllərində *hüsülü* Qarabağda maldarlıqla məşğul olan 13 ailədən ibarət kiçik elat olmuşdur. *Hüsülü* mənşəcə qızılbaşların ustaclı tayfasının tirələrindən biri idi. XVII əsrdə bu tirəyə mənsub ailələr şahsevənlərə qarışmış və Qarabağda yaşamağa başlamışdılar. Yayı Sarıyer və Qırxqız yaylaqlarında, qışı isə Qarabağ düzündə keçirən hüsülülər əvvəlcə indiki kənddən 1 km aralıdakı Məşədi Ələkbər Suatı (*suat* "su götürülən yer" deməkdir) adlı yerdə məskunlaşmışdılar. XIX əsrin ortalarında Hacı Həsən adlı bir nəfər indiki kəndin yerində kəhriz qazmış və əhali də buraya köçüb məskunlaşmışdır. 2. Laçın r-nunun Malıbəy i.ə.v.-də kənd. Dağətəyi ərazidədir. Keçmiş adı Sultanlar (Sultanlı, Sultankənd kimi də qeydə alınmışdır) olmuşdur. Yaşayış məntəqəsi qaraçorlu tayfasından Həmzə Sultanın (hazırda onun XVIII əsrə aid malikanəsi qorunur) adı ilə adlandırılmışdır. 1931-ci ildə burada Kürdüstan Qəza İcraiyyə Komitəsinin sədri olmuş *Hüsü Hacıyevin* (1897-1931) adına kolxoz yaradılmışdır. Yaşayış məntəqəsi də həmin vaxtdan onun adı ilə adlandırılmışdır.

**Hüşün** *oyk., sadə.* Ağdaş r-nunun Kükəl i.ə.v.-də kənd. Şirvan düzündədir. Oykonimin monqol dilinə mənsub *xuşun/xoşun* sözündən olub, "feodal malikanəsi, feodal mülkü" mənasında olması ehtimal edilir.





# Xx

**Xaçal Kəkər** *or., mür.* Balakən r-nu ərazisində dağ. Oronim avar dilindəki *xaçal* (kvadrat formalı) və Azərb. dilinin dialektlərində işlənən *kəfər/kəkər* (su süzmək üçün xüsusi daş növü) komponentlərindən düzəlib, "dördkünc daş" deməkdir.

**Xaçbulaq** *hidr., sadə.* Daşkəsən r-nunda çay. Qoşqar çayının sol qoludur. Çay öz adını ərazidəki eyniadlı bulağın adından almışdır. Ərazidəki Xaçbulaq yaylağının adı da buradandır. *Xaç* (dörd guşəli, dörd gözlü) və *bulaq* komponentlərindən düzəlmiş bu hidronim "dörd gözü olan bulaq" mənasındadır.

**Xaçbulaq** *oyk., sadə.* Daşkəsən r-nunun Zağalı i.ə.v.-də kənd. Qoşqar çayının sahilində, Şahdağ silsiləsinin ətəyindədir. Kəndin ərazisi keçmişdə Yelizavetpol (Gəncə) qəzasına daxil olan Əhmədli, Alabaşlı, Kamanlı, Hacallı, Qarabağlar, Lək, Şadılı və b. kəndlərin yaylaq yeri olmuşdur. Sonralar burada yaranan yaşayış məntəqəsi də yaylağın adını almışdır. 1991-ci ildən kəndin adı Xoşbulaq kimi rəsmiləşdirilmiş, *xaç* sözünün qədim türk sözlərindən biri kimi Azərb. toponimiyasında özünəməxsus yeri olması unudulmuşdur.

**Xaçın** *hidr., sadə.* Kəlbəcər, Ağdam və Bərdə r-nları ərazisində çay. Kür çayının sağ qoludur. Mənbəyini Qarabağ silsiləsindən (Uyuxlu dağından c.-da, 2100 m yüksəklikdən) alır. Mühüm qolu Kolatağdır. Məcrasında Xaçınçay su anbarı yaradılmışdır (1964). Hidronim Qafqaz Albaniyasının Xaçın əyalətinin adından yaranmışdır. Bu əyalətin adı ilk dəfə mənbələrdə VII-X əsrlərin hadisələri ilə bağlı çəkilir. XII əsrdə Arsaxda (Yuxarı Qarabağ) Xaçın hökmdarlığı yaranmış, tarixi Xaçın qalası bu hökmdarlığın ərazisində olmuşdur. XIII əsrdə monqollar həmin qalanı dağıtmış və Xaçın hökmdarlığına son qoymuşdular.

**Xaçınabad** *oyk., mür.* Beyləqan r-nunun Kəbirli i.ə.v.-də kənd. Xaçın çayı sahilində, Mil düzündədir. Kənd əvvəllər el arasında Xaçınstroy (Xaçıntikinti) adlanırdı. Oykonim *Xaçın* (yaxınlığındakı çayın adı) və *abad* komponentlərindən düzəlib, "Xaçın kəndi" deməkdir.

**Xaçınçay** *hidr., mür.* Ağdam r-nu ərazisində su anbarı. Xaçın çayının məcrasında yaradılmış, 1964-cü ildə istifadəyə verilmişdir. 8 min ha-dan çox sahənin suvarılmasında istifadə edilən bu anbar Xaçın çayının adı ilə adlanmışdır.

**Xaçındərbətli** *oyk., mür.* Ağdam r-nunun Əlimədədli i.ə.v.-də kənd. Xaçın çayı sahilində, dağətəyi ərazidədir. 1917-ci ildə r-nun ərazisində Xaçın Dərbətlı və Cinli Dərbətli adlı iki kənd qeydə alınmışdır. Bu kəndlərdən birincisi Xaçın çayı kənarında yerləşdiyi üçün, ikincisi isə Cinli kəndinin yaxınlığında salındığı üçün belə adlanırdı. *Dərbətli/dərbətli* oryat tayfasının qollarından birinin adıdır. Oykonimi kəndin ərazisində daşdan tikilmiş XIV əsrə aid xaçvarı 12 üzlü, piramida formalı günbəzi olan türbə ilə bağlayanlar onun Xaçıntürbətli variantında olmasını ehtimal edirlər.

**Xaçıntək** *hidr., sadə.* Xocalı r-nu ərazisində çay. Çay mənbəyini aldığı eyniadlı yüksəkliyin adını daşıyır.

**Xaçınyalı** *oyk., sadə.* Laçın r-nunun Kürdhacı i.ə.v.-də kənd. Qarabağ silsiləsinin ətəyindədir. Yaşayış məntəqəsi XIX əsrdə bir qrup ailənin Xaçınyalı adlı yüksəklikdə məskunlaşması nəticəsində yaranmışdır. Oykonim "Xaçının üstü" mənasındadır.

**Xaçısər** *or., mür.* Şəmkir r-nunda dağ. Çardaqlı kəndindən c.-ş.-də yerləşir. Hün. 1581 m. Oronim *xaçı* (xaçabənzər, dörd guşəli, dörd) və İran dillərindəki *sər* (baş) komponentlərindən düzəlib, "dördbaşlı, dörd zirvəli dağ" mənasındadır.

**Xaçmaç** *oyk., sadə.* Xocalı r-nunun Qızıloba i.ə.v.-də kənd. Qarabağ silsiləsinin ətəyindədir. Yaşayış məntəqəsi Bərgüşaddan və Zəngəzurda hazırda dağıdılmış Köhnə Kotuk kəndindən çıxmış erməni ailələrinin Xaçmaç adlı yerdə məskunlaşması nəticəsində yaranmışdır. Tədqiqatçılara görə, toponim bu ərazidə mövcud olan sütun üzərində xaç formalı daşların olması ilə bağlı yaranmışdır.

**Xaçmaz** *or., sadə.* Xocavənd r-nu ərazisində dağ. Tədqiqatçılar oronimin V əsrdə

Qafqaz Albaniyasının şm -ş -ində yaşamış *xaçmatan* (xaçpərəstlər) tayfasının adı ilə bağlı olduğunu ehtimal edirlər

**Xaçmaz** *hidr*, *sadə* Quba r-nu ərazisində çay Qudyal çayının sağ qoludur Ərazisindən axdığı Xaçmaz şəhərinin adı ilə adlandırılmışdır Yerli əhali bu çayı Ağçay da adlandırır

**Xaçmaz** *oyk*, *sadə* 1 Azərb -da inzibati r-n Şm -q -dən Dağıstan, q -dən Qusar və Quba r-nları, c -dan Dəvəçi r-nu və ş -dən Xəzər dənizi ilə sərhədlənir R-n əsasən Samur-Dəvəçi düzənliyində qismən Qusar maili düzənliyinin bir hissəsində yerləşir Mərkəzi Xaçmaz şəhəridir 1930-cu ildə təşkil edilmiş, 1963-cü ildə ləğv edilərək ərazisi Quba və Qusar r-nlarına verilmiş, 1965-ci ildən yenidən müstəqil r-n olmuşdur, 2 Azərb -da şəhər, eyniadlı inzibati r-nun mərkəzi Qudyal çayı sahilində, Samur-Dəvəçi ovalığındadır Yaşayış məntəqəsi kimi XVIII əsrin əvvəllərindən məlumdur Şəhər XIX əsrin 80-ci illərində tikilmiş d y stansiyası əsasında yaranmışdır Stansiya isə yaxınlığındakı Xaçmaz (hazırda Köhnə Xaçmaz) kəndinin adı ilə adlanırdı. Hazırda şəhərə birləşdirilmiş Xaçmaz kəndinin əhalisi vaxtilə tat dilində danışan xristianlar olmuşdur Bu əhalinin qədim *xaçmatak* (xaçpərəst xalq) tayfasından olması ehtimal edilir; 3 Oğuz r-nunun eyniadlı i ə v -də kənd Qalaçayın sahilində, Baş Qafqaz silsiləsinin yamacındadır Yaşayış məntəqəsi və mahal kimi ilk dəfə VII əsrə aid mənbələrdə adı çəkilir Xaçmatak tayfa adından yaranması ehtimal edilir Kəndin şm -ında, Qaladağın zirvəsində orta əsrlərə aid Gavurqala yerləşir

**Xaçmazqışlaq** *oyk., mür* Oğuz r-nunun Xaçmaz i ə v -də kənd Qalaçayın sahilində Baş Qafqaz silsiləsinin ətəyindədir Kəndin ərazisi vaxtilə Xaçmaz kəndinə məxsus qışlaq yeri olmuş, tədricən daimi yaşayış məntəqəsinə çevrilmişdir Oykonim "Xaçmaz kəndinə məxsus qışlaq" mənasındadır

**Xaxaper** *or*, *mür* Xocalı r-nunun şm -q -ində yerləşir Hün 1773 m Oronim *xaxa/kaxa* (kiçik tikili, türbə) və *per* (pir sözünün tələffüz forması) komponentlərindən düzəlib, "türbə, pir" mənasındadır Görünür, dağın adı ərazisindəki qəbir pirin adındandır Dağın başqa bir adının Qarqar dağı olması haqqında mülahizələr mövcuddur

**Xakeqan** *or*, *mür* Xocalı r-nunda dağ Oronim türk dillərindəki *kaka/xaka* (yarğan) və *qan* (dağlıq ərazı, zirvə) komponentlərindən düzəlib, "yarğanlı dağ" deməkdir

**Xalaxı** *hidr*, *mür* Zaqatala r-nunda, Xalaxı dağının ətəyində, 2800 m yüksəklikdə şirin sulu, axarlı kiçik göl Muxax çayının başlanğıcını təşkil edən Xalaxı çayı bu göldən axır Hidronim avar dilindəki *xala* (uzun) və *xe* (su) sözlərindən düzəlib, "uzun çay" mənasındadır Göl öz adını çayın adından almışdır

**Xalaxı** *or*, *sadə* Zaqatala r-nu ərazisində dağ Oronim ərazideki eyniadlı su obyektlərinin adından yaranmışdır

**Xalatala** *oyk., mür* Balakən r-nunun eyniadlı i ə v -də kənd Alazan-Əyriçay çökəkliyindədir Oykonim avar dilindəki *xala* (uzun) və Azərb dilindəki *tala* (meşəliklə əhatə olunmuş açıq sahə) komponentlərindən düzəlib, "uzun tala" mənasındadır Keçən əsrdə Ermənistan ərazisində də Uzuntala adlı kənd qeydə alınmışdır

**Xalatalabinə** *oyk., mür* Zaqatala r-nunun Danaçı i ə v -də kənd Kəndin ərazisi bir zamanlar Balakən r-nundakı Xalatala kəndinə məxsus binə yeri olmuşdur Sonralar həmin kənddən çıxmış ailələrin burada məskunlaşması nəticəsində daimi yaşayış məntəqəsi yaranmışdır

**Xaldan** *oyk düz* Yevlax r-nunun eyniadlı i ə v -də kənd Kürsahili düzənlikdədir Keçmiş adı Ərəş (qədim Ərəş şəhərinin xarabalığı Xaldan yaxınlığındadır) olmuşdur Ərəş oykonimi ərəb dilindəki "qala, tikili" mənalı *ərəş* sözündən hesab edilir Xaldan adı ilk dəfə XIX əsrin 20-ci illərində çəkilir Mənbələrin məlumatına görə, 1827-ci ildə Cənubi Azərb -nın Urmiya mahalından köçüb gəlmiş və özlərini *xalde* adlandıran aysor ailələrindən bir qismi burada məskunlaşdıqdan sonra Ərəş həm də Xaldan adlanmağa başladı Oykonim *xald* etnonimindən, cəmlik və məkan bildirən *-an* şək -sindən düzəlib, "xaldlar yaşayan yer" deməkdir





**Xalxal** *hidr*, *sadə* 1 Oğuz r-nunda min bulaqlar Xalxal kəndindən şm -da, Kordərə çayının sol sahilində yerləşir Suyu isti və kükürdlü olub 3 bulaqdan ibarətdir Əhali tərəfindən müalicə məqsədilə istifadə edilir; 2 Oğuz r-nu ərazisində çay Əlican çayının sağ qoludur Təngətin və Buqdax çaylarının birləşməsindən yaranmışdır Həmin çayların mənbəyi Xalxal dərəsindən başlanır Aqlux çayının bu çaya töküldüyü yerdən Xalxal adlanır Hidronimlər Xalxal kəndinin və Xalxal dərəsinin adından yaranmışdır

**Xalxal** *oyk*, *sadə* 1 Babək r-nunun Alagözməzrə i ə v -də kənd Naxçıvan çayının sahilində, Zəngəzur silsiləsinin ətəyindədir, 2 Oğuz r-nunun eyniadlı i ə v -də kənd Baş Qafqaz silsiləsinin ətəyindədir. Qədim mənbələrdə V əsr hadisələri ilə əlaqədar Albaniya (Qafqaz) hökmdarlarının qış iqamətgahı Xalxal şəhərinin (xarabalığı Qazax r-nunun Yuxarı Əskipara kəndinin ərazisindədir) adı çəkilir Cənubi Azərb -da Xalxal şəhəri, Xalxal Məhəllə, Xalxal Kuçek yaşayış məntəqələri mövcuddur XIX əsrdə İrəvan quberniyasında Xalxallı adlı iki dağ, Gürcüstan ərazisində Xalxal dağı qeydə alınmışdır Tədqiqatçılar bu toponimi Azərb dialektlərində "açıq hava şəraitində mal-qara saxlamaq üçün ətrafı hasarlanmış yer, ağıl" mənasında işlənən *xalxal* sözü ilə bağlayırlar

**Xalxalqışlaq** *oyk*, *mür* Oğuz r-nunun Xalxal i ə v -də kənd Dağətəyi ərazidədir Kənd keçmişdə Xalxal kəndinə məxsus qışlaq yeri olmuş, kollektivləşmədən sonra daimi yaşayış məntəqəsinə çevrilmişdir

**Xalidli** *oyk*, *sadə* Göyçay r-nunun Yeniarx i ə v -də kənd Şirvan düzündədir XIX əsrin birinci yarısında Çərəkə kəndindən ayrılmış *xalidli* nəslinə mənsub ailələrin məskunlaşması nəticəsində yarandığına görə belə adlandırılmışdır

**Xallava** *oyk mür* Qubadlı r-nunun Çardaqlı i ə v -də kənd Dağətəyi ərazidədir Oykonim "hündür yer" kimi izah olunur Oğuz r-nunda bu oykonimin Hallavar variantı qeydə alınmışdır

**Xallanlı** *oyk*, *sadə* Kəlbəcər r-nunun Başlıbel i ə v -də kənd. Başlıbel çayının sahilində, Dəlidağın (Kiçik Qafqaz) ətəyindədir Yerli əhalinin məlumatına görə, yaşayış məntəqəsini XIX əsrdə indiki Laçın r-nu ərazisindəki Bozlu və Kamallı kəndlərindən köçmüş ailələr salmışlar Həmin ailələr *xallanlı* kürd tayfasının ilyaslar və şükürlən tirələrinə mənsub idilər Kənd həmin tayfanın adını daşıyır

**Xallıcalı** *oyk düz* Masallı r-nunun Qarğalıq i ə v -də kənd Lənkəran ovalığındadır XIX əsrə aid mənbədə Xaliceli variantında qeydə alınmışdır Bəzi tədqiqatçılara görə, yaşayış məntəqəsi gözəl təbiətinə görə belə adlandırılmışdır Oykonimin "boş, istifadəsiz torpaq sahəsi" mənasında işlənən *xalı* sözündən düzəldiyini də ehtimal etmək olar

**Xaltan** *hidr mür* 1 Quba r-nu ərazisində, Xaltan kəndinin şm -ş -ində Gilgilçayın hər iki sahilində çoxdebitli, isti kükürdlü bulaqlar Qədimdən yel və dəri xəstəliklərinin müalicəsində istifadə olunur Tədqiqatçılara görə, bulağın adı qədim İran mənşəli *xar* və ya *gar* ("isti" deməkdir; sonralar *r* səsi *l* səsinə keçmişdir) və *dan* (su) sözlərindən düzəlib (osetin dilində *qardan* "istisu" mənasındadır) Hidronimdəki *dan* (su) sözünün *tan* formasına düşməsi isə tat dilinin Xaltan şivəsində *d* səsinin *t* kimi tələffüz olunması ilə əlaqələndirilir Dən çayının adı da tarixən Tan variantında işlənmişdir; 2 Quba r-nu ərazisində çay Gilgil çayının sağ qoludur Yaxınlığındakı eyniadlı min bulaqların adı ilə adlanır

**Xaltan** *oyk*, *sadə* Quba r-nunun eyniadlı i ə v -də kənd Dağətəyi ərazidədir Yaşayış məntəqəsi Gilgilçayın sahilindəki Xaltan min bulaqlarının adı ilə adlandırılmışdır

**Xaltan** *or sadə* Quba və Şamaxı r-nları arasında dağ aşırımı Oronim ərazideki eyniadlı bulağın adı ilə adlandırılmışdır

**Xamlıdağ** *or mür* Ordubad şəhərindən ş -də, Zəngəzur silsiləsində zirvə Hün 2690 m Tədqiqatçılara görə, oronim fars dilindəki *xam* (əyilmiş, qıvrılmış) sözündən, Azərb dilindəki *-lı* şək -sindən və *dağ* komponentindən ibarət olub, "əyilmiş dağ əyri dağ" mənasındadır Oronimi Azərb dilindəki *xam* (əkilməmiş, ayaq dəyilməmiş yer) sözü ilə də əlaqələndirənlər var

**Xanabad** *or., sadə* Şəki r-nunda, Xanabad kəndindən c.-da yüksəklik. Hün. 192 m. Oronim eyniadlı kəndin adından yaranmışdır.

**Xanabad** *oyk., mür.* 1. Xocalı r-nunun eyniadlı i.ə.v.-də kənd. Dağətəyi ərazidədir; 2. Yevlax r-nunun Aşağı Bucaq i.ə.v.-də kənd. Düzənlikdədir. XIX əsrdə Şəki əyalətinə məxsus olmuşdur. Yaşayış məntəqələri vaxtilə Qarabağ xanlarına məxsus olduğundan belə adlandırılmışdır. Oykonim "xana məxsus kənd" mənasındadır.

**Xanadzax** b.a.x. Xanyurdu.

**Xanəgah** *or., sadə* Kür sahilində palçıq vulkanı. Oronim ərazidəki xanəgahların adından yaranmışdır.

**Xanəgah yolu** *oyk., mür.* Quba r-nunun Güləzi i.ə.v.-də kənd. Cağacıq çayı sahilindədir. Oykonim *Xanəgah* (kənd adı) və *yol* komponentlərindən düzəlib, "Xanəgah kəndinə gedən yol" mənasındadır. Kənd XX əsrin əvvəllərində Xanəgah kəndindən ayrılmış ailələrin məskunlaşması nəticəsində yaranmışdır.

**Xanağa** *hidr., sadə* Quba r-nunda min. bulaqlar. Yuxarı Xanağa və Aşağı Xanağa kəndləri arasındadır. Suyu soyuq, kükürdlü, çoxdebitli 2 bulaqdan ibarətdir. Yerli əhali tərəfindən bir qədər qızdırılıb müalicə məqsədilə istifadə edilir. Hidronim eyniadlı yaşayış məntəqəsinin adından yaranmışdır.

**Xanağa** *or., sadə* 1. Culfa r-nu ərazisində dağ. Xanağa kəndindən ş.-də yerləşir. Hün. 191 m. 2. Qubadlı r-nu ərazisində dağ. Əsl adı Xanəgahdır. Tərəvlu kəndinin q.-ində Xanəgah yeri adlı sahə var. Dağ onun ərazisindəki *xanəgahla* (dini tikili, zaviyə, təkyə) əlaqədar belə adlandırılmış, sonralar isə adı təhrif olunmuşdur.

**Xanağalı** *oyk., düz.* Bərdə r-nunun Alpout i.ə.v.-də kənd. Qarabağ düzündədir. Xanəgahlı variantında da qeydə alınmışdır. Yaşayış məntəqəsi Xanəgah kəndindən köçüb gəlmiş ailələrin məskunlaşması nəticəsində yaranmışdır.

**Xanalı** *oyk., sadə* Şuşa r-nunun Şırlan i.ə.v.-də kənd. Qarabağ silsiləsinin ətəyindədir. Əsl adı Xanalılar olmuşdur. Yerli əhalinin məlumatına görə, yaşayış məntəqəsini Araz çayı sahilində yerləşən Xələfli kəndindən köçüb gəlmiş *xanalılar* nəslinə mənsub ailələr salmışlar.

**Xanallar** *oyk., sadə* Laçın r-nunun Aşağı Fərcan i.ə.v.-də kənd. Dağətəyi ərazidədir. Əsl adı Xanalılardır. Kəndin c.-q.-ində Xanalı dərəsi də var. Oykonim *xanalılar* nəslinin adından yaranmışdır. Etnotoponimdir.

**Xanalyan** *oyk., düz.* Masallı r-nunun Böyük Kolatan i.ə.v.-də kənd. Xanalyan çayı sahilində, Lənkəran ovalığındadır. XIX əsrin əvvəllərində Bədəlan kəndindən ayrılmış ailələrin məskunlaşması nəticəsində yaranmışdır. 1870-ci ildə kənddə cəmi 3 ailə yaşayırdı. Kəndin əsasını Xanəli adlı şəxsin qoyduğu söylənilir. Oykonim *Xanəli* şəxs adından və talış dilində cəmlik bildirən *-on* şək.-sindən düzəlib, "xanəlilər" mənasındadır.

**Xanarx** *hidr., mür.* Qusar r-nunda arx. Samur çayından başlanır. Qusar r-nunun şm.-ş. hissəsini suvarır. Hidronim *xan* və *arx* komponentlərindən düzəlib, "xan tərəfindən çəkilmiş arx" mənasındadır.

**Xanaşençay** *hidr., mür.* Xocavənd və Ağcabədi r-nlarından axan çay. Orconikidze adına kanala çatmadan quruyur. Xonaşen variantında da qeydə alınmışdır. Hidronim *xona* (hündür yer, yüksəklik), *şen* ("ev"; burada "mənbə") və *çay* (su hövzəsi) komponentlərindən düzəlib, "mənbəyini yüksəklikdən alan çay" mənasındadır.

**Xanbulaq** *or., sadə* Xanlar r-nunda dağ. Murovdağ silsiləsinin şm. yamacında, Qoşqar və Gəncə çaylarının suayrıcındadır. Hün. 1422 m. Dağ oradakı bulağın adı ilə belə adlandırılmışdır. Bulaq isə vaxtilə Gəncə xanlarına məxsus yurd yerlərindən birinin yaxınlığında yerləşməsinə görə Xanbulağı adlandırılmışdır.

**Xanbulaq** *hidr., sadə* Xanlar r-nunda çay. Gəncə çayının sol qoludur. Hidronim ərazidəki eyniadlı bulağın adından yaranmışdır.

**Xanbulaq** *oyk., sadə* 1. Ağsu r-nunun eyniadlı i.ə.v.-də kənd. Dağətəyi ərazidədir. Yaşayış məntəqəsini XVIII əsrdə Gürcüstanın Qurcani r-nundan gəlmə erməni ailələri qədim Xanbulaq adlı yerdə salmış və gəldikləri ərazinin adı ilə Gürcüvan adlandırmışdılar. 1988-ci ildə ermənilər kəndi tərk etdilər. Vaxtilə Gürcüstandan Orta Asiyaya sürgün edilmiş, 1989-cu ildə Özbəkistandan





qovulmuş türklərin bir hissəsi bu kənddə məskunlaşdı. Kənd 1990-cı ildən yerləşdiyi ərazinin adı ilə Xanbulaq adlandırıldı; 2. Yardımlı r-nunun Şəfəqli i.ə.v.-də kənd. Peştəsər silsiləsinin ətəyindədir. Kənd adını ərazidəki eyniadlı bulağın adından almışdır.

**Xanbulanı** *hidr., sadə* Lənkəran r-nunda çay. Tədqiqatçılar bu hidronimi xanbulan (sığın) zoonimi ilə bağlayırlar. Lakin çayın adını "bulanıq çay" kimi də izah etmək olar.

**Xanbulanı** *oyk., sadə* Lənkəran r-nunun Avrora qəsəbə i.ə.v.-də kənd. Dağətəyi düzənlikdədir. Oykonim ərazidəki eyniadlı çayın adından yaranmışdır.

**Xandabənd** *or., mür.* Astara r-nu ərazisində dağ. Oronim *xanda* (yüksək yer) və *bənd/band* (dağ, zirvə) komponentlərindən düzəlib, "dağ zirvəsi" və ya "yüksək dağ" deməkdir.

**Xandan** *oyk., sadə* Bakı şəhəri Əzizbəyov r-nunun Qala qəsəbə i.ə.v.-də qəsəbə. Yerli əhali arasında Seyid Xəndan adı ilə tanınır. Qəsəbə vaxtilə mövcud olmuş *Seyid Xəndan obası* adlı yaşayış məntəqəsi əsasında yarandığına görə həmin obanın ixtisar olunmuş adını daşıyır. Fars *xəndan* "gülən, şad" deməkdir.

**Xandək** *oyk., sadə* 1. Dəvəçi r-nunun Ərziküş i.ə.v.-də kənd. Dağətəyi ərazidədir; 2. Qubadlı r-nunun Muradxanlı i.ə.v.-də kənd. Həkəri çayının sahilində, dağətəyi ərazidədir. Yaşayış məntəqəsini Cənubi Azərb.-nın Xəndək kəndindən gəlmiş Hacı Məmməd adlı şəxsin salması və hazırda kənddəki nəsillərdən birinin hacıməmmədquşağı adlanması haqqında məlumat verilir. Tədqiqatçılar bu oykonimi X əsrdə Orta Asiyada Çu çayı vadisində və Talas Alatausu ərazisində yaşamış və sonralar Səlcuq oğuzlarına qoşulmuş türk mənşəli *xandak* tayfasının adı ilə bağlayırlar. XIX əsrin əvvəllərində Şəki əyalətində Kandak, Gürcüstan ərazisində Aşağı Xandək və Yuxarı Xandək kəndləri qeydə alınmışdır. Oykonim Xəndək variantında da işlənir.

**Xanəgah** *oyk., sadə* 1. Bərdə r-nunun Alpout i.ə.v.-də kənd. Qarabağ düzündədir; 2. Cəlilabad r-nunun eyniadlı i.ə.v.-də kənd. Burovar silsiləsinin yamacındadır; 3. Culfa r-nunun eyniadlı i.ə.v.-də kənd. Əlincə çayının sahilində, dağətəyi ərazidədir; 4. İsmayıllı r-nunun Qalıncaq i.ə.v.-də kənd. Dağətəyi ərazidədir; 5. Quba r-nunun Rustov i.ə.v.-də kənd. Çağacıq çayı sahilindədir; 6. Lerik r-nunun Osyedərə i.ə.v.-də kənd. Dağətəyi ərazidədir. Oronimlər ziyarətgah, pir və müqəddəs qəbirlərin ətrafında qurulmuş tikililər və ya zəvvarlara məxsus tikili qurumlarına verilən ümumi ad *Xanəgahla* bağlıdır. Xanəgahlar ümumiyyətlə "dərvişlərin məskəni" mənasında olub, müqəddəs yerlərin üstündə tikilirdi. Culfadakı Şeyx Xorasan (Fəzlullah Nəimi), Lerikdəki Xoca Seyid türbələri belə xanəgahlardandır.

**Xanərəb** *oyk., mür.* Bərdə r-nunun eyniadlı i.ə.v.-də kənd. Qarabağ düzündədir. Yaşayış məntəqəsi ərəb mənşəli tayfaların məskunlaşması nəticəsində yaranmış, Qarabağ xanlarına məxsus mülk olmuşdur. Bir müddət Bəylik də adlanmışdır. Oykonim *xan* (titul) və *Ərəb* (etnotoponim) komponentlərindən düzəlib, "xana məxsus Ərəb kəndi" mənasındadır.

**Xanxanımlı** *oyk., düz.* Bərdə r-nunun Şirvanlı i.ə.v.-də kənd. Qarabağ düzündədir. Yaşayış məntəqəsi vaxtilə Azərb. xanlarından birinin xanımına məxsus olduğundan belə adlandırılmışdır. Oykonim "xanın xanımına məxsus" deməkdir.

**Xanılı** *oyk., sadə* Cəlilabad r-nunun Kürdlər i.ə.v.-də kənd. Dağətəyi ərazidədir. Keçən əsrin əvvəllərində Xanılarkənd variantında qeydə alınmışdır. Yaşayış məntəqəsini *xanılı* (və ya *xanılar*) nəslinə mənsub ailələr bina etdiyinə görə belə adlanmışdır.

**Xankeçən** *oyk., sadə* Sabirabad r-nunun Azadkənd i.ə.v.-də kənd. Kür çayının sahilində, Muğan düzündədir. Yaşayış məntəqəsi Kür çayı üstündəki keçid yaxınlığında yerləşdiyinə görə belə adlandırılmışdır. Həmin keçid xalq arasında *Xankeçən* (Şamaxı xanı Mustafa xanın qardaşı Haşım xan nəzərdə tutulur) adı ilə məşhurdur. 1968-1969-cu illərdə Kür çayının daşması ilə əlaqədar Böyükkəndin əhalisinin bir hissəsi bu kəndə köçürülmüşdü.

**Xankəndi** *oyk., mür.* 1. Azərb.-da şəhər. Qarqar çayı sahilində, Qarabağ silsiləsinin

ətəyindədir. Yaşayış məntəqəsini Qarabağ xanı Pənahəli xanın oğlu Mehdiqulu xan saldığına görə 1923-cü ilədək Xankəndi adlanırdı. Xana məxsus cins atlar və sağmal inəklər burada saxlanırdı. Qarabağ xanlığı Rusiyaya birləşdirildikdən sonra kənd Mehdiqulu xanın arvadı Pərcahan bəyimə bağışlanmışdı. Rusiya ordusunun Sünjen polku orada yerləşdirildikdən sonra bu polka məxsus tikililərin hesabına kənd xeyli böyümüşdü. Odur ki, yaşayış məntəqəsi bəzən "ştab" da adlanırdı. Sonralar gəlmə ermənilər burada yerləşdirilmiş, kəndin adı da dəyişdirilərək Stepan Şaumyanın adı ilə Stepanakert adlandırılmışdı. 1991-ci ildən yaşayış məntəqəsinin tarixi adı özünə qaytarılmışdır; 2. İsmayıllı r-nunun Basqal i.ə.v.-də kənd. Xankəndi çayının sahilində, dağətəyi ərazidədir. Yaşayış məntəqəsi XIX əsrin əvvəllərində Şirvan xanı Mustafa xana məxsus ailələrin məskunlaşması nəticəsində yaranmışdır; 3. Şamaxı r-nunun Mədrəsə qəsəbə i.ə.v.-də kənd. Ləngəbiz silsiləsinin ətəyindədir. Kənd vaxtilə Şirvan xanlarına məxsus olduğundan Xankəndi adlanırdı. Kollektivləşmə illərindən sonra S.G.Şaumyanın adı ilə Şaumyanabad adlanmışdır. 1990-cı ildən kəndin keçmiş adı özünə qaytarılmışdır. Oykonim "xana məxsus kənd" mənasındadır.

**Xanqərvənd** *oyk., mür.* Goranboy r-nunun eyniadlı i.ə.v.-də kənd. Qarabağ düzündədir. Yerli əhalinin məlumatına görə, yaşayış məntəqəsi XVIII əsrdə Qarabağ xanı İbrahimxəlil xanın göstərişi ilə Qərvənd adlı ərazidə salındığına görə belə adlandırılmışdır. "Xanın saldırdığı, xana məxsus Qərvənd kəndi" mənasındadır. Oykonimin birinci komponenti bu kəndi Qərvənd adlı digər yaşayış məntəqələrindən fərqləndirməyə xidmət edir.

**Xanlar** *oyk. sadə.* 1. Azərb.-nın q.-də inzibati r-n. Murovdağ silsiləsinin şm. yamacı ətəklərində yerləşir. R-nun ərazisi şm.-dan 500 m. hündürlükdən başlayaraq c.-a doğru yüksəlir. Ən yüksək hissəsi Gamışdağ zirvəsidir (3722 m.). Gəncə və Kür çayları r-nun ərazisindən axır. Mərkəzi Xanlar şəhəridir. 1930-cu ildə təşkil olunmuşdur; 2. Azərb.-da şəhər, eyniadlı inzibati r-nun mərkəzi. Gəncə çayının sahilində, Kiçik Qafqaz dağlarının ətəyindədir. Keçmişdə bu ərazidə azərb. ailələri yaşadığı Xanlıqlar kəndi mövcud idi. 1818-ci ildə Almaniyanın Vürtemburq əyalətindən köçmüş alman kolonistləri burada yerləşdirildikdən sonra yaşayış məntəqəsi çar I Aleksandrın (1801-25) arvadı Yelizavetanın şərəfinə Yelenendorf adlandırıldı. Keçən əsrin 20-ci illərində yaşayış məntəqəsinə N.Nərimanovun (1870-1925) adı verilmişdi. 1938-ci ildən peşəkar inqilabçı *Xanlar Həsən oğlu Səfərəliyevin* adı ilə Xanlar adlandırılmışdır; 3. Bakı şəhəri Səbail r-nunun ərazisində ştq. 2001-ci ildən Bibiheybət kimi rəsmiləşdirilmişdir; 4. Xanlar r-nunun eyniadlı şəhər i.ə.v.-də qəsəbə. Ərazisinə daxil olduğu şəhərin adını daşıyır. Memorial toponimdir.

**Xanlar** *or., sadə.* Bakı körfəzində ada. Qum adası da adlanır. Hövsan burnundan 3 mil c.-da, Qum adasından ş.-də yerləşir. Ada *Xanlar Səfərəliyevin* adını daşıyır. Memorial toponimdir.

**Xanlarkənd** *oyk., mür.* Saatlı r-nunun eyniadlı i.ə.v.-də kənd. Muğan düzündədir. Yaşayış məntəqəsi Böyük Vətən müharibəsindən sonrakı illərdə salınmışdır. İnqilabçı *Xanlar Səfərəliyevin* (1885-1907) adı ilə adlandırılmışdır. Memorial toponimdir.

**Xanlıq** *oyk., düz.* Qubadlı r-nunun eyniadlı i.ə.v.-də kənd. Həkəri çayının sahilində, dağətəyi ərazidədir. Xanlıq əvvəllər kəndin ərazisində yerləşən Qarabağ xanı Pənahəli xanın oğlu Mehrəli bəyin malikanəsinin adı olmuşdur. Sonralar mülkün ətrafında salınan kənd də mülkün adı ilə adlanmışdır. Oykonim "xana məxsus mülk" mənasındadır.

**Xanlıqlar** *oyk., düz.* 1. Qazax r-nunun Ağköynək i.ə.v.-də kənd. Ağstafa çayının sahilində, dağətəyi ərazidədir. Bir müddət Musaköy adlanmışdır. Yerli əhali kəndin adını Musa adlı türk sərkərdəsinin burada dəfn olunması və ya XVIII əsrdə qazaxların tərkibində olan *musalı* elatının burada məskunlaşması ilə bağlayır. 1994-cü ildən kənd öz qədim adını almışdır. Kəndin ərazisi Qazax xanlarına məxsus mülk yeri olduğundan belə adlandırılmışdır; 2. Şərur r-nunun eyniadlı i.ə.v.-də kənd. Şərur düzündədir. Yaşayış məntəqəsi vaxtilə Naxçıvan xanlarına məx-





sus Xanlıq adlanan mülk yerinin ərazisində salındığı üçün belə adlandırılmışdır.

**Xanlıqlı** *oyk., düz.* Lənkəran r-nunun Haftoni qəsəbə i.ə.v.-də kənd. Dağətəyi ərazidədir. Yaşayış məntəqəsi vaxtilə burada talış xanlarına məxsus torpaq sahəsinin olmasına görə belə adlandırılmışdır. Kənd hazırda Haftoni qəsəbəsi ilə birləşmişdir.

**Xanlıqoba** *oyk., mür.* Xaçmaz r-nunun Çarxı i.ə.v.-də kənd. Samur-Dəvəçi ovalığındadır. Yaşayış məntəqəsi XIX əsrin ortalarında Quba r-nunun Qrız kəndindən ayrılmış ailələrin *Xanlıq* adlı ərazidə məskunlaşması nəticəsində yaranmışdır. Həmin ərazi isə vaxtilə Quba xanlarına məxsus mülk yeri olmuşdur. Oykonim *xanlıq* və *oba* komponentlərindən düzəlib, "xanlara məxsus oba yeri" deməkdir.

**Xanlıqpəyə** *oyk., mür.* Şuşa r-nunun Şırlan i.ə.v.-də kənd. Dağətəyi ərazidədir. Yaşayış məntəqəsinin ərazisi vaxtilə Qarabağ xanlarının yurd yeri olmuşdur. Burada xanlara məxsus at ilxıları saxlandığından kənd belə adlandırılmışdır.

**Xanmədbinə** *oyk., mür.* Zaqatala r-nunun Əli Bayramlı i.ə.v.-də kənd. Alazan-Əyriçay çökəkliyindədir. Yaşayış məntəqəsinin salındığı ərazidə əvvəllər Aşağı Tala kəndindəki *xanmədlər* (*xəmmədlər*, əsli *xanməmmədlər*) tabununa (nəslinə) məxsus binə olmuş, sonralar bu nəsildən bir neçə ailə köçərək həmin ərazidə daimi yaşayış məntəqəsi salmışdır.

**Xanməmmədli** *oyk., sadə.* 1. Neftçala r-nunun Qaçaqkənd i.ə.v.-də kənd. Bala Kür çayının sahilində, Salyan düzündədir. Yaşayış məntəqəsi XIX əsrin birinci yarısında Şorsulu kəndindən ayrılmış *xanməmmədli* nəslinə mənsub ailələrin məskunlaşması nəticəsində yaranmışdır; 2. Zərdab r-nunun Gəlmə i.ə.v.-də kənd. Türyan çayının sahilində, Kür-Araz ovalığındadır. Yaşayış məntəqəsi *xanməmmədli* nəslinə mənsub ailələrin məskunlaşması nəticəsində yaranmışdır.

**Xanoba** *oyk., mür.* Xocavənd r-nunun Kiş i.ə.v.-də kənd. Qarabağ silsiləsinin ətəyindədir. Yaşayış məntəqəsi Qarabağ xanlarına məxsus məntəqələrdən biri olmuş, XIX əsrin 20-ci illərində İrandan köçüb gəlmiş erməni ailələrinin məskunlaşmasından sonra Xnuşinak (erm. Xanoba) adlandırılmışdı. 1992-ci ildən kəndin keçmiş adı bərpa edilmişdir.

**Xantsk** b. a. x. Xanyeri.

**Xanyaylağı** *or., mür.* Şəki r-nu ərazisində dağ. Baş Qafqaz silsiləsindən ayrılan qoldadır. Hün. 2087 m. Oronim *xan* və *yaylaq* komponentlərindən (-ı mənsub şək.-sidir) düzəlib, "xana məxsus yaylaq" mənasındadır.

**Xanyeri** *oyk., mür.* Xocalı r-nunun Daşbulaq i.ə.v.-də kənd. Qarabağ silsiləsinin ətəyindədir. XIX əsrdə gəlmə ermənilərin məskunlaşması nəticəsində kəndin adı Xantsk olmuşdu. 1992-ci ildə yaşayış məntəqəsinin Xanyeri adı bərpa edildi. Oykonim "xana məxsus yer" mənasındadır.

**Xanyurdu** *oyk., mür.* Xocalı r-nunun Ballıca i.ə.v.-də kənd. Dağətəyi ərazidədir. Kənd XIX əsrdə Zəngəzur qəzasından köçmüş erməni ailələri tərəfindən Xanyurdu adlanan yerdə Xanadzax adı ilə salınmışdı. 1992-ci ildən kənd salındığı yerin adı ilə adlandırılmışdır.

**Xaraxoba** *oyk., mür.* Xaçmaz r-nunun Dədəli i.ə.v.-də kənd. Samur-Dəvəçi ovalığındadır. XIX əsrin əvvəllərində Dağıstanın Xarax kəndindən köçüb gəlmiş ailələrin məskunlaşması nəticəsində yaranmışdır. Oykonim "Xarax kəndinə məxsus oba" mənasındadır. *Xarax* avar dilində "köhnə, əski" deməkdir.

**Xarataq** *or., mür.* Qax r-nu ərazisində dağ aşırımı. Oronim qəd. türk dillərindəki *xara* (torpaq) və *taq* (dağ) komponentlərindən düzəlib, "torpaq dağ" mənasındadır. Oronimi Torpaqtəpə toponiminin sinonimi hesab etmək olar.

**Xarxaput** *oyk., mür.* Goranboy r-nunun Qaraçinar i.ə.v.-də kənd. Murovdağ silsiləsinin ətəyindədir. Tədqiqatçıların bir qismi bu oykonimin erkən orta əsrlərdə Qafqaz Albaniyasının Arsax əyalətində mövcud olmuş Xarx qalasının adı ilə eyni mənşədən olmasını güman edir, digər qismi isə türk dillərindəki *karqa* (daş) və *hud* (təpə) sözlərindən yarandığını söyləyir. Əslində, oykonim Azərb. dilinin dialektlərində işlənən qəd. türk dillərindəki *xarxa* (kimsəsiz, dərin) və *hud/put* (ağac, meşə) komponentlərindən düzəlib "dərin meşə" mənasındadır. 1992-ci ildə kəndin adı dəyişdirilərək Meşəli olmuşdur.

**Xarxar** *oyk., sadə* Gədəbəy r-nunun Zəhmətkənd i ə v -də kənd Dağətəyi ərazidədir Yaşayış məntəqəsini 1904-cü ildə Azərb -na köçürülmüş moldavan ailələri Novoalekseyevka adı ilə salmışdılar 1916-1917-ci illərdə onlar geriyə qayıtdıqdan sonra burada azərb ailələr məskunlaşmış və Xarxar adlı dərədə yerləşən bu kəndi Xarxar adlandırmışlar. Tədqiqatçılara görə, toponim qəd. alban tayfalarından olan *qarqarların* adı ilə bağlıdır

**Xarxar** *hidr., sadə* 1 Gədəbəy r-nu ərazisində min bulaqlar Xarxar kəndinin c -ş -ində, Ceyir çayının dərəsindədir Yaxınlığındakı eyniadlı kəndin adı ilə adlandırılmışdır; 2 Şəmkir r-nu ərazisində çay Etnotoponimdir

**Xarxatan** *oyk sadə* Lənkəran r-nunun Şağləsər i ə v -də kənd Lənkəran düzündədir Belə ehtimal edilir ki, oykonim XIII əsrdə Yaxın Şərqin, o cümlədən Cənubi Qafqazın işğallarında iştirak etmiş monqol tayfalarından olan *xartaqanların* adı ilə bağlıdır Güman ki, Hülakülərin talış zonasına köçürdüyü monqol tayfaları içərisində *xartaqanlar* da olmuşdur Kəndin adı XIX əsrdə Xortaqan variantında qeydə alınmışdır Rusiya ərazisində eyniadlı göl mövcuddur

**Xarkiştey** *or.,mür.* Dəvəçi r-nu ərazisində dağ Belə güman edilir ki, oronimin əsli Xərküşteyidir Bu coğrafi ad tat dilindəki *xər* (eşşək) və *küştey* (uçan, ölən) sözlərindən düzəlib, "eşşək uçan, eşşək yıxılıb öldüyü yer" mənasındadır

**Xaruşə** *oyk., mür* Quba r-nunun Talabı i ə v -də kənd Vəlvələ çayının sahilində, Qusar maili düzənliyindədir Yaşayış məntəqəsi XIX əsrin birinci yarısında Talabı kəndindən çıxmış ailələrin Xarüşə adlı qışlaqda məskunlaşması nəticəsində yaranmışdır Oykonim tat dilindəki *xar* (düzən yer, güneyin ətəyi) və *üşə* (meşə) sözlərindən düzəlib, "düzənlikdə meşə" və ya "meşənin düzən yeri" mənalarındadır Kənd üç tərəfdən meşə ilə əhatə olunmuşdur

**Xasabağ** *oyk., sadə* Samux r-nunda qəsəbə Gəncə şəhəri yaxınlığındadır Qəsəbəni 1960-cı illərdə Nizamı adına sovxozun üçüncü şöbəsi yanında vaxtilə Gürcüstandan Orta Asiyaya sürgün edilmiş və sonralar Azərb -na gəlib burada məskunlaşmış türklər Xasabağı adlı ərazidə salmışlar Yerli əhalinin məlumatına görə, *Xasa* buradakı bağın sahibinin adı olmuşdur Oykonim "Xasanın bağı" mənasındadır.

**Xasıdərə** *oyk., sadə* Ağsu r-nunun Nuran i ə v -də kənd. Ağsu çayının sahilindədir Keçmiş adı Qubalı olmuşdur Oykonim *Xası* (ş.a.) və *dərə* komponentlərindən düzəlib, "Xasıya məxsus dərə" mənasındadır Kənd yerləşdiyi dərənin adını daşıyır

**Xaspolad** *oyk., sadə* Quba r-nunun Zərqova i ə.v -də kənd Yan silsiləsinin (Böyük Qafqaz) ətəklərindədir. Kəndin keçmiş adı Xaspolad qışlağı olmuşdur Kəndin ərazisi XVIII əsrdə *Xaspolad* adlı şəxsə məxsus qışlaq yeri olmuş, sonralar daimi yaşayış məntəqəsinə çevrilmişdir və kəndin adındakı *qışlaq* sözü də ixtisara uğramışdır

**Xaspoladoba** *oyk., mür* Xaçmaz r-nunda kənd Samur-Dəvəçi ovalığındadır Oykonim *Xaspolad* (ş a ) və *oba* komponentlərindən düzəlib, "Xaspolada məxsus oba" mənasındadır

**Xaşaxut** *or., mür* Şamaxı r-nu ərazisində dağ Oronim *xaşa* (r-nun ərazisində əkilən qiymətli yem bitkisi) və *xut* (topa, qalaq, təpə) komponentlərindən düzəlib, "xaşa təpəsi" mənasındadır Dağın yamacında bu bitki becərildiyi üçün belə adlandırılmışdır

**Xaşı** *hidr., mür* Quba r-nu ərazisində min bulaqlar Xaşı kəndindən c -da, Xaldan çayının hər iki sahilində yerləşir. Suyu isti və kükürdlüdür Yerli əhali tərəfindən müalicə məqsədilə istifadə edilir Tədqiqatçılara görə, hidronim *xaş* (tat "xoş") və *-ıl-ulov* (su) sözlərindən düzəlib, "xoş su" mənasındadır Xaşi variantında da qeydə alınmışdır

**Xaşı** *oyk., sadə* Quba r-nunun Qonaqkənd qəsəbə i ə v -də kənd Cimi çayının sahilində, dağətəyi ərazidədir Kənd yaxınlığındakı eyniadlı bulağın adı ilə adlandırılmışdır

**Xaşlı** *or., düz* Ordubad r-nu ərazisində dağ Azərb -nın Ermənistanla sərhədində, Zəngəzur silsiləsindədir Hün 2686 m Oronim "zirvəli, başlı" mənasındadır Bəzən Xamlıdağ variantında da qeydə alınmışdır

**Xaşvaxt** *or., mür* Xocavənd r-nunun c -ş -ində sıra dağlar Cəbrayıl r-nunun sərhədi yaxınlığında yerləşir Oronim *xaş/qaş* (axşam, tutqun) və *vaxt* (zaman) sözlərindən düzəlib, "qaranlıq" mənasındadır Vaxtilə ərazidə mövcud olmuş Qaranlıq (Martuni) yer adının sinonimidir

**Xatınbəyli** *oyk., sadə* Tərtər r-nunun Canyataq i ə v -də kənd Dağətəyi ərazidədir Oykonim *xatınbəyli* nəslinin adını əks etdirir, etnotoponimdir

**Xatınbulaq** *oyk., sadə* Füzuli r-nunun Qarakollu i ə v -də kənd Qarabağ silsiləsinin ətəyindədir Oykonim kəndin ərazisindəki Xatın bulağının adından yaranmışdır

**Xatıncan** *oyk., sadə* Tovuz r-nunun Kırən i ə v -də kənd Orta dağlıq qurşaqdadır Yaşayış məntəqəsi Əsrik Cırdaxan camaatına məxsus keçmiş binə yerində salınmışdır Yerli əhalinin məlumatına görə, kənd xalq təbabəti ilə məşğul olmuş *Xatıncan* adlı qadının adı ilə adlandırılmışdır

**Xatınlı** *oyk., sadə* Tovuz r-nunun eyniadlı i ə v -də kənd. Gəncə-Qazax düzənliyindədir Yaşayış məntəqəsi Kür çayı sahilində olan Xatınlı kəndinin əhalisinin 1930-1936-cı illərdə Xunni düzündə həmin kəndə məxsus əkin yerlərində məskunlaşması nəticəsində yaranmışdır Tədqiqatçıların bir qismi oykonimi etnotoponim hesab edir Bəzi tədqiqatçılar isə oykonimi Atabəy Özbəyin sonralar isə Cəlaləddin Xarəzmşahın zövcəsi Mehri Cahan Xatunun (XIII əsr) adı ilə bağlayırlar *Xatun* "xan arvadı, xan qadını" mənasındadır

**Xatınlı** *hidr., sadə* Tovuz r-nunda su anbarı. Xatınçay su anbarı da adlanır Xatınlı kəndinin ərazisindədir Su anbarına su Xanım arxı vasitəsilə daxil olur Eyniadlı kəndin adını daşıyır

**Xatman** *oyk., mur* Ağsu r-nunun Kalva i ə v -də kənd Niyaldağ silsiləsinin ətəyindədir XVIII əsrdə Azərb -nın c -undan köçüb gəlmiş azərb ailələrin məskunlaşması nəticəsində yaranmış Dilman, Hacıman və Xatman yaşayış məntəqələrindən biridir Azərb dilinin dialektlərində *xatman* quru ot tayasına deyilir Oykonim *xat/hat* (kiçik təpə) və *man* (yer) komponentlərindən düzəlib, "kiçik təpəli yer" mənasındadır

**Xersonovka** b a x Nəsimi

**Xervəsər** *or., mür* Lerik r-nu ərazisində dağ silsiləsi Oronim İran dillərindəki *xerva* (zirvə) və *sər* (baş) komponentlərindən düzəlib, "zirvəli dağ" mənasındadır

**Xev** *or., sadə* Qusar r-nu və Dağıstan ərazisində dağ silsiləsi Oronim ləzgi dilində "dağ, aşırım" mənasındadır Gürcü dağlıları da Xevsurlar adlanır

**Xeyrə** *hidr., sadə* Daşkəsən və Xanlar r-nları ərazisində çay Qoşqar çayının sol qoludur Keçmişdə dəyirmanların hərəkətə gətirilməsi üçün istifadə edilirdi Türk dillərində *xiyrə* "tutqun, bulanıq", "arıq, nazik" mənalarında işlənir Hidronimi fars dilindəki *xara* (mərmər), *Xeyrə* şəxs adı və "xeyir verən, bərəkətli" mənası ilə də bağlayırlar

**Xeyrimli** *oyk., sadə* Qazax r-nunun Əskipara i ə.v -də kənd. Gəncə-Qazax düzənliyindədir Keçmiş adı Dəli Xeyrimli olmuşdur Tədqiqatçılara görə, oykonim əvvəllər *dəli* və *xeyirli* adlı iki etnonimin birləşməsindən düzəlmiş, sonralar bu etnonimlərdən birincisi ixtisara uğramışdır

**Xələc** *or sadə* 1 Sədərək r-nu ərazisində dağ, 2 Şamaxı r-nu ərazisində dağ. Dağ vaxtilə *xələc* tayfasına mənsub yaylaq yeri olduğu üçün belə adlandırılmışdır Xalac variantında da qeydə alınmışdır; 3 Şərur r-nu ərazisində dağ Hün. 813 m Oronim Səlcuq oğuzlarının *xələc* tayfasının adını əks etdirir Mənbələrdə XVII əsrdə Muğanda, XIX əsrin sonlarında Cavad qəzasında xələclərin yaşaması və maldarlıqla məşğul olması haqqında məlumat verilir

**Xələc** *oyk., sadə* 1 Xızı r-nunun Xızı i ə v -də kənd Böyük Qafqaz dağlarının yamacındadır; 2 Qubadlı r-nunun Çardaqlı i ə v -də kənd Bərgüşad çayının sahilində dağlıq ərazidədir; 3 Salyan r-nunun eyniadlı i ə v -də kənd Cənub-Şərqi Şirvan düzündədir Əvvəllər iki müstəqil kəndlərdən - Aşağı Xələc (1965-ci ildə Yenikənd) və Yuxarı Xələc (1965-ci ildən Xələc) ibarət olmuşdur Mənbələrə görə, kəndin əhalisi XVIII əsrin 20-ci illərində Şamaxıdan köçüb gəlmişdir Onlar əvvəllər köçəri həyat sürmüş, yazı Zəngəzurda, Üçtəpə yaylaqlarında, qışı Mil və Muğan düzlərində keçirmişlər; 4 Şərur r-nunun Yengicə i ə v -də kənd Arızboyu

düzənlikdədir; 5 Ucar r-nunun Lək i.ə v.-də kənd Şirvan düzündədir Oykonimlər Səlcuqoğlu tayfa birliyinə daxil olmuş *xələclərin* adından yaranmışdır Yaxın Şərqin işğallarında (XII-XVIII əsrlər) iştirak etmiş xələclərin bir hissəsi indi də İranda və Türkmənistan ərazisində yaşayırlar

**Xələfli** *oyk., düz* 1 Cəbrayıl r-nunun Sirik i ə v.-də kənd Düzənlikdədir Yerli əhalinin məlumatına görə, yaşayış məntəqəsini vaxtilə *Xələf* adlı şəxs salmış və hazırda onun qəbri Xələf piri adı ilə kəndin ş.-indədir; 2 Cəbrayıl r-nunun Qumlaq i.ə v.-də qəsəbə Araz çayı sahilində, düzənlikdədir Yaşayış məntəqəsini Xələfli kəndindən çıxmış ailələr salmışlar 1965-ci ildən qəsəbə adlanır

**Xələfşə** *oyk. sadə.* Füzuli r-nunun Cuvarlı i ə v.-də kənd. Düzənlikdədir Yerli əhalinin məlumatına görə, yaşayış məntəqəsini *Xələfşah* adlı şəxs saldığına görə kənd onun adı ilə adlandırılmışdır Xələfşə variantında da qeydə alınmışdır

**Xələftala** *oyk., sadə* Qax r-nunun Qax İngiloy i ə v.-də kənd. Baş Qafqaz silsiləsinin ətəyindədir Yaşayış məntəqəsi Qax İngiloy kəndinin Çayqırağı adlı məhəlləsindən (və ya tabunundan) köçüb gətmiş ailələrin Xələftala adlı yerdə məskunlaşması nəticəsində yaranmışdır Oykonim "Xələfin talası" mənasındadır

**Xələncəçay** *hidr., mür* Abşeron r-nu ərazisində çay Ataçayın sağ qoludur Əsli Xələcçaydır Çay Xələc kəndi yaxınlığından axdığı üçün belə adlandırılmışdır Hidronim "Xələc kəndi yaxınlığından axan çay" mənasındadır

**Xəlfəhonu** *oyk., sadə* Lerik r-nunun Siyov i ə v.-də kənd Peştəsər silsiləsinin ətəyindədir. Yaşayış məntəqəsi ərazisindəki eyniadlı bulağın adını daşıyır Hidronim *xəlfə* (*xəlfəli* etn.-nin qısaldılmış forması) və talış dilindəki *honu* (bulaq) komponentlərindən düzəlib, "xəlfəlilərə məxsus bulaq" mənasındadır

**Xəlfəküçə** *oyk mür* Lerik r-nunun Biləbənd i ə v.-də kənd Peştəsər silsiləsinin yamacındadır Yaşayış məntəqəsi XIX əsrin əvvəllərində Lerik kəndindən köçüb gəlmiş ailələr tərəfindən salınmışdır Oykonim *xəlfə* (*xəlfəli* etn.-nin qısaldılmış forması) və talış dilindəki *küçə* (məhəllə) sözlərindən düzəlib, "xəlfəli məhəlləsi" deməkdir

**Xəlfələr** *oyk., sadə* 1 Dəvəçi r-nunun Düz Bilici i ə v.-də kənd Yan silsiləsinin (Böyük Qafqaz) ətəyində, düzənlikdədir Yaşayış məntəqəsi XIX əsrin sonlarında Quba xanı Fətəli xanın (1758-1789) Ərdəbil səfəri (1784) zamanı Azərb.-nın c.-undan gətirdiyi şahsevənlərə mənsub *xəlfələr* nəslinin bir hissəsinin məskunlaşması nəticəsində yaranmışdır; 2 Masallı r-nunun Yeyənkənd i ə v.-də kənd Lənkəran ovalığındadır Keçmiş adı Milli Xəlfələr olmuşdur Sonralar oykonimin birinci komponenti düşmüşdür Yaşayış məntəqəsi XIX əsrin sonlarında Muğanın şm.-ında yaşamış şahsevənlərə mənsub *xəlfələr* nəslinin məskunlaşması nəticəsində yaranmışdır

**Xəlfəli** *hidr., sadə* Xocalı və Şuşa r-nları ərazisində çay Qarqar çayının sol qoludur Mənbəyini Sarı Baba dağının şm.-ş. yamacından (2100 m yüksəklikdən) alır Çay öz adını ərazisindən axdığı Xəlfəli kəndinin adından almışdır

**Xəlfəli** *oyk., sadə* 1 İmişli r-nunun eyniadlı i ə v.-də kənd. Muğan düzündədir; 2 Sabirabad r-nunun Şəhriyar i ə v.-də kənd Muğan düzündədir Yaşayış məntəqələri XIX əsrin ortalarında Muğanın şm. hissəsində maldarlıqla məşğul olmuş *xəlfəli* tayfasının məskunlaşması nəticəsində yaranmışdır 250 ailədən ibarət olan *xəlfələr* oturaqlaşdıqdan sonra bir neçə kənd yaratmışdılar; 3 Şuşa r-nunun eyniadlı i ə v.-də kənd Qarabağ silsiləsindədir Kəndin adı keçmişdə Qarabağda yaşamış *xəlfəli* tayfasının adı ilə bağlıdır Keçmiş adı Milli Xəlfəli olmuşdur Mənşəcə şahsevənlərdən olan xəlfəlilər Qarabağ xanı Mehdiqulu xana məxsus olmuş, xan İrana qaçdıqdan sonra oturaqlaşmışdılar

**Xəlfəlikənd** *oyk mür* Lerik r-nunun Mistan i ə v.-də kənd Peştəsər silsiləsinin yamacındadır Oykonim *xəlfəli* (etn.) və *kənd* komponentlərindən düzəlib, "xəlfəlilərə məxsus kənd" deməkdir

**Xəlilabad** *oyk mür* Cəlilabad r-nunun *Xəlilli* i ə v.-də kənd Oykonim *xəlil* (*xəlilli* etn.-nin qısaldılmış forması) və *abad* (kənd) komponentlərindən düzəlib, "xəlillilərin məskunlaşdığı kənd" mənasındadır





**Xəlilli** *oyk., sadə* 1 Ağsu r-nunun Ərəbmehdibəy i ə v.-də kənd. Şirvan düzündədir; 2 Babək r-nunun Şıxmahmud i.ə v.-də kənd. Arazboyu düzənlikdədir, 3 Cəlilabad r-nunun eyniadlı i ə v.-də kənd Burovar silsiləsinin ətəyindədir; 4 Dəvəçi r-nunun Çöl Quşçu i ə v.-də kənd Dağətəyi düzənlikdədir Yaşayış məntəqəsi Quba xanı Fətəli xanın (1759-1789) 1781-ci ildə Qarabağdan köçürdüyü *xəlilli* tayfasına mənsub ailələrin məskunlaşması nəticəsində yaranmışdır, 5 Xocalı r-nunda kənd. Dağətəyi ərazidədir; 6 İsmayıllı r-nunun Qubaxəlilli i ə v.-də kənd Girdiman çayının sahilində, dağətəyi düzənlikdədir Tam adı Xəlilli Qasımbəydir Kənd *xəlilli* tayfasından Qasımbəyə məxsus ailələrin məskunlaşması nəticəsində yaranmışdır Mənşəcə türkdilli qayıların tərkibinə daxil olan *xəlillilər* XIII əsrdə Qərbi Türküstandan köçürülmüş, bir qismi Şirvan zonasında yaşamışdır

**Xəlliaba** b a x. Xallava

**Xəlsə** *oyk., sadə.* Kürdəmir r-nunun Qocalı i ə v.-də kənd Kür çayının sahilində, Şirvan düzündədir Oykonimin ərəb dilindəki *xəlisə* (xanın bəylərə bağışladığı mülk) sözündən olması ehtimal edilir

**Xəndək** b a x Xandək

**Xərə Zirə** *or., mür* Xəzər dənizində ada Bakı arxipelaqında ən böyük adalardan biridir Ələt burnundan ş.-dədir Oronim *Xərə* (fars *xara* "mərmər" deməkdir) və *zirə* (ərəb dilindəki *cəzirə* "ada" sözünün qısaldılmış forması) komponentlərindən düzəlib, "mərmər ada" deməkdir XVIII əsrin əvvəllərində Xəzərin q sahillərinə, Bakı üzərinə yürüş edən I Pyotrun hərbi gəmiləri Bakı arxipelaqına daxil olduqda topoqraflar bu adanı Fin körfəzindəki (Baltik dənizi) Bulla adasına oxşadıb, Bulla adı ilə qeydə almışdılar Sonralar bu ad xəritələrdə də belə rəsmiləşdirilmiş, XX əsrin sonlarına qədər ada bu adı daşımışdır

**Xərxan** *oyk., düz* Xocavənd r-nunun Hərhər i ə v.-də kənd Qarabağ silsiləsinin ətəyindədir Oykonim erkən orta əsrlərdə Qafqaz Albaniyasının Arsax əyalətində (indiki Ağdərə r-nu ərazisində) mövcud olmuş Xarx qalasının adındandır Bu qalanın adı ilk dəfə XIII əsrə aid mənbədə çəkilmişdir Xərxan yaşayış məntəqəsi kimi əvvəlcə Ağdərə r.-nu ərazisində olmuş, orta əsrlərdə dağıdılmış, əhalisi Xocavənd və Şuşa r.-nları ərazisində Xərxan adlı iki kənd salmışdır Oykonim türk dillərindəki *xarx* (boş, kimsəsiz) və İran dillərindəki *-an* (yer) komponentlərinin birləşməsindən düzəlib, "kimsəsiz, boş yer" mənasındadır Görünür, qala XIII əsrdə artıq boşalmış və kimsəsiz olduğu üçün bu adla qeydə alınmışdır.

**Xəsədərli** *oyk., sadə* Goranboy r-nunun Əzizbəyov i ə v.-də kənd Qarasu çayının dərəsində, Gəncə-Qazax düzənliyindədir Tədqiqatçılara görə, oykonimin əsli Xasadərəli olmalıdır. Onların fikrincə, *xasa* (Azərb dilinin bəzi dialektlərində "yaşıllıq, göylük" mənasında işlənir) və *dərə* komponentlərindən düzəlmiş bu oykonim "yaşıl dərə" mənasındadır Lakin eyni zamanda, dialektlərimizdə "çirkli, bulanıq" mənasında *həsə* sözü də işlənir ki, bu da Xəsədərəli (Həsədərəli) toponiminin Qarasu çay dərəsi coğrafi adı ilə eyni mənanı daşıdığını söyləməyə əsas verir

**Xəsili** *oyk., sadə* Bərdə r-nunun eyniadlı i ə v.-də kənd Qarabağ düzündədir Əsli Xasılıdır Yaşayış məntəqəsini *xasılı* nəslinə mənsub ailələr saldığı üçün belə adlandırılmışdır

**Xətai** *oyk sadə* 1 Xocavənd r-nunun eyniadlı i ə v.-də kənd Qarabağ silsiləsinin ətəyindədir Keçmiş adları Arakül, Hərəkül olmuş, hətta ermənilər tərəfindən Arakel də adlandırılmışdır 1988-ci ildə Ermənistandan qovulmuş azərb ailələri kənddə məskunlaşdıqdan sonra əhalinin xahişi ilə yaşayış məntəqəsi Azərb şairi və Səfəvilər dövlətinin görkəmli xadimi *Şah İsmayıl Xətainin* şərəfinə Xətai adlandırılmışdır; 2 Şərur r-nunun Siyaqut i ə v.-də kənd Şərur düzündədir Yaşayış məntəqəsi 1930-cu illərdə Naxçıvan MSSR-in 10 illiyi adına sovxozun malikanəsi yanında salınmış və Sovxoz adlandırılmışdı 1991-ci ildə şair və dövlət xadimi *Şah İsmayıl Xətainin* adı ilə Xətai adlandırıldı Memorial toponimdir

**Xəzər** *oyk., sadə* 1 Lənkəran r-nunda şəhər Xəzər dənizi sahilindədir 1922-ci ildə burada neft daşımaq üçün port salınmış və

V İ Leninin şərəfinə Port İliç adlandırılmışdı 1992-ci ildə Xəzər dənizi sahilində yerləşdiyi üçün şəhərin adı Xəzər adı ilə dəyişdirildi, 2 Neftçala r-nunun eyniadlı i.ə.v.-də qəsəbə Bala Kür çayı sahilində, Salyan düzündədir Keçən əsrdə M Qasımov adına sovxozun malikanəsi yanında yaradılmış, Xəzər dənizi yaxınlığında salındığı üçün Xəzər adlandırılmışdır

**Xəzər** *or., sadə* Füzuli r-nu ərazisində dağ Oronim özündə *xəzər* etnonimini əks etdirir Görünür, Azərb.-da məskunlaşmış xəzər ailələri əvvəlcə maldarlıqla məşğul olmuşlar və həmin dağlarda onların yaylaqları yerləşmişdir Etnotoponimdir

**Xəzər dənizi** *hidr., mür* Azərb., Rusiya, Qazaxıstan, Türkmənistan və İran ərazilərində dəniz Dünyada ən böyük qapalı su hövzəsi və göldür Avropa ilə Asiyanın sərhədindədir Tarixi mənbələrdə Xəzərin yüzədək adına (Əkfudə, Cürcan, Təbəristan, Alban, Abeskun, Qunduz, Quz, Xvalis, Bakı, Quzğun, Saray, Bab əl-Əbvab və s ) rast gəlinir Hələ eramızın I əsrində yaşamış Roma müəllifi Plini göstərirdi ki, sahilboyunda yaşayanlar arasında dənizin çoxlu adı vardır Bu adların yaranması müəyyən tarixi-siyasi şəraitlə bağlı olmuşdur Dəniz çox vaxt onun sahilində yaşayan xalqların [kaspi, xəzər, alban, quz (oğuz), türkmən, bəhr əl-ətrak (ər "türklərin dənizi" deməkdir)], yaxud yaxınlığındakı ölkə, tarixi vilayət və yaşayış məntəqələrinin (Şirvan, Dərbənd, Abeskun, Təbəristan, Xorasan, Muğan, Bakı, Saray, Deyləm, Gilan və s ) adı ilə adlanmışdır Lakin bu adlardan yalnız Kaspi və Xəzər adı daha çox işlənməkdədir Kaspi dənizin qədim və ən çox yayılmış adlarından biridir Toponim özündə Qafqaz Albaniyasında yaşamış *kaspi* tayfasının adını əks etdirir Onların adı ilk dəfə e ə V əsrdə yaşamış Herodotun "Tarix" əsərində çəkilmişdir Xəzər isə orta əsrlərdən başlayaraq Şərq mənbələrində dənizin ən çox işlədilən adlarından biridir Dəniz öz adını erkən orta əsrlərdən Şimali Qafqazın ş -ində və Volqa çayının aşağı axarında yaşamış və qüdrətli Xəzər xaqanlığı yaratmış türkdilli *xəzər* tayfasının adından almışdır Xəzərlər başqa türkdilli tayfalarla (suvar, bulqar, hun və b ) birlikdə Azərb. xalqının etnogenezində mühüm rol oynamışlar Onların Cənubi Qafqaz ərazisində görünmələri barədə tarixi mənbələrdə müxtəlif məlumatlara təsadüf edilir "Kartlis Sxovrebo" ("Gürcüstanın həyatı") adlı qədim gürcü mənbəsində e ə IV əsrdə Kartlidə əhalinin altı dildə, o cümlədən xəzər dilində danışdığı qeyd olunub Xəzərlərin Azərb -na axını I-III əsrlərdə daha da gücləndi Sasani hökmdarı II Şapur (309-379) və Xosrov Ənuşirəvan (531-579) dövründə on minlərlə xəzər ailəsi Azərb -da yerləşdirildi 679-cu ildə xəzərlər Arranı tutaraq yüz əlli ildən çox burada hökmranlıq etmişlər Azərb -nı işğal etməyə çalışan ərəblərlə xəzərlər arasında təqr yüz il davam edən müharibə Xilafətin xeyrinə nəticələndi 965-ci ildə Kiyev knyazı Svyatoslav Xəzər xaqanlığına son qoyduqdan sonra xəzərlər siyasi fəaliyyət meydanından çıxdılar və tədricən müxtəlif türk xalqları, o cümlədən azərb -larla qaynayıb-qarışdılar Azərb -da xəzər etnonimi ilə bağlı bir çox toponim mövcuddur.

**Xəzərdərə** *or., mür* Babək r-nu ərazisində dağ Oronim özündə türkdilli qədim *xəzər* tayfasının adını əks etdirir, "xəzərlərin dərəsi" mənasındadır

**Xəzərli** *oyk., düz* Xaçmaz r-nunun Uzunoba i ə v -də qəsəbə Xəzər dənizi sahilində, Samur-Dəvəçi ovalığındadır Yaşayış məntəqəsi Böyük Vətən müharibəsindən sonrakı illərdə yaranmışdır Xəzər dənizi sahilində salındığı üçün belə adlandırılmışdır

**Xəzəryurd** *or., mür.* Ordubad r-nu ərazisində dağ. Tivi kəndindən şm -ş -dədir Hün 3168 m Çox güman ki, dağın ərazisində erkən orta əsrlərdən Azərb.-da məskunlaşmış *xəzərlərin* yurd yeri olduğu üçün belə adlanmışdır Oronim "xəzərlərin yurdu" mənasındadır

**Xəznədərə** *hidr., mür* Culfa r-nu ərazisində çay Əlincə çayının sağ qoludur. Hidronim *xəznə* (örüş, otlaq) və *dərə* (çay dərəsi) komponentlərindən düzəlib, "otla zəngin çay dərəsi" mənasındadır Çay bu dərədən axdığı üçün belə adlandırılmışdır

**Xəznəvarsu** *hidr., mür* Laçın r-nu ərazisində çay Zabux çayının sağ qoludur Əsl





adı Xəzinəvarsudur Hidronim *xəznə/xəzinə* (Azərb dilinin dialektlərində "otla zəngin örüş", "otlaq"), *var* (kürd dilində "binə", "yurd", "köç", "düşərgə", "qışlaq") və *su* (burada "çay") sözlərindən düzəlib Çay başlanğıcını otla zəngin olan yurd yerinin yaxınlığından aldığı üçün belə adlandırılmışdır

**Xəzrəarx** *hidr., mür* Xaçmaz r-nu ərazisində çay Əsli Həzrəarxdır Çay Qusar r-nundakı Həzrə kəndinin ərazisindən axdığı üçün belə adlanmışdır

**Xəzrəkəndçay** *hidr., mür* Abşeronda çay Əsli Həzrəkəndçaydır Hidronim *Həzrəkənd* (oyk ) və *çay* komponentlərindən düzəlib, "Həzrə kəndindən axan çay" mənasındadır

**Xıçəso** *oyk., mür* Astara r-nunun Kijəbə qəsəbə i ə v -də kənd Təngərud çayının sahilində, Lənkəran ovalığındadır Yerli əhalinin dilində Xıçəso kimi tələffüz edilir Oykonimi talış dilindəki *xıç* (armud), -*ə* (bitişdirici sait) və *so* (həyət) komponentlərinin birləşməsindən ibarət "armudluq", "armud bağı" və ya *xıçə* (budaq) və *sə* (baş) komponentlərindən ibarət "budaq başı" mənasını bildirən söz kimi izah edirlər

**Xıdırlı** *or., sadə* 1 Ağdam r-nunda dağ; 2 Salyan r-nu ərazisində palçıq vulkanı Kürün sahilinə yaxındır Yüksəkliklər ərazisində yerləşdikləri Xıdırlı kəndinin adı ilə adlandırılmışdır

**Xıdırlı** *oyk., sadə* 1 Ağdam r-nunun eyniadlı i ə v -də kənd Qarabağ silsiləsinin ətəyindədir Yaşayış məntəqəsi XIX əsrin ortalarında Cavad qəzasında yaşamış *xıdırlı* tayfasının məskunlaşması nəticəsində yaranmışdır; 2 Qubadlı r-nunun Teymurmüskənli i ə v -də kənd Bərgüşad çayının sahilində, dağlıq ərazidədir Yerli əhalinin məlumatına görə, kəndi Xıdır, Məhərrəm və Həsən adlı şəxslər salmışlar Hazırda kənddə xıdırlı, məhərrəmli və həsənli nəsilləri yaşayır Oykonim *xıdırlı* nəslinin adını daşıyır; 3 Salyan r-nunun eyniadlı i ə v -də kənd Düzənlikdədir Yaşayış məntəqəsi XIX əsrin ortalarında Cavad qəzasında Mişovdağın ətəyində qışlayan 46 ailədən ibarət maldar *xıdırlı* tayfasının məskunlaşması nəticəsində yaranmışdır Etnotoponimdir

**Xıdırzində** *or., sadə* Dəvəçi r-nu ərazisində palçıq vulkanı Vulkan Beşbarmaq qayasındakı *Xıdırzində* (Diri Xıdır) *pirinin* adı ilə adlandırılmışdır Pir qayanın başında indi də mövcud olan və Dirilik suyu adlanan bulaqdan su içdiyinə görə guya diri qalmış Xıdır (Xızır) peyğəmbər haqqındakı rəvayətlə bağlıdır Bu bulaq haqqında hələ IX-X əsrlərdə ərəb coğrafiyaşünas-səyyahları öz əsərlərində məlumat vermişlər Dağ Beşbarmaq dağı da adlanır

**Xıl** *oyk., sadə* Masallı r-nunun eyniadlı i.ə v -də kənd Lənkəran ovalığındadır Tədqiqatçıların bir qismi oykonimi talış dilindəki *xil* (çayda çökək yer, dərə, su yığılan çala) sözü ilə bağlayır və bunu yaşayış məntəqəsinin çökəklikdə yerləşməsi ilə əlaqələndirirlər Bəzi tədqiqatçıların fikrinə görə, kəndin adı ərəb mənşəli *xil* tayfasının adından yaranıb

**Xılxına** *oyk., mür* Ağstafa r-nunun Düzqışlaq i ə v -də kənd Gəncə-Qazax düzənliyindədir 1808-ci ilə aid arxiv sənədlərində kəndin adı Xılxınna variantında qeydə alınmışdır Oykonim *xıl* (tat "dərə" deməkdir) və *xınna* ("xunan" sözünün tarixən dəyişmiş forması) komponentlərindən düzəlib, "xunan dərəsi" mənasındadır Tarixi mənbələrin məlumatına görə, xunanlar hələ çox qədimdən Azərb -nın q bölgəsində, Kür çayı boyunca yaşamışlar Tədqiqatçılar Tovuz r-nu ərazisindəki Torpaqqalada və onun ətrafında qədim Xunan şəhərinin və Xunan qalasının yerləşdiyini iddia edirlər Bu gün Tovuz ərazisində mövcud olan Xunanyurd, Xunanarx, Xunanyol, Xunan təpəsi, Xunan dərəsi, Xunan düzü, Ulu Xunan düzü kimi coğrafi obyektlər xunanların bu ərazidə yaşadıqlarından xəbər verir Mənbələrə görə, monqol istilaları zamanı Xunan şəhəri viran edilmiş, əhalisi Tovuzun başqa yerlərinə səpələnmişdi Xunan qaçqınlarının bir hissəsi Xınna dərəsi adlanan ərazidə məskunlaşmışdı Xılxına toponimi Xınna dərəsi oroniminin sinonimidir Güman etmək olar ki, yaşayış məntəqəsini Xınna dərəsindən köçüb gəlmiş ailələr saldığı üçün belə adlandırılmışdır

**Xıllı** *oyk., sadə* Neftçala r-nunda kənd Kür çayı sahilində, Salyan düzündədir.

2 Salyan r-nunun eyniadlı qəsəbə i ə v -də qəsəbə Salyan düzündədir Bəzı tədqiqatçılara görə, yaşayış məntəqələrinin adı ərəb işğalları dövründə İraqın Xilə əyalətindən Azərb -na köçürülmüş və sonralar *xilli* adlandırılmış tayfanın adını əks etdirir

**Xınaxlı** *oyk*, *sadə* Ağdaş r-nunun Kotavan i ə v -də kənd. Kür çayının sahilində, Şirvan düzündədir Əsli Xınalıqlıdır XIX əsrin ortalarında Quba r-nunun Xınalıq kəndindən çıxmış ailələrin məskunlaşması nəticəsində yaranmışdır Həmin ailələr həpıt tayfaları içərisində kiçik köç şəklində buraya gəlmişlər

**Xınalıq** *oyk*., *düz* Quba r-nunun eyniadlı i ə v -də kənd Baş Qafqaz silsiləsi ilə Yan silsiləsi arasındadır Azərb -nın ən yüksək dağ kəndidir Qafqazdilli xınalıqlıların yaşadığı yeganə kənddir Yaşayış məntəqəsinin erkən orta əsrlərdə salındığı ehtimal edilir Xınalıq, əsasən, dağ kəndləri üçün səciyyəvi üslubda planlaşdırılmışdır; bir evin damı o birisi üçün həyət kimi istifadə olunur Xınalıqlılar digər yaşayış məntəqələri ilə əsasən yay aylarında əlaqə saxlayırlar İlk dəfə haqqında XIII əsrə aid mənbələrdə məlumat verilir Tədqiqatçıların fikrincə, oykonim *xeni* sözündən və Azərb dilində mənsubiyyət anlayışı bildirən *-lıq* şək -sindən düzəlib, "Xenidən olanlar, xenililər" mənasındadır Xınalıqlılar özlərini *kattid*, kəndlərini isə *Kətş* adlandırırlar Yerli əhalinin məlumatına görə, əhali indiki yaşayış yerinə çox qədim zamanlarda zəlzələdən dağılmış Xeno şəhərindən köçüb gəlmişdir Qafqaz Albaniyasının şm -q -ində erkən orta əsrlərdə Xeni əyaləti mövcud olmuşdur Güman edilir ki, Xına komponenti Xeni toponiminin dəyişikliyə uğramış formasıdır Xeno/Xeni toponiminin antik və erkən orta əsr müəlliflərinin III və IV əsrlərdə Dağıstan düzlərində və Azərb -nın şm bölgəsində, Xəzər sahili boyunda yaşayan hunlarla bağlı olmasını ehtimal etmək olar

**Xınalıq** *or*, *sadə* Quba r-nunda dağ Baş Qafqaz silsiləsindən şm istiqamətində ayrılan qolun zirvəsidir Qudyal çayı və onun sağ qolu olan Ağçayın mənbəyi buradadır Hün 3730 m Dağ adını ərazidəki eyniadlı yaşayış məntəqəsindən almışdır

**Xınalıq** *hidr*, *sadə*. Quba r-nunda min bulaq Xınalıq kəndindən 1.5 km c -q -də yerləşir Suyu soyuq və kükürdlüdür Bulaq adını yaxınlığında yerləşdiyi kəndin adından almışdır

**Xındırıstan** *oyk*, *mür* Ağdam r-nunun eyniadlı i ə v -də kənd Qarqar çayının sahilində, dağətəyi ərazidədir Bəzi mənbələrə görə, toponim erməni dilindəki *xndzor* (alma) və fars dilindəki *stan* (yer, ölkə, məkan) sözlərindən ibarət olub, "almalıq" mənasındadır Oykonimin ərəb dilindəki *Xınzır* (donuz) və *stan* (məkan) komponentlərindən ibarət olması haqqında da məlumat verilir Oykonimi Xındzortuman toponiminin variantı kimi qəbul etmək olar XIX əsrin əvvəllərində Qarabağ xanı Mehdiqulu xan (1806-1822) bu kəndi şair Qasım bəy Zakirə bağışlamışdı Bu zaman kənddə cəmi 8 erməni ailəsi yaşayırdı Sonralar gəlmə erməni ailələri burada məskunlaşmışdılar

**Xındzortuman** *hidr*, *sadə* Xocalı r-nu ərazisində min bulaq Bulaq vaxtilə bu ərazinin daxil olduğu eyniadlı mahalın adını daşıyır Toponim *xın/xun* (hun), *dzor* (erm dərə) və *tuman/tümən* (monq hərfi mənası "on min", Elxanilər dövründə inzibati ərazi vahidi, mahal, dairə) komponentlərindən düzəlib, "hun dərəsi mahalı" mənasındadır

**Xınıslı** *oyk*, *sadə* Kürdəmir r-nunun Karrar i ə v -də kənd. Yaşayış məntəqəsi XVI əsrdə qızılbaşların tərkibində adıçəkilən *xınıslı* (*xunuslu*) tayfasının məskunlaşması nəticəsində yaranmışdır Mənbələrdə Xınıslı XIX əsrin ortalarında Girdimançay ətrafında yaşamış 19 tüstüdən ibarət köç kimi qeyd olunur Şamaxı r-nunda Böyük Xınıslı və Dərə Xınıslı kəndləri qeydə alınmışdır Ərazidə eyniadlı çay da var

**Xınnakirən** *oyk*, *mür* Tovuz r-nunun Kirən i ə v -də kənd Zəyəm çayının sahilində, dağətəyi ərazidədir Keçən əsrin əvvəllərində r-nun ərazisində Xınna Kirən və Quşçu Kirən adlı iki kənd qeydə alınmışdır Tədqiqatçıların bir qismi *kirən* sözünü türk dillərindəki *kir/gir* (yamac, yoxuş) və İran dillərindəki cəmlik bildirən *-ən* şək -sının birləşməsi, digər qismi isə ərazidəki meşəliklə əlaqədar (tir, pərdi) sözü ilə əlaqələndirirlər Oykonim






"xınanlara məxsus Kirən kəndi" mənasındadır Mənbələrin məlumatına görə, Ağstafa çayının hövzəsində qədim monastırın adı da Kirən olmuşdur Xınnagirən variantında da qeydə alınmışdır

**Xınnalı** *oyk*, *sadə* Goranboy r-nunun eyniadlı i ə v.-də kənd Gəncə-Qazax düzənliyindədir Yaşayış məntəqəsini vaxtilə indiki Tovuz r-nundakı Zəyəm çayı boyunca yerləşən *Xınna dərəsi* adlı ərazidəki kəndlərdən köçüb gəlmiş ailələr saldığına görə belə adlandırılmışdır

**Xırdalan** *oyk*., *mür* 1 Abşeron r-nunda ştq Abşeron yarımadasındadır 1936-cı ildə təşkil olunmuşdur Oykonim *xırda* (*xırt/qurd* türk dillərində "yaşayış məntəqəsi, yurd, məskən" və *alan* (etn ) komponentlərindən düzəlib, "alanların məskəni" mənasındadır 2007-ci ildən qəsəbəyə şəhər statusu verilmişdir

**Xırdaoymaq** *oyk*., *mür* Xaçmaz r-nunun Çarxı i ə v -də kənd Samur-Dəvəçi ovalığındadır Oykonim *xırda* (kiçik) və *oymaq* (kənd, el, oba) komponentlərindən düzəlib, "kiçik kənd" mənasındadır

**Xırdapay** *oyk*., *sadə* Kürdəmir r-nunun eyniadlı i.ə v -də kənd Şirvan düzündədir XIX əsrin ortalarında Muğan düzünün şm.-ında yaşayan şahsevənlərin tərkibində xəlfəli, muğanlı tayfaları ilə yanaşı *xırdapay* adlanan tayfanın da adı çəkilir. Kəndin həmin tayfaya məxsus ailələr tərəfindən salındığı ehtimal edilir Etnonim *xırda* (kiçik) və *pay* (hissə) komponentlərinin birləşməsi kimi "kiçik hissə" mənasındadır

**Xırxatala** *oyk*., *mür* Qəbələ r-nunun Həmzəli i ə v -də kənd Qul çayı sahilində, Alazan-Əyriçay çökəkliyindədir Oykonim Yerli əhalinin dilindəki *xırxa/xırxıra* (çayın iki dağ arasından axıb düzənliyə çıxdığı yer) və *tala* komponentlərindən düzəlib, Qul çayının coğrafi mövqeyini bildirir

**Xırmancıq** *oyk*, *sadə* Xocavənd r-nunun Bulutan i ə v -də kənd Dağətəyi ərazidədir Yaşayış məntəqəsi Rusiya-İran müharibəsindən (1826-28) sonra Cənubi Azərb -nın Qaradağ mahalından gəlmə ermənilərin Xırmancıq adlı yerdə məskunlaşması nəticəsində yaranmışdır Tədqiqatçılara görə, oykonim "kiçik xırman" mənasındadır Etnotoponim olması da mümkündür.

**Xırmancıq** *or*, *sadə* Şərur r-nu ərazisində dağ Yuxarı Yaycı kəndindən şm -da yerləşir Hün 1703 m Xamancıq variantında da qeydə alınmışdır Tədqiqatçılara görə, oronimin əsli Karmancıqdır Toponim *karman* və ya *kermen* (qəd türk dillərində "qala") sözündən və *-cıq* şək -sindən ibarət olub, "kiçik qala, qalacıq" mənasındadır Oronimin etnotoponim olması da mümkündür

**Xırmandalı** *oyk*, *sadə* 1 Biləsuvar r-nunun eyniadlı i ə v -də kənd Muğan düzündədir; 2 Masallı r-nunun eyniadlı i ə v -də kənd. Lənkəran ovalığındadır Yaşayış məntəqələrinin adı türkdilli *xırmandalı* tayfasının adı ilə bağlıdır Mənbələrdə *harmandalu/xarmandalu/xarbandalu/xudabandalu* kimi qeydə alınan xırmandalıların adı bayat tayfasının tərkibində çəkilir və Səfəvilər dövlətinin siyasi həyatında mühüm rol oynadıqları göstərilir Bu tayfanın adına İran və İraq toponimiyasında da rast gəlmək mümkündür Qubalı Fətəli xan dövründə (1758-89) xırmandalıların bir hissəsi Cənubi Azərb -nın Ərdəbil əyalətindən köçüb Quba xanlığının Müşkür və Şabran mahallarına gəlmişlər Füzuli r-nundakı Mandılı oykonimi də Xırmandalı adının təhrif olunmuş formasıdır

**Xırmandalı** *or*, *sadə* Füzuli r-nunda, Qarabağ silsiləsinin c -ş qurtaracağında zirvədir Hün 1813 m Oronim eyniadlı tayfanın adını daşıyır, etnotoponimdir

**Xırmanqaynarbinə** *oyk* *mür* Zaqatala r-nunun Yuxarı Tala i ə v -də kənd Alazan-Əyriçay çökəkliyindədir Yaşayış məntəqəsi Qaynarbinə və Yuxarı Tala kəndlərinə məxsus xırman yerində salınmışdır Oykonim *xırman* (taxıl döyülən yer, zəmi), *Qaynarbinə* (əslində Qaynaqbinə kənddə iki bulaq olduğundan belə adlanır) komponentlərindən düzəlib Binə sonralar daimi yaşayış məntəqəsinə çevrilmişdir

**Xırmanlar** *oyk*., *sadə* Laçın r-nunun Qarıkaha i ə v -də kənd Qarabağ yaylasındadır Keçmişdə köhnə *xırmanların* (taxıl döymək təmizləmək və qurutmaq üçün hazırlanmış düzən yer, meydança *xırman* adlanır) yanında Xırmanlar adlanan binə XX əsrin 30-cu illə-

rında daimi yaşayış məntəqəsinə çevrilmiş, kənd həmin adı saxlamışdır **Xırstan** *or düz* Qazax r-nu ərazisində dağ Oronim *xır* (çınqıl, çay daşı) sözündən və *-stan* şək -sindən düzəlib, "çınqıllıq", "səthi çay daşı ilə örtülmüş dağ" mənasındadır

**Xırt** *oyk*, *sadə* Quba r-nunun Gülezi i ə v -də kənd Yan silsiləsinin ətəyindədir Tədqiqatçılara görə, oykonimin əsli Sırtdır Qədim türk dillərində *sırt* "sıra dağlar", "yal", "yayla", "qaya", "yüksək sıldırım sahil" və s mənaları bildirir Bu coğrafi termin Orta Asiya, Qazaxıstan, Sibir, Volqaboyu, Ural, Qafqaz, Kiçik Asiya, Balkan toponimiyasında da işlənir. *Xırt* tat dilinin Qonaqkənd ləhcəsində "sıldırım qaya, dağ" mənasını bildirir Lakin Quba r-nunun toponimiyasında "sırt" termini (Sırt Çiçi) olduğu kimi də işlənməkdədir *Xırt* isə qəd türk dillərində "köhnə" mənasını, müasir türk dillərində isə *xırt/xurt/qurt* variantında "yaşayış məntəqəsi" mənasını bildirir

**Xışqalası** *or sadə* Xocavənd r-nu ərazisində dağ Əsl adının Kiş qalası olması söylənilir Dağ adını zirvəsində xarabalıqları mövcud olan Kış adlı erkən orta əsr alban monastırından almışdır

**Xızı** *oyk*, *sadə* 1 Azərb -da inzibati r-n, 2 Xızı r-nunda ştq Eyniadlı r-nun mərkəzi Xızı platosundadır Kəndin əhalisinin erkən orta əsrlərdə Sasanilərin şm sərhədlərini qorumaq üçün İranın Xuzistan əyalətindən buraya köçürüldüyü güman edilir Ehtimal ki, toponim həmin əyalətin adı ilə bağlıdır Ərəb işğallarına qədər Xızan kiçik Xızanşahlığın mərkəzi olmuşdur İlk dəfə VII əsrə aid mənbələrdə Əhli-Xizan kimi qeydə alınıb IX əsr ərəb mənbələrində Xızan qalasının və xizan tayfasının adı çəkilir Xarabalıqları hazırda Dizəvar ("qala yeri") adı ilə məlumdur Bəzi tədqiqatçılar Xızı toponimini türk dillərindəki *xız/qız* (od, istilik) sözü ilə bağlayırlar

**Xilmilli** *oyk*, *mür* Şamaxı r-nunun eyniadlı i ə v -də kənd Qozluçayın sahilində, dağətəyi ərazidədir Keçmişdə Qozluçay da adlanırdı Oykonim *xil* (*xıl* Azərb dilinin dialektlərində "dəstə, sürü, qrup" mənalarında işlənir) və *milli* (etn ) komponentlərindən düzəlib, "milli tayfası" mənasındadır Görünür, millilər bu kəndin ilk sakinləri olmuşlar Ərazidə onların adlarını əks etdirən min bulaq da var Hilmilli variantında da qeydə alınmışdır

**Xilmilli** *hidr*., *sadə* Şamaxı r-nunda min bulaq Xilmilli kəndi yaxınlığında, Qozluçayın sağ sahilindədir Soyuq, acı-turş-şor sulu bulaqdır Hidronim eyniadlı oykonimdən yaranmışdır

**Ximran** *oyk*., *düz* İsmayıllı r-nunun Əhən i ə v -də kənd Niyaldağ silsiləsinin yamacındadır Yerli əhali kəndi Ximrun adlandırır Zəngi çayının sahilində yerləşdiyi üçün keçmişdə həm də Xumran Zəngi adlanmışdır Yaşayış məntəqəsini Əhən kəndindən çıxmış ailələr Kələköz dərəsinin sol tərəfində daşlıq ərazidə salmışlar *Ximrun* tat dilində "çökəklik, uçqun" deməkdir

**Xincab** *oyk*, *sadə* Babək r-nunun Əznəburt i ə v -də kənd Dərələyəz silsiləsinin ətəyindədir Oykonim eyniadlı hidronimdən yaranmışdır Hidronim fars dilindəki *xinq* və ya *xınq* (boz, tutqun, bulanıq) və *ab* (su) sözlərindən düzəlib, "bulanıq su, tutqun çay" mənasındadır. Kənd keçmişdə mövcud olmuş suyu bulanıq arx sahilində yerləşdiyi üçün belə adlandırılmışdır

**Xirsakulya** *or*, *mür* Dəvəçi r-nu ərazisində dağ Oronimin əsli Xürsəkuevliyadır Tədqiqatçılar bu oronimi tat dilindəki *xürs* (ayı), *ku* (dağ) və *övliya* (pir) komponentlərinin birləşməsindən ibarət "ayı dağı övliyası" və ya "pir olan ayı dağı" mənalı söz kimi izah edirlər Dağın ərazisində keçmişdə sitayiş yeri olan pir (övliya) var Oronimi "səbir dağı piri" kimi də izah etmək olar

**Xişgədərə** *oyk sadə* Dəvəçi r-nunun Zarat i ə v -də kənd Samur-Dəvəçi ovalığındadır Oykonim tat dilindəki *xişk/xişg* (quru), *-ə* (bitişdirici sait) və *dərə* (çay dərəsi) komponentlərindən düzəlib, "quru dərə" mənasındadır Yaşayış məntəqəsi quru çay dərəsində yerləşdiyi üçün belə adlandırılmışdır Hişgədərə variantında qeydə alınmışdır

**Xndzristan** b a x Almalı

**Xnuşinak** b a x Xanoba

**Xocadoy** *oyk sadə*. Lerik r-nunun Qosmalyan i ə v -də qəsəbə Dağətəyi ərazidədir Keçmiş adı Qoşatürbə olmuşdur 1886-cı ilin məlumatına görə, yaşayış məntəqəsi 21 tüstüdən ibarət icma imiş Tədqiqatçılara görə, oykonim *Xıçadoy* adının təhrif formasıdır Talış dilindəki *xıça* (qoşa) və *doy* (ağac, baş ağacı, türbə) komponentlərindən ibarət olan bu coğrafi ad Qoşa türbə toponiminin kalkasıdır





**Xocahan** *oyk*., *düz* Qubadlı r-nunun eyniadlı i.ə.v -də kənd Həkən çayının sahilindədir Oykonim *xoca* (orta əsrlərdə ticarətlə məşğul olan tacir, habelə məşhur din xadimləri *xoca* adlanırdı) sözündən və *-an* (məkan və cəmlik bildirir) şək -sindən (*h* iki *a* səsinin arasına əlavə edilmişdir) ibarət olub "xocalar; xocaların məskunlaşdığı yer" mənasındadır Yerli əhalinin məlumatına görə, kənd tarixən ticarət yeri olmuşdur Oykonim Xocaxan variantında da qeydə alınmışdır

**Xocalı** *hidr*, *sadə* Xocavənd r-nu ərazisində çay. Badara çayının sol qoludur Çay Xocalı şəhəri yaxınlığından axdığı üçün belə adlandırılmışdır

**Xocalı** *or*, *sadə* Füzuli r-nu ərazisində dağ Oronim *xocalı* nəslinin adındandır, etnotoponimdir

**Xocalı** *oyk sadə* 1 Azərb -da inzibati r-n, 2 Azərb -da şəhər Qarabağ silsiləsinin ətəyindədir; 2 Salyan r-nunun Kürqaraqışlı i ə v -də kənd Kür çayının sahilində, Salyan düzündədir Yaşayış məntəqələrini *xocalı* nəslinə mənsub ailələr saldığı üçün belə adlandırılmışdır

**Xocasən** *hidr*, *sadə* Abşeron r-nu ərazisində göl Xocasən qəsəbəsi yaxınlığında yerləşdiyindən qəsəbənin adı ilə adlandırılmışdır

**Xocasən** *oyk*, *sadə* Bakı şəhəri Binəqədi r-nunun Biləcəri qəsəbə i ə v -də ştq Abşeron yarımadasındadır Əsli Xocahəsəndir Orta əsrlərə (XIV-XVII) aid mənbələrdə adı çəkilir Yaşayış məntəqəsinin adı Xoca Həsən şəxs adı ilə bağlıdır

**Xocaşen** *or sadə* Qax r-nu ərazisində dağ silsiləsi Bozdağ silsiləsinin q qurtaracağındadır Acınohur çölü ilə Mingəçevir su anbarı arasında yerləşir Dağ vaxtilə burada mövcud olmuş Xocaşen kəndinin adını daşıyır Kəndin adı isə *Xocalı* (etn ) və *şen/şın* (yer, kənd, yurd) komponentlərindən düzəlib, "xocalıların yurd yeri" mənasındadır

**Xocavənd** *oyk*., *sadə* 1 Azərb -da inzibati r-n; 2. Ağcabədi r-nunun eyniadlı i ə v -də kənd Qarabağ düzündədir; 3 Xocavənd r-nunun eyniadlı i ə v -də ştq Qədim adı Qaranluq olmuşdur XIX əsrin sonlarında Türkiyədən köçüb gəlmiş ermənilər məskunlaşdıqdan sonra Nijni Qaranluq, Cüməbazarı, bir müddət Xonaşen adlandırılmışdır 1940-cı ildə A.F Myasnikovun təxəllüsü ilə Martuni, 1991-ci ildən isə Xocavənd kimi rəsmiləşdirilmişdir Xocavənd "xocalı nəsli" deməkdir

**Xocayurd** *or*, *mür* Kəlbəcər r-nu ərazisində dağ Çilgəz dağ tirəsində zirvədir Tərtər və Xaçın çaylarının suayrıcında yerləşir Hün 2397 m Keçmişdə maldar ellərin yaylaq yeri olmuş bu dağ *xocalı* nəslinin adını daşıyır Oronim "xocalıların yurdu" mənasındadır

**Xocik** *oyk*, *sadə* Qubadlı r-nunun Bala Soltanlı i ə v -də kənd. Həkəri çayının sahilindədir Yaşayış məntəqəsini Cənubi Azərb -nın Xocik kəndindən köçüb gəlmiş ailələr salmışlar Oykonimin "kiçik kənd" mənasında olması ehtimal edilir

**Xocqayadikçay** *hidr*, *mür* Qubadlı r-nu ərazisində çay Hidronim "haça qayadan üzüyuxarı axan çay" mənasındadır

**Xok** *oyk sadə* Şərur r-nunun Qıvraq i.ə v -də kənd. Arazboyu düzənlikdədir Qədim yaşayış məntəqələrindəndir Bəzi tədqiqatçılara görə, oykonim türk dillərindəki "çəmən, otlaq" mənasında işlənən *xok/xak* sözü ilə əlaqədardır Toponimin İran dillərindəki *xak* (torpaq) sözündən olmasını da güman etmək olar

**Xok** *or*, *sadə* Şərur r-nu ərazisində dağ Dərələyəz silsiləsinin c qurtaracağında zirvədir Hün 1060 m Oronim yaxınlığındakı yaşayış məntəqəsinin adından yaranmışdır

**Xol Qarabucaq** *oyk mür* Neftçala r-nunun eyniadlı i ə v -də kənd Salyan düzündədir Yaşayış məntəqəsi XIX əsrdə Qarabucaq kəndindən köçmüş ailələrin Bala Kür (Aquşa) çayı sahilində məskunlaşması nəticəsində yaranmışdır *Xol* sözü dilimizə monqol dilindən keçmiş termin olub "quru çay

yatağı", "çay qolu" mənalarında işlənir *Qarabucaq* isə türk-monqol mənşəli tayfanın adıdır

**Xol Qaraqaşlı** *oyk., mür* Neftçala r-nunun eyniadlı i ə v -də kənd Salyan düzündədir Oykonim "çay qolu sahilində yerləşən Qaraqaşlı kəndi" mənasındadır Oykonimin ikinci komponenti türk-monqol tayfalarından hesab olunan *qaraqaşlıların* adını əks etdirir

**Xolçay** *hidr., mür* Abşeron r-nunda çay Hidronim *xol* (qurumuş çay qolu) və *çay* (su hövzəsi) komponentlərindən düzəlib, "qurumuş qolu olan çay" mənasındadır

**Xoləzəy Alxaslı** *oyk. mür* Kəlbəcər r-nunun Orta Qaraçanlı i ə v -də kənd. Uluxan çayının (Tərtər çayının qolu) sahilində, dağətəyi ərazidədir Oykonimin birinci komponenti r-nun ərazisindəki Alxaslı adlı iki yaşayış məntəqəsini bir-birindən fərqləndirməyə xidmət edir *Xoləzəy* (əsli *Xoləsəy*) "çayın qolu" deməkdir Oykonim "çay qolu kənarındakı Alxaslı kəndi" mənasındadır

**Xolmili** *oyk., mür* Lənkəran r-nunun eyniadlı i ə v -də kənd Lənkəran ovalığındadır Oykonim *xol* (çay qolu, çayın qurumuş qolu) və Milli (etnotoponim) komponentlərindən düzəlib, "çay qolu sahilindəki Milli kəndi" mənasındadır

**Xoltəzəkənd** *oyk., mür* Neftçala r-nunun Xolqarabucaq i ə v -də kənd Salyan düzündədir 1918-20-ci illərdə ətraf kəndlərdən köçüb gəlmiş ailələr Xol adlanan sahədə məskunlaşmış və yeni yaranmış yaşayış məntəqəsi Xoltəzəkənd adlanmışdır Oykonim "Xolda salınmış təzə kənd" mənasındadır

**Xonaşen** *hidr., sadə* Xocavənd və Ağcabədi r-nları ərazisində çay Orconikidze adına kanala çatmadan quruyur Çay öz adını keçmişdə Xonaşin adlanmış böyük yaylaq yurdunun adından almışdır Yaylağın adı isə, tədqiqatçılara görə, V əsrdə Azərb -da məskunlaşmış türkdilli *hun* tayfasının adından və *şen/şin* (yer, ölkə) sözlərindən düzəlib, "hun ölkəsi, hunlar yaşayan ərazi" mənasındadır

**Xonaşenyeri** *or., mür* Şəki r-nu ərazisində dağ Oronim XIX əsrdə mövcud olmuş, sonralar dağılmış *Xonaşin* adlı kəndin adı və *yeri* sözündən düzəlib "Xonaşen kəndinin yurd yeri" mənasındadır Görünür, dağın ərazisi bu kəndə məxsus yaylaq yeri olmuşdur

**Xoruzlu** *oyk., sadə* Tərtər r-nunun eyniadlı i ə v -də kənd Qarabağ düzündədir Oykonim kəngərli tayfa birliyinə daxil olan *xoruzlu* tirəsinin adı ilə bağlıdır

**Xosrov** *oyk., sadə* Ağdaş r-nunun eyniadlı i ə v -də kənd Şirvan düzündədir Yerli əhalinin məlumatına görə, kəndin əsasını *Xosrov* adlı şəxs qoyduğu üçün kənd onun adını daşıyır

**Xoşaxuna** *or., mür* Bakı şəhəri Əzizbəyov r-nu ərazisində yüksəklik Əsli Qoşaxunadır Oronim *qoşa* (cüt, iki) və tat dilindəki *xuna* (ev, tikili) komponentlərindən düzəlib, "qoşa qüllə, qoşa bürc" mənasındadır

**Xoşavənd** *or., mür* İsmayıllı r-nu ərazisində dağ Bozavənd kəndindən c -dadır Hün 717 m Əsli Xaçabanddır Oronim *xaç* və tat dilindəki *band* (təpə, kiçik dağ) sözlərindən düzəlib, "xaç daşı olan dağ" mənasındadır Dağın başında alban xristian dini tikililərinin qalıqları var

**Xoşçobanlı** *oyk., sadə* 1 İmişli r-nunun Murquzalı i ə v -də kənd Araz çayı sahilindədir; 2 Masallı r-nunun Təklə i ə v -də kənd Lənkəran ovalığındadır Hal-hazırda yaşayış məntəqəsi Təklə kəndi ilə birləşdirilmiş və Təklə adlanır; 3 Neftçala r-nunun Aşağı Surra i ə v -də kənd Kür çayının sahilində, Salyan düzündədir Yaşayış məntəqələri Şirvanda yaşamış qədim ellərdən biri olan *xoşçobanlı* tayfasının məskunlaşması nəticəsində yaranmışdır XIX əsrdə xoşçobanlıların adı təklə tayfasının tirələrindən biri kimi çəkilir və onların Şirvandan gələrək maldarlıqla məşğul olmaları haqqında məlumat verilir Bəzi mənbələrdə tayfanın əsl adının *xançobanı* olduğu söylənilir

**Xoşgədik** *or., mür* Laçın r-nu ərazisində dağ Oronim türk dillərindəki *keş* (müvəqqəti yurd, köç) və Azərb dilindəki *gədik* (keçid) sözlərindən düzəlib, "köç olan dağ keçidi" mənasındadır

**Xoşgədik** *hidr., sadə* Laçın r-nu ərazisində çay Həkəri çayının sol qoludur Suvarma və dəyirmanları hərəkətə gətirmək üçün istifadə edilir Çayın adı Xoşgədik dağının adından alınmışdır





**Xoşkeşin** *oyk. mür* Culfa r-nunun Xanağa i ə v -də kənd. Əlincə çayının sahilində, dağətəyi ərazidədir. Oykonim türk dillərindəki *koş* (çobanların müvəqqəti yaşayış yeri, yurd, dayanacaq, köç) və *kəzən* (aşırım, dağ yalı) sözünün fonetik forması olan *kesin/keşin* sözlərindən düzəlib, "dağ yalında çobanların dayanacaq yeri" mənasındadır

**Xoşkeşin** *hidr., sadə* 1 Culfa r-nunda çay Əlincə çayının sol qoludur; 2 Culfa r-nunda min bulaq Xoşkeşin kəndindən ş -də, İlanlı dağının şm qurtaracağında yerləşir Suyu mülayim-istidir Tərkibində karbon qazı vardır İçməyə yararlıdır Yerli əhali tərəfindən müalicə məqsədilə istifadə edilir Su obyektləri Xoşkeşin kəndinin adını daşıyır

**Xoylu** *oyk., düz* Goranboy r-nunun eyniadlı i ə v -də kənd Yaşayış məntəqəsini XIX əsrin əvvəllərində Rusiya təbəəliyini qəbul etmiş Xoy əyalətinin hakimi Cəfərqulu xanla birlikdə Cənubi Azərb -dan gələnlər salmışlar Oykonim "Xoy şəhərindən gələnlər", "xoylular" mənasındadır 1998-ci ildə kəndin adı dəyişdirilmiş, Şirvanlı kimi rəsmiləşdirilmişdir

**Xozavi** *oyk., mür* Lerik r-nunun Bilabənd i ə v -də köç Yerli əhali tərəfindən Həzovi kimi tələffüz edilən bu oykonimi tədqiqatçılar talış dilindəki *hazo* (min) və *vi* (söyüd ağacı) komponentlərindən ibarət "söyüdlük", "çoxlu söyüd olan yer" mənalı söz kimi izah edirlər

**Xoznavarçay** b a x Xəznəvarsu

**Xram** *hidr. sadə* Gürcüstan və qismən Azərb ərazisində (Qazax r-nundan keçir və İkinci Şıxlı kəndi yaxınlığında Kürə tökülür) çay Kürün sağ qoludur Gürcülər bu çayı Xrami, azərb -lar isə Təvədəy adlandırırlar *Təvədöy* "sahilə çırpılan, sahili döyərək axan" mənasındadır Azərb ilə Gürcüstanı birləşdirən məşhur Qırmızı körpü (və ya Sınıq körpü) bu çayın üzərindədir *Xram* gürcü dilində "dərədə axan çay, dərin yataqlı dağ çayı, dərin yarğanlı yataqla axan çay" mənasındadır Çay həqiqətən də Gürcüstan ərazisində başdan-başa dərin dərə ilə axır

**Xramort** *oyk. mür* Xocalı r-nunun eyniadlı i ə v -də kənd Dağətəyi ərazidədir Oykonim *Xram* (yarğan) və *art* (arxa tərəf, aşırım) komponentlərindən düzəlib, "yarğanın arxa tərəfi" deməkdir

**Xrsa Güney** *or., mür* Qax r-nu ərazisində dağ Daşüz silsiləsinin q. qurtaracağında, Qanıx çayından sol tərəfdə zirvədir Hün 586 m Oronim *Xrsa* (avar "qotur") və *güney* komponentlərindən düzəlib, "Gündöyən Qotur dağı" mənasındadır. Qəbələ r-nunda Qoturdağ, Şəki r-nunda Qoturçay toponimləri qeydə alınmışdır

**Xtsabert** b a x Çaylaqqala.

**Xubyarlı** *oyk., sadə* 1 Cəbrayıl r-nunun Cəbrayıl qəsəbə i ə v -də kənd Qarabağ silsiləsinin ətəyındədir; 2. İmişli r-nunun Məzrəli i ə v -də kənd Mil düzündədir Tədqiqatçılara görə, oykonim özündə qəd türkdilli bulqarların *xuvyar* tayfasının adını əks etdirir Tarixi mənbələrin məlumatına görə, V əsrin sonu – VI əsrdə dəfələrlə Cənubi Qafqaz hücum etmiş bulqarların bir qismi bu ərazidə məskunlaşmışdır

**Xucbala** *oyk., mür* Quba r-nunun eyniadlı i.ə v -də kənd Qusar maili düzənliyindədir Keçmiş adı Yuxarı Xuc olmuşdur Oykonim *Xuc* (qıpçaqların kuç tayfa adını əks etdirən etnotoponim) və *bala* (kiçik) komponentlərindən düzəlib, "kiçik Xuc kəndi" mənasındadır Buradakı *bala* komponenti yaşayış məntəqəsini Orta Xuc və Aşağı Xuc kəndlərindən fərqləndirməyə xidmət edir

**Xudat** *oyk sadə* Xaçmaz r-nunda şəhər Samur-Dəvəçi ovalığındadır Oykonim türk dillərindəki *xod/xud* (tərəvəz) və *-at* (yer) komponentlərindən düzəlib, "bostan yeri" mənasındadır Quba xanlığının ilk mərkəzi Xudat olmuşdur

**Xudaverdili** *oyk., düz* Cəbrayıl qəsəbə i.ə v.-də kənd Qarabağ silsiləsinin ətəyindədir Yerli əhalinin məlumatına görə, yaşayış məntəqəsini vaxtilə qonşu Hacılı kəndindən köçüb gəlmiş *Xudaverdi* adlı şəxs saldığına görə kənd onun adı ilə adlandırılmışdır

**Xudayarlı** *oyk. sadə* Cəbrayıl r-nunun Qumlaq i ə v -də kənd Araz çayı sahilində, düzənlikdədir *Xudayarlı* kənddə yaşayan dörd nəsildən birinin adıdır Böyük Vətən müharibəsi illərində kənd əhalisinin bir hissəsi Xələfli qəsəbəsinə, qalan hissəsi isə Xudafərin körpüsünün yanına köçmüşdür Odur ki, kənd bəzən Xudafərin də adlanır

**Xuluq** *oyk.* *sadə* Qusar r-nunun Gilah i ə v -də kənd. Qusar maili düzənliyindədir. Tədqiqatçılara görə, oykonim ləzgi dilindəki *qulux* (arxa tərəf, dalda, dal tərəf) sözündəndir. Kəndin coğrafi mövqeyi bu mənaya uyğundur.

**Xuluqoba** *oyk.*, *mür.* Qusar r-nunun Əniq i ə v -də kənd. Yan silsiləsinin ətəyindədir. Oykonim *Xuluq* (kənd adı) və *oba* komponentlərindən düzəlib, "Xuluq kəndinin obası" mənasındadır.

**Xumarlı** *oyk.*, *sadə* Zəngilan r-nunun Alıbəyli i ə v -də kənd. Həkəri çayının sahilindədir. Tədqiqatçıların bir qismi oykonimi XIII-XIV əsrlərdə adıçəkilən *qumar* tayfasının adı ilə, digər qismi isə *Xumar* şəxs adından yaranmış nəsil adı ilə əlaqələndirir. Hər iki halda etnotoponimdir.

**Xumarta** *oyk.*, *mür.* Laçın r-nunun Köhnəkənd i.ə.v -də kənd. Qarabağ silsiləsinin yamacındadır. Əsli Xumartıdır. Yerli əhalinin məlumatına görə, yaşayış məntəqəsini atlıxan nəsli salmışdır. Oykonim *Xumar* (ş a.) və *tı/ti* (kürd dilində "kənd" deməkdir) sözlərindən düzəlib, "Xumara məxsus kənd" mənasındadır.

**Xurama** *oyk.*, *sadə* Zəngilan r-nunun Hacallı i ə v -də kənd. Araz çayı sahilində, düzənlikdədir. Yaşayış məntəqəsini XVIII əsrdə Cənubi Azərb -nın Xurama kəndindən köçüb gəlmiş ailələr salmış və köhnə yaşayış məntəqəsinin adını da buraya vermişlər. Azərb. dilinin q qrupu dialektlərində *xıram* "qumlu yer" mənasında işlənir. Oykonimin həmin sözlə bağlılığı güman edilir.

**Xuray** *or.*, *sadə* Baş Qafqaz silsiləsində dağ aşırımı. Qax r-nu ilə Dağıstan arasında yerləşir. Oronimin ərazidəki eyniadlı yaşayış məntəqəsinin adı ilə bağlılığı güman edilir.

**Xuray** *oyk.*, *sadə* 1. Qusar r-nunun eyniadlı i ə v -də kənd. Yan silsiləsinin ətəyindədir. Kənd yaxınlığındakı dağ aşırımının adını daşıyır. Oykonimin ləzgi dilindəki *xur/xür* (kənd) sözü və *-ay* (ismin çıxışlıq hal şək -si) topoformantının birləşməsi kimi "kənddən olan" mənasında olduğu da ehtimal edilir; 2. Xaçmaz r-nunun Susayqışlaq i ə v -də kənd. Samur-Dəvəçi ovalığındadır. Keçmiş adı Xurayqışlaq olmuşdur. Kəndin ərazisi əvvəllər Qusar r-nundakı Xuray kəndinə məxsus qışlaq olmuş, XIX əsrin ortalarında həmin kənddən gələn ailələr burada məskunlaşmışlar.

**Xurəl** *oyk.*, *mür.* Qusar r-nunun Avaran i ə v -də kənd. Qusar maili düzənliyindədir. Oykonim ləzgi dilindəki *xur/xür* (kənd) və *əl/el* (üst) sözlərindən düzəlib, "kəndin üstü" mənasındadır. Kəndə bu ad başqa kəndin üst tərəfində yerləşdiyinə görə verilmişdir.

**Xurlu** *or.*, *düz.* Qax r-nu ərazisində dağ. Dağıstanla sərhəddə, Ağbulaq dağından şm -dadır. Hün. 3187 m. Dağın adı fars dilindəki *xur* (duman, çiskin) sözündən və Azərb. dilindəki *-lu* şək -sından düzəlib, "dumanlı" deməkdir.

**Xurs** *oyk.*, *sadə* Ordubad r-nunun Bist i ə v -də kənd. Gilan çayı sahilindədir. Tədqiqatçılar bu oykonimi Gorus etnoniminin variantı hesab edirlər.

**Xursən** *or.*, *sadə* Kəlbəcər r-nu ərazisində dağ. X əsrə aid mənbədə Xursan Dərbəndlə Şirvan arasında yerləşən knyazlığın adı kimi yad olunur. Tədqiqatçılar bu toponimi *xorus/gorus* etnonimi ilə bağlayırlar. Oronim "gorusllar" mənasındadır.

**Xurşud** *oyk.*, *sadə* Salyan r-nunun Arbatan i ə v -də kənd. Salyan düzündədir. XIX əsrdə balıq vətəgəsinin adı olub. Vətəgənin adı *Xurşud* şəxs adı ilə bağlıdır. Yaşayış məntəqəsinin ilk sakinləri Cənubi Azərb -dan gəlib balıq vətəgəsində muzdla işləyən ailələr olmuşdur.

**Xustumtok** *or.*, *mür.* Yuxarı Qarabağda dağ. Oronimin qədim türk dillərindəki *Kustun* (inləyən, nəfəs alan) və *tok* (dağ) sözlərindən düzəlib, "inləyən dağ" mənasını bildirməsi ehtimal edilir.





# İi

**İbadisu** *hidr.*, *mür.* Lənkəran r-nu ərazisində min. bulaqlar. Havzaqya çayının yatağında yerləşir. 11 bulaqdan ibarətdir. Çoxunun suyu isti və kükürdlüdür. Qədim zamandan yerli əhali tərəfindən müalicə üçün istifadə edilir. Tədqiqatçılar hidronimi "İbadın suyu" mənasında izah edirlər. Lakin Azərb. dilinin bəzi dialektlərində *ibi/iba* "kiflənmiş, xarab olmuş, pis qoxulu" mənalarında işlənir. Güman etmək olar ki, hidronim *İbalısu/İbilisu* adının təhrif formasıdır və "pis qoxulu su" mənasındadır.

**İbadulla** *oyk.*, *sadə* Şərur r-nunun eyniadlı i.ə.v.-də kənd. Arpa çayının sahilində, düzənlikdədir. Yaşayış məntəqəsi vaxtilə *İbadulla* adlı şəxs tərəfindən salındığı üçün belə adlandırılmışdır.

**İbaxlı** *oyk.*, *düz.* Qax r-nunun Əlibəyli i.ə.v -də kənd. Alazan-Əyriçay vadisindədir. Tədqiqatçılar bu oykonimi qəd. türk dillərindəki "yüksək yer, yüksəklik" mənalı *obux* sözü ilə əlaqələndirirlər. Keçən əsrdə Qəbələ r-nu ərazisində Obuxlu adlı kənd qeydə alınmışdır.

**İbrahimhacılı** *oyk.*, *mür.* Tovuz r-nunun Alakol i ə v -də kənd. Zəyəm çayının sahilində, dağətəyi ərazidədir. Yaşayış məntəqəsini *hacılı* tirəsinə mənsub ailələrin başçısı *İbrahim* adlı şəxs saldığı üçün kənd belə adlandırılmışdır. Oykonim "hacılı tayfasından olan İbrahimin kəndi" mənasındadır.

**İbrahimhapıt** *oyk.*, *mür.* Quba r-nunun Vəlvələ i ə v -də kənd. Qusar maili düzənliyindədir. Yaşayış məntəqəsi Yuxarıqışlaq, Aşağıqışlaq və Qabaqqışlaq adlı üç kiçik obanın birləşməsi əsasında yaranmışdır. Kəndin bünövrəsini isə *Hapıt* kəndindən köçüb gəlmiş ailələrin başçısı *İbrahim* adlı şəxs qoyduğu üçün kənd belə adlandırılmışdır. Oykonim "hapıtlı İbrahimin kəndi" mənasındadır.

**İbrahimkənd** *oyk.*, *mür.* Şəki r-nunun Aşağı Küngüt i ə v -də kənd. Alazan-Əyriçay çökəkliyindədir. Oykonim *İbrahim* (ş a.) və *kənd* komponentlərindən düzəlib, "İbrahimə məxsus kənd" mənasındadır.

**İçəri Muşlan** *oyk.*, *mür.* Zəngilan r-nunun Zəngilan i ə v -də kənd. Oxçu çayının sahilində, dağətəyi ərazidədir. Keçmiş adı Muşlan olmuşdur. Yaşayış məntəqəsini Türkiyənin *Muş* əyalətindən köçüb gəlmiş ailələr saldığına görə belə adlandırılmışdır. Bu kənddən çıxmış ailələr Oxçu çayının sağ sahilində Qıraq Muşlan kəndini saldıqdan sonra buraya İçəri Muşlan, yəni "əsas, iç Muşlan" deyilmişdir.

**İdrisqışlaq** *oyk.*, *mür.* Quba r-nunun Vəlvələ i ə v -də kənd. Qusar maili düzənliyindədir. Yaşayış məntəqəsi XIX əsrdə Quba qəzasındakı *İdrisi* kəndindən çıxmış ailələrin həmin kəndə məxsus qışlaq yerində məskunlaşması nəticəsində yaranmışdır. Oykonim "İdrisi kəndinə məxsus qışlaq" mənasındadır.

**İdrisoba** *oyk.*, *mür.* Xaçmaz r-nunun Köhnə Xudat i ə v -də kənd. Qusar maili düzənliyindədir. Yaşayış məntəqəsi keçmişdə Qırız kəndindən olan İdris adlı şəxsin obası olmuş, sonralar daimi yaşayış məntəqəsinə çevrilmişdir. Oykonim "İdrisə məxsus oba" mənasındadır.

**İgahçayı** b a x. Allı.

**İki qardaş** *or.*, *mür.* Xəzərdə ada. Siyəzən r-nu ərazisində Beşbarmaq dağı ilə üzbəüz, dənizin ortasında yanaşı görünən iki qayadan ibarətdir. Mütəxəssislərin məlumatına görə, bu qaya parçaları dənizin dibində bir kökə bağlıdır. Ona görə də iki qardaş adını almışdır.

**2 №-li Mayak** *oyk.*, *mür.* Neftçala r-nunun Bankə qəsəbə i ə v -də qəsəbə. Düzənlikdədir. Əsli İkinci mayak qəsəbəsidir. Yaşayış məntəqəsi 2 №-li Mayak vətəgəsi yanında salındığına görə belə adlandırılmışdır.

**İkinci Ağalı** *oyk.*, *mür.* Zəngilan r-nunun Ağalı i ə v -də kənd. Həkəri çayının sahilində, dağətəyi düzənlikdədir. Keçmiş adı Hüseynxanlı olmuşdur. Yerli əhali arasında Orta Ağalı da adlanır. Oykonimin birinci komponenti r-nun ərazisindəki Ağalı adlanan üç yaşayış məntəqəsini bir-birindən fərqləndirməyə xidmət edir.

**İkinci Alxasova** b a x. Alxasova.

**İkinci Alıbəyli** *oyk.*, *mür.* Zəngilan r-nunun Alıbəyli i ə v -də kənd. Həkəri çayının

landırmək üçün İkinci Zabrat adlandırılmışdır.

**İqal-Kit** *hidr., mür.* Ordubad r-nu ərazisində çay. Hidronim, qəd. türk dillərinin materiallarına görə, "silib aparan" kimi izah olunur. Güman ki, bu ad çayın tez-tez daşaraq ətrafı dağıtması ilə əlaqədar verilmişdir.

**İqnati daşı** *or., mür.* Bakı arxipelaqının adalarından biri. Səngi-Muğan adasından c.-ş.-də yerləşir. Oronim Xəzəri tədqiq edən rus dənizçiləri tərəfindən müqəddəs İqnatinin şərəfinə adlandırılmışdır.

**İqəndunax** *hidr., mür.* Laçın r-nu ərazisində çay. Hidronim ərazideki Ağbulaqçay su hövzəsinin kürd dilinə tərcümə olunmuş adıdır.

**İqrığ** *oyk., sadə.* Quba r-nunun Alekseyevka i.ə.v.-də kənd. Düzənlikdədir. Oykonimi tədqiqatçıların bir qismi qəd. türk dillərində "düşərgə, dayanacaq yeri" mənasında işlənən *uqruq* sözü ilə, başqa bir qismi isə qəd. türk tayfalarından biri olan *iqrak/uqrak* tayfasının adı ilə əlaqələndirir.

**İlanca** *or., düz.* Şəmkir r-nu ərazisində dağ. Oronimin əsli İlanlıcadır. Dağın adı "ilan çox olan" mənasındadır.

**İlandağ** *or., mür.* 1. Culfa r-nu ərazisində dağ. Hün. 2412 m. Qədim adı Saltağ olmuşdur. Bu ad onun dörd tərəfdən sıldırım sal qayadan ibarət olması ilə əlaqədardır. Zirvəsi haça olduğuna görə Haçadağ, bəzi ədəbiyyatlarda isə İlanlıdağ adlanır; 2. Kəlbəcər r-nu ərazisində dağ. Ağcakənd kəndindən c.-da yerləşir. Hün. 2467 m. Dağlarda tez-tez görünən ilanlara görə dağlar belə adlandırılmışdır. Oronimlərin *ilanlı* tayfa adı ilə bağlı olması da istisna deyil.

**İlanlı** *oyk., sadə.* Qobustan r-nunun Dərəkənd i.ə.v.-də kənd. Dağətəyi ərazidədir. Tədqiqatçıların ehtimalına görə, oykonim türkdilli *ilanlı* tayfasının adı ilə bağlıdır. Türkmənlərin ərsarı tayfasının bir qolu da *ilanlar* adlanır. Belə güman etmək olar ki, həmin tayfanın totemi ilan olduğu üçün bu adı daşımışdır. Eyniadlı yaşayış məntəqələri Cənubi Sibirdə, Səmərqənd vilayətində və Ermənistanda da qeydə alınmışdır.

**İlanlı** *or., sadə.* Füzuli r-nu ərazisində dağ. Dağın adının etnotoponim olduğu güman edilir.

**İldərəsiçay** *hidr., mür.* İsmayıllı r-nu ərazisində çay. Çay öz adını eyniadlı dərədən almışdır. Dərə isə buradakı isti sulu mın bulaqlar olduğu üçün belə adlandırılmışdır. Türk dillərində ili "ılıq", "isti" deməkdir.

**İldırım** *or., sadə.* Laçın r-nu ərazisində, Mıxtökən silsiləsində zirvədir. Yerli əhali tərəfindən formasına görə Yeddibölük də adlanır. Dağ burada tez-tez ildırım çaxması ilə əlaqədar belə adlandırılmışdır.

**İldırımsu** *hidr., mür.* Laçın r-nu ərazisində çay. Hocazsu çayının sağ qoludur. Dar dərələrdən axır. Başlanğıcını İldırım dağından aldığı üçün belə adlandırılmışdır.

**İldırımvurandağ** *or., mür.* Kəlbəcər r-nu ərazisində dağ. Dağın üzərində tez-tez ildırım çaxdığından dağ belə adlandırılmışdır.

**İləcə** *hidr., düz.* Lerik r-nu ərazisində çay. Gəncəvü çayının qoludur. Çay axdığı İlə dərəsinin adı ilə İldərəçayı da adlanır. Hidronim qəd. türk dillərindəki *iləcə* (aydın, şəffaf, çox təmiz) sözündən olub, "şəffaf sulu çay" mənasını ifadə edir.

**İlxıçı** *or., sadə.* Şamaxı r-nu ərazisində dağ. Pirsaat çayının sol sahilindədir. Hün. 673 m. Dağ keçmişdə Şamaxı qəzasında maldarlıqla məşğul olmuş *ilxıçı* tayfasına məxsus yaylaq yurdu olduğu üçün belə adlandırılmışdır.

**İlxıçı** *oyk., sadə.* 1. Ağsu r-nunun Qaraqoyunlu i.ə.v.-də kənd. Şirvan düzündədir. Keçmiş adı İlxıçı Əlicanlı olmuşdur. Yaşayış məntəqəsi şahsevən tayfa birliyinə daxil olan *ilxıçıların* bir qrupuna başçılıq edən Əlican adlı şəxs tərəfindən salındığı üçün belə adlandırılmışdır; 2. Xaçmaz r-nunun Qələqan i.ə.v.-də kənd. Samur-Dəvəçi ovalığındadır. Kəndin keçmiş adı İlxıçı Həsən Əfəndi olmuşdur. Quba xanları tərəfindən xanlığın qazısı Həsən Əfəndiyə bağışlanmış və vergilərdən azad edilmiş *ilxıçı* tayfasının məskunlaşdığı kənd olmuşdur. Sonralar oykonimin tərkibindəki Həsən Əfəndi komponenti atılmışdır; 3. Xaçmaz r-nunun Niyazabad i.ə.v.-də kənd. Samur-Dəvəçi ovalığındadır. Kəndin keçmiş adı Məmmədxan İlxıçı olmuşdur. Məmmədxan həmin kənddə məskunlaşmış *ilxıçı* tayfasına mənsub ailələrin başçısının adı olmuşdur.





**İlxıçılar** *oyk., sadə.* 1. Ağdam r-nunun Güllücə i.ə.v.-də kənd. Dağətəyi ərazidədir; 2. Tərtər r-nunun Azad Qaraqoyunlu i.ə.v.-də kənd. Dağətəyi ərazidədir. Yaşayış məntəqələri *ilxıçılar* tayfasının məskunlaşması nəticəsində yarandığından belə adlandırılmışdır.

**İlxıdaş** *or., mür.* Sumqayıt şəhəri ərazisində dağ. Sumqayıt çayının sol sahilində yerləşir. Hün. 336 m. Dağ bu ərazidə bir zamanlar at ilxıları saxlandığı üçün belə adlandırılmışdır.

**İlxıdərə** *hidr., sadə.* Xanlar r-nu ərazisində çay. Kürəkçayın sağ qoludur. Çay axdığı İlxıdərənin adı ilə adlandırılmışdır. İlxıdərə bir zamanlar Gəncə xanlığına məxsus at ilxılarının saxlandığı yer olmuşdur.

**İlxısu** *hidr., mür.* Laçın r-nu ərazisində Minkənd mın bulaqlarının digər adıdır. Tədqiqatçılar bu hidronimi İlıqsu adının təhrif olunmuş forması hesab edirlər.

**İlis** *hidr., sadə.* Xocalı r-nu ərazisində çay. Qarqar çayının hövzəsindəki iki kiçik dağ çayının qovuşaraq birgə axdığı çayın adıdır. Qəd. türk dillərində *ilis/iliş* "bir-birinə sarılmaq, görüşmək" mənasında işlənmişdir.

**İlis** *oyk., sadə.* Xocalı r-nunun Almalı i.ə.v.-də kənd. Qarabağ silsiləsindədir. Yaşayış məntəqəsi XIX əsrdə Cənubi Azərb.-nın Qaradağ mahalından köçüb gəlmiş erməni ailələrinin İlis adlı yerdə məskunlaşması nəticəsində yaranmışdır. İlis Qarqar çayı hövzəsindəki iki çayın qovuşduğu yerin adıdır. Bu yerdən başlanan çay da eyni adı daşıyır. 1992-ci ildən kəndin adı Qarakötük kimi rəsmiləşdirilmişdir.

**İlisu** *or., sadə.* Qax r-nu ərazisində dağ. Dağın adı yaxınlığındakı kəndin adından alınmışdır.

**İlisu** *hidr., mür.* Qax r-nu ərazisində mın bulaqlar. İlisu kəndindən 5 km ş.-də Hamamçay dərəsində Moxbulaq, Oğlanbulaq və Qızbulaq adlı hərarətləri 30 dərəcəyə çatan kükürdlü 3 isti bulaqdır. Bu bulaqların suyu birləşərək Hamamsu çayını əmələ gətirir. Qədimdən qadınların (Qızbulaq) və kişilərin (Oğlanbulaq) yel xəstəliyindən müalicə olunduğu yerdir. Hidronim qıpçaq sözü olan *ili* (isti) və *su* sözlərindən düzəlib, "isti su" deməkdir. Türk dillərində *ilisu* həm də "yel suyu" mənasındadır.

**İlisu** *oyk., sadə.* Qax r-nunun eyniadlı i.ə.v.-də kənd. Kürmük çayının sahilində, Baş Qafqaz silsiləsinin c. yamacındadır. Azərb.-nın qəd. yaşayış məntəqələrindən olan bu kənd bir zamanlar Dağıstanın Saxur r-nundan köçüb gəlmiş saxurların və yerli azərb.-ların İlisu adlı yerdə məskunlaşması nəticəsində yaranmışdır. 1562-ci ildə Səfəvi hökmdarı I Təhmasibin (1524–76) fərmanı ilə İlisu sultanı hüququ alan Saxur bəyləri XVII əsrdən sultanlığın mərkəzini İlisuya köçürmüşdülər. Yaşayış məntəqəsi buradakı İlisu bulaqlarının adı ilə adlandırılmışdır.

**İliç** b a x Şərur

**İliç buxtası** *or., mür.* Xəzər hövzəsindədir. Keçmiş adı Bibiheybət buxtası olmuşdur. Bu ərazidə neft istismarına hələ inqilabdan əvvəl təşəbbüs göstərilmişdi. Sovet dövründə buxta primitiv əl üsulu ilə torpaqla doldurulmuşdu. 1923-cü ilin aprelində burada ilk neft quyusu fontan vurmuşdu. Bolşeviklərin təşəbbüsü ilə buxta V. İ. Leninin şərəfinə adlandırılmışdı. Memorial toponimdir. *Buxta* kiçik körfəzdir.

**İliç portu** b a x Port İliç

**İlyaslılar** b a x Elyaslılar

**İmambağı** *oyk., sadə.* Cəbrayıl r-nunun Cəbrayıl qəsəbə i.ə.v.-də kənd. Qarabağ silsiləsinin ətəyindədir. İmanbağı şəklində də işlənir. Yaşayış məntəqəsini keçmiş Mirzəcanlı kəndindən köçmüş ailələr *İmamqulubəy* adlı şəxsə məxsus İmambağı adlanan ərazidə saldıqları üçün belə adlandırılmışdır.

**İmambinəsi** *oyk., mür.* Kəlbəcər r-nunun Orta Qaraçanlı i.ə.v.-də kənd. Dağətəyi ərazidədir. Əslı İmanbinəsidir. Yaşayış məntəqəsi *İman* adlı şəxsə məxsus binə yerində salındığına görə belə adlandırılmışdır. 1961-ci ildən kənd yerini dəyişərək Tərtər çayının sahilindəki Əhmədoğlunun şamı deyilən yerə köçmüşdür. Ona görə də kənd yerli əhali arasında Əhmədoğlunun şamı da adlanır.

**İmamqulubəyli** *oyk., sadə.* 1. Ağcabədi r-nunun Hindarx i.ə.v.-də kənd. Qarabağ düzündədir; 2. Ağdam r-nunun Quzanlı i.ə.v.-də kənd. Qarabağ düzündədir; 3. Bərdə r-nunun Yeni Daşkənd i.ə.v.-də kənd. Qarabağ düzündədir. XIX əsrin əvvəllərində 104 ailədən ibarət olan qurudolaq tayfasına mənsub ailələr

indiki Ağdam r-nu ərazisində məskunlaşmışdı Çar hökuməti həmin ailələrin idarəsini 5 il ərzində *İmamqulu bəyə* vermişdi Bundan sonra İmamqulubəyli adlanan həmin qaradolaq ailələri sonralar müxtəlif yerlərdə məskunlaşaraq bir neçə eyniadlı kənd yaratmışdılar

**İmamquluçay** *hidr mür* Şahbuz r-nu ərazisində çay Hidronim *imamqulular* nəslinin adı ilə bağlı olub, etnotoponimdir

**İmamqulukənd** *oyk. mür* Qusar r-nunun eyniadlı i ə v -də kənd Qusar maili düzənliyindədir. Yaşayış məntəqəsini *İmamqulu* adlı şəxs saldığı üçün belə adlandırılmışdır Eyniadlı çay Xaçmaz r-nundan axıb Xəzər dənizinə tökülür Oykonim və hidronim İmanqulukənd variantında da qeydə alınmışdır

**İmamqulular** *oyk., sadə* Şuşa r-nunun Şırlan i ə v -də kənd Dağətəyi ərazidədir Yaşayış məntəqəsi *imamqulular* nəslinin məskunlaşması nəticəsində yaranmışdır Həmin ərazidə bu nəslin adı ilə bağlı olan meşə və mın bulaq da var

**İmamlı** *oyk. sadə* Qəbələ r-nunun Mırzəbəyli i ə v -də kənd Alazan-Əyriçay çökəkliyindədir Yaşayış məntəqəsini *imamlı* nəslinə mənsub ailələr saldığı üçün belə adlandırılmışdır

**İmamverdili** *oyk. sadə* Beyləqan r-nunun Bünyadlı i ə v -də kənd. Mil düzündədir Keçən əsrin 90-cı illərinədək r-nun ərazisində Birinci və İkinci İmamverdili adı ilə iki kənd olmuşdur 1991-ci ildən İkinci İmamverdili kəndi Qaralılar adı ilə rəsmiləşdirildikdən sonra Birinci İmamverdili kəndi də İmamverdili adlandırılmışdı Yaşayış məntəqələri *imamverdili* nəslinə mənsub ailələrin məskunlaşması nəticəsində yaranmışdır

**İmanlar** *oyk , sadə* Laçın r-nunun Şəlvə i ə v -də kənd. Dağətəyi ərazidədir Kəndin adı orada məskunlaşmış *imanlar* nəslinin adı ilə bağlıdır

**İmanlı** *oyk. sadə* Masallı r-nunun Çaxırlı i ə v -də kənd Dağətəyi düzənlikdədir Keçmişdə Talış-Lənkəran zonasında maldarlıqla məşğul olmuş *pirəmbəl* (pirımbəl) tayfasının beşinci qoluna məxsus altı ailənin başçısı *Kərbəlayı İman xan* adlı şəxs olmuşdur XIX əsrdə həmin ailələrin oturaqlaşması nəticəsində yaranmış kənd də bu ailələrin mənsub olduğu qolun adı ilə *imanlı* (Kərbəlayı İmanın adından) adlandırılmışdır.

**İmarət Qərvənd** *oyk., mür* Kəlbəcər r-nunun eyniadlı i ə v -də kənd Ağdaban çayının sahilində, Murovdağ silsiləsinin ətəyindədir Kəndi Qarabağda yaşamış *qarvənd* tayfasına mənsub ailələr salmışlar Oykonimin birinci komponenti *imarət* (vaxtilə burada mövcud olmuş mülkə işarədir) sözü yaşayış məntəqəsini eyniadlı digər kəndlərdən fərqləndirmək üçün artırılmışdır

**İmdərəçay** *hidr , mür* Lerik r-nu ərazisində çay. Hidronim *İmdərə* (çayın axdığı dərənin adı) və *çay* komponentlərindən düzəlib, çayın axdığı dərənin adını daşıyır Qəd türk dillərində *im* "xalq təbabətinə aid dərman, türkəçarə, təbii dərman" mənasında işlənir Görünür, bu dərədə müalicəvi otlar, bitkilər yetişdiyindən dərə belə adlandırılmışdır

**İmirli** *oyk., sadə* Bərdə r-nunun Xanərəb i ə v -də kənd Qarabağ düzündədir Əmirlı variantında da qeydə alınmışdır. Yaşayış məntəqəsi 1948-ci ildə dağıdılmışdı 1951-52-ci illərdə Ermənistandan qanunsuz olaraq köçürülmüş azərb ailələri orada məskunlaşdıqdan sonra dağılmış kəndin adı yeni yaşayış məntəqəsinə verilmişdi. *İmirli* əfşar tayfasının bir qolu olan *eymurların* adının yerli tələffüzə uyğunlaşmış formasıdır

**İmişli** *oyk. sadə* 1 Azərb -da inzibati r-n Kür-Araz ovalığının c hissəsində, Mil və Muğan düzlərində yerləşir R-nun ərazisi hamar ovalıq olub, əsasən Arazın çöküntülərindən əmələ gəlmişdir R-nun ərazisindən Araz çayı keçir Keçmiş adı Qaradonlu olmuşdur Mərkəzi İmişli şəhəridir; 2 Azərb -da şəhər, eyniadlı inzibati r-nun mərkəzi Araz çayının sahilində, Mil düzündədir Şəhər d y stansiyası əsasında yaranmışdır. Stansiya isə XIX əsrin ortalarında yaxınlıqdakı İmişli obasının adı ilə adlanmışdır 1938-ci ildə r-n mərkəzinin Qaradonludan İmişliyə köçürülməsi ilə əlaqədar yaşayış məntəqəsi ətraf kəndlərdən köçüb gəlmiş ailələr hesabına böyümüş, əvvəlcə qəsəbə , sonra isə şəhər olmuşdur R-n və şəhər türkmənşəli *imişli* tayfasının adını daşıyır





**İncə** *oyk , sadə* 1 Göyçay r-nunun eyniadlı i ə v -də kənd. Şirvan düzündədir; 2. Şəki r-nunun eyniadlı i ə v -də kənd Baş Qafqaz silsiləsinin ətəyindədir Yaşayış məntəqələri qıpçaqların əncə tayfa adı ilə bağlıdır

**İncəçay** *hidr , mür* 1 Cəbrayıl r-nu ərazisində çay Arazın sol qoludur Mənbəyini Qarabağ silsiləsinin c qurtaracağından (1370 m yüksəklikdən) alır; 2 Cəlilabad r-nu ərazisində çay Mənbəyini Alaşar-Burovar silsiləsindən (600 m yüksəklikdən) alır, Kirov körfəzinin çiyilliklərində itir Yayda quruyur; 3 Tərtər və Yevlax r-nları ərazisində çay Mənbəyini Murovdağ silsiləsinin ş. yamacından (2580 m yüksəklikdən) alır Yuxarı axarında dərin dar dərələrdən axır Kür çayına çatmır Çayın üstündə Gülüstan kəndi yaxınlığında kiçik SES tikilmişdir Hidronimlərin qıpçaqların *əncə* tayfa adından yarandığı güman edilir

**İncəgöl** *or , mür* Cəbrayıl r-nu ərazisində, Kiçik Qafqazın c -ş ətəyində düz Gəyan çölünün q hissəsini təşkil edir Düz İncəçayın (Arazın qolu) sahili boyunca uzandığı üçün belə adlandırılmışdır

**İncədağ** *or , mür* Şəki r-nu ərazisində dağ Baş Qafqaz silsiləsinin c yamacında, Şin və Kış çaylarının suayrıcında yerləşir Hün 1750 m. Oronim *incə/əncə* (etn ) və *dağ* komponentlərindən düzəlib, etnotoponimdir

**İncəqol** *hidr , mür* Cəbrayıl r-nu ərazisində çay İncə çayının qoludur Hidronim *İncə* (çay adı) və *qol* (çay qolu) komponentlərindən düzəlib, "İncə çayının qolu" mənasındadır

**İncəsu** *hidr , mür* Qazax r-nu ərazisində çay Kürün sağ qoludur İkinci Şıxlı kəndi yaxınlığında Kürlə birləşir Çay axdığı İncə dərəsinin adı ilə adlandırılmışdır Yerli əhalinin məlumatına görə, çaya bu ad dayaz, xırda olmasına və yay aylarında qurumasına görə verilmişdir Tədqiqatçılar isə İncə dərəsinin adını qədimdən burada məskunlaşmış qıpçaqların *əncə* tayfası ilə bağlayırlar

**İncilli** *oyk., sadə* Cəlilabad r-nunun Xəlilli i ə v -də kənd Qarabalaca çayının sahilində, Burovar silsiləsinin ətəyindədir Keçmiş adı Hüseyn Əncəlu olmuşdur Yaşayış məntəqəsini XIX əsrdə Cənubi Azərb -dan çöllük tarlalarında muzdla işləməyə gəlmiş mənşəcə qıpçaqların *əncə* tayfasına mənsub ailələr salmışdılar Bu ailələrin başçısı isə Hüseyn adlı şəxs olmuşdur

**İncir** *oyk., sadə* Bakı şəhəri Əzizbəyov r-nu ərazisində, Bakı-Mərdəkan elektrik d y xəttində stansiya Abşeron yarımadasındadır Əsli *Əncirlikdir* Ərazıdəki encir bağlarının çoxluğuna görə stansiya belə adlandırılmışdır

**İnəkboğan** *oyk , sadə* Gədəbəy r-nunun eyniadlı i ə v -də kənd Şahdağ silsiləsinin ətəyindədir Yaşayış məntəqəsi həmin ərazidən axan eyniadlı çayın adını daşıyır

**İnəkboğançay** *hidr mür* Gədəbəy r-nu ərazisində çay Zəyəm çayının qoludur Yerli əhalinin məlumatına görə, çaya ad keçmişdə daşqın zamanı çayın naxırı aparması və inəklərin boğulması hadisəsi ilə bağlı verilmişdir

**İnəkçay** *hidr , mür* Laçın r-nu ərazisində çay Çay öz başlanğıcını İnəkdağ zirvəsindən aldığı üçün belə adlandırılmışdır

**İnəkdağ** *or , mür* Kəlbəcər r-nu ərazisində dağ Ağcakənddən c -dadır İlandağ da adlanır Dağ ərazidəki İnək qayası adlı oroqrafik obyektin adını daşıyır Çox güman ki, dağın ərazisi inəklər üçün otlaq yeri olduğundan bu adı almışdır

**İngiloy Kötüklü** *oyk. mür* Qax r-nunun Əlibəyli i ə v -də kənd. Alazan-Əyriçay çökəkliyindədir Keçmişdə r-nun ərazisində Kötüklü adlı üç kənd olmuşdur İngiloy Kötüklü, Ləkit Kötüklü və Əli Sultan Kötüklüsü Kötüklü komponenti Azərb -nın şm bölgəsində və Qarabağda yayılmış qəd türk mənşəli *kötük/kötək/kətük* tayfa adı ilə bağlıdır *İngiloy* isə Azərb -nın şm -q zonasında yaşayan və gürcü dilində danışan etnik qrupun adıdır Əsl adı *yeni geloy* olan bu etnik qrup keçmişdə xristian olmuş, XVIII əsrdə islam dinini qəbul etmişdir Tədqiqatçıların görə, geloylar I əsrdən Albaniyada məlum olan *gel* tayfasının varisləri gəsab olunurlar Geloyların yaşadığı ərazi erkən orta əsr mənbələrində Gelavu kimi qeydə alınıb Hazırda azərb -lar ingiloyları *geloy*, saxurlar *gelavu* avarlar isə *gelovu* adlandırırlar

**İnlidağ** *or mür* Goranboy r-nu ərazisində dağ Oronim *in* (türk dillərində "yarğan", "mağara", "heyvan yuvası") və *dağ* sözlərin-

dən düzəlib (burada *-li* mənsubluq bildirir). "mağaralı dağ, mağarası olan dağ" mənasındadır

**İnilli** *oyk., sadə* Cəlilabad r-nunun Şiləvəngə i.ə.v.-də kənd. Ovalıqdadır. Əsli İnallıdır. XII–XIII əsrlərdə oğuz tayfalarından biri kimi adı çəkilən *inallılar* Səlcuq hökmdarı İbrahim İnalın (XII əsr) nəsli hesab edilir. Orta əsrlərdə Cənubi Azərb. ərazisində yaşayan inallılar XVII əsrdə şahsevənlərin dəmirçili qolunun tərkibinə daxil olmuşlar. XIX əsrdə Lənkəran qəzasında 12 ailədən ibarət bir el olan inallılar, görünür, bu yaşayış məntəqəsində məskunlaşmışlar

**İnjenertəpə** *or., mür.* Cəlilabad r-nu ərazisində Alaşar-Burovar silsiləsinin şm.-q. qurtaracağında zirvə. Bolqarçayın sağ sahilindədir. Hün. 625 m. Oronim dağda mühəndislərin apardıqları geoloji axtarışlara görə belə adlandırılmışdır

**İnstitut** *oyk., sadə* Samux r-nunun Çoban Abdallı i.ə.v.-də fəhlə qəsəbəsi. Gəncə çayının sahilində, Gəncə-Qazax düzənliyindədir. Yaşayış məntəqəsi Azərbaycan Elmi-Tədqiqat Pambıqçılıq İnstitutunun və Zaqafqaziya Maşın-Sınaq Stansiyasının birləşmiş qəsəbələrindən ibarət olub, 1964-cü ildən ərazisindəki elmi-tədqiqat institutunun adı ilə adlandırılmışdır

**İolada** *hidr., mür.* Lerik r-nu ərazisində çay. Hidronim *io* (türk dillərində "təmiz su, bulaq suyu, mənbə") və *lada/loda* (talış "arıq") komponentlərindən düzəlib, "arıq su" mənasındadır.

**İori** b a x. Qabırrı çayı

**İori** *or., sadə* Xanlar r-nu ərazisində dağ. Oronim eyniadlı çayın adından yaranmışdır

**İranlı Bankəsi** *or., mür.* Xəzərdə dayazlıq. Qonşu İran İslam Respublikasının adından yaranmışdır

**İrçan** *oyk., sadə* Laçın r-nunun Köhnəkənd i.ə.v.-də kənd. Dağlıq ərazidədir. Oykonim *arçan* (ardıc ağacı) sözündən olub, "ardıclı yer" mənasındadır. Türk dillərində ardıc ağacına "arça" da deyilir. Türkdilli xalqların toponimiyasında Arçan toponimi geniş areala malikdir

**İrmaşlı** *oyk., sadə* Şəmkir r-nunun eyniadlı i.ə.v.-də kənd. Dağətəyi ərazidədir. Kəndin ərazisi *irmaşlı* tayfasına mənsub olduğundan həmin tayfanın adını daşıyırdı. XIX əsrdə burada yerləşən alman ailələri onu Enğenfeld, 1930-cu illərdə isə Engelskənd adlandırmışdılar. 1992-ci ildən kəndin əvvəlki adı bərpa olunmuşdur

**İsə bulağı** *hidr., mür.* Şuşa r-nu ərazisində bulaq. Şuşa şəhərindən 2 km. aralı, dəniz səviyyəsindən təqr. 1500 m. hündürlükdə, meşədədir. Azərb. təbiətinin incilərindən sayılır. Yerli əhalinin məlumatına görə, bulaq XVIII əsrdə ilk dəfə onu qalın meşəlikdə üzə çıxarmış *İsa* adlı biçinçinin adını daşıyır

**İsakənd** *oyk., mür.* Tovuz r-nunun Qəribli i.ə.v.-də kənd. Zəyəm çayının sahilində, Kiçik Qafqazın yamacındadır. Oykonim *İsa* (ş.a.) və *kənd* komponentlərindən düzəlib, "İsanın kəndi" mənasındadır. Yerli əhali kəndi qeyri-rəsmi olaraq Aşağı və Yuxarı İsakənd adı ilə adlandırır

**İsaqbağı** *hidr., sadə* Zərdab və Ağcabədi r-nlarının ərazisində göl. Su hövzəsi adını ərazidəki eyniadlı yaşayış məntəqəsindən almışdır

**İsaqbağı** *oyk., sadə.* Zərdab r-nunun eyniadlı i.ə.v.-də kənd. Kür çayının sahilində, Şirvan düzündədir. Yaşayış məntəqəsi Kür çayı sahilində yerləşən çəkilliyin (cır tut bağı) *İsaq* adlı şəxsə məxsus hissəsində yerləşdiyi üçün belə adlandırılmışdır. İsabağı variantında da qeydə alınmışdır

**İsaqlı** *oyk., sadə* Cəbrayıl r-nunun Havuslu i.ə.v.-də kənd. Düzənlikdədir. Yaşayış məntəqəsi Ermənistanın Destəkert kəndinin zəlzələ nəticəsində dağılmasından sonra (1931-ci il) əhalinin köçüb gəlməsi nəticəsində yaranmışdır. Kənd XIX əsrdə Zəngəzur qəzasında yaşayan *xocaisaqlı* tayfasına mənsub olan *İsaqlı qışlağında* salındığı üçün qışlağın adı ilə adlandırılmışdır

**İsaqlıgirmə** *oyk., sadə* Balakən r-nunun Şambul i.ə.v.-də kənd. Alazan-Əyriçay çökəkliyindədir. İsaqlıgörmə variantında da qeydə alınmışdır. Yerli əhalinin məlumatına görə, vaxtilə kəndin ərazisində Mazım çayının keçidi (yerli əhali çay keçidini *girmə* adlandırır) yaxınlığında *İsaq* adlı şəxsin binəsi olmuş və keçid də onun adı ilə İsaqlıgirmə adlanmışdır. Sonralar burada salınan kənd də həmin adı qəbul etmişdir







**İsalar** *oyk., sadə.* Ağdam r-nunun Əfətli i.ə.v.-də kənd. Qarabağ düzündədir. Kənd *isalar* nəslinə mənsub ailələr tərəfindən məskunlaşdığı üçün belə adlandırılmışdır

**İsalı** *oyk., sadə* Gədəbəy r-nunun eyniadlı i.ə.v.-də kənd. Axınca çayının sahilində, Şahdağ silsiləsinin ətəyindədir. Yerli əhalinin məlumatına görə, XIX əsrin ortalarında Qazax qəzasının Qıraq Salahlı kəndindən *İsa* adlı şəxs bir qrup ailə ilə birlikdə Gədəbəyə qaçmış və Qızıltorpaq adlı yerdə məskunlaşmışdı. Bir qədər sonra oraya köçürülən ruslar Saratovka və İvanovka kəndlərini yaratdılar. İsa isə öz övladları ilə oranı tərk edərək indiki kəndin ərazisində məskunlaşmış və yeni yaranmış yaşayış məntəqəsi də onun adı ilə adlandırılmışdı. Kəndin əhalisinin böyük əksəriyyəti İsanın oğullarının nəsilləridir

**İsgəndərbəyli** *oyk., sadə* Zəngilan r-nunun eyniadlı i.ə.v.-də kənd. Dağətəyi ərazidədir. Keçmiş adı Dəmirçilər olmuşdur. Yaşayış məntəqəsi dəmirçilər nəslinin məskunlaşması nəticəsində yaranmışdır. *İsgəndərbəy* kənddə məskunlaşmış dəmirçilərin başçısı olmuşdur. Kənd sonralar onun adı ilə adlandırılmışdır

**İsi** *oyk., sadə.* Masallı r-nunun Qodman i.ə.v.-də kənd. Viləş çayının sahilində, Lənkəran ovalığındadır. Keçmiş adı *İsibəy* olmuşdur. Yaşayış məntəqəsi İsibəyə məxsus ailələrin məskunlaşması nəticəsində yaranmışdır. Yerli əhali tərəfindən Bəykəndi də adlanırdı. Sovet hakimiyyəti illərində oykonimin tərkibindəki "bəy" sözü atılmışdır

**İstilikçay** *hidr., mür.* Ağsu r-nu ərazisində çay. Əsli İstilikçay olmalıdır. Hidronim *istili* (kiçik qol) və *çay* komponentlərindən düzəlib (-lik burada çoxluq bildirir), "çoxlu kiçik qolları olan çay" mənasındadır

**İskəndərli** *oyk., sadə* Şəmkir r-nunun Təzəkənd i.ə.v.-də kənd. Gəncə-Qazax düzənliyindədir. İnqilabdan əvvəl Cənubi Azərb.-nın Qaradağ və Məşkin əyalətindən gələrək ətraf kəndlərdə rəncbərlik edən əhaliyə 1925-ci ildə kənd salmaq üçün mülkədar Qasımın yeri adlanan ərazidə torpaq sahəsi verilmişdi. Yaşayış məntəqəsi Sovet hakimiyyəti illərində V.İ.Leninin şərəfinə Leninabad adlanırdı. 1994-cü ildən kəndin adı İskəndərli kimi rəsmiləşdirilmişdir

**İskət** *or., sadə* Xocalı r-nu ərazisində dağ. Oronim türk dillərindəki *iskit* (fit, fit çalan) sözünün yerli tələffüz variantı olub, Fitdağ (İsmayıllı r-nu) oroniminin sinonimidir

**İslamdağ** *or., mür.* Sumqayıt şəhəri ərazisində dağ. Pirəkəşkül kəndindən q.-də yerləşir. Hün. 317 m. Oronim *İslam* (ş.a.) və *dağ* komponentlərindən düzəlib. Çox güman ki, dağın ərazisi İslam adlı şəxsə məxsus otlaq yeri olmuşdur

**İsmayılabad** *oyk., mür.* Yevlax r-nunun Nemətabad i.ə.v.-də kənd. Qarabağ düzündədir. Yaşayış məntəqəsini 1918-ci ildə Ermənistanın Ozan, Veri, Toxaçar kəndlərindən milli qırğın zamanı qaçıb gəlmiş və bir müddət Tovuz r-nunda yaşadıqdan sonra 1928-ci ildə indiki ərazidə məskunlaşmış azərb. ailələr salmışlar. Kənd vaxtilə oranın abadlaşmasında xidməti olmuş İsmayılın (Bərdə r-n sovetinin sədri) adı ilə adlandırılmışdır

**İsmayılbəy Qutqaşınlı gölü** *hidr., mür.* Qəbələ r-nu ərazisində göl. Göl Azərb. yazıçısı, general İsmayılbəy Qutqaşınlının (1806–69) adı ilə adlandırılmışdır. Memorial toponimdir

**İsmayılbəyli** *oyk., düz.* 1. Ağdam r-nunun Bağbanlar i.ə.v.-də kənd. Dağ ətəyindədir. Keçmiş adı Mərzili İsmayılbəy olmuşdur. Yaşayış məntəqəsi Cavanşir qəzasında yaşamış *mərzili* tayfasına mənsub ailələrin başçısı *İsmayıl bəyin* adı ilə adlandırılmışdır; 2. Tərtər r-nunun Evoğlu i.ə.v.-də kənd. Qarabağ düzündədir. Yaşayış məntəqəsini Laçın r-nunun Zerti kəndindən gəlmiş *İsmayıl bəy* adlı şəxs saldığı üçün onun adı ilə adlandırılmışdır. Kənddəki nəsillərdən biri hazırda zertilər adlanır. Sonralar ətrafdakı Daşarlı, İsgəndərbəyli və Sarvanlar kəndləri də bu kəndə birləşdirilmiş, kəndin ərazisini genişləndirmişlər

**İsmayıllı** *oyk., sadə* 1. Azərb.-da inzibati r-n. Baş Qafqaz sıra dağlarının c. yamacında yerləşir. Səthi dağlıqdır. Şm. hissəsi Baş Qafqazın suayrıcı xəttinə qədər (Babadağ 3632 m.) yüksəlir. R-nun ərazisindən Göyçay, Girdımançay, Əyriçay, Vəndam çayı və bir neçə xırda çay axır. Mərkəzi İsmayıllı şəhəridir; 2. Azərb.-da şəhər, eyniadlı r-nun mərkəzi. Böyük Qafqazın ətəyində, Əyri-

çayın üzərindədir; 3. İsmayıllı r-nunun Mican i.ə.v.-də kənd. Əyriçayın sahilindədir; 4. Kürdəmir r-nunun Qarasaqqal i.ə.v.-də kənd. Şirvan düzündədir; 5. Neftçala r-nunun Tatarməhlə i.ə.v.-də kənd. Şirvan düzündədir. Oykonim yaşayış məntəqələrinin əsasını qoymuş *ismayıllı* nəslinin adından yaranmışdır.

**İsmətli** *oyk., sadə*. Biləsuvar r-nunda kənd. Düzənlikdədir. Yaşayış məntəqəsini XIX əsrdə Rusiyadan köçürülmüş rus kəndliləri Konstantinovka adı ilə salmışdılar. 1992-ci ildən kəndə *İsmət Qayıbovun* şərəfinə İsmətli adı verilmişdir.

**İsnov** *oyk., sadə*. Quba r-nunun Zərqova i.ə.v.-də kənd. Dağətəyi düzənlikdədir. İstinov adının təhrif formasıdır. Kəndin ərazisində müalicə əhəmiyyətli çoxlu min. bulaq var. Keçmişdə bu bulaqların yaxınlığında müalicə üçün hovuzu əvəz edən novlar düzəldilirdi. Bunun üçün çala qazılır, içərisi daşla hörülürdü. Bulaqların suyu arxla bu novlara doldurulur, kənarda qızdırılmış daşlar oraya tökülürdü. Yel xəstəliyi olan adamlar həmin novlarda uzanırdılar. Tatlar belə novları *varov*, azərb.-lar isə *istinov* adlandırırdılar. Kənd belə novun yaxınlığında salındığına görə İstinov adlandırılmışdır.

**İsnovqışlaq** *oyk.*, Quba r-nunun Vəlvələ i.ə.v.-də kənd. Qusar maili düzənliyindədir. Oykonim *İsnov* (kənd adı) və *qışlaq* komponentlərindən düzəlmişdir, "İsnov kəndinin qışlağı" mənasındadır. Kənd əvvəllər İsnov kəndinə məxsus qışlaq yeri olmuş, sonralar daimi yaşayış məntəqəsinə çevrilmişdir.

**İspik** *or. sadə*. Quba r-nu ərazisində dağ. Baş Qafqaz silsiləsinin şm.-ş.-ində, Qudyalçay ilə Ağçayın suayrıcında yerləşir. Hün. 1101 m. Tədqiqatçıların ehtimalına görə, oronim türk dillərindəki *aspak* və ya *aspak* (aşırımlı dağ, keçidli dağ) sözünün fonetik variantıdır.

**İspik** *oyk., sadə*. Quba r-nunun Tüləkəran i.ə.v.-də kənd. Dağətəyi ərazidədir. Kəndin adı eyniadlı dağdan alınmışdır.

**İstibulaq** *oyk., sadə*. Kəlbəcər r-nunun Çaykənd i.ə.v.-də kənd. Dağətəyi ərazidədir. Yaşayış məntəqəsi qonşu Çaylı kəndindən köçmüş ailələrin İstibulaq adlı min. bulağın yaxınlığında məskunlaşması nəticəsində yaranmışdır. Bir məlumata görə, kəndin adı əvvəllər Üstübulaq olmuşdur.

**İstisu** *hidr., mür.* 1. Astara r-nu ərazisində müalicəvi min. bulaqlar. Astara ş.-dən 13 km aralıdır. Suyunun termik olması ilə əlaqədar belə adlandırılmışdır; 2. Astara r-nu ərazisində çay. Astara çayının sol qoludur. Çayın dərəsində min. bulaqlar vardır. İstisudərə çayı da adlanır; 3. İsmayıllı r-nu ərazisində çay. Qalacıq çayının qoludur. Çayın adı onun yuxarı axarı boyunda İstisu bulaqlarının olması ilə əlaqədardır; 4. Kəlbəcər r-nu ərazisində min. bulaqlar. Tərtər çayının hər iki sahilində yerləşir. Yuxarı və Aşağı İstisu bulaqlarına bölünür. Aşağı İstisu bulaqları çoxdebitli 8 bulaqdır. Suyunun dadı turşməzədir. İçmək və müalicə üçün istifadə edilir. Yuxarı İstisu bulaqları 23 bulaqdan ibarətdir. Müalicə və içmək üçün istifadə edilir. Ətrafında kurort salınmışdır. Salyan, Dəvəçi, Quba r-nlarında da eyniadlı termik min. bulaqlar var.

**İstisu** *oyk., sadə*. 1. İsmayıllı r-nunun Qalacıq i.ə.v.-də kənd. Dağətəyi ərazidədir. Qalacıq çayının qollarından biri olan İstisu çayının sahilində yerləşdiyinə görə belə adlandırılmışdır; 2. Kəlbəcər r-nunun eyniadlı qəsəbə i.ə.v.-də ştq.; balneoloji kurort. Qarabağ yaylasında, Tərtər çayının vadisində, 2100-2200 m yüksəklikdədir. Yaşayış məntəqəsinin adı buradakı İstisu min. bulaqlarının adı ilə bağlıdır. Min. bulaqlar isə 1139-cu ildə güclü zəlzələ zamanı yerin çatlaması nəticəsində əmələ gəlmişdir.

**İşğınçay** *hidr., mür.* Dəvəçi r-nu ərazisində çay. Hidronim Azərb. dilindəki *uçqun* (tat. *işqın* formasında tələffüz edilir) və *çay* sözlərindən ibarət olub, "sahilləri uçqun çay, yarğanlı çay" mənasını bildirir.

**İşxan** *hidr., mür.* Xocavənd r-nunda çay. Quruçayın sol qoludur. Hidronimin *işğın* sözünün təhrif forması olduğu güman edilir.

**İşıqlı** *or., sadə*. Laçın r-nu ərazisində dağ. Qarabağ silsiləsinin ən hündür zirvələrindən biridir. Ermənistanla sərhəddə yerləşir. Hün. 2520 m. Tədqiqatçılara görə, dağın başının qarlı olması və qarın gün işığında parıldaması bu adın yaranmasına səbəb olmuşdur. Oronimi *şıxlı* nəslinin adı ilə də bağlayırlar.





**İşıqlı** *oyk., sadə*. 1. Qubadlı r-nunun Muradxanlı i.ə.v.-də kənd. Həkəri çayının sahilində, dağətəyi ərazidədir. Keçmiş adı Ciyciyi olmuşdur. Zəngilan r-nunda Ciyciyi dərəsi adlı yer də qeydə alınmışdır. Kənd sonralar Şeyx Şərif adlı şəxsin adı ilə *Şıxlı* adlanmış, sonralar tələffüzdə *İşıqlı* formasına düşmüşdür. 1937-ci ildə yaxınlığındakı Binədərəsi, Damlanıc və Narcaq kəndləri də bu kəndə birləşdirilmiş, kəndin ərazisi xeyli böyümüşdür. Kəndin ərazisindəki köhnə qəbiristanlıq hazırda Şeyx Şərif qəbiristanı adlanır; 2. Füzuli r-nunun Dədəli i.ə.v.-də kənd. Arazboyu düzənlikdədir. Oykonim *şıxlı* nəslinin adı ilə bağlıdır.

**İtbaşı** *or., sadə*. Cəlilabad r-nu ərazisində yüksəklik. Alaşar-Burovar silsiləsinin q. yamacındadır. Hün. 211 m. Yüksəkliyin başı it başına oxşadığına görə belə adlandırılmışdır.

**İtdişi** *or., sadə*. Xəzər dənizinin adalarından biridir. Vaxtilə burada aparılan ekspedisiya zamanı it kəllələri tapıldığı üçün belə adlandırılmışdır.

**İtitala** *oyk., mür.* Balakən r-nunun eyniadlı i.ə.v.-də kənd. Katex çayının sahilində, Alazan-Əyriçay çökəkliyindədir. Kəndə belə ad onun yerləşdiyi talanın iti bucağa oxşamasına görə verilmişdir. Yaşayış məntəqəsini Zaqatala r-nunun Əliabad kəndindən çıxmış ailələr salmışlar.

**İvanovka** *oyk., sadə*. İsmayıllı r-nunun eyniadlı i.ə.v.-də kənd. Acınohur ön dağlığındadır. Kənddə 1840-cı ildə çar hökumətinin Rusiyanın mərkəzi quberniyalarından köçürüb gətirdiyi müxtəlif dini təriqətlərə mənsub rus ailələri məskunlaşmışdılar. Yaşayış məntəqəsi köçürmə kampaniyasına başçılıq edən rus polkovniki P. N. İvanovun adını daşıyır.

**26 Bakı komissarı** *r-n*. b. a. x. Səbail.

**26 Bakı komissarı** *ştq.* b. a. x. Həsənabad.

**28 Aprel** b. a. x. Aran.

**İyirminci** b. a. x. Piran.

**İzmara** *oyk., düz.* Dəvəçi r-nunun Pirəbədil i.ə.v.-də kənd. Dağətəyi ərazidədir. Oykonim ərəb dilindəki *izmi* (sümüklər) və fars dilindəki *ara* (sakinləşmək) sözlərindən düzəlib, "sümüklülər sakin olduğu yer" mənasındadır. *Sümüklülər* və ya *üstüxanlılar* Azərb. ərazisində yayılmış tayfalardan birinin adıdır.

# Jj

**Janjaru** *hidr.*, *mür.* Lənkəran r-nunda çay. Beşərü çayının sağ qoludur. Hidronim İran dillərindəki *janga* (pas, paxır, cəng, mıs pası) və *ru* (su, çay) komponentlərindən düzəlib, "paxırlı su, sarı suyu olan çay" mənalarını bildirir. Bu baxımdan hidronim Mıssuyu (Gədəbəy) çayının adı ilə sinonimdir.

**Jarski** b a x Şirvanlı

**Jdanov** b a x Biləsuvar

**Jiloy** b a x Çilov

**Jindi** *oyk.*, *mür.* Lerik r-nunun Bilabənd i.ə v.-də kənd. Peştəsər silsiləsinin yamacındadır. Oykonim talış dilindəki *jin* (aşağı) və *di* (kənd) sözlərindən düzəlib, "aşağı kənd" mənasındadır.

**Jiy** *oyk.*, *sadə.* Yardımlı r-nunun Ərus i.ə v.-də kənd. Burovar silsiləsinin ətəyindədir. Oykonim talış dilindəki "alt", "aşağı" mənasında işlənən *jiy* sözündəndir. Kənd dağ silsiləsinin aşağı hissəsində yerləşdiyi üçün belə adlandırılmışdır.





# Kk

**Kabarrıdağ** *or.*, *mür.* Xanlar r-nu ərazisində dağ. Oronim Qarabarrıdağ variantında da qeydə alınmışdır. Dağın ərazisi bir zamanlar *kəbirli* (kabarlı, kəbərli) tayfasına mənsub yaylaq yerlərindən olduğu üçün belə adlandırılmışdır. Oronim *kabbarı* (etn.) və *dağ* komponentlərindən düzəlib, "kəbirlilərə məxsus dağ" mənasındadır.

**Kabeddağ** *or.*, *mür.* Ordubad r-nu ərazisində dağ. Azərb.-la Ermənistan sərhədindədir. Oronimin *gəbə* (xalı, zəngin, bəzəkli, əlvan) və *dağ* komponentlərindən ibarət olub, dağın adının əlvan bitki örtüyü ilə əlaqədar yaranması ehtimal edilir.

**Kaftarandağ** *or.*, *mür.* Qobustanda palçıq bulkanı. Ceyrankeçməz çayının orta axarından solda yerləşir. Hün. 377 m. Palçıq vulkanının adı buradakı eyniadlı dağdan alınmışdır. Oronim *kaftar* (gorəşən), *-an* (İran dillərinə mənsub cəmlik və məkan anlayışı bildirən şək.) və *dağ* komponentlərindən düzəlib, "kaftarlı dağ" mənasındadır.

**Kaftarlı** *or.*, *düz.* Xocavənd r-nu ərazisində dağ. Əmiranlar kəndindən şm.-dadır. Dağın ərazisi keçmişdə sıx meşəlik olduğundan orada tez-tez yırtıcı heyvan olan *kaftara* (gorəşənə) təsadüf edildiyinə görə dağ belə adlandırılmışdır.

**Kaftarı** *or.*, *düz.* Qazax r-nunun c.-ş.-ində dağ. Hün. 627 m. Kaftan variantında da qeydə alınmışdır. Əsli *Kaftarlıdır.* Dağın ərazisində kaftara təsadüf edildiyindən dağ belə adlandırılmışdır.

**Kaha** *oyk.*, *sadə.* 1. Kəlbəcər r-nunun Keşdək i.ə v.-də kənd. Dağətəyi ərazidədir. Kəndin ərazisi əvvəllər Keşdək kəndinin binəsi olmuşdur. Sonralar həmin kənddən ayrılmış ailələr burada daimi məskunlaşmışlar. Kənd öz adını ərazisindəki qəd. *kahadan* (zağadan) almışdır; 2. Laçın r-nunun Daşlı i.ə v.-də kənd. Çalbayır silsiləsinin ətəyindədir. Keçmiş adı İsgəndər kahası olmuşdur. Yaşayış məntəqəsi XIX əsrdə qarabayramlı tirəsinə mənsub ailələrin özlərinə məxsus qışlaqlardan birində məskunlaşması nəticəsində yaranmışdır. Oykonim kəndin ərazisindəki qədim kaha qalıqları ilə əlaqədardır.

**Kahab** *hidr.*, *mür.* Şahbuz və Babək r-nları ərazisində çay. Naxçıvan çayının sol qoludur. Kahab kəndindən aşağıda Naxçıvan düzünə çıxır və suvarmada geniş istifadə edilir. Hidronim *kaha* (mağara) və *ab* (İran dillərində "su") komponentlərindən düzəlib, "mağara suyu" mənasındadır.

**Kalafalıq** *oyk.*, *sadə.* Laçın r-nunun Vaqazin i.ə v.-də kənd. Ərdəşəvə çayının (Şəlvə çayının qolu) sahilində, Qarabağ silsiləsinin yamacındadır. Yaşayış məntəqəsi keçmişdə r-nun ərazisində mövcud olmuş Birinci Cağazur kəndindən çıxmış ailələrin Kalafalıq adlanan yerdə məskunlaşması nəticəsində yaranmışdır. *Kalafa* köhnə kəndin, yaxud mal-qara saxlamaq üçün tikilmiş pəyələrin xarabalığına, quyuya, qazılmış çökək yerə deyilir. Oykonimin tərkibindəki *-lıq* şək.-si çoxluq və məkan anlayışı ifadə edir.

**Kalağaylı** *oyk.*, *düz.* Ağsu r-nunun Padar i.ə v.-də kənd. Şirvan düzündədir. Tədqiqatçıların fikrincə, oykonimin əsli Qalaqayınlıdır, kəndin əhalisinin Sabirabad r-nundakı Qalaqayın kəndindən olduqlarını bildirir. 1917-ci ildə tərtib olunmuş inzibati ərazi bölgüsündə Göyçay qəzasında *Kalaqa* (İsmayıllı) və *Kalaqaylı* (Kürdəmir) adlı iki kənd qeydə alınmışdır. Bunlardan biri indiki Qalagah, digəri isə Qalagahlı (Kalağaylı) kəndləridir. Oykonim "Qalagahdan gəlmişlər" mənasındadır.

**Kalininkənd** b a x Vurğun

**Kalinovka** *oyk.*, *sadə.* 1. Masallı r-nunun eyniadlı i.ə v.-də kənd. Viləş çayı sahilində, Lənkəran ovalığındadır. Keçmiş adı Nikolayevka olmuşdur. 1843-cü ildə Volqaboyundan köçüb gələn rus kəndlilərinin məskunlaşması nəticəsində yaranmış yaşayış məntəqəsi Sovet hakimiyyəti illərində sovet dövlət xadimi M. İ. Kalininin şərəfinə Kalinovka adlandırılmışdır; 2. Sabirabad r-nunun eyniadlı i.ə v.-də kənd. Kür çayının sahilində, Şirvan düzündədir. XIX əsrdə rus kəndlilərinin məskunlaşdığı yaşayış məntəqəsi Sovet hakimiyyəti illərində M. İ. Kalininin şərəfinə Kalinovka adlandırılmışdır. Memorial toponimdir.

**Kalmıçkov Bankəsi** *or., mür.* Xəzərdə dayazlıq. Kalmıkların adı ilə bağlıdır.

**Kalva** *oyk., mür.* Ağsu r-nunun eyniadlı i.ə.v.-də kənd. Niyaldağ silsiləsinin ətəyindədir. Oykonim *kələ* (tat. "böyük") və *va* (*ova/oba* sözlərinin ıxtisar olunmuş forması) komponentlərindən düzəlib, "böyük oba" mənasındadır.

**Kamal** *hidr., sadə.* Quba r-nu ərazisində çay. Çağacıq çayını əmələ gətirən qollardan biridir. Türk dillərində *kamal* sözünün mənalarından biri "axın"dır. Çayın mövqeyi bu mənaya uyğundur.

**Kamallı** *oyk., dür.* 1. Laçın r-nunun Alxaslı i.ə.v.-də kənd. Dağlıq ərazidədir. Keçmiş adı Bozlu olmuşdur. Yaşayış məntəqəsini Dərələyəz mahalından gəlmiş bozlu tayfasına mənsub ailələr salmışlar. Kəndin q.-indəki əkin sahələrindən biri Kamalın çuxuru adlanır; 2. Saatlı r-nunun Hacıqasımlı i.ə.v.-də kənd. Araz çayı sahilində, düzənlikdədir. Yerli əhalinin məlumatına görə, yaşayış məntəqəsini *Kamal* adlı şəxs qoyduğundan kənd onun adını daşıyır. Güman etmək olar ki, bu kəndlər ya Dərələyəz mahalında vaxtilə mövcud olmuş Kamal kəndindən köçüb gəlmiş ailələrin gətirdiyi adla, ya da *kamallı* nəslinin adı ilə adlandırılmışdır. Keçən əsrdə Tatarıstan ərazisində də Kamallı adlı yaşayış məntəqəsi qeydə alınmışdır. Türk dillərində *kamal* sözü "qala", "səngər", "axın" mənalarında işlənir.

**Kamandar** *oyk., sadə.* Şəmkir r-nunun Badakənd i.ə.v.-də kənd. Dağətəyi ərazidədir. Yaşayış məntəqəsi XIX əsrdə *Kamandar meşəsi* adlanan ərazidə salınmışdır. Yerli əhalinin məlumatına görə, Kamandar həmin meşənin sahibinin adıdır.

**Kamıqaya** *or., mür.* Qax və Şəki r-nları ərazisində dağ. Acınohur gölündən şm.-da yerləşir. Hün. 460 m. Qamıqaya variantında da qeydə alınmışdır. Oronim *komquya* sözünün təhrif olunmuş forması hesab edilir. Dağın adı türk dillərindəki *kom* (çökək, oyuq) və *quya* sözlərindən düzəlib, "oyuqlu qayası olan dağ" mənasındadır. Ordubad r-nunda bu oronimin Qamıqaya variantı qeydə alınmışdır.

**Kamlakan** *oyk., mür.* Astara r-nunun Həmoşam i.ə.v.-də kənd. Həmoşam çayı sahilində, dağətəyi ərazidədir. Yerli əhalinin məlumatına görə, oykonim Kamalakeon adının təhrif formasıdır. *Kamal* (ş.a.) və talış dilindəki *kəon* (evlər) komponentlərindən düzəlmiş bu toponim "Kamala məxsus evlər" mənasındadır. Tədqiqatçılara görə, *kamlakan* talış dilində "böyürdə salınmış evlər, azlıqda qalan evlər" mənasındadır.

**Kamo** *oyk., sadə.* Xanlar r-nunun Azad i.ə.v.-də kənd. Azad çayının sahilində, Sarıyalın ətəyindədir. Keçmiş adı Hacıkənd olmuşdur. Yerli əhalinin məlumatına görə, əvvəllər burada Gəncə əsilzadələrindən Hacı adlı bir şəxsin yaylaq yurdu olduğuna görə kənd belə adlandırılmışdır. XIX əsrdə burada gəlmə erməni ailələri yerləşdirildikdən sonra onlar kəndin adını Hacışen adlandırmış, 1939-cu ildə isə erməni inqilabçısı S.A.Ter-Petrosyanın inqilabi ləqəbi olan Kamo adı ilə əvəz etmişdilər. Yaşayış məntəqəsinin keçmiş adı özünə qaytarılmışdır.

**Karaçayev Bankəsi** *or., mür.* Xəzərdə dayazlıq. Qaraçaylıların adı ilə bağlıdır. Etnotoponimdir.

**Karaqlux** *or., mür.* Xocalı r-nu ərazisində dağ. Keçmiş adı Daşbaşı olmuşdur. Ədəbiyyatda Karıtaşlux variantında da qeydə alınmışdır. Oronim "səthi daşlıq olan dağ" mənasındadır.

**Karxulu** *oyk., sadə.* Cəbrayıl r-nunun eyniadlı i.ə.v.-də kənd. Düzənlikdədir. Yaşayış məntəqəsini XIX əsrdə Qarabağdan gəlmiş Allahverdi və Xudaverdi adlı qardaşlar Karxulu adlanan yerdə salmışlar. Yerli əhalinin məlumatına görə, oykonim Kar Qulu şəxs adı ilə bağlıdır. Lakin keçən əsrin əvvəllərində Tiflis quberniyasında Karxun adlı dağ və çayın, Krımda Karqulu toponiminin qeydə alınması bu fikri təkzib edir. Qəd. türk dillərində *karqu/karxu* sözü "gözətçi məntəqəsi" mənasında işlənmişdir. Oykonimin "gözətçi məntəqəsi olan yer" mənasında olmasını ehtimal etmək olar.

**Karrar** *oyk., sadə.* Kürdəmir r-nunun eyniadlı i.ə.v.-də kənd. Şirvan düzündədir. Oykonim şahsevənlərin *karrar* tayfasının adı ilə bağlıdır. Karrar adlı nəsil kənddə bu gün də yaşamaqdadır.

**Karvansara** *hidr., sadə.* 1. Naxçıvan MR ərazisində çay. Axınca çayının qoludur; 2. Şahbuz r-nu ərazisində min bulaqlar. Kö-





mür kəndindən 7 km ş.-də yerləşir. İki bulaqdan ibarətdir. Bulaq keçmişdə həmin ərazidə mövcud olmuş qəd. karvansaraya görə belə adlandırılmışdır.

**Kasapat** b.a.x. Qasapet.

**Kaspi dənizi** *hidr., mür.* Xəzər dənizinin qədim və çox yayılmış adlarından biri. Hidronim Qafqaz Albanıyasında Xəzər dənizi sahilində yaşamış kaspi tayfasının adı ilə bağlıdır. Kaspilərin adı ilk dəfə yunan tarixçisi Herodotun (e.ə. V əsr) "Tarix" əsərində çəkilir. Antik dövr müəllifləri onlar haqqında geniş məlumat vermişlər. Kaspi tayfaları Makedoniyalı İsgəndərin qoşunlarına qarşı döyüşlərdə (e.ə. IV əsr) İran hökmdarı Daranın tərəfində iştirak etmişdir. Kaspilərin yaşadıqları tarixi vilayət Kaspiana adlanırdı. Bu vilayət indiki Şimali Azərb.-nın ərazisində Kürün Arazla birləşdikdən sonra Xəzərədək olan hissəsində c.-da yerləşən dənizətrafı sahəni əhatə edirdi. Şərqi Avropanın c.-unu Yaxın Şərq ölkələri ilə birləşdirən ticarət karvan yolu Kaspiana ərazisindən keçirdi. III əsrdən sonra bu vilayət Bala-Sakan, sonralar isə həm də Muğan adlandırıldı.

**Kass** b.a.x. Qas.

**Katex** *hidr., mür.* Zaqatala və Balakən r-nları ərazisində çay. Qanıx çayının qoludur. Tədqiqatçıların bir qismi hidronimi avar dilindəki *kats* (keçid) və *udin* dilindəki *xe* ("su" mənasını bildirən *ex* sözünün dəyişikliyə uğramış forması) sözlərinin birləşməsi kimi "keçiddən axan su", yaxud "su keçidi" mənaları ilə izah edirlər. Bəzi tədqiqatçılara görə isə, çayın adı Azərb. dilindəki gədik (dağ belində keçid, alçaq yer) sözü ilə bağlıdır. Hidronimin "yüksəkdən axan su" mənasında olduğunu da düşünmək olar.

**Katex** *oyk., sadə.* Balakən r-nunun eyniadlı i.ə.v.-də kənd. Katex çayı sahilində, Alazan-Əyriçay çökəkliyindədir. XVII əsrdə Cənubi Dağıstandan gəlmiş avarların Katex adlanan yerdə məskunlaşması nəticəsində yaranmışdır. Ərazı adını buradan axan Katex çayının adından almışdır.

**Katos** *oyk., sadə.* Laçın r-nunda kənd. Dağ yamacındadır. Yaşayış məntəqəsini XX əsrin əvvəllərində yaxınlıqdakı Şeylanlı kəndindən köçüb gəlmiş ailələr (nəbilər, xudular və əsədlər nəslinə mənsub) Katos meşəsi adlanan yerdə salmışlar. Qəd. türk dillərində *katıs* "birləşmək, qarışmaq", *kadus* "gözəllik", "sənət əsəri" mənalarında işlənmişdir.

**Kavdadıq** *oyk., mür.* Qubadlı r-nunun eyniadlı i.ə.v.-də kənd. Bərgüşad və Həkəri çaylarının birləşdiyi yerdədir. Yerli əhali kəndin adını *kovxalıq* (kəndxudaya məxsus) kimi izah edir. Oykonimin ilkin variantının Kavdoabdıq olduğunu iddia edən tədqiqatçılara görə, *kav* (fars. "dağ keçidi, aşırım"), *doab* (iki çay) və *-dıq* (Azərb. dilindəki məkan bildirən *-lıq* şək.-sının variantı) komponentlərindən ibarət olan bu söz "dağ keçidində iki çayın birləşdiyi yer" mənasındadır. Başqa bir mülahizəyə görə isə, kəndin adı *kavda* (fars. "yabı" mənalı *gövdən* sözündən) və *-dıq* (-lıq şək.-si) komponentlərindən düzəlib, "yabılar saxlanan yer" və ya "arıqlamış atlar üçün ayrılmış otlaq, örüş sahəsi" deməkdir.

**Kavdar** *oyk., sadə.* Cəbrayıl r-nunun Hacılı i.ə.v.-də kənd. Arazboyu düzənlikdədir. Tədqiqatçıların ehtimalına görə, kəndin adı qədim türkdilli *qovlar* tayfasının adını əks etdirir. Peçeneq tayfalarından biri olan qovların adına Tovuz, Sabirabad, İsmayıllı, Samux və b. r-nların toponimiyasında da rast gəlmək mümkündür. Kavdar qovlar etnoniminin yerli tələffüz formasıdır.

**Kavran** b.a.x. Gavran.

**Kazımabad** *oyk., mür.* Cəlilabad r-nunun Svetlaya Zarya i.ə.v.-də kənd. Düzənlikdədir. Yerli əhalinin məlumatına görə, kəndin əsasını Kazım adlı şəxs qoyduğu üçün belə adlandırılmışdır. Oykonim *Kazım* (ş.a.) və *abad* (kənd) komponentlərindən düzəlib, "Kazımın kəndi" mənasındadır.

**Kazımlı** *oyk., dür.* Tovuz r-nunun Çatax i.ə.v.-də kənd. Çınqıldağ silsiləsinin yamacındadır. Əsrik çayı kəndi iki hissəyə ayırır. Yaşayış məntəqəsi XIX əsrdə Aşağı Quşçu kəndindən olan *Kazım* adlı şəxsə məxsus yurdun yerində salındığı üçün belə adlandırılmışdır.

**Kebeloba** *oyk., mür.* Zaqatala r-nunun Car i.ə.v.-də kənd. Baş Qafqaz silsiləsinin ətəyindədir. Mənbələrin məlumatına görə, təqr. XVI-XVII əsrlərdə Dağıstanın Kabal kən-

sahilində. Bərgüşad silsiləsinin ətəyindədir Keçmiş adı Balabəyli olmuşdur. Yaşayış məntəqəsini Ağdam r-nunda vaxtilə mövcud olmuş Alıbəyli kəndindən köçüb gəlmiş ailələr salmışlar Kəndin ərazisi əvvəllər Alıbəyli kəndinə məxsus yaylaq yeri olmuşdur

**İkinci Alıcanlı** *oyk* *mür* Zərdab r-nunun Çalı i ə v -də kənd Şirvan düzündədir Qarabağdan gəlmə ailələrin məskunlaşması nəticəsində yarandığından Qarabağ Alıcanlısı da adlanır Oykonimin birinci komponenti ərazideki Alıcanlı adlanan yaşayış məntəqələrini bir-birindən fərqləndirməyə xidmət edir

**İkinci Aral** *oyk.*, *mür* Ağdaş r-nunun Xosrov i ə v -də kənd Şirvan düzündədir. Yaşayış məntəqəsi XIX əsrdə Şəmsabad kəndindən çıxmış ailələrin Aral adlanan torpaq ərazisində məskunlaşması nəticəsində yaranmışdır Bu torpaq sahəsi xəzinə torpağı olduğundan *Aral* (yəni "fərqli, ayrılmış") adlanırdı Oykonimin birinci komponenti kəndi eyniadlı digər yaşayış məntəqəsindən fərqləndirməyə xidmət edir

**İkinci Aratkənd** b a x Aratlı-Curuğlu

**İkinci Aşıqlı** *oyk*, *mür* Beyləqan r-nunun Eyvazalılar i ə v -də kənd Mil düzündədir Yaşayış məntəqəsi keçmiş Aşıqlı (indiki Birinci Aşıqlı) kəndindən çıxmış ailələrin burada məskunlaşması nəticəsində yaranmışdır Oykonim şahsevənlərin *aşıqlı* tirəsinin adını əks etdirir

**İkinci Biləcik** *oyk.*, *mür* Şəki r-nunun Aşağı Göynük i ə v -də kənd Alazan-Əyriçay çökəkliyindədir Yaşayış məntəqəsi XIX əsrdə Biləcik (indiki Birinci Biləcik) kəndindən çıxmış ailələrin pay torpaqlarında məskunlaşması nəticəsində yaranmışdır Oykonimin birinci komponenti onu eyniadlı digər kənd adından fərqləndirmək üçün əlavə edilmişdir

**İkinci Çağan** *oyk*, *mür* Şamaxı r-nunun Dədəgünəş i ə v -də kənd Dağətəyi ərazidədir Yaşayış məntəqəsi keçmiş Çağan Məmmədsəlimli (indiki Birinci Çağan) kəndindən çıxmış ailələrin burada məskunlaşması nəticəsində yaranmışdır

**İkinci Dərəşam** *oyk*, *mür* Babək r-nunun Nehrəm i ə v -də qəsəbə Araz çayı dərəsindədir Yaşayış məntəqəsi 1964-cü ildə Dərəşam d.y platforması yanında salınmış və eyniadlı kənddən fərqləndirmək üçün İkinci Dərəşam adlandırılmışdır

**İkinci Ərəbcəbirli** *oyk*, *mür* Göyçay r-nunun Şəhadət i ə v -də kənd. Şirvan düzündədir Yaşayış məntəqəsi r-nun ərazisində məskunlaşmış *ərəbcəbirli* tayfasına məxsus kəndlərdəndir Oykonimin birinci komponenti fərqləndirici xüsusiyyətə malikdir

**İkinci İmamverdili** b a x. Qaralılar

**İkinci Qala** *oyk*, *mür* Bakı şəhəri, Əzizbəyov r-nunda qəsəbə. Yaşayış məntəqəsi Böyük Vətən müharibəsindən sonrakı illərdə Bakı-Sabunçu d y xəttindəki stansiya əsasında yaradılmış və Qala qəsəbəsindən fərqləndirmək üçün İkinci Qala adlandırılmışdır

**İkinci Qarademirçi** *oyk*, *mür* Bərdə r-nunun Qarademirçi i ə v.-də kənd Qarabağ düzündədir Oykonimin birinci komponenti r-nun ərazisində *qaradəmirçi* tayfasının məskunlaşdığı eyniadlı yaşayış məntəqələrini fərqləndirməyə xidmət edir.

**İkinci Qaralı** *oyk.*, *mür* Neftçala r-nunun Yuxarı Qaramanlı i ə.v -də kənd Cənub-Şərqi Şirvan düzündədir Yaşayış məntəqəsi r-nun ərazisində məskunlaşmış *qaralı* tayfasının saldığı kəndlərdən biridir

**İkinci Mahmudlu** *oyk.*, *mür* Füzuli r-nunun Əhmədbəyli i ə v -də kənd Düzənlikdədir Yaşayış məntəqəsi keçmiş *Mahmudlu* kəndindən ayrılmış ailələrin saldığı üç kənddən biridir Oykonimin birinci komponenti yaşayış məntəqəsini Birinci Mahmudlu və Üçüncü Mahmudlu kəndlərindən fərqləndirməyə xidmət edir

**İkinci Meyniman** *oyk.*, *mür.* Hacıqabul r-nunun Kalinovka i ə v -də kənd Şirvan düzündədir Keçmiş adı Bino Meyniman olmuşdur Yaşayış məntəqəsi Meyniman (indiki Birinci Meyniman) kəndindən ayrılmış ailələrin məskunlaşması nəticəsində yaranmışdır

**İkinci Milli** *oyk*, *mür* Kəlbəcər r-nunun Sınıqkilsə i ə v -də kənd Tərtər çayının sahilində, Qoçdaş dağının yamacındadır Yaşayış məntəqəsi XIX əsrin sonunda Milli (indiki Üçüncü Milli) kəndindən ayrılmış ailələrin məskunlaşması nəticəsində yaranmışdır Oykonimin birinci komponenti fərqləndirici xüsusiyyətə malikdir İkinci komponent isə etnotoponimdir





**İkinci Nügedi** *oyk.*, *mür* Quba r-nunun eyniadlı i ə v -də kənd Qaraçayın sahilində, dağətəyi ərazidədir Yaşayış məntəqəsi r-nun ərazisində nisbətən yeni salınan kəndlərdəndir *Nügədi* tat dilində "yeni kənd" deməkdir Oykonimin birinci komponenti fərqləndirici xüsusiyyətə malikdir

**İkinci Paşalı** *oyk.*, *mür* Hacıqabul r-nunun Udullu i ə v -də kənd Pirsaat çayının sahilində, Ləngəbiz silsiləsinin ətəyindədir Yaşayış məntəqəsi XIX əsrin axırlarında Paşalı (və ya Paşalıkənd) kəndindən köçmüş ailələrin məskunlaşması nəticəsində yaranmış və İkinci Paşalı adlandırılmışdır Keçmiş kəndin adı isə Birinci Paşalı kimi rəsmiləşdirilmişdir.

**İkinci Səmədxanlı** *oyk*, *mür* Masallı r-nunun Şərəfə i ə v -də kənd Lənkəran ovalığındadır Yaşayış məntəqəsi XIX əsrdə Səmədxanlı (indiki Birinci Səmədxanlı) kəndindən çıxmış bir qrup ailənin məskunlaşması nəticəsində yaranmışdır

**İkinci Şahsevən** *oyk.*, *mür* Beyləqan r-nunun eyniadlı i ə v -də kənd Düzənlikdədir Yaşayış məntəqəsi Qarabağda məskunlaşmış Şahsevən tayfa birliyinə mənsub ailələrin saldıqları kəndlərdəndir Oykonimin birinci komponenti bu kəndi Ağcabədi r-nundakı eyniadlı (Birinci Şahsevən) kənddən fərqləndirməyə xidmət edir

**İkinci Şıxlı** *oyk.*, *mür* Qazax r-nunun eyniadlı i ə v -də kənd Düzənlikdədir 1950-ci ildə r-nun ərazisindəki Sarıvəlli və Dəllər kəndlərinin genişlənərək birləşməsi nəticəsində yaranmış bu yaşayış məntəqəsi yaxınlığındakı eyniadlı kəndin adı ilə Şıxlı adlandırılmış, sonralar bu kəndlər birinci və ikinci komponentləri ilə fərqləndirilmişdir Oykonimin ikinci komponenti etnotoponimdir

**İkinci Şordəhnə** *oyk.* *mür* Ağdaş r-nunun Qəsil i ə v -də kənd Kür-Araz ovalığındadır Yaşayış məntəqəsi keçmiş Şordəhnə (sonralar Birinci Şordəhnə) kəndindən ayrılmış ailələrin məskunlaşması nəticəsində yaranmışdır 1992-ci ildən kəndin adı Bəylik oykonimi ilə əvəz olunmuşdur

**İkinci Tığık** *oyk* *mür* Laçın r-nunun Qarıkaha i ə v -də kənd Qarabağ silsiləsinin ətəyindədir Tığıq dağının ətəyində yerləşən iki yaşayış məntəqəsi dağın adı ilə Birinci Tığıq və İkinci Tığıq adlandırılmışdır

**İkinci Tiyaqanı** *oyk*, *mür* Masallı r-nunun Hişkədərə i ə v -də kənd. Lənkəran ovalığındadır Yaşayış məntəqəsini keçmiş Tiyaqanı (indiki Birinci Tiyaqanı) kəndindən ayrılmış ailələr salmışlar Oykonimin birinci komponenti fərqləndirici xüsusiyyətə malikdir, ikinci komponenti isə tədqiqatçılar tərəfindən talış dilindəki "teğoni" sözünün "tikanlıq" və ya "tiyəhoni" sözünün "əyri bulaq" mənası ilə izah olunur

**İkinci Udullu** *oyk*, *mür* Hacıqabul r-nunun Udullu i ə v -də kənd Pirsaat çayının sahilində, Ləngəbiz silsiləsinin ətəyindədir. Yaşayış məntəqəsi XIX əsrdə Udullu (indiki Birinci Udullu) kəndindən köçmüş bir qrup ailənin burada məskunlaşması nəticəsində yaranmışdır Şahsevənlərin *udullu* tayfasının adı ilə bağlı olan kəndlərdəndir

**İkinci Yeddioymaq** *oyk*, *mür* Masallı r-nunun Yeddioymaq i ə v -də kənd. Lənkəran ovalığındadır Yaşayış məntəqəsi XIX əsrin sonlarında Yeddioymaq (indiki Birinci Yeddioymaq) kəndindən çıxmış ailələrin burada məskunlaşması nəticəsində yaranmışdır Birinci və ikinci komponentləri eyniadlı iki kəndi bir-birindən fərqləndirməyə xidmət edir

**İkinci Yeniyol** *oyk*, *mür* İsmayıllı r-nunun Təzəkənd i ə v -də kənd Dağətəyi ərazidədir Yaşayış məntəqəsi XX əsrin ortalarında Yeniyol (indiki Birinci Yeniyol) kəndindən çıxmış ailələrin burada məskunlaşması nəticəsində yaranmış və İkinci Yeniyol adlandırılmışdır *Yeniyol* komponenti rəmzi olaraq verilmiş adlardandır

**İkinci Yüzbaşılı** *oyk*, *mür* Ağdam r-nunun Xındırıstan i ə v -də kənd Qarabağ düzündədir Yaşayış məntəqəsi XIX əsrdə Yüzbaşılı (indiki Birinci Yüzbaşılı) kəndindən çıxmış ailələrin burada məskunlaşması nəticəsində yaranmışdır Oykonimin ikinci komponenti etnotoponimdir

**İkinci Zabrat** *oyk* *mür* Bakı şəhəri Sabunçu r-nunda kənd və d y stansiyası Abşeron yarımadasındadır Yaşayış məntəqəsi XX əsrin 30-cu illərində elektrik d y xəttinin istismara verilməsi nəticəsində yaranmış, kənd eyniadlı digər yaşayış məntəqəsindən fərq-

dindən köçüb gəlmiş *kabal* (*kebel*) nəslinə mənsub ailələr Zaqatala r-nunun Car kəndində məskunlaşmış, Kebeloba kəndinin ərazisi isə onların müvəqqəti bino yeri olmuşdur Sonralar isə kebellər burada daimi məskunlaşmış, kəndə də bu adı vermişdilər Oykonim "kebellərin obası" mənasındadır

**Keçdərə** *hidr mür* Gədəbəy r-nu ərazisində çay Hidronim türk dillərindəki *keş/keç/köş* (yaylaq düşərgəsi, qoyunlar üçün qışlaq yeri) və *dərə* (çay dərəsi) komponentlərindən düzəlib, "ərazisində yaylaq düşərgəsi olan dərədən axan çay" mənasındadır

**Keçəlçay** b a x Keçəldağ çayı.

**Keçəldağ** *or*, *mür* 1 Abşeron yarımadasında palçıq vulkanı. Masazır gölündən q -də yerləşir Hün 114 m , 2 Ağdam r-nu ərazisində dağ, 3 Gədəbəy r-nunda sıra dağlar Ermənistanla sərhəd boyu uzanaraq Şahdağ sıra dağlarını Murquzdağ sıra dağları ilə birləşdirir; 4 Gədəbəy r-nunun q -ində dağ Ermənistanla sərhəddə yerləşir Hün 2435 m ; 5 Kəlbəcər r-nu ərazisində dağ. Qarabağ yaylasındadır Keçəldağ çayı mənbəyini buradan alır; 6 Qəbələ r-nu ərazisində dağ Bum çayı ilə Qaraçayın suayrıcında yerləşir Hün 2873 m , 7 Şahbuz r-nunda dağ Zəngəzur silsiləsinin ən yüksək zirvələrindən biridir Naxçıvan və Şərqi Arpa çaylarının suayrıcında, Dərələyəz silsiləsində zirvədir Hün 3115 m Zirvənin c -q yamacında yüksək dağ gölü olan Qanlı göl yerləşir; 8 Şuşa r-nu ərazisində aşırım Qarabağ silsiləsindədir Yevlax-Laçın avtomobil yolu bu aşırımdan keçir, 9 Tərtər r-nu ərazisində dağ Murovdağ silsiləsində, Tərtər çayının sol sahilində yerləşir Hün 2292 m Bu dağların səthi çılpaq, bitki örtüyündən məhrum olduğuna görə belə adlandırılmışdır

**Keçəldağ çayı** *hidr , mür* Kəlbəcər r-nu ərazisində çay Qaraxaç çayının sağ qoludur Mənbəyini Keçəldağın yamacından (3080 m yüksəklikdən) alan bu çay tipik dağ çayı olub, dar dərələrdən axır Çay eyniadlı dağın adı ilə adlandırılmışdır Keçəlçay kimi də qeydə alınmışdır

**Keçələkəran** *oyk , mür* Yardımlı r-nunun Vərgədüz i ə v -də kənd Maman dağının yamacındadır Kəndin adı yerli camaat arasında "keçəllər məhəlləsi" kimi izah olunur Oykonimin, əslində, Gecələkəran variantında olduğunu iddia edən tədqiqatçılar onu talış dilindəki *ka* (ev), *cal* (dərin) və *karan* (kənd) sözlərindən (-*ə* bitişdirici saitdir) ibarət, Talış zonasına məxsus xüsusi ev tipinin adı kimi yozurlar Bəzi tədqiqatçılara görə isə, oykonim "damı olmayan, üstü açıq evlər" mənasındadır

**Keçəlmuradlı Qalası** b a x Hacıəlmuradlı

**Keçəltəpə** *or , mür* Şərur r-nu ərazisində dağ Dərələyəz silsiləsinin ən yüksək zirvələrindən biridir Hün 2740 m Dağın başı çılpaq, bitkisiz olduğuna görə belə adlandırılmışdır

**Keçibelli** *or , mür* Kəlbəcər r-nu ərazisində dağ zirvəsi Dağın dərəsi keçilər üçün otlaq olduğundan belə adlandırılmışdır. Oronim *keçi* və *bel* (dağın üstü) sözlərindən və -*i* mənsub şək -sindən düzəlmişdir

**Keçikli** *oyk düz* Zəngilan r-nunun Zəngilan şəhər i ə v -də kənd Əsgülüm dağının yamacındadır Yerli əhalinin məlumatına görə, yaşayış məntəqəsi XIX əsrdə Cənubi Azərb -nın Qaradağ mahalından gəlmiş məmmədkərimli tirəsinə mənsub ailələr və Naxçıvanın Hüsülü kəndindən çıxmış ailələr tərəfindən dağda keçid yerində salınmışdır Oykonim *keçik* (keçid) sözündən və -*li* mənsubluq şəkilçisindən düzəlmişdir Bəzi tədqiqatçılar isə kəndin adını mənşəcə oğuz tayfalarından olan *keçililərin* adı ilə bağlayırlar

**Keçiqıran** *or sadə* Yardımlı r-nu ərazisində dağ Yerli əhalinin məlumatına görə, dağın əsl adı Keçiqırılandır Oronimin vaxtilə burada dağ keçilərinin çox ovlanıb qırılması ilə bağlı yarandığı güman edilir Azərb dilində çox soyuq iqlim şəraitinə də *keçiqıran* deyirlər Yəqin ki, dağın iqliminin çox soyuq olması ilə əlaqədar dağ belə adlandırılmışdır

**Keçili** *hidr sadə* Kəlbəcər r-nu ərazisində çay Tutqunçayın qoludur Əsl adı Keçiliqayadır Aşağı axarında Altıkövşən adlanır Çay öz mənbəyini *Keçiliqaya* adlanan ərazidən aldığı üçün belə adlandırılmışdır

**Keçili** *oyk., sadə* 1 Şahbuz r-nunun Külüs i ə v -də kənd Zəngəzur silsiləsinin ətəyindədir XIX əsrə aid (1816-cı il) mənbələrdə Naxçıvan zonasında (Arazın sol sahilində) *tayfaye-keçililərin* yaşadığı və onların Səfəvilər dövründə kəngərlilərlə qaynayıb-qarışdığı qeyd olunmuşdur Mənbələrdə oğuz mənşəli qayı tayfa birliyinə daxil olan qızılkeçili qolundan bəhs edilmişdir Türkmənlərin yersarı tayfasının qollarından biri də keçili adlanırdı Keçili tayfasının adı Türkiyədəki yürüklərin arasında da qeydə alınmışdır, 2 Şəmkir r-nunun eyniadlı i ə v -də kənd Dağətəyi ərazidədir Yerli məlumata görə, yaşayış məntəqəsini XVII əsrdə Naxçıvan mahalının Keçili kəndindən gəlmiş ailələr salmışlar 1954-cü ildə kənd planlaşdırılaraq köhnə ərazidən bir qədər aralıda indiki yerində salındığı üçün Plankənd adlanmışdır 1994-cü ildə kəndə öz köhnə adı qaytarıldı

**Keçiliçay** b a x· Keçəldağ çayı

**Keçiliqaya** *oyk , sadə* Kəlbəcər r-nunun Zülfüqarlı i ə v -də kənd Dağlıq ərazidədir Keçmiş adı Qoşunəlilər olmuşdur Kəndi qoşunəlilər nəslinə mənsub ailələr Keçiliqaya deyilən yerdə saldığına görə belə adlandırılmışdır Oronim *keçili* (etnonim) və *qaya* sözlərindən düzəlib, keçili tayfasının adı ilə bağlıdır

**Kekonu** *oyk , sadə* Lerik r-nunun Osyedərə i.ə v -də kənd Alaşa çayının mənbəyi yaxınlığında, dağlıq ərazidədir Oykonim *kek/kök* (Azərb dilindəki *göy* sözü) və *honi* (talış "bulaq") sözlərindən ibarət toponim kimi "göybulaq" mənasında izah olunur Kəndin adını "birəli bulaq" kimi izah edənlər də var Hər iki halda kənd ərazisindəki bulağın adı ilə adlandırılmışdır

**Kemraquç** *oyk , mür* Xocavənd r-nunun Xocavənd qəsəbə i ə v -də kənd Dağətəyi ərazidədir. Yaşayış məntəqəsi Ermənistanın Qafan r-nundan köçüb gəlmiş ailələrin Kemraquç adlı ərazidə məskunlaşması nəticəsində yaranmışdır Tədqiqatçılara görə, bir qədər təhrifə uğramış oykonim Azərb dilindəki *kəmrə* (heyvan ağılı) və *qoç* (erkək qoyun) sözlərindən düzəlib, "qoç saxlanılan ağıl" mənasındadır

**Ker** *oyk , sadə* Lerik r-nunun Mistan i ə v -də köç Oykonimin türk dillərindəki *kor/ker* sözündən olub, "qoruq, gözətçi məntəqəsi" mənasında olması ehtimal edilir

**Kergəzan** *or , mür* Qusar r-nu ərazisində dağ Oronim *kör/ker* (gözətçi məntəqəsi), *gəz* (dağ silsiləsində gədiyin ən alçaq hissəsi) və -*an* (İran dillərində məkan və cəmlik anlayışı bildirən şək.) komponentlərindən düzəlib, "gözətçi məntəqəsi olan alçaq dağ aşırımı" mənasındadır

**Kerkəsik** *or , mür* Gədəbəy r-nu ərazisində dağ Oronim türk dillərindəki *kör/ker* (möhkəmləndirilmiş yer, gözətçi məntəqəsi, pusqu) və *kəsik* (aşırım, dağ sırasının alçaq yeri) komponentlərindən düzəlib, "gözətçi məntəqəsi olan aşırım" mənasındadır

**Kert** b a x Quzumkənd

**Keskən** *oyk., mür* Lerik r-nunun Osyedərə i ə v -də kənd Dağətəyi ərazidədir Oykonim talış dilindəki *kes/qes/ges* (yapışmış, yaxın) və *kəən* (məhəllə, evlər) sözlərindən düzəlib Kənddəki evlər bir-birinə yaxın olduğu üçün belə adlandırılmışdır

**Keş** *hidr , sadə* Dəvəçi r-nu ərazisində çay Sumqayıt ərazisindən axıb Xəzər dənizinə tökülür İlin çox vaxtı quru olur Xızı r-nu ərazisində Keçiçay adlanır Dağlıq ərazidə kiçik, dar dərələrlə axan dağ çayına *keş* deyilir

**Keşbaş** *hidr , sadə* Quba r-nunda çay Çağacıq çayının sol qoludur Hidronim *Keş* (Dəvəçi r-nundakı çayın adı) və *baş* (yuxarı) sözlərindən ibarət olub, "Yuxarı Keş, Keş çayının başı" mənasındadır

**Keşdək** *oyk , düz* Kəlbəcər r-nunun eyniadlı i ə v -də kənd Tərtər çayının sahilində, dağətəyi ərazidədir Yaşayış məntəqəsini XIX əsrdə keçmiş Dərələyəz mahalından gəlmiş fərruxxanlı tayfasına mənsub ailələr *Keşdək* adlı yerdə salmışlar Yerli əhali kəndin adını "keçid, keçid olan yer" kimi izah edir Tədqiqatçılar isə oykonimi "elat düşərgəsi", "koç", "sıldırım eniş", "hündür yer", "çox da böyük olmayan dik" mənaları ilə bağlayırlar

**Keşdiməz** *oyk , düz* Ağsu r-nunun Bico i ə v -də kənd Ləngəbiz silsiləsinin ətəyindədir Kəndin ərazisində Kişdeməz adlı pir də var Yerli əhali oykonimi bu pirin adı ilə bağlayır Rəvayətə görə, burada yaşayan mömin şəxs hətta toyuğa da "kiş!" deməzmiş Ona görə də ləqəbi Kişdeməz qalmışdır Pirə

"yara piri" kimi müraciət olunur Tədqiqatçılar bu oykonimi toponimik termin olan və "bərk dərə" mənasında işlənən *keçirtmaz* sözü ilə bağlayırlar

**Keşxurt** *oyk., mür* İsmayıllı r-nunun Qubaxəlilli i ə v -də kənd Dağətəyi ərazidədir Yerli əhali tərəfindən Keşqurt kimi tələffüz edilir. Yaşayış məntəqəsi XVIII əsrin sonlarında Qarabağdan gəlmiş ailələrin Xorsor dağının ətəyindəki Pərıbulaq adlı yerdə məskunlaşması nəticəsində yaranmışdır Oykonim *Keş* (dar dərədən axan kiçik dağ çayı) və *xurt* (kənd) komponentlərindən düzəlib, "kiçik dağ çayının sahilində kənd" mənasındadır Oykonimi "dərədə yurd", "qurd tayfasına mənsub kənd" kimi də izah edirlər

**Keşətəpə** *or mür* Qazax r-nunda dağ Kür çayının sol sahilindədir. Hün 277 m. XIX əsrdə Keştəpə variantında qeydə alınmışdır Oronim türk dillərindəki *köş* (elat düşərgəsi) və *təpə* komponentlərindən düzəlib, "elat düşərgəsi olan təpə" mənasındadır

**Keşişkənd** *hidr sadə* Kəlbəcər r-nunda çay Tərtər çayının sol qoludur Aşağı axarında qismən suvarma və dəyirmanların hərəkətə gətirilməsi üçün istifadə edilir Çay vaxtilə bu ərazidə mövcud olmuş *Keşişkənd* adlı yaşayış məntəqəsinin adından yaranmışdır Tovuz r-nunda da eyniadlı kənd var

**Keşiştəpə** *or, mür* Laçın r-nunun şm -ında dağ. Şəlvə kəndindən ş -də yerləşir Hün 2292 m Oronim *keşiş* (xristian ruhanisi) və *təpə* komponentlərindən düzəlib, ərazidəki *keşiş* komponentli yaşayış məntəqələrinin adı ilə bağlı yaranmışdır

**Keşkir** *hidr, mür* Kürdəmir r-nu ərazisində göl Hidronim *keş* (kiçik dağ çayı, dar dərələrdən axan çay) və *kir/gir* (dolmaq, yığılmaq) komponentlərindən düzəlib, "çayın dolduğu, yığıldığı yer" mənasındadır

**Keşkü** *oyk, sadə* Xanlar r-nunun Aşıqlı i ə v -də kənd Sarıyal dağının ətəyindədir Əslinin Köşkü olması ehtimal edilir Yaşayış məntəqəsi keçmişdə yaylaq köçlərinin dayanacaq yerində salınmışdır Oykonim *köçkü* sözündən olub, "köç yeri, müvəqqəti dayanacaq" mənasındadır

**Keşqutan** *oyk sadə* Qax r-nunun Qax İngiloy i ə v -də kənd Dağətəyi meşəlik ərazidədir Əsli Keşkutandır Oykonim *Keşqutan* hidronimindən yaranmışdır

**Keşqutan** *hidr, mür.* Quba r-nu ərazisində çay Hidronim *keş* (kiçik dağ çayı) və *qutan/kutan* (etn ) komponentlərindən düzəlib, "kutan çayı" mənasındadır

**Keşlə** *oyk., sadə* Bakı şəhəri, Nizami r-nu ərazisində ştq, d y stansiyası Keşlə adı mənbələrdə ilk dəfə XVII əsrdən çəkilir Keçmiş adı Keşləqışlaq olmuşdur Oykonim türk mənşəli *keşli/keşlə* tayfasının adını əks etdirir XVIII əsrə aid sənəddə keşlilərin və qaramanlı tayfalarının Qazaxlı, Ələsli və Borçalı yaylaqlarından istifadə hüququ haqqında məlumat verilir

**Keşməddin** *oyk., sadə* Şamaxı r-nunun Qalaybuğrut i ə v -də kənd Buğurt çayının (Ağsu çayının qolu) sahilində, dağlıq ərazidədir Keşmaddin variantında da qeydə alınmışdır Yerli əhalinin məlumatına görə, kəndin adı Keçmədin olmalıdır Ərazi sıx meşəlik və dağlıq olduğundan vaxtilə guya toqquşma zamanı qoşun Qaladərəsi kəndi istiqamətinə keçə bilmədiyi üçün kənd belə adlandırılmışdır Kəndin ərazisindəki Davalı nova, Yaralı düzü kimi mikrotoponimləri də kəndin adı ilə əlaqələndirirlər Lakin güman etmək olar ki, kəndin adı qədim türk dillərindəki *keşmə/keçmə* (körpü) və *din* (dağlıq ərazidə yaylaq, dayanacaq) komponentlərindən düzəlib, "körpü yaylaq" mənasındadır

**Keştaz** *oyk., mür* Şərur r-nunun Dərvişlər i ə v -də kənd Arazboyu düzənlikdədir Oykonim qəd türk dillərindəki *keş* (kəmər, qurşaq) və Azərb dialektlərində izi saxlanılmış qəd *taz* (uzun) sözlərindən düzəlib, "uzun qurşaq" mənasındadır və kəndin yerləşdiyi ərazini təyin edir 2003-cü ildən kəndin adı Çəmənli kimi rəsmiləşdirilmişdir

**Keştazlı** *oyk, düz* Ağdam r-nunun Qiyaslı i ə v -də kənd Qarabağ düzündədir Yaşayış məntəqəsi vaxtilə Şərur əyalətinin Keştaz kəndindən köçüb gəlmiş ailələrin məskunlaşması nəticəsində yaranmışdır Oykonim "Keştazdan olanlar, keştazlılar" mənasındadır

**Keşunkar** *or, mür* Oğuz r-nu ərazisində dağ Baş Qafqaz silsiləsinin c yamacında zirvədir. Hün 2808 m Oronim *keşun* (monqol dilindən Azərb dilinə keçmiş *xuşun/qoşun*







variantlarında işlənən "sıldırım qaya" mənasını ifadə edən sözdür) və *kar* (ucalıq, yüksəklik) sözlərindən düzəlib, "sıldırım qayalı yüksəklik" mənasındadır.

**Ketam** *or, sadə* Ordubad r-nu ərazisində dağ Oronimi bəzi tədqiqatçılar Kuhitam toponiminin təhrif olunmuş variantı hesab edir və bu sözü İran dillərindəki *kuh* (dağ) və türk dillərindəki *tam/dam* (ev, tikili, hasar) sözlərinin birləşməsi olaraq "ev olan, tikili olan dağ" kimi izah edirlər Türk dillərində, o cümlədən Azərb. dilinin dialektlərində *kat/ket/kot/köt/kut/küt* "alçaq boylu", "qısa", "kök", "yığın, topa", "qurğu", "var-dövlət" mənalarında işlənir, *-am* isə sözdüzəldici şək -dir Bu baxımdan oronimi "alçaq boylu dağ", "təpə" kimi də izah etmək olar

**Ketam** *hidr, sadə* Ordubad r-nu ərazisində çay Araz çayının sol qoludur Çay ərazidəki eyniadlı dağın adını daşıyır

**Ketam** *oyk., sadə* Ordubad r-nunun Ordubad şəhər i ə v -də kənd. Ketam çayının sahilində, dağətəyi ərazidədir Yerli əhali arasında Kotam variantında da işlənən bu ad Ketam dağının adından yaranmışdır

**Ketidağ** *or. mür* Kəlbəcər r-nu ərazisində dağ Azərb -la Ermənistanın sərhədindədir Yerli əhali tərəfindən Keyti dağı adlanır Dağla bağlı xalq arasında bir çox əfsanə və rəvayətlər mövcuddur Tədqiqatçıların ehtimalına görə, oronim türk dillərindəki *kat* (dağın meşəsiz, gündüşən tərəfi, pillələri, sıra) sözündən əmələ gəlmişdir

**Keyban-Ləkit** *or, mür* Lənk r-nu ərazisində dağ Oronim *key* (hündür, yüksək), *ban* (baş, zirvə) və *Ləkit* ("ləklərə aid yer" mənalı etnotoponim) komponentlərindən düzəlib, "ləklərə məxsus dağ zirvəsi" mənasındadır Dağın ərazisi vaxtilə talış zonasında yaşayan ləklərə məxsus yaylaq yurdu olduğu üçün dağ belə adlandırılmışdır Cəlilabad r-nunda da ləklərin adı ilə bağlı olan Ləkin kəndi mövcuddur

**Keymərəz** *oyk sadə* Xaçmaz r-nunun Qalağan i ə v -də kənd Samur-Dəvəçi ovalığındadır Keçmiş adı Ərəb Keymuraz olmuşdur Kəndin *Keymuraz* adlı boyə məxsus ailələrin məskunlaşması nəticəsində yaranması ehtimal edilir

**Keyrəki** *or, düz* Bakı şəhəri yaxınlığında, Binəqədi qəsəbəsindən c -q -də palçıq vulkanı Tədqiqatçılara görə, oronim tat dilindəki *koraku* ifadəsinin təhrif olunmuş variantıdır *Koor* (yaşıl, göy) və *ku* (dağ) sözlərindən düzəlmiş bu coğrafi ad "yaşıl dağ" mənasında izah olunur və kəsik konus formalı vulkanın kraterindən çıxan lavanın açıq yaşıl və ya göyə çalan rəng alması ilə əlaqələndirilir Əslində, oronim Azərb dilinin dialektlərində "qaynar, dağ olmuş" mənasında işlənən *keyrak* sözündən və İran dillərində mənsubluq bildirən *-i* şək -sindən düzəlib, Abşerondakı Yanardağ oroniminin sinonimidir

**Keyrəkli** *or, düz* Gədəbəy r-nunda dağ Oronim *keyrək* (yanan, püskürən) və *-li* (şək.) komponentlərindən düzəlib, "yanan, püskürən dağ" mənasındadır Dağın adı vaxtilə burada baş vermiş vulkanlarla əlaqədar yaranmışdır

**Keyvəndi** *oyk, mür* İsmayıllı r-nunun eyniadlı i ə v -də kənd. Baş Qafqaz silsiləsinin ətəyindədir Kənd keçmişdə Dağıstanın c -undakı Keyvən kəndindən gəlmiş ailələrin məskunlaşması nəticəsində yaranmışdır Tədqiqatçılar bu oykonimi *Keyvən* (kənd adı) və *di* (tat "kənd") komponentlərinin birləşməsi kimi "Keyvən kəndi" mənasında izah edirlər Azərb dilinin bir çox dialektlərində heyvanların belinə qoyulan çula, yük daşımaq üçün işlənən haça ağaca və ya qırxılmayıb saxlanılan bir parça yuna da *keyvənd* deyilir Bu mənada oykonimi "dağ kəndi", "yüksəklikdə olan kənd" kimi də izah etmək olar

**Kəbər Zəyzit** *oyk mür* Şəki r-nunun Zəyzit i ə v -də kənd Baş Qafqaz silsiləsinin ətəyində, Alazan-Əyriçay çökəkliyindədir Oykonim Kübər Zəyzit variantında da qeydə alınmışdır *Kəbər* komponenti yaşayış məntəqəsini r-nun ərazisindəki Baş Zəyzit və Orta Zəyzit kəndlərindən fərqləndirməyə xidmət edir Oykonim *kəbər* (xəzərlərin *kəbir* tayfa adı) və *zəyzit* (*zəkzit/zəqzit* variantlarında da təsadüf edilən bu ad monqol tayfalarından birinə məxsusdur) komponentlərindən düzəlib "kəbirlilərə məxsus Zəyzit kəndi" deməkdir

**Kəbirli** *oyk., sadə.* 1. Beyləqan r-nunun eyniadlı i.ə.v.-də kənd. Mil düzündədir; 2. Tərtər r-nunun Xoruzlu i.ə.v.-də kənd. Qarabağ düzündədir. Yaşayış məntəqələrinin adı qədim xəzərlərin *kəbər* (*kəbirli*) tayfasının adı ilə bağlıdır. Məlumdur ki, xəzərlər eranın əvvəllərindən bəri Qafqaz Albaniyası ilə əlaqədə olmuş, erkən orta əsrlərdə buraya dəfələrlə xəzər ailələri köçürülmüşdü. Xanlıqlar dövründə Azərb.-da Kəbirli mahalı mövcud olmuş, sonralar Cavad qəzasında Kəbərri, Ərəş qəzasında Gəndə Kəbərri (aralı Kəbərri) kəndləri, Cavanşir qəzasında Kəbərdi çayı qeydə alınmışdır. XIX əsrin axırlarında Qarabağın qədim tayfalarından biri olan kəbirlilərin 4 qoldan (qərvəndli, qızılməhəmmədli, arıqməhəmmədli və ulubabalı) və 36 nəsildən ibarət olması haqqında məlumat verilir.

**Kəbləəhmədli** *oyk., düz.* Tovuz r-nunun Yanıqlı i.ə.v.-də kənd. Zəyəm çayının hər iki sahilində, dağətəyi ərazidədir. Əsli Kərbəlayı Əhmədlidir. Yerli əhali arasında Əhmədli də adlanır. Yaşayış məntəqəsini *Kərbəlayı Əhməd* adlı şəxs saldığı üçün kənd onun adı ilə adlandırılmışdır. Oykonim Kəlbəəhmədli variantında da qeydə alınmışdır.

**Kəbləhüseynli** *oyk., sadə.* 1. Ağdam r-nunun Xındırıstan i.ə.v.-də kənd. Qarabağ düzündədir; 2. Masallı r-nunun Çaxırlı i.ə.v.-də kənd. Düzənlikdədir. Yaşayış məntəqələri *kəblahüseynli* (Kərbəlayi Hüseyn şəxs adı ilə bağlıdır) nəsli tərəfindən salındığı üçün belə adlandırılmışdır. Oykonim Kəlbəhüseynli variantında da qeydə alınmışdır.

**Kəcəvənd** *oyk., sadə.* Tovuz r-nunun Yanıqlı i.ə.v.-də kənd. Zəyəm çayının sahilindədir. Yaşayış məntəqəsi nisbətən yüksək dağlıq ərazidə yerləşən kiçik kənd olub, əlverişli mövqeyə, təbii gözəlliyə malikdir. Kəndin ərazisində Sultan səkisi adlı yer də mövcuddur. Yerli əhalinin məlumatına görə, əvvəllər burada Türkiyə sultanına məxsus istirahət yeri olmuş, çadır və kəcəvə qurulduğu üçün belə adlandırılmışdır.

**Kəhriz dərəsi** *hidr., mür.* Şərur r-nu ərazisində çay. Hidronim *kəhriz* (quyu, bulaq) və *dərə* (çay dərəsi) komponentlərindən düzəlib (burada -(s)i mənsub şək.-sidir), "bulağı olan çay dərəsi" mənasındadır.

**Kəhrizoba** *oyk., mür.* Şəki r-nunun Cəfərabad i.ə.v.-də kənd. Alazan-Əyriçay çökəkliyindədir. Oykonim *kəhriz* (içməli suları toplayıb yer səthinə çıxarmaq üçün yeraltı quyu) və *oba* sözlərinin birləşməsindən düzəlib, "kəhriz yanında oba" mənasındadır.

**Kəkildağ** *or., mür.* 1. Qazax r-nunun şm.-q.-ində dağ. Gürcüstanla sərhəddə yerləşir. Hün. 730 m.; 2. Gədəbəy r-nu ərazisində dağ. Dağların zirvəsində kəkilə oxşar dik qaya olduğuna görə belə adlandırılmışdır.

**Kəkilnohur** *hidr., mür.* Şamaxı r-nu ərazisində göl. Astraxanka (Qızmeydanı) kəndindən şm.-da yerləşir. Şırınsulu, axarlı kiçik göldür. Keçmişdə ətraf maldar ellərin yaylaq yeri olmuşdur. Nohurun ortasında kəkilə oxşar qamış topası olduğuna görə belə adlandırılmışdır.

**Kəl** *or., sadə.* İsmayıllı r-nu ərazisində dağ. Oronim "baş, zirvə" mənasındadır.

**Kəlbəcər** *oyk., mür.* 1. Azərb.-nın q. hissəsində inzibati r-n. Tərtər çayının yuxarı axarındadır. R-n şm.-da Murovdağ silsiləsi ilə c.-da Mıxtökən silsiləsi arasında qalan dağlıq ərazini tutur. R-nun q.-ində Ermənistan sərhədi boyunca Zəngəzur sıra dağları uzanır. Vulkan mənşəli süxurlar geniş yayılmışdır. Min bulaqları çoxdur (İstisu və b.). R-nun ərazisindən Tərtər çayı və onun qolları olan Tutqun və Lev çayları axır. Mərkəzi Kəlbəcər şəhəridir; 2. Azərb.-da şəhər, eyniadlı r-nun mərkəzi. Tərtər çayının sahilində, sıldırım qayalıq üstündə 1560 m. yüksəklikdə yerləşir. Bəzi tədqiqatçılar oykonimin ilkin variantının Kevliçer olduğunu güman edir və onu qəd. türk dillərində "çay üstündə qala" (*kevli* – "çayın üstü" və *çer/car* – "qala") kimi izah edirlər. Yaşayış məntəqəsinin yerləşdiyi qayada Tərtər çayı boyunca cərgə ilə düzülmüş qədim süni mağaraların mövcudluğuna əsaslanan bir qrup tədqiqatçı oykonimi *kevil* (fars. "mağara", Azərb. dilində *kühül* kimi də işlənir) sözü ilə əlaqələndirib onun *kəvl* və qəd. türk dillərindəki *car* (qaya, yarğan) komponentlərindən ibarət "kühüllü yarğan, mağaralı yarğan" mənasında olduğunu iddia edirlər. Bəzi tədqiqatçılara görə isə, toponim qəd. türk dillərindəki *kevli* (çayın ağzı) və *car* (dərə, yarğan, əks tərəf) sözlərindən düzəlib, "çay ağzının əks tərəfi" mənasındadır və əvvəllər Kəbləcər formasında olmuş, sonralar tədricən cildini dəyişmişdir.





**Kəlbənd** *or., mür.* Astara r-nunda dağ. Oronim *kəl* (baş, zirvə) və *band* (kiçik dağ) sözlərindən düzəlib, "dağ başı, dağ zirvəsi" deməkdir.

**Kəlbənd** *oyk., sadə.* İsmayıllı r-nunun eyniadlı i.ə.v.-də kənd. Burovuldağ silsiləsinin ətəyindədir. Kənd yaxınlığındakı dağa görə "dağ başı, dağ zirvəsi" mənalı bu adı almışdır. Tədqiqatçılar bu toponimi "məbəd dağı, məbədi olan dağ" kimi də izah edirlər.

**Kələbağ** *oyk., mür.* Quba r-nunun Rustov i.ə.v.-də kənd. Kamalçayın sahilində, Baş Qafqaz silsiləsinin ətəyindədir. Yaşayış məntəqəsinin ərazisi əvvəllər Rustov kəndinə məxsus meyvə (alma) bağları olmuşdur. Müharibədən sonrakı illərdə Rustovun müxtəlif məhəllələrindən çıxmış ailələr burada məskunlaşdıqdan sonra daimi yaşayış məntəqəsinə çevrilmiş bağlar bu adı almışdır. Oykonim *kələ* (tat. "böyük") və *bağ* sözlərindən düzəlib, "böyük bağ, iri bağ" deməkdir.

**Kələdəhnə** *hidr., mür.* Astara r-nu ərazisində, Xəzər dənizi sahilində şirin sulu, axarlı göl-bataqlıq. Hazırda qurudulmuşdur. Keçmişdə bu gölə Lovaynaru, Daqabıru və Şuaçay adlı çaylar tökülürdü. Buraya tökülən çayların Xəzər dənizinə bilavasitə çatması üçün kanal qazılmışdır. Tədqiqatçılara görə, hidronimin əsli Qaladəhnədir. Hidronimin *qala* və fars dilindəki *dəhnə* (ağız, başlanğıc) sözlərindən düzəlib, "qala yaxınlığında çayların töküldüyü su hövzəsi" mənasında olduğu güman edilir. Gölün yaxınlığında qədim qala xarabalığı var. Hidronim Kəllədəhnə variantında da qeydə alınmışdır.

**Kələfərəc** *oyk., sadə.* İsmayıllı r-nunun Tağlabiyan i.ə.v.-də kənd. Niyaldağın yamacındadır. Kəlfərəc variantında da qeydə alınmışdır. Kəndin adı ərazisindəki Kəlfərəc dağının adından yaranmışdır. Yaşayış məntəqəsi Kələkənd də adlanır. Oykonim ərəb dilindəki *kələ* (sərdabə, zaviyə) sözündən və *Fərəc* şəxs adından düzəlmişdir, "Fərəcin sərdabəsi" deməkdir.

**Kələxan** *oyk., mür.* Lerik r-nunun Qosmalyan i.ə.v.-də kənd. Peştəsər silsiləsinin ətəyindədir. Tədqiqatçılara görə, oykonim *kəl* (yekə, güclü, zorba) və *Əxan* (Ağaxan adının qısaldılmış forması) sözlərindən və yaxud *kələ* (camış) və *xan* (*xana* sözünün qısaldılmış forması olub, "ev", "tikili" mənasındadır) komponentlərindən düzəlib, "güclü Ağaxan" və ya "camış saxlanılan yer" mənasındadır.

**Kələxana** *oyk., sadə.* Şamaxı r-nunun Şamaxı şəhər i.ə.v.-də kənd. Şamaxı platosundadır. Tarixi-memarlıq kompleksi olan Kələxana türbələri buradadır. Kəndin adı bu türbələrin adından alınmışdır. Toponim ərəb dilindəki *kələ* (məbəd, sərdabə, zaviyə) və fars dilindəki *xana* (bina, ev, tikili) komponentlərindən düzəlib, "məbəd, sərdabə, kompleks tikili" mənasındadır.

**Kələxana** *hidr., sadə.* Şamaxı r-nunda çay. Kələxana kəndinin ərazisindən axır. Çay eyniadlı kəndin adını daşıyır.

**Kələk** *oyk., sadə.* Goranboy r-nunun Xınalı i.ə.v.-də kənd. Gəncə-Qazax düzənliyindədir. Yerli əhalinin məlumatına görə, yaşayış məntəqəsinin əsasını keçmiş Tiflis quberniyasının Axalkalaki r-nundan gəlmiş ailələr qoymuş, yeni yaşayış məntəqəsinə də keçmiş yurdlarının adını vermişlər. Sonralar toponimin tərkibindəki *axal* komponenti və *kalakı* sözündən isə *i* saiti düşmüşdür. Tədqiqatçılara görə isə, oykonim İran dillərində "qala" mənasında işlənən *kalak/kələk* sözündəndir, yaxud XIX əsrdə Gəncə qəzasında maldarlıqla məşğul olmuş *kələk* adlı icmanın adını əks etdirir.

**Kələki** *or., mür.* Dəvəçi r-nunda dağ. Dağ Quşçu kəndindən c.-q.-də yerləşir. Hün. 403 m. Tədqiqatçılara görə, dağın adı ərəb dilindəki *kələ* (məbəd, zaviyə, sərdabə) və tat dilindəki *ki* (dağ) sözlərindən düzəlib, "məbəd dağı" deməkdir.

**Kələki** *oyk., sadə.* Ordubad r-nunun Dırnıs i.ə.v.-də kənd. Vənənd çayının sahilində, Uçurdağın ətəyindədir. Kənd öz adını yaxınlığındakı məbəd xarabalığından almışdır. Oy-

konim ereb dilindeki *kala* (mebed) ve fars dilindeki *kuh* sözünün fonetik variantı olan *kı* (dağ) sözlerinden düzelib, "mebed dağı" menasındadır

**Keleqoparan** *or* *sade* Quba r-nunda dağ Yerfi kendinden şm -ş -de yerleşir Hün 2070 m Əsli Kelleqoparandır ve hemin dağın eteyinde ve yamaclarındakı çox soyuq sulu bulaqların ümumi adıdır İsti havada içildikde derhal başağrısı verdiyine göre bele adlandırılmışdır Dağ öz adını hemin bulaqlardan almışdır Yerli ehalinin melumatına göre, keçmişde etraf r-nların ehalisi yay vaxtı Baba dağına ziyarete gederken hemin bulaqlardan ehtiyat su götürürdüler Oronim Qalaqoparan variantında da qeyde alınmışdır

**Keleqova** *or , mür* Quba r-nu erazisinde dağ Baş Qafqaz silsilesinin şm -ş yamacında, Qaraçayın sağ sahilinde yerleşir Hün 2334 m Tedqiqatçılara göre, oronim *Qaleyi-Quba* (Quba qalası) adından yaranmışdır

**Keleman** *oyk., sade* Gedebey r-nunun Poladlı i e v -de kend Keleman çayının (Zeyem çayının qolu) deresinde, dağlıq erazidedir Yerli ehali arasında Kalaman kimi teleffüz olunur Yaşayış menteqesi el arasında Kalaman adlanan ve "qala, istehkam yeri" menasında izah olunan qedim yaşayış yerinde salındığı üçün bele adlandırılmışdır

**Kelemeddin** *or . sade* Şamaxı r-nu erazisinde dağ ve palçıq vulkanı İncebel dağının c -q davamıdır Oronim Qalameddin, Malameddin variantlarında da qeyde alınmışdır Tedqiqatçıların ehtimalına göre, esl adı Kemaleddin olan bu dağın erazisi keçmişde *Kamaləddin* adlı şexsin qışlağı olduğu üçün bele adlandırılmışdır

**Kelence** *or , mür* Quba r-nu erazisinde dağ Qaraçay ve Ağçayın suayrıcında yerleşir Hün 2559 m Oronim *qala* ve *ancə* (qıpçaq tayfalarından biri) sözlerinden ve ya *kal* (baş, zirve) ve *anca* komponentlerinden düzelib, "encelerin qalası" ve yaxud "encelere mexsus dağ zirvesi" menasındadır Ehtimal ki, dağın erazisi *anca* tayfasına mensub ailelerin yaylaq yeri olmuşdur

**Kelenov** *oyk , mür* Quba r-nunun Zerqova i e v -de kend Dağeteyi erazidedir Oykonim *kala* (tat "böyük") ve *nov* (çökek yer, qobu, kiçik dere) sözlerinden düzelib, "böyük nov, böyük qobu" menasındadır Toponim kendin salındığı erazini relyef cehetden tesvir edir

**Kelenter** *hidr , sadə* Quba r-nunda çay Cimi çayını emele getiren qollardan biridir Azerb dilinin dialektlerinde *kalantar* "yoğun", "sağlam" menasında işlenir Görünür, çay enli, güclü olduğu üçün bele adlandırılmışdır

**Kelenter Dize** *oyk., mür* Ordubad r-nunun Aza i e v -de kend Dağeteyi erazidedir Oykonim *kalantar* (orta esrlerde beylerbeyi terefinden teyin edilmiş ticaret ve senetkarlığa nezaret eden şexs, nesli vezife adı) ve *Dizə* ("kend", "yaşayış menteqesi" menası bildiren kend adı) komponentlerinden düzelib, "kelentere mexsus Dize kendi" menasındadır XVI esrde Hetem bey Ordubadinin neslinden kelenterlerin irsen seçilmesi haqqında melumat verilir Güman etmek olar ki, bu kend de hemin neslin nümayendelerine mexsus olmuşdur

**Kelenterli** *oyk., sadə* Berde r-nunun eyniadlı i e v -de kend Qarabağ düzündedir Yaşayış menteqesi ilk defe hemin erazide meskunlaşmış *kalantarli* neslinin adını daşıyır Etnotoponimdir

**Kelenteroba** *oyk . mür* Qusar r-nunun Şirvanovka i e v -de kend Düzenlikdedir Oykonim *Kalantar* (ş a ) ve *oba* komponentlerinden düzelib, "Kelentere mexsus oba, Kelenterin obası" menasındadır Kollektivleşmeden sonra daimi yaşayış yerine çevrilmişdir

**Kelet** *or , sadə* Qusar r-nu ile Dağıstanın serhedinde aşırım Sarıqaya dağından keçir Hün 2708 m Oronim fars dilindeki *kalat* (qala) sözündendir Dağın adı oradakı qedim qala xarabalığı ile bağlı yaranmışdır

**Kelezeyve** *oyk , mür* İsmayıllı r-nunun Sulut i e v -de kend Niyaldağ silsilesinin eteyindedir Oykonim *kala* (tat "böyük, baş") ve *Zeyva* (kend adı; er zaviye "hücre" demekdir) komponentlerinden düzelib, "böyük Zeyve kendi" menasındadır

**Kelgez** *or , mür* Quba ve Şamaxı r-nları serhedinde Baş Qafqaz silsilesinin zirvesidir





Hün 2135 m Əsli Kelegezdir Oronim tat dilindeki *kala* (böyük, baş) ve Azerb dilindeki *gəz* (aşırım) komponentlerinden düzelib, "böyük dağ aşırımı" menasındadır

**Kelikdağ** *or* *mür* Zengilan r-nunda zirve Oronim *kəlik* (üstü yastı) ve *dağ* komponentlerinden düzelib, "üstü yastı dağ zirvesi" menasındadır

**Kelveşte** *or , sadə* Lenk r-nu erazisinde dağ Cenubi Azerb -la serheddedir Hün 1905 m Dağın adı Qelepeşte toponiminin tehrif olunmuş forması hesab edilir Oronim yerli danışıq dilinde Kelvaşte formasında işlenir Oronimin Kyalvaşta variantına da tesadüf edilir Bu variant coğrafi adın rusca teleffüz formasıdır Dağın adı *kəl* (yaşlı erkek camış) ve talış dilindeki *vaşta* (tullanan, atlanan) sözlerinden düzelib, "kel tullanan dağ" menasındadır

**Kelvez** *oyk., mür* Lenk r-nunun Qosmalyan i e v -de kend. Peşteser silsilesinin eteyindedir Kendin adı XVI esre aid "Şeyx Sefi tezkiresi"nde Kelevez kimi qeyde alınmışdır Yerli ehalinin melumatına göre, yaşayış menteqesini güclü, qüvvetli, azman olan *Əvəz* adlı şexs saldığı üçün Kelevez adlandırılmışdır

**Kelvezçay** *hidr , mür* Lenk r-nu erazisinde çay Çay Kelvez kendi erazisinden axdığı üçün bele adlandırılmışdır

**Kelvezin** *hidr , düz* Lenk r-nunda çay Hidronim *Kalvaz* (kend adı) ve *-in* (yiyelik hal şek -si) komponentlerinden düzelib, "Kelvez kendine mexsus çay" menasındadır

**Kemçe** *or , sadə* Xızı r-nu erazisinde dağ Baş Qafqaz silsilesinin c -ş qurtaracağında zirvedir Hün 1028 m Tedqiqatçılara göre, dağın adı tat dilindeki *gamça* (düzen sahede çay yatağı) sözü ile bağlıdır Lakin Azerb dilinde "kesik, başı kesik", "ucu kesilmiş" menalarında *kəmçə/kəmçik* sözü de işlenmekdedir ki, dağın adı da mehz bu sözle bağlı ola biler

**Kemendqaya** *or , mür* Qazax r-nu erazisinde dağ Ermenistanla serhedde yerleşir Hün 921 m Keçmişde maldar ellerin yaylaq yeri olmuşdur Oronim *kəmənd* (heyvan tutmaq üçün uzaqdan atılan ucu ilmekli uzun kendir) ve *qaya* sözlerinden düzelib, "kemend atmaq üsün elverişli qayası olan dağ" menasındadır

**Kemerli** *oyk., sadə.* Qazax r-nunun eyniadlı i e v -de kend İnceçayın sahilinde, dağlıq erazidedir Yaşayış menteqesi Qazax tayfa ittifaqına daxil olan *kəmərli* tayfasının meskunlaşması neticesinde yaranmışdır Menşece qıpçaq tayfalarından olan kemerlilerin adına İrandakı qaşqayların terkibinde, Ermenistan, Türkiye toponimiyasında da rast gelmek mümkündür Tedqiqatçılar kemerli etnonimini menşece e e VII esrde Cenubi Qafqaza gelmiş *kimmerilərlə* de elaqelendirirler

**Kemerli** *or , sadə* Daşkesen r-nunda dağ. Zeylik kendinden c -dadır Kemerdaş, Kemerqaya variantlarında da qeyde alınmışdır Etnotoponimdir

**Kemerliçöl** *or , mür* Qazax r-nu erazisinde dağ Ermenistanla serheddedir Dağın erazisi Kemerli kendinde yaşayan maldar ellerin yaylaq yurdu olduğundan bele adlandırılmışdır

**Kenarçay** *oyk., mür* Qusar r-nunun Sudur i e v -de kend Sudur çayının sahilinde, dağeteyi erazidedir Oykonim *kənar* (burada "sahil" menasındadır) ve *çay* sözlerinden düzelib, "çay sahili" demekdir Yaşayış menteqesi Böyük Veten müharibesinden sonra müxtelif kendlerden gelmiş ailelerin meskunlaşması neticesinde yaranmışdır Kendin adı Qenerçay variantında da qeyde alınmışdır

**Kenaremeşe** *oyk., mür* Lenkeran r-nunun Aşağı Nüvedi qesebe i e v -de kend Xezer denizi sahilinde, Lenkeran ovalığındadır Kenarmeşe variantında da qeyde alınmışdır Oykonim *kənar* (qıraq) ve *meşə* sözlerinden düzelib (burada *-ə* mensubluq bildirir), "meşe kenarı" menasındadır Kend heqiqeten de meşenin kenarında yerleşir

**Kende** *hidr , mür* Xızı r-nu erazisinde çay Sumqayıt çayının sol qoludur Əsl adı Kendedur Çayın adı tat dilindeki *kənd/gənd* (bulanıq, pis qoxulu, çirkli) ve *o/ov* (su) sözlerinden düzelib, "bulanıq, qoxulu su, çirkli su" menasındadır

**Kendaxan** *oyk , mür* Ağsu r-nunun Gürcüvan i e v -de kend Dağeteyi düzenlikdedir Keçmişde Kendüvan da adlanmışdır Yerli ehalinin melumatına göre, yaşayış mente-

qəsini *Kəndaxan* adlı bir şəxs saldığı üçün kəndə onun adı qoyulmuşdur. Əslində, istər yaşayış məntəqəsinin keçmiş adı, istərsə də indiki adı "kənd yeri" mənasındadır.

**Kəndxurd** *oyk., mür.* Xocavənd r-nunun eyniadlı i.ə.v.-də kənd. Qarabağ silsiləsinin ətəyindədir. Kəndin əhalisi XIX əsrdə Cənubi Azərb.-nın Qaradağ mahalından, Türkiyənin Qars, Muş və Sarıqamış əyalətlərindən köçüb gəlmiş ailələrdən ibarətdir. Oykonim *kənd* və bəzi türk dillərində "kənd" mənasında işlənən *xurd* sözlərindən düzəlib, "kənd" deməkdir. Oykonimi "yüksəklikdə yerləşən kənd" mənasında da izah edirlər.

**Kəndi** *or., sadə.* Şəmkir r-nu ərazisində dağ. Axınca və Əsrik çaylarının suayrıcında yerləşir. Hün. 1600 m. Dağ uzaqdan *kəndiyə* (keçmişdə taxıl və un saxlamaq üçün gildən düzəldilmiş xüsusi qab) oxşadığına görə belə adlandırılmışdır.

**Kəndoba** *oyk., mür.* Ağsu r-nunun eyniadlı i.ə.v.-də kənd. Şirvan düzündədir. Yaşayış məntəqəsi vaxtilə Qaraağaclı kəndinin yaxınlığında oba (müvəqqəti yaşayış məntəqəsi) olmuş, daimi yaşayış məntəqəsinə çevrildikdən sonra Qaraağaclı kəndi də ona birləşdirilmişdir. *Kənd* və *oba* komponentlərinin birləşməsindən düzəlmiş oykonim də buradan yaranmışdır.

**Kəndyeri** *oyk., sadə.* Kəlbəcər r-nunun Çaykənd i.ə.v.-də kənd. Tərtər çayının sahilində, dağətəyi ərazidədir. Yaşayış məntəqəsini XIX əsrdə Laçın r-nunun Alxaslı kəndindən köçmüş ailələr qədim kəndin xarabalıqlarının qalıqları olan və *Kəndyeri* adlanan ərazidə salmışlar. Həmin ərazinin adı da yeni kəndə verilmişdir.

**Kənəə** *oyk., mür.* İsmayıllı r-nunun Lahıc qəsəbə i.ə.v.-də kənd. Dağətəyi ərazidədir. Keçmiş adı Kənəgə olmuşdur. Oykonim Kənagah adının təhrif olunmuş forması hesab edilir. Tədqiqatçılara görə, toponim tat dilindəki *kəna* (mədən, yataq) və *gah* (məkan yer) sözlərindən ibarət olub, "mədən olan yer" mənasındadır.

**Kəngərli** *oyk., sadə.* 1. Ağdam r-nunun Göytəpə i.ə.v.-də kənd. Qarabağ düzündədir; 2. Tərtər r-nunun Qaradağlı i.ə.v.-də kənd Qarabağ düzündədir. Oykonimlər peçeneqlərin tərkib hissəsi olan qədim türk mənşəli *kəngərli* tayfasının adı ilə bağlıdır. Mənbələrə görə, eramızın əvvəllərində hunların tərkibində Cənubi Qafqaz ərazisinə gəlmiş kəngərlər Azərb. ərazisində əsasən iki zonada – Naxçıvanda və Azərb.-nın q.-ində məskunlaşmışlar. V əsrə aid mənbədə kəngərlərin Ermənistan-Albaniya sərhədində, Albaniyanın q. sərhədində və indiki Qukasyan (Ermənistan) ərazisində yaşamaları göstərilir. Kəngərlər Ermənistan ərazisindəki Kəngər dağları (hazırda Qukasyan r-nu ərazisində Kəngərdağ adlı dağ var) ətrafından Kür vadisinə – Kəngər əyalətinə gəlmişlər. VII əsr erməni mənbəyinə əsasən, İberiyada (güman ki, Albaniyanın Gürcüstanla sərhədində) Kəngər əyaləti olmuşdur. Erkən orta əsrlərdə həmin zonada yaşayan qazaxların tayfa birliyinə *kəngərli* tirəsi də daxil idi. Kəngərlərin başqa hissəsi isə hələ qədimdən Naxçıvan bölgəsində yaşamışdır. Erkən orta əsr erməni mənbələrində Ararat vilayətində Kəngər mahalı haqqında məlumat verilir. Kəngərlər orta əsrlərdə Naxçıvanda daha çox müstəqilliklərini və etnik mənsubiyyətlərini saxlamışdılar. Kəngərlilərin müxtəlif ərazilərdə məskunlaşması məlumdur. XVIII əsrdə Qarabağ xanı Pənahəli xan Cavanşir (1747-60) Naxçıvandan kəngərlilərin bir hissəsini Qarabağa köçürmüşdü. Buradan isə onların bir hissəsini Quba xanı Fətəli xan (1758-89) Quba xanlığına aparmışdı.

**Kəngərli** *or., sadə.* Ağdam r-nu ərazisində dağ. Boyəhmədli kəndindən şm.-ş.-də yerləşir. Hün. 318 m. Oronim Qarabağda yaşamış *kəngərli* tayfasının adı ilə bağlıdır.

**Kəngərli düzü** *or., mür.* Şərur r-nu ərazisində maili düzənlik. Oronim Naxçıvan ərazisində yaşamış *kəngərlilərin* adı ilə bağlıdır.

**Kənizdağ** *or., mür.* Qaradağ r-nu, Qobustan qəsəbəsi yaxınlığında palçıq vulkanı. Duvannı d.y. stansiyasından c.-dadır. Hün. 393 m. Dağın başında qədim xarabalıq mövcuddur. Oronim ərəb dilindəki *kənisə* (kilsə, məbəd) və Azərb. dilindəki *dağ* sözlərindən düzəlib, "məbəd olan dağ, kilsəli dağ" mənasındadır.





**Kənzə** b.a.x: Gənzə.

**Kəpənəkçi** *oyk., sadə.* Zaqatala r-nunun Mosul i.ə.v.-də kənd. Alazan-Əyriçay çökəkliyindədir. Oykonim *kəpənəkçi* tayfa adı ilə bağlıdır. Vaxtilə yapıncı düzəldən adamları yerli əhali *kəpənəkçi* adlandırırdı. Gürcüstan ərazisində də azərb.-lar yaşayan Kəpənəkçi kəndi var.

**Kəpəz** *or., sadə.* Kiçik Qafqazda dağ. Xanlar r-nu ərazisində, Murovdağ silsiləsinin şm. yamacındadır. Ağsu çayının mənbəyi buradadır. Hün. 3030 m. Güclü zəlzələlər nəticəsində dağda bir neçə dəfə uçqunlar olmuşdur. 1139-cu il sentyabrın 30-da baş vermiş zəlzələ nəticəsində bu dağdan böyük qaya parçaları qoparaq Ağsu çayının dərəsinə tökülmüş və çayın qabağını kəsmişdir. Nəticədə çayın yatağında Göygöl, Maralgöl və b. göllər əmələ gəlmişdir. Bəzi tədqiqatçılara görə, *kəpəz* sözü türk dillərində "qaya" və ya "su kənarında qaya" mənasındadır. Bir qrup tədqiqatçılar isə oronimin *kəp* (Azərb. dilinin bəzi dialektlərində "pillə", "pilləli qaya") və *kəz/gəz* (dağ başında batıq, çökək) komponentlərindən ibarət olub, "zirvəsi çökəkli, pilləli, qayalı dağ" mənasını bildirdiyini göstərirlər. Dağın bu adı alması, görünür, onun zəlzələdən sonra pilləli, qayalı şəklə düşməsi ilə əlaqədardır. XII-XIII əsr müəllifləri (N.Gəncəvi, Zəkəriyyə Qəzvini və b.) dağın adını Hərək kimi qeydə almışlar. Türkmənistan ərazisində də Hərəkdağ adlı dağ mövcuddur. Dağın zəlzələdən əvvəlki adı olan *Hərək* türk dillərində "ikihürgüclü dəvə" mənasında izah edilir. Belə güman edilir ki, zəlzələdən əvvəl bu dağın görünüşü ikihürgüclü dəvəyə bənzədiyinə görə belə adlandırılmışdır.

**Kərgəlan** *oyk., mür.* Lənkəran r-nunun eyniadlı i.ə.v.-də kənd. Lənkəran ovalığındadır. Yerli əhali arasında Kəqolon kimi tələffüz edilir. Oykonimi talış dilindəki *kəğ* (toyuq) və *lona* (hın) komponentlərindən ibarət "toyuq hini" mənalı söz kimi izah edirlər. Bəzi tədqiqatçılara görə isə, kəndin əsl adı Kəqolondur və "ev tikmək üçün əkilməmiş, münbit torpaq, düzən" mənasını bildirir (talış *kə* – "ev", *qo* – "yer", *lon* "əkilməmiş, münbit torpaq" deməkdir).

**Kərimbəyli** *oyk., sadə.* 1. Bərdə r-nunun Yeni Əyricə i.ə.v.-də kənd. Qarabağ düzündədir; 2. Füzuli r-nunun eyniadlı i.ə.v.-də kənd. Düzənlikdədir; 3. Salyan r-nunun Qarabağlı i.ə.v.-də kənd. Şirvan düzündədir. Kəndin ilk sakinləri Kərimbəyov, Şıxlıbəyov və Hüseynbəyovların tarlalarında muzdla işləyən ailələr olmuşlar. Kəndin adını *Kərimbəyovun* adı ilə bağlayırlar. Lakin oykonimin Qarabağdan gəlmiş *kərimbəyli* tayfası ilə əlaqədar olması da istisna deyil; 4. Sədərək r-nunun Dəmirçi i.ə.v.-də kənd. Araz çayının sahilində, Arazboyu düzənlikdədir. Yaşayış məntəqələri qazaxlı tayfa birliyinə daxil olan *kərimbəyli* tayfasının məskunlaşması nəticəsində yaranmışdır. Kərimbəylilər Qazax mahalından Qarabağa köçüb gəlmiş, sonralar bir sıra yaşayış məntəqələrinin əsasını qoymuşlar.

**Kərimqulu Dizə** *oyk., mür.* Culfa r-nunun Yaycı i.ə.v.-də kənd. Düzənlikdədir. Oykonim *Kərimqulu* (ş.a., kəndin vaxtilə kimə mənsub olduğunu göstərmək, həm də onu eyniadlı digər kənd adlarından fərqləndirmək üçün toponimə əlavə olunmuşdur) və *Dizə* (oyk., "kənd", "qala", "istehkam", "möhkəmləndirilmiş şəhər") komponentlərindən düzəlib, "Kərimquluya məxsus Dizə kəndi" mənasındadır.

**Kərimli** *oyk., sadə.* Gədəbəy r-nunun İnəkboğan i.ə.v.-də kənd. Dağlıq ərazidədir; 2. Oğuz r-nunun eyniadlı i.ə.v.-də kənd. Alazan-Əyriçay çökəkliyindədir. Keçmiş adı Vardanlı olmuş, 1991-ci ildən Kərimli kimi rəsmiləşdirilmişdir. Yaşayış məntəqələri şahsevənlərin *kərimli* tirəsinin məskunlaşması nəticəsində yaranmışdır və həmin tirənin adını daşıyır.

**Kərkənc** *oyk., sadə.* Şamaxı r-nunun Mədrəsə qəsəbə i.ə.v.-də kənd. Kərkənc yaylasındadır. Oykonim qıpçaqların *kərki* və *əncə* tayfa adlarını əks etdirir. XIX əsrdə Altayda tubaların və toquşların yaşadığı Kərkəç adlı əyalət qeydə alınmışdır.

**Kərkəncək** *hidr., sadə.* Kolbəcər r-nu ərazisində çay. Tutqunçayın sol qoludur. Tipik dağ çayı olub, dərin dərələrdən axır. Hidronim qıpçaqların *kərki* və *əncə* tayfa adlarından düzəlib, etnotoponimdir.

**Kərki** *oyk., sadə* Sədərək r-nunun Sədərək i ə v -də kənd. Arpa çayı sahilində, düzənlikdədir Oykonım *kərkı* tayfasının adı ilə bağlıdır Mənbələrdə kərkilərin Azərb -na erkən orta əsrlərdə qıpçaqların tərkibində gəldiyi göstərilir XIX əsrin əvvəllərində qazaxlı tayfasının tərkibində *kərkibaşlı* adlı tirənin olması haqqında məlumat verilir Türkmənlərin ərsarı tayfasının bir qolu da kərkı adlanırdı Kərki tayfaları Türkiyə, Özbəkistan ərazısində də qeydə alınmışdır Türkmənıstan ərazisində Kərkı adlı şəhər, r-n, qəsəbə və Kərkıdağ adlı dağ mövcuddur

**Kərkicahan** *oyk., düz* Xocalı r-nunun Xankəndi şəhər i ə v -də ştq. 1960-cı illərdə vılayətın millətçi erməni rəhbər orqanları qəsəbənin adını yaşayış məntəqələrinin rəsmi siyahısından çıxarıb özünü Stepanakert (Xankəndi) şəhərinə birləşdirmişdilər Azərb -lar yaşayan bu qədim kəndə ştq statusu verilmişdi Xankəndi şəhərini vaxtilə Qarabağ xanı Pənahəli xanın oğlu Mehdiqulu xan Kərkicahan yaxınlığında salmışdı Oykonım mənbələrdə Kərkican və ya Kırkıcan kimi qeydə alınmışdır Əsli Kərkıcan olan bu etnotoponim *kərkı* tayfa adından və yer, məkan bildirən *-can* topoformantından ibarət olub, "kərki tayfasının məskəni" mənasındadır 1992-ci ildə kənd ermənilər tərəfindən yandırılmışdır

**Kərməçatax** b a x. Gərməçatax

**Kəsəmən** *oyk., sadə* 1 Gədəbəy r-nunun Böyük Qaramurad i ə v -də kənd Şahdağ silsiləsinin (Kiçik Qafqaz) şm yamacındadır Yaşayış məntəqəsi XIX əsrin birinci yarısında Qazax r-nunun Qıraq Kəsəmən kəndindən çıxmış ailələrin məskunlaşması nəticəsində yaranmışdır; 2 Samux r-nunun Poylu i.ə v -də kənd Qabırrı (İori) çayının sahilində, düzənlikdədir Oykonimlər *kəsəmən* tayfasının adı ilə bağlıdır Kəsəmənlər qazax tayfa birliyinə daxil olmuşlar Mənbələrin məlumatına görə, XVIII əsrin axırlarında Kartli Kaxeti çarı İrakli dövründə Qazax və Şəmşədil mahallarından poylu, salahlı, kəsəmən tayfalarına mənsub azərb ailələri Gəncə xanlığına köçürülmüşdü

**Kəsəndağ** *or., mür* Culfa r-nu ərazisində dağ. Culfa şəhərindən şm -dadır Hün 1099 m Bir ehtimala görə, dağın əsl adı Kəsəyəndağdır, *kəsəyən* (çölsiçanı) və *dağ* komponentlərindən ibarət olub, "kəsəyən çox olan dağ" mənasındadır Əslində *kəsən* türk dillərində "kəsik", "parça", "kəsilmiş, çapılmış" mənalarında işlənir Odur ki, oronimi "kəsik dağ, çapılmış dağ" kimi izah etmək daha məqsədəuyğundur.

**Kətəlparaq** *oyk., sadə* Bərdə r-nunun eynıadlı i ə v -də kənd. Qarabağ düzündədir Kalbəyəhmədli də adlanır Yaşayış məntəqəsi 1949-50-ci illərdə indiki Ermənistan ərazisındəki qədim Azərb torpaqlarından köçürülmüş azərb ailələrin Kətəlparaq adlı yerdə məskunlaşması nəticəsində yaranmışdır Toponim azərb dilinin dialektlərindəki *kətəl* (dik yer, kotan tutmayan yer) və *paraq* (mal-qara saxlamaq üçün hasarlanmış yer, ağıl) komponentlərindən düzəlib, "dık yerdə düzəlmiş ağıl" mənasındadır

**Kətəndağ** *or., mür* Dəvəçi və Quba r-nları sərhədində sıra dağlar Hün 1481 m Əsli Kotandağdır Oronim *kotan* (türk dillərində "əhatə olunmuş yer") və *dağ* komponentlərinden düzəlib, "divar dağ, dağ silsiləsi" deməkdir Oronimin etnotoponim olması da mümkündür

**Kətidağ** *or., mür* Kəlbəcər r-nunun q hissəsində dağ. Tərtər çayının yuxarı axarında yerləşir Alagöl çökəyini Tərtər çayının yuxarı axarından ayırır Hün 3437 m Oronim *kəti* (türk dillərində "hamar, çıxıntısı olmayan") və *dağ* komponentlərindən düzəlib, "hamar dağ" mənasındadır

**Kətikdağ** *or., mür* Xocalı r-nu ərazisində dağ. R-nun şm -ş hissəsində yerləşir Hün 1375 m Bəzı tədqiqatçılara görə, oronim qədim türk dillərindəki *katık* (Azərb dilində *gədik*) və *dağ* sözlərindən düzəlib, "iki dağ arası, gədik" mənasındadır Oronimin kətik komponentini Qafqaz Albaniyasındakı məşhur Ketik məbədinin adı ilə də əlaqələndirirlər Qazaxıstan ərazisində Ketik adlı yer qeydə alınmışdır

**Kətişən** *oyk., mür* Daşkəsən r-nunun Çovdar i ə v -də kənd Dağətəyi ərazidədir Yerli əhalinin məlumatına görə, yaşayış məntəqəsini vaxtılə Qarabağdan və Gürcüstandan köçmə erməni ailələri salmışlar Oykonim







*qet* (erm. "çay") və *şen* (kənd) sözlərinin birləşməsindən əmələ gəlib, "çay sahilindəki kənd" mənasındadır 1992-ci ildən kəndin adı Çaykənd kimi rəsmiləşdirilmişdir.

**Kətük** *oyk., sadə.* Xocalı r-nunun Xanabad i ə v -də kənd Dağətəyi ərazıdədir Əsli Kətikdir Keçmiş adı Ağdar olmuşdur Bəzi tədqiqatçılar kəndin adını Qafqaz Albaniyasındakı məşhur Ketik məbədinin (XII əsr) adı ilə bağlayırlar

**Kınçvə** *oyk., mür* Lerık r-nunun Vizəzəmin i ə v -də kənd Gəncəvü çayının sahilində, Peştəsər silsiləsinin yamacındadır Tədqiqatçılara görə, oykonim *Kıncəvo* sözündən olub, "küncdən, böyürdən əsən külək yeri" (burada Xəzri küləyi nəzərdə tutulur) mənasındadır

**Kiçan** b a x Ballıqaya

**Kiçik Alagöl** *hidr., mür* Kəlbəcər r-nunda 2780 m yüksəklikdə göl Alagöllər qrupuna daxildir Şirin sulu, axarsız göldür Suyunun bir hissəsi boğaz vasitəsilə Böyük Alagölə axıdılır Hidronim Böyük Alagöl coğrafi adının qarşılığıdır

**Kiçik Alatəmir** *oyk., mür* Qax r-nunun Qax İngiloy i ə v -də kənd Dağətəyi ərazidədir Oykonim Böyük Alatəmir kənd adının qarşılığıdır

**Kiçik Arzanax** *or., mür.* Qax r-nu ərazısində dağ Qaşqaçay kəndindən şm -ş -də yerləşir Hün 2094 m Oronim Böyük Arzanax dağ adının qarşılığıdır

**Kiçik Balakən** *hidr., mür* Balakən r-nu ərazisində çay Balakən çayından ayrılan və sərbəst olaraq sağ tərəfdən Katex çayına tökülən qoldur Hidronim böyük, əsas çayın qolu olduğu üçün belə adlandırılmışdır

**Kiçik Baraxum** *oyk., mür* Xaçmaz r-nunun Dədəli i ə v -də kənd Düzənlikdədir Vaxtilə Baraxum kəndindən ayrılmış ailələr tərəfindən salındığı üçün belə adlandırılmışdır

**Kiçik Bozdağ** *or., mür* Qax r-nu ərazisində dağ Əyriçayın aşağı axarından sol tərəfdə yerləşir Hün 337 m Oronim Bozdağ dağ adının qarşılığıdır

**Kiçik Dəhnə** *oyk., mür* Şəki r-nunun eyniadlı i ə v -də kənd Acınohur ön dağlığındadır Yaşayış məntəqəsi keçən əsrdə Dəhnə (indiki Böyük Dəhnə) kəndindən çıxmış ailələr tərəfindən salınmışdır Oykonim Böyük Dəhnə kənd adının qarşılığıdır

**Kiçik Düzyurd** *oyk., mür* Gədəbəy r-nunun Qumlu i ə v -də kənd Dağlıq ərazıdədir Kəndin ərazisi əvvəllər Şəmkir r-nunun Dəllər kəndinə məxsus yurd yeri olmuşdur Yaşayış məntəqəsi 1922-ci ildə Düzyurd adlanan bu sahədə salınmışdır R-ndakı eyniadlı digər kənddən fərqləndirmək üçün oykonimin əvvəlinə *kiçik* sözü əlavə edilmişdir Oykonim Düzyurd kənd adının qarşılığıdır

**Kiçik Əmili** *oyk., mür* Qəbələ r-nunun Zalam i ə v -də kənd Daşüz silsiləsinin ətəyində, Ərəş düzündədir Oykonim özündə qədim türkdilli qıpçaqların *imi* tayfasının adını əks etdirir və r-nun ərazısindəki Böyük Əmili kənd adının qarşılığıdır

**Kiçik Həkəri** *hidr., mür* Xocavənd və Qubadlı r-nları ərazisində çay Həkəri çayının sol qoludur Mənbəyini Qarabağ silsiləsinin c -q yamaclarından (1810 m yüksəklikdən) alır Böyük çayın qolu olduğu üçün belə adlandırılmışdır

**Kiçik Hərami** *or., mür* Əli Bayramlı r-nu ərazisində dağ silsiləsi Böyük Hərami silsiləsinin c davamıdır Mışovdağın ş -indən başlayaraq getdikcə alçalan dağlardır Pirsaat düzünü Şirvan düzündən ayırır *Kiçik* sözü fərqləndirici xüsusiyyət daşıyır

**Kiçik İşıqlı** *or., mür* Laçın r-nu ərazisində, Qarabağ yaylasında dağ Ermənistanla sərhədin yaxınlığında, Böyük İşıqlı dağından şm -dadır Hün 3455 m Böyük İşıqlı dağından (3552 m) nisbətən alçaq olduğu üçün belə adlandırılmışdır

**Kiçik Kirs** *or., mür* Şuşa r-nu ərazisində dağ. R-nun c -ş -ində yerləşir Hün 1800 m Ərazidəki Böyük Kirs dağından (2725 m) nisbətən alçaq olduğu üçün belə adlandırılmışdır

**Kiçik Kuda** *or., mür* Qusar r-nu ərazisində dağ Hün 2430 m Kiçik Kuza variantında da qeydə alınmışdır Dağıstan ərazısindəki eyniadlı dağ adının qarşılığıdır

**Kiçik Kulagin** *or., mür* Xəzərdə ada Bakı arxipelaqındadır. Akad V K Abıxin ekspedisiyalarında iştirak etmiş gəmi kapitanı

*Kulagının* adı ilə adlandırılmış Kulagın adasının adının qarşılığıdır

**Kiçik Qafqaz** *or., mür.* Cənubi Qafqazda dağ sistemi. Qara dənizlə Araz çayı arasındadır. Kiçik Qafqaz bir sıra dağ silsilələri və yaylalardan ibarətdir. Azərb.-da Kiçik Qafqazın başlıca oroqrafik obyektləri bunlardır: Şahdağ, Murovdağ, Qarabağ, Zəngəzur, Mıxtökən, Dərələyəz sıra dağları və Qarabağ yaylası. Ən hündür nöqtəsi Qapıcıq dağıdır. Kiçik Qafqazın səthi Kür çayının sağ qolları Ağstafa, Gəncə, Tovuz, Zəyəm, Şəmkir, Qoşqar, Kürək çaylarının, habelə Tərtər və Qarqar çayının, Arazın sol qolu olan Həkəri (Əkərə) çayının dərələri ilə xeyli parçalanmışdır. Kiçik Qafqaz oronimi Böyük Qafqaz coğrafi adının qarşılığıdır

**Kiçik Qarabəy** *oyk., mür.* Tərtər r-nunun eyniadlı i.ə.v.-də kənd. Dağətəyi ərazidədir. XIX əsrdə Cavanşir qəzasında Böyük Qarabəy və Kiçik Qarabəy adlı iki kənd qeydə alınmışdır. Çar Rusiyası Azərb.-nın şimalını işğal etdikdən sonra XIX əsrdə İrandan köçüb gəlmiş erməni ailələri Kiçik Qarabəy kəndində məskunlaşaraq kəndi Möhrətağ (palçıqdan tikilmiş barılı məhəllə) adlandırmışdılar. 1992-ci ildə kəndin keçmiş adı bərpa edildi

**Kiçik Qaramurad** *oyk., mür.* Gədəbəy r-nunun eyniadlı i.ə.v.-də kənd. Orta dağlıq qurşaqdadır. Mənbələrin məlumatına görə, Qaramurad adlı kənd 1828-ci ildə yaranmışdır. 1826-28-ci illər Rus-İran müharibəsi dövründə Gürcüstandan İrəvana qaçmış 400 azərb. ailəsini İrəvanlı Hüseynqulu xan Zəngi çayının sağ sahilində sərhəddə məskunlaşdıraraq bir neçə kəndlə (Mürsəlli, Baratlı, Ardışlı, Qarakeçiş) birlikdə Qaramurad kəndini də yaratmışdı. Yaşayış məntəqəsini XIX əsrin axırlarında Qaramurad (indiki Böyük Qaramurad) kəndindən çıxmış ailələr salmışlar. Oykonim Böyük Qaramurad kənd adının qarşılığıdır

**Kiçik Qaramurad** *hidr., sadə* 1. Gədəbəy r-nu ərazisində min bulaqlar. Kiçik Qaramurad kəndindən c.-ş.-də yerləşir. Suyu soyuq və turşməzə olub, bir neçə bulaqdan ibarətdir; 2. Gədəbəy r-nu ərazisində çay. Zəyəm çayının sol qoludur. Hidronimlər Kiçik Qaramurad kəndinin adı ilə bağlıdır

**Kiçik Qızılqaya** *or., mür.* Kəlbəcər r-nu ərazisində dağ. Çalbayır silsiləsində zirvədir. Oronim ərazidəki Qızılqaya (Laçın r-nu) dağ adının qarşılığıdır

**Kiçik Qubah** *or., mür.* Balakən r-nu ərazisində, Baş Qafqaz silsiləsinin qolu üstündə zirvədir. Hün. 1855 m. Oronim r-nun ərazisindəki Qubah dağının adının qarşılığıdır

**Kiçik Mişov** *or., mür.* Əli Bayramlı r-nu ərazisində dağ. Hün. 250 m. Yanaşı duran iki eyniadlı dağın kiçiyinin adıdır

**Kiçik Pirəli** *oyk., mür.* Qəbələ r-nunun Böyük Pirəli i.ə.v.-də kənd. Alazan-Əyriçay çökəkliyindədir. XIX əsrdə keçmiş Qədim Pirəlili kəndindən ayrılmış ailələr yeni yaşayış məntəqəsi yaratmış və onu Cocuq Pirəlili adlandırmışdılar. Sonralar *cocuq* sözü *kiçik* sözü ilə əvəz olunmuşdur. Qədim Pirəli isə Böyük Pirəli adlanmışdır

**Kiçik Samur** *hidr., mür.* Xaçmaz r-nunda çay. Samur çayından ayrılıb bilavasitə Xəzərə tökülür. Samurun qolu olduğu üçün belə adlandırılmışdır

**Kiçik Siyəki** *or., mür.* Şamaxı r-nu ərazisində dağ. Siyəki Cəngi çayının dərəsindən şm.-da iki zirvənin adıdır. Böyük Siyəki (792 m.), Kiçik Siyəki (787 m.). Oronim tat dilindəki *siyə* (qara) və *kü* (dağ) sözlərindən düzəlib, "qara dağ" mənasındadır

**Kiçik Tava** *or., mür.* Abşeron arxipelaqı adalarından biridir. Böyük Tava adasından 4 km ş.-dədir. Ərazisi kiçik qaya parçalarından (tavalardan) ibarət olduğu üçün belə adlandırılmışdır. Kiçik Plita (tava) variantında da qeydə alınmışdır

**Kiçik Udabno** *or., mür.* Qazax r-nunda dağ. Gürcüstanla sərhəddə yerləşir. Hün. 764 m. Ərazideki Udabno (hün. 871 m.) adlı dağdan nisbətən alçaq olduğu üçün belə adlandırılmışdır

**Kiçik Zirə** *or., mür.* Xəzərdə ada. Bakı körfəzini dənizdən ayıran adalardan biridir. Ərazisində daş karxanası olduğundan Daş Zirə də adlanır. Vaxtilə rus dənizçiləri adaya Vulf adı vermişdilər. Böyük Zirə adasının adının qarşılığıdır





**Kiçikdağ** *or., mür.* 1. Xanlar r-nu ərazisində dağ. R-nun c.-ş.-ində yerləşir. Hün. 1158 m.; 2. Qobustanda dağ. Duvannı d.y. stansiyasından c.-q.-də yerləşir. Hün. 176 m. Oronimlər "balaca dağ" mənasındadır. Bu dağlar ətrafındakı oroqrafik obyektlərə nisbətən alçaq olduqları üçün belə adlandırılmışlar

**Kiçikdaş** *or., mür.* Qaradağ r-nu ərazisində dağ. Qobustan qəsəbəsindən 3 km c.-q.-dədir. Qobustan qaya təsvirləri kompleksinə daxildir. Burada üzərində qədim rəsmlər aşkar olunmuş 200-ə qədər qaya qeydə alınmış üç qədim yaşayış məskəni və Tunc dövrünə aid 10-dan çox kurqan tipli qəbir abidəsi öyrənilmişdir. Dağdakı tapıntılar göstərir ki, qədim qobustanlılar hələ e.ə. VIII minillikdən başlayaraq burada məskunlaşmışlar. Dağ yaxınlığındakı Böyükdaşdan kiçik olduğu üçün belə adlandırılmışdır

**Kiçikli** *oyk., sadə* Ağdam r-nunun Üçoğlan i.ə.v.-də kənd. Qarabağ düzündədir. Kənd həmin ərazidə məskunlaşmış *kiçikli* nəslinin adı ilə adlanmışdır

**Kijəbə** *oyk., mür.* Astara r-nunun eyniadlı i.ə.v.-də ştq. Lənkəran ovalığının Talış dağlarına qovuşduğu yerdədir. Əvvəllər burada eyniadlı kənd olmuş, sonralar subtropik bitkilər sovxozu salındıqdan və çay fabriki tikildikdən sonra kənd qəsəbəyə çevrilmişdir. Oykonimi talış dilindəki *kijə* (cücə) və *oba* komponentlərindən düzəlmiş, "cücə obası" və ya *kijə* (quş) və *bə* (qapı) sözlərindən düzəlmiş "quş damı" mənası ilə bağlayırlar. Bu oykonimi *Kijə* ləqəbli tarixi şəxsiyyətin adı ilə də əlaqələndirirlər

**Kilisəsur** *hidr., mür.* Tovuz r-nu ərazisində çay. Hidronim *kilisə* (kilsə, xristian məbədi) və *sur* (şeypur, kərənay, məcazi mənada "uzun, uzanıb gedən") komponentlərindən düzəlib, "kilsə olan ərazidən axan çay" mənasındadır

**Kilit** *or., sadə* Quba r-nu ərazisində dağ. Afurca kəndindən c.-ş.-dədir. Dağın başında qədim qala xarabalıqları var. Dağın adı da buradan yaranmışdır. Oronim İran dillərindəki *kalat* (qala) sözündəndir

**Kilit** *oyk., sadə* Ordubad r-nunun Ordubad şəhər i.ə.v.-də kənd. Kilit çayının sahilində, Arazboyu düzənlikdədir. Hər tərəfdən sıldırım yamaclı dağ və dərələrlə əhatə olunan kəndin c.-ş.-ində iki karst mağarası, yaxınlığındakı İldərəsi adlanan yerdə orta əsrlərə aid yaşayış yerlərinin qalıqları və qəbir abidələri var. Oykonim *kalat* (qala) sözündəndir

**Kilit** *hidr., sadə* 1. Ordubad r-nu ərazisində çay. Arazın qoludur; 2. Ordubad r-nunun Kilit kəndi ərazisində min bulaqlar. Azdebitli iki bulaqdır. Suyu soyuq, tərkibində karbon qazı vardır. Hidronimlər Kilit kəndinin adından yaranmışdır

**Kilsə** *oyk., sadə* Kəlbəcər r-nunun Çaykənd i.ə.v.-də kənd. Dağətəyi ərazidədir. Yerli əhalinin məlumatına görə, yaşayış məntəqəsini XIX əsrdə indiki Laçın r-nunun Alxaslı kəndindən gəlmiş Qasım Məhərrəmoğlu saldığına görə ona Qasımlı da deyilir. Kənd meşənin ortasında, köhnə kənd yerində, qədim alban kilsəsinin ətrafında salındığına görə belə adlandırılmışdır

**Kilsəbuqov** *oyk., mür.* Balakən r-nunun Şambul i.ə.v.-də kənd. Alazan-Əyriçay çökəkliyindədir. Yaşayış məntəqəsi alban kilsəsi olan ərazi yaxınlığında salındığı üçün belə adlandırılmışdır. Oykonim *kilsə* (xristian məbədi) və *buqov* (avar "künc", "bucaq") sözlərindən düzəlib, "kilsə olan künc, bucaq" mənasındadır

**Kilsəçay** *hidr., mür.* Oğuz r-nu ərazisində çay. Hidronim *kilsə* (ərazidəki xristian məbədinə işarədir) və *çay* komponentlərindən düzəlib, "kilsə olan ərazidən axan çay" mənasındadır.

**Kilsədağ** *or., mür.* Qəbələ r-nu ərazisində dağ. Böyük Əmili kəndi yaxınlığındadır. Dağ burada erkən orta əsrlərə aid alban (Qafqaz) məbədinin qalıqlarının olmasına görə belə adlandırılmışdır. Tədqiqatçıların 1971-ci ildə qeydə aldığı bu məbədin əsl adı unudulduğuna görə, onun qalıqları yerli əhali arasında sadəcə olaraq Kilsə, elmi ədəbiyyatda isə dağın adı Kilsədağ məbədi adlandırılmışdır

**Kilsəli** *oyk., düz.* 1. Gədəbəy r-nunun Çayrosullu i.ə.v.-də kənd. 1992-ci ildən Turşsu adlandırılmışdır; 2. Kəlbəcər r-nunun eyniadlı i.ə.v.-də kənd. Dağətəyi ərazidədir. Kənd

qədim kilsə yanında salındığı üçün belə adlandırılmışdır. Yerli əhalinin məlumatına görə, yaşayış məntəqəsini XIX əsrin əvvəllərində Dağıstanın Çardinsk r-nundan gəlmələr saldığı üçün bəzən kəndə Ləzgilər Kilsəsi də deyilir.

**Kilsəli** *hidr., sadə.* Gədəbəy r-nunun Kilsəli (indiki Turşsu) kəndindən c.-ş.-də min bulaqlar. Suyu soyuq və turşməzə olub, 3 bulaqdan ibarətdir. Yaxınlığındakı eyniadlı yaşayış məntəqəsinin adı ilə adlandırılmışdır.

**Kilsəlidağ** *or., mür.* Kəlbəcər r-nunda dağ. Əsrik kəndindən c.-ş.-də yerləşir. Hün. 2301 m. Oronim *Kilsəli* (ərazidəki kənd adı) və *dağ* komponentlərindən düzəlib, "Kilsəli kəndi yaxınlığındakı dağ" mənasındadır.

**Kilsəsuyu** *hidr., mür.* 1. Kəlbəcər r-nu ərazisində çay; 2. Tovuz r-nu ərazisində çay. Zəyəm çayının sağ qoludur. Hidronim *kilsə* (çayın yaxınlığındakı məbəd xarabalığına işarədir) və *su* (çay) komponentlərindən düzəlib (*-u* mənsub şək. -sidir), "kilsə yaxınlığında olan çay" mənasındadır.

**Kimil** b.a.x. Qımıl.

**Kirən** *oyk., sadə.* Tovuz r-nunun eyniadlı i.ə.v.-də kənd. Əsrik və Zəyəm çaylarının suayrıcında, orta dağlıq qurşaqdadır. Keçmiş adı Quşçu Kirən olmuşdur. Keçmişdə burada Kirən adlı iki kənd vardı. Bir-birindən fərqləndirmək məqsədilə biri Xınna Kirən, digəri Quşçu Kirən adlandırılmışdı. Quşçu Kirən kəndi quşçu tayfasına mənsub ailələrin Kirən adlı yerdə məskunlaşması ilə əlaqədar yaranmışdı. Fıstıq, vələs meşəliyi olan bu yerdə keçmişdə *kəran* (tir, pərdi) kəsildiyi üçün Kirən (yerli əhali arasında Kəran) adlandırılmışdır. Oykonimi qədim *kiran/küran* tayfa adı ilə də əlaqələndirir, "yamaclar" kimi də izah edirlər.

**Kirəvud** *oyk., mür.* Lerik r-nunun eyniadlı i.ə.v.-də kənd. Burovar silsiləsinin yamacındadır. Kəndin adı talış dilindəki *gir* (əyri) və *vud* (yer) sözlərindən düzəlib (-ə bitişdirici saitdir), "əyri yerdə salınmış kənd" mənasındadır. Oykonimi "kiçik yer", "çəmənlik", "kiçik təpə" kimi də izah edirlər.

**Kirk** *oyk., sadə.* İsmayıllı r-nunun Kəlbənd i.ə.v.-də kənd. Dağlıq ərazidədir. Yaşayış məntəqəsini XVIII əsrin axırlarında Qarabağdan köçüb gəlmiş ailələr salmışlar. Keçmişdə r-nun ərazisində Kirk və Kirk Güzəran adlı iki kənd mövcud olmuşdur. Yerli əhali arasında Ləngəbiz dağları Qaş dağları, onun yamacında olan kəndlər isə Qaş kəndləri adlanır. Kirk kəndi də Qaş kəndlərindən biridir. Oykonimi tədqiqatçılar türk dillərində "dağlıq ərazi" mənasında işlənən *kırka* sözü ilə bağlayırlar.

**Kirməgiz** *or., mür.* Abşeron yarımadasının mərkəzi hissəsində dağ. Balaxanı qəsəbəsindən şm.-q.-də yerləşir. Hün. 105 m. Oronim *girmə* (burada "keçid") və *giz/gəz* (aşırım) komponentlərindən düzəlib, "aşırımlı keçid" mənasındadır.

**Kirməki** *or., mür.* Abşeron yarımadasında, Böyükşor gölündən şm.-da təpə. Hün. 100 m. Oronim *kırma/girmə* (kolluq) və *kı/ku* (tat. "dağ") komponentlərindən düzəlib, "ətəyi kolluq olan təpə, dağ" mənasındadır. Təpənin yaxınlığında eyniadlı göl də var.

**Kirnə** *oyk., sadə.* Culfa r-nunun eyniadlı i.ə.v.-də kənd. Zəngəzur silsiləsinin ətəyindədir. 2003-cü ildən Kırna kimi rəsmiləşdirilmişdir. Oykonim qəd. türk dillərindəki *kırna* (yan, böyür, kənar, qıraq) sözündəndir.

**Kirov** *şıq.* B.a.x. Binəqədi (Binəqədi r-nu).

**Kirov** *şıq.* B.a.x. Qızılağac (Lənkəran r-nu).

**Kirov** b.a.x. Kiçik Qaladərəsi (Şuşa).

**Kirov adına şıq.** b.a.x. Yeni Suraxanı.

**Kirov körfəzi** b.a.x. Qızılağac körfəzi.

**Kirovabad** b.a.x. Gəncə.

**Kirovka** b.a.x. Həsənsu (Qazax r-nu).

**Kirovka** *oyk., sadə.* 1. Biləsuvar r-nunun eyniadlı i.ə.v.-də kənd. Muğan düzündədir. Yaşayış məntəqəsi Rusiyanın köçürmə siyasəti nəticəsində rus kəndlilərinin Azərb.-da yerləşdirilməsi ilə əlaqədar olaraq 1905-ci ildə yaranmış və Alekseyevka adlandırılmışdı. Sovet hakimiyyəti illərində S.M.Kirovun (1886-1934) adı ilə Kirovka adlandırılmışdır. 1998-ci ildən kəndin adı Azərb. yazıçısı M.C.Paşayevin şərəfinə Mircəlal kimi rəsmiləşdirilmişdir. Memorial toponimdir; 2. Şamaxı r-nunun eyniadlı i.ə.v.-də kənd. Orta dağlıq qurşaqdadır. Yaşayış məntəqəsi XIX əsrin ikinci yarısında Rusiyanın







köçürmə siyasəti ilə əlaqədar rus kəndlilərinin Azərb.-da yerləşdirilməsi nəticəsində Nağaraxana adlı yerdə salınmış və Madiyevka adlandırılmışdı. Sovet hakimiyyəti illərində kəndə S.M.Kirovun şərəfinə Kirovka adı verilmişdir. Memorial toponimdir.

**Kirovkənd** *oyk., mür.* 1. Qax r-nunun İlisu i.ə.v.-də kənd. Kürmük çayının sahilində, Baş Qafqaz silsiləsinin c. yamacındadır; 2. Saatlı r-nunun eyniadlı i.ə.v.-də kənd. Muğan düzündədir; 3. Ucar r-nunun eyniadlı i.ə.v.-də kənd. Şirvan düzündədir. Sovet hakimiyyəti illərində bu yaşayış məntəqələri sovet partiya və dövlət xadimi S.M.Kirovun şərəfinə belə adlandırılmışdır. Memorial toponimdir.

**Kirs** *hidr., sadə.* Xocavənd r-nu ərazisində min bulaq. İşxan çayının dərəsində yerləşir. Soyuq sulu, azdebitli turş bulaqdır. Bulaq yaxınlığındakı Kirs dağının adı ilə adlanmışdır. Kirs "yumru, şiş" deməkdir.

**Kiryaqanıt** *or., sadə.* Quba r-nu ərazisində dağ. Qaraçayla Qudyal çayının suayrıcıdır. Hün. 3380 m. Güman etmək olar ki, oronim Kirnaqanıt adının təhrif formasıdır və "yana əyilmiş, kənara çıxmış" mənasındadır.

**Kirzan** *oyk., düz.* Tovuz r-nunun Əlimərdanlı i.ə.v.-də kənd. Kür çayı sahilində, Gəncə-Qazax düzənliyindədir. Tarixi mənbələrdə kəndin adı Kırzan variantında da qeydə alınmışdır. Bəzi tədqiqatçılar oykonimi Kür çayının adı ilə əlaqələndirərək "Kür sahili, Kür qırağı" kimi izah edirlər. Lakin tədqiqatçıların araşdırmalarına görə, kəndin əsl adı Kürsandır. Kəndin sakinləri udinlər olmuşdur. XIX əsrə aid arxiv sənədlərində Kürsanda cəmi 32 udin ailəsinin yaşadığı göstərilir. *Kürs* qədim türk dillərində "yad, qohum olmayan" mənasında işlənmişdir. Deməli, oykonim "yadlar, qohum olmayanlar" mənasındadır. Ruslarda Kirsanov soyadı və Tambov vilayətində bu soyadla bağlı şəhər də qeydə alınmışdır.

**Kiş** *oyk., sadə.* 1. Xocavənd r-nunun eyniadlı i.ə.v.-də kənd. Qarabağ silsiləsinin ətəyindədir. Qiş (Qişi) variantında da qeydə alınmışdır. 1992-ci ildən kəndin adı Kiş kimi rəsmiləşdirilmişdir; 2. Şəki r-nunun eyniadlı i.ə.v.-də kənd. Kiş çayının sahilində, dağətəyi ərazidədir. Qədim yaşayış məntəqələrindəndir. Alban tarixçisi Movses Kalankatlının "Alban tarixi" əsərində adı Kis kimi çəkilir. Onun yazdığına görə, ilk xristian missionerlərindən biri olan Yenisey təqr. 74-cü ildə Uti vilayətinin Kıs kəndinə gəlib kilsə tikmişdir. Bu, bütün Cənubi Qafqaz ərazisində ilk xristianlıq məbədi idi. Kilsə əvvəllər burada mövcud olmuş qədim sitayiş yerində tikilmişdir. *Kiş* fars dilində "kult, sitayiş yeri" mənasındadır. Erkən orta əsrlərdə Albaniyada (indiki İsmayıllı və Xocavənd r-nları ərazisində) Kış adlı başqa obyektlər də qeydə alınmışdır.

**Kiş** *hidr., sadə.* Şəki r-nu ərazisində çay. Əyriçayın (Qanıx hövzəsi) sağ qoludur. Mənbəyini Baş Qafqaz silsiləsindəki Seyidyurd dağının c. yamacından (2900 m. yüksəklikdən) alır. Cənubi Qafqazın ən selli çaylarındandır. Yuxarı axınında Damarçın (Damarcıq) adlanır. Kiş kəndinin adı ilə adlanmışdır.

**Kişt** *or., sadə.* Quba r-nu ərazisində dağ. Əsli Keştdir. Bəzi tədqiqatçılara görə, oronim İran mənşəli *keşt/kaşt* sözündən olub, "əkin sahəsi, şum yeri" deməkdir. Dağın maili yamaclarında əkin sahəsi olduğuna görə ona belə ad verilmişdir. Türkmənistandakı Kiştan və İrandakı Keştan toponimlərini də keşt sözü ilə bağlayırlar.

**Kılınbi** *oyk., sadə.* Astara r-nunun Hamoşam i.ə.v.-də kənd. Peştəsər silsiləsinin ətəyindədir. Belə güman edilir ki, oykonimin əsli Qılınbi olmuşdur. Oykonim talış dilindəki *qılın* (sıx) və *bi* (heyva) sözlərindən düzəlib, "heyvalıq, heyva ağaclarının sıx olduğu yer" mənasındadır. Yaşayış məntəqəsi heyva ağaclarının çox olduğu ərazidə salındığı üçün belə adlandırılmışdır. Oykonimi "kol dibi", "kol-kosdan kənar yer" mənalarında da izah edirlər.

**Koxanəbi** *oyk., sadə.* Tovuz r-nunun Əsrik Cırdaxan i.ə.v.-də kənd. Əsrik və Zəyəm çayları arasında, dağlıq ərazidədir. Yaşayış məntəqəsi keçmiş Ocaqlı kəndindən çıxmış ailələrin məskunlaşması nəticəsində yaranmışdır. Kəndin adı *koxa* (kovxa) və *Nəbi* (ş.a.) sözlərindən ibarət olub, "kəndxuda Nəbiyə məxsus" mənasındadır. "Kəndxuda"

sözünün sinonimi olan *kovxa* XVI-XIX əsrlərdə Azərb -da və qonşu ölkələrdə inzibati vəzifə olmuşdur Kovxalar mahal bəyinə tabe idilər Hər kəndin ayrıca kovxası olurdu Bu kənd də tabeliyində olduğu kovxanın adını daşıyır

**Koxoir** *or*, *mür* Quba r-nu ərazisində dağ Cimi çayı ilə Babaçayın suayrıcıdır Hün 1776 m Dağın adının əslinin Kuyexir olduğu göstərilir Tədqiqatçılara görə, oronim tat dilindəki *ku* (dağ) və *xür* (duman) sözlərindən düzəlib, "dumanlı dağ" deməkdir

**Kokolos** *oyk* *sadə* Astara r-nunun eyniadlı i ə v -də kənd Lənkəran ovalığındadır Kokalos variantında da qeydə alınmışdır Kəndi XIX əsrdə Lənkəran qəzasının Butasar kənd icmasına məxsus bir neçə ailə daimi yaşayış məntəqəsinə çevirmişdir Oykonimin *kokolkoka* (qədim türk dillərində "vəhşi", "qəzəbli, quduz") və *los/lüs* (talış "çölpişiyi") sözlərindən ibarət olub, "vəhşi çölpişiyi" mənasını bildirdiyi güman edilir Yəqin ki, kəndin ərazisində vaxtilə bu heyvanlar göründüyü üçün ərazi belə adlandırılmışdır

**Kolabağ** *hidr* *mür* Xocalı r-nu ərazisində çay Hidronim türk dillərindəki *kola* ("səs-küylü", "üzüaşağı axan") və *bağ* (qol, hissə) komponentlərindən düzəlib, "üzüaşağı axan çay qolu" mənasındadır Qarqar çayını əmələ gətirən kiçik dağ çaylarından olduğu üçün belə adlandırılmışdır

**Kolanı** *oyk*, *sadə* 1 Hacıqabul r-nunun Abdulyan i ə v -də kənd Kür çayının sahilində, Şirvan düzündədir Kənd vaxtilə Cavad qəzasında yaşamış *kolani* tayfasına mənsub 71 ailənin Toyuqplov adlı qışlaq yerində məskunlaşması nəticəsində yaranmışdır, 2 Salyan r-nunun Qarabağlı i ə v -də kənd Düzənlikdədir XIX əsrdə Dağ Kolanı adı ilə Quşçu-Şamaxı yolu üstündə yaşayan kolanılar suyun olmaması üzündən Pirsaat çayının sol sahilinə köçərək indiki kəndin əsasını qoymuşlar Yerli əhali yaşayış məntəqəsini Arxapası da adlandırır Oykonim *kolanı* tayfasının adı ilə bağlıdır, 3 Siyəzən r-nunun Yenikənd i ə v -də kənd Dəniz sahilindədir Keçmiş adı Kolanıqışlaq olmuşdur, 4 Şahbuz r-nunun eyniadlı i ə v -də kənd Naxçıvan çayının sahilində, orta dağlıq qurşaqdadır; 5 Yevlax r-nu Malbinəsi i ə v -də kənd Düzənlikdədir Yaşayış məntəqəsini vaxtilə Ağdam r-nunun Kolanı kəndindən gəlmiş ailələr salmışlar Kolanılar qədim türk tayfalarındandır XVIII əsrin ortaları – XIX əsrin birinci yarısında Qarabağ xanlığında yaşayan kolanıların ərazisi Kolanı mahalı adlanırdı XIX əsr Azərb tarixçisi Mirzə Adıgözəl bəy Uşacıq kəndindən Göyçə sərhədinə qədər uzanan Tərtər çayı hövzəsini kolanıların məskəni adlandırırdı XIX əsrdə Cavad qəzasında 282 ailəli Kolanı eli yaşayırdı Sonralar onlar müxtəlif yerlərdə məskunlaşmışlar Mənbələrə görə, Ağa Məhəmməd şah Qacarın Qarabağa hücumu zamanı Qarabağ elatlarının bir qismi, o cümlədən kolanılar köçüb Naxçıvanda, Şirvanda və b yerlərdə məskunlaşmışlar

**Kolanıdağ** *or*, *mür* Xanlar r-nu ərazisində dağ Gəncə və Kürək çaylarının suayrıcında yerləşir Hün 1157 m Oronim Kolandağ variantında da qeydə alınmışdır Dağın adı keçmişdə burada *kolanı* tayfasına məxsus yaylaqların olması ilə əlaqədar yaranmışdır

**Kolatağ** *oyk*, *mür* Kəlbəcər r-nunun eyniadlı i ə v -də kənd Qarabağ silsiləsinin yamacındadır Əsli Kolatəkdir Oykonim *kol* (meşəlik, xırda meşə) və *ətək* komponentlərindən düzəlib, "meşə ətəyi" mənasındadır Yaşayış məntəqəsi meşə ətəyində salındığı üçün belə adlandırılmışdır Bəzi tədqiqatçıların fikrinə görə, toponim əslində Gülyataq olub, "güllü, çiçəkli yataq" mənasındadır

**Kolatağ** *hidr*, *sadə* Xocalı r-nunda çay Xaçın çayının sağ qoludur Mənbəyini Alaqaya dağı yamacından (2500 m yüksəklikdən) alır Dəyirmanların hərəkətə gətirilməsində və suvarmada istifadə edilir Çayın adı ərazideki Kolatağ kəndinin adından yaranmışdır

**Kolayır** *oyk* *sadə* 1 Ağstafa r-nunun Düzqışlaq i ə v -də kənd Gəncə-Qazax düzənliyindədir Kəndin adı yerli əhalinin dilində Koləir kimi tələffüz edilir Bəzi tədqiqatçıların ehtimalına görə, oykonim qismən







təhrifə uğramış, əslində Kolayir olmalıdır Oykonimin tərkibindəki *kol* sözü "xırda meşə, meşəlik" mənasındadır Kəndin adı "meşə yeri, meşəli yer" kimi izah edilir Toponimi tayfa adı ilə əlaqələndirənlər də var Lakin türk dillərində *kolayi* sözü işlənir ki, bu da "əlverişli, rahat" mənalarını ifadə edir Kəndin Düzqışlaq adlı i ə v -in tərkibində olması da ərazinin hamar, rahat bir yer olduğunu bildirir Azərb dilinin dialektlərində "hamar, çıxıntısı olmayan" mənasında *kola* (buynuzsuz keçi) sözü işlənir Odur ki, oykonimi "hamar, düz, əlverişli yer" kimi izah etmək daha məqsədəuyğundur; 2 Bərdə r-nunun eyniadlı i ə v -də kənd Qarabağ düzündədir Yerli əhalinin məlumatına görə, yaşayış məntəqəsi vaxtilə Qazax mahalındakı Kolayır kəndindən gəlmiş ailələr tərəfindən salındığı üçün belə adlandırılmışdır; 3 Samux r-nunun eyniadlı i ə v -də kənd Gəncə-Qazax düzənliyindədir Yaşayış məntəqəsi Qazax mahalındakı Kolayır kəndindən gəlmiş ailələr tərəfindən salınmışdır

**Kolxəlfəli** *oyk*, Ağstafa r-nunun Pirili i ə v -də kənd Ağstafa çayının sahilində, Gəncə-Qazax düzənliyindədir Oykonim *kol* (əslində *xol* "delta, axar suyun böyük su hövzəsinə töküldüyü yer") və *Xəlfəli* (etnotoponim) komponentlərindən düzəlib, "deltada yerləşən Xəlfəli kəndi" mənasındadır Yaşayış məntəqəsi Ağstafa çayının sağ tərəfdən Kürə töküldüyü yerdə yerləşdiyi üçün belə adlandırılmışdır

**Kolxozaşen** b a x Arpadüzü

**Kolxozkənd** b a x Bayramlı

**Kolqışlaq** *oyk*, *mür* Ağdam r-nunun Qərvənd i ə v -də kənd. Düzənlikdədir Oykonim *kol* (burada "düz, hamar") və *qışlaq* komponentlərindən düzəlib, "hamar, düz qışlaq" mənasındadır Qışlaq sonralar daimi yaşayış məntəqəsinə çevrilmişdir

**Kollu** *oyk* *düz* 1 Daşkəsən r-nunun Zinzahal i ə v -də kənd Dağətəyi ərazidədir Keçmiş adı Köhnəqışlaq olmuşdur Yaşayış məntəqəsini XIX əsrin sonunda Qarabağdan köçüb gəlmiş Məhərrəm adlı şəxs salmışdır Hazırda kənddə məhərrəmli nəsli mövcuddur Sonralar kənd əhalisi q -ə doğru 1-2 km kəndin yerini dəyişmiş, əvvəlki yer isə Köhnəqışlaq adlanmışdır Yaşayış məntəqəsi kolluq ərazidə bina edildiyi üçün belə adlandırılmışdır, 2 Gədəbəy r-nunun Göyəli i ə v -də kənd Dağlıq ərazidədir Kəndi XIX əsrdə Qazax mahalının Dəmirçilər kəndindən gəlmiş Mahmud adlı şəxs kolluq sahədə saldığı üçün belə adlandırılmışdır Hazırda kənddəki nəsillərdən biri mahmudlu adlanır Kəndin şm -q -ində isə Mahmudun yeri adlı sahə var

**Kolluqışlaq** *oyk*, *mür* Zəngilan r-nunun Rəzdərə i ə v -də kənd Dağətəyi ərazidədir Əvvəllər burada Pirdavudan kəndinin (İrəvan quberniyası) qışlağı olmuşdur Qışlaq kollukoslu olduğu üçün belə adlandırılmışdır Sonralar burada salınmış kənd də həmin adı almışdır

**Koltuş** *or*, *sadə* Xəzərdə ada Abşeron yarımadasının Abşeron arxipelaqına daxildir Oronim toponimikada "körfəz" mənasını bildirən *koltuk/kultuk* sözündəndir

**Koman** *oyk*, *sadə* Lerik r-nunun Şingədulan i ə v -də kənd Dağətəyi ərazidədir Oykonim I minilliyin ortalarından kaymakların (kımakların) tərkibində olmuş *koman/ kuman* türk tayfasının adını əks etdirir Komanlar rus mənbələrində 1078-ci ildən *poloves* adı ilə məlumdur X əsrdə Volqanı keçərək Qara dəniz sahillərinə köçmüşlər Komanların bir qismi qıpçaqların tərkibində Azərb -na gələrək burada məskunlaşmışlar

**Komanlı** *oyk*, *sadə* Cəlilabad r-nunun eyniadlı i ə v -də kənd Burovar silsiləsinin yamacındadır Yaşayış məntəqəsi türk mənşəli *koman/kuman* tayfalarının Azərb -da məskunlaşması nəticəsində yaranmışdır

**Komintern** b a x Soyuqbulaq

**Komsomol** *qəsəbə* B a x Yuxarı Aran

**Komsomol** b a x Ərəbqardaşbəyli (1939-cu ilədək kəndin adı olmuşdur)

**Komsomol** b a x Qaralar

**Konstantinovka** b a x İsmatlı

**Kontavurçay** *hidr* *mür* Lerik r-nu ərazisində çay Hidronim *kont* (dialektlərdə "tərs" mənasında işlənir), *avur* (gur sulu) və *çay* komponentlərindən düzəlib, "gur sulu tərs çay" mənasındadır

**Kopıton** *hidr*, *mür* Sabirabad r-nu ərazisində göl Kürboyu ərazidə yerləşən axmazlardan biridir Hidronim *kopı* (yerli dialektdə "toplanmaq" mənasında işlənən *kopalanmaq* sözündəndir) və *ton* (türk dillərində "çay") komponentlərindən düzəlib, "çaydan toplanmış" mənasındadır

**Korarx** *oyk*., *sadə* Ağdaş r-nunun Pirkəkə i ə v -də kənd. Şirvan düzündədir Kənd vaxtilə mövcud olmuş *Korarx* (tutulmuş, batmış arx) adlı arxın kənarında salındığına görə belə adlanmışdır Gürcüstanın Marneuli r-nunda Dəmyə Korarx adlı kənd var

**Korazıllı** *oyk*, *düz* Füzuli r-nunun Qarakollu i ə v -də kənd Qozluçayın (Arazın qolu) sahilində, Qarabağ silsiləsinin ətəyindədir Oykonimin "körpə quzular üçün ağılların olduğu yer" mənasında olan *koracıl* sözündən və *-lı* mənsubluq bildirən şəkilçidən düzəldiyi güman edilir

**Korcabulaq** *oyk*, *sadə* Laçın r-nunun Qarabəyli i ə v -də kənd Dağlıq ərazidədir Yaşayış məntəqəsi XIX əsrin ikinci yarısında Korcabulaq adlı bulağın yanında salınmışdır Kənd həmin bulağın adı ilə adlandırılmışdır Bulaq quraqlıq olanda quruyur, yağmurlu vaxtlarda isə gözü açılır Ona görə də gözü tez-tez tutulan, yeni susuz qalan belə bulaqlara xalq arasında *korbulaq* və ya *korcabulaq* deyilir

**Korcabulaq** *or*, *sadə* Şəmkir r-nu ərazisində dağ Dağ Ceyir kəndindən ş -dədir Dağın adı ərazidəki eyniadlı bulağın adı ilə bağlıdır

**Korçay** *hidr* *mür* Goranboy və Yevlax r-nları ərazisində çay Kürəkçayın sol qoludur Çay başlanğıcını Xanlar r-nunun Yuxarı Ağasıbəyli kəndi yaxınlığındakı Korbulaqlar adlanan bulaqlardan götürdüyünə görə belə adlanmışdır

**Kordərə** *hidr* *sadə* Oğuz r-nu ərazisində çay Əlican çayının sol qoludur Çay axdığı Kordərə adlı dərənin adı ilə adlanmışdır Dərənin adı isə Koradərə adının təhrif olunmuş variantıdır Toponim türk dillərindəki *kora* (quzu saxlanan yer) və *dərə* sözlərindən düzəlib, "kora olan dərə" mənasındadır

**Korgöz** *oyk* *sadə* Bakı şəhəri Qaradağ r-nunun Qızıldaş qəsəbə i ə v -də şiq Qəsəbə öz adını yaxınlığındakı eyniadlı vulkanın adından almışdır. Sovet hakimiyyəti illərində neft yataqlarının aşkar edilməsi ilə əlaqədar yaranmışdır

**Korgöz** *or*, *mür* Qaradağ r-nu ərazisində, Abşeron yarımadasının c.-q.-ində sönmüş palçıq vulkanı Hün 398 m Dağın adı *kor* (tutmuş, fəaliyyətdən qalmış, batmış) və *göz* (burada "vulkanın ağzı" mənasında) sözlərindən ibarətdir Kerkəs variantında da qeydə alınmışdır

**Koroğludağ** *or*, *mür* Tovuz r-nu ərazisində dağ. Yerli əhali arasında Koroğlu qalası dağı da adlanır Qalanın xarabalığı həmin r-ndakı Yuxarı Öysüzlü kəndi yaxınlığındakı Gilencə dağındadır Rəvayətə görə, qalanı xalq qəhrəmanı Koroğlu tikdirmişdir

**Koroğluqobu** *hidr*, *mür* Bərdə r-nu ərazisində çay Oykonim *Koroğlu* (xalq qəhrəmanı Koroğlunun adı) və *qobu* (yarğan, dərə, çay dərəsi) komponentlərindən düzəlib, "Koroğlu dərəsi" mənasındadır

**Kortala** *oyk*, *mür* Balakən r-nunun Püştətala i ə v -də kənd. Katex çayının sahilində, Alazan-Əyriçay çökəkliyindədir Kəndin adı türk dillərindəki *kora* (təzə doğulmuş quzuların saxlandığı yer) və *tala* (meşədə açıq sahə) komponentlərindən düzəlib Kəndin ərazisi keçmişdə maldarların qışlaq yeri olduğu üçün belə adlandırılmışdır

**Kosacan** *oyk*, *sadə* Şərur r-nunun Siyaqut i ə v -də kənd Arpa çayının sahilində, Şərur düzündədir Bəzi tədqiqatçılara görə, XIII əsrdə Türkiyə ərazisində monqolların dağıtdığı *Kusakan* şəhərindən gəlmiş ailələrin gətirdiyi addır Lakin bu oykonimin Azərb ərazisində də özünəməxsus arealları vardır. Kosakan (Zəngilan), Küsəkan/Küsəkəran (Lerik) Türkiyədə, Sivasın 80 km -liyində Kosadağ oronimi qeydə alınmışdır

**Kosagül** *oyk*, *sadə* Masallı r-nunun Banbaşı i.ə v -də kənd Lənkəran ovalığındadır Yerli əhalinin məlumatına görə, yaşayış məntəqəsi XVI əsrdə salınmış, XVIII əsrdə isə Talış xanı Mir Mustafaxan bu kəndi qızına bağışladığı üçün bir müddət Xanımkənd adlanmışdır. Oykonim *kosalar* nəslinin adından olub bu etnonimin Kosagil variantıdır





**Kosakan** *oyk*, *sadə*. Zəngilan r-nunun Cahangirbəyli i ə v -də kənd Dağətəyi ərazidədir Keçmiş adı Kosakan Tatar olmuşdur Əhali arasında Tatar Kosalar, Əhmədbəy Tatar da adlanır Yaşayış məntəqəsini XIX əsrdə Qubadlı r-nunun Tatar kəndindən gəlmiş ailələr Kosakan adlı kəndin ərazisində məskunlaşaraq salmışdılar Bu kəndin əvvəlki sakinləri isə vaxtilə Cənubi Azərb ərazisinə köçərək orada məskunlaşmışlar Oykonim qəd türk dillərindəki *kosak* (bağlanmış, birləşmiş) sözlərindən və *-an* (yer, məkan) şək -sindən düzəlib, insanların oturaq həyata keçməsi ilə əlaqədar yaranmışdır

**Kosalar** *oyk*, *sadə*. 1 Ağdam r-nunun Göytəpə i ə v -də kənd Dağətəyi düzənlikdədir Oykonim XIX əsrin əvvəllərində Qarabağ xanı Mehdiqulu xana mənsub xəlfəli tayfasının *kosalar* tirəsinin adı ilə bağlıdır, 2 Xocalı r-nunun eyniadlı i ə v -də kənd Qarabağ silsiləsinin yamacındadır Yerli əhalinin məlumatına görə, yaşayış məntəqəsini keçmiş Zəngəzur qəzasının Kosalar (indiki Ağoğlan) kəndindən köçmüş ailələr salmışlar; 3 Qazax r-nunun eyniadlı i ə v -də kənd Gəncə-Qazax düzənliyindədir Yaşayış məntəqəsi kəndin əsasını qoymuş *kosalar* nəslinin adını daşıyır; 4 Lerik r-nunun Qosmalyan i ə v -də kənd. Peştəsər silsiləsinin ətəyindədir Yaşayış məntəqəsi *kosalar* nəslinin məskunlaşması nəticəsində yarandığı üçün belə adlandırılmışdır, 5 Lənkəran r-nunun Gərmətük qəsəbə i ə v -də kənd Lənkəran çayının sahilində, Lənkəran ovalığındadır Oykonim yaşayış məntəqəsinin əsasını qoymuş *kosalar* nəslinin adını əks etdirir Keçən əsrdə Krım vilayətində Kosalar və Kosa Eli adlı yaşayış məntəqələri qeydə alınmışdır

**Kotal** *oyk*, *sadə* Bakı şəhəri Qaradağ r-nunun Ələt qəsəbə i ə v -də koçəbə Xəzər dənizi sahilində, düzənlikdədir Tədqiqatçılar bu oykonimi İran dillərindəki "hündür təpə", "kurqan", "dağ keçidi" mənalı *kotal* sözü ilə əlaqələndirirlər Dialektlərimizdə də bu söz "dik yer" mənasında işlədilir Lakin bu mənaların heç biri obyektin yerləşdiyi məkanın coğrafi mövqeyi ilə müqayisədə özünü doğrultmur Türk dillərində və Azərb dilinin dialektlərində "var-dövlət" mənasında *kotal* və müxtəlif mənalarla yanaşı "təkərli böyük araba", "kənd, köç" mənalarında *kotan* sözləri işlənir ki, bu da köçəri həyat şəraiti ilə bağlıdır

**Kotanarx** *oyk*, *sadə* Ağdaş r-nunun Nehrəkəlil i ə v -də kənd Türyan çayının sahilində, Şirvan düzündədir XVIII əsrə aid mənbədə kəndin adı çəkilir Tədqiqatçıların ehtimalına görə, oykonim qədim arxçəkmə üsulunun adı ilə bağlıdır Belə ki, keçmişdə torpağı bərk olan yerlərdə arx çəkmək üçün əvvəlcə kotanla dərin şırımlar açılır, sonra onun içərisinin torpağı çıxarılaraq daha da dərinləşdirilirdi Belə arxlara adətən *kotanarxı* deyilirdi Yaşayış məntəqəsi kotan arxının dalında salındığına görə belə adlandırılmışdır Yevlax r-nunun Hürüuşağı kəndində də Kotanarx hidronimi qeydə alınmışdır Lakin istər Azərb, istərsə də türkdilli xalqların toponimiyasında *kotan* komponentli toponimlərin geniş arealı göstərir ki, bu coğrafi adlar etnotoponimdir Babək r-nunun Nəzərabad kəndində yaşayan *kotanrı* tayfasının qeydə alınması da bunu sübut edir

**Kotandağ** *or*, *mür* 1 Babək r-nu ərazisində dağ Sirab kəndindən c -dadır Hün 1267 m, 2 Qazax r-nunun c -ş -ində dağ Hün 1100 m Oronim *kotan* (etn) və *dağ* komponentlərindən düzəlib, etnotoponimdir

**Kotanqaya** *or*, *mür* Laçın r-nu ərazisində dağ Oronim *kotan* (etn) və *qaya* komponentlərindən ibarət olub, etnotoponimdir Kotanlar çölü (Qax və Zaqatala r-nları). Kotanlar (Oğuz r-nu), Kotan dərəsi (Qubadlı r-nu), Kotanlı (Ermənistan) və s toponimlər də etnonim mənşəlidir *Kotan* eyni zamanda keçmişdə Azərb -da, eləcə də bir sıra Yaxın Şərq ölkələrində sahə ölçü vahidini bildirən termindir Adətən kotanla bir gündə əkilən torpaq sahəsi *kotan yeri* adlanırdı Abşeronda mövcud olan Kotan əkin yerinin adı həmin məna ilə bağlıdır Oronimi türk dillərində "qoyun saxlamaq üçün dairəvi ağıl" mənasında işlədilən *kutan* sözü ilə də bağlayırlar

**Kotavan** *oyk* *mür* Ağdaş r-nunun eyniadlı i ə v -də kənd Kür çayının sahilində, Şirvan düzündədir Keçmişdə həm də Eləvlı (eləvlı nəsli bu kənddə məskunlaşdığı üçün)

adlanmışdır Yerli əhalinin məlumatına görə, kənd əvvəlcə Qarabağda olmuş, XVIII əsrdə indiki yerə köçürülmüşdür Hazırda Ağdam r-nunun Boyəhmədli kəndinin ərazisində Kotavan arxı adlı yer mövcuddur Bəzi tədqiqatçılara görə, kəndin adı fars dilindəki *qut* (qala) sözündən və məkan bildirən *-van* şək -sindən ibarət olub (*-i* bitişdirici saitdir), "qala yeri" mənasındadır A Bakıxanov keçmişdə kənddə möhkəm qalanın olduğunu yazırdı İstər yazılı abidələrin, istərsə müasir monqol, buryat, uyğur dillərində *xota/xotan/xoton/xot* sözləri "şəhər", "kənd", "şəhər divarı", "ağıl", "tövlə" mənalarını ifadə edir *Van* komponenti isə Qafqaz, Yaxın və Orta Şərq toponimiyasında "ev", "yer", "ölkə", "yaşayış məntəqəsi" və s mənalarda işlənir Odur ki, kəndin adını "kənd yeri", "yaşayış məskəni" kimi də izah etmək olar

**Köbər Zəyzit** *oyk. mür* Şəki r-nunun Zəyzit i ə v -də kənd Baş Qafqaz silsiləsinin ətəyində, Alazan-Əyriçay çökəkliyindədir Həmin r-nda Baş Zəyzit və Orta Zəyzit kəndləri də mövcuddur Oykonim *köbər* ("düzənlik, ərazidə bir qədər hündür, dik yer", "alçaq təpəlik" mənasını bildirən coğrafi termin) və *Zəyzit* (monqol tayfalarından birinin adını əks etdirən etnotoponim) komponentlərindən düzəlib, "hündür, dik yerdə yerləşən Zəyzit kəndi" mənasındadır

**Köbərkənd** *oyk., mür* Bərdə r-nunun Birinci Qaradəmirçi i ə v -də kənd Qarabağ düzündədir Oykonim "dik yerdə salınmış kənd" mənasındadır

**Köçdərə** *hidr., sadə* Gədəbəy r-nu ərazisində çay Axınca çayının qoludur Çay öz adını ərazisindən axdığı eyniadlı dərənin adından almışdır Dərə isə həmin r-ndakı Düz Rəsullu kəndinin əhalisinin əvvəllər Keçəldağ yaylağına gedərkən həmin dərədə müvəqqəti köç (düşərgə) saldıqları üçün belə adlandırılmışdır Zamanlı kəndinin ərazisindəki İstidərə adlı yerdən axdığına görə burada İstidərə çayı da adlanır

**Köçəkli** *oyk sadə* Masallı r-nunun Xırmandalı i ə v -də kənd Taxtaçayın sahilində, Lənkəran ovalığındadır Yerli əhali oykonimi "köç əhli" kimi izah edir Tədqiqatçılara görə, kəndi *köçəkli* nəslinə mənsub ailələr saldığına görə belə adlandırılmışdır

**Köçərli** *oyk., sadə* Tərtər r-nunun Azad Qaraqoyunlu i ə v -də kənd. Qarabağ düzündədir. Yaşayış məntəqəsi XIX əsrin əvvəllərində Qarabağda yaşamış 52 ailədən ibarət *köçərli* tayfasının məskunlaşması nəticəsində yaranmışdır Köçərli tayfası isə mənşəcə qədim türk tayfalarından olan *koçarlara* mənsubdur Karluk və uyğurların tərkibinə daxil olan koçarların adına VIII-IX əsrlərə aid Kuçar adlı uyğur şəhərinin adında da rast gəlmək mümkündür Keçən əsrdə Ermənistan ərazisində Köçərli adlı yaşayış məntəqəsi qeydə alınmışdır

**Köçəsgər** *oyk.*, Ağstafa r-nunun eyniadlı i ə v -də kənd. Gəncə-Qazax düzənliyindədir Oykonim *köç* sözündən və *Əsgər* şəxs adından ibarət olub, "Əsgərin köç yeri" mənasındadır

**Köçvəlili** *oyk., sadə* Ağstafa r-nunun eyniadlı i ə v -də kənd Qarayazı düzündədir Yaşayış məntəqəsi 1920-ci illərdə Birinci Şıxlı kəndinin *köçvəlili* (*köçvəlli*) nəslindən ayrılmış ailələrin Kürün sol sahilində məskunlaşması nəticəsində yaranmışdır Yerli əhalinin verdiyi başqa bir məlumata görə, vaxtilə bu ərazidə Vəli adlı bir şəxsin köçü yerləşmiş, sonralar burada salınmış kənd də belə adlandırılmışdır

**Köhnə Alvadı** *oyk., mür* Masallı r-nunun Banbaşı i ə.v -də kənd Vileş çayının sahilində, Lənkəran ovalığındadır Qədim adı Alvadı olmuşdur XIX əsrdə bu kənddən yeni yaşayış məntəqəsi yarandıqdan sonra əvvəlki kənd Köhnə Alvadı, yeni məntəqə isə Təzə Alvadı adlandırılmışdır Yerli əhalinin dediyinə görə, bu ərazi qırmızı lalələrlə örtüldüyündən onu Alvadi (qırmızı çöl) adlandırmışlar

**Köhnə Bilgəh burnu** *or., mür* Bakı şəhəri Sabunçu r-nu ərazisində çıxıntı Abşeron yarımadasının şm hissəsindədir Digər adı Amburandır Köhnə Bilgəh kəndinin yaxınlığında olduğu üçün kəndin adı ilə adlandırılmışdır

**Köhnə Çorman** *oyk., mür* Laçın r-nunun Şamkənd i ə v -də kənd Dağətəyi ərazidədir Yaşayış məntəqəsi yaxınlığındakı Çorman





kəndindən (Kəlbəcər r-nu) fərqləndirmək məqsədilə belə adlandırılmışdır.

**Köhnə Gegir** *oyk., mür* Lənkəran r-nunun Gegiran i ə v -də kənd Burovar silsiləsinin ətəyindədir Keçmiş adı Gegir olmuşdur XIX əsrdə bu kənddən çıxmış bir qrup ailə yeni yaşayış məntəqəsi yaradaraq onu Gegiran adlandırmışlar Keçmiş kənd isə Köhnə Gegir adlandırılmışdır Tədqiqatçıların ehtimalına görə, oykonim XIII əsr monqol işğallarında iştirak etmiş türkdilli *kukir* tayfasının adını əks etdirir

**Köhnə Xaçmaz** *oyk., mür* Xaçmaz r-nunun Pavlovka i ə v -də kənd Samur-Dəvəçi ovalığındadır 1900-cü ildə Biləcəri-Dərbənd d y xəttinin çəkilişi ilə əlaqədar burada tikilən stansiyaya Xaçmaz adı verilmişdi Xaçmaz kəndi yeni yaradılmış stansiyadan əvvəl salındığı üçün belə adlandırılmışdır

**Köhnə Xudat** *oyk., mür* 1. Xaçmaz r-nunun eyniadlı i ə v -də kənd Samur-Dəvəçi ovalığındadır; 2 Qusar r-nunun eyniadlı i ə v -də kənd Qusar maili düzənliyindədir 1900-cü ildə Biləcəri-Dərbənd d y xəttinin çəkilişi ilə əlaqədar burada tikilən stansiyaya Xudat adı verilmişdi Xudat kəndi yeni yaradılmış stansiyadan əvvəl salındığı üçün Köhnə Xudat adlandırılmışdır Sonradan yarandığı üçün kənd əhli arasında Törəmə də adlanır

**Köhnə Xudat qazmalar** *oyk., mür* Qusar r-nunun Bala Qusar i ə v -də kənd Qusar maili düzənliyindədir Oykonim *Köhnə Xudat* (kənd adı) və *qazmalar* (müvəqqəti yaşayış evi) komponentlərindən ibarət olub, "Köhnə Xudat kəndinə məxsus qazmalar" mənasındadır Kollektivləşmədən sonra qazmalar daimi yaşayış məntəqəsinə çevrilmişdir

**Köhnə Quşçu** *oyk., mür* Siyəzən r-nunun Ərziküş i ə v -də kənd Aydınlar çayının (Gilgilçayın qolu) sahilində, Baş Qafqaz silsiləsinin ətəyindədir Yaşayış məntəqəsi XIX əsrin əvvəllərində Dağ Quşçu kəndindən çıxmış ailələrin məskunlaşması nəticəsində yaranmışdır Çöl Quşçu kəndindən fərqləndirmək üçün və həmin kənddən əvvəl yarandığına görə Köhnə Quşçu adlandırılmışdır Oykonim *quşçu* tayfasının adını əks etdirir

**Köhnə Orand** *oyk., mür* Lerik r-nunun Nüravud i ə v -də kənd Dağlıq ərazidədir Bu kəndin əsasında yaranmış yeni yaşayış məntəqəsi Orand adlandırıldığından keçmiş kənd Köhnə Orand adını almışdır Yaşayış məntəqəsi XIII əsrdə monqol noyonlarının talış zonasına köçürdüyü *oyrat* tayfasının məskunlaşması nəticəsində yaranmışdır

**Köhnə Vayxır** *oyk., mür* Azərb -da orta əsrlərə aid yaşayış yeri Naxçıvan şəhərindən 16 km şm -da, Vayxır kəndindən 1 km ş -də aşkar edilmişdir Oykonim "Vayxır kəndinin keçmiş yeri" mənasındadır

**Köhnədəhar** *oyk., mür* İsmayıllı r-nunun Təzəkənd i ə v -də kənd Dağlıq ərazidədir Yaşayış məntəqəsi həmin r-ndakı Dəhar və Çəndəhar kəndlərindən fərqləndirmək məqsədilə Köhnədəhar adlandırılmışdır Kəndin adı "qədim Dəhar kəndi" mənasındadır *Dahar* sözü tat dilində "qaya" deməkdir

**Köhnəkənd** *oyk mür* 1 Gədəbəy r-nunun Gərgər i ə v -də kənd Dağlıq ərazidədir Keçmiş adı Qaraqoyunlu olmuşdur Yaşayış məntəqəsi qədim Göyçə mahalının Qaraqoyunlu kəndindən ermənilərin zorla didərgin saldığı azərb ailələr tərəfindən salınmışdır 1919-cu ildə yaxınlığındakı Yenikənd kəndi bina edildikdən sonra bu kənd Köhnəkənd adı ilə tanınmışdır; 2 Laçın r-nunun eyniadlı i ə v -də kənd Kiçik Kirs dağının ətəyindədir Keçmiş adı Kirs olmuşdur Yerli əhalinin məlumatına görə, Kirs kəndi XV əsrdə teymurilərin işğalı zamanı tamamilə dağıdılmışdı Sonralar Xocavənd r-nunun Susanlıq kəndindən çıxmış ailələrin buradakı köhnə kəndin yerində məskunlaşması nəticəsində yaranan yeni yaşayış məntəqəsi ərazinin adı ilə Köhnəkənd adlandırılmışdır

**Köhnəqala** *oyk mür* Tovuz r-nunun Alakol i ə v -də kənd Orta dağlıq qurşaqdadır Kənd oradakı köhnə (qədim) qalanın adı ilə adlandırılmışdır

**Köhnəqışlaq** *oyk mür* 1 Ağstafa r-nunun Tatlı i ə v -də kənd Həsənsu çayının sahilində, dağətəyi ərazidədir Kənd köhnə qışlaq yerində salındığı üçün belə adlandırılmışdır; 2 Gədəbəy r-nunun İnəkboğan i ə v -də kənd Dağlıq ərazidədir Yaşayış məntəqəsi XIX əsrdə İnəkboğan kəndindən

ayrılmış ailələr tərəfindən *Köhnə qışlaq* adlı yerdə salındığı üçün belə adlandırılmışdır

**Köhnətağlar** *oyk., mür* Xocavənd r-nunun eynıadlı i ə v -də kənd Qarabağ silsiləsindədir Sonralar burada yerləşən ermənilər kəndin adını Hıntağlar adlandırmışdılar Oykonim *köhnə* və *tağlar* (silsilələr) komponentlərindən düzəlib, "silsilədə yerləşən köhnə kənd" mənasındadır Kənd yerləşdiyi ərazının coğrafi xüsusiyyətinə görə belə adlandırılmışdır

**Köhünlü** *oyk., sadə* Kürdəmir r-nunun eynıadlı i ə v -də kənd Kür çayının sahilində, Şırvan düzündədir Keçmiş adı Şilyan Köhünlü olmuşdur Yaşayış məntəqəsi XIX əsrdə Fətixan adlı şəxsə mənsub ailələrin məskunlaşması nəticəsində yarandığı üçün Fətixanlı da adlanırdı. *Köhünlü* mənşəcə şahsevənlərin novruzelilər tayfasının ıkı qolundan (köhünlü və pırheybətli) birinin adıdır

**Kömür** b a x Gömür

**Kömürdağ** b a x Gömürdağ

**Kömürdəhnə** b a x Gömürdəhnə

**Kömürlüdağ** b a x Gömürlüdağ

**Köndələn** *oyk., sadə* Şəki r-nunun Aşağı Göynük i ə v -də kənd Alazan-Əyriçay çökəklıyındədır Kəndın adı "eninə ıstiqamətdə olan, əyri, tərs" mənasında olub, yerləşdiyi çökəkliyin adı ilə bağlıdır Azərb ərazısındə *köndələn* komponenti geniş areala malikdir Köndələnarx (Göyçay r-nu), Köndələn əkin yeri (Qəbələ r-nu), Köndələnyer (Oğuz, Füzuli r-nları). Köndələnyol (Qax r-nu), Köndələnçöl (Zaqatala r-nu) və s

**Köndələnçay** *hidr., mür* 1 Xocalı, Xocavənd və Füzuli r-nları ərazısində çay Arazın sol qolu olub, mənbəyini Çaxmaqdağın ş yamacından (1780 m yüksəklıkdən) alır Yuxarı axarında su anbarı salınmışdır Yayda aşağı axarında su olmur; 2 Füzuli şəhəri yaxınlığında su anbarı Köndələn çayın yatağında düzəldilmiş süni göldür Göldən kanallar başlanır və əkin sahələri suvarılır Hidronim "eninə istiqamətdə axan, tərs, əyri çay" mənasındadır Çay yerləşdiyi mövqeyinə görə belə adlandırılmışdır

**Könüllü** *oyk., sadə* Şəmkir r-nunun eyniadlı i ə v -də kənd Gəncə-Qazax düzənliyindədir Yerli əhalinin məlumatına görə, 1920-ci illərdə yeni yaşayış məntəqəsi salmaq üçün dövlət Qarayir adlı ərazidə torpaq sahəsi ayırsa da, oraya heç kım köçmürdü 30-cu illərın əvvəllərındə şaır Əhməd Cavad (1892-1937) burada ilk dəfə özünə ev tikdirmiş, bır qədər sonra isə onun təşəbbüsünə könüllü qoşulan Seyfəli camaatının Abbaslı kəndinin Kələnterli məhəllesi buraya köçmüş və kənd Körpüqıran adlandırılmışdır *Könüllü* eyni zamanda bir tayfanın adıdır

**Körnədi** *oyk., mür* Lerık r-nunun Vızəzəmın i ə v -də kənd Gəncəvü çayının (Lənkəran çayının qolu) sahilındə, Peştəsər silsiləsinin yamacındadır Kəndin adı yerli əhalının dılındə Kornədi kimı tələffüz edilir Tədqiqatçılara görə, oykonım talış dilindəkı *kornə* (iş-güc) və *di* (kənd) komponentlərındən düzəlib, "iş-güclü kənd, fəaliyyətdə olan kənd" mənasındadır

**Körpükənd** *oyk., mür* Zərdab r-nunun eyniadlı i ə v -də kənd Kür çayının sahilındə, Şırvan düzündədir Kəndin ərazisində körpü olduğu üçün "körpüsü olan kənd" mənalı oykonimlə adlandırılmışdır

**Körpüsındıran** *oyk., sadə* Bərdə r-nunun Kələntərli i ə v -də kənd. Yaşayış məntəqəsi r-nun ərazısindən axan Tərtər və ya Xaçın çayının güclü sel nəticəsində kəndin ərazisində dağıtdığı körpüyə görə belə adlandırılmışdır

**Köryədi** *oyk., mür* Yardımlı r-nunun Vəlixanlı i ə v -də kənd Burovar və Peştəsər silsilələrı arasında, çökəklıkdədır Tədqiqatçılar bu oykonimi "ocaqxana olan kənd", "yarğanda, dərədə olan kənd" kımi ızah edırlər Bu mənalardan ikıncisi kəndin coğrafi mövqeyinə uyğundur

**Kötüklü** *oyk., sadə* Qəbələ r-nunun Mıxlıqovaq i ə v -də kənd Alazan-Əyriçay çökəkliyındədır Yerli əhalının məlumatına görə, yaşayış məntəqəsi vaxtilə əkin məqsədilə ağaclardan təmizlənmiş *Kötüklü* adlanan sahədə salındığı üçün belə adlandırılmışdır

**Kövdadıq** b a x Gövdadıq

**Kövlüc** b a x: Gövlüc

**Kövər** b a x Gövər

**Kövşətlı** b a x Gövşətli





**Köynük** b a x Göynük

**Krasnı Stan** *oyk., sadə* Neftçala r-nunun Bankə qəsəbə i.ə v.-də qəsəbə Kür çayının sahilində, Cənub-Şərqi Şırvan düzündədir Yaşayış məntəqəsi eynıadlı balıq vətəgəsinin yanında salınmışdır Keçmiş adları Sibırkə (Sibırka) və Qırmızı Urxana olmuşdur Oykonim rus dilindəki *krasnı* (qırmızı) və *stan* (dayanacaq, düşərgə) sözlərındən düzəlib, "qırmızı düşərgə, qırmızı kənd" mənasındadır

**Krasnı Xutor** *oyk., mür*. Xaçmaz r-nunun Uzunoba i ə.v -də kənd Samur-Dəvəçi ovalığındadır Yerli əhalı tərəfindən Şıxdanovka adlandırılır Oykonim rus dilındəki *krasnı* (qırmızı) və *xutor* (yaşayış yeri) sözlərındən düzəlib, "qırmızı qəsəbə, kənd" mənasındadır

**Krasnoselski** b a x Qara Nuru

**Krestovı dili** *or., mür* Salyan r-nunda Qızılağac körfəzinin şm -ş sahilində çıxıntı Oronım XVIII əsrdə rus dənizçilərının Xəzər dənizində apardıqları ekspedisiyaların nəticəsi kimi meydana çıxmışdır

**Kubin** *oyk., mür* Masallı r-nunun Hişkədərə i ə v -də kənd Dağətəyi ərazıdədir Oykonim talış dilindəki *ku* (dağ) və *bin* (alt, dib) komponentlərındən düzəlib, "dağın ətəyi, dağın dibi" mənasındadır

**Kufoba** *oyk., mür* Qusar r-nunun Şirvanovka i ə v -də kənd Dağətəyi ərazidədir Bəzi tədqiqatçılara görə, oykonim ləzgı dilində "qıraq" mənasında işlədilən *kuflkyuf* və *oba* sözlərindən ibarət olub, "qıraq oba, ucqar oba" mənasındadır Digərlərınə görə isə, *kuf* sözü ləzg "başlanğıc, birinci" deməkdir

**Kulagin** *or., sadə* Xəzər dənizində ada Bakı arxipelaqına daxildir Sarı yarımadası yaxınlığındadır Keçmiş adı Əllibulaq olmuşdur Adaya akademik V G Abıxin ekspedisiyalarında iştırak etmiş gəmi kapitanı Kulagının adı verilmişdir

**Kuleymar** *hidr., Culfa* r-nu ərazisində mın. bulaqlar Kuleymar kəndi yaxınlığında, Əlincə çayının sol sahilində yerləşir Soyuq sulu bir qrup bulaqdır Hidronim *kuleı/qullay* (Azərb dilinin dialektlərində "su saxlamaq üçün qazılmış xüsusi yer, hovuz, anbar") və *marimora* (arx, şırnaq) komponentlərindən düzəlib, "axarı olan su hövzəsi" mənasındadır

**Kulibinka** b a x Ovçudərə.

**Kuman** *or., sadə* Dəvəçi r-nu ərazisində dağ Oronim özündə qədim türk mənşəli *kumanlkoman* tayfasının adını əks etdirir

**Kumani** *or., sadə* Xəzər dənizində ada Bakı arxipelaqının c adalarından biridir Bəndovan burnundan 20 km c -ş -dədir Ada 1861-ci ildə akademık V G Abix ilə birlikdə Xəzər dənizində tədqiqat aparmış gəmi kapitanı M İ Kumaninin adını daşıyır

**Kunxırt** *oyk., mür* Quba r-nunun Gülezı i ə v -də kənd Yan silsiləsinin ətəyindədır Yaşayış məntəqəsi r-nun ərazısındəki Xırt kəndinın aşağısında yerləşdiyi üçün belə adlandırılmışdır Oykonim tat dilındəki *kun* (aşağısı, ətəyi) və *Xırt* (kənd adı) komponentlərındən düzəlib, "Xırt kəndinın aşağısı, ətəyi" mənasındadır

**Kuropatkino** *oyk., sadə* Xocavənd r-nunda kənd. Dağətəyi ərazıdədir 1960-cı illərdə vilayətın millətçi erməni rəhbər orqanları kəndin adını yaşayış məntəqələrının rəsmı siyahısından çıxarıb, onu keçmiş Martunı (Xocavənd) qəsəbəsi ilə birləşdirmişdilər Yaşayış məntəqəsinə 1990-cı ildə yenidən kənd statusu verilib yaşayış məntəqələrinin rəsmi siyahısına daxil edilmişdir Yerli əhalinin məlumatına görə, kənd bu ərazidə çoxlu *kəklik quşu* (rus *kuropatka*) olduğuna görə belə adlandırılmışdır Bəziləri toponimi *Kuropatkın* rus familiyası ilə bağlayırlar

**Kuybışev** *oyk., sadə* Ağcabədi r-nunun eyniadlı i ə v -də kənd Keçmiş adı Qaradolaq olmuşdur Yaşayış məntəqəsi kəngər tayfalarının bir qolu tərəfindən salındığı üçün belə adlandırılmışdı 1935-ci ildən kənd sovet partiya və dövlət xadimi V V *Kuıbışeıın* (1888-1935) xatirəsinə Kuybışev adlandırılmışdır Memorial toponimdir

**Kuybışev** (İmişli) b a x Ölçələr

**Kuybışevkənd** *oyk., mür* Dəvəçi r-nunun eyniadlı i ə v -də kənd Samur-Dəvəçi ovalığındadır Yaşayış məntəqəsi 1958-ci ildə keçmiş Qalagah i ə v -nə daxil olan dağ kəndlərindən köçürülmüş əhali üçün salınmış v o

V I *Kuybışevin* xatirəsinə Kuybışevkənd adlandırılmışdır

**Kuzun** *oyk. sadə* Qusar r-nunun Zındanmuruq i ə v -də kənd Qusar çayının sahilində, dağətəyi ərazidədir Tədqiqatçıların fikrincə, oykonim türk dillərində coğrafi termin kimi işlədilən *kazen* (dağın beli, yayla, aşırım) sözündəndir Yaşayış məntəqəsi salındığı ərazinin adını daşıyır

**Kuzunqışlaq** *oyk., mür* Qusar r-nunun Bala Qusar i ə v -də kənd Samur-Abşeron kanalının sahilində, düzənlikdədir Oykonim *Kuzun* (kənd adı) və *qışlaq* komponentlərindən ibarət olub, "Kuzun kəndinin qışlağı" mənasındadır Qışlaq kollektivləşmədən sonra daimi yaşayış məntəqəsinə çevrilmişdir

**Küçəyi** *oyk., sadə* Quba r-nunun Talabı i ə v -də kənd Dağətəyi ərazidədir Tədqiqatçılara görə, kəndin əsl adı Küçeyə-qışlaq olmuşdur Yaşayış məntəqəsi XIX əsrdə həmin r-nun Talabı kəndinə məxsus qışlaq yerində yaranmışdır Oykonim tat dilindəki *küçeyə* (balaca) və *qışlaq* sözlərindən ibarət olub, "balaca, kiçik qışlaq" mənasındadır Əslində, oykonim hələ XIII əsrdə Rəşidəddinin "Cami-ət təvarix" əsərində qeydə aldığı türkdilli *küçayların* adı ilə bağlı olub, etnotoponimdir 1933-cü ildə Xızı r-nu ərazisində də Küçeyri adlı yaşayış məntəqəsi qeydə alınmışdır

**Küçəkənd** *oyk., mür* Ucar r-nunun Pirkənd i ə v -də kənd Şirvan düzündədir Qədim adının Köçəkənd olduğu söylənilir Tədqiqatçılar oykonimi "köç kəndi" kimi izah edirlər Yaşayış məntəqəsi keçmişdə maldarlıqla məşğul olmuş beşəvli, kəbləsadıqlı, məhərrəmli və əsgərli nəsillərinin məskunlaşması nəticəsində yaranmışdır

**Küdab-qara-bezer** *or., mür* Balakən r-nu ərazisində dağ Baş Qafqaz silsiləsinin c yamacında zirvədir Avar dilinin materiallarına əsasən oronimi "böyük, nəhəng tutqun çaylar, sular" kimi izah etmək olar Görünür, r-nun ərazisindən axan böyük çayların bir neçəsi bu dağdan başlanır

**Küdürdüzü** *or., mür* Ağsu, Kürdəmir və Şamaxı r-nları ərazisində düz Küdrü düzü variantında da qeydə alınmışdır Oronim "quru, susuz yer, çöl" mənasındadır Azərb -da axar suyu olmayan quru subtropik iqlimli çölə *küdrı* deyilir Maştağa ilə Buzovna yaşayış məntəqələri arasındakı geniş çölə yerli əhali Küdrı deyir H Zərdabi öz yazılarında Şirvanın aran hissəsini Küdrı Şirvan adlandırır Azərb -da bu coğrafi terminlə düzəlmiş Uzun küdrı sıra dağları (İmişli r-nu) Ləmbəran küdrısi (Ağdam r-nu) və b yer adları da qeydə alınmışdır

**Küdürlü** *oyk., düz* 1 Ağdam r-nunun Əfətli i ə v -də kənd Qarabağ düzündədir; 2 Şəki r-nunun Qaradağlı i ə v -də kənd Alazan-Əyriçay çökəkliyindədir Oykonim Azərb dilinin dialektlərində işlənən *küdür/küdrü/küdrı* (quru iqlimli yer, su çıxmayan ərazi) sözündən və *-lü* şəkilçisindən düzəlib, ərazinin coğrafi mövqeyini təyin edir

**Kükəl** *oyk., sadə* Ağdaş r-nunun eyniadlı i ə v -də kənd. Şirvan düzündədir Xalq etimologiyasına görə, oykonim şəxs adı ilə bağlıdır Türk dillərində *kükəl* "alaqotu, qaramuq otu", Azərb dilinin dialektlərində *kükən* "boş, mənasız, lazımsız" mənalarında işlənir, *kükü* isə "gicitkənə oxşar xoş ətirli bitki" adıdır Şərqi Sibir toponimiyasında *kükü* "göy, yaşıl rəng" mənalarında, Qərbi Sibir toponimiyasında isə *kikke* "çay, çay qolu, su" mənalarında işlənir Deməli, *kükəl* "yaşıllıq, otluq" mənasındadır

**Kükü** *or., sadə* Şahbuz r-nunun şm -ında dağ Ermənistanla sərhəddə yerləşir Hün 3113 m Kükü dağ variantında da qeydə alınmışdır Vaxtilə dağın ərazisində kəngərli tayfasına məxsus ailələrin məskunlaşdığı Kükü adlı kənd olmuşdur XX əsrin əvvəllərində Quba qəzasında Kuki dağı, Tiflis qəzasında Kuki gölü, Zəngəzur qəzasında Kukulu dağı, Kuban vilayətində Kukuoba dağı, Batumi dairəsində Kukuti kəndi, Tatarıstanda Kuku kəndi, Ermənistanda Kükü çayı və s qeydə alınmışdır Dağın adı ərazidəki eyniadlı çaydan götürülmüşdür

**Kükü** *oyk., sadə* Şahbuz r-nunun eyniadlı i ə v -də kənd Dərələyəz silsiləsinin c -q yamacındadır Kənd ərazidən axan eyniadlı çayın adını daşıyır





**Küküçay** *hidr., mür* Şahbuz r-nu ərazisində çay Naxçıvan çayının sağ qoludur Mənbəyini Kükü dağın ş yamacından (2500 m yüksəklikdən) alır Dəyirmanların hərəkətə gətirilməsi və suvarma üçün istifadə edilir Hidronim *kükü* (göy su) və *çay* komponentlərindən düzəlib, "göysu çayı" mənasındadır

**Kükürdsu** *hidr., mür* Gədəbəy r-nu ərazisində çay Şəmkir çayının sol qoludur Hidronim *kükürd* (kimyəvi element) və *su* (burada "çay" deməkdir) sözlərindən düzəlib, "kükürdlü çay" mənasındadır

**Külaza** *hidr., sadə* Qazax r-nunda çay Qanıx çayının sol qoludur Türk dillərində *külas* "qaynaq, mineral su mənbəyi" mənalarında işlənmişdir Görünür, çayın hövzəsində min bulaqlar olduğu üçün belə adlandırılmışdır

**Küləməsər** *or., mür* Lerik r-nu ərazisində dağ Daşkəsən kəndindən şm -da yerləşir Hün 863 m Tədqiqatçılar oronimi Qulamsər sözünün təhrif olunmuş forması hesab edərək onu *Qulam* (ş a ) və talış dilindəki *sər* (baş, zirvə, təpə) komponentlərindən ibarət "Qulam təpəsi" mənalı toponim kimi izah edirlər Əslində, *küləm* yabanı bitki adıdır və oronim də "küləm bitən təpə, küləmli zirvə" mənasındadır

**Külüllü** *oyk. düz* 1 Ağsu r-nunun Padar i ə v -də kənd Şirvan düzündədir; 2 İsmayıllı r-nunun İvanovka i ə v -də kənd Dağətəyi ərazidədir Yaşayış məntəqələri keçmişdə bu zonada istifadə edilən yeraltı yaşayış evlərinin adı (*kühül*) ilə bağlıdır Bu tipli evlər Azərb.-nın şm r-nlarında *qazma* da adlanır Bu kəndlər vaxtilə kühüllərin mövcud olduğu Kühüllü adlanan yerdə salınmışdır Oykonimlərin *külül* adlı bitkinin adından və ya *Qulu(lu)* şəxs adının təhrif formasından ibarət olduğunu güman edənlər də var

**Külüs** *oyk., sadə* Şahbuz r-nunun eyniadlı i ə v -də kənd Orta dağlıq qurşaqdadır Yaşayış məntəqəsi kəngərli tayfasının səleykə qolunun məskunlaşması nəticəsində yaranmışdır Tədqiqatçılar oykonimin *kühül* (mağara) sözündən düzəldiyini ehtimal edirlər Altay dillərində, o cümlədən monqol dilində *kuluz* "qamış" mənasında işlənir Güman etmək olar ki, kəndin ərazisi qamışlıq olduğu üçün belə adlandırılmışdır

**Künəxeydağ** *or., mür* Qax r-nu ərazisində dağ Baş Qafqaz silsiləsinin c yamacında yerləşir Hün 2833 m Oronim *künə* (yastı), *xay* (tərəf, *solaxay* sözündə olduğu kimi) və *dağ* komponentlərindən düzəlib, "dağın yastı tərəfi" mənasındadır

**Künəxaysu** *hidr., mür* Qax r-nu ərazisində çay Qurmux çayının sağ qoludur Hidronim *Künəxay* (dağ adı) və *su* (çay) komponentlərindən düzəlib, "Künəxay dağından axan su, çay" mənasındadır

**Küngüt** *hidr., sadə* Şəki r-nu ərazisində çay Əyriçayın sağ qoludur Mənbəyini Saylaxan dağının yamacından (3200 m yüksəklikdən) alır Aşağı axarında (Alazan-Əyriçay vadisində) suvarma üçün geniş istifadə edilir Çay keçmiş Küngüt (indiki Yuxarı Küngüt) kəndinin adı ilə adlanmışdır Kəndin adı isə XIII əsrdə monqolların işğallarında iştirak etmiş *kıngit* tayfasının adını əks etdirir Etnotoponimdir

**Künüdağ** *or., mür* Şahbuz r-nu ərazisində dağ Oronim türk dillərindəki *küni* (alçaq, yastı) və *dağ* sözlərindən düzəlib, "alçaq, yastı dağ" mənasındadır

**Küpçal** *oyk., sadə* Quba r-nunun eyniadlı i ə v -də kənd Qudyal çayının sahilindədir Kəndin adı türk dillərindəki *qapçal* (keçilməz yer, sıldırım dik qaya) sözündən yaranmış, yaşayış məntəqəsinin yerləşdiyi coğrafi mövqeyi təyin edir Kənd Qudyal çayının əmələ gətirdiyi uçurumun, sıldırımın yaxınlığında salındığı üçün belə adlandırılmışdır

**Küpçalqışlaq** *oyk., mür* Quba r-nunun Hacıhüseynli i ə v -də kənd Qudyal çayının sahilində, Qusar maili düzənliyindədir Kəndin ərazisi vaxtilə Küpçal kəndinə məxsus qışlaq yeri olmuş. XIX əsrdə həmin kənddən çıxan ailələr qışlaqda məskunlaşmış, kollektivləşmədən sonra qışlaq daimi yaşayış məntəqəsinə çevrilmişdir Oykonim "Küpçal kəndinin qışlağı" mənasındadır

**Kür** *oyk., sadə* Şəmkir r-nunda şəq Düzənlikdədir Yaşayış məntəqəsi 1975 ci ildə Şamxor SES-ın tikintisi ilə əlaqədar olaraq,

həmin tikintidə çalışan mühəndis-fəhlə işçiləri üçün salınmış, 1978-ci ildən isə rəsmi olaraq Kür qəsəbəsi adlandırılmışdır Qəsəbənin adı Kür çayının adından götürülmüşdür

**Kür** *hidr sadə* Gürcüstan, Azərb və Türkiyə ərazisində çay Qafqazda ən böyük çaydır Mənbəyini Türkiyədəki Qızılgədik dağının şm -ş yamacından (2740 m yüksəklikdən) alır Xəzər dənizinə tökülür Azərb ərazısındə Kür çayının başlıca qolları sağdan Ağstafa, Həsənsu, Tovuz, Zəyəm, Şəmkır, Gəncə, Kürək, İncə, Tərtər, Araz, soldan isə Qabırrı, Qanıx, Göyçay və Türyan çaylarıdır Kür çayı haqqında bir çox antik və orta əsr müəlliflərinin əsərlərində məlumat verilmişdir Qədim yunan, latın, ərəb, fars, türk, erməni, gürcü mənbələrində Kor, Kur, Kir, Kırı, əl-Kurr, Mtkuari və s kimi adı çəkilir Tədqiqatçılara görə, "su, çay" mənası verən *kür* sözü yerli alban (Qafqaz) tayfalarının birinin dilindən götürülmüşdür Azərb -da yaşayan qırızların və buduqların dillərində indi də *kur* sözü "su, çay" mənasında işlədilir Türk dillərində isə bu sözün "sürətli, inadkar, güclü" mənaları vardır "Dədə Qorqud" dastanlarındakı "kür qopdu, ərcil qopdu" ifadəsində də *kür* eyni mənada işlənmişdir

**Kür-Araz ovalığı** *or mür* Azərb -nın mərkəzi hissəsində Kür və Araz çaylarının aşağı axarları boyunda yerləşir Kür-Araz ovalığı q -də Mingəçevir su anbarından başlayaraq ş -də Xəzər dənizinədək uzanır Ovalığın mərkəzi hissəsində Kür çayı ilə Araz qovuşur Çaylar ovalığı Şirvan, Qarabağ, Mil, Muğan və Salyan düzlərinə ayırır Oronim Kür və Araz çaylarının adından yaranmışdır

**Kür Qaraqaşlı** *oyk , mür* Salyan r-nunun eyniadlı i ə v -də kənd Kür çayının sahilində, Salyan düzündədir Yaşayış məntəqəsi keçmişdə Şirvanda yaşamış qaraqaşlı tayfasına mənsub ailələrin Kür çayı sahilində məskunlaşması nəticəsində yaranmışdır Oykonim *Kür* hidronimindən və *Qaraqaşlı* (etnotoponim) kənd adından ibarət olub, "Kür çayı sahilindəki Qaraqaşlı kəndi" mənasındadır

**Kür Qarabucaq** *oyk , mür* Neftçala r-nunun Aşağı Qaramanlı i ə v -də kənd Kür çayı sahilindədir Keçmişdə burada mövcud olmuş Qarabucaq adlı iki kəndi bir-birindən fərqləndirmək üçün biri Kür çayı sahilində yerləşdiyi üçün Kür Qarabucaq, digəri isə Kürün qollarından birinin üzərində yerləşdiyi üçün Xol Qarabucaq adlanmışdır Oronimin ikinci komponenti bucaqların bir qolu olan *qarabucaqların* adı ilə bağlıdır

**Kürd** *oyk , sadə* 1 Göyçay r-nunun Potu i ə v -də kənd. Düzənlikdədir Kəndi vaxtilə kürd ailələri saldığına görə belə adlandırılmışdır; 2 Qəbələ r-nunun eyniadlı i ə v -də kənd Ərəş düzündədir Yaşayış məntəqəsi özlərini *kurmanc* adlandıran və XIX əsrdə bu ərazidə maldarlıqla məşğul olan icmaya məxsus ailələrin məskunlaşması nəticəsində yaranmışdır Etnotoponimdir

**Kürd Çullu** *oyk , mür* Şərur r-nunun Şahrıyar i ə v -də kənd. Arazboyu düzənlikdədir Keçmiş adı Çullu olmuşdur Yaşayış məntəqəsi digər eyniadlı kəndlərdən (Ağdam, Cəbrayıl r-nlarında, Cənubi Azərb -da) fərqləndirmək üçün yaxınlıqdakı Kürdkəndin adı ilə Kürd Çullu, yəni "Kürdkəndin yaxınlığındakı Çullu kəndi" mənasındadır 2003-cü ildən kəndin adı Kürdçülü kimi rəsmiləşdirilmişdir

**Kürd Mahrızlı** *oyk., mür* Qubadlı r-nunun Zilanlı i ə v -də kənd Dağətəyi düzənlikdədir Əsl adı Kürd Mafruzlu olmuşdur Yaşayış məntəqəsi 1820-ci ildə İrandan köçüb gəlmiş mafruzların bir qolunun adından yaranmışdır

**Kürdaşı** *or , mür* Xəzər dənizində Bakı arxipelaqı adalarından biri Kür dili yarımadası yaxınlığında yerləşir Adada fəaliyyətdə olan bir neçə kiçik palçıq vulkanı vardır Oronim *Kür* çayının adı ilə bağlıdır Sonrı Müzəffər (Müzəffər daşı), Sonrı Kür (Kür daşı) adası da adlanır

**Kürdboraki** *oyk , mür* Bərdə r-nunun Şatırlı i ə v -də kənd Düzənlikdədir Əsli Kürdparaqı olmuşdur Oykonim *kürd* (etn ) və *paraq* (heyvan saxlamaq üçün hasarlanmış, çəpərlənmiş yer) sözlərindən düzəlib, "kürd pəyəsi, kürd tövləsi" mənasındadır

**Kürdçü** *oyk , düz* Hacıqabul r-nunun Atbulaq i ə v -də kənd Düzənlikdədir Tədqiqatçılara görə, oykonim *kürd* (etn ) və *-çü*





(türk dillərində mənsubiyyət bildirən şəkilçi) komponentlərindən düzəlib, "kürdlər kəndi" mənasındadır Yaşayış məntəqəsini vaxtilə kürdmənşəli ailələr saldığına görə belə adlanmışdır Oykonimin Kürçü adının təhrif variantı kimi "Kür çayı sahilindən gələnlər" mənasında olması da güman edilir

**Kürdeldarbəyli** *oyk , düz* İsmayıllı r-nunun Hacıhətəmli i ə v -də kənd Göyçayın sahilində, təpəlikdədir Kürd adı ilə də tanınır Yaşayış məntəqəsi XIX əsrdə Eldarbəy adlı kürdə mənsub, maldarlıqla məşğul olan ailələrin məskunlaşması nəticəsində yaranmışdır Oykonim "kürd Eldarbəyə məxsus kənd" mənasındadır

**Kürdəbazlı** *oyk , sadə* Masallı r-nunun Qarğalıq i ə v -də kənd Düzənlikdədir XIX əsrə aid mənbələrə əsasən kəndin əsl adının Kürdabaslı olduğu məlum olur Oronim kənddə məskunlaşmış *kürdabaslı* nəslinin adı ilə bağlıdır

**Kürdəxanı** *oyk , mür* Bakı şəhəri, Sabunçu r-nunun eyniadlı qəsəbə i ə v -də ştq Abşeron yarımadasındadır Oykonim *gırdə* (dəyirmi) və fars mənşəli *xana* (ev, bina) sözlərindən ibarət olub, "gırdə evlər" mənasını bildirir XVI əsrdə qızılbaşların tərkibindəki *kürd* tayfalarına mənsub ailələrin məskunlaşması nəticəsində kəndin yaranması ehtimalı da mövcuddur Bu ehtimala görə, kəndin yaxınlığındakı Kürdlər burnu adlı kiçik yarımadanı və kəndin yerini həmin ailələrə Səfəvi hakimləri vermişlər

**Kürdəmir** *oyk., mür* 1 Azərb -nın mərkəzi hissəsində inzibati r-n Mərkəzi Kürdəmir şəhəridir; 2 Azərb -da şəhər Eyniadlı r-nun mərkəzidir Şirvan düzündədir; 3 Zaqatala r-nunun Verxıyan i ə v -də kənd Düzənlikdədir Adın Zaqatala r-nu ərazisinə "gətirilmə" olduğu güman edilir Tədqiqatçıların bir qismi Kürdəmir toponimini "kürd Əmir", "qurd Əmir" şəklində izah etmişlər Bəzi tədqiqatçılara görə, Kür ovalığındakı ərazilər çoxlu çay daşqınlarına məruz qaldığından "Kürün dəymədiyi yer" kimi, yəni "su basmasından kənarda qalan sahə" kimi Kürdəmir adı formalaşmışdır Oykonimin *kür* (dilimizin qədim dövrlərində "hirslı, qəzəbli, dəliqanlı, coşqun") və *temir/dəmir* (etn ) sözlərindən düzəlib, "qəzəbli dəmir, dəliqanlı dəmir" mənasında olması da güman edilir 1728-ci ildə İrəvan əyalətinin Dərələyəz nahiyəsində də Kürdəmir adlı kənd qeydə alınmışdır

**Kürdəmir** *hidr , sadə* Girdiman çayından Kürdəmir şəhərinə çəkilmiş arxın adıdır Arx eyniadlı şəhərin adını daşıyır

**Kürdəmiş** *oyk , mür* Göyçay r-nunun Qızılağac i ə v -də kənd. Düzənlikdədir Oykonim *kür* (çay, su) və *dəmi/dəmi* (dəmyə, su çıxmayan yer) sözlərindən, -ş (burada şiddətləndirmə bildirir) şək -sindən ibarət olub, "tamamilə su çıxmayan yer, dəmyə, əkilməyən sahə" mənasındadır 1917-ci və 1933-cü illərdə Şamaxı r-nu ərazisində də eyniadlı kənd qeydə alınmışdır Oronim keçən əsrdə Kürdəmiç, Kürdəmic variantlarında işlənmişdir

**Kürddərəsi** *hidr sadə* Gədəbəy r-nu ərazisində çay Şamxor çayının yuxarı hövzəsindədir Araşdırmalara görə, çay başlanğıcını Şahdağ silsiləsinin yamacındakı *Qurddərəsi* deyilən yerdən aldığı üçün həmin dərənin adını daşıyır Oronim təhrif olunaraq hidronimə keçmişdir

**Kürdəsər** *oyk. mür* Lerik r-nunun Nüvədı i ə v -də kənd. Dağlıq ərazidədir Kəndin əhalisi talış dilində danışan kürdlərdən ibarətdir Bu fakta istinad edən tədqiqatçılar oykonimi "kürdlər yaşayan yüksəklik, təpə" kimi izah edirlər Yerli əhali kəndin adını *Qurdasə* kimi tələffüz edir və oykonimi "qurd kəndi" mənasında izah edir Başqa bir ehtimala görə isə, kəndin adı talış dilindəki *kirdə* (Azərb dilində girdə, yumru, dəyirmi) və *sər* (baş) sözlərindən ibarət olub, "dəyirmi başlı" mənasındadır Kəndin coğrafi mövqeyini əks etdirir

**Kürdhacı** *oyk , sadə* Laçın r-nunun eyniadlı i ə v -də kənd Kürdhacı çayının sahilində, Qarabağ silsiləsinin yamacındadır Keçmiş adı Qasımuşağı olmuşdur Oykonim yerli əhalinin dilində *Qurdqujı* kimi tələffüz edilir və "qurd aşırımı" şəklində izah olunur Kəndin adının belə dəyişməsi rus dilində olan ədəbiyyatdan uğursuz tərcümənin nəticəsidir

**Kürdhacı** *hidr., sadə* Laçın r-nu ərazisində çay. Çay adını ərazisindən axdığı Kürdhacı kəndindən almışdır.

**Kürdili** *or., mür.* Xəzər dənizi ilə Qızılağac körfəzi arasında yarımada. Oronim *Kür* çayının adından və coğrafi termin olan *dil* (dəniz, göl və çayların sahil zonasında qum və çınqıllardan ibarət alçaq, hamar səthli uzunsov quru zolağı) sözlərindən ibarətdir.

**Kürdili** oyk., sadə Neftçala r-nunun Şirvanlı i.ə.v.-də kənd. Xəzər dənizi sahilindədir. Kənd Kürdili yarımadasının adı ilə adlanmışdır.

**Kürdkənd** *or., mür.* Şərur r-nunun Şəhriyar i.ə.v.-də kənd. Düzənlikdədir. Oykonim *kürd* (etn.) və *kənd* sözlərinin birləşməsindən düzəlib, "kürdlərin kəndi" mənasındadır. 1933-cü ildə Kürtkənd variantında qeydə alınmışdır. 2003-cü ildən kəndin adı Kürkənd kimi rəsmiləşdirilmişdir.

**Kürdqobu** *hidr., mür.* Ağsu və Kürdəmir r-nları ərazisində çay. Girdiman çayından ayrılıb bilavasitə Qarasuya tökülür. Tədqiqatçılara görə, hidronim Qurdqobu (canavar dərəsi) adından təhrifdir. Hidronimin *kürd* etn.-indən və *qobu* (kiçik dərə, yarğan, çay dərəsi, dərin arx və s.) sözündən düzəlib, "kürdlərə məxsus çay dərəsi" mənasında olması da ehtimal edilir.

**Kürdlər** *oyk., sadə* 1. Ağcabədi r-nunun eyniadlı i.ə.v.-də kənd. Qarqar çayının sahilində, Qarabağ düzündədir. Kənd musanlı tayfasının *kürdlər* tirəsinin məskunlaşması nəticəsində yaranmışdır; 2. Ağdam r-nunun Əlimədədli i.ə.v.-də kənd. Dağətəyi ərazidədir. Yerli əhalinin məlumatına görə, vaxtilə kürddilli ailələrin məskunlaşması nəticəsində yarandığına görə belə adlandırılmışdır; 3. Cəbrayıl r-nunun Sirik i.ə.v.-də kənd. Qarabağ silsiləsinin ətəyindədir. Yerli əhalinin məlumatına görə, keçmiş adı Hacıisaqlı olmuşdur. Əvvəllər bu ərazidə Zəngəzur qəzasındakı şotlanlı kürd tayfasına məxsus qışlaq yeri (Kürdlər qışlağı adlanırdı) olmuşdur. Sonralar burada salınmış yaşayış məntəqəsi köhnə qışlağın adı ilə tanınmışdır. Əslində isə kənd sakinlərinin kürdlərlə heç bir etnik əlaqəsi yoxdur. 1922-ci ildə çap edilmiş yaşayış məntəqələrinin siyahısında da kəndin adı Hacıisaqlı kimi qeydə alınmışdır; 4. Cəlilabad r-nunun eyniadlı i.ə.v.-də kənd. Burovar silsiləsinin şm.-ş. ətəyindədir. Yaşayış məntəqəsi XIX əsrin ortalarında panavand tayfasının *kürdlər* tirəsinin oturaqlaşması nəticəsində yaranmışdır; 5. Füzuli r-nunun Əbdürrəhmanlı i.ə.v.-də kənd. Düzənlikdədir. Mehdibəy Kürdü də adlanır. Yaşayış məntəqəsi Mehdibəy adlı şəxsə məxsus *kürd* ailələrinin məskunlaşması nəticəsində yaranmış və məskunlaşan ailələrin ümumi adını qəbul etmişdir. Etnotoponimdir.

**Kürdmahmudlu** *oyk., sadə* İmişli r-nunun Xəlfəli i.ə.v.-də kənd. Düzənlikdədir. Yaşayış məntəqəsi *kürdmahmudlu* tayfasının burada məskunlaşması nəticəsində yaranmışdır. Kənd bu tayfanın adını daşıyır.

**Kürdmaşı** *oyk., sadə* İsmayıllı r-nunun eyniadlı i.ə.v.-də kənd. Dəvəbatan çayının sahilində, dağətəyi ərazidədir. XIX əsrdə kəndin adı rusca Kurtmaşı variantında qeydə alınmışdır. Tədqiqatçılara görə, oykonim *Qurd* ləqəbli *Maşı* adlı şəxsin adından yaranmışdır. Oykonimin bitki adından yarandığını da güman etmək olar.

**Kürdşaban** *oyk., sadə* Göyçay r-nunun Məlikkənd i.ə.v.-də kənd. Şirvan düzündədir. Oykonim *kürd* (etn.) və *Şaban* (ş.a.) sözlərinin birləşməsindən əmələ gəlmişdir. Yaşayış məntəqəsi ilk dəfə orada məskən salmış *Kürd Şabanın* nəslinin adını daşıyır.

**Kürdüvan** *oyk., düz.* İsmayıllı r-nunun Basqal i.ə.v.-də kənd. Niyaldağ silsiləsinin ətəyindədir. Oykonim *kürd* (etn.) və *-van* (məkan bildirən şək.) komponentlərindən düzəlib, "kürdlər olan yer" mənasındadır. 1917-ci ildə kəndin adı Kürdivan variantında qeydə alınmışdır. Oykonimin *kür* (çay, su) sözündən və *divan/duvan* türkdilli tayfa adından yaranması da mümkündür.

**Kürdyurd** *or., mür.* Goranboy r-nu ərazisində dağ. Goran və Buzluq çayları arasında yerləşir. Hün. 2190 m. Oronim *kürd* (etn.) və *yurd* (məskən) komponentlərindən düzəlib. Görünür, dağın ərazisi maldar kürdlərin yaylaq yeri olduğundan belə adlandırılmışdır.

**Kürəkçay** *hidr., mür.* Xanlar, Yevlax və Goranboy r-nları ərazisində çay. Kürün sağ qoludur. Mənbəyini Murovdağ silsiləsinin





şm. yamacından (3100 m. yüksəklikdən) alır. Ən böyük qolları sağdan Ağsu, Sarısu, Buzluq və ya Balakürək çayları, soldan isə Azad və Korçaydır. Çaykənd kəndindən aşağıda suvarma üçün istifadə edilir. Çayın üstündə kiçik SES tikilmişdir. Hidronim mənbələrdə XIV əsrdən məlumdur. Tədqiqatçılara görə, çayın adı qəd. türk dillərindəki *kürək/kükrək* (qaçan, sürətlə axan, yuyub aparan) sözü ilə bağlı olub, "sürətli çay, iti axan çay" mənasındadır.

**Kürəkçay** *oyk., mür.* Goranboy r-nunun Goranlı i.ə.v.-də qəsəbə, d.y. stansiyası. Düzənlikdədir. Kürəkçay d.y. stansiyası yanında salınmışdır. D.y. stansiyası 1908-ci ildə tikilmiş, yaxınlığından axan Kürəkçayın adı ilə adlandırılmışdır. Yaşayış məntəqəsinin adı da çayın adındandır.

**Kürəkçi** *oyk., sadə* Yardımlı r-nunun eyniadlı i.ə.v.-də kənd. Viləş çayının sahilində, Peştəsər silsiləsinin ətəyindədir. Yaşayış məntəqəsi pirəmbəl tayfasının *kürəkçi* tirəsinin məskunlaşması nəticəsində yaranmışdır.

**Kürəkçidağ/Kürkaçıdağ** *or., mür.* Abşeron r-nu ərazisində dağ. Vəqvər çayının sol sahilində yerləşir. Hün. 521 m. Əsl adının Kürgəcə olduğu söylənilir. Tədqiqatçılar oronimi tat dilindəki *kürg/qurq* (canavar) və *cə* (yer) sözlərinin birləşməsi hesab edərək "canavar yaşayan yer" kimi izah edirlər. Azərb. dilinin Bakı dialektində *kürgə* "qotman, ot tayası" mənasında işlənir. Odur ki, oronimi "qotmana bənzər dağ" kimi də izah etmək olar.

**Kürkəndi** *oyk., mür.* Sabirabad r-nunun eyniadlı i.ə.v.-də kənd. Muğan düzündədir. Oykonim *Kür* (çayın adı) və *kəndi* sözlərindən düzəlib, "Kür keçən kənd, Kürün yaxınlığındakı kənd" mənasındadır.

**Kürkün** *oyk., sadə* Quba r-nunun Alpan i.ə.v.-də kənd. Qusar maili düzənliyindədir. Tədqiqatçıların fikrincə, oykonim ləzgi dilindəki *kürkün* sözündən olub, "yüksəkliyin yamacı" mənasını bildirir. Yaşayış məntəqəsi təbii-coğrafi mövqeyinə görə belə adlandırılmışdır.

**Kürküt** *hidr., sadə* Qax r-nunda çay. Əyriçayın qollarından biridir. Böyük Qafqazın c. yamacından axır. Hidronim türk dillərindəki "kükrəyən, uğuldayan" mənalı *kükürət* sözündəndir.

**Kürmük/Qurmux** *hidr., sadə* 1. Qax r-nunda çay. Qanıx çayının sol qoludur. Mənbəyini Baş Qafqaz silsiləsinin c. yamacından (3280 m. yüksəklikdən) alır. Alazan-Əyriçay vadisinə çıxdıqdan sonra bir çox qollara ayrılır. Çayda güclü sel hadisələri baş verir; 2. Qax r-nunun İlisu kəndi yaxınlığında min bulaqlar. Qurmux çayının sağ və sol sahilində yerləşir. Az mineralli olub, suyu mülayim-isti iki bulaqdan ibarətdir. Hidronimə ilk dəfə XI əsr gürcü mənbəyində təsadüf edilmişdir. Tədqiqatçılar belə hesab edirlər ki, hidronim qədim türk dillərindəki *körmük* (gölməçə) sözündəndir. Çayın adı mineral bulaqlardan alınmışdır.

**Kürsəngi** *oyk., sadə* Salyan r-nunun Qaraçala qəsəbə i.ə.v.-də qəsəbə. Cənub-Şərqi Şirvan düzündədir. Keçən əsrin ortalarında 1 №-li sovxozun 3 №-li şöbəsinin malikanəsi yanında salınmış qəsəbə 1965-ci ildən yaxınlığındakı *Kürsəngi* dağının adı ilə adlandırılmışdır. Dağ keçmişdə maldar ellərin qışlaq yeri olmuşdur.

**Kürsəngi** *or., mür.* Salyan r-nu ərazisində dağ və sönmüş palçıq vulkanı. Cənub-Şərqi Şirvan düzündədir. Kür-Araz ovalığının ən böyük palçıq vulkanlarından biridir. Hün. 77 m. Oronim *Kür* (çayın adı) və fars dilindəki *səng* (daş, qaya) sözlərindən düzəlib (burada *-i* mənsub şək.-sidir), "Kür daşı" mənasındadır.

**Kürtport** *or., mür.* Goranboy r-nu ərazisində dağ. Murovdağ silsiləsinin şm. yamacındadır. Hün. 2190 m. Oronim türk dillərində, o cümlədən Azərb. dilinin dialektlərində "qar, qar yığını" mənalarında işlənən *kürt* və *part/port* (parıldayan, işıldayan) sözlərindən düzəlib, "qarı parıldayan dağ" mənasındadır.

**Küsəkəran** *oyk., mür.* Lerik r-nunun Yeri i.ə.v.-də kənd. Peştəsər silsiləsinin yamacındadır. Yerli əhali arasında Küsəkən şəklində işlənir. Oykonim talış dilindəki *kü* (dağ), *sə* (üst) və *kəran* (burada "kənd" mənasındadır) sözlərindən düzəlib, "dağın üstündə, dağın zirvəsində salınmış kənd" mənasındadır.

Yaşayış məntəqəsi təbii-coğrafi mövqeyinə görə belə adlandırılmışdır

**Küsnət** *oyk., sadə.* 1 Qəbələ r-nunun Qəbələ şəhər i e v -də kənd. Baş Qafqaz silsiləsinin yamacındadır Kənd Quba r-nunun Küsnət kəndindən çıxmış ailələrin məskunlaşması nəticəsində yaranmışdır; 2. Quba r-nunun Küpçal i e v -də kənd Baş Qafqaz silsiləsinin ətəyindədir Yaşayış məntəqəsi əvvəlcə indiki Vladimirovka kəndinin yerində idi və Dağıstanın Küsnət kəndindən qədimdə gəlmiş ailələrin məskunlaşması nəticəsində yaranmışdı Rus ailələri ora köçürüldükdən sonra küsnətlilərin bir hissəsi indiki Küsnət kəndinin əsasını qoymuş, digər hissəsi isə Qəbələ r-nuna gedərək Küsnət kəndini yaratmışdılar Küsnət sözü Ağdaş r-nunda "ağırxasiyyətli, qaraqabaq" mənalarında işlənir. Bu sözün türk dillərində "payızlıq", "dağlıq ərazı", "quzey" mənaları da vardır

**Küsnətqazma** *oyk., mür* Quba r-nunun Küpçal i.e v -də kənd. Qızılqaya yaylağının ətəyindədir. Keçmişdə Qazma Küsnət, Küsnət qazmaları, Küsnət qışlaq da adlanmışdır Yaşayış məntəqəsi XIX əsrin ortalarında Küsnət kəndinə məxsus pay torpağında həmin kənddən çıxmış ailələrin məskunlaşması nəticəsində yaranmışdır Oykonim *Küsnət* (kənd adı) və *qazma* (ev tipi) komponentlərindən düzəlib, "Küsnət kəndinin qazmaları" mənasındadır

**Kyunçal/Günçal/Künçal** *oyk., mür* Siyəzən r-nunun Ağbaş i e v.-də kənd Samur-Dəvəçi ovalığındadır Əsli Günçaldır. Yerli əhali arasında Güneyçal da adlanır Oykonim "Güneydəki çalda, yalda yerləşən kənd" mənasındadır Oykonim 1917-ci ildə də Günçal variantında qeydə alınmışdır Kyunçal (Qyunçal) bu coğrafi adın rusca tələffüz formasıdır



# MÜNDƏRİCAT

Buraxılışa məsul: *Əziz Güləliyev*

Texniki redaktor: *Rövşən Ağayev*

Kompyuter səhifələyiciləri: *Ələkbər Kərimov*
*Aslan Almasov*

Korrektor: *Kəmalə Cəfərli*

Yığılmağa verilmişdir 17.04.2007. Çapa imzalanmışdır 19.07.2007.
Formatı 60x90 $^1/_{16}$. Fiziki çap vərəqi 19. Ofset çap üsulu.
Tirajı 10000. Sifariş 104.

DÜST 5773-90, DÜST 4.482-87




Kitab "CBS-PP" MMC mətbəəsində çap olunmuşdur.
Bakı, Şərifzadə küçəsi, 3.

